*Bu kitab "**Aleksandr Düma.** Üç muşketyor" (Bakı, Gənclik, 1977) nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*

Birinci hissənin tərcüməçisi: **Mikayıl Rzaquluzadə**

İkinci hissənin tərcüməçisi: **Beydulla Musayev**

**843.7 - dc 21**
**AZE**
**Düma Aleksandr. Üç muşketyor.** Bakı, "Öndər nəşriyyat", 2004, 600 səh.

XIX əsrin məşhur fransız yazıçısı Aleksandr Dümanın əsərləri sərgüzəşt və macəra romanları kimi hələ öz əhəmiyyətini itirməmişdir. Doğrudur, həmin əsərlərdə lirik, təsirli səhnələr yoxdur. Lakin yazıçı əvvəldən axıradək hərəkətdə olan qəhrəmanlarını həmişə yeni vəziyyətlərə salaraq və onları böyük ziddiyyətlər qarşısında qoymaqla öz oxucusunu intizarda saxlamağı bacarır.

Kəskin mükalimə, təsvirdə və xarakteristikada yığcamlıq kimi vasitələr Düma romanlarını maraqlı və əyləncəli etmişdir. Tarixi həqiqət və həyatilik nə qədər az olsa belə, keçmiş Fransa həyatını öyrənmək baxımından həmin əsərlər, o cümlədən "Üç muşketyor" romanı bugünün oxucusu üçün yenə də maraqlı olaraq qalmaqdadır.

**ISBN 9952-416-23-6**





Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**"Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında"**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir

## ADAMI VALEH EDƏN YAZIÇI

Fransız qoşunlarının Avropa ölkələrini sürətlə işğal etməyə başladığı il idi. Həmin il Napoleon ordusu generallarından birinin ailəsində bir oğlan uşağı dünyaya gəldi. O, sonralar təkcə fransız ədəbiyyatının deyil, eləcə də dünya ədəbiyyatının korifeylərindən biri olacaq Aleksandr Düma idi.

Aleksandr Düma 1802-ci il iyulun 24-də Fransanın Villa-Kortre şəhərciyində anadan olmuşdur. Zənci atası Tomas-Aleksandr Davi-Düma de La Payetri (yazıçının babası öz zənci qulu ilə evlənmiş zəngin koloniya mülkədarıydı) respublikanın generalı, anası Mari-Luiz-Elizabet Labure isə keçmiş otel sahibinin qızı idi. O, əmək fəaliyyətinə notariat kontorunda xidmətlə başlamış, lakin bu iş onu qane etmədiyindən meylini teatra salmışdır. Teatra maraq onun ədəbi fəaliyyətinin başlanğıcını müəyyənləşdirmiş və o, ədəbiyyata dramaturq kimi daxil olmuşdur. Düma həyatda çox bədxərc insan olmuş, nəticədə müflisləşmişdir. Ağır vəziyyəti və dalınca düşən kreditorlar onu Belçikaya qaçmaq məcburiyyəti qarşısında qoymuşdur. Ömrünün sonunda yazıçının yoxsul həyat keçirdiyi faktını bütün bioqraflar etiraf edir. Bu vəziyyətdə ikən övladları – qızıyla məşhur dramaturq olan oğlu Aleksandr Düma ona dayaq olmuşlar.

...1870-ci ildə Düma Sena çayının aşağısında yerləşən Tüys şəhərinə oğlugilə gəlir. Qızı Mari də onunla idi. Sanki ədib oğluyla vidalaşmağa gəlmişdi...

Həmin il dekabrın 5-də Fransa-Prussiya müharibəsi və Fransanın alman ordusu tərəfindən işğalı zamanı vəfat etmişdir. O, Villa-Kortredə dəfn edilmişdir. Hüqo o zaman Dümanın oğluna yazırdı: "Bilmirəm bu kədərli mərasimdə danışmağa. Qəlbimi kəskin bir həyəcan bürüyür... İcazə verin demək istədiyimi Sizə yazım."

Hüqo sonra ürəkdolusu, geniş qəlblə qələm dostu haqqında yazır: "Aleksandr Düma adamı məftun edir, valeh edir, əyləndirir, öyrədir. Onun bu qədər canlı, valehedici olan əsərləri bütün Fransaya nur saçır...

Aleksandr Dümanın ağlı qədər ürəyi də böyük idi. O, nəcib və mehriban insan idi..."

*Düma dramaturq kimi 1826-1830-cu illərin geniş romantik* savaşında mühüm rol oynamış və onun dram əsərləri həmin vaxt çox böyük əks-səda yaratmışdı. 1829-cu ildə gənc Dümanın ilk sanballı əsəri olan "III Henri və onun sarayı" adlı tarixi dramı səhnələşdirilir. Bu milli-tarixi əsər ilk növbədə köhnə klassisizm qanunlarına qarşı yönəlmiş tipik romantik dram əsəriydi. Burada antik süjetlərin yerinə XVI əsr Fransa həyatının hadisələri və tarixi şəxsiyyətlər səhnəyə çıxmışdı. Bundan əlavə, Düma klassisizm faciəsinin zaman, məkan, hərəkət birliyi qaydalarına da qətiyyətlə son qoyur. "III Henri və onun sarayı" əsərində nə məkan, nə də zaman sabitliyi var. Hərəkət burada heç bir zaman məhdudiyyətinə məruz qalmır. Hərəkətin sürətli inkişafı, bir neçə siyasi və eşq intriqasının



parlaq əks etdirilməsi, romantik qəhrəmanların coşqun ehtirasları klassisizm teatrın fərqli olan, effektli və dinamik romantik tamaşa mühitini yaratmağa kömək edir.

"III Henri və onun sarayı" əsərinə görə əldə etdiyi uğur Dümaya dəbdə olan yazıçı şöhrətini qazandırmışdır. O, atası kimi ehtiraslı respublikaçı olduğunu nümayiş etdirərək *1830 və 1848-ci illərdə* barrikadalarda görünür.

1830-cu il inqilabını Düma böyük heyranlıqla qarşılamışdı. O, iyul hadisələrində yaxından iştirak etmiş, liberal xadim Lafayetin tapşırığı ilə üsyançılar üçün barıt dalınca Suassona və milli ordu sıralarının təşkili üçün Vandeyə getmişdi. 30-cu illərin əvvəlində o, İyul inqilabının azadlıq ideyalarına hüsn-rəğbət nümayiş etdirmiş, hökumətin tutduğu mürtəce kursa hiddətini bildirmişdi. Düma general Lamarkın dəfn mərasimində iştirak etmişdi.

İyul inqilabından təsirlənən Dümanın dram əsərləri bu hadisələrdən az müddət sonra hələ də davam edən xalq üsyanları şəraitində yaradıldığı üçün romantik və üsyankar xarakter daşıyır. Nəşri 1831-ci ilə təsadüf edən ən məşhur "Antoni"dramında Paris cəmiyyətinin yüksək təbəqəsi tənqid atəşinə tutulur. Əsərin qəhrəmanı atılmış, əsli-nəcabəti məlum olmayan Antoni adlı gənc silk üstünlükləri və onu rədd edən mühitə qarşı mübarizə aparır. Mövcud qanunlarla hesablaşmaq istəməyən baş qəhrəman öz məhəbbəti uğrunda mübarizəyə qalxır. Məsələ burasındadır ki, bu dram əsəri kübar cəmiyyətə, onun köhnəlmiş adət-ənənələrinə və üstünlüklərinə müharibə elan edən qabaqcıl gənclərin duyğu və hisslərinə uyğun gəlirdi. Qarşısıalınmaz romantik ehtiraslar, mənəvi azadlığın cəsarətli təsdiqi və dramın faciəli sonluğu – Antoni sevgilisini rüsvayçılıqdan qurtarmaq üçün onu öz əlləri ilə öldürür – bunlar hamısı tamaşanın uğurlu alınmasına gözəl zəmin yaratmışdı. Əsər İyul inqilabı ilə bağlı mühitin yüksək ümidlərinə cavab verirdi.

Dümanın 30-cu illərdə "Kin" (1836) və s. romantik dramları melodram xarakterini alır, buradakı münaqişələr çox vaxt xoşbəxt sonluqlu olur ki, bu da onların bir o qədər ciddi olmadığına dəlalət edir.

Ədəbiyyat tarixində dramaturq kimi müəyyən rol oynamış Düma ən çox romançı kimi yaddaşlarda qalıbdır. Bədii ədəbiyyatın sehrinə Düma "Robinzon Kruzo" və "Min bir gecə"əsərləri vasitəsilə düşmüşdür. O, Avropada tarixi roman yaradıcısı Valter Skotu özü üçün kəşf edir, lakin bu kəşf heç də təqlidə gətirib çıxarmır. Müəllifin qələmə aldığı ilk nəsr əsəri də bunu sübut edir. Bədii-*mənəvi və fəlsəfi-estetik zəmində yaradılmış həmin əsərdən sonra* hələ uzun illər boyu onun "Qraf Monte-Kristo" ("Le compte de Monte-Cristo", 1844-1845), "Üç muşketyor" ("Les trois mousquetaires", 1844), "İyirmi ildən sonra" ("Vingt ans apres", 1845), "Kraliça Marqo" ("La reine Margot", 1846) və s. əsərlərinə oxucu marağı tükənməyəcəkdi. Bu isə onu göstərir ki, elə məhsuldar və çox istedadlı yazıçı da var, bəzi müəllifin sənətkarlıq qeydinə qalmadan əyləndirməyə çalışdığı tox bir cəmiyyətdə heç zaman darıxdırıcı olmamaq kimi bir qabiliyyətə malik ola bilər.

Düma romanlarını bir-biri ardınca yaradır. Yaradıcılığının ən əsas bədii cəhətlərindən biri bundan ibarətdir ki, yazı öz qəhrəmanlarını əsərdən-əsərə

adladaraq hadisələri bir neçə roman boyunca inkişaf etdirir. Müəllif elə bir nəql üsulundan istifadə edir ki, oxucu nəqlin bitdiyini güman etdiyi zaman hadisələr yenidən cərəyan etməyə başlayır. Sənətkar oxucunu qətiyyən sərbəst buraxmır, onu daim gərginlikdə saxlayır. Dümanın yaradıcılığına aydınlıq, sadəlik, bir sözlə, əsl fransız üslubu xasdır; hərçənd ki, bəzən qeyri-müəyyən tərzdə uzanan, lakin canlı və çox təbii dialoq və s. – bütün bunlar sanki sonsuz bir mənbədən bəhrələnir. Oxucu qəhrəmanların xasiyyətindəki şişirtmələri, hərəkətin təsvir edildiyi tərzdə inkişaf etdirilməsinin mümkünsüzlüyünü, faktların təqdimatında həqiqətin təhrif edilməsini və s. çatışmazlıqları görməyə bilmir, amma o bundan hiddətlənmir, çünki dərk edir ki, söhbət uzun-uzadı axtarışlara qərq olmayan, heç nəyin üzərindən xətt çəkməyib, heç nəyi düzəltməyən, sanki yeganə məqsədi əylənmək və əyləndirmək olan xarakterlərdən gedir.

Düma romanları bütövlükdə mühüm tarixi hadisələrin əksi ilə səciyyələnir. Katoliklərlə hugenotlar arasındakı vətəndaş müharibələri, Varfolomey qırğını ("Kraliça Marqo"), Rişelye hökmranlığı və La-Roşelin mühasirəsi ("Üç muşketyor"), Fronda hərəkatı ("İyirmi ildən sonra"), Napoleonun 100 günü və Fransadakı ikinci Restavrasiya ("Qraf Monte-Kristo") və s. bu qəbildən olan tarixi hadisələrdir. Lakin müəllif tarixlə çox sərbəst davranır, tarixi faktları istədiyi kimi təqdim edir. Müharibələr, üsyanlar, dövlət çevrilişləri, dərin tarixi konflikt və kolliziyalar şəxsi motivlərlə – tarixi personajların xarakterləri, onların rəqabəti, istəyi, qısqanclığı, şöhrətpərəstliyi, eqoizm dolu ehtiraslar, saray hiylələri ilə əlaqələndirilir. Məsələn, "Üç muşketyor" romanında konflikt kardinal Rişelye ilə hersoq Bekinhem arasında olan şəxsi ədavət və kardinalla Fransa kralı arasında olan rəqabət üzərində qurulubdur. "Kraliça Marqo" əsərində XVI əsrin dini münaqişələri ana-kraliça və hersoq Qizin intriqaları ilə izah olunur. Düma romanlarında təsvir olunan dövrün siyasi həyatından kral mütləqiyyətinin feodallarla müharibəsi kimi bəzi mühüm məqamlar öz əksini tapmamışdır. Qəhrəmanlarını müəyyən tarixi mühitdə təsvir edərkən əsərlərini məlum hadisə, adlar və faktlarla zənginləşdirən yazıçı əslində macəra romanı yaradır. Belə olduqda qəhrəmanların ağlı, çevikliyi və enerjisi hadisələrin cərəyan etməsində birinci dərəcəli və həlledici rol oynamaqdadır.

Düma romanları Fransa tarixi haqqında tam və doğru təsəvvür yarada bilməməsinə baxmayaraq, çox maraqlı və oxunaqlıdır. Onlar, ilk növbədə, ona görə maraqlıdır ki, burada təsvir olunan məşhur Atos, Portos, Aramis və onların gənc dostu d'Artanyan kimi qəhrəmanların həyatı hadisələr, macəralar, görüşlər, davalar, qələbələr və eyni zamanda hiyləgər Yekaterina Mediçinin toruna düşən Navarralı hersoqun həyatı daimi təhlükə, sui-qəsd, gizlin müharibə və intriqalarla doludur. Bu romanlar nikbin ruhlu əsərlərdir. Müəllif öz romanları ilə gerçəkliyə fəal münasibət bəsləməyin vacibliyini təbliğ edir. Düma personajlarının böyük əksəriyyəti cəsarətli, iradəli, istənilən çətinliyi dəf etməyə hazır olan, müəllifin böyük məharətlə uydurub yollarında səxavətlə səpələdiyi qəliz və təhlükəli hiylələrdən qələbə ilə çıxan insanlardır. Düma personajları sadə psixologiyaya malikdir, daxili kolliziyalar onlara yaddır.



Kompozisiya şəklinin aydın və hərəkətli olması, romanların canlı və enerjili dili, ifadəli dialoqlar Dümanı məharətli hekayəçi kimi səciyyələndirir.

Dümanın 50-60-cı illərdə yaradılmış əsərləri öz sadəlövh və şən xarakterini itirib tutqun fantastika ilə dolur: baş verən hadisələr taleyin müəyyənləşdirdiyi hadisələrdən asılı vəziyyətə salınır və onlara artıq üstün gəlmək iqtidarında olmayan qəhrəmanlar, məsələn, "Şeytan dərəsi" əsərində olduğu kimi, alın yazısına boyun əyməli olurlar.

Düma Azərbaycana da səyahət etmişdir. O, 1858-ci ildə Dərbənd, Quba, Bakı və Şamaxını dolaşmış, şairə Natəvanla görüşmüş, Şamaxının ən məşhur, varlı adamlarından olan Mahmud ağanın qonağı olmuşdur. Fransız ədibinin bu səyahətdən aldığı təəssüratın məhsulu olan "Qafqaz" əsərində azərbaycanlıların adət-ənənələrindən, qonaqpərvərliyindən, sözü bütövlüyündən geniş söhbət açılmışdır. Fikrimizi əsaslandırmaq üçün bəzi parçalara müraciət etmək yerinə düşər:

"Səbirsizliklə gözlədiyimiz, hörmətlə qəbul olunduğumuz bir məclisdə bizi görmək istəyən iki azərbaycanlı xanım və onlardan birinin – gənc xanımın əri də iştirak edirdi. Çadra örtmüş bu xanımlardan biri Qarabağın axırıncı xanı Mehdiqulu xanın arvadı, o biri qızı idi. Hər ikisi milli geyimdə idi. Qəşənglikdən daha çox bahalı olması ilə seçilən nazik paltarda cazibədar görünən gənc xanımın yanında iki uşağı vardı. Anası kimi milli geyimdə olan üç-dörd yaşlı qız uşağı maraq dolu gözlərini bizdən çəkmirdi. Beş-altı yaşlı oğlan uşağı isə nənəsinin dizinə sıxılmış və sövqi-təbii ilə kiçik əlini belindən asılan xəncərin üstünə qoymuşdu. Mən mat qalmışdım. Bu, fransız qadınının uşağının oynamasına icazə verə biləcək oyuncaq xəncər deyildi, oğlanın belindən asılan əsl iti xəncər idi. Azərbaycanlı qadınlar üçün bu, birinci uşaq oyuncağı hesab olunur. Və yaxud...

Qadınlar yun əyirir, xalça toxuyurlar. Onların toxuduqları Quba, Şamaxı və Nuxa xalıları rəng çalarlarına, naxışlarına və keyfiyyətlərinə görə İran xalılarından heç də geridə qalmırdı. Eləcə də azərbaycanlılar ağzı ülgüc kimi iti xəncər düzəldirdilər. Qını zinətli, dəstəyi fil sümüyündən və gümüşlə işlənmiş belə bir silaha dağlıların başçısı dörd at və iki arvad verirmiş. Azərbaycanlı ilə bir şey barədə sövdələşəndə ondan imzalanmış sənəd tələb etməyə ehtiyac yoxdur. Söz verdi, qurtardı" (A.Duma. "Qafqaz səfəri". Bakı, "Yazıçı", 1985. Fransız dilindən tərcümə edənlər Q.Paşayev, H.Abbasov).

"Üç muşketyor" romanına gəlincə, bunu qeyd etməliyik ki, Dümanın Oqüst-Jül Make (1813-1888) ilə əməkdaşlığının bəhrəsi olan bu əsərin hissələri ilk dəfə 1844-cü ilin mart-iyul tarixlərində Parisdə çıxan "Siecle" ("Əsr") tərəfindən ardıcıl nəşr edilmiş, kitab halında isə roman həmin il Bodri nəşriyyatında işıq üzü görmüşdür. Romanın ikinci nəşri 1846-cı ildə Felan və Düfur nəşriyyatlarında çıxmışdır. Əsərin böyük şöhrət qazanması onun müxtəlif versiyalarda üzə çıxmasına səbəb olmuşdur.Məsələn, Ansye, Dümanuar və Brizbar müəllif üçlüyü "Portos techizat axtarışında" adlı vodevil yazır ki, bu əsər də Vodevil teatrının səhnəsində 1845-ci iyunun 23-də il tarixində nümayiş etdirilir. Düma ilə Make 14 pərdədən ibarət "Muşketyorların gəncliyi" adlı dram yazıb, onu 1849-cu ilin fevralında Teatr-İstorik, yəni Tarixi teatrda səhnələşdirməyə müvəffəq olurlar.

Düma öz yaradıcılığında əməkdaşlıq prinsipindən geniş istifadə etmişdir. Onun romanlarının hamısı heç də yalnız öz əməyinin bəhrəsi olmamışdır. Bu mənada Oqüst Makenin adı xüsusilə qeyd edilməlidir. Müəllif onunla əməkdaşlıq edən insanların imzalarına biləzəkdən öz imzası yanında yer verməmiş, lakin bir kitab haqqında aşağıdakı sözləri deməklə onların mövcudluğunu etiraf etmişdir: "Mən ona imza atmış, lakin oxumamışam". Yazıçının köməkçiləri ona nə qədər xidmət göstərmiş olsalar da, onun qüvvə və fantaziya dolu ən gözəl və ən dəyərli romanlarında, "Səyahət təəssüratları"nda ("Les impressions de voyage") müəllifin yalnız öz dəst-xəttinin olduğu heç bir şübhə yaratmır.

Dümanın əməkdaşlıq etdiyi insanlar haqda isə demək lazımdır ki, onların köməyini yazıçı ən çox nəzakətdən, bir az da ehtiyacdan qəbul edir. Dümanın fikrincə, əməkdaş "cəsarətlə sizin mindiyiniz qayığa minib yavaş-yavaş üzməyi bacarmadığını sizə bildirən bir səmişindir". Make ilə eksklüziv xarakter daşıyan əməkdaşlığına gəlincə, yazıçı ona qarşı dostluq münasibətləri olduğunu nümayiş etdirir. Ancaq Düma ilə Makenin əməkdaşlığı da ideal əməkdaşlıq olmamış, bir zaman sonra pozulmuşdur.

"Üç muşketyor"a müraciətlər bu gün də davam edir; nəinki Fransa, hətta dünyanın müxtəlif ölkələrində sözügedən əsərin müxtəlif versiyaları peyda olmaqdadır. Məsələn, postsovet məkanının seyrçiləri bu roman əsasında yaradılmış çoxseriyalı televiziya filmini yaxşı xatırlayırlar. Məşhur aktyorların həmin filmdə iştirakı ona xüsusi hüsn-rəğbət qazandırmışdır. Doğrudan da, təqlidlər, parodiyalar, serial və variasiyalar, teatr, kinematoqraf və ya televiziya versiyaları indiyədək təsəvvürümüzün ayrılmaz hissəsinə çevrilmiş roman personajlarının məşhur olaraq qaldığını bir daha sübut edirlər.

Məhz bu kitabın gətirdiyi şöhrətin məhsulu olan trilogiyanın "Üç muşketyor" adlı birinci hissəsi – (ikinci hissə "İyirmi ildən sonra" (1845), üçüncü hissə – "Brajelon vikontu" romanlarıdır (1848) – tarixi roman və çoxhissəli romanın müsbət keyfiyyətlərini özündə cəmləşdirir. Yeniyetmə auditoriyası tərəfindən qəbul edilməsi və geniş yayılması bu əsərin sehrkar qüvvətini daha da möhkəmləndirmişdir.

Əsərə yazdığı ön sözündə müəllif qeyd edir ki, personajların adlarının "os" və "is" şəkilçiləri ilə bitmələrinə baxmayaraq, onlarda heç bir mifoloji cəhət yoxdur. O, Kral kitabxanasında yaradacağı əsər üçün materiallar araşdıran zaman, özünün dediyinə görə, "möcüzə" baş verir: müəllif "Cənab d'Artanyanın xatirələri"nə rast gəlir və heç nəyi uydurmadan onları canlandırır. Ön sözdən başqa, iki hissə, 66 fəsil, nəticə və epiloqdan ibarət olan bu əsərdə baş qəhrəman d'Artanyanın sərgüzəştlərindən bəhs edilir. Fransanın Qaskon əyalətindən paytaxta karyera dalınca gələn bu gənc ayrılıqda deyil, dostları Atos, Portos və Aramislə birgə təsvir olunur. Bu, 1825-ci ildə kral XIII Lüdovikin hökmranlıq etdiyi dövrə təsadüf edir. D'Artanyan kral muşketyorlarının komandanı cənab de Trevilin hüzuruna atasının ona verdiyi zəmanət məktubu ilə təşrif buyurur. D'Artanyanın üç dueldən sonra muşketyorların ənənəvi düşməni olan kardinal de Rişelyenin mühafizə dəstəsi ilə Atos, Portos və Aramisin birgə iştirak etdiyi döyüş nəticəsində adları çəkilən bu dörd personaj dostlaşır. Onların dostluğu o qədər möhkəmdir ki, bu dostluq xüsusilə də gənc oxucu üçün bir simvola çevrilir. Nəhəng Portosun əsl adı dü Valondur, Atos kimi təqdim olunan qraf de la Fer fırıldaqçı bir qadınla kəbin nəticəsində müflisləşmişdir, Aramis isə mistik meyli qadınlara göstərdiyi meyllə ziddiyyət təşkil edən d'Erble şevalyesidir. Muşketyorların dəstəsinə qəbul edildikdən sonra d'Artanyan təsadüfən nə vaxtsa Atosun həyat yoldaşı olmuş, hazırda kardinalın hiyləgər agenti miledi de Vinterin qurbanına çevrilir. Bu, ötəri hissdir, lakin d'Artanyan əsl məhəbbət hissi də yaşayır: o, kraliça Avstriyalı Annanın sadiq qulluqçusu Konstans Bonasyeyə aşiq olur. Kraliça kralın ona hədiyyə etdiyi 12 brilyant qaşlı bəzək əşyasını aşnası qraf de Bekinhemə bağışlamışdır. Kraliçanı məhv etmək istəyən Rişelye kralın beyninə yeridir ki, arvadı saraydakı növbəti balda o bəzək əşyalarını taxmalıdır. Dörd qəhrəman İngiltərəyə üz tutmalı olur və bir çox çətinliklərlə üzləşir, ancaq yenə də, tapşırığı yerinə yetirib kraliçanı xilas etməyə müvəffəq olurlar.

Muşketyorlar La Roşelin tutulması sevincini yaşayan zaman miledi protestantların tərəfdarı olan Bekinhemi öldürməyə cəhd göstərir. Dördlük onu həbs edir, amma o qaçır, qrafı öldürtdürür və Konstans de Bonasyeni zəhərləyir. Dörd dost onun öldürdüyü lord Vinterin qardaşının köməkliyi ilə onu cəllad Betünə verərək etdiyi cinayətləri yudurdurlar. Rişelye ilə barışmış d'Artanyan leytenant rütbəsinə layiq görülür. Atos kəndə qayıdır, Portos evlənir, Aramis isə keşiş olur.

Romandakı əsas süjet xətti gözlənilməz hadisə və hərəkətin qeyri-adi istiqamətdə cərəyan etməsi prinsipinə tabe olur. İlk yeddi fəsildə personajların toplanması, mühit, dövrün ab-havası məharətlə əks etdirilir. Muşketyorların dördünün də təsviri müəllifin zəngin yaradıcılıq əməyinin bəhrəsi olaraq meydana çıxmışdır.

"Üç muşketyor"un davamını təşkil edən "İyirmi ildən sonra" romanının sonunda d'Artanyan söyləyir ki, Atos səxavətə görə roman qəhrəmanı, Portos əla təbiətli, amma asanlıqla təsir altına düşən bir insan, Aramis isə iyeroqlifik, yəni daim anlaşılmaz bir şəxsdir. O, fikrini belə tamamlayır: "Görəsən, mən bu insanları birləşdirməsəm, onlar nə edəcəklər?" Bu sözlər muşketyor dördlüyü arasında hökm sürən əlaqələri anlamağa kömək edir.

"Üç muşketyor" əsəri Fransanın milli tarixinə bədii bir səyahət kimi də qiymətləndirilə bilər. Bu mənada Aleksandr Dümanın "Üç muşketyor" silsiləsi Onore de Balzakın "Bəşəri komediya"sı ilə səsləşir. Roman tarixi anlatmaq üçün də bir vasitədir. Silsilədə və konkret olaraq birinci hissədə bədii uydurmaların bolluğu, bəlkə təbii haldır, çünki roman hər halda tarix dərsliyi rolunu oynaya bilməz.

"Üç muşketyor" o qədər böyük əks-səda doğurmuşdu ki, bu, müəllifi yenə də Makenin əməkdaşlığı ilə əsəri səhnə üçün 5 akt və 12 pərdədən ibarət dram şəklində təqdim etməyə vadar etmişdir. Yazıçının bioqrafı Klod Şşop teatr üzərində qurulmuş tarixi romanın səhnələşdirmə yolu ilə teatra qayıdışını əlamətdar hadisə kimi qiymətləndirir.

"Üç Düma" (1957) əsərinin müəllifi Andre Morua Dümanın Balzak, Dikkens, Tolstoy kimi yazıçılarla müqayisədə bir qədər aşağı pillədə durduğunu qeyd etməklə yanaşı, onun Viktor Hüqo tərəfindən yüksək qiymətləndirildiyini vurğu-

layır. Ona bədxərc, şən və məhsuldar olduğuna dair tutulan iradlara müəllif belə bir ritorik sual ünvanlayır ki, simic, darıxdırıcı və bəhrəsiz olmaq yazıçı üçün məgər daha üstündürmü?!

Düma haqqında Fransanın görkəmli şəxsiyyətlərinin bəzi fikirlərini burada bir daha səsləndirmək, bizcə, yerinə düşərdi:

"Sən öz parlaq, ucsuz-bucaqsız əsərinə qayıtdın. Rəngarəng, gözəl, uğurlu, işıq saçan əsərinə... Mən isə gecənin vahiməli təkliyinə..." (*Viktor Hüqo*)

"Bu bir Enseladdır, Prometeydir, Titandır!" (*Lamartin*)

"Siz böyük yazıçı olmaqdan da üstünsünüz, siz təbiətin ən böyük qüvvələrindənsiniz." (*Mişle*)

"Sizə elə gəlir ki, bir aləm əhvalat, qəhrəman, xain, cadugər, avantürist yaradan bir kəsi, özü özlüyündə dram olan bir kəsi ziyansız zövqlər söndürə bilməzdimi? Nəhəng həyat ocağını daim təzələmək üçün ona həyat bolluğu lazım idi." (*Jorj Sand*)

"Çox gözəl Düma..." (*Apolliner*)

Düma romanı heç də keçmişə və onun itmiş dəyərlərinə istiqamətlənməyibdir, müəllif qədim dövr üçün darıxmır da. Onun tarixi hekayəti bu günə və gələcəyə üz tutur; keçmiş bu günün izahı, sabahın timsalıdır.

Dümanın "Üç muşketyor" romanı müasir dövrdə də öz aktuallığını itirməyibdir. Burada təbliğ edilən ümumbəşəri dəyərlər və hisslər gənc nəslin tərbiyəsi üçün əhəmiyyətlidir. Bu mənada muşketyor dördlüyünü səciyyələndirən ümdə xüsusiyyətlərdən biri olan dostluq münasibətləri nümunəvi xarakter daşıyır, dostlara xas olan cəsarət, ruh yüksəkliyi, ağıl itiliyi – bütün bunlar bir örnəkdir. Qəhrəmanların yaşadığı məhəbbətin saflığı və paklığı, sədaqət oxucunu valeh edir. Əsərin humanist ideyaları ilə yanaşı, döyüşkən, mübariz ruhu xüsusilə nəzərə çarpır, burada məkan və zaman baxımından uzaq hadisələrdən bəhs edilsə də, roman öz gənc oxucusunu ruhlandırır.

***Ə.Zeynalov***
*filologiya elmləri doktoru*

***S.Vahabova***
*filologiya elmləri namizədi*



## I

## CƏNAB D'ARTANYAN – ATANIN ÜÇ HƏDİYYƏSİ

1625-ci il, aprel ayının birinci bazar ertəsi günü Menq qəsəbəsində, "Qızılgül romanı"[1] müəllifinin doğulduğu qəsəbədə elə bir çaxnaşma vardı ki, guya quqenotlar[2] həmin qəsəbəni ikinci Laroşelə[3] çevirmək üçün ora basqın etmişdilər. Şəhər əhlindən bir çoxu arvadların baş küçə ilə qaçdıqlarını görüb və qapıların ağzında uşaqların çığırışdıqlarını eşidib, tələsik zireh geyinir və kimi muşket[4] ilə, kimi balta ilə silahlanaraq, "Azad Dəyirmançı" meyxanasına doğru yüyürürdü. Bu meyxananın qabağında getdikcə artmaqda olan hay-küylü camaat yığışmışdı.

O zamanlar belə çaxnaşma tamamilə adi bir şeydi. Ayrı-ayrı şəhərlərin tarixçiləri göstərirlər ki, bu cür hadisələr, demək olar ki, hər gün baş verirmiş. Məşhur əyanlar bir-birilə, kral kardinal[5] ilə, ispaniyalılar kral ilə vuruşurdular. Bu aşkar və gizli vuruşmalardan başqa bir də oğrular, dilənçilər, quqenotlar, səfillər və nökərlər vardı ki, onlar hamı ilə vuruşurdu. Şəhər əhalisi həmişə oğrulara, səfillərə və nökərlərə qarşı, bəzən də krala qarşı silahlanardı. Amma kardinala

[1] "Qızılgül romanı" – orta əsrdə Fransada nəşr edilmiş məşhur poema. Onun ikinci hissəsinin müəllifi – Jan Mendskidir (XIII əsr).

[2] Quqenotlar – Fransada protestant-kalvinistləri belə adlandırırdılar. Protestantizm (yaxud reformasiya) adı ilə Qərbi Avropada meydana gəlmiş və katoliklər kilsəsinin hökmranlığını məhdud etmək və onu mülki hökmranlığa tabe etməyə çalışan hərəkat kimi məşhurdur. Protestantizm – Fransada geniş inkişaf etmədi – o, burjuaziyanın yalnız bəzi dairələrini və feodalların az bir hissəsini əhatə etdi. Bu dairələr dini protest adı ilə kral hökumətinin tədbirlərinə qarşı, şəhərlər və feodallıqların köhnə azadlıqları əleyhinə olan tədbirlərə qarşı öz siyasi narazılıqlarını bildirirdilər. Bir tərəfdən, kral hökumətilə katoliklər kilsəsi, digər tərəfdən isə, quqenotlar arasında gedən mübarizə bir sıra dini müharibələrə çevrildi və quqenotların tamamilə darmadağın edilməsi, onların kütləvi surətdə digər ölkələrə mühacirət etməsilə nəticələndi.

[3] Laroşel – Atlantik okeanı sahilində bir şəhərdir. Bu şəhər Fransada quqenotların kral hökumətinə qarşı mübarizələrinin istinadgahı olmuşdur. Laroşel XIII Lüdovik qoşunları tərəfindən 1628-ci ildə alınmışdır.

[4] Muşket – qədim zamanlarda işlənmiş iri çaplı fitilli tüfəng.

[5] Kardinal – Roma-katolik kilsəsində baş ruhani rütbəsi.

və ispaniyalılara qarşı heç bir zaman əl qaldırmazdılar. Buna görə də 1625-ci ilin aprelində ilk bazar ertəsi günü Menq qəsəbəsindəki əhalinin hay-küy eşidib "Azad dəyirmançı" meyxanasına doğru yüyürməsində heç bir təəccüblü şey yox idi.

Bu çaxnaşmanın səbəbi nə idi?

Cavan bir oğlan... Əvvəlcə onu qısaca təsvir edək:

Don Kixotu on səkkiz yaşında, ancaq yüngülcə geyinmiş, zirehsiz və polad qolçaqsız təsəvvür edin; əynində vaxtilə sürmeyi rəngində olub, indi isə, qəribə yaşıla çalan göy rəng almış yun kamzol[1] var. Üzü uzunsov və qarayanızdır, almacıq sümüklərinin iriliyi hiyləgər olduğunu göstərir, çənəsi həddindən artıq inkişaf etmişdir ki, bu da onun beretsiz də qaskoniyalı[2] olduğunu bildirir, halbuki bizim qəhrəmanın başında lələk taxılmış bir beret də vardır. Gözləri iri və ağıllıdır; burnu donqar, ancaq zərif və gözəldir. Boyu yaşına nisbətən xeyli uca, ancaq yaşlı adama nisbətlə xeyli qısadır. Təcrübəsiz bir adam bizim qəhrəmanı səyahətə çıxmış bir bostançı oğlu hesab edə bilərdi. Ancaq onun belində qayışdan asılmış uzun bir qılınc var idi. Bu qılınc piyada getdiyi zaman onun topuqlarına dəyir, ata mindiyi zaman isə, atın pırtdaşıq tüklərinə toxunurdu. Bəli, bizim cavanın bir atı da var idi. Bu at o qədər qəribə idi ki, ona diqqət yetirməmək olmazdı. On iki və ya on dörd yaşında kürən, quyruğu qısa və ayaqlarında ağarmış tükləri olan bir Bearn yabısı təsəvvür edin. Bu at həmişə başını dizlərindən aşağı tutduğu üçün ona heç qantarğa taxmaq da lazım deyildi. Bununla belə gündə səkkiz lie yol gedirdi. Təəssüf ki, bu atın gözəlliyini əcaib rəngi və qəribə yerişi o qədər korlamışdı ki, o zamanlar hər bir adam yaxşı at tanıyan olduğundan, Bojan darvazasından Menq qəsəbəsinə daxil olan bu at çox pis təsir buraxmışdı və bu təsir atlının özünə də keçmişdi. Cavan d'Artanyan (bu yeni Rosinantın sahibi olan Don Kixotun adı belə idi) özü də görkəminin gülünc olduğunu çox yaxşı başa düşürdü. O, həmin bu atı atası cənab d'Artanyandan hədiyyə alanda, nahaq yerə dərindən köksünü ötürməmişdi. O, bilirdi ki, bu atın heç olmazsa iyirmi livr[3]

---

[1] Kamzol – qolsuz və qısa kişi paltarı.

[2] Qaskoniya – Fransanın cənubunda bir vilayətdir. Qaskoniya əsilzadələri, adətən, kral qvardiyasında xidmət edirdilər.

[3] Livr – Fransada qədim gümüş pul. Bu pulun qiyməti vaxt və yerinə görə dəyişirdi. Sonralar frankla əvəz edildi.



qiyməti olar. Ancaq bu hədiyyə veriləndə, söylənmiş sözlərin heç qiyməti yox idi.

Qaskoniya əsilzadəsi – ata öz oğluna IV Henrixin[1] ömrü boyunca ayrıla bilmədiyi xalis Bearn[2] ləhcəsilə belə demişdi:

– Əziz oğlum, bu at on üç il bundan əvvəl anadan olmuş və o vaxtdan atanızın evini tərk etməmişdi. Buna görə də siz bunun qədrini bilməlisiniz. Bunu heç bir zaman satmayın. Qoy rahat və namusla qocalıb ölsün və əgər siz bu atla yürüşə getməli olsanız, onu, qoca bir nökəri qoruyan kimi qoruyun. – D'Artanyanın atası sözlərinə davam edib demişdi: – Əgər, siz saraya girmək şərəfinə nail olsanız, – bu elə bir şərəfdir ki, qədim əsilzadələr nəslinə mənsub olmanız bunun üçün sizə haqq verir, – o zaman öz əsilzadə adınızı şərəflə qoruyun. Sizin babalarınız həmin bu adı beş yüz ildən artıq bir müddətdə şərəflə yaşatmışlar. Cənab kardinal və kraldan başqa heç kəsin yanında, heç bir şeydə özünüzü əskik tutmayın. Bunu yaxşı bilin ki, əsilzadə bu gün özünə mərdlik ilə, yalnız mərdlik ilə yol aça bilər. Hər kim bircə saniyə qorxaqlıq etsə, ola bilər ki, taleyin ona bəxş etdiyi təsadüfü həmin bu bir saniyədə itirsin. Siz hələ cavansınız və iki səbəbə görə cürətli olmalısınız. Birincisi – ona görə ki, siz qaskoniyalısınız, ikincisi – ona görə ki, siz mənim oğlumsunuz. Təsadüfdən qorxmayın və macəra axtarın. Mən sizə qılınc oynatmağı öyrətmişəm, sizin ayaqlarınız dəmir və qollarınız polad kimidir. Həm fürsət düşəndə vuruşun, həm də, indi təkbətək vuruşma qadağan edildiyindən, vuruşmaq üçün iki qat mərdlik lazımdır. Oğlum, mən sizə yalnız on beş ekü[3] pul, öz atımı, bir də indicə eşitdiyiniz məsləhətlərimi bəxş edə bilərəm. Ananız mənim hədiyyələrimə bir dərman nüsxəsi də əlavə edəcək ki, bu məlhəm ürək yarasından başqa hər bir yaranı ecazkar bir surətdə sağalda bilər. Ananız bu dərmanın nüsxəsini bir qaraçıdan almışdır. Bütün bunlardan istifadə edib xoşbəxt və uzun bir ömür edin. Yalnız

---

[1] IV Henrix Burbon – Fransa kralı (1589-1610). O, Fransa taxtına çıxmazdan əvvəl quqenotların rəhbəri olmuşdur. Sonralar siyasi mülahizələrə görə katolisizmə keçmişdir. Buna baxmayaraq o, 1598-ci ildə Nant fərmanı nəşr etmişdir ki, bu fərmana görə quqenotlara din azadlığı və müəyyən siyasi istiqlaliyyət verilmişdi. Rişelye və XIII Lüdovikin vaxtında Nant fərmanı xeyli məhdud edildi və 1685-ci ildə XIV Lüdovikin vaxtında tamamilə ləğv olundu.

[2] Bearn – şəhər adıdır

[3] Ekü – üç livr miqdarında gümüş pul

bir söz də əlavə edəcəyəm. Özümü sizə nümunə göstərmirəm: çünki mən özüm heç bir zaman saraya daxil olmamışam və yalnız din uğrunda müharibələr zamanı könüllü xidmət etmişəm. Sizə bir zaman qonşum olan, hələ uşaqlıqdan bizim kral XIII Lüdovik[1] ilə, Allah onun ömrünü uzun eləsin, oynamaq şərəfinə nail olan cənab de Trevili nümunə göstərirəm. Onların oyunları bəzi vaxt vuruşa çevrilirdi və bu vuruşmalarda kral heç də həmişə qalib çıxmırdı. Onun cənab de Trevildən yediyi yumruqlar həmin əsilzadəyə hörmət etməyinə səbəb olmuşdur. Sonralar cənab de Trevil birinci dəfə Parisə səyahət etdiyi zaman beş dəfə dueldə vuruşub, rəhmətlik kralın vəfatından cavan kralın həddi-buluğa yetişməsinə qədər müddətdə, müharibə və mühasirələr hesaba alınmazsa, – yeddi dəfə, kralın həddi-buluğa yetişməsindən indiyə qədər isə, bəlkə yüz dəfə vuruşmuşdur. Buna görə də fərmanlara, qərarlara və xəbərdarlıqlara baxmayaraq, cənab de Trevil indi muşketyorların kapitanı, yəni kralın iftixar etdiyi qəhrəmanlar legionunun[2] başçısıdır və ondan hətta cənab kardinal da çəkinir; hamıya məlum olduğu kimi, hersoq Rişelye çox az adamdan çəkinir. Bundan başqa cənab de Trevil on min ekü pul alır. Deməli, o, böyük əyanlardan biridir. O da vaxtilə sizin başladığınız kimi başlamışdır. Bu məktubla bərabər onun yanına gedin. Onun kimi olmaq üçün ondan nümunə götürün.

Bu sözlərdən sonra cənab d'Artanyan – ata öz qılıncını oğlunun belinə bağladı və mehribanlıqla onun hər iki üzündən öpüb, xeyir-dua verdi.

Cavan oğlan atasının otağından çıxdıqda, əlində məşhur nüsxə ilə gözləməkdə olan anasına rast gəldi. Yuxarıdakı nəsihətlərdən anlaşıldığına görə, bu dərman tez-tez işlədilməli olacaqdı. Cavan oğlanın anası ilə vidalaşması atası ilə olduğundan xeyli uzun çəkdi və daha mehribançılıqla başa gəldi; ona görə yox ki, cənab d'Artanyan öz bircə oğlunu sevmirdi, ona görə ki, cənab d'Artanyan kişi idi və kişi üçün hissiyyata qapılmağı nalayiq bir hal hesab edirdi. Xanım d'Artanyan isə qadın, həm də ana idi. O, bir xeyli ağladı, cavan d'Artanyanın

[1] XIII Lüdovik – Fransa kralı (1610-1643). XIII Lüdovik tamamilə özünün birinci naziri – kardinal Rişelyenin nüfuzu altında olmuşdur (1585-1642). Rişelye mütləqiyyət tərəfdarı olaraq dvoryanların feodal azadlığını pozmaq və protestantların (quqenotların) azadlıqlarını darmadağın etmək siyasətini təkidlə yürüdürdü.

[2] Legion – qoşun, qoşun dəstəsi.



xeyrinə olaraq qeyd edək ki, gələcək bir muşketyora yaraşan kimi özünü nə qədər mərd göstərməyə çalışdısa da, yenə göz yaşlarını gizlədə bilmədi.

Həmin gün cavan oğlan atasının verdiyi üç hədiyyə ilə, yuxarıda göstərildiyi kimi, on beş ekü pul, bir at və cənab de Trevilə yazılmış bir məktubdan ibarət hədiyyələr ilə yola düşdü. Aydındır ki, atasının ona etdiyi məsləhətlər hesaba daxil deyildir.

Beləliklə, cavan d'Artanyan həm mənəvi cəhətdən, həm də bədən cəhətdən Servantesin qəhrəmanının dürüst bir surəti idi. Buna görə də bir tarixçi kimi vəzifəmiz bizi onun surətini təsvirə məcbur etdiyi zaman, onu xoşbəxt bir surətdə həmin qəhrəmanla müqayisə etdik. Don Kixot yel dəyirmanlarını nəhəng pəhləvanlar və qoyun sürülərini qoşun hesab edirdi. D'Artanyan isə, hər bir gülümsünməni təhqir və hər bir baxışı vuruşa dəvət sayırdı. Buna görə də o, Tarbdan Menqə qədər yumruqlarını düyünləmiş bir halda yol getdi və hər gün əlini azı on dəfə qılıncının qəbzəsinə atdı. Ancaq nə yumruğu bir çənəni əzdi, nə də qılıncı bir dəfə qınından sıyırıldı. Doğrudur, yazıq kürən yabının görkəmi yoldan ötənlərin üzündə təbəssüm doğururdu, ancaq atın üstündə ağır bir qılınc asılmış və qılıncın üstündə bir cüt qəzəbli göz parıldayırdı. Buna görə də yoldan ötənlər öz təbəssümlərini gizlədir və ya qədim maskalar kimi üzlərinin yalnız bir tərəfi ilə gülümsəyirdilər.

Cavan qaskoniyalı məlun Menq şəhərinə qədər bu sayaq yol getdi. Ancaq orada "Azad Dəyirmançı" meyxanasının qabağında nə meyxana sahibinin, nə qulluqçunun, nə də mehtərin köməyi olmadan, atdan düşdükdə, d'Artanyanın gözünə aşağı mərtəbənin açıq pəncərəsi önündə uca boylu və zahirən təmkinli görünən bir əsilzadə dəydi. Həmin bu əsilzadə onu çox hörmətlə dinləyən iki adamla söhbət edirdi. D'Artanyan öz adətincə elə güman etdi ki, bu adamlar onun barəsində danışırlar, onların söhbətlərini dinləməyə başladı. Bu dəfə o, yalnız yarıya qədər yanılmışdı; çünki söhbət onun özündən deyil, atından idi. Əsilzadə, deyəsən, atın üstünlüklərindən danışırdı. Onu dinləyənlər isə, yuxarıda qeyd etdiyimiz kimi, danışan adama hörmət etdiklərindən, onun şuxluqla söylədiyi hər bir sözə uğuna-uğuna gülürdülər. Bizə məlumdur ki, hətta yüngül bir gülümsünmə də bizim qəhrəmanı qəzəbləndirməyə kifayət edərdi. Buna görə də bu adamların hay-küylə gülüşüb əylənmələrinin ona necə təsir etdiyini

başa düşmək çətin deyildir. D'Artanyan hər şeydən əvvəl ona istehza edən bu qaba adamın sir-sifətini görmək istədi. O, məğrur nəzərlərini naməlum adamın üzünə dikib gördü ki, onun qırx-qırx beş yaşı olar. Gözləri qara və itidir, üzü solğundur, xeyli iri burnu və səliqə ilə vurulmuş qara bığları var. Naməlum adamın əynində bənövşəyi rəngdə kamzol, şalvar və şalvarının da həmin rəngdə bağları var idi. Kamzolunun yarıqlarından köynəyi görünür, başqa heç bir bəzəyi yox idi. Onun kamzol və şalvarı təzə olsa da, uzun müddət yol heybəsində qalmış paltar kimi əzik-üzük idi. D'Artanyan bütün bu təfərrüatı ən kəskin nəzərli bir müşahidəçi kimi tez gördü. Bəlkə də naməlum adamın onun müqəddəratına böyük təsiri olacağını hiss etmişdi.

Lakin d'Artanyan bənövşəyi kamzollu əsilzadəni gözdən keçirdiyi bu dəqiqələrdə həmin əsilzadə Bearn yabısı haqqında son dərəcə aqilanə və həkimanə düşüncələrindən birini söylədi. Onun hər iki həmsöhbəti qəhqəhə ilə ucadan gülüşdü. Bu dəfə artıq şübhə etmək olmazdı: d'Artanyanı, doğrudan da, təhqir etmişdilər. O, beretini gözünün üstünə çəkib, səyahətə çıxmış senyorların saray adətlərini təhqir təqlid etməyə çalışaraq – d'Artanyan belə şeyləri Qaskoniyada ikən çox görmüşdü – bir əlini belinə vurub, o biri əlini qılıncının qəbzəsinə uzadıb irəli yeridi. Bədbəxtlikdən, hər addım atdıqca, qəzəb onun gözlərini daha artıq tutduğundan ləyaqətli, yüksək ədalı söz söyləmək əvəzinə ağzından qaba bir qışqırıq qopdu və bunu eyni dərəcədə nalayiq bir hərəkət təqib etdi.

D'Artanyan çığırdı:

– Ey, cənab! Ey, pəncərə dalında gizlənən adam, sizinləyəm... Hə, hə, sizinlə!.. Bir mənə deyin görüm nəyə gülürsünüz, gəlin bir yerdə gülək!

Əsilzadə nəzərlərini ağır-ağır atdan ayırıb, sahibinə çevirdi. Deyəsən bu qəribə sözlərin özünə aid olduğunu başa düşə bilmək üçün ona bir müddət vaxt lazım idi. Sonra onun qaşları azacıq çatıldı, uzun sükutdan sonra təsvir edilməz bir istehza və cürətli səslə d'Artanyana cavab verdi:

– Mən sizinlə danışmıram, cənab!

– Ancaq mən sizinlə danışıram! Mən! – cavan oğlan cürət və gözəl əda, nəzakət və həqarət qarışıq bir qəzəblə çığırdı.

Naməlum adam yenə də əvvəlki kimi azacıq gülümsəyərək bir də d'Artanyana baxdı və pəncərədən çəkilib ağır-ağır meyxanadan bayıra çıxdı.



O, d'Artanyana yaxınlaşıb, atından iki addım aralı durdu. Naməlum adamın sakit və istehzalı görkəmi pəncərənin qabağında durmuş həmsöhbətlərini daha da şənləndirdi.

D'Artanyan naməlum adamın yaxınlaşdığını görüb, qılıncını qınından bir fut çəkdi.

Naməlum adam atı gözdən keçirməyə davam edərək, qəzəblənmiş d'Artanyanı heç görmürmüş kimi, etina etmədən öz həmsöhbətlərinə müraciətlə dedi:

– Bu at, şübhəsiz ki, sarı-qızılı rəngdədir. Yaxud, daha doğrusu, cavanlıqda bu rəngdə imiş. Nəbatat aləmində çox yayılmış olan bu rəng, bu vaxta qədər atlarda çox az görünmüşdür.

– Bəzi adamlar ata istehza edər, amma sahibinə istehza etməyə cürətləri çatmaz, – deyə de Trevilin cavan təqlidçisi qəzəblə qışqırdı.

Naməlum adam cavab verdi:

– Cənab, mən çox tez-tez gülən adamlardan deyiləm. Yəqin ki, siz bunu mənim üzümdən də görürsünüz. Ancaq arzu etdiyim zaman gülmək ixtiyarını özümdə saxlamaq istəyirəm.

D'Artanyan çığırdı:

– Ancaq mən arzu etmədiyim zaman kimsənin gülməsini istəmirəm.

– Doğrudanmı, cənab? – naməlum adam əvvəlkindən daha sakit bir əda ilə davam etdi. – Nə olar ki! Bu, tamamilə ədalətli bir arzudur, – deyib dabanları üzərində dönüb meyxanaya tərəf yönəldi. D'Artanyan meyxananın darvazası ağzında yəhərli bir atın durduğunu əvvəldən görmüşdü. Ancaq o, özünə istehza edən bir adamı cəzasız buraxmağa adət etməmişdi. Qəti bir hərəkətlə qılıncını siyirib onu təhqir edən adamın ardınca yüyürərək çığırdı:

– Geri dönün, geri dönün, cənab masqaraçı! Yoxsa sizin kürəyinizi dələrəm!

– Mənimmi kürəyimi dələrsiniz? Mənimmi? – Naməlum adam həqarətlə cavan oğlana baxdı. – Bura baxın, əzizim, siz dəli olubsunuz? – o, yavaşcadan, öz-özü ilə danışırmış kimi əlavə etdi: – Heyf! Öz muşketyorlar bölüyü üçün qoçaq oğlanlar axtaran əlahəzrət üçün bu, lap göydəndüşmə olardı.

O, sözlərini deyib qurtarmamış, d'Artanyan ona elə şiddətli bir zərbə endirdi ki, naməlum adam birdən-birə kənara sıçramasaydı, bu zarafat onun son zarafatı olacaqdı. Əsilzadə bunu gördükdə, işin

ciddiləşdiyini başa düşüb, qılıncını çəkdı, düşməninə baş əyib müdafiə vəziyyəti aldı. Ancaq həmin dəqiqədə onun ıki həmsöhbəti meyxana sahibi ilə birlikdə, əllərində dəyənək, bel və soba maşası d'Artanyanın üstünə atıldılar. Vəziyyət bir saniyənin içində tamamilə dəyişdi. D'Artanyan üzərinə enən zərbələri sinəsilə qarşılamaq üçün geri çevrilməli oldu. Onun düşmənı qılıncını qınına qoyub sakıt-sakit vuruşmanı seyr etməyə başladı. O, seyredici rolunda da öz adi laqeydliyini mühafizə etməkdə idı. Bununla bərabər, o deyinməyə başladı:

– Allah bu qaskoniyalılara lənət eləsin! Bu yekəbaşı öz narıncı atına mindirib yola salın getsin.

Səni öldürməmiş gedən deyiləm, qorxaq! D'Artanyan var qüvvəsilə özünü müdafiə edə-edə çığırdı. O, zərbələr endırməkdə olan üç düşməninin qarşısında bircə addım da geri çəkilmirdi.

Yenə də bu Qaskoniya lovğalığıdır! əsilzadə mırıldandı. – Namusuma and içirəm ki, bu qaskoniyalılar düzələn deyil! Di tez olun, indi ki, ürəyi istəyir, onu bir doyunca kötəkləyin. Yorulanda özü deyər ki, daha bəsdir.

Ancaq bu naməlum adam bilmirdi ki, necə inadkar bir adama rast gəlmişdir. D'Artanyan aman istəyən adamlardan deyildi. Vuruşma bir neçə saniyə də davam etdi. Nəhayət, d'Artanyan taqətdən duşdü və bir ağac zərbəsilə iki parça olmuş qılıncını əlindən saldı. Həmin bu anda başqa bir zərbə alnını yardı, o qana bulaşmış halda yerə yıxıldı.

Bu zaman hər tərəfdən hadisə yerinə camaat axışmağa başladı. Meyxana sahibi başına bir iş gələcəyindən qorxub, yaralını öz qulluqçularının köməyilə mətbəxə apardı, orada onun yaralarını sarıdılar. Əsilzadə isə, öz pəncərə qabağındakı yerinə qayıdıb səbirsiz halda camaatı seyr etməyə başladı. Görünür camaatın yığışması onun xoşuna gəlmirdi.

Hə, nə var, o qudurğanın halı necədir? – o, öz qonağının halını xəbər almağa gələn mehmanxana sahibindən soruşdu.

Meyxana sahibi onun halını soruşdu:

– Cənabınız sağ və salamatdırmı?

– Hə, tamamilə sağ və salamatam, əzizim, bəs bizim o cavan oğlanın halı necədir?

– Halı yaxşıdır, bihuş yatır.

Əsilzadə soruşdu:



– Doğrudanmı?

- Ancaq o, huşunu itirməmişdən əvvəl bütün qüvvətini toplayıb sizi duelə çağırdı.

Elə isə, o lap şeytanın özüdür! – naməlum adam çığırdı.

Yox, yox, hörmətli cənab, o, şeytan deyil, – meyxana sahibi istehzalı bir əda ilə cavab verdi. O, huşsuz yatdığı zaman biz şeylərini axtardıq. Düyünçəsində bircə köynəkdən başqa bir şey yoxdur. Pul kisəsində isə, ancaq on ikicə ekü var. Bununla bərabər, o, huşunu itirməmişdən əvvəl dedi: "Əgər bu hadisə Parisdə baş vermiş olsaydı, siz həmin saat peşman olardınız. Burada isə... peşman olacaqsınız, amma geci-tezi var".

Onda yəqin ki, bu, paltarını dəyişmiş bir prinssessadır, – naməlum adam soyuqqanlıqla cavab verdi.

- Cənab, mən sizə bunu ona görə deyirəm ki, ehtiyatlı olasınız.

– Yaxşı, o, qəzəbləndiyi zaman heç bir kəsin adını çəkmədimi?

– Bəs necə! O, əlini cibinə döyə-döyə deyirdi ki: "Hələ bir görək cənab de Trevil öz himayə etdiyi adamın təhqir olunmasına necə baxacaq?"

– Cənab de Trevilmi? naməlum adam birdən-birə tamamilə diqqətli oldu. – O, əlini cibinə döyüb cənab de Trevilini adınımı çəkirdi? Bura baxın, a kişi, oğlan huşsuz yatdığı zaman, yəqin, siz onun cibinə də baxıbsınız. Orada nə vardı?

– Muşketyorlar kapitanı cənab de Trevilə bir məktub.

– Doğrudanmı?

Bunu hüzuruna ərz etməklə fəxr eləyirəm, cənab.

O qədər də diqqətli olmayan meyxana sahibi bu sözlərin naməlum adama necə təsir etdiyini sezmədi. Əsilzadə pəncərədən çəkilib, nədənsə tutulmuş kimi, qaşlarını düyünlədı.

"Vay məlun! – o, dişlərini bir-birinə sıxaraq deyindi: – Görəsən de Trevil doğrudanmı bu qaskoniyalını mənim dalımca göndərib? Bu ki, lap gəncdir! Ancaq qılınc zərbəsi, istər uşaq, istərsə böyük tərəfindən vurulsun, yenə zərbə olaraq qalır. Həm də ki, uşaqdan şübhələnmək çətindir. Bəzən kiçik bir əngəl böyük bir işə mane ola bilər".

Bu sözlərdən sonra naməlum adam dərin düşüncələrə daldı. Sonra o, meyxana sahibini səslədi:

– Bura baxın, a kişi, siz mənim yaxamı bu sarsağın əlindən qurtara bilməzsinizmi? Düzü, vicdanım onu öldürməyə razı deyildir. Ancaq

eyni zamanda, o, soyuq bir təhdid ədasilə əlavə etdi, – bu qaskoniyalı mənə mane olur. O haradadır?

– İkinci mərtəbədə, arvadımın otağındadır. Yaralarını sarıyırlar.

– Şeyləri də oradadırmı? Kamzolunu çıxarmayıb ki?

– Xeyr, kamzolu aşağı mətbəxdədir. Əgər bu dəli sizə mane olursa...

– Əlbət ki! O sizin meyxanada elə bir hay-küy qaldırıb ki, buna namuslu adamlar dözə bilməz. Gedin mənim hesabımı hazırlayın və xidmətçimi xəbərdar edin.

– Necə, məgər hörmətli cənab bizi tərk etmək niyyətindədirmi?

Axı gərək ki, mən sizə atımı yəhərləməyi əmr etmişdim? Məgər əmrimi yerinə yetirməmisiniz?

– Heç ola bilərmi, hörmətli cənab! Atınız darvaza ağzındadır.

– Yaxşı, mən dediyim kimi edərsiniz.

Meyxana sahibi öz-özünə düşündü: "Aha! Deyəsən, bu hərif o uşaqdan qorxur!"

Naməlum adamın qorxulu baxışları onu xəyalından ayırdı. O, iki-qat əyilib təzim etdi və bayıra çıxdı.

"Miledı bu sarsağı görməməlidir, – deyə naməlum adam mırıl-dandı. – O, ləngiyə bilməz, onsuz da gecikmişdir. Ən yaxşısı budur ki, atıma minim, onu qarşılamağa gedim... Ancaq bir biləydim ki, de Trevilə yazılan o məktubda nə danışılır!"

Meyxana sahibi bu naməlum adamın meyxanadan çıxıb getməsinə həmin cavanın bais olduğunu yəqin edərək, öz arvadının yanına qayıtdı. D'Artanyan artıq özünə gəlmişdi. Meyxana sahibi yaralıya polisin onu narahat edə biləcəyinə və məşhur bir əyanla dalaşdığı üçün sorğu-suala çəkəcəyinə işarə etdi; çünki meyxana sahibinin fikrincə bu naməlum adam məşhur bir əyan olmaya bilməzdi. Bu sözlərlə meyxana sahibi cavan qaskoniyalını ayağa durub, yoluna davam etməyə qane etdi. D'Artanyan kamsolsuz, başı sarıqlı, çətinliklə yerindən qalxıb, meyxana sahibinin köməyilə pillələrdən enməyə başladı. O, mətbəxə girib pəncərəyə yaxınlaşanda, həmin saat öz düşmənini görüb tanıdı. Naməlum adam bir cüt kök Normandıya atı qoşulmuş ağır bir karetanın qapısı ağzında durub bir xanımla sakit-sakit söhbət edirdi.

Onun söhbət etdiyi qadına iyirmi yaş vermək olardı. Biz əvvəlcə söyləmişdik ki, hər bir insan siması d'Artanyanın hafizəsində çox



sürətlə özünə yer edirdi. O, ilk baxışda bu qadının çox cavan və gözəl olduğunu gördü. Onun gözəlliyi cavan oğlanı heyrətə saldı; çünki bu gözəllik d'Artanyanın bu vaxta qədər yaşadığı cənub ölkələrinə tamamilə yad bir gözəllik idi. Naməlum qadının üzü solğun, yanaqları ağ, çiyinlərinə düşmüş uzun qıvrım hörükləri, iri, tünd-mavı gözləri, çəhrayı dodaqları və qar kimi ağappaq əlləri var idi. Qadın naməlum adamla həyəcanlı söhbət edirdi. O deyirdi:

– Deməli, kardinal həzrətləri mənə əmr edir ki...

– Həmin saat İngiltərəyə qayıtmalı və hersoq Londonu tərk edərsə, təxirsiz onu xəbərdar etməlisiniz.

– Bəs başqa təlimat yoxmu? – deyə gözəl yolçu qadın soruşdu.

– Tapşırıqlar bu zərfdədir. Siz bunu Lamanşın o tayında açmalı-sınız.

Yaxşı, bəs siz nə edəcəksiniz?

Mən Parisə qayıdıram.

Xanım soruşdu:

Bəs o azğın oğlanın cəzasını verməyəcəksinizmi?

Naməlum adam ona cavab vermək üçün ağzını açmamış, bütün bu danışığı eşitmiş olan d'Artanyan qapı ağzında göründü:

– Bu azğın oğlan özü başqalarına cəza verir! deyə o bağırdı. Ümid edirəm ki, mənim cəza verməli olduğum adam, keçən dəfə olduğu kimi indi daha mənim əlimdən qaça bilməz.

– Necə, qaça bilməzmi? – naməlum adam qaşlarını çataraq dil-ləndi.

– Yox, güman edirəm ki, qadının hüzurunda siz qaçmağa cürət etməzsiniz.

Miledi əsilzadənin əlini qılıncının qəbzəsinə apardığını görüb çığırdı:

– Bir düşünün, bir düşünün, kiçik bir ləngimə hər şeyi məhv edə bilər!

– Siz haqlısınız! əsilzadə bağırdı. – Siz öz yolunuzla gedin, mən də öz yolumla.

O, xanıma təzim edib atını mindi; həmin saat karetanın sürücüsü də atları qamçıladı. Kareta hərəkət etdi.

– Hey! Sizin hesabınız? meyxana sahibi qonağının pul vermədən getdiyini görüb çığırdı və ona bəslədiyi hörmət həmin saat dərin bir nifrətə çevrildi.

– Pulunu ver, ay axmaq! – naməlum yolçu atını çapa çapa öz xidmətçisinə bağırdı. Xidmətçi meyxana sahibinin ayaqları altına iki üç gümüş pul tullayıb ağasının dalınca atını çapdı.

– Qorxaq, əclaf, riyakar! – d'Artanyan da xidmətçinin dalınca yüyürə-yüyürə çığırdı.

Ancaq yaralı olduğundan, bu cür sarsıntılar üçün hələ çox zəif idı. O, hələ onca addım yüyürməmiş qulaqları cıngıldədi, başı hərləndi, gözlərində qanlı buludlar oynaşdı və küçənin ortasında yerə yıxılıb:

– Qorxaq, qorxaq, qorxaq! – deyə bağırmağına davam etdı.

– O, doğrudan da, yaman qorxaqmış, – meyxana sahibi d'Artanyana yaxınlaşaraq, yaltaqlıqla könlünü ələ almağa və onunla barışmağa çalışdı.

– Bəli, yaman qorxaqmış, d'Artanyan pıçıldadı. – Amma xanım gözəl xanım idi.

– O xanım kimdi? – meyxana sahibi soruşdu

– Miledı, – d'Artanyan pıçıldadı və yenə huşunu itirdi.

Meyxana sahibi öz-özünə dedi. "Bax belə. İkisi əlimdən çıxdısa, üçüncusü mənə qaldı. Hər halda bir neçə gün burada qalacaq. Necə olsa, on iki ekü də puldur".

Məlum olduğu kimi, on iki ekü həmin o pul idi ki, d'Artanyanın pul kisəsində qalmışdı.

Meyxana sahibi güman edirdi ki, cavan oğlanın xəstəliyi on iki gün davam edəcək və gündə bir ekudən on iki ekü qazanacaqdır. Ancaq qonaq meyxana sahibinin bu haqq-hesabını pozdu. Ertəsi gün səhər saat beşdə d'Artanyan qalxıb özü mətbəxə endi, bəzi ədviyyatdan başqa (bunların nədən ibarət olduğu barədə məlumat bizə gəlib çatmamışdır) özünə şərab, yağ və rozmarin tələb edib anasının verdiyi nüsxəyə baxaraq, məlhəm hazırladı, bu məlhəmi yaralarına sürtdü. Yaraların sarıqlarını özü açıb sarıyır, heç bir tibbi yardım istəmirdi. Bu qaraçı məlhəminin sayəsində, bəlkə də həkimlərin olmaması sayəsində d'Artanyan həmin gün axşam artıq ayaq üstündə idi və ertəsi gün, demək olar ki, tamamilə sağalmışdı.

Ancaq o rozmarin, yağ, şərab d'Artanyanın özü üçün sərf etdiyi yeganə şeylər idi; çünki ciddi pəhriz saxlayırdı, halbuki atı, sahibinin söylədiyinə görə, üç qat artıq yem yemişdi, d'Artanyan rozmarin, yağ və şərabın pulunu vermək istədikdə, gördü ki, cibində yalnız on iki ekü pul olan köhnə məxmər pul kisəsi qalmışdır; de Trevilə yazılan məktub isə yoxa çıxmışdı.



Cavan oğlan səbirlə məktubu axtarmağa başladı. Ciblərini iyirmi dəfə tərsinə çevirdi, heybəsini ələk-vələk elədi, pul kisəsini hey açıb-bağladı. Ancaq məktubu tapmayacağını yəqin edib, üçüncü dəfə yaman qəzəbləndi və az qaldı ki, bu qəzəb onun üçün yenidən şərab və yağ məxarici törədə. Meyxana sahibi bu dəlisov cavanın məktubu tapılmasa, bütün meyxananı alt-üst edib, hər şeyı yıxıb sındıracağını gördükdə, özü bir yaba, arvadı bir süpürgə, qulluqçuları isə, üç gün bundan əvvəl işə salınmış olan həmin dəyənəkləri qapdılar.

D'Artanyan çığırırdı:

– Hanı mənim məktubum? Ay məlunlar, mənim məktubumu verin, yoxsa, kəkliyi şişə çəkən kimi hamınızı qılınca keçirəcəyəm!

Çox təəssüf ki, bir vəziyyət onun bu təhdidi yerinə yetirməsinə mane oldu: əvvəl söylədiyimiz kimi, cavan qaskoniyalının qılıncı hələ birinci döyüşdə sınıb iki bölünmüşdü. O, bunu tamamilə yadından çıxarmışdı. D'Artanyan qılıncını qınından siyirmək istəyəndə, əlində yalnız səkkiz və ya on düym uzunluğunda olan tiyə parçası zahir oldu. Meyxana sahibi həmin bu parçanı səliqə ilə qınına soxmuşdu. Tiyənin ikinci parçasını isə, şiş qayırmaq üçün özündə saxlamışdı.

Qılıncının olmaması bu igid cavanın qabağını kəsə bilməzdi. Ancaq meyxana sahibi özü başa düşdü ki, qonağının tələbi haqlıdır.

Ə, əlindəki yabanı aşağı endirib cavan oğlana dedi:

– Doğrudan da, bəs məktub necə oldu?

– Bəli, məktubum hanı? – d'Artanyan çığırdı. – Sizi xəbərdar edırəm ki, məktub cənab de Trevilə yazılmışdı və necə olsa tapılmalıdır. Yoxsa muşketyorlar kapitanı özü onu axtarıb tapar!

Bu təhdid meyxana sahibini lap qorxuya saldı. Kraldan və kardinaldan sonra hərbi adamlar, hətta şəhərlilər ən çox cənab de Trevilin adını çəkirdilər. Bir də əlbət ki, Jozef ata var idi. Ancaq onun adını pıçıltı ilə çəkirdilər; çünki Rişelyenin dostu olan və "boz kardinal" adlanan bu adamdan yaman qorxurdular.

Beləliklə, meyxana sahibi özü əlindəki yabanı yerə qoyub, arvadına süpürgəni və qulluqçulara dəyənəkləri yerə qoymalarını tapşırıb, özü itmiş məktubu axtarmağa başladı.

Hər tərəfi diqqətlə axtardıqdan sonra heç bır şey tapmayıb soruşdu:

– Necə məgər, bu məktubda mühüm bir şeymi vardı?

Bu məktubla sarayda özünə rütbə və mənsəb qazanmaq ümidində olan cavan qaskoniyalı çığırdı:

– Bəs necə! Mənim bütün var-yoxum o məktubda idı.

– Orada İspanıya bankının kağızlarımı var idi? meyxana sahibi həyəcanla soruşdu.

– Əlahəzrət kralın xüsusi xəzinəsinin kağızları var idi! – d'Artanyan cavab verdi. O, ümid edirdi ki, bu tövsiyə kağızı sayəsində kral xidmətinə girəcək və buna görə də bu cür cürətli cavab verməklə əsla yalan söyləmir.

– Lənət şeytana! meyxana sahibi tamamilə məyus bir halda çığırdı.

Bunun əhəmiyyəti yoxdur, d'Artanyan xalis qaskoniyalı ədasilə davam etdi. – Bunun əhəmiyyəti yoxdur. Pul boş şeydir. Bütün iş məktubdadır. Mən bu məktubu itirməkdənsə, min pistol[1] itirməyə razı olardım.

O, bu qayda ilə "iyirmi min pistol" da deyə bilərdi. Ancaq gənclik vicdanı ona mane oldu.

Acığından özünə lənətlər yağdıran meyxana sahibinin başına birdən bir fikir gəldi.

Məktub itməmişdir! – deyə bağırdı.

– Necə? d'Artanyan soruşdu.

– Yox, onu sizdən oğurlayıblar.

Oğurlayıblar! Kim?

Dünənki əsilzadə. O, bayaq tək mətbəxə enmişdi, sizin kamzolunuz da oradaydı. And içirəm ki, məktubu o oğurlamışdır.

– Siz beləmi güman edirsiniz? d'Artanyan şübhəli-şübhəli soruşdu. O, hamıdan yaxşı bilirdi ki, bu məktub yalnız onun özü üçün faydalı ola bilər və başa düşürdü ki, bu məktub başqaları üçün əsla əhəmiyyətli deyildir. Doğrudan da, nə qulluqçular, nə burada yaşayan qonaqlar bu məktubdan özləri üçün heç bir fayda götürə bilməzdilər.

– Siz deyirsiniz ki... d'Artanyan davam etdi, – həmin o həyasız əsilzadədən şübhəlisiniz?

Mən əminəm ki, bu, onun işidir! – meyxana sahibi uca səslə cavab verdi. - Mən ona deyəndə ki, cənabınız de Trevil cənablarının himayəsi altındasınız və bu məşhur əyana məktub aparırsınız, bu sözlərim görünür ki, onu çox narahat etdi. O, məktubun harada olduğunu soruşdu və sizin kamzolunuzun mətbəxdə olduğunu bilib, o saat ora getdi.

[1] Pistol on livr qiymətində qədim qızıl pul.



Aha, deməli oğru o imiş! – d'Artanyan çığırdı. – Mən cənab de Trevilə şikayət edərəm; cənab de Trevil isə krala...

Sonra o, qürurla cibindən iki ekü çıxarıb meyxana sahibinə uzatdı. O da şapkasını əlinə alıb cavanı darvazaya qədər ötürdü. D'Artanyan öz kürən yabısına mindi və at onu macərasız Parisin Sent-Antuan darvazasına qədər apardı. Burada cavan oğlan atı üç eküyə, yəni, yaxşı qiymətə satdı, çünki yolun axırıncı hissəsində d'Artanyan yazıq atı lap yorub əldən salmışdı. Atı doqquz livrə alan at dəllalı onu inandırırdı ki, bu baha qiyməti yalnız atın qeyri-adi rəngdə olduğuna görə verir.

Beləliklə, d'Artanyan Parisə, qoltuğunda bir düyünçə, piyada daxil oldu. O, şəhəri gəzib öz cüzi vesaitinə müvafiq bir otaq tapdı. Bu otaq Lüksemburq yaxınlığında Məzarçılar küçəsində bir çardaqda idi.

D'Artanyan beh verib öz mənzilində yerləşdi və günün qalan hissəsini kamzoluna və şalvarına zərli bafta tikməyə sərf etdı.

Bu baftaları anası onun atasının, demək olar ki, tamamilə təzə olan kamzolundan söküb gizlincə oğluna vermişdi. Bunları tikib qurtarandan sonra qılıncına yeni bir tiyə qayıtdırmaq üçün dəmirçi bazarına getdi. Buradan Luvra[1] sarı yönəldı. İlk rast gələn muşketyordan cənab de Trevilin evinin harada olduğunu soruşdu. Onun evi "Köhnə Göyərçin hını" küçəsində, yəni d'Artanyanın mənzilının yaxınlığında idi... Bu da cavan qaskoniyalıya səyahətinin müvəffəqiyyətli olacağına yaxşı bir əlamət kimi göründü.

Sonra cavan oğlan öz Menqdəki rəftarından tamamilə razı qalıb, baş verən hadisələr üçün vicdan əzabı duymadan, indiki vəziyyətindən razı və gələcəyə ümidlər bəslədiyi bir halda yatağına girdi və möhkəm yatdı.

Cavanın bu yuxusu, əyalətdə yaşayanların adəti üzrə səhər saat doqquza qədər çəkdı. Bu zaman nəhayət d'Artanyan qalxıb atasının sözlərinə görə bütün ölkədə üçüncü şəxs olan məşhur cənab de Trevilin yanına getməyə hazırlaşdı.

[1] Luvr Parisdə kral sarayı

II

## CƏNAB DE TREVİLİN DƏHLİZİNDƏ

Qaskoniyada cənab de Truavil adlanan, Parisdə isə özünü de Trevil adlandıran muşketyorlar kapıtanı doğrudan da, öz karyerasına d'Artanyan kimi başlamışdı. Yəni onun da bir qəpik pulu yox idi, ancaq cürət, ağıl və zirəklik ehtiyatı çox idi. Bu keyfiyyətlər sayəsində ən yoxsul Qaskoniya əsilzadəsinə öz atasından sonra ən varlı Berri və ya Periqor əsilzadəsinin həqiqi nemətlərindən daha artıq bir ümid irsi qalır. De Trevilin cürətli igidliyi və daha artıq cürətli xoşbəxtliyi, qılınc zərbələrinin dolu kimi yağdığı o zamanlarda bu mərd əsilzadəni saray nailiyyəti adlanan pillənin ən yuxarısına qaldırmışdı. O, bu pillələrin üç-dördünü birdən adlayıb çıxmışdı.

O, kralın dostu idi. Məlum olduğu kimi, kral öz atası IV Henrixin xatirəsini çox əziz saxlardı. Cənab de Trevilin atası isə, cəmiyyətlə müharibələr zamanı IV Henrixə sədaqətlə qulluq etmişdir. Bearnlı kralın pulu çatmadığından, daha doğrusu, heç bir zaman pulu olmadığından o hamı ilə haqq-hesabını hazırcavablıqla kəsərdi ki, bu onun borc almadığı yeganə nemət idi. IV Henrix cənab de Trevilin atasına, Parisi təslim etdikdən sonra, göstərdiyi xidmətlərin müqabilində öz gerbinə tünd-qırmızı zəmində qızıl bir aslan şəkli çəkməyə və *Fidelis et fortis*[1] şüarını yazmağa icazə vermişdi. Əlbət ki, bu, çox böyük bir hörmət idi. Ancaq faydası az idi. Böyük Henrixin dostu bu məşhur adam öləndən sonra onun oğluna qalan yeganə irs – bir qılınc, bir də bu şüardan ibarət idi. Bu irs sayəsində cənab de Trevil prinssessanın evinə qəbul edilmişdi. Cavan əsilzadə elə məharətlə qılınc oynadardı və öz şüarına o qədər sadiq idi ki, krallığın ən yaxşı qılınc oynadanlarından biri olan XIII Lüdovik, adətən, belə deyərdi: "Mənim dostlarımdan hər kim vuruşmalı olsa, məsləhət görürəm ki, şahidliyə əvvəla məni, sonra de Trevili, yaxud, əksinə, əvvəl onu, sonra məni çağırsın".

XIII Lüdovik de Trevilə böyük məhəbbət bəslərdi. Doğrudur, bu məhəbbət padşah məhəbbəti, xudbin bir məhəbbət idi, ancaq hərböyük bir həvəslə Trevil kimi adamlar saxlardılar. Bu adamlardan

[1] Fidelist et forils (latınca) – sadiq və cürətli



bir çoxu onun şüarının ikinci hissəsi olan "qüvvətli" sifətini öz üstlərinə götürə bilərdilərsə də, "sədaqətli" ləqəbini çox nadir adamların götürməyə ixtiyarı var idi. Trevil də bu nadir adamlardan biri idi. Bu vaxta qədər Trevil üçün ancaq bir fürsət düşməmişdi, lakin bu fürsəti gözləyirdi və möhkəm qərara almışdı ki, bu fürsət əlinə keçən kimi, ondan istifadə edəcəkdir. XIII Lüdovik Trevili öz muşketyorlarına kapitan təyin etmişdi. III Henrix üçün xüsusi mühafizələr və ya XI Lüdovik üçün Şotlandiya qvardiyası nə idisə, XIII Lüdovik üçün də ona kor-koranə və mütəəssib bir surətdə sədaqətli olan muşketyorlar eyni şeydi.

Rişelye XIII Lüdovikin özünü belə zəhmli mühafizlərlə əhatə etdiyini gördükdə, Fransanın ikinci və ya, daha doğrusu, birinci kralı olan kardinal da özü üçün mühafizlər toplamağı qərara aldı. O da özü üçün muşketyor topladı. Hər iki hakim bu muşketyorları Fransanın bütün mahallarında və hətta xaricdə qılınc oynatmaqda məşhur olan adamlardan seçirdilər. Çox zaman axşam çağları şahmat oynarkən Rişelye və XIII Lüdovik öz muşketyorlarının üstünlükləri barəsində bəhsə girişərdilər. Hər biri öz muşketyorlarınının nizam-intizamını və mərdliyini təriflərdi. Zahirdə duel və savaşmanı pislədikləri halda, həqiqətdə hər ikisi öz mühafizlərini qızışdırar və onların zəfərlərindən sevinər, məğlubiyyətlərindən isə kədərlənərdilər. Kralın cənab de Trevilə olan davamlı və dəyişməz məhəbbətinin əsl səbəbi bu idi. Trevil öz ağasının bu boş damarını tapmışdı. Kral öləndən sonra sədaqətdə möhkəm bir adam kimi ad qoyub getməmişdi.

Trevil öz muşketyorlarını rəsmi-keçid halında kardinal Rişelyenin gözü önündə gəzdirərdi. Muşketyorların istehzalı görkəmləri o müqəddəs atanın bığlarını qəzəbdən biz-biz edərdi. Trevil o zamankı müharibələrin mahiyyətini çox yaxşı başa düşürdü. O zamanlar ya düşmən hesabına, ya öz vətəndaşları hesabına yaşardılar. Onun şeytan dəstəsindən ibarət olan əsgərləri təkcə özünə tabe idilər.

Kralın səliqəsiz, yarımsərxoş, cır-cındır geymiş muşketyorları, daha doğrusu, cənab de Trevilin muşketyorları meyxanaları, bazarları, qumarxanaları gəzib bağıra-bağıra nəğmə oxuyar, bığlarını bura-bura qılınclarını cingildədərdilər. Onlar hər dəfə rast gəldikdə böyük bir ləzzətlə kardinal qvardiyaçılarını vurub itələyər, sonra küçənin ortasında qılınclarını çəkib vuruşar və bir-birinə sataşardılar. Bəzi vaxt onları öldürərdilər. Lakin onlar ölərkən bilərdilər ki, heyfsilənən

və intiqamlarını alan olacaqdır. Çox zaman onlar özləri öldürərdilər və belə olduqda dustaqxanada yatmaqdan qorxmazdılar; çünki cənab de Trevil həmişə onları qurtarardı.

Bu adamlar cənab de Trevilə Allah kimi pərəstiş edərdilər. Özləri nadürüst və asılmağa layiq adamlar idilərsə də, de Trevilın qarşısında müəllimdən qorxan şagird kimi əsərdilər. Onlar kapitanın hər bir sözünə əməl edər və onun kiçik bir töhmətini üstlərindən götürmək üçün ölməyə razı olardılar.

Cənab de Trevil bu qüvvətli istinadgahdan əvvəl kral və onun yaxın adamları, sonra isə özü də öz dostları üçün istifadə edərdi Bununla bərabər, o zamandan qalmış hədsiz hesabsız qeydlərdən belə məlum olur ki, bu ləyaqətli əsilzadə öz adamlarının kömək göstərməsindən ötrü guya pul alması barədə heç düşmənləri tərəfindən də töhmətləndirilmir. Öz dövrünün ən böyük fitnəkarları kimi nadir bir fitnəkarlıq istedadına malik olduğu halda, ən namuslu bir adam olaraq tanınırdı. Bundan başqa, aldığı hədsiz yaralara və çəkdiyi yorucu zəhmətlərə baxmayaraq, ən coşqun bir qadın pərəstişkarı, ən şıq geyinən bir adam və zamanının ən mahir natiqlərindən biri sayılırdı. Onun qadınlar arasındakı müvəffəqiyyətlərindən, iyirmi il əvvəl Bassompyerin[1] müvəffəqiyyətlərindən bəhs edən kimi danışardılar. Bu surətdə muşketyorlar kapitanı heyranlıq, qorxu və məhəbbət oyandırmağa nail olmuşdu ki, bu da dünya nemətlərinin son həddi deməkdi.

XIV Lüdovik öz sarayında olan xırda mənsəbli adamları kölgədə qoyurdu. Amma onun *pluribus impar*[2] günəşi olan atası öz yaxın adamlarının hər birinin hörmət və izzətini gözləyir, hər birinin öz ləyaqətini qoruyurdu. Parisdə kral və kardinalın səhər qəbul mərasimlərindən başqa, o zaman iki yüzə qədər belə mərasim var idi ki, onlara getmək bir adət halını almışdı. Bu iki yüz qəbul mərasimi içərisində Trevilin bir mərasimi var idi ki, ona gələnlərin sayı hamıdan çox olardı.

Onun "Köhnə Göyərçin hini" küçəsində olan evinin həyəti yayda səhər saat altıdan, qışda isə saat səkkizdən başlayaraq bir düşərgə

[1] Bassompyer, Fransua (1579 1646) Fransa marşalı və diplomatı Rışelye əleyhinə saray intriqalarında iştirak etmiş ve bu intriqalar baş tutmadıqdan sonra qüdrətli kardinalın əmrile Bastiliyada 12 il həbsdə oturmuşdur

[2] Pluribus impar (latınca) "çoxlarına tay deyil deyil", yəni hər adamın tayı deyil



halını alardı. Əllı altmış nəfər silahlı muşketyor daima əmrə müntəzir, həyətdə gezişərdi. Evin enli pilləkənləri üzərində təvəqqeyə gələnlər, bir mərhəmət üçün gələn Paris əhli, mahallardan gəlmiş və mühafizlər sırasına daxil olmağı arzu edən əsilzadələr, öz ağalarından gətirdikləri məktubu cənab de Trevilə təhvil verən ala-bəzək baftalı nökərlər gəzişərdilər. Dəhlizdə seçilmiş adamlar, yəni bu gün qəbul mərasiminə dəvət edilmiş olanlar uzun skamyalar üzərində otarardılar. Orada səhərdən gecə yarısına qədər pıçıltı eşidilərdi. Dəhliz ilə yanaşı otaqda, öz kabinetində cənab de Trevil gələnləri qəbul edər, onların şikayətlərini dinlər, əmrlər verər və kral Luvr sarayının balkonundan baxan kimi o da istədiyi dəqiqədə pəncərədən öz mühafizlərinin və silahlı qüvvələrinin rəsm-keçidinə tamaşa edə bilərdi.

D'Artanyanın gəldiyi bu gün də camaat çox idi. Bu camaat, xüsusən əyalətdən Parisə birinci dəfə gəlmiş cavan oğlana daha çox görünməli idi. Doğrudur, əyalətdən gələn bu oğlan qaskoniyalı idi, o zamanlar isə d'Artanyanın yerliləri çox da utancaq adamlar sayılmazdı.

Üzərinə iri, dördkünc başlı mıxlar vurulmuş ağır darvazadan içəri girən adam həyətdə o baş-bu başa gedib gəlməkdə, bir-birilə ucadan danışmaqda, bəhs etməkdə və zər atma oyunu oynamaqda olan bir dəstə silahlı adam arasına düşmüş olurdu. Bu coşqun dalğalar arasından maneəsiz keçmək ancaq zabitlərə, məşhur əyanlara, bir də gözəl xanımlara müyəssər olardı.

Bizim cavan bu çaxnaşma və qat-qarışıqlıq içərisindən, ürəyi döyünə-döyünə, uzun qılıncını nazik ayaqlarına sıxmış və bir əli ilə şlyapasının kənarını tutmuş halda, utandığını gizlətməyə çalışan bir əyalətli təbəssümü ilə irəliyə hərəkət edirdi. O, hər bir dəstənin yanından keçdikcə daha asudə nəfəs alırdı. Ancaq hiss edirdi ki, camaat ona baxır və d'Artanyan bu günə qədər özü barəsində çox yüksək fikirdə olduğu halda, indi birinci dəfə özünü gülünc hiss etdi.

O, pilləyə yaxınlaşdığı zaman vəziyyət daha da xarablaşdı. Birinci pillələrdə dörd muşketyor durub belə bir oyun ilə məşğul idilər: onlardan biri, əlində siyirmə qılınc, yuxarı pillədə durub qalan üç nəfərə pillələri çıxmağa mane olur və ya hər halda mane olmağa çalışırdı. On-on iki nəfər başqa muşketyor aşağıda durub bu qəribə oyunda iştirak etmək üçün öz növbəsini gözləyirdi.

Üç muşketyor öz yuxarıda duran yoldaşlarına qarşı qılınclarını məharətlə işlədirdilər. D'Artanyan əvvəlcə elə güman etdi ki, bu

qılınclar təlim zamanı istıfadə edilən ucu küt qılınclardır. Amma bir neçə nəfər yüngülcə yaralandıqdan sonra o inandı ki, qılıncların tiyəsı kifayət qədər itidır. Muşketyorlardan hər biri yüngülcə yaralandıqda, yalnız tamaşaçılar deyil, oyunda iştırak edənlər özləri də qəhqəhə ilə gülürdülər.

Bu dəqiqə üst pillədə durmuş adam öz yoldaşlarının hücumunu böyük bir məharətlə dəf edir və onları özündən həmişə kifayət qədər aralı saxlayırdı. Hücum edənlər dəstəsinin ətrafında bir dairə əmələ gəlmışdı. Oyunun şərtlərinə görə, yaralananlar oyundan çıxıb öz görüş növbəsini yaralayana verirdilər. Beş dəqiqənin içində üç nəfər bıri əlindən, bırı çənəsındən, biri də qulağından yaralandı. Amma pilləni müdafiə edən yaralanmamışdı və bu surətlə, oyunun şərtlərinə görə, üç növbə qazanmışdı.

Bizim cavan yolçu öz heyrətini gizlətməyə çalışırdı. Ancaq bununla yanaşı belə bir əyləncəyə heyrətlənməkdən özünü saxlaya bilmirdi. Onun vətənində adamlar çox tez qızışardılar. Amma bununla bərabər, səbəbsiz vuruşmazdılar. Ancaq bu zarafatçıların Qaskoniya əyləncələrindən də üstün olan əyləncələrini o hətta Qaskoniyada da görməmişdi. İş bununla qurtarmırdı. Hələ irəlidə pillə üstündəki artırma və dəhliz var idi.

Artırmada artıq vuruşmur, qadınlardan söhbət edirdilər. Dəhlizdə isə saraydakı yeniliklərdən danışırdılar. Artırmada d'Artanyan qızardı, dəhlizdə isə titrəməyə başladı. Orada d'Artanyan bütün Avropanı qorxuya salan siyasətin açıq-aşkar tənqid edildiyini çox böyük bır heyrətlə eşitdi. Orada hətta kardinalın şəxsi həyatına da lağ edirdılər. Bu həyatın sirlərinə vaqif olmaq üstündə nə qədər məşhur və qüdrətlı əyanlar ağır cəzalara düçar olmuşdular. D'Artanyanın atasının bu qədər hörmət bəslədiyi o böyük adam cənab de Trevilin muşketyorları üçün əyləncə mövzusu olmuşdu. Onun əyri ayaqlarına və qozbelınə istehza edirdilər. Bir çoxları kardinalın sevimlisi olan xanım d'Egilyon barəsində və onun bacısı qızı xanım de Kombal haqqında nəğmələr oxuyur, bir qismi hersoq-kardinalın saray xidmətçıləri və mühafizəçilərinə sataşmağa hazırlaşırdı. Bütün bunlar d'Artanyana çox dəhşətlı və yolverilməz şeylər kimi görünürdü.

Ancaq bütün bu zarafatlar arasında kralın adı çəkildiyi zaman sanki birdən-birə dodaqlara qıfıl vurulurdu. Hamı susub elə bil cənab de Trevilin otağını bu otaqdan ayıran arakəsmənin etıbarsız olmasından



şübhələnərək, o yan-bu yana baxışırdı. Lakin bir az sonra söhbət yenə kardinal üzərınə gəldıyi zaman gülüşmə səsləri yenidən eşidilir və kardinalın hər bır hərəkəti yenə də ıstehza üçün bir hədəf olurdu.

D'Artanyan qorxu içərisındə öz özünə belə düşünürdü: "Yəqin bu cənabları tutub Bastılıyaya salacaq və asacaqlar. Məni də yəqin onlarla əlbir hesab edəcəklər; çünkı onların bütün danışıqlarını eşitmişəm. Kardinala böyük bır hörmət bəsləməyi tapşıran atam belə allahsızlar arasına düşdüyümü bilsəydı, görəsən nə deyərdi?"

Buna görə aşkardır ki, d'Artanyan bu söhbətlərə qoşulmağa cürət etmir, yalnız gözlərını dörd açıb, hər ıkı qulağı ılə diqqətlə qulaq asır, heç bır sözü ötürməmək üçün bütün beş duyğusunu gərirdi. O, atasının məsləhətlərinə inandığına baxmayaraq, başa düşürdü ki, öz zövq və meylləri onu burada söylənənləri pisləməkdənsə, tərifləməyə vadar edır Lakin o, cənab de Trevilin yaxın adamları arasında tamamilə yad bir adam idi və onu burada birıncı dəfə görürdülər. Ona yaxınlaşıb nə istədıyını soruşdular. D'Artanyan təvazökar bir surətdə öz adını söyləyib xahiş etdi ki, cənab de Trevıl ilə bir dəqiqəlik görüşməyə icazə alsın. Yavər hımayəedici bır əda ilə onun xahişini yerinə yetirməyə söz verdı.

D'Artanyan əvvəlkı utancaqlığından bir qədər əl çəkib, yavaş-yavaş oradakıların paltarına və üzlərinə tamaşa etməyə başladı.

Ən coşqun dəstənin ortasında məğrur simalı, ucaboylu bır muşketyor durmuşdu. O, qəribə paltarı ilə hamının diqqətini özünə cəlb etmişdı. Muşketyorun əynındə rəsmı plaş yox ıdi. O zamanlar insanın azadlığı az, müstəqilliyı çox olduğundan rəsmi geyim məcburi deyildi. Muşketyorun əynində hava rəngində, solmuş və köhnəlmiş bir kamzol var idi Kamzolun üstündən bəzəkli bir gərdənlik salınmışdı ki, üzərındəkı zərlı çəkilər günəş qabağında parlayan su halqacıqları kimi parıldayırdı. Al məxmərdən tikilmiş uzun plaşı onun çiyinlərindən sallanaraq bədənıni örtürdü. Yalnız ön tərəfdən gözəl gərdənlik görünürdü, bu gərdənlikdən iri bir qılınc asılmışdı.

Bu muşketyor növbədən yenicə çıxmışdı və soyuqdəymədən şikayətlənərək tez-tez yalandan öskürürdü. Onun sözlərinə görə elə bu səbəbdən də plaşa bürünmüşdü. Onun danışa-danışa istehzalı bir

Bastılıya mohkəm bır qala və sıyası cınayətkarların həbsxanası olmuşdur. Böyük Fransa burjua inqilabı zamanı usyan etmiş xalq tərəfindən 1789-cu il 14 iyulda dağıdıldı

surətdə bığlarını eşdiyi zaman o birilər onun çəkili gərdənlıyinə heyran qalmışdılar. D'Artanyan ona hamıdan artıq heyran olmuşdu.

Oradakılardan biri dedi:

Eh, Portos, nahaq yerə özünü yorub bizi inandırmağa çalışma ki, guya bu gərdənliyi atan alicənablıq edib sənə bağışlamışdır! O yoqın keçən bazar günü Sent-Onore darvazasında səni qarşılayan o əsrarəngiz, naməlum xanımın hədiyyəsidir.

Yox, namusum haqqı, öz puluma almışam! – Portos adlanan adam cavab verdi.

– Bəli, mənim sevgilim köhnə pul kisəmə qoyduğu pul ilə bu yeni pul kisəmi öz puluma necə almışamsa, sən də bunu eləcə öz puluna alıbsan, – deyə başqa bir muşketyor dilləndi.

Sizi inandırıram ki, – Portos etiraz etdi, – öz puluma almışam. Sübutu da budur ki, buna on iki pistol pul vermişəm

Bu sözlərdən sonra heyrət iki qat artdısa da, şübhə rəf olmadı.

Portos başqa bir muşketyora müraciət edib soruşdu:

– Elə deyilmi, Aramis?

Bu muşketyor Portosa əsla bənzəmirdi. O, iyirmi iki və ya iyirmi üç yaşlarında bir cavan idi. Üzü xoş və mülayım, gözləri zərif və qara, yanaqları payız şaftalısı kimi çəhrayı və dolu idi. Üst dodağının üzərindəki incə bığları sanki qələmlə çəkilmişdi. O elə bil damarlarının şişəcəyindən qorxub, əlini aşağı endirə bilmirdi. Arabir qulaqlarının sırğalığını çimdikləyirdi ki, pəmbə və şəffaf görünsün. O, az-az və ağır-ağır danışıb, tez-tez baş əyir, səssizcə gülür və bu zaman onun gözəl dişləri görünürdü. Sanki o bütün vücuduna olduğu kimi dişlərinə də xüsusi bir diqqət yetirirdi. Yoldaşının sualına başının işarəsilə təsdiqedici cavab verdi.

Sanki bu təsdiq işarəsi gərdənlik barəsindəki butun şübhələri ortadan qaldırdı. Hamı ona heyran qalmaqla bərabər, artıq o barədə danışmırdı. Söhbət başqa bir mövzuya keçdi.

– Siz Şalenin mehtərinin danışıqları barəsində nə fikirdəsiniz? üçüncü muşketyor heç bir kəsə ayrılıqda müraciət etməyib, ümumilikdə soruşdu.

O, nə danışırdı ki? Portos özündən məmnun bir əda ilə soruşdu.

O danışırdı ki, Brüsseldə bütün varlığı ilə kardinala sadiq olan Roşforu görmüşdür. Əyninə ruhani paltarı geymiş məlun Roşfor bu paltar sayəsində cənab de Leqi axmaq yerinə qoyub aldatmışdır.



Lap əsl axmaq yerinə, - deyə Portos dilləndi. Ancaq görəsən bütün bunlar doğrudurmu?

Aramis mənə belə dedi, – deyə muşketyor cavab verdi.

Doğrudanmı?

– Siz ki, bilirsiniz, Portos, Aramis dilləndi, mən bu barədə dünən sizə danışdım. Daha burada danışmalı bir şey yoxdur.

– Eləmi güman edirsiniz? – deyə Portos etiraz etdi Lənət şeytana! Siz nəticə çıxarmağa çox tələsirsiniz. Kardinal əsilzadənin yanına casuslar göndərir. Bir nəfər xainin köməyilə onun məktublarını oğurlayır. Casusun köməyilə və bu məktublar arasında guya Şale kralı öldürmək və kralın qardaşı ilə kraliçanı evləndirmək istəyirmiş kimi, mənasız bir bəhanə ilə Şalenin boynunu vurdurur. Bu əsrarəngiz macəra barəsində heç kəs bir şey bilmir. Dünən siz hamımızı böyük bir heyrət içində qoyub, əhvalatı danışır və özümüzə gəlməyə bizə vaxt verməyib bu gün deyirsiniz ki: "Daha bu barədə danışmalı bir şey yoxdur!".

– Yaxşı, indi ki, istəyirsiniz, gəlin danışaq, – Aramis razılaşdı.

– Əgər mən yazıq Şalenin mehtəri olsaydım, Portos çığırdı, Roşfor yaxasını əlimdən qurtara bilməzdi!

Onda siz də yaxanızı "Qızıl hersoqun" əlindən qurtara bilməzdiniz, – Aramis cavab verdi.

– Aha, "Qızıl hersoq!" Sağ ol, sağ ol, "Qızıl hersoq!" Portos əllərini bir-birinə vuraraq və razılıqla başını tərpədərək çığırdı. "Qızıl hersoq"... Çox gözəl sözdür! Mən bunu işə salaram. Əzizim, arxayın olun. Amma bu Aramis yaman ağıllı adamdır ha!.. Çox heyf ki, siz öz layiq olduğunuz yol ilə getməmisiniz, əziz dostum, sizdən çox gözəl bir abbat olardı!

Bu, müvəqqəti bir haldır, Aramis cavab verdi. Mən bir zaman abbat olacağam. Siz ki, bilirsiniz, Portos, mən ilahiyyatı öyrənməyə davam edirəm.

– O, dediyini edəcək, Portos dilləndi. Yoqin edəcək, gecitezi var.

Gec olmaz, tez olar, Aramis təsdiq etdi.

- O, yalnız bircə şeyi gözləyir ki, əyninə ruhani paltarı geysin. O paltar indi də şkafda muşketyor paltarlarının arxasında asılmışdır – muşketyorlardan biri əlavə etdi.

Bir başqası soruşdu:

Bəs o, nə gozləyir?

*Gözləyir ki, kraliça fransız taxtına bir varis bəxş etsin.*

Gəlın buna istehza etməyək, cənablar, Portos dilləndi, Allaha şükür, kraliça hələ cavandır.

– Deyirlər ki, Bekinhem[1] hersoqu Fransadadır, deyə Aramis belə sadə bir cümləyə xeyli eybəcər bır məna verən təbəssümlə sözə qarışdı.

Aramis, dostum, bu dəfə siz haqlı deyilsiniz, Portos onun sözünü kəsdi. – Hazırcavablığa olan meyliniz sizi çox uzaqlara aparıb çıxara bilər və əgər cənab de Trevıl sizın sözlərinizi eşitmiş olsaydı, danışdığınıza peşman olardınız.

Yoxsa mənim başıma ağıl qoymaq fikrindəsiniz, Portos? Aramis çığırdı və onun ürkək baxışlarında bir qığılcım parladı.

*Əzizim, ya muşketyor olun, ya da abbat: ya ondan, ya bundan;* ancaq ikisi birdən olmaz, deyə Portos davam etdı. – Yadınızdadırmı, Atos hələ bu yaxınlarda sizə demişdi ki, ağzınızı çox boş qoyursunuz? Xahiş edirəm acığınız tutmasın. Bundan bır şey çıxmaz. Atosun, sizin və mənim aramızda olan şərti bilirsiniz. Siz xanım d'Egilyonun yanına gedir və ona nəvazişlər edirsiniz. Siz xanım de Şevrözün əmisi qızı xanım de Bua-Trasinin yanına gedirsiniz və deyirlər ki, bu xanım sizə çox mehribanlıq göstərır. Siz allah, öz səadətinizi inkar etməyin. Heç kəs sizin sirlərinizi öyrənmək fikrində deyildir. Sızın təvazökarlığınız hamıya məlumdur. Ancaq indı ki, sızdə bu xeyirxahlıq var, onu kraliça həzrətlərinə qarşı da tətbiq edin. Qoy kral və kardinal haqqında kim nə deyır desın, ancaq kralıça həzrətlərinə toxunmaq olmaz. Onun barəsində yalnız yaxşı söz söyləmək olar.

Portos, siz Narsiss[2] kimi özünüzə çox güvənirsiniz. Mən sizi xəbərdar edirəm, Aramis cavab verdi. Siz yaxşı bilirsiniz ki, mənə nəsihət etməyə yalnız Atosa icazə verirəm. Mən istəsəm abbat da olaram, ancaq hələ ki, muşketyoram və bir muşketyor kimi istədiyimi də deyirəm. İndi isə demək istəyirəm ki, sizdən zəhləm gedır.

– Aramis!

Portos!

Bəsdir cənablar! deyə ətrafdakılar çığırışdılar.

[1] Bekinhem hersoqu Corc Vilyers (1592-1628) İngiltərə sıyasi xadimi, kral I Yakov və kral I Karlın sevdiyi şəxs

[2] Narsiss yunan dini əfsanələrində Sefiza çayının oğlu olaraq özünün suya düşmüş gözəl əksinə aşıq olmuşdur. Narsiss – özünü sevən adam mənasında ışlənır.



## III

## GÖRÜŞ

*Cənab de Trevilin bu dəqiqə ovqatı yaman təlx idi.* Ancaq buna baxmayaraq o, cavan oğlanı nəzakətlə qəbul etdi və cavan oğlan ikiqat əyilib ona təzim etdi. Cənab de Trevil d'Artanyanın salamını təbəssümlə dinlədi. Onun Bearn ləhcəsi birdən kapitanın həm vətənini, həm də cavanlığını yadına saldı. Lakin həmin saat o, dəhlizin qapısını açıb və guya onunla söhbətə başlamazdan əvvəl başqaları ilə ışini qurtarmaq üçün üzr istəyirmiş kimi, əli ilə işarə edib, üç dəfə ucadan çığırdı. Onun səsi amiranə və qorxunc idi:

Atos! Portos! Aramis!

Artıq tanış olduğumuz muşketyorlar həmin saat öz söhbətlərini buraxıb kabinetə keçdilər. Onlar hələ də həyəcanlı idilər. Lakin onların ləyaqətlə bərabər hörmətkaranə olan sərbəst ədа və hərəkətləri d'Artanyanı heyran qoydu. Muşketyorlar ona yarımallah, onların başçısı isə, bütün şimşəklərilə silahlanmış olimpiyalı Yupiter[1] kimi görünürdü.

Muşketyorlar kabinetə girib, ardlarınca qapı örtülən kimi, dəhlizdəki pıçıltılar yenidən başlandı. Görünür bu dəvət söhbət üçün yeni bir mövzu olmuşdu. Cənab de Trevil dinməzcə otaqda üç-dörd dəfə o baş-bu başa gedib gəldi; hər dəfə rəsm-keçid zamanı olduğu kimi hərəkətsiz durmuş Portos və Aramisin yanından keçərkən qaşlarını çatırdı Kapitan birdən birə muşketyorların qarşısında durub, qəzəblı baxışlarla onları başdan-ayağa süzdü.

[1] Olimpıyalı Yupiter Qədim Roma dini əfsanələrinə görə göylərin baş allahıdır

Bilirsinizmi, cənablar, kral mənə nə dedi, özü də dünən axşam? Bunu siz bilirsinizmi? deyə o çığırdı.

Xeyr, cənab, azacıq sükutdan sonra hər iki muşketyor cavab verdi, bilmirik.

– Ancaq ümid edirik ki, siz lütfən bunu bizə söylərsiniz, – deyə Aramis böyük bir ehtiramla əyilib təzim etdi.

Kral mənə dedi ki, bundan sonra öz muşketyorlarını cənab kardinalın qvardiyaçıları arasından seçəcəkdir!

– Cənab kralın qvardiyaçılarındanmı?! Bəs belə niyə ki? Portos soruşdu.

Ona görə ki, kral öz gecə şərabına yaxşı şərab qatmağı vacib bilir.

Hər iki muşketyor qulaqlarına qədər qızardı. D'Artanyan az qalmışdı ki, utandığından yerə girə.

– Bəli, bəli, - de Travil davam etdi, – əlahəzrət haqlıdır; çünki: namusum haqqı, muşketyorlar sarayda çox pis bir rol oynayırlar! Dünən oyun zamanı cənab kardinal mənim heç xoşuma gəlməyən canyandırıcı bir ədа ilə krala danışırdı ki, "Üç gün bundan əvvəl bu yaramaz muşketyorlar, bu davakarlar, – o öz sözlərini elə istehza ilə dedi ki, bu heç də xoşuma gəlmədi, bu qoçaqlar, kardinal vəhşi pişik gözlərilə mənim üzümə baxaraq nəticə çıxartdı, – Feru küçəsindəki bir meyxanada gecə yarısına qədər oturub qalıblar və onun qvardiyasının nəzarətçiləri – mənə elə gəldi ki, o üzümə baxıb qəhqəhə ilə güləcəkdir, bu sakitliyi pozanları həbs etməyə məcbur olublar". Lənət şeytana! Yəqin ki, sizin bundan xəbəriniz var! Muşketyorları həbs etsinlər?! Siz də orada olmusunuz, heç gizlətməyin! Sizi tanıyıblar və kardinal sizin adınızı çəkdi. Təqsir məndədir, bəli, məndədir çünki mən özüm adamları seçirəm. Bax elə götürək sizi, Aramis, indi ki, sizə ruhani libası daha çox yaraşır, nə üçün muşketyor kamzolu geyməyi xahiş edirsiniz? Portos, indi ki, siz bu yaraşıqlı gərdənlikdən saman çöpündən qayrılmış bir qılınc asacaqdınız, onda.. Bəs Atos?.. Atosu görmürəm, bəs o hanı?

Atos xəstədir, cənab, Aramis kədərli bir ədа ilə cavab verdi. O, yaman xəstədir.

Necə? Deyirsiniz ki, xəstədir, yaman xəstədir? Xəstəliyi nədir?

– Həkimlər qorxurlar ki, çiçək ola, cənab, – deyə Portos da söhbətə qarışmaq arzusu ilə cavab verdi, həm də bu çox böyük dərddir; çünki çiçək yəqin onun üzünü korlayacaq.



Çiçək! Boş boş danışmayın, Portos! O yaşda adam çiçək xəstəliyinə tutularmı? Bu nə boş sözdür! Başa düşürəm: Atos yaralıdır, bəlkə də ölmüşdür! Ax, birce mən bunu biləydim! Lənət şeytana! Cənablar, mən istəmirəm ki, muşketyorlarım şübhəli yerlərdə veyllənsinlər. Küçələrdə bəhsə girişib tin başlarında vuruşsunlar. Mən istəmirəm ki, mənim alayım cənab kardinalın qvardiyaçıları üçün istehza mövzusu olsun. O qvardiyaçılar çox yaxşı uşaqlardır, qoçaqdırlar, hamısı seçmədir, sakit, qüvvətli və zirəkdirlər. Onları həbs etmək üçün heç bir səbəb yoxdur. Bir də ki, onlar özlərini həbs etməyə qoymazdılar. Mən buna inanıram .. Qaçmaq, canını qurtarmaq, əkilmək... belə şeylər ancaq kral muşketyorlarına yaraşır!..

Portos və Aramis qəzəbdən titrəyirdilər. Əgər onlar de Trevilin sevdiyindən belə söylədiyinə inanmasaydılar, onu həmin saat boğardılar Onlar ayaqlarını yerə döyür, dodaqlarını qanayıncaya qədər gəmirir və qılınclarının qəbzələrini var gücləri ilə sıxırdılar.

Söylədiyimiz kimi, dəhlizdə Atos, Portos və Aramisin kabinetə çağırıldığını eşitmişdilər. Orada oturanlar cənab de Trevilin səsindən başa düşmüşdülər ki, son dərəcə qəzəblənmişdir. On nəfər adam başlarını maraqla örtulu qapıya söykədi. Bu adamların bənizi qəzəbdən ağarmışdı; çunki onların qulaqları kabinetdə söylənilənlərin hamısını eşitmişdi, dodaqları isə, muşketyor kapitanının təhqiredici sözlərini o saat dəhlizdə oturanlara çatdırdı. Bir dəqiqə içində kabinetin qapısından tutmuş darvazaya qədər bütün evə çaxnaşma düşdü.

İşə bir bax! Kral muşketyorları razı olurlar ki, cənab kardinalın qvardiyaçıları onları həbs etsinlər?! cənab de Trevil öz əsgərlərindən daha artıq qızışaraq sözlərinə davam etdi. O, hər bir sözü ayrılıqda ölçüb-biçir, sanki onları xəncər kimi bir-bir öz dinləyicilərinin bağrına sancmaq istəyirdi. İşə bir bax! Kardinal həzrətlərinin altı qvardiyaçısı əlahəzrət kralın altı muşketyorunu həbs edir! Lənət şeytana, lap ağ oldu! Mən bu saat Luvra gedib istefa verəcəyəm və xahiş edəcəyəm ki, məni kardinalın qvardiyasına kiçik zabit vəzifəsinə qəbul etsinlər. Bu da olmasa gedib abbat olacağam.

Bu sözlərdən sonra dəhlizdə və həyətdə pıçıltı bir tufan halını aldı. Hər tərəfdən bağırtı və lənətlər yağdırılırdı. "Məlun şeytanlar! Vay şeytanlar! Şeytanlara ölüm!"

D'Artanyan qaçıb gizlənməyə dörd gözlə yer axtarırdı, az qalmışdı gedib masanın altına girsin.

– İndi ki, belə oldu, cənab, – Portos çığırdı, – mən sizə bütün həqiqəti söyləyim! Biz altıya qarşı altı nəfərdik. Onlar bizim üzərimizə xaincəsinə basqın etdilər və biz qılınclarımızı çəkməyə macal tapmamış, onlar bizdən iki nəfəri öldürdülər. Atos da ağır yaralanıb, ölü kimi yerə sərilmişdi. Siz ki, Atosu tanıyırsınız, cənab! O iki dəfə qalxmağa cəhd etdi, ancaq qalxa bilməyib yerə yıxıldı. Bununla belə, biz təslim olmadıq, yox, bizi zorla apardılar. Yolda biz qaçmağa fürsət tapdıq. Atosa gəlincə, onu ölmüş güman edib döyüş meydanında qoyub getmişdilər. Onlar bu fikirdə idilər ki, meyiti aparmağa dəyməz. İşin əsli belədir. Lənət şeytana, cənab, axı bütün vuruşmalarda qalib gəlmək olmaz. Böyük Pompey[1] Farsal[2] müharibəsini uduzmuşdu. Eşitdiyimə görə çox yaxşı bir sərkərdə olan kral Birinci Fransisk də Pavi[3] müharibəsini uduzmuşdu.

– Mən də hüzurunuza ərz edirəm ki, düşmənlərimizdən birini öz qılıncı ilə öldürdüm, – deyə Aramis söhbətə qoşuldu. – Çünki, mənim qılıncım elə birinci zərbədə sınmışdı. Cənab kapitan, necə istəyirsiniz elə də başa düşün: ya öldürdüm, ya gəbərtdim.

– Mən bunları bilmirdim, – bir az sakitləşən de Trevil cavab verdi. – Mən görürəm ki, cənab kardinal xeyli mübaliğə edibmiş...

– Ancaq lütf edin, – de Trevilin bir qədər sakitləşdiyini görən Aramis ondan xahiş etməyə cürətlənib sözünə davam etdi, – lütf edin, cənab, Atosun yaralandığını heç kəsə söyləməyin. Əgər bu xəbər gedib krala çatsa, Atos üçün böyük dərd olar. Onun yarası çox təhlükəlidir; çünki qılınc çiynindən keçib köksünə girmişdir. Onun halı qorxuludur.

Elə bu dəqiqədə qapının pərdələri aralandı, kabinetin astanasında mütənasib vücudlu, gözəl, nəcib üzü müdhiş solğunluğu ilə insanı heyran qoyan qəşəng bir muşketyor göründü.

– Atos! – hər iki muşketyor birdən çığırdı.

– Atos! – de Trevil də təkrar etdi.

---

[1] Qney Pompey (miladdan əvvəl 106–48-ci il) Romanın məşhur dövlət xadimi və sərkərdəsi.

[2] Farsal vuruşması – bu vurşmada Roma sərkərdəsi Kay Yuli Sezar bütün Roma dövlətinə hakimlik iddiasında olan Pompeyə qalib gəlmişdir. Bu vuruşma miladdan əvvəl 48-ci ildə Makedoniyanın Farsal şəhərinin yaxınlığında olmuşdur.

[3] Pavi vuruşması – 1525-ci ildə İtaliyanın Pavi şəhərinin yaxınlığında olmuş və bu vuruşmada Roma imperatoru V Kral Fransa kralı I Fransiskin qoşunlarını əzmişdir.



– Siz məni çağırmışdınız, cənab, – Atos zəif, lakin tamamilə sakit bir səslə dilləndi, – yoldaşlarım dedilər ki, siz məni soruşmusunuz. Mən də tələsik hüzurunuza gəldim. Qulluğunuzda hazıram, cənab kapitan!

Başdan-ayağa rəsmi geyimdə olan muşketyor bu sözləri söyləyə-söyləyə, həmişə olduğu kimi, özünü şax tutaraq möhkəm addımlarla kabinetə daxil oldu. Bu cür mərdlik nümunəsindən həyəcana gəlmiş cənab de Trevil ona doğru yüyürdü.

– Mən indicə bu cənablara elə onu söyləyirdim ki, – de Trevil dedi, – ehtiyac olmadan öz həyatlarını təhlükəyə salmağı öz muşketyorlarıma qadağan edirəm: çünki krala igid çox əzizdir. Kral isə yaxşı bilir ki, onun muşketyorları ən igid adamlardır. Əlinizi verin, Atos!

Cənab de Trevil cavab gözləmədən Atosun sağ əlindən tutub var gücü ilə sıxdı. O, Atosun özünə hakim olmaq qüvvəsinin çox böyük olduğuna baxmayaraq, xəstə halda qımıldandığını və rənginin daha da ağardığını hiss etmədi.

Atosun gəlməsindən doğan həyəcan o qədər qüvvətli idi ki, qapı yarıaçıq qalmışdı. Atosun yaralandığını özü və yoldaşları nə qədər gizlətməyə çalışdılarsa da, bu xəbər hamıya məlum olmuşdu. Kapitanın son sözləri razılıq nidaları içərisində itdi və bu zaman pərdənin arasından iki-üç baş göründü. Cənab de Trevil, əlbət ki, intizam qaydalarını pozan bu adamları o saat cəzalandırardı. Ancaq birdənbirə öz əlinin içində Atosun əlinin xəstə bir halda titrədiyini hiss etdi. Cənab de Trevil Atosun üzünə baxdı və onun huşunu itirmək üzrə olduğun gördü. Ağrıya qalib gəlmək üçün bütün qüvvəsini toplamış olan Atos bir an içində ölü kimi yerə sərildi.

– Cərrah! – cənab de Trevil çığırdı. – Cərrah! Mənim cərrahımı! Kralın cərrahını! Ən yaxşı cərrahı! Tez olun, lənət şeytana, tez olun, yoxsa qəhrəman Atosum əldən gedər!

Cənab de Trevilin səsinə dəhlizdə olanlar hamısı kabinetə doluşub yaralının ətrafında vurnuxmağa başladılar. Ancaq cərrah gəlib çıxmasaydı, onların bütün cidd-cəhdləri boşa çıxacaqdı.

Cərrah izdihamın içindən özünə yol açıb hələ də huşsuz halda yerə sərilmiş Atosun yanına gəldi. Hay-küy və çaxnaşma ona mane olduğundan, hər şeydən əvvəl, yaralını qonşu otağa aparmalarını tələb etdi. Cənab de Trevil o saat qapını açıb Portos və Aramisə yol göstərdi. Onlar da yoldaşlarını qolları üstünə alıb apardılar. Onların ardınca cərrah içəri girdi.

Cənab de Trevlin kabinetinə adətən muşketyorlar əsə-əsə gəlirdilər. Ancaq indi bura bir an içində dəhlizin bir şöbəsinə çevrilmişdi. Hay-küy, söyüşmə səsləri oranı bürümüşdü. Kardinala və onun qvardiyaçılarına lənətlər yağırdı.

Bir dəqiqədən sonra Portos ilə Aramis qayıtdılar. Cərrah ilə cənab de Trevil yaralının yanında qaldılar

Nəhayət, cənab de Trevil də qayıdıb gəldi. Cərrah xəbər verdi ki, muşketyorun vəziyyəti dostlarını qorxuya salmamalıdır, çünki huşunu itirməsinin səbəbi qanının azalmasıdır Sonra cənab de Trevil əli ilə bir işarə etdi və d'Artanyandan başqa hamı çıxıb getdi. D'Artanyan isə ona görüş vəd edildiyini unutmayıb, həqiqi bir qaskoniyalı kimi inadla öz yerində durmuşdu.

Hamı kabinetdən çıxıb getdikdən sonra cənab de Trevil dönüb cavan oğlanı gördü. O, bunu tamamilə yadından çıxarmışdı. Bir az əvvəl baş verən hadisə onun fikrini dağıtmışdı. O, bu inadcıl cavanın nə istədiyini soruşdu. D'Artanyan öz adını söylədi, cənab de Trevil o saat keçmişi və indini yad edib gülümsəyə-gülümsəyə dedi:

Bağışlayın, eloğlu, az qalmışdı ki, sizi unudam. Nə çarə! Muşketyorlar kapitanı da ata kimi bir şeydir. Ancaq onun məsuliyyəti daha artıqdır. Əsgərlər böyük uşaqlardır. Ancaq mən kralın və xüsusən cənab kardinalın əmrlərinin sözsüz-sovsuz yerinə yetirilməsinə çalışdığımdan...

D'Artanyan gülümsəməkdən özünü saxlaya bilmədi. Bu gülümsünmədən cənab de Trevil başa düşdü ki, onun qarşısında duran adam axmaq deyildir və sözü dəyişib düz mətləb üstünə gəldi:

- Mən sizin atanızla çox yaxın dost idim. Deyin görüm onun oğlu üçün nə iş görə bilərəm? Tez olun söyləyin, çünki mənim vaxtım öz ixtiyarımda deyildir.

D'Artanyan dedi:

– Cənab kapitan, Tarbı tərk edib Parisə gələrkən qəsdim bu idi ki, sizin unutmamış olduğunuz o dostluq xatirinə məni muşketyorluğa qəbul etmənizi xahiş edim. Ancaq iki saat ərzində burada gördüyüm bütün bu hadisələrdən sonra başa düşürəm ki, bu çox böyük bir lütf olardı və qorxuram ki, mən bu lütfə layiq olmayam.

– Bu doğrudan da, böyük bir lütfdür, cavan oğlan, cənab de Trevil cavab verdi. Ancaq bəlkə bu, sizin təxmin etdiyiniz qədər də əlçatmaz bir şey deyildir. Amma bu barədə əlahəzrətin xüsusi fərmanı



var və mən təəssüflə sizə bildirməliyəm ki, muşketyorluğa ancaq bir neçə müharibədə iştirak etmiş adamları və yaxud xüsusi bir surətdə özünü göstərənləri, ya da bizim hissəmizdən daha az imtiyazlı olan hər hansı bir başqa hissədə iki ildən az xidmət etməmiş olanları qəbul edirlər

D'Artanyan dınməz söyləməz təzim etdi. O, muşketyorluğun bu qədər çətin olduğunu bildikdən sonra muşketyor olmağa həvəsi daha da artdı

De Trevil öz yerlisinə nüfuzlu bir nəzərlə baxıb, sözünə davam etdi: Ancaq bir az əvvəl dediyim kimi, mənim köhnə dostum olan atanızın xatirinə sizə bir yaxşılıq etmək istəyirəm. Bizim Bearn cavanları, adətən, çox varlı olmurlar və mən güman edirəm ki, oradan çıxdığım müddətdən bəri vəziyyətdə çox da böyük bir dəyişiklik olmamışdır. Yəqin siz də özünüzlə çox da artıq pul gətirməyibsiniz.

D'Artanyan məğrurcasına başına dik tutdu. Sanki bununla o demək istəyirdi ki, heç bir sədəqəyə ehtiyac yoxdur.

Yaxşı cavan oğlan, yaxşı, Trevil davam etdi, mən sizi yaxşı tanıyıram. Mən Parisə gələndə cibimdə dördcə ekü pul var idi. Ancaq hər kəs mənim Luvru satın ala biləcəyimə şübhə etmiş olsaydı, onu duelə çağırardım.

D'Artanyan özünü bir qədər qürrəli hiss etdi; çünki atı satdıqdan sonra karyerasının başlanğıcında o, cənab de Trevildən düz dörd ekü varlı idi

Cənab de Trevil dedi:

Odur ki, sizin pulunuz nə qədər çox olursa olsun, qorumalısınız. Bu mənim birinci sözüm; sonra, siz bir əsilzadəyə lazım olan biliyinizi artırmalısınız Mən günü bu gün kral akademiyasının müdirinə bir məktub yazaram və sizi sabah pulsuz parasız qəbul edər. Bundan imtina etməyin, çünki bizim ən məşhur və varlı əyanlarımız bəzən bu barədə nə qədər yalvarırlarsa boşa çıxır. Siz orada at minməyi, qılınc oynatmağı və rəqs etməyi öyrənərsiniz. Bir neçə yaxşı dost qazanarsınız və hərdənbir yanıma gəlib, öz müvəffəqiyyətlərinizdən danışarsınız və məndən sizə nə kömək lazım olsa, söyləyərsiniz.

D'Artanyan hələ saray adətlərini bilmirdisə də, ancaq bu qəbulun çox soyuq olduğunu hiss etdi. O dedi:

– Ah, cənab, mən indi görürəm ki, atamın sizə yazmış olduğu məktub mənə nə qədər lazımmış

Doğrudan, mən təəccüb edirəm ki, de Trevil cavab verdi, – siz belə uzun bir yola bizim bearlıların yeganə var-dövləti olan tövsiyə məktubu gətirmədən çıxmısınız.

– Mənim tövsiyə məktubum vardı və sizi inandırıram ki, o tam bir səliqə ilə yazılmışdı, - d'Artanyan səsini ucaltdı, ancaq onu xaincəsinə məndən oğurladılar.

Bu sözlərdən sonra o, Menqdə baş verən hadisəni nağıl edib, naməlum əsilzadəni təfsilatı ilə təsvir etdi. Bunları o, elə bir hərarət və səmimiyyətlə danışdı ki, cənab de Trevili valeh etdi.

– Qəribə işdir, – cənab de Trevil bir az düşündükdən sonra dilləndi. Siz, doğrudanmı, mənim adımı ucadan çəkdiniz?

Bəli, cənab, utansam da, boynuma alıram ki, belə bir günah etmişəm... Yolda sizin adınız mənim üçün qalxan kimi bir şey idi və özünüz təxmin edə bilərsiniz ki, mən bundan nə qədər tez-tez istifadə etmişəm.

O zaman təriflənmək dəbdə idi. Cənab de Trevil də mədh olunmağı kral və kardinaldan az xoşlamırdı. O, gizlətmədən məmnuniyyətlə gülümsündü və bu təbəssüm bir anda yox oldu. O, yenə də Menqdəki əhvalat üzərinə qayıdıb soruşdu:

– Söyləyin görüm, o əsilzadənin gicgahında kiçik bir yara izi yox idi ki?

Bəli, güllə yarasına bənzər bir yara izi vardı.

O kişi gözəl və yaraşıqlıydımı?

Bəli.

– Boyu uca idimi?

– Bəli.

Rəngi solğun, saçları da qara idimi?

- Bəli, bəli, elədir ki, var. Siz onu haradan tanıyırsınız, cənab? Ax, bircə ona rast gəlsəydim! Ancaq sizə and içirəm ki, cəhənnəmdə də olsa, ona rast gələcəyəm...

O, bir qadınımı gözləyirdi? – de Trevil davam etdi.

Hər halda o, gözlədiyi xanımla bir az danışdıqdan sonra çıxıb getdi.

Bilmirsinizmi onlar nə barədə danışırdılar?

O, qadına bir zərf verib tapşırdı ki, içində təlimat vardır və xahiş etdi ki, zərfi Londona çatdıqdan sonra açsın.

- O qadın ingilisdimi?



Kişi ona miledi deyə xitab edirdi.

Özüdür ki, var! de Trevil pıçıldadı. – Özüdür ki, var! Mən güman edirdim ki, o, hələ Brüsseldədir

Ah, cənab kapitan, əgər siz o adamın kim olduğunu bilirsinizsə, - d'Artanyan çığırdı, mənə söyləyin və mən sizi hər bir şeydən, hətta məni muşketyorluğa götürmək vədindən də azad edərəm; çünki mən hər şeydən əvvəl intiqam almaq istəyirəm.

- Özünüzü gözləyin, cavan oğlan! - Trevil çığırdı. Əksinə, siz onu küçənin bu tərəfində görsəniz, o biri tərəfinə keçin. O qaya ilə üz-üzə gəlməyin; çünki ona toxunsanız, parça-parça olarsınız.

- Ancaq, hər halda, d'Artanyan dilləndi, – əgər bircə ona rast gələ bilsəydim...

Bura baxın, cənab, – de Trevil onun sözünü kəsdi, əgər yaxşı bir məsləhət eşitmək istəyirsinizsə, ona rast gəlməkdən çəkinin...

De Trevilin ürəyinə birdən bir şübhə damdı və o, sözünü kəsib dayandı. Bu cavan qaskoniyalının atasının məktubunu oğurlamış olan adama qarşı belə qızğın nifrəti ona qəribə göründü. O, bu nifrəti həddindən artıq açıq ifadə edirdi. Bir də məktubun oğurlanması hadisəsi özü də həqiqətə az bənzəyirdi. Bəlkə bu nifrətin altında bir xəyanət gizlənmişdir? Bəlkə bu cavanı onun yanına kardinal həzrətləri göndərmişdir? Bəlkə bu bir tələdir? Bəlkə bu cavan oğlan bir casusdur? Bəlkə kardinal onu muşketyorlar kapitanının evinə göndərməklə onun etimadını qazanmaq, sonra isə, dəfələrlə olduğu kimi, onu məhv etmək qəsdindədir? De Trevil d'Artanyana əvvəlkindən daha artıq diqqətlə baxdı. Ancaq qaskoniyalının üzündə gördüyü hiyləgərlik və ağıl əlamətləri onu heç də rahat etmədi.

Cavan oğlan, o, ağır-ağır sözə başladı, mən məktubu itirmək əhvalatına inanıram və bunun üçün köhnə dostumun bir oğlu kimi bizim siyasətin sirlərini açıb sizə söyləmək istəyirəm ki, soyuq rəftarımın təsirini yumşaldım. Kral ilə kardinal yaxın dostdurlar. Onların arasında nəzərə çarpan zahiri çəkişmə ancaq axmaqları aldada bilər. Mən istəmirəm ki, mənim yerlim, yaxşı bir oğlan və müvəffəqiyyətlər üçün yaranmış gözəl bir cavan olan siz, bu fitnələrin qurbanı olub, axmaq kimi pis vəziyyətə düşəsiniz. Əmin ola bilərsiniz ki, mən hər iki müqtədir zata sədaqət bəsləyirəm və mənim gördüyüm bütün işlərdən yeganə məqsəd krala və kardinala xidmət etməkdir; çünki kardinal Fransanın bütün tarixi boyunca yetişdirdiyi ən nadir

və boyük dühalardan biridir. Beləliklə, cavan oğlan, siz bunu nəzərdə tutun və əgər bizim əsilzadələr kimi ailə tərəfdən və ya hər hansı başqa bir səbəbə görə kardinala qarşı bir düşmənliyiniz varsa, yaxşısı budur ki, elə bu saat sizinlə vidalaşıb ayrılaq. Mən sizə hər barədə kömək etməyə hazıram, ancaq sizi öz yanıma götürə bilmərəm. Ümid edirəm ki, bu səmimiyyət sayəsində, hər halda sizi özümə dost edə bilərəm. Siz bilməlisiniz ki, mən cavan adamlarla çox da tez-tez belə açıq söhbət edən deyiləm.

Trevil öz-özünə deyirdi

"Əgər bu cavan tülkünü mənim yanıma kardinal göndəribsə, yəqin öz casusunu başa salıb ki, mənim xoşuma gəlmək və etimadımı qazanmaq üçün ən yaxşı vasitə həm kardinalın öz, həm də onun yaxın adamları barəsində hərzə söyləməkdən ibarətdir; çünki kardinal ona nə qədər nifrət etdiyimi çox yaxşı bilir. Şübhə etmirəm ki, mənim sözlərimə baxmayaraq bu cavan hiyləgər bu saat and içməyə başlayacaq ki, onun kardinal həzrətlərini görən gözü yoxdur!"

Ancaq de Trevilin gözlədiyinin əksinə olaraq d'Artanyan böyük bir sadəliklə belə cavab verdi:

– Cənab kapitan, mən Parisə gələndə eynən bu fikirlərlə gəlmişəm. Atam mənə tapşırmışdı ki, kral, kardinal və sizdən başqa heç bir barədə heç kəsə güzəşt etməyim. Bu üç nəfəri o, Fransanın birinci adamları hesab edirdi.

Biz görürük ki, bu sözlərlə d'Artanyan de Trevili də kral və kardinala qoşmuşdu. O, güman edirdi ki, bununla o heç bir pis iş görmür.

D'Artanyan sözlərinə davam edib dedi:

– Mən cənab kardinala və onun fəaliyyətinə böyük bir ehtiram bəsləyirəm. Sizin mənimlə açıq danışmağınız mənim üçün böyük bir səadətdir; çünki onda mənim səmimiyyətim də sizin xoşunuza gələcəkdir. Lakin əgər siz mənə inanmırsınızsa, əlbəttə, bu da tamamilə təbiidir, onda mən hiss edirəm ki, həqiqəti söyləməklə özüm-özümə ziyan etmişəm. Ancaq mənim üçün nə qədər kədərli olsa da, bununla təsəlli tapıram ki, siz heç olmasa mənə olan hörmətinizi əsirgəməzsiniz. Sizin hörmətiniz isə mənim üçün dünyada hər şeydən əzizdir.

Cənab de Trevil böyük bir heyrət içində qalmışdı. Cavanın bu ürəyiaçıqlığı və səmimiyyəti onun xoşuna gəlirdi. Ancaq hələ bütün şübhələri ortadan qaldırmamışdı. Bu cavan oğlan nə qədər ağıllı, zəkalı olsa, bir o qədər təhlükəli ola bilərdi. Ancaq Trevil d'Artanyanın əlini sıxıb dedi:

Görünür siz sədaqətli bir cavansınız. Ancaq indi mən sizə bu saat vəd etdiyimdən artıq heç bir şey edə bilmərəm. Mənim evim həmişə sizin üzünüzə açıqdır. İstədiyiniz vaxt yanıma gələ bilərsiniz. Şübhəm yoxdur ki, istədiyinizə nail olacaqsınız.

D'Artanyan cavabında dedi:

Başqa sözlərlə desək, gözləyirsiniz ki, sizin etimadınıza layiq olam. Arxayın olun, o, qaskoniyalıya yaraşan bir sərbəstliklə əlavə etdi. – Bunu çox gözləməli olmayacaqsınız!

Bu sözlərdən sonra artıq qalan hər bir şey yalnız onun özündən asılıymış kimi, təzim edib getmək istədi.

Bir az gözləyin, cənab de Trevil onu saxladı, – mən akademiya müdirinə vermək üçün məktub vəd etmişdim. Yoxsa o qədər məğrursunuz ki, bunu qəbul etmək istəmirsiniz?

Yox, cənab, sizə vəd edirəm ki, birinci məktubun başına gələn əhvalat bu məktubun başına gəlməyəcəkdir. Bu məktub sahibinə çatdırılacaqdır. Vay o adamın halına ki, onu məndən almaq fikrinə düşə!

Cənab de Trevil bu xalis qaskoniyalı öyünməsini eşidib gülümsündü və d'Artanyanı söhbət etdiyi pəncərənin qabağında qoyub, vəd etdiyi məktubu yazmaq üçün masanın arxasına oturdu. Bu zaman bekar qalmış d'Artanyan barmaqlarını şüşəyə döyüb marş çala-çala bir-birinin ardınca çıxıb getməkdə olan muşketyorlara tamaşa edirdi. D'Artanyan nəzərləri ilə onları küçənin döngəsində gözdən itincəyə qədər izlədi.

Cənab de Trevil məktubu yazıb möhürlədi və cavan oğlana yanaşdı. Lakin d'Artanyan əlini uzadıb məktubu almaq istədiyi anda cənab de Trevil birdən-birə gördü ki, cavan sarsıldı, qəzəbdən rəngi qızardı və bu sözləri çığıra-çığıra kabinetdən qaçmağa başladı:

– Ah, lənət şeytana! Bu dəfə daha mənim əlimdən qurtarmayacaq!

Kim? – cənab de Trevil soruşdu.

– O, oğru! d'Artanyan cavab verdi. - Ax, xain!

Bu sözləri deyib o yox oldu.

Bu oğlan deyəsən dəlidir, de Trevil deyindi və sonra ağır ağır əlavə etdi: – Bəlkə də fırıldağı baş tutmadığından, belə bir hərəkət, qaçıb qurtarmaq üçün mahiranə bir üsuldur?

## IV

## ATOSUN ÇİYNİ, PORTOSUN ASQI KƏMƏRİ VƏ ARAMİSİN YAYLIĞI

D'Artanyan üç adlayışda dəhlizdən keçıb yüyürə-yüyurə pilləkənin meydançasına çıxdı. Ancaq burada o, gözlənmədən cənab de Trevilin yanından çıxan bir muşketyorla toqquşub, başını onun çiyninə elə bərk vurdu ki, o, ağrının şiddətindən çığırdı, daha doğrusu, nərə çəkdi.

Məni bağışlayın, d'Artanyan qaça-qaça yoluna davam etmək istədi, məni bağışlayın, çox tələsirəm.

Ancaq o, bircə addım da atmamışdı ki, dəmir bir əl şərfindən yapışıb onu saxladı.

Siz tələsırsiniz! rəngi kətan kimi ağarmış muşketyor çığırdı. Siz məni ıtələyib üzr istəyirsiniz və elə güman edirsiniz ki, bu kifayətdir? Əsla yox, cavan oğlan! Siz elə bilırsiniz ki, cənab de Trevil bizim üstümüzə çığırmışsa, demək siz də bizimlə istədiyiniz kimi rəftar edə bilərsiniz! Səhv edırsınız, cənab! Siz cənab de Trevil deyilsiniz və belə asanlıqla yaxanızı qurtara bilməzsiniz!

– Sızı ınandırıram ki, deyə d'Artanyan ona cavab verdi. O, yarasını sarıtdırdıqdan sonra çıxıb evə getməkdə olan Atosu tanıdı. – Sizi inandırıram ki, mən bunu qəsdən etmədim. Bilmədən sizə toxundum və dedım ki, "Məni bağışlayın!" Mənə elə gəlir ki, bu kıfayətdır Təkrar edirəm ki, mən tələsirəm, çox tələsirəm, xahiş edirəm məni buraxasınız.

Cənab, -Atos onu buraxdı, siz nəzakətsizsiniz, görünür əyalətdənsiniz.

Artıq bir neçə pillə aşağı enmiş d'Artanyan Atosun bu sözlərini eşitcək dayandı.

Bura baxın, cənab, mən haralı oluramsa olum, ancaq sizi xəbərdar edırəm ki, özümü necə aparmağı sizdən öyrənməyə ehtiyacım yoxdur.

– Ola bilər! Atos cavab verdi.

- Ax, bircə mən belə tələsməyəydim, – d'Artanyan çığırdı, əgər mən bir adamı qovub çatmağa tələsməsəydim...

Cənab tələsən oğlan, sizə mənim dalımca düşüb qovmaq lazım gəlməyəcəkdir. Siz məni elə belə də tapa bilərsiniz, eşidirsinizmi?



Harada?

Karmelitlər monastırının qabağında.

– Saat neçədə?

Günorta!

Günortamı? Yaxşı gələrəm.

– Çalışın ki, gecikməyəsiniz; çünkı birə on beş dəqiqə işləmiş gəlməsəniz, qulaqlarınızı kəsilmiş bilin.

Heç narahat olmayın, d'Artanyan çığırdı. Saat on ikiyə on dəqiqə qalmış oradayam.

Bu sözlərdən sonra o, yenə dəli kimi yüyürməyə başladı. O, ümıd edirdi ki, həmin əsrarəngiz naməlum adamı tapa biləcəkdir; çünkı o, heç bır yerə gedə bilməzdi.

Ancaq darvazanın ağzında o, qvardıyaçı ilə söhbət edən Portosu gördü. D'Artanyan yolu kəsmiş olan bu ıkı adamın arasından sivişib keçmək istədi. Ancaq küləyi nəzərə almamışdı. Birdən külək Portosun uzun plaşının ətəyini qaldırdı və d'Artanyan düz plaşın içinə soxuldu. Görünür ki, Portosun libasının çox mühüm bir hissəsi olan bu plaşdan ayrılmamasına bır səbəb var idi; çünki o, plaşın, ovcunda olan uclarını buraxmaq əvəzınə möhkəm tutub özünə sarı çəkdi və d'Artanyan məxmər plaşın içində dolaşıb qaldı.

D'Artanyan muşketyorun lənətlər yağdırdığını eşidib, gözlərini tutmuş olan plaşın içindən çıxmağa çalışırdı; ancaq onun qatlarının içində vurnuxub qalırdı. O, xüsusilə, artıq bizə məlum olan gözəl gərdənliyi zədələməkdən qorxurdu. Ancaq qorxa-qorxa gözlərini açdıqda gördu ki, burnu düz bu gərdənliyə söykənmişdir. Heyhat, bu dünyada olan və zahirən parıldayan bir çox şeylər kimi bu gərdənliyin də üzü qızıl, arxa tərəfi meşin idi. Portosun xalis qızıl gərdənlik almağa pulu olmadığından özünə yalnız üzü qızıl suyuna çəkilmiş meşin gərdənlik almışdı. Bu əzəmətli muşketyorun öskürməsinin və isti yay günündə plaş geyməsinin səbəbi də bu idi.

- Vay, şeytan, Portos plaşının altında vurnuxmaqda olan d'Artanyandan yaxasını qurtarmağa çalışa-çalışa çığırdı. Dəli olubsunuz ki, adamların üstünə belə atılırsınız?

Mənı bağışlayın, d'Artanyan nəhəng muşketyorun qoltuğu altından başını çıxarıb dilləndi. – Mən çox tələsırəm. Bir adam var, onun dalınca qaçıram və ...

Yəqin ki, tələsdiyinizdən gözünüzü yaddan çıxarıb evdə qoyubsunuz? - deyə Portos soruşdu.

Yox, d'Artanyan acıqlı-acıqlı cavab verdi. Mən hələ bir çox adamların görə bilmədiklərini də görürəm.

Qaskoniyalının nəyə işarə etdiyini Portosun başa düşüb-düşmədiyi məlum deyilsə də, ancaq o acıqlandı:

- Cənab, sizi xəbərdar edirəm ki, əgər muşketyorların ətrafında belə ehtiyatsız atılıb düşəcək olsanız, qulaqlarınızı kəsərlər!

Qulaqlarımızı kəsərlər? Mənimmi? - d'Artanyan cavab verdi. Bu nə qabalıqdır?

- Bu, düşmənin gözünə dik baxmağa öyrəşmiş bir adama yaraşar. Əlbəttə, mən yaxşı bilirəm ki, siz öz iç üzünüzü göstərməyə cürət etməzsiniz.

Cavan oğlan özünün bu hazırcavablığından məmnun qalmış halda ucadan gülə-gülə yoluna davam etdi.

Portos qəzəbdən titrəyirdi. O, d'Artanyanın üzərinə atılmaq üçün bir hərəkət etdi.

- Sonraya qalsın, sonraya, - qaskoniyalı ona sarı çevrildi, -əyninizdə plaş olmayan bir vaxta qalsın!

Saat birdə! Lüksemburq sarayının arxasında!

– Çox yaxşı, saat birdə, d'Artanyan cavab verib tini döndü.

Ancaq nə onun getdiyi küçədə, nə də baxdığı o biri küçədə öz düşməninə rast gələ bilmədi. Naməlum adam, artıq gözdən itib gizlənməyə müvəffəq olmuşdu. D'Artanyan rast gələn adamlardan onu soruşa-soruşa bərəyə qədər endi. Sena və Qızıl Xaç küçələrilə yuxarı qalxdı. Heç bir yerdə bir kəsə rast gəlmədi. Lakin bu gəzinti cavan qaskoniyalı üçün faydalı oldu. Onun alnını tər basdıqda ürəyi soyuyurdu. D'Artanyan bütün bugünkü hadisələri xatırlamağa başladı. Bu hadisələr çox idi Hamısı da bədbəxt hadisələr idi. Hələ səhər saat on bir idi. Ancaq bu qısa müddətdə cənab de Trevilin, yəqin ki, onun birdən-birə qaçmasını kobudluq sayıb ona acığı tutmuşdu. Sonra o, iki adamla vuruş təyin etmişdi ki, bunların hər biri üç d'Artanyan öldürə bilərdi. O, muşketyorlara o qədər hörmət bəsləyirdi ki, onları həm qəlbən, həm də fikrən bütün adi insanlardan yüksək tuturdu.

D'Artanyanın vəziyyəti, doğrudan da, pis idi. Atosun onu öldürəcəyinə əmin olduğundan, cavan oğlan Portos barədə o qədər narahat deyildi. Ancaq ümid insan qəlbində son saniyəyə qədər yaşadığından,



d'Artanyan da inanırdı ki, bu vuruşmalardan, əlbət ki, dəhşətli yaralar alaraq, diri çıxacaqdır. Ancaq bütün bunlardan o öz gələcəyi üçün ibrət almışdı.

O, öz-özünə deyirdi: "Mən nə qədər dəli və axmağam! İgid və bədbəxt Atos həmin o çiynindən yaralanmışdır ki, mən də ora qoç kimi kəllə vurdum. Bir şeyə heyrət edirəm ki, Atos niyə məni oradaca öldürmədi. Buna tamamilə haqqı var idı. Ancaq yəqin onun yarasını yaman ağrıtmışam. Portosa gəlincə, vallahi, o qorxunc olmaqdan artıq gülüncdür!"

Belə düşünə-düşünə cavan oğlan qeyri-ixtiyari güldü. Ətrafına göz gəzdirdi ki, görsün bu səbəbsiz gülməsilə təsadüfən yoldan keçən bir adamı təhqir etmir ki, sonra yenə öz-özünə davam etdi.

"Portosa gəlincə, o yaman gülməlidir. Ancaq şübhə yoxdur ki, mən lap səfehlik etdim.. Axı heç adamın üstünə "kənara çəkilin!"- deyə xəbərdar etmədən, belə atılmaq olarmı? Bir də adamın plaşının altında olub-olmayan şeyi görmək yaxşı şeydirmi? Əgər mən o məlum asqıya işarə etməsəydim, yəqin ki, Portos məni bağışlardı. Şeytan bu bu zarafatı haradan mənim ağlıma gətirdi. Lənətə gəlsin bu Qaskoniya hazırcavablığı! Bura bax, əziz dostum d'Artanyan, deyə məcbur bildiyi bu mehribanlıqla özünə xitabən davam etdi, əgər bu dəfə sən bu bəlalardan başını salamat qurtara bilsən, buna ehtimal çox azdır, bundan sonra adamlarla nəzakətlə rəftar edərsən. Gərək elə nəzakətli olasan ki, səni nümunə göstərsinlər. Ehtiyatlı və nəzakətli olmaq qorxaqlıq demək deyildir. Bu Aramisə bax, gör necə təvazökar, necə zərif bir insandır. Amma heç bir adamın ağlına gələrmi ki, Aramisə qorxaq desin? Yox, məlum şeydir ki, bundan sonra mən də təqlid etməyə çalışacağam. Budur ha, o özü də oradadır!..."

D'Artanyan öz-özü ilə danışa-danışa, demək olar ki, d'Egilyonların evlərinə qədər çatdı və bu evin qabağında Aramisin üç kral qvardiyaçısı ilə şən-şən söhbət etdiyini gördü.

Aramis də d'Artanyanı gördü və o saat yadına düşdü ki, de Trevil bu cavan oğlanın yanında səhər onun və Portosun üstünə çığırmışdı. Bu səhnənin şahidi olmuş bir adam, əlbət ki, onun xoşuna gəlməzdi. Buna görə də o, özünü görməməzliyə qoydu. Ancaq elə indicə hamı ilə nəzakətli olmağı qərara almış cavan qaskoniyalı bu cavanlara yanaşdı və ən hörmətli bir təbəssümlə onlara salam verdi. Aramis azacıq başını əydi, ancaq gülümsəmədi. Onlar dördü də o saat söhbəti kəsdı.

D'Artanyan o qədər axmaq deyildi ki, özünün burada artıq olduğunu hiss etməsin. Ancaq kübar aləminin adətlərini kifayət dərəcədə bilmədiyindən, düşdüyü çətin vəziyyətdən məharətlə çıxmağı bacarmırdı. Heç tanış olmadığı adamlara yanaşıb özünə dəxli olmayan söhbətə qarışmaq isə belə çətin vəziyyətlərdən biri idi. O istəyirdi ki, onlara təzim edib getsin, ancaq birdən gördü ki, Aramisin əlindən bir yaylıq düşdü və yəqin ki, xəbəri olmadan ayağını yaylığın üstünə basdı. D'Artanyana elə gəldi ki, öz yöndəmsiz hərəkətini yumşaltmaq üçün bu, əlverişli bir təsadüfdür. O, əyildi, mehribancasına yaylığı muşketyorun ayağı altından çəkib çıxartdı və sahibinə uzadaraq dedi:

- Buyurun, cənab, yəqin ki, bu yaylığı itirdiyinizə heyfsilənəcəkdiniz.

Yaylığa, doğrudan da, zərif naxışlar salınmış və bir ucuna da tac və gerb çəkilmişdi.

Aramis bərk qızarıb yaylığı qaskoniyalının əlindən qapdı.

Aha! qvardiyaçılardan biri çığırdı. Nə var, təvazökar Aramis? Yoxsa yenə də deyəcəksən ki, xanım de Bua-Trasi ilə aran yoxdur? Görürəm, bu mehriban xanım sənə öz yaylıqlarını bağışlayır.

Aramis d'Artanyana elə kəskin bir nəzərlə baxdı ki, ancaq ən qəddar düşmənə bu cür baxarlar. Sonra o, yenə öz təvazökar görkəmini alıb sakitcə dedi:

Siz səhv edirsiniz, cənablar, bu yaylıq mənim deyildi. Bilmirəm bu yaylığı mənə vermək bu cənabın haradan ağlına gəldi. Bunu elə bu cür sizin hər birinizə verə bilərdi. Mənim yaylığım cibimdədir.

Aramis bu sözləri deyib öz yaylığını cibindən çıxartdı. Bu yaylıq da çox gözəl və zərif batistdən idi. O zamanlar batist çox qiymətli parça idi. Ancaq bu yaylığın üstündə gerb yox idi, yalnız sahibinin monoqramı var idi.

Bu dəfə d'Artanyan dinmədi. O, öz səhvini başa düşmüşdü. Ancaq Aramisin sözləri onun dostlarını inandırmadı və onlardan biri qondarma bir hörmətkarlıqla cavan muşketyora dedi:

– Əgər dediyin doğrudursa, onda, mehriban Aramis, mən səndən bu yaylığı tələb etməyə məcburam. Sən bilirsən ki, Bua-Trasi mənim yaxın dostumdur və mən istəmirəm ki, kənar adamlar onun arvadına məxsus olan şeylərlə boş-boşuna öyünsünlər.

– Sənin xahişin doğru deyildir, Aramis cavab verdi. Sənin tələbini mahiyyətcə qəbul etsəm də, rəsmi səbəblərə görə rədd etməliyəm



Doğrudur, d'Artanyan qorxa-qorxa sözə qarışdı. Mən bu yaylığın cənab Aramisin cibindən düşdüyünü görmədim; ancaq onu gördüm ki, ayağını yaylığın üstünə basdı, vəssalam. Yalnız buna görə mən elə güman etdim ki, yaylıq cənab Aramisindir.

– Siz də səhv etmisiniz, cənab, d'Artanyanın bu üzrxahlığından çox da mütəəssir olmayan Aramis soyuq bir əda ilə cavab verdi

Sonra o özünü Bua-Trasinin dostu adlandıran qvardiyaçıya müraciətlə əlavə etdi:

– Bir də ki, əziz dostum, mən də cənab Bua-Trasi ilə sənin qədər dostam. Buna görə bu yaylıq mənim cibimdən olan kimi, sənin də cibindən düşə bilərdi.

- Yox, namus haqqı, yox! kral qvardiyaçısı etiraz etdi.

Sən öz namusuna and içəcəksən, mən də öz sözümə, hər halda ikimizdən biri yalan demiş olacaq. Bilirsənmi nə var, Montaran, yaxşısı budur gəl adama yarısını götürək.

Yaylığınmı?

Bəli.

Çox gözəl! – o biri iki qvardiyaçı dilləndi. - Bu lap Süleyman[1] peyğəmbərin mühakiməsi oldu. Doğrudan da, Aramis, sən yaman ağıllı adamsanmış!

Cavanlar gülüşdülər, aydındır ki, bu işdən daha başqa nəticə çıxmadı.

Bir az sonra söhbət kəsildi və üç qvardiyaçı ilə muşketyor bir-birinin əlini möhkəm sıxıb, hərəsi bir tərəfə ayrılıb getdi.

"Bax, bu cənabla barışmaq üçün ən əlverişli bir dəqiqədir!" deyə düşünərək d'Artanyan Aramisin dalınca yüyürdü. Cavan muşketyora çatıb dedi:

– Möhtərəm cənab, ümid edirəm ki, siz məni bağışlarsınız.

Cənab, Aramis onun sözünü kəsdi. İcazə verin sizə deyim ki, siz indi, belə hallarda nəcib bir adama yaraşan kimi hərəkət etmədiniz.

[1] Süleyman məhkəməsi Yəhudilərin Süleyman padşah haqqındakı əfsanəyə işarədir (miladdan əvvəl X əsr) Bu əfsanəyə görə Süleyman qeyri-adi idrak sahibi hesab edilir. Süleyman haqqındakı əfsanələrdən ən məşhuru burada deyilən "Süleyman məhkəməsi"dir. Bu əfsanədə iki arvadın bir uşağa sahiblik iddiasında olduqları nağıl edilir. Süleyman bu uşağı qılıncla yarı bölməyi əmr etmişdi Arvadlardan biri bu qərara razı olmuş, o biri isə yalvarmışdır ki, onun oğluna rəhm etsinlər Beləliklə, padşah mübahisə edən arvadlardan hansının həqiqi ana olduğunu bilmişdir

– Necə, cənab, siz güman edırsiniz ki...

– Mən güman edirəm ki, sız axmaq deyılsınız və hərçənd Qaskoniyadan gəlibsiniz, ancaq bılırsınız kı, adam boş yerə ayağını yaylığın üstünə basmaz Lənət şeytana! Axı Parısın küçələrınə batist döşənməyib ki!

Möhtərəm cənab, Sız nahaq yerə məni təhqir etmək istəyirsiniz, – d'Artanyan cavab verdı. Onun qızğın təbiətı dınc dolanmaq arzularına qələbə çalmaq üzrə ıdi. Mən qaskoniyalıyam. Bu doğrudur və indi kı siz bunu bilirsiniz, Sizə deməyim artıqdır ki, qaskoniyalılar çox da dözümlü olmurlar. Sizdən üzr istəməklə əminəm kı, lazım olduğundan daha artıq hörmətkarlıq göstərmışəm.

– Möhtərəm cənab, mən bunu Sizinlə bəhsə girişmək üçün söyləmədim Allaha şükür, mən vuruşqan adam deyiləm və yalnız məcbur edıldıyım zaman, özü də böyük bir nifrətlə vuruşuram. Ancaq bu dəfə iş ciddidır; çünki sizin səbəbinizdən bir xanım rüsvay olmuşdur.

Daha doğrusu, bizim ikimizin səbəbindən! deyə d'Artanyan çığırdı.

– Axı Siz o yaylığı niyə mənə verdiniz?

– Bəs Siz o yaylığı niyə yerə saldınız?

Təkrar edirəm ki, bu yaylıq mənim cibimdən düşməmişdir.

– Belə olduqda, cənab, Siz ikiqat yalan söyləmiş olursunuz. Mən o yaylığın Sizin cibinizdən düşdüyünü gördüm.

– Ax, cənab qaskoniyalı, Siz mənimlə belə bir əda iləmi danışırsınız? Yaxşı, mən kübar aləminin rəftarını Sizə öyrədərəm!

– Mən də, cənab abbat, sizi monastıra qayıtmağa məcbur edərəm. Qılıncınızı çəkin və qorunun!

Yox, əziz dostum, hər halda burada yox. Məgər görmürsünüz ki, biz d'Egilyonun evinin qabağındayıq və bu ev kardinalın adamları ilə doludur? Mən nə bilim! Bəlkə də kardinal həzrətləri Sizə tapşırıb ki, mənim başımı aparıb ona təqdim edəsiniz? Ancaq mən öz başımın qədrini bilirəm və mənə elə gəlır ki, başım çiyinlərimin üstündə çox gözəl yerləşmişdir. Mən Sizin sinənizi vurub dəlməyə razıyam. Ancaq elə bir xəlvət yerdə ki, bizə heç kəsi mane olmasın.

– Necə istəyirsiniz elə də olsun. Ancaq güman etməyin ki, qalibiyyət Sizə çox asan qismət olacaq. Bir də özünüzlə yaylıq götürün. Yaylıq hər kimin olursa-olsun, ola bilər ki, Sizin işinizə yarasın.

Siz qaskoniyalısınızmı, cənab? Aramıs soruşdu.



– Bəli, qaskoniyalıyam və bizim Qaskoniyada ehtiyat üçün vuruşmanı təxirə salmaq adət deyildir.

Cənab, ehtiyat muşketyorlar üçün lazım deyilsə də, ruhanilər üçün zəruridir. Mənim də muşketyorluğum yalnız müvəqqəti bir şey olduğundan, ehtiyatlı olmaq istəyirəm. Saat ikidə mən Sizi cənab de Trevilin evində gözləmək şərəfinə naıl olacağam. Orada mən Sizə bizim duel üçün münasib bir yer göstərərəm

Cavanlar bir-birinə təzim edib ayrıldılar. Aramıs Lüksemburqa sarı gedən küçəyə yönəldi, d'Artanyan isə, günortaya az qaldığını görüb Karmelitlər monastırına doğru getdi. O, öz-özünə deyırdi:

"Yəqin ki, mənə diri qalmaq qismət olmayacaq! Lakın hər halda, ölmüş də olsam, muşketyorların əlində öləcəyəm!"

## V

## KRAL MUŞKETYORLARI VƏ CƏNAB KARDİNALIN QVARDİYAÇILARI

D'Artanyan Parisdə heç kəsi tanımırdı. Buna görə Atos ilə vuruşmağa şahidsiz getdi. O, bu fikirdə idi ki, düşmənin təklif edəcəyı şahidləri qəbul edəcəkdir. Bununla bərabər, möhkəm qərara almışdır ki, igid muşketyordan üzr istəsin. D'Artanyan qorxurdu ki, adətən, belə duellərdən doğan pis bır nəticə çıxmasın; çünki bir adam yaralı və zəif düşmənlə vuruşub məğlub olduqda, düşmənin şöhrətini ikiqat artıracaq, qalib gəldikdə ısə, hiyləgər və ucuz qəhrəmanlıq şöhrəti qazanan bir adam kimi tanınacaq.

Bununla bərabər, bizim oxucular artıq bilirlər ki, d'Artanyan adicə bir cavan deyildi. Buna görə də öz-özünə mütləq tələf olacağını təkrar edir, amma onun yerinə hər hansı bir adamın edəcəyi kimi, belə bir hal ılə razılaşmırdı. O, vuruşacağı adamların xasiyyətlərini təsəvvür edir və öz vəziyyətini aydınca başa düşürdü. Ümid edırdi ki, Atos səmimi üzrxahlığını dinləyib onunla dost olacaq. Atosun əzəmətli görkəmi və ağır tərpənişı onun xoşuna gəlirdi. Güman edirdi ki, əgər Portos onu öldürməmiş olsa, gərdənlik barəsindəki əhvalatı bütün aləmə yaymaqla onu hədələyəcəkdir. Əgər bu əhvalat məharətlə söylənmış olsa, Portos rüsvay olacaqdır. Nəhayət, dinc və sakit Aramisə gəlincə,

d'Artanyan ondan çox da qorxmurdu, ümid edirdi ki, onu asanlıqla o biri dünyaya göndərəcək və ya heç olmasa, yaralayacaqdır.

D'Artanyan özünü cürətli hiss edirdi. Atasının məsləhətlərını yadından çıxarmamışdı. Ona görə də Karmelitlər monastırına doğru sadəcə getmir, sanki uçurdu. Bu tənha çəmənliklər ortasında tikilmiş pəncərəsiz bir bina idi. Orada, adətən, vaxt itirməyi istəməyən adamlar vuruşardılar.

D'Artanyan binanın divarları dibindəki boş yerə çatdıqda, saat on ikini vurdu. Atos burada idi və onu beş dəqiqədən artıq gözləməmişdı. Beləliklə, d'Artanyan düz vaxtında gəlmişdı və şərəf məsələsində ən tələbkar bir hakim ona bu barədə kiçik bir məzəmmət də edə bilməzdi.

Atosun yarasını cənab de Trevilin cərrahı yenidən sarımışdısa da, bu yara ona hələ də çox əziyyət verirdi. O, bir kötüyün üstündə oturub özünə məxsus olan çox sakit və ləyaqətli bir əda ilə düşmənini gözləyirdi.

D'Artanyanı gördükdə, qalxıb ona sarı yeridi. D'Artanyan da başı açıq ona sarı gəldi. Onun şlyapasının üstündəki lələk yerlə sürünürdü.

Atos dedi:

– Möhtərəm cənab, mən iki dostumu dəvət etmişəm ki, şahidim olsunlar. Ancaq hələ gəlib çıxmayıblar.Ləngimələrınə təəccüb edirəm; çünki onlardan çıxmayan işdir.

– Mənim şahidim yoxdur, möhtərəm cənab, – d'Artanyan cavab verdi. Çünki mən Parisə dünən gəlmışəm və burada cənab de Trevildən başqa heç kəsi tanımıram.

Atos fikrə getdi.

Siz cənab de Trevildən başqa heç kəsı tanımırsınızmı? soruşdu.

– Xeyr, cənab.

– Bu, yaxşı iş olmadı, – Atos d'Artanyana olduğu qədər də özünə müraciət edirmiş kimi söyləndi. Əgər mən sizı öldürmüş olsam, adımı uşaq öldürən qoyacaqlar.

Çox da elə deyil, cənab, d'Artanyan ləyaqətlə təzım etdi, çox da elə deyil; çünki siz mənimlə ağır yaralı olduğunuz halda lütf edib vuruşmağa razı olursunuz. Yəqin kı, yara ındi də sizə çox əzıyyət verir.

– Bəli, düzünü deyim ki, çox incidir. Bir də kı, sız bayaq məni yaman əzdiniz. Ancaq mən qılıncı, çox zaman belə hallarda olduğu



kimi, sol əlimə alacağam. Güman etməyin ki, bu sizə bir üstünlük vermiş olar. Mən hər iki əlimlə çox yaxşı vuruşuram. Bunun sizə hətta zərəri dəyə bilər; çünkı solaxay qılınc oynadan bu işə hazırlığı olmayan adam üçün çox təhlükəlı bir düşməndir. Təəssüf edirəm ki, əvvəlcə sizi bu vəziyyətdən xəbərdar etməmişəm.

Sız çox mərhəmətlisiniz, cənab, d'Artanyan yenidən təzım edib cavab verdi, bu xəbərdarlığınız üçün sizə çox təşəkkür edirəm.

– Yox, nə söyləyirsiniz! - Atos ləyaqətli bir əda ilə cavab verdi. Əgər etiraz etmirsinizsə, başqa bir barədə danışaq. Ax, lənət şeytana, siz məni bayaq yaman əzdiniz!.. Çiynim od tutub yanır...

Əgər mənə icazə versəydiniz... d'Artanyan çəkinə-çəkinə sözə başladı.

– Nə deyirsiniz, cənab?

Məndə yaranı ecazkar surətdə sağaldan bir məlhəm var. Onu mənə anam vermişdir. Öz üzərimdə təcrübə etmişəm.

Yaxşı, nə olsun ki?

– Mən əminəm kı, bu məlhəm üç gündə sizi tamamən sağaldar və üç gündən sonra tamamilə sağaldığınız zaman sizinlə gücümü sınamağı özüm üçün böyük şərəf bilərəm.

D'Artanyan bu sözlərı elə bir sadəliklə söylədi ki, izzət-nəfsinə əsla xələl gətirmədən, nəzakətini artırmış oldu.

– Sözün doğrusu, cənab, təklifiniz xoşuma gəlir. Onu qəbul edə bilməsəm də, görürəm ki, qarşımda duran bir əsilzadədir. Böyük Karl zamanındakı cəngavərlər bu cür davranır və hərəkət edərdilər. Məncə, hər bir nəcib adam onlara təqlid etməlidir. Bədbəxtlikdən biz o böyük imperatorun zamanında deyil, cənab kardinalın zamanında yaşayırıq və biz öz sirrimizı nə qədər gizlətməyə çalışmış olsaq da, bu üç günün ərzində hamı xəbər tutacaq kı, biz vuruşacağıq və bizə mane olacaqlar. Yaxşı, bəs bu tənbəllər niyə gəlıb çıxmırlar?

D'Artanyan bir dəqiqə əvvəl dueli təxirə salmağı təklif etdiyi eyni sadəliklə Atosa dedi:

Cənab, əgər siz tələsirsinizsə və məni elə bu saat o biri dünyaya göndərmək istəyirsinizsə, xahiş edirəm çəkinmədən söyləyəsiniz.

Bax, bu söz də mənim çox xoşuma gəlir, Atos xoş bir əda ilə başını əydi. Bu sözlər beyni və qəlbi yerində olan bir insanın sözləridir. Mən sizin kimi adamları sevirəm, cənab və əminəm ki, əgər bız bır birimizı öldürməsək, sizinlə söhbət etmək mənə həmişə

xoş gələcəkdir. Xahiş edirəm o cənabları gözləyək. Mən tələsmirəm, budur ha, deyəsən onlardan biri gəlir.

Doğrudan da, Vojirar küçəsinin axırında nəhəng Portos göründü.

– Necə! – d'Artanyan çığırdı. Sizin birinci şahidiniz cənab Portosdurmu?

Bəli, bu, sizin xoşunuza gəlmirmi?

Yox, əsla!

Budur, ikincisi də gəldi.

D'Artanyan Atosun göstərdiyi tərəfə baxdı və Aramisi tanıdı.

Necə! daha artıq bir heyrətlə çığırdı. – İkinci şahidiniz cənab Aramisdirmi?

Əlbəttə! Məgər siz bilmirsinizmi ki, biz həmişə bir yerdə oluruq və sarayda muşketyorlar və qvardıyaçılar arasında və şəhərdə bizi Atos, Portos və Aramis və ya ayrılmaz üç dost adlandırırlar? Ancaq siz Daksdan və ya Po...

– Mən Tarbdan gəlmişəm, – d'Artanyan dilləndi.

Buna görə də sizin bu təfərrüatı bilməməyiniz mümkündür, deyə Atos cavab verdi.

Bu zaman Portos yaxınlaşdı və əli ilə Atosu salamladı. Sonra üzünü d'Artanyana çevirib heyrətdən donub qaldı. Yeri gəlmişkən qeyd edək ki, onun gərdənliyi və çiynində plaşı yox idi.

Aha! – deyə o dilləndi. Bəs bu necə işdir?

- Mən bu cənabla vuruşacağam, – Atos Portosu salamlayaraq cavab verdi.

Mən də onunla vuruşacağam, - Portos dilləndi.

– Ancaq saat birdə, - d'Artanyan cavab verdi.

- Mən də bu cənabla vuruşacağam, Aramis yaxınlaşaraq dilləndi.

Ancaq saat ikidə, d'Artanyan eyni əda ilə cavab verdi

Yaxşı, son nə üstə vuruşursan, Atos? – Aramis soruşdu.

– Düzü özüm də bilmirəm. O, mənə toxunub çiynimi əzmişdi. Bəs sən niyə vuruşursan, Portos?

Mən vuruşuram ona görə ki, vuruşuram, Portos qızararaq cavab verdi.

Gözündən heç bir şey qaçmayan Atos qaskoniyalının dodaqlarında xəfif bir təbəssüm oynadığını gördü.

– Biz tualet barəsində sözə gəlmişik, cavan oğlan dilləndi.

Bəs sən niyə vuruşursan, Aramis? – Atos soruşdu



Mən dini məsələlərə aid bir mübahisə üstündə vuruşuram, Aramis duelin əsil səbəbini söyləməməsi üçün d'Artanyana işarə edərək cavab verdi.

Atos yenə də d'Artanyanın dodaqlarında bir təbəssüm sezdi.

Doğrudanmı? Atos soruşdu.

Bəli, bizim müqəddəs Avqustin mətni üzərində mübahisəmiz düşmüşdür. Bunu hərəmiz bir cür şərh edirik, – qaskoniyalı cavab verdi.

– O, doğrudan da, ağıllı oğlandır, Atos mızıldandı.

İndi ki, hamınız yığışıbsınız, cənablar, icazə verin mən sizdən üzr istəyim.

"Üzr istəyim" sözlərini eşitdikdə Atos qaşlarını çatdı. Portosun dodaqlarında lovğa bir təbəssüm göründü, Aramis isə həqarətlə dodaqlarını büzdü.

D'Artanyan qürurla başını dik qaldırıb dedi:

Siz mənim dediyimi yaxşı başa düşmədiniz, cənablar. Mən sizdən ona görə istəyirəm ki, bəlkə hamınızın borcunu vermək mənə mümkün olmaya; çünki cənab Atos birinci olaraq məni öldürmək haqqına malikdir. Bu da, cənab Portos, sizə olan borcumu xeyli qiymətdən salır. Siz isə, cənab Aramis, daha pis bir vəziyyətdə qalırsınız. İndi isə, cənablar, təkrar edirəm, sizdən ancaq buna görə üzr istəyirəm. Başlayaq!

D'Artanyan bu sözləri söylədikdən sonra cəngavərlərə yaraşan ən məğrur bir əda ilə qılıncını çəkdi.

Qan onun beyninə vurdu. Bu dəqiqədə o, Fransanın bütün muşketyorları ilə vuruşmağa hazır idi.

Saat birə on dəqiqə işləmişdi. Günəş xeyli ucalmışdı, duel üçün seçilən yer isə, tamamilə açıqlıq idi.

Atos qılıncını çəkərək dedi:

Yaman istidir, ancaq kamzolumu çıxara bilmərəm, çünki yaramdan hələ də qan axdığını hiss edirəm. Qorxuram ki, düşmənim özü axıtmadığı qanı görüb narahat olsun.

Doğrusu, cənab, bu qanın axmasının müqəssiri kim olursa-olsun, sizi inandırıram ki, belə nəcib bir əsilzadənin qanının axmasına mən təəssüflə baxa bilərəm. Mən də sizin kimi kamzolumu çıxarmadan vuruşacağam.

Portos dedi:

– Bəsdir, bir-birinizə xoş sözlər söylədiniz, bəsdir. Unutmayın ki, biz də öz növbəmizi gözləyirik.

Aramis onun sözünü kəsib dedi:

Portos, yalnız öz adınızdan danışın. Şəxsən mən elə güman edirəm ki, bu cənabların söylədikləri bütün sözlər büsbütün doğru və nəcib insanlara tamamilə layiq olan sözlərdir.

– Qulluğunuzda hazıram, – Atos vəziyyət aldı

– Əmrlərini gözləyirəm, – d'Artanyan cavab verdi.

Onların qılıncları çarpazlaşdı.

Ancaq qılınclar bir-birinə yenicə toxunub cingildəmişdi ki, birdən cənab de Jüssakın komandası altında bir dəstə kardinal qvardiyaçısı monastırın önündə göründü.

Portos ilə Aramis bir ağızdan çığırdılar:

Kardinalın qvardiyaçıları! Qılıncları qına qoyun, cənablar! Qılıncları qına qoyun!

Ancaq daha iş işdən keçmişdi. Duel edən hər iki cavan vəziyyət alıb üz-üzə durmuşdu və məqsədləri tamamilə aydın idi.

Jüssak yaxınlaşa-yaxınlaşa öz adamlarına da işarə ilə bunu əmr edərək çığırdı:

Hey, hey, muşketyorlar! Yenə də vuruşursunuzmu? Bəs kralın duel barəsindəki fərmanlarını unutmuşsunuzmu?

– Cənab qvardiyaçılar, bunu yadımıza saldığınız üçün sizə təşəkkür edirik, - Atos üç gün bundan əvvəlki vuruşmanın iştirakçılarından olan Jüssaka acıqlı-acıqlı baxdı. – Əgər biz sizin öz aranızda vuruşduğunuzu görmüş olsaydıq, sizi inandırıram ki, buna mane olmazdıq. Qoyun biz vuruşaq, siz də tamaşa edib ləzzət alın!

– Cənablar, çox böyük təəssüflə sizə deməliyəm ki, bu mümkün deyildir. Vəzifə hər şeydən üstündür! Zəhmət çəkin, qılıncları qınına qoyun və ardımızca gəlin.

Aramis Jüssakı cırnatmağa çalışaraq dedi:

- Cənab, əgər bizim ixtiyarımız özümüzdə olsaydı, böyük bir məmnuniyyətlə sizin bu mehriban dəvətinizə əməl edərdik. Ancaq təəssüf ki, bu mümkün deyildir. Cənab de Trevil bunu bizə qadağan etmişdir. Buna görə də öz yolunuzla gedin, bu, sizin üçün ən yaxşı hərəkət olardı.

Aramisin istehzalı ədası Jüssakı lap qızışdırdı.

– Əgər tabe olmasanız, zorla apararıq.



Atos yavaşcadan yoldaşlarına dedi:

Onlar beş nəfərdir, biz isə üç, yalnız üç nəfər. Onlar bizə yenə üstün gələcəklər və biz burada ölməliyik; çünki mənim ikinci dəfə məğlub olmuş halda kapitanın yanına getməyə daha üzüm yoxdur.

Jüssak öz əsgərlərini cərgəyə düzdüyü zaman, Atos, Portos və Aramis də həmin saat cərgəyə düzülüb durdular.

D'Artanyanın bir qərara gəlməsi üçün bircə an kifayət etdi. Bu elə bir hadisə idi ki, insanın bütün müqəddəratını təyin etmiş olurdu. O, kardinal ilə kraldan birini, təxirsiz olaraq həmişəlik seçməli idi. Vuruşmaya qoşulmaq qanunla itaət etməmək, yəni öz canından keçmək və birdən-birə kralın özündən də qüdrətli olan nazirin düşməni olmaq demək idi. Bu fikir bir anda cavanın başından gəlib keçdi Ancaq onun xeyrinə olaraq qeyd etməliyik ki, o, bircə saniyə də tərəddüd etmədi.

D'Artanyan üzünü Atosa və onun dostlarına tutub dedi:

Cənablar, əgər icazə versəniz, sizin sözlərinizi azacıq təshih edərəm. Siz dediniz ki, yalnız üç nəfərsiniz; ancaq mənə elə gəlir k, biz dörd nəfərik.

Portos dedi:

Elədir, ancaq siz axı yadsınız

D'Artanyan ona cavab verdi:

Doğrudur, mənim paltarım başqadır, amma qəlbim sizin qəlbinizdəndir, ürəkdən mən də muşketyoram, mən bunu hiss edirəm və öz qəlbimin əmrinə itaət edirəm.

Jüssak yəqin ki, d'Artanyanın hərəkətlərindən və üzünün ifadəsindən onun fikrini başa düşüb cavan oğlana dedi:

Siz kənara çəkilin, cavan oğlan, siz gedə bilərsiniz, biz buna razıyıq, ancaq tez olun.

D'Artanyan yerindən tərpənmədi:

Namusuma and içirəm k, hətta biz məğlub olsaq da, mən buradan gedən deyiləm.

– Cavan igid, sizin adınız nədir? –Atos soruşdu.

D'Artanyandır, cənab.

Necə oldu, cənablar, bir qərara gəldinizmi? deyə de Jüssak üçüncü dəfə çığırdı.

- Bəli, – Atos cavab verdi.

– Nə qərara gəldiniz? – de Jüssak soruşdu.

– Biz sizə hücum etmək şərəfinə nail olacağıq, – Aramis bir əli ilə şlyapasını qaldırıb, o biri əli ilə qılıncını çəkərək cavab verdi.

Bu sözlərdən sonra doqquz nəfər bir-birinin üstünə atıldı, ancaq məlum intizamı pozmadılar. Atos kardinalın sevimlilərindən biri olan Kayuzak adlı birilə, Portos Bikara ilə qılınc qılınca gəldi. Aramisin qarşısında isə, iki düşmən vardı.

D'Artanyan de Jüssakın özü ilə üz-üzə gəldi.

Cavan qaskoniyalının ürəyi elə şiddətlə döyünürdü ki, elə bil bu saat parçalanacaq. Ancaq o, zərrə qədər qorxu hiss etmirdi. Qızmış pələng kimi vuruşur, fırfıra kimi düşmənin başına hərlənir, dəqiqədə iyirmi kərə öz hərəkətini və yerini dəyişdirirdi.

O zaman söyləndiyinə görə Jüssak qılınc vuruşmasına yaman həris olub, özü də çox təcrübəli idi. Ancaq yüngül və zirək rəqibinin qabağında özünü böyük bir çətinliklə müdafiə edirdi. Cavan oğlan qəbul edilmiş qaydalara fikir vermədən, onun üstünə hər tərəfdən hücum edir və eyni zaman oz canının qədrini yaxşı bilən bir adam kimi qorunurdu

Nəhayət, bu mübarizə de Jüssakı özündən çıxartdı. Balaca bir oğlanın bu cür muqavimətindən qəzəblənərək qızışdı və səhv etməyə başladı. D'Artanyan böyük bir təcrübəyə malik deyildisə də, döyüş nəzəriyyəsini yaxşı bilirdi. O, sürətini iki qat artırdı. De Jüssak onun işini bitirmək arzusu ilə birdən-birə böyük bir sıçrayışla atılıb d'Artanyana şiddətli bir zərbə endirdi. Ancaq d'Artanyan onun zərbəsini dəf etdi və de Jüssak özünü düzəltməyə macal tapmamış o, ilan kimi onun qılıncının altından sivişib qılıncını onun sinəsinə elə soxdu ki, ucu kürəyindən çıxdı. De Jüssak kötük kimi yerə sərildi

Bu vaxt d'Artanyan sürətli və narahat nəzərlə döyüş meydanını gözdən keçirtdi.

Aramis öz düşmənlərindən birini öldürmüşdü. Ancaq o birisi onu yaman sıxışdırmışdı. Lakin Aramisin vəziyyəti yaxşı idi, özünü müdafiə edə bilərdi.

Bikara ilə Portos hər ikisi bir-birini yaralamışdı. Portos əlindən, Bikara isə ayağından yaralanmışdı. Hər ikisinin yarası yüngül idi və onlar daha artıq bir qızğınlıqla vuruşurdular.

Kayuzakın yenidən yaraladığı Atosun rəngi ağarmışdı. Ancaq bircə addım da geri çəkilmirdi. Yalnız qılıncı o biri əlinə almış, indi sol əli ilə vuruşurdu.



O zamankı duel qaydalarına görə d'Artanyan yoldaşlarından birinə kömək edə bilərdi. Kimin köməyə ehtiyacı olduğunu nəzərlə axtaranda, gözü Atosun gözünə sataşdı. Onun nəzəri çox aydın idi. Atos dili ilə köməyə çağırmaqdansa ölməyə razı olardı. Ancaq o baxa bilər və gözlərilə çağıra bilərdi. D'Artanyan bunu başa düşdü və yandan Kayuzaka doğru yüyürüb çığırdı:

Bu tərəfə dönün, cənab qvardiyaçı, yoxsa sizi öldürərəm!

Kayuzak döndü, d'Artanyan özünü vaxtında yetirmişdi. Özünü yalnız mərdliklə ayaq üstə durmağa məcbur edən Atos həmin saat bir dizi üstə çökdü.

Lənət şeytana! – o, d'Artanyana çığırdı. – Cavan oğlan, sizdən xahiş edirəm ki, onu öldürməyin. Onunla mənim köhnə haqq-hesabım var. Mən sağaldıqdan sonra bu haqq-hesabı çürütmək lazımdır. Onun yalnız silahını əlindən alın, qılıncını vurub salın. Bax, belə! Yaxşı, çox yaxşı!

Kayuzakın qılıncı əlindən çıxıb iyirmi addım aralı yerə düşdü. D'Artanyan və Kayuzak hər ikisi qılınca sarı yüyürdülər. Ancaq daha zirək olan d'Artanyan əvvəl çatıb ayağını qılıncın üstünə basdı.

Kayuzak Aramisin öldürdüyü qvardiyaçıya sarı yüyürüb onun qılıncını qapdı və d'Artanyanın yanına qayıtmaq istədi. Ancaq yolda o, Atosa rast gəldi; Atos d'Artanyanın sayəsində azacıq tənəffüs edib özünə gəlmişdi. Öz köhnə düşməninə d'Artanyanın qalib gələcəyindən qorxub özü yenidən vuruşmağı qərara aldı.

D'Artanyan başa düşdü ki, buna mane olsa, Atos inciyəcək. Bir neçə saniyədən sonra Kayuzak boğazından yaralanıb yerə yıxıldı.

O dəqiqə Aramis də qılıncını yerə yıxılmış düşməninin sinəsinə dirəyib onu aman diləməyə məcbur etdi.

Portos ilə Bikara qalmışdı. Portos öz düşməninə istehza edir, ondan saat neçə olduğunu xəbər alır, qardaşının Navar alayında bölük komandanı olması münasibətilə onu təbrik edirdi. Ancaq bu istehzalar ona kömək etmirdi. Bikara elə dəmir kimi möhkəm adamlardan idi ki, onu yalnız ölüm savaşdan çıxara bilərdi.

Ancaq işi qurtarmaq lazım idi. Nəzarətçi dəstəsi yetişib yaralanan və yaralanmayan, royalist və kardinalist – bütün vuruşanları tutub apara bilərdi. Atos, Aramis və d'Artanyan Bikaranı araya salıb təslim olmasını tələb etdilər. Hamının qarşısında tək qalmış və ayağından yaralanmış olan Bikara razı olmurdu. Bir dirsəyi üstündən azacıq

yerindən qalxmış de Jüssak ona təslim olmağı məsləhət görürdü. Bikara da d'Artanyan kimi qaskoniyalı idi. O, özünü karlığa qoyub yalnız güldü. İki həmlə arasında o, qılıncının ucu ilə yeri göstərib dedi:

– Bax, burada, Bikara burada ölər, amma geri çəkilməz!

De Jüssak ona çığırdı:

Axı onlar dörd nəfərdir, sən isə toksən! Sənə əmr edirəm, təslim ol!

Bikara dedi:

– Əgər, sən əmr edirsənsə, o başqa məsələ. Sən mənim briqadirimsən, mən əmrinə tabe olmalıyam.

Bu sözlərdən sonra o, bir addım geri sıçrayıb qılıncını dizi ilə sındırdı ki, düşmənlərinə qismət olmasın. Qılıncın sınıqlarını monastır divarının ardından tullayıb qollarını sinəsində çarpazladı və fit ilə bir hava çalmağa başladı.

Qəhrəmanlıq hətta düşməndə də olsa, həmişə hörmətə layiqdir. *Muşketyorlar qılıncları ilə Bikaraya salyut verib onları qına qoydu.*

D'Artanyan da onlar kimi etdi. Sonra o, Bikaranın köməyilə de Jüssakı, Kayuzakı və Aramısin yaraladığı düşməni götürüb monastırın pillələri üstündə qapı ağzında qoydular. Əvvəlcə söylədiyimiz kimi, dördüncü qvardiyaçı ölmüşdü. Sonra muşketyorlar monastırın zəngini çaldılar və beş qılıncdan dördünü götürüb şadlıqdan özlərini itirmiş halda cənab de Trevilin evinə sarı yönəldilər.

Onlar qol qola gedir və küçənin bütün enini tutmuşdular. Yolda rast gəldikləri bütün muşketyorları özlərinə qoşurdular. Beləliklə, onların bu gəzintisi nəhayət, zəfər rəsm-keçidinə çevrildi

D'Artanyan şadlığından nə edəcəyini bilmirdi. O, Atos ilə Portosun arasında gedir və onların qollarını məhəbbətlə sıxırdı.

Cənab de Trevilın darvazasından içəri girərkən d'Artanyan öz yeni dostlarına dedi:

– Mən hələ muşketyor deyiləmsə də, hər halda şagirdliyə qəbul edilmişəm. Elə deyilmi?



## VI

## ƏLAHƏZRƏT KRAL XIII LÜDOVİK

Bu hadisə yaman hay-küyə səbəb olmuşdu. Cənab de Trevil üzdə öz muşketyorlarını danlayır, dalda isə onları alqışlayırdı. Təxirsiz kralın yanına getmək lazım idi. Cənab de Trevil tələsik Luvra getdi. Ancaq o gecikmişdi. Kardinal kralın yanında idi. Cənab de Trevilə dedilər ki, kral məşğuldur və bu saat onu qəbul edə bilməyəcəkdir.

Axşam kral qumar oynadığı zaman de Trevil gəldı. Kral udmuşdu. Əlahəzrət çox xəsis adam olduğundan, indi kefi kök idı. O, cənab de Trevili görüb dedi:

– Buyurun bura, cənab kapitan, buyurun. Mən sizi danlamalıyam. Xəbəriniz varmı ki, kardinal mənə sizin muşketyorlardan şikayət etmişdir? O qədər *həyəcanlanmışdı ki, axşam hətta azarlamışdır.* Belə məlum olur ki, sizin muşketyorlar əsl şeytan və asılmağa layiq adamlardır!

De Trevil birdən-birə işin nə yerdə olduğunu görüb cavab verdı:

– Xeyr, hökmdar, xeyr, əksinə, muşketyorlar quzu kimi dinc və sakit uşaqlardır. Mən zənnınam ki, onların yalnız bircə arzuları var, o da yalnız siz əlahəzrətin xidmətində qılınc çəkməkdən ibarətdir Ancaq nə çarə? Cənab kardinalın qvardiyaçıları həmişə muşketyorlara sataşırlar və yazıq cavanlar alayın şərəfini qorumaq üçün özlərini müdafiə etməyə məcbur olurlar.

Bura baxın, cənab de Trevil. Sizin danışığınızdan belə çıxır ki, guya muşketyorlar bir monax cəmiyyətinə mənsub adamlarmış. Doğrusu, mehriban kapitan, mən istəyirəm ki, sizin kapitanlıq patentinizi alıb, abbatlıq vəd etdiyim de Şemro xanıma verim. Ancaq elə güman etməyin ki, sizin sözlərinizə inandım. Mənə nahaq yerə Adil Lüdovik adı qoymayıblar, cənab de Trevil! Bu saat biz məsələni həll edərik.

· Məhz bu ədalətinizə güvənib əlahəzrətin qərarını sakit və səbirlə dinləməyə hazıram.

Kral dedi:

Gözləyin, cənab kapitan. Mən sizi ləngitməyəcəyəm.

Doğrudan da, qumar oyununda əl dəyişmişdi. Kral udduqlarını yavaş-yavaş uduzmağa başladığını görüb, oyunu tərk etməyə məmnun idi. O, ayağa qalxıb qabağındakı pullarını cibinə qoydu və dedi:

– Le Vyevil, mənim yerimdə oturun, mənim cənab de Trevil ilə mühüm bir iş barəsində söhbətim var. Bəli!.. Mən səksən luidor udmuşam, siz də bu qədər pul qoyun ki, uduzanlar narazı qalmasınlar. Ədalət hər şeydən vacibdir.

Sonra o, de Trevilə dönüb onunla birlikdə pəncərəyə yaxınlaşdı və soruşdu:

– Deməli, sizin sözlərinizə görə kardinal həzrətlərinin qvardiyaçıları sizin muşketyorlara sataşmışlar. Eləmi?

Bəli, əlahəzrət, onlar həmişə belə edirlər.

Bəs bu iş necə baş vermişdir? Siz bilirsiniz ki, möhtərəm kapitan, hakim gərək hər iki tərəfin sözlərini dinləsin.

Vallah, iş ən sadə və təbii bir surətdə baş vermişdir Mənim ən yaxşı əsgərlərimdən üç nəfəri, adları siz əlahəzrətə məlum olan Atos, Portos və Aramis cavan bir qaskoniyalı əsilzadə ilə gəzməyə çıxıblarmış. Gərək ki, əhvalat Sen-Jermen tərəfdə baş verib. Onlar Karmelitlər monastırı yanında görüşməyə şərtləşiblərmiş. Birdən de Jüssak, Kayuzak, Bikara və başqa iki nəfər də qvardiyaçı böyük bir dəstə ilə, şübhəsiz, pis bir niyyətlə, ora gəlib onları narahat etməyə başlayıblar.

Kral dedi:

Aha! Doğrudan da, onlar yəqin ki, ora vuruşmağa gəliblərmiş.

Mən onları taqsırlandırmıram, hökmdar! Ancaq xahiş edirəm əlahəzrət özü mülahizə etsin, beş nəfər əli silahlı adam Karmelitlər monastırının ətrafı kimi tənha bir yerə nə üçün getmiş ola bilər?

– Siz haqlısınız, Trevil, haqlısınız.

Onlar mənim muşketyorlarımı görən kimi öz niyyətlərini yerinə yetirmişlər. Əlahəzrətə məlumdur ki, muşketyorlar krala, yalnız krala tabedirlər. Onlar cənab kardinala tabe olan qvardiyaçıların qəddar düşmənidir.

Kral kədərli halda dedi:

Bəli, Trevil, bəli, bu çox kədərli bir haldır. İnanın ki, Fransada iki firqə var. Krallığın iki başı var. Ancaq buna nəhayət veriləcəkdir, Trevil. Deməli, sizin sözlərinizə görə qvardiyaçılar muşketyorlara sataşıblar, eləmi?

– Mən düşündüyümü söyləyirəm, hökmdar, ancaq buna and içə bilərəm. Əlahəzrətə məlumdur ki, həqiqəti aşkara çıxarmaq çox çətin bir məsələdir. Bunu yalnız ecazkar bir nüfuzi-nəzərlə müəyyən etmək olar ki, buna görə də XIII Lüdovik Adil adlandırılmışdır...



Siz haqlısınız, Trevil, ancaq sizin muşketyorlar tək olmayıblar.

– Bəli, hökmdar. Üç kral muşketyoru, bir də ki, cavan oğlan, o da lap uşaqdır, cənab kardinalın ən qorxunc qvardiyaçılarından beş nəfərinin qarşısında nəinki özlərini qoruya biliblər, hətta onlardan dördünü oradaca yerə səriblər. Əlahəzrət, mən əlavə etməliyəm ki, muşketyorlardan biri əvvəlcədən yaralı idi.

Bu ki qələbədir! Heyran qalmış kral çığırdı. Tam qələbədir!

Bəli, hökmdar. Özü də Se körpüsü yanında olan qələbə kimi tam, əsl qələbə

Deməli, dörd nəfərmişlər, bunların da biri yaralı, biri də uşaq, eləmi?

– Bəli, o, gənclik yaşına hələ yenicə qədəm qoymuşdur. Özü də elə bir şücaət göstərmişdir ki, mən onu əlahəzrətə təqdim etmək cürətini öz üzərimə götürürəm.

O cavanın adı nədir?

D'Artanyandır, əlahəzrət. O, mənim köhnə dostlarımdan birinin, əlahəzrətin rəhmətlik atası zamanında dini müharibədə iştirak etmiş bir adamın oğludur.

Deyirsiniz ki, bu cavan oğlan özünü çox yaxşı aparmışdır, eləmi? Əhvalatı başdan mənə səliqə ilə danışın, Trevil. Siz bilirsiniz ki, mən döyüş barəsində söhbətləri xoşlayıram.

XIII Lüdovik bu sözləri söyləyib qürurla bığlarını eşdi və əlini belinə vurdu.

*Trevil sözünə davam etdi:*

Hökmdar, hüzurunuza ərz etdiyim kimi, cənab d'Artanyan, demək olar ki, uşaqdır. O, hələ muşketyorluq şərəfinə nail olmayıb. Buna görə də onun əynində adi bir paltar imiş. Cənab kardinalın qvardiyaçıları düşmənlərindən birinin çox cavan olduğunu, həm də alaya mənsub olmadığını görüb, muşketyorlara hücum etməzdən əvvəl *onun çıxıb getməsini xahiş etmişlər...*

Kral onun sözünü kəsib dedi:

Özünüz görürsünüz ki, Trevil, hücuma onlara başlayıblar.

Elədir ki, var, əlahəzrət. Deməli, bu barədə daha heç bir şübhə qalmır. Bəli, qvardiyaçılar ondan xahiş ediblər ki, çıxıb getsin. Ancaq cavan onlara cavab verib ki, o qəlbən muşketyordur, ürəkdən siz əlahəzrətə sadiqdir, buna görə də cənab muşketyorların arasında qalır.

– Nə yaxşı oğlanmış! kral pıçıldadı.

– Doğrudan da, o, muşketyorlar arasında qalır və həmin bu şanlı döyüşçü cənab de Jüssaka dəhşətli bir yara vurur kı, bu da cənab kardınalı belə qəzəbləndirmişdir.

- Jüssakı yaralayan odurmu? - kral həyəcanla soruşdu. O uşaqmı? Trevil, bu mümkün olan şey deyil!

– Bu, məhz əlahəzrətin hüzuruna ərz etdıyım kımi olmuşdur.

Axı Jüssak krallıqda ən yaxşı döyüşçülərdən biridir!

Bəli, hökmdar! O, layiq bir rəqibə rast gəlmişdir.

Mən o cavan oğlanı görmək istəyirəm, Trevil, mən onu görmək ıstəyırəm və əgər onun üçün bir neçə şey etmək mumkün olsa, biz qeydinə qalarıq.

Əlahəzrət onu nə zaman qəbul etmək niyyətindədir?

Sabah günorta, Trevil.

Onu təkmi gətirim?

Yox, dördünü də gətirin. Mən onların hamısına bır yerdə təşəkkür etmək ıstəyirəm. İndı sadiq adamlar azdır, Trevil və sədaqət gərək mükafatlandırılsın.

– Günorta biz Luvrda olarıq, əlahəzrət.

Hə, hə! Kiçik qapıdan gəlın, Trevil, kiçik qapıdan. Gərək kardinal bunu bilməsin.

Baş üstə, əlahəzrət!

– Başa düşürsünüzmü, Trevil, qanun həmişə qanundur. Axı hər necə olsa da, vuruşmaq qadağan edılmişdir.

- Lakin, hökmdar, bu vuruşma əsla duelə bənzəmir. Bu – ıkı dostə arasında olan toqquşmadır. Axı onlar üç muşketyorla cənab d'Artanyanın müqabilində beş nəfər qvardiyaçıdan ibarət imiş.

Kral dedi:

– Doğrudur. Ancaq hər halda, Trevil, kiçik qapıdan gəlin.

Trevil gülümsündü. Ancaq onsuz da kralı kardinala qarşı qəzəb ləndirməklə çox şey qazanmış olduğundan, krala hörmətlə təzim etdi və ondan icazə alıb getdı.

Həmin axşam üç muşketyora onları gözləyən şərəfli görüş barəsində xəbər verildı. Onlar kralı çoxdan tanıdıqlarından, bu xəbər cavan muşketyorları çox da həyəcanlandırmadı. Ancaq qaskoniyalı xə yalpərvərliyinə malik olan d'Artanyan bu dəvətdə öz gələcək səadətini görürdü və bütün gecə onun gözünə zərli-bəzəkli röyalar göründü. Səhər saat səkkızdə o, artıq Atosun yanında idi. D'Artanyan muşketyoru geyinmiş və evdən çıxmağa hazır gördü. Onlar gərək düz günorta kralın yanına gedəydilər. Atos, Portos və Aramis sözləşmışdi ki, Lüksemburq tövlələrinin yaxınlığındakı oyun yerində top oynamaga getsinlər. Atos d'Artanyanı da özü ilə dəvət etdi. D'Artanyan bu oyunu bilmirdısə, günortaya qədər vaxtını bir təhər keçirmək üçün təklifi qəbul etdı.



Portos ılə Aramıs artıq orada ıdılər və oyuna başlamışdılar. Bədən tərbiyəsinə aid bütün oyunlarda çox mahir olan Atos d'Artanyanla birlıkdə onlara qarşı oyuna qoşuldular. Atos sol əli ilə oynadısa da, birinci hərəkətdən sonra hiss etdı ki, onun yarası hələ belə hərəkətlər etmək üçün sağalmamışdır. D'Artanyan tək qalıb dedi ki, bu oyunu bütün qaydaları ilə oynamağı bacarmır; buna görə də udub-uduzmağı hesaba almadan eləcə top vurmağı qərara aldılar. Lakin Portosun nəhəng əli ılə atılmış bir top d'Artanyanın üzündən bir tük qədər aralı keçdı və o, başa düşdü kı, bu top onun üzünə dəysəydi, o daha kralın hüzuruna gedə bılməzdı Halbuki ona elə gəlirdi ki, kral ilə görüş bütün gələcəyını müəyyən edəcəkdır. O, nəzakətlə Portos və Aramisə baş əyib dedi kı, belə qüvvətli oyunçularla oynaya bilmək üçün özünü tamamilə hazırlıqlı bildıkdən sonra oynamağa başlayacaqdır.

D'Artanyanın bədbəxtliyındən tamaşaçılar arasında kardinal qvardiyaçılarından bır nəfər var ıdi. Bu qvardıyaçı öz yoldaşlarının dünənki məğlubiyyətindən yaman qəzəblənmış olduğundan özünə söz verimişdi ki, ilk fürsət düşən kımı onların ıntıqamını alacaqdır. O, bu fürsətin düşdüyünü güman edib, öz yanındakı adama müracıətlə dedi:

Bu cavan oğlanın topdan qorxması təəccüblü deyildir. Yəqin ki, muşketyorların şagirdidir.

D'Artanyan ılan vurmuş kimi döndü, bu sözləri söyləyən qvardiyaçının dik gözünün içinə baxdı.

Qvardiyaçı sözlərinə davam edib dedi:

Nə qədər kefinizdir mənə baxın, sözüm sözdür.

Sizin sözləriniz kifayət qədər aydın olub izaha ehtıyacı qalmadığından, d'Artanyan yavaşcadan ona cavab verdı, xahış edirəm ki, ardımca gələsınız.

Nə zaman? qvardiyaçı həmın istehzalı əda ilə soruşdu.

İstəsəniz, elə bu saat.

Bilirsinizmi mən kiməm?

- Yox, bilmirəm, bılmək də istəmirəm.

Nahaq yerə. Mənim adımı bilsəydiniz, yəqin ki, belə tələsməzdiniz.

– Adınız nədir?

– Adım Bernaju, qulluğunuzda hazıram.

Çox ola, cənab Bernaju, – d'Artanyan sakitcə davam etdi. Sizi qapının ağzında gözləyirəm.

Gedin, ardınızca gəlirəm.

– Tələsməyin, bilirsiniz ki, bizim işimizdə artıq şahidlərin olması yersizdir.

Yaxşı, qvardiyaçı cavab verdi və adının bu cavan oğlana təsir etmədiyinə təəccüb etdi.

Doğrudan da, Bernajunun adı bəlkə də bircə d'Artanyandan başqa hamıya məlum idi: Bernaju saysız-hesabsız vuruşmalarda iştirak etmişdi. Bu vuruşmaların qarşısını kral və kardinalın heç bir fərmanı ala bilmirdi.

Portos ilə Aramisin öz oyunlarına başı o qədər qarışmışdı, Atos isə oyuna elə diqqətlə tamaşa edirdi ki, onlar öz cavan yoldaşlarının nə vaxt çıxıb getdiyindən heç xəbər tutmadılar. Bir dəqiqə sonra qvardiyaçı da onun ardınca getdi.

D'Artanyan vaxtını itirə bilməzdi; çünki kralın hüzurunda görüş saat on ikiyə təyin edilmişdi. O, ətrafına göz gəzdirib küçənin boş olduğunu gördü və öz düşməninə dedi:

Hərçənd sizin adınız Bernajurdur, amma sizə xoşbəxtlik üz verib ki, muşketyorların yalnız şagirdinə rast gəlmisiniz. Amma arxayın olun ki, mən əlimdən gələni edəcəyəm; özünüzü qoruyun.

Qvardiyaçı dedi:

Mənə elə gəlir ki, seçdiyiniz yer çox da münasıb deyildir. Sen-Jermen abbatlığının ardında və ya Pre-o Klerdə vuruşsaydıq, daha münasib olardı.

– Sizin mülahizəniz tamamilə haqlıdır, d'Artanyan cavab verdi. Ancaq təəssüf ki, mənim vaxtım azdır; çünki düz günortaya görüş təyin etmişəm. Tez olun, özünüzü qoruyun, cənab, özünüzü qoruyun!

Bernajuya belə dəvəti təkrar etmək lazım deyildi. O saat qılıncı əlində parladı və o, öz düşməninin üstünə atıldı.

Dünənki qələbədən və öz özəl gələcəyindən qürurlanmış olan d'Artanyan bir addım da geri çəkilməməyi qərara aldı. Onların qılınc ları çarpazlaşdı. D'Artanyanın düşməni bir addım geri çəkilməyə



məcbur oldu. D'Artanyan bundan istifadə etdi, Bernajunun qılıncı xətdən kənara çıxdı. D'Artanyan bir həmlə edib düşmənini çiynindən yaraladı. Sonra bir addım kənara çəkilib qılıncını yuxarı qaldırdı. Ancaq Bernaju ona çığırdı ki, yarası boş şeydir, özün kor-koranə irəli atdı və özünü məğlub bilmədi. Yalnız de La Tremulun evinə sarı geri çəkilməyə başladı. Bu evdə onun əqrəbalarından biri qulluq edirdi. D'Artanyan düşməninə vurduğu yaranın nə qədər təhlükəli olduğunu bilmədən, onun üzərinə həmləyə davam edirdi və yəqin ki, üçüncü zərbə onu vurub öldürəcəkdi. Bu zaman qvardiyaçının iki dostu onun d'Artanyan ilə danışdığını və sonra ardınca bayıra çıxdığını görmüş olduqlarından, onlar da oyun oynanılan binadan bayıra yüyürüb qılınclarını çəkərək qalib gəlməkdə olan d'Artanyanın üstünə atıldılar. Ancaq bu zaman Atos, Portos və Aramis də göründülər. Bernaju yerə yıxıldı. Qvardiyaçılar: "Bura gəlin! Köməyə gəlin!" deyə çığırdılar. Onların bu səsinə La Tremulun evində olan bütün adamlar bayıra yüyürüb dörd yoldaşın üstünə düşdülər. Muşketyorlar da: "Bura gəlin, muşketyorlar!" deyə çığırmağa başladılar.

Adət üzrə belə çağırışa hamı qoşulmağa çalışırdı; çünki muşketyorların kardinal həzrətlərinə düşmən olduqlarını bilir və kardinala nifrət etdiklərinə görə hamı onları sevirdi.

Buna görə də Aramisin Qızıl Hersoq adlandırdığı kardinalın komandası altında onlardan başqa digər hissələrə mənsub olan qvardiyaçılar belə vuruşmalarda, adətən, kral muşketyorlarının tərəfini saxlardılar. Cənab Dezessarın bölüyünə mənsub olub oradan keçən üç qvardiyaçıdan ikisi dörd yoldaşın köməyinə gəldi, üçüncü isə "Bura gəlin, muşketyorlar, bura gəlin!" deyə çığıra-çığıra de Trevilin evinə sarı qaçdı. De Trevilin evi həmişəki kimi əsgərlərlə dolu idi və onlar hamısı öz yoldaşlarının köməyinə yüyürüşdü. Vuruşma ümumi hal aldı. Muşketyorlar qvardiyaçılardan çox idi. Kardinalın qvardiyaçıları və cənab de La Tremulun adamları geri çəkilib düşmənlərinin həyətə doluşmaması üçün darvazanı zorla bağlaya bildilər.

Muşketyorların və onların müttəfiqlərinin coşqunluğu son dərəcəyə çatmışdı. Onlar kral muşketyorlarına basqın etməyə cürət lənmiş cənab de La Tremulun adamlarının həyasızlığını cəzalan dırmaq üçün bu evi yandırıb-yandırmamaq məsələsini müzakirəyə başladılar. Bu təklif böyük bir həyəcanla qəbul edildi. Ancaq xoşbəxtlikdən saat on biri vurdu. D'Artanyan və onun yoldaşları

görüşü yadlarına saldılar. İstəmirdilər ki, belə şən bir əyləncə onlarsız baş tutsun. Buna görə də yoldaşlarını bu fikirdən daşındırdılar. Darvazaya bir neçə iri daş atdılar, darvaza davam gətirdi. Bu, hücum edənlərin coşqunluğunu soyutdu. Bir də ki, əsl səbəbkarlar artıq aradan çıxıb getmişdilər. Muşketyorlar cənab de Trevilin evinə getdilər. De Trevil artıq əhvalatdan xəbərdar idi.

Kapitan muşketyorlara dedi.

– Tez olun, Luvra, tez olun, bir dəqiqə də itirmədən Luvra gedək və hələ kardinal kralı xəbərdar etməmiş onu görməyə çalışaq. Biz ona belə məlumat verərik ki, bu əhvalat dünənki hadisənin mabədidir və hər iki iş onda birləşmiş olar.

Cənab de Trevil dörd cavanın müşayiəti ilə Luvra getdi. Ancaq muşketyorlar kapitanına xəbər verdilər ki, kral Sen-Jermen meşəsinə maral ovuna getmişdir. Bu xəbər kapitanı heyrət içində qoydu. De Trevilin təkidilə bu xəbəri ona iki dəfə təkrar etdilər. Dörd yoldaş gördülər ki, onların başçılarının üzü get-gedə kədərlənir.

De Trevil soruşdu:

– Əlahəzrət bu ova dünəndənmi hazırlaşmışdı?

Saray xidmətçisi ona xəbər verdi ki:

Xeyr, kapitan cənabları, bu gün səhər baş şıkarçı xəbər gətirdi ki, gecə meşədə bir maral görüblər. Kral əvvəlcə söylədi ki, ova getməyəcək, amma sonra bu ovda alacağı ləzzətdən əl çəkə bilməyib, yeməkdən sonra ova getdi.

– Kral kardinal ilə görüşmüşdürmü? cənab de Trevil soruşdu.

– Yəqin görüşmüşdür, saray xidmətçisi cavab verdi. – Səhər mən kardinalın karetasını gördüm. Onun hara getdiyini soruşdum, dedilər Sen Jermenə gedir.

Cənab de Trevil muşketyorlara dedi:

– O, bizi qabaqlamışdır. Mən bu axşam kralı görərəm, ancaq sizə tövsiyə edirəm ki, onun gözünə görünməyin.

Bu məsləhət ağıllı bir məsləhətdi, həm də bunu kralı çox yaxşı tanıyan adam söyləyirdi.

Cənab de Trevil öz evinə qayıdıb, bu qərara gəldi ki, onun üçün ilk olaraq şikayət etmək daha faydalıdır. O, cənab de La Tremula bir məktub yazıb xahiş etdi ki, cənab kardinalın onun evində olan qvardiyaçılarını qovsun, öz adamlarına da, muşketyorlara həyasızca hücum etdikləri üçün töhmət versin. Ancaq cənab de La Tremul cavab



verdi ki, şikayəti cənab de Trevil və onun muşketyorları deyil, o özü etməlidir; çünki muşketyorlar onun adamlarını yaralamış, üstəlik evini də yandırmaq istəyirmişlər. Bu əyanlar arasındakı mübahisə uzun çəkə bilərdi; çunki hər biri öz dediyinin üstündə duracaqdı. Cənab de Trevil bütün bunlara nəhayət vermək üçün bir tədbir tapdı. O, cənab de La Tremul ilə görüşməyi qərara aldı.

O saat cənab de La Tremulun evinə gedib ona xəbər göndərdi.

Hər iki əyan bir-birinə hörmətlə təzim etdi: çünki onlar düşmən olsalar da, eyni zamanda bir-birinin hörmətini gözləyirdilər. Bu dəfə cənab de Trevili cənab de La Tremul həmişəkindən soyuq qəbul etdi.

Cənab de Trevil ona dedi:

Möhtərəm cənab, bizim hər ikimizə elə gəlir ki, bir-birimizi kusdurmuşük. Mən də ona görə gəlmişəm ki, sizinlə birlikdə bu məsələni aydınlaşdıraq.

Cənab de La Tremul ona cavab verdi:

- Mən buna məmnuniyyətlə hazıram. Ancaq sizi xəbərdar edirəm ki, əhvalat mənə çox yaxşı məlumdur: təqsir sizin muşketyorlardadır.

Siz çox ədalətli və ağıllı bir adamsınız. Ona görə də əminəm ki, mənim təklifimi qəbul edəcəksiniz, cənab de Trevil ona müraciət etdi.

– Lütfən buyurun, sizi dinləyirəm.

Sizin mehtərinizin qohumu cənab Bernajunun halı necədir?

Çox pisdir, əlindən aldığı yüngül yaradan başqa ciyərindən də yaralanmışdır. Sağalmaq ümidi çox azdır.

– Yaralının huşu özündədirmi?

- Bəli.

Onda, zəhmət çəkin, onun yanına gedək və onu Allaha and verib xahiş edək ki, həqiqəti söyləsin. Özünə aid olan bu işdə mən onun özünü hakim seçirəm. O, nə desə, inanmağa hazıram.

Cənab de La Tremul bir dəqiqə fikrə getdi. Bundan daha ağıllı bir təklif ola bilməzdi. Razı oldu.

Hər iki əyan yaralının otağına getdilər. Bernaju onları görən kimi yataqdan qalxmaq istədi. Ancaq həddindən artıq zəif idi və qalxmaq üçün etdiyi hərəkət nəticəsində taqətini itirib huşsuz halda yatağa yıxıldı.

Cənab de La Tremul ona yaxınlaşıb burnuna bir dərman tutdu və onu özünə gətirdi. Cənab de Trevil onun yaralıya guya təsir etdiyini söyləmələrinə yol verməmək üçün, cənab de La Tremuldan xahiş etdi ki, cavan qvardiyaçıdan özü sorğu-sual etsin.

Cənab de Trevilin gözlədiyi kimi oldu. Bernaju həyat ilə ölüm arasında olduğundan, həqiqəti gizlətməyi ağlına belə gətirməyib, bütün əhvalatı əslində olduğu kimi danışdı.

Cənab de Trevilə də elə bu lazım idi. O, Bernajuya tezliklə şəfa arzu edib, cənab de La Tremul ilə vidalaşdı, evinə qayıtdı və dörd yoldaş üçün xəbər göndərdi ki, onları evində nahara gözləyir

Cənab de Trevilin evində ən seçmə adamlar yığışardı, əlbət ki, bunlar hamısı kardinalın əleyhinə olan adamlardı. Aydındır ki, süfrə başında olan bütün söhbətlər kardinal həzrətlərinin qvardıyaçılarının düçar olduqları iki məğlubiyyət barəsində idi. D'Artanyan hər iki vuruşmanın qəhrəmanı olduğu üçün onun üzərinə təbrik və alqışlar yağmaqda idi. Bu alqışlar və təbriklər barəsində Atos, Portos və Aramisin d'Artanyandan heç bir iddiaları yox idi; çünki bunlar mehriban yoldaşlar idi; həm də özləri çox tez-tez tərifləndiklərindən, bu təriflərin bir dəfə də öz yoldaşlarına qismət olmasına razı idilər.

Saat altıya yaxın cənab de Trevil bildirdi ki, Luvra getmək lazımdır. Ancaq əlahəzrətin təyin etdiyi görüş saatı keçmiş olduğundan o, kiçik qapıdan getmək əvəzinə dörd cavanla birlikdə dəhlizdə gözlədi. Kral hələ ovdan qayıtmamışdı. Bizim cavanlar bir yığın saray adamları ilə birlikdə yarım saata qədər gözlədilər, birdən-birə bütün qapılar açıldı, xəbər verdilər ki, əlahəzrət gəlir.

D'Artanyanın canına üşütmə düşdü. Bir dəqiqə sonra, yəqin ki, onun bütün gələcək müqəddəratı həll ediləcəkdi. Cavan qaskoniyalı kralın girəcəyi qapıdan gözünü çəkmirdi.

XIII Lüdovik qapıda göründü. Onun əynində tozlu ov paltarı, ayaqlarında uzunboğaz çəkmə, əlində bir qamçı vardı. İlk baxışdan d'Artanyan gördü ki, kral qəzəblidir.

Muşketyorlar tərəddüd etmədən irəli yeridilər. D'Artanyan arxada qaldı. Kral Atosu, Portosu və Aramisi üzdən tanıdığına baxmayaraq, bir kəlmə də danışmadan yanlarından ötüb keçdi. Sanki heç onları ömründə görməmişdi.

Kralın gözləri cəab de Trevilə zilləndi. Ancaq o, bu baxışlara elə mətanətlə dözüb durdu ki, ilk olaraq kral üzünü çevirdi. Sonra əlahəzrət deyinə-deyinə öz otağına getdi.

Atos gülümsəyərək dedi:

İş xarabdır. Bu dəfə bizə mükafat verməyəcəklər.

Cənab de Trevil muşketyorlara dedi:



– Məni burada on dəqiqə gözləyin, əgər on dəqiqəyə qayıtmasam, nahaq yerə gözləməyib evinizə gedin.

Cavanlar on dəqiqə, on beş dəqiqə, iyirmi dəqiqə gözlədilər, cənab de Trevil qayıtmadı. Onlar çox narahat və nigaran halda çıxıb getdilər.

Cənab de Trevil cürətlə kralın kabinetinə girdi, gördü ki, əlahəzrətin ovqatı yaman təlxdir. Kral kresloda oturub, qamçının sapını çəkməsinin boğazına döyəcləyirdi. Bu hal cənab de Trevilin soyuqqanlıqla əlahəzrətin kefini xəbər almasına mane olmadı.

Çox pisdir, cənab, çox pisdir, kral cavab verdi. Yaman darıxıram.

Bu darıxmaq, doğrudan da, XIII Lüdovikin ən davamlı bir xəstəliyi idi. Çox zaman saray adamlarından birini pəncərənin qabağına çağırıb deyərdi: "Cənab filankəs, gəlin bir yerdə darıxaq".

Cənab de Trevil krala dedi:

Necə? Əlahəzrət darıxırmı? Məgər siz bu gün ovdan ləzzət almadınızmı?

Yaxşı ləzzətdir! Vallah, hər şeyin dadı qaçıb, bilmirəm necə şeydir: ya heyvanın izi qalmır, ya da tulalar iy bilmək hissini itiriblər. Biz yekə bir maral gördük. Dalınca düşüb altı saat qovaladıq. Ona çatmağa az qalmışdı ki, elə Sen-Simon şeypuru dodaqlarına götürmək istəyirdi ki, birdən tulalar geri qayıdıb başqa bir heyvanın dalınca yüyürüşdülər. Mən daha quş ovundan da, bu ovdan da əl çəkməyə məcbur olacağam. Of, mən nə bədbəxt kralam, cənab de Trevil! Birce tərlanım qalmışdı, o da srağagün öldü.

Bəli, hökmdar, sizin məyusluğunuzun səbəbini başa düşürəm. Bu böyük fəlakətdir Ancaq mənə elə gəlir ki, sizin hələ bir xeyli qırğı, şahin və başqa ov quşlarınız var.

Ancaq bircə adam da yoxdur ki, onları öyrətsin. Daha əsl şikarçılar qalmamışdır. Ovdan bircə mənim başım çıxır, məndən sonra artıq hər şey qurtarıb gedəcək. Ovu yalnız cələ və tələ ilə tutacaqlar. Heç olmazsa, şagirdlər hazırlamağa vaxtım olaydı! Bu da ki, mümkün deyil! Cənab kardinal məni bir dəqiqə rahat qoymur. Başımın üstünü alıb, hey İspaniyadan, Avstriyadan, İngiltərədən uzun-uzadı danışır. Hə, yeri gəlmişkən, cənab de Trevil, kardinal barəsində deyim: mən sizdən narazıyam

Cənab de Trevil kralı çoxdan tanıyırdı. O bilirdi ki, bütün şikayətlər ancaq müqəddimədir. Kral öz-özünə ürək-dirək verirdi. O, məhz bu axırıncı məsələdən danışmaq istəyirdi.

– Mən bədbəxt əlahəzrətə xoş gəlməyən nə iş tutmuşam ki? ;ənab de Trevil bərk heyrətə düşmüş kimi soruşdu.

Kral cənab de Trevilin sualına dolayısı ilə cavab verib sözünə davam etdi:

– Siz öz vəzifənizi beləmi yerinə yetirirsiniz? Mən sizi ona görəmi muşketyorlara kapitan təyin etmişəm ki, onlar adamları öldürsünlər, bütün bir məhəlləni bir-birinə vursunlar və az qala bütün Parisi odlasınlar? Bir də ki, siz bütün bu işlər barəsində niyə mənə məlumat vermirsiniz? Ancaq, bəlkə də, – kral davam etdi, bəlkə də mən tələsirəm, yəqin ki, üsyankarlar həbs edilmişlər və siz də müqəssirlərin artıq məhkum edildiklərini mənə xəbər verməyə gəlmisiniz?

Hökmdar, cənab de Trevil sakitliklə cavab verdi, əksinə, mən gəlmişəm ki, məhkəmə qurulmasını xahiş edim.

Kimin əleyhinə? kral çığırdı.

– Böhtançılar əleyhinə, – cənab de Trevil cavab verdi.

– Bu təzə xəbərdir! kral dilləndi. Siz üç məlun muşketyorun, Atos, Portos və Aramisin, bir də o bearnlı qoçağın qudurmuş kimi yazıq Bernajunun üstünə düşüb onu ölümcül bir hala saldıqlarını və bu bədbəxtin indi yəqin ki, can verməkdə olduğunu inkarmı edirsiniz? Onların bütün bu işlərdən sonra hersoq de La Tremulun evini əhatə etdiklərini və yandırmaq istədiklərini inkarmı edirsiniz? Müharibə zamanında bəlkə də quqenotların evini yandırmaq böyük bir fəlakət olmazdı, ancaq sülh zamanında belə bir təşəbbüs çox pis işdir.

- Bütün bu əhvalatı əlahəzrətə kim danışmışdır? – cənab de Trevil sakitcə soruşdu.

– Bütün bu əhvalatı mənə kimmi danışmışdır? O adam ki, mən yatdığım zaman o oyaq olur, əyləndiyim zaman o işləyir, dövlətin daxilində və xaricində, Fransada və Avropada olan bütün işlərə rəhbərlik edir.

– Yəqin ki, əlahəzrət Allahı nəzərdə tutur? cənab de Trevil dilləndi. Çünki mən Allahdan başqa elə bir adam tanımıram ki, əlahəzrətdən yüksək ola.

Yox, cənab, mən krallığın istinadgahı, mənim yeganə dostum olan cənab kardinalı nəzərdə tuturam.

– Cənab kardinal hələ papa deyildir

– Siz bununla nə demək istəyirsiniz?



Onu demək istəyirəm ki, bircə papa günah edə bilməz və onun bu məsumluğu kardinala aid deyildir

– Siz demək istəyirsiniz ki, o məni aldadır? Siz demək istəyirsiniz ki, o mənə xəyanət edir? Siz onu taqsırlandırırsınızmı? Açıqca söyləyin, siz onu təqsirləndirirsinizmi?

Yox, hökmdar, ancaq mən deyirəm ki, kardinal özü aldanır, onun özünə də yanlış məlumat veriblər. O da əlahəzrətin muşketyorlarını haqsız təqsirləndirməyə tələsmiş və məlumatı pis bir mənbədən almışdır.

Taqsırlandıran de La Tremuldur, hersoq özüdür. Sizin buna cavabınız nədir?

Mən cavab verə bilərdim ki, hersoq özü bu işlə əlaqədardır və buna görə də o özü qərəzsiz bir şahid ola bilməz; ancaq mən bunu demirəm; mən hersoqu tanıyıram. O, nəcib bir əsilzadədir və hər cəhətdən ona inanıram, yalnız bir şərtlə, hökmdar!

O şərt nədir?

Xahiş edirəm ki, əlahəzrət onu çağırıb üz-üzə şahidsiz-flansız özü dindirsin.

Çox yaxşı! kral cavab verdi. Siz de La Tremulun bütün söyləyəcəklərinə razısınızmı?

Bəli, hökmdar.

– Onun bütün tələblərini yerinə yetirərsinizmi?

Əlbəttə.

La Şene! kral çığırdı. La Şene!

XIII Lüdovikin inanılmış saray xidmətçisi olan və həmişə onun qapısında duran La Şene kabinetə daxil oldu.

Kral ona dedi:

– La Şene, bu saat cənab de La Tremulun dalınca adam göndərin. Mən onunla danışmaq istəyirəm.

Əlahəzrət mənə söz verirmi ki, cənab La Tremuldan sonra o saat məni qəbul edəcək?

– Söz verirəm.

– Elə isə sabah görüşərik, əlahəzrət.

Sabah görüşərik.

Saat neçədə əmr edirsiniz, əlahəzrət?

Nə vaxt istəsəniz.

- Bəlkə mən çox tez gəldim? Qorxuram ki, əlahəzrəti yuxudan edəm.

Məni yuxudan etməkmi? Məgər mən yatırammı ki? Cənab, mən daha yatmıram. Mən hərdən azacıq mürgüləyirəm, vəssalam. Saat yeddidə gəlin. Amma əgər təqsir sizin muşketyorlarda olsa, onda özünüzü gözləyin!

– Əgər təqsir mənim muşketyorlarımda olsa, hökmdar, onlar əlahəzrətin ixtiyarına veriləcək və siz onlarla istədiyiniz kimi rəftar edərsiniz. Mənə görə başqa bir qulluğunuz yoxdurmu? Əlahəzrət nə əmr edirsə etsin, mən itaət etməyə hazıram.

Yoxdur, cənab, mənə nahaq yerə Adil Lüdovik adı qoymayıblar. Hələlik, sabah görüşərik, cənab, sabah görüşərik.

– Allah əlahəzrəti hifz etsin!

Kral nə qədər pis yatdısa, cənab de Trevil o gecə ondan da pis yatdı. O, axşamdan üç muşketyora və onların yoldaşına xəbər göndərdi ki, səhər saat yeddinin yarısında onun yanına gəlsinlər. Onları özü ilə bərabər aparıb, onlara heç bir şey barəsində təminat vermədi, heç bir şey vəd etmədi və gizlətmədi ki, onların müqəddəratı və bəlkə də hətta onun öz taleyi bir təsadüfdən asılıdır.

Onlara tapşırdı ki, kiçik qapının içində gözləsinlər. Əgər kralın onlara qəzəbi hələ soyumayıbsa, oradan çıxıb gedə bilərdilər və heç kəs onları görməzdi. Əgər kral onları qəbul etməyə razı olarsa, dallarınca adam göndərər.

Cənab de Trevil içəridə La Şeneyə rast gəldi. La Şene ona söylədi ki, dünən axşam hersoq de La Tremulu evdə tapmayıblar. Hersoq indicə gəlmişdir və kralın hüzurundadır.

Bu vəziyyət cənab de Trevilin çox xoşuna gəldi.

On dəqiqə keçmədi ki, kralın kabinetinin qapısı açıldı, hersoq de La Tremul oradan çıxdı. O, cənab de Trevilin yanına gəlib dedi:

Cənab de Trevil, əlahəzrət mənim dalımca adam göndərmişdi ki, dünən səhər evimin yanında baş verən əhvalatdan xəbər bilsin. Mən ona həqiqəti, yəni mənim adamlarımın müqəssir olduğunu və sizdən üzr istəməyə hazır olduğumu söylədim. Üzrümü qəbul edin və məni özünüzə dost tutun.

Cənab de Trevil ona dedi:

Cənab hersoq, mən sizin ürəyinizin düzlüyünə o qədər əmindim ki, əlahəzrətin hüzurunda sizdən başqa özümə bir müdafiəçi istəmədim. Görürəm ki, aldanmamışam. Mən sizə ona görə təşəkkür



edirəm ki, Fransada hələ haqlarında bütün sizin barənizdə söylədiklərimi səhv etmədən söyləmək olan kişilər qalıb

Qapının ağzında durub bu xoş sözləri eşitmiş kral birdən dedi:

– Yaxşı, yaxşı! Ancaq, Trevil, hersoqa söyləyin ki, mən də onun dostlarından olmaq istərdim, amma o, məni yaddan çıxarır, budur, üç ildir ki, onu görmürdüm. Ancaq dalınca adam göndərəndən sonra görmək müyəssər olur Bunu mənim adımdan ona söyləyin; çünki elə şeylər var ki, kral özü o barədə danışa bilməz.

Hersoq dedi:

Sizə təşəkkür edirəm, əlahəzrət. Ancaq inanın ki, sizə ən çox sədaqətli olan adamlar hər gün yanınızda gördüyünüz adamlar deyildir; əlbət ki, bu sözün cənab de Trevilə dəxli yoxdur.

Aha, siz mənim sözlərimi eşitdinizmi? Daha yaxşı, hersoq, daha yaxşı! kral lap qapının ağzına gəldi: Sizsinizmi Trevil? Bəs sizin muşketyorlar hanı? Srağagün sizə əmr etmişdim ki, onları gətirəsiniz. Bu əmrimi niyə yerinə yetirməyibsiniz?

Onlar aşağıdadır, hökmdar. Əgər, icazə versəniz, La Şene onları çağırar.

Bəli, bəli, bu saat gəlsinlər. Saat səkkizə az qalır, saat onda isə, mən bir adam gözləyirəm. Gedin, hersoq, ancaq yaddan çıxarmayın., hərdənbir gəlin. Buyurun, Trevil.

Hersoq təzim edib çıxdı. O, qapını açdığı dəqiqədə üç muşketyorla d'Artanyan pilləkənin başında göründülər.

Kral onları görüb dedi:

Bura gəlin, qoçaqlar, gəlin. Mən gərək sizi bir danlayam.

Muşketyorlar yaxın gəlib təzim etdilər. D'Artanyan hamıdan arxada gəlirdi.

Siz dörd nəfərsiniz, kral sözünə davam etdi. – İki gün ərzində kardinal həzrətlərinin yeddi qvardiyaçısını vurub cərgədən çıxarıbsınız, bu, həddindən artıqdır, cənablar, həddindən artıqdır! Əgər işlər belə getsə, kardinal həzrətləri üç həftədən sonra bütün bölüyünü təzələməli olacaq. Mən də duelin qadağan edilməsi barəsində fərmanı bütün ciddiyyətilə yerinə yetirməli olacağam. Bir qvardiyaçını cərgədən çıxarmağa sözüm yoxdur, ancaq yeddisi, təkrar edirəm ki, çoxdur, həddindən artıq çoxdur!

– Əlahəzrət özü görür ki, onlar nə qədər xəcalət çəkirlər və tutduqları işdən peşmandırlar, – de Trevil dilləndi.

– Onlar xəcalət çəkirlər və tutduqları işdən peşmandırlarmı? Hm, hm, kral davam etdi. Mən bu riyakarlara çox da etibar etmirəm. Xüsusən, bax onun o qaskoniyalı təhər-tövrünə heç etibarım yoxdur Bura buyurun, cənab!

D'Artanyan başa düşdü ki, bu lütf ona aiddir və xəcalət çəkə-çəkə irəli gəldi.

– Bəs siz mənə deyirdiniz ki, bu cavan bir oğlandır? Bu ki uşaqdır, cənab de Trevil, lap uşaqdır! Jüssaka elə dəhşətli zərbəni vuran həmin budurmu?

Hələ Bernajuya da iki məharətli zərbə vurmuşdur.

– Doğrudanmı?

Atos dilləndi:

Burası da var ki, əgər o məni Kayuzakın əlindən qurtarmasaydı, yəqin ki, bu gün əlahəzrətin hüzuruna hörmətkaranə təzim etmək şərəfinə nail ola bilməyəcəkdim.

Elə isə, bu bearnlı oğlan lap şeytandır, rəhmətlik atam demişkən, ventre saint gris[1].

Ancaq belə bir peşə ilə məşğul olan adam gərək xeyli kamzol yırtıb, xeyli qılınc sındırmış ola. Qaskoniyalılar isə həmişə yoxsul olublar. Elə deyilmi? La Şene, mənim bütün ciblərimi axtarın, görün orada qırx pistol taparsınızmı, əgər tapsanız bura gətirin. İndi isə, cavan oğlan, özün vicdanla söylə, əhvalat necə olmuşdur?

D'Artanyan bütün əhvalatı olduğu kimi söylədi. Kralı görmək sevincindən yata bilmədiyini, buna görə görüş vaxtından üç saat əvvəl dostlarının yanına gəldiyini, bir yerdə top oynamağa getdiklərini, topun üzünə dəyməsindən qorxduğunu, bu səbəbdən qvardiyaçının az qala həyatla vidalaşmalı olduğunu və əsla müqəssir olmayan cənab de La Tremulun da az qala evinin yandırılmalı olduğunu bir-bir nağıl etdi.

– Elə belədir ki var, – kral pıçıldadı. Bəli, hersoq da mənə belə nağıl etdi. Yazıq kardinal iki gündə yeddi adam itirmişdir. Ancaq, cənablar, daha bəsdir, eşidirsinizmi? Bəsdir! Siz Feru küçəsində məğlub olmanızın əvəzini artıqlamasılə çıxmışsınız. Siz razı qalmış olmalısınız.

Əgər əlahəzrət razı qalmışsa, biz də razıyıq.

[1] Fentre saint gris – fransızca tərcüməsi mümkün olmayan bir nidadır ki, mənası deyilmə vurğusundan asılı olaraq hiddət, təəccüb və yaxud heyrət deməkdir



– Bəli, mən razıyam, kral La Şenenin əlindən bir ovuc qızıl pul alıb d'Artanyanın ovcuna tökdü. – Bu da mənim razılığımın sübutu.

D'Artanyan qırx pistolu cibinə qoyub kral həzrətlərinə təşəkkür etdi.

Kral divar saatına baxıb dedi:

Yaxşı! Daha saat doqquzun yarısıdır, sədaqətinizə görə sizə təşəkkür edirəm, cənablar! Mən sizə arxayın ola bilərəm, deyilmi?!

Bəli, hökmdar! – dördü də birdən çığırdı. Əlahəzrətə lazım gəlsə, biz bədənimizin parça-parça edilməsinə hazırıq.

– Yaxşı, yaxşı, ancaq sapsağlam qalın. Bu halda siz mənə daha faydalı olarsınız. Trevil, kral yavaşcadan dilləndi, – sizin bölükdə boş yer yoxdur. Bu cavanı yeznəniz cənab Dezessarın qvardiya bölüyünə göndərin. Lənət şeytana, Trevil. Kardinalın təhər-tövrünün nə hala düşəcəyini təsəvvür edib sevinirəm. O lap dəli olacaq. Ancaq mənə nə! Mən ancaq ədalətlə iş görürəm!

Kral görüşün bitmiş olduğuna işarə ilə başını əydi. Trevil də çıxıb öz muşketyorlarına çatdı. Dostlar d'Artanyanın aldığı qırx pistolu aralarında bölüşdülər.

Kardinal isə, əlahəzrətin söylədiyi kimi, doğrudan da, yaman qızmışdı. Elə qızmışdı ki, bir həftə kral ilə qumar oynamağa gəlmədi. Bununla bərabər, kral onunla son dərəcə mehriban rəftar edirdi və hər dəfə ona rast gəldikdə ən nəzakətli bir səslə soruşurdu:

Hə, nə var, cənab kardinal, sizin yazıq Bernaju və yazıq Jüssakın kefləri necədir?

## VII

## MUŞKETYORLARIN EV MƏİŞƏTİ

D'Artanyan Luvrdan çıxıb öz payına düşən pulu nəyə sərf etməyi dostlarından soruşduqda, Atos məsləhət gördü ki, "Şam Qozası" yeməkxanasında gözəl bir nahar versin. Portos isə ona bir nökər tutmasını tövsiyə etdi.

Yeməyi həmin gün tərtib etdilər. Süfrəyə isə yeni nökər xidmət edirdi. Yemək Atosun sifarişi ilə hazırlanmışdı, nökəri isə Portos tapıb gətirmişdi. Nökər pikardiyalı idi. Şanlı muşketyor onu bu təntənəli hal üçün həmin gün Türnel körpüsündən tapıb gətirmişdi. Bu adam körpüdən suya tüpürüb əmələ gələn halqalara baxıb əylənirdi

Portos onun bu əyləncəsindən sakıt və müşahidəçi bir ağla malik olduğunu yəqin edib, daha heç bir tövsiyənaməyə ehtıyac görmədən, qulluğa götürmüşdü. Pikardiyalı onu qulluğa götürən əsılzadənin əzəmətlı görkəmini görüb sevinmiş və Planşe (pikardiyalının adı belə idi) elə güman etmişdi ki, əsilzadə onu öz yanına qulluğa götürür. Ancaq Portos ona söyləmişdi kı, təsərrüfatı iki nökər tutmağa ımkan vermır Buna görə də Planşe d'Artanyanın yanında xidmət etməlidir. Lakin Planşe ağasının verdiyi naharda iştirak edib onun pul verərkən cıbındən bir ovuc qızıl çıxartdığını gördükdə, arxayın olmuşdu ki, taleyi artıq təmin olunmuşdur və belə səxavətli bir ağanın yanında qulluq tapdığı üçün Allaha şükür etmişdi. O, yeməkdən artıq qalan şeylərlə uzun müddətdən bərı pəhriz çəkən qarnını doydurduqdan sonra da həmin bu fikirdə qalmışdı. Ancaq öz ağasının yatağını hazırladıqda, qızıl röyaları puça çıxdı. Bir dəhliz, bır də yataq otağından ibarət olan mənzıldəki bu yataq tək bircə dənə idi. Planşe d'Artanyanın yatağından götürdüyü yorğana bürünüb dəhlizdə yatdı və o zamandan d'Artanyan yorğansız qaldı.

Atosun da öz nökəri var ıdı. Bu nökəri o, xüsusı bır qayda ilə tərbiyə etmişdi. Nökərin adı Qrimo ıdi. Bu ləyaqətli əsılzadə tamamilə qaradinməz bir adam ıdı. Əsilzadə dedikdə, əlbət ki, biz Atosu nəzərdə tuturuq. Portos və Aramis ilə ən yaxın dostluq münasibətlərilə yaşadığı bu beş-altı il ərzində yoldaşları tez-tez onun gülümsədiyini görmüşdülər, ancaq heç bır zaman güldüyünü görməmişdilər. Onun danışıqları qısa və dəqiq olardı. Həmişə demək istədiyindən artıq bir söz işlətməzdi. Sözlərinə əsla bəzək-düzək vurmazdı. O ancaq əsas hadisələri danışıb təfərrüata varmazdı.

Atosun yaşı otuz, özü də tamamilə gözəl və ağıllı bır adam idisə də, sevgilisi yox idi. Özü heç bir zaman qadınlardan danışmazdı. Yanında qadınlar barəsində söhbət edilməsinə mane olmazdısa da, ancaq aşkar duyulardı ki, belə söhbətlər xoşuna gəlmir Belə söhbətlərə qarışanda da yalnız acı bır söz söylər, ya da kı, nıfrətlı bır mülahizə edərdi. Yovuşmazlığı və qaradinməzliyı onu lap qocaya bənzədirdi. Öz vərdişlərını pozmamaq üçün o, Qrimonu da əlinin və ya dodaqlarının sadə bir hərəkətinə tabe olmağa öyrətmişdi.

Öz ağasına çox sədaqətli olan və ondan oddan qorxan kimi qorxan Qrimo ağasının arzusunu dürüst başa düşdüyünü güman edib, əmri tez yerinə yetirməyə tələsırdı və çox zaman onun istədiyinın tamamilə əksinə



edirdi Belə hallarda Atos çiyinlərini qaldırar və çox da qəzəblənmədən Qrımonu kötəklərdi. Axır günlər ağası bir az dilli-ağızlı olmuşdu.

Oxuculara məlum olduğu kımi, Portosun xasıyyəti isə tamamilə tərsinə idi. O, həm çox, həm də ucadan danışardı. Ancaq bu barədə ona haqq vermək lazımdır; çünki o danışarkən dinləyən olub-olmadığına fikir verməzdi. Ancaq danışmaqdan və öz səsini eşıtməkdən zövq almaq xatırınə danışardı. Elmdən başqa hər barədə danışardı; çünki özünün də boynuna aldığı kımi lap uşaq yaşlarından alimlərdən yaman zəhləsi gedərdi. Onun görkəmi Atos qədər əzəmətli deyildi. Atosun daha üstün olması tanışlıqlarının ilk zamanlarında Portosun ona qarşı bəzi haqsız hərəkətlərinə səbəb olmuşdu. O, heç olmasa paltarının gözəlliyilə yoldaşını ötüb keçməyə cəhd edərdi. Ancaq Atos adi muşketyor plaşında da başını dık qaldırıb ayağını irəli atmaq kimi bircə hərəkətilə özünə layiq olan mövqeyi tutub Portosu kölgədə qoyardı. Portos cənab de Trevilin dəhlizində və Luvr sarayının hərbi mühafizlər otağında öz eşq şücaətləri barəsində ucadan danışıb lovğalanmaqla özünə təsəlli verərdi. Atos isə bu barədə heç bir zaman danışmazdı.

Köhnə bir atalar sozündə deyilir ki, "Ağa ilə nokərin torpağı bir yerdən götürülmüşdür", buna görə də Atosun nökərindən sonra Portosun nökərindən, yəni Qrimodan sonra Muşketondan danışaq.

Muşketon normandiyalı idi. Onun əsl adı Bonifas idisə də ağası bu adı xeyli ahəngdar olan Muşketon adı ilə əvəz etmişdi. O, Portosun yanına bu şərtlə qulluğa girmişdi ki, ağası ona yalnız paltar, bir də mənzil versin. Ancaq hər ikisi gözəl olsun. Bunlardan başqa o, gündə özünə ikicə saat vaxt istəmişdi ki, qalan ehtiyaclarını ödəmək üçün öz peşəsilə məşğul olsun. Portos bu şərtləri qəbul etmışdi və bu şərtlər onun üçün olduqca əlverişli idi. O, öz köhnə paltar və plaşlarını dərziyə verib Muşketon üçün kamzol tikdirirdi. Məharətli bir dərzinin əlində tərsinə çevrilən bu cır-cındır yararlı paltar halını alırdı. Buna görə də Muşketon həmişə səliqə ilə geyinirdi.

Aramisə gəlincə, onun şəxsiyyətını, gərək ki, biz kifayət qədər təsvir etmişik. Ancaq həm onun, həm də yoldaşlarının xasiyyətlərinin ınkişafını hələ gələcəkdə təqib edəcəyik. Onun nökərinə gəlincə, əvvəlcə qeyd edək ki, adı Bazen idi. Ağası tez-gec ruhaniliyə daxıl olmaq niyyətində olduğundan nökər həmişə ruhanilərin nökərinə yaraşan kimi qara paltar geyərdı. Bu nökər otuz beş-qırx yaşlarında, mülayim, dinc və ətli-canlı bir berriyalı idi. Vaxtının

çoxunu dini kitablar oxumağa sərf edər və yeri gələndə iki nəfər üçün yaxşı yemək hazırlamağı da bacarardı Bu adam artıq-əskik danışmaz, ora-bura nəzər salmaz, heç bir sözə qulaq asmaz və son dərəcə sədaqətli idi.

İndi, azacıq da olsa, ağalar və nökərlər ilə tanış olduqdan sonra onların mənzillərinə gələk.

Atos Feru küçəsində, Lüksemburq sarayının yaxınlığında kiçik, ancaq səliqəli və içərisində müxəlləfat olan iki otaqdan ibarət bir mənzildə yaşayırdı. Bu mənzilin sahibi cavan və kifayət qədər gözəl olan qadın ona nə qədər göz qaş edirdisə, bir şey çıxmırdı. Onun bu sadə mənzilinin divarlarında orada-burada keçmiş dəbdəbənin bəzi əlamətləri gözə çarpırdı. Məsələn, divarlardan birində Fransisk zamanına aid gözəl bir qılınc asılmışdı. Bu qılıncın təkcə qəbzəsində olan qiymətli daş-qaşların dəyəri iki yüz pistoldan artıq olardı. Ancaq ən ağır ehtiyac içərisində olan dəqiqələrdə də Atos bunu satmağa və girov qoymağa razı olmazdı. Portos xeyli müddət bu qılıncın təmənnasında olmuşdu. Bu qılınca malik olmaq üçün o, ömrünün on ilindən keçməyə razı olardı

Hətta bir dəfə Portos bir hersoq arvadı ilə görüş təyin etdiyi zaman Atos bircə kəlmə də danışmayıb, pul kisəsində olan var-yoxunu, qızıl zəncirini, akselbantlarını yığıb Portosa təklif etmişdi. Qılınca gəlincə, Portosa demişdi ki, asıldığı yerindən ancaq sahibi mənzildən köçdüyü zaman çıxarıla bilər. Qılıncdan başqa divarda bir şəkil də var idi. Bu şəkil III Henrix dövründə yaşamış olan, çox gözəl geyinmiş və döşündə müqəddəs ruh ordeni olan bir əyan şəkli idi. Bu şəklin Atosa nə isə bənzəyən, ailəvi cəhətdən müştərək bir cəhəti var idi ki, bu da kral ordenləri kavaleri olan həmin bu əyanın Atosun babalarından biri olduğunu göstərirdi. Nəhayət, buxarının üstündə gözəl nəqşəli bir mücrü var idi. Bu mücrünün üstündə də qılınc və şəkildə olan həmin gerb nəqş edilmişdi. Bu mücrü otağın qalan şeylərindən çox seçilirdi. Atos bu mücrünün açarını həmişə öz yanında gəzdirirdi. Bir dəfə o, Portosun yanında mücrünü açdı və Portos gördü ki, içində ancaq məktublar və kağız var. Yəqin bunlar aşiqanə məktublar və ailəyə aid kağızlar idi.

Portos "Köhnə Göyərçin hini" küçəsində, zahirən çox yaraşıqlı, çox geniş bir mənzildə yaşayırdı. Hər dəfə o, bir dostu ilə öz pəncərəsinin qabağından keçdikdə, başını və əlini yuxarı qaldırıb deyərdi:



"Budur, mənim mənzilim buradadır!" Pəncərənin qabağında isə həmişə Muşketon yaraşıqlı rəsmi geyimdə durmuş olardı. Ancaq Portosu heç bir zaman evdə tapmaq olmazdı. O, heç kəsi evinə çağırmazdı və heç kəs bu zahiri gözəlliyin altında olan həqiqi zənginliyin nədən ibarət olduğunu bilməzdi.

Aramisin isə, dəhliz, yemək otağı və yataq otağından ibarət kiçik bir mənzili var idi. Bu otaqlar aşağı mərtəbədə olub, qapısı həmişə yamyaşıl, kölgəlikli və qonşuların gözündən iraq bir bağçaya açılırdı.

D'Artanyanın isə, özünə necə bir mənzil tapdığı biz artıq bilirik və onun nökəri cənab Planşe ilə tanış olmuşuq.

İntriqa meylində olan bütün adamlar kimi, hər bir şeylə maraqlanan d'Artanyan Atos, Portos və Aramisin əslində kim olduqlarını bilmək üçün çox çalışırdı; çünki bu qondarma adlar altında bu cavanların hər biri öz həqiqi familiyasını gizlətmişdi. Qaskoniyalını xüsusən, üzündən əsilzadəlik yağan Atosun əsil familiyası çox maraqlandırırdı. Buna görə də d'Artanyan Atos və Aramis barəsində məlumat almaq üçün Portosa, Portos barəsində məlumat almaq üçün isə Aramisə müraciət etmişdi.

Çox təəssüf ki, Portos öz qaradinməz yoldaşı barəsində hamıya məlum olan şeylərdən atıq heç nə bilmirdi. Deyirdilər ki, o, eşq aləmində böyük bir fəlakətə düçar olub və dəhşətli bir xəyanət onun bütün həyatını zəhərləmişdi. Bu xəyanətin nədən ibarət olduğunu isə heç kəs bilmirdi.

Portosa gəlincə, onun həqiqi adı, iki yoldaşının adı kimi, yalnız cənab de Trevilə məlum idi. Onun həyatının qalan cəhətlərində isə heç bir sirli şey yox idi. O, şöhrətpərəst idi; təvazökarlığı sevmirdi.

Aramisə gəlincə, zahirən elə görünürdü ki, heç bir sirri yoxdur. Əslində isə, həyatı sirlər ilə dolu idi. O, başqaları barəsində suallara könülsüz cavab verər, öz barəsindəki suallardan isə boyun qaçırardı. Bir dəfə d'Artanyan ondan Portos barədə ətraflı sorğu-sual edib, Aramisin öz aşiqanə əlaqələri barədə bir şey öyrənmək istəmişdi.

O, Aramisə demişdi:

- Əziz dostum, siz Portosun baronessa, qrafinya və prinsessa xanımlarla olan müaşiqələrindən danışırsınız, bəs özünüz neyləyirsiniz?

Aramis onun sözünü kəsib demişdi:

Bağışlayın, mən bunları ona görə danışdım ki, Portos özü bunları gizlətmir; çünki o özü mənim yanımda, bu barədə çığıra-çığıra da-

nışmışdır. Ancaq, əzizim, d'Artanyan, arxayın olun, əgər mən bunları başqa mənbədən öyrənmiş olsaydım və əgər mənə bunu bir sırr kimi inanıb söyləmiş olsaydılar, bir rahib kimi qaradinməz olardım.

Buna şübhə etmirəm, – d'Artanyan cavab vermişdi. Ancaq mənə elə gəlir ki, özünüz də gerblər ilə kifayət dərəcədə tanışsınız. Sübutu da məşhur nəqşəli yaylıqdır ki, onun vasitəsilə sizinlə tanış olmaq şərəfinə nail olmuşam.

Bu dəfə Aramis qəzəblənməmişdi Ancaq ən təvazökar bir hal alıb, mulayim əda ilə cavab vermişdi:

Əziz dostum, unutmayın ki, mən ruhani olmağa hazırlaşıram və hər bir dünyəvi münasibətdən çəkinirəm. Gördüyünüz o yaylıq isə mənə verilməmişdi Bir dostumun yadından çıxıb məndə qalmışdı. Həmin adamı və onun sevdiyi qadını rüsvay etməmək üçün bu yaylığı götürüb saxlamağa məcbur olmuşdum. Özümə gəlincə, heç bir sevgilim yoxdur və olmasını da istəmirəm. Bu cəhətdən Atosa təqlid edirəm: onun da sevgilisi yoxdur.

Eh, lənət şeytana, axı indi siz muşketyorsunuz, abbat deyilsiniz.

Əzizim, mənim muşketyorluğum müvəqqətidir, kardinal demişkən, mən arzumun xilafına muşketyor olmuşam. Ancaq inanın ki, ürəkdən kilsə xadimiyəm. Kilsə xidmətinə girməli olduğum bir zamanda başıma kiçik bir macəra gəlmişdi... Ancaq bu sizi maraqlandıra bilməz; bir də ki, mən sizin qiymətli vaxtınızı alıram.

Əsla yox, bu mənim üçün çox maraqlıdır, – d'Artanyan çığırmışdı, – indi mənim heç bir işim yoxdur.

Elədir, ancaq mənim dua oxumaq vaxtım çatmışdır, deyə Aramis cavab vermişdi. – Sonra gərək xanım d'Egilyonun xahişinə görə bir şer yazım, ondan sonra da Sent-Onore küçəsinə gedib xanım de Şevröz üçün ənlik-kirşan alam. Görürsünüz ki, əziz dostum, siz tələsməsəniz də, mən çox tələsirəm.

Bu sözlərdən sonra Aramis mehribanlıqla əlini cavan dostuna uzadıb onunla xudahafizləşmişdi.

D'Artanyan nə qədər çalışdısa, öz yeni dostları barədə artıq heç bir şey öyrənə bilmədi. O, hələlik onların keçmişi barəsində söylənilən bütün şeylərə inanmağı qərara alıb ümid edirdi ki, gələcəkdə daha düzgün və daha ətraflı məlumat toplaya bilər.

Cavanlar günlərini çox şən keçirirdilər. Atos qumar oynayır və həmişə də əli bəd gətirirdi. Ancaq heç bir zaman dostlarından bir



quruş da borc almazdı. Öz pul kisəsi isə, həmişə yoldaşlarına açıqdı. Qumarı nisyə oynadıqda isə, borclu olduğu adamı səhər saat altıda yuxudan oyadıb gecə uduzduğu pulları gətirib verərdi.

Portosun halı isə tamamilə başqa cür idi. O udduğu zaman əliaçıq və səxavətli olardı, uduzanda isə, bir neçə gün gözdən itib sonra rəngi solmuş, taqətdən düşmüş halda qayıdıb gələr, amma cibi dolu olardı.

Aramisə gəlincə, o, heç bir zaman qumar oynamazdı. O, yarıtmaz bir muşketyor və süfrə başında ən darıxdırıcı bir qonaq idi. Həmişə başı qarışıq olardı. Gah yemək zamanı yoldaşları şərab içib qızğın söhbət etdikləri halda, süfrə başında hələ iki-üç saat da oturmaq istərkən Aramis saatına baxıb mehriban bir təbəssümlə ayağa qalxar, camaatla xudahafizləşər və dediyinə görə, guya görüş təyin etdiyi bir ruhani ilə məsləhətləşməyə gedərdi. Bəzi vaxtlar isə, dissertasiya yazmaq üçün evinə qayıdar və yoldaşlarından da xahiş edərdi ki, ona mane olmasınlar.

Belə hallarda Atos həzin bir təbəssümlə gülümsər və bu təbəssüm onun alicənab simasına yox yaraşardı. Portos and içər, deyərdi ki, Aramis heç bir zaman keşişlikdən irəli gedə bilməyəcəkdir.

D'Artanyanın nökəri Planşe pul olanda, özünü yaxşı aparırdı. Bu zaman o, ağasından gündə otuz su pul alardı və bir ay müddətində evə gülər üzlə qayıdar, öz ağasına çox diqqətlə baxar və qulluq edərdi. Ancaq Mozarçılar küçəsində pis yellər əsməyə başladıqda, yəni kral XIII Lüdovikin verdiyi qırx pistol, demək olar ki, tamamilə xərclənib qurtardıqda, nökər şikayətlənməyə başlardı. Atos bu şikayətləri ürəkbulandırıcı, Portos ədəbsizlik, Aramis isə gülünc hesab edirdi. Atos d'Artanyana məsləhət görürdü ki, həyasızı rədd etsin, Portos məsləhət görürdü ki, əvvəl yaxşıca kötəkləsin, Aramis isə məsləhət görürdü ki, ağa gərək elə rəftar etsin ki, həmişə tərifə layiq olsun.

Danışmaq asandır, d'Artanyan onlara cavab verirdi. – Atos, siz Qrimo ilə həmişə lal kimi rəftar edib, onu danışmağa qoymursunuz, deməli ki, onunla heç bir zaman aranızda mübahisə olmayıb. Portos, siz bir əyan kimi yaşayırsınız və nökəriniz Muşketon sizə Allah kimi səcdə edir Nəhayət, Aramis, siz həmişə ilahiyyatla məşğul olub nökəriniz Bazenin dərin hörmətini qazanıbsınız. O, özü də dilsiz-ağızsız və dindar bir adamdır. Mənim isə nə mövqeyim var, nə pulum. Özüm də nə muşketyoram, nə də hətta qvardiyaçı. Bəs, mən necə edim ki, nökərim Planşe mənə rəğbət göstərsin, hörmət bəsləsin, ya da məndən qorxsun?

Məsələ ciddidir! – hər üç dost bir ağızdan cavab verdi. Bu ev, ailə məsələsidir. Nökərin də arvad kimi əvvəlcə gözünün odunu almalısan. Deməli, siz bu barədə düşünməlisiniz.

D'Artanyan düşünüb bu qərara gəldi ki, Planşeni əvvəlcə bir kötəkləsin və bunu da özünəməxsus bir səliqə ilə yerinə yetirdi Onu yaxşıca kötəkləyəndən sonra icazəsiz evdən çıxıb getməyi ona qadağan etdi və sonra dedi:

– Sən bilməlisən ki, mənim gələcəyim parlaqdır, mən mütləq işimin yaxşılaşacağını gözləyirəm; deməli sənin də xoşbəxt olacağın yəqindir. Bu şərtlə ki, mənim yanımda qalasan. Mən isə yaxşı bir ağa olduğumdan, sənin xoşbəxtliyinin pozulmasına razı ola bilmirəm. Buna görə də sənin xahişini yerinə yetirməyib səni buraxmıram.

D'Artanyanın bu cür hərəkət etməsi muşketyorların hörmətini artırdı. Planşe də onlar kimi öz ağasına məftun oldu.

Dörd cavanın həyatı müştərək bir hal almışdı. D'Artanyan özü üçün tamamilə yeni olan bir mühitə düşüb öz dostlarının vərdişlərini tez mənimsəmişdi.

Onlar qışda səhər saat səkkizdə, yayda isə altı radələrində yuxudan durub, parolu və işlərin vəziyyətini öyrənmək üçün cənab de Trevilin evinə gedərdilər. D'Artanyan muşketyor olmasa da, onların xidmətini həyəcanlı bir dürüstlüklə yerinə yetirərdi. O, həmişə növbədə olardı; çünki öz dostlarından hansı növbədə olsaydı, o da onun yanında qalardı. Muşketyorların evində də onu tanıyır və mehriban bir yoldaş sayırdılar. İlk baxışdan onu xoşlamış və bağlanmış olan de Trevil daim onun barəsində krala danışırdı.

Üç muşketyor da öz yoldaşlarını çox sevirdi. Bu dörd nəfəri bir-birinə bağlayan dostluq və hər gün gah duel üçün, gah bir iş üçün, gah da zövq almaq üçün üç-dörd dəfə görüşmək ehtiyacı daim kölgə kimi bir-birinin ardınca qaçmağa məcbur edirdi. Bir-birindən ayrılmayan bu yoldaşları həmişə Lüksemburq ilə Sen-Syulpis meydançası arasında, yaxud "Köhnə Göyərçin hini" küçəsilə Lüksemburq arasında bir-birini axtaran görərdin.

Yavaş-yavaş cənab de Trevilin vədləri yerinə yetməkdə idi. Bir dəfə kral cənab Dezessara əmr etdi ki, d'Artanyanı öz qvardiya bölüyündə kadetliyə qəbul etsin. D'Artanyan köksünü ötürərək bu mundiri əyninə geydi; onu muşketyor plaşı ilə əvəz etmək üçün ömrünün on ilindən keçməyə razı olardı. Ancaq cənab de Trevil ona bu



lütfün yalnız iki il təcrübədən keçdikdən sonra mümkün ola biləcəyini vəd edirdi. Bu imtahan müddəti yalnız o zaman qısaldıla bilərdi ki, d'Artanyan üçün krala bir xidmət etmək fürsəti düşəydi və ya bir işdə özünü göstərmiş olaydı. D'Artanyan bu vədlə özünə təsəlli verib ertəsi gün öz vəzifəsinə başladı.

Bundan sonra d'Artanyan ilə qarovula getmək növbəsi Atos, Portos və Aramisə düşdü. Belə ki, cənab Dezessarın bölüyündə d'Artanyanın daxil olması ilə dörd nəfər artmış oldu.

## VIII

## SARAY FİTNƏSİ

Dünyada hər şeyin bir əvvəli, bir də axırı olduğu kimi, kral XIII Lüdovikin verdiyi qırx pistolun da axırı çatdığı zaman bizim dörd yoldaş çox çətin bir vəziyyətə düşdü. Əvvəllər bir müddət Atos bütün yoldaşlarını öz hesabına saxladı. Atosdan sonra bunu Portos etdi. Yoldaşlarının alışdığı kimi, o bir dəfə də yox olub qayıdandan sonra iki həftə onların bütün zəruri ehtiyaclarını təmin edə bildi. Nəhayət, növbə Aramisə çatdı. O da öz yoldaşlarına kömək edib söylədi k, dini kitab satmaqdan bir neçə pistol qazanmışdır.

Bütün bunlardan sonra yoldaşlar, adət etdikləri kimi, kömək üçün cənab de Trevlə müraciət etdilər. O, maaşlarının hesabına bunlara bir qədər pul verdi. Ancaq bu pul köhnədən borcları olan üç muşketyora və hələ borcu olmayan bir qvardiyaçıya uzun müddət çatmadı. Axırda onların gəmisi, tamamilə, saya oturdu və onlar böyük bir çətinliklə səkkiz və ya on pistol pul toplayıb Portosa verdilər və o, qumar oynamağa getdi. Ancaq bədbəxtlikdən əli gətirmədi. On pistolun onunu da uduzduqdan sonra, əlavə iyirmi beş pistol da borcu qaldı.

Bu dörd yoldaşın çətin vəziyyəti əsl dilənçiliyə çevrildi. Ac muşketyorlar, dallarınca nökərləri bir dostlarının evində yemək tapmaq ümidilə şəhəri gəzməyə başladılar; çünki onlar, Atosun dediyi kimi, xoşbəxt olduqları zaman dost-aşnalarına bolluca qonaqlıq vermişdilər ki, bədbəxtlik üz verəndə bunun hesabına dolansınlar.

Atos dörd dəfə qonaq çağırıldı və hər dəfə öz yoldaşlarını da nökərlərilə bərabər apardı. Portos altı dəfə qonaq çağırılmağa

müvəffəq oldu. Onun yoldaşları da bu qonaqlıqdan istifadə etməkdə gecikmədilər. Aramısi səkkiz dəfə qonaq çağırdılar. İrəlidə qeyd etdiyimiz kimi, bu adam az danışıb, çox iş görərdi.

D'Artanyan paytaxtda heç kəsi tanımırdı. Buna görə də onu yalnız bircə dəfə öz yerlisi olan bir keşiş səhər yeməyinə, bir də qvardiya korneti nahara dəvət etmişdi. D'Artanyan öz qoşununu keşişin evinə apardı və bu ac adamlar keşişin bir aylıq şokolad ehtiyatını ötürdülər. Kornet isə, bunlara çox yaxşı bır qonaqlıq verdi. Ancaq Planşenin dediyi kimı, "nə qədər yesən də, ömürlük doya bilməzsən".

Atos, Portos və Aramis tərəfindən verilən qonaqlıqların müqabilində d'Artanyan öz yoldaşlarını yalnız bir yarım nahara qonaq edə bıldiyindən vıcdan əzabı çəkirdi; çünkı keşişin verdiyi səhər yeməyini ancaq yarım nahar hesab etmək olardı

D'Artanyan yoldaşlarına yük olmaqdan qorxurdu. Uşaq kimi sadədil olan bu cavan, yoldaşlarını duz bır ay yedirdib -içirdıyini yadından çıxarmışdı. Onun beyni yaxşı işləyirdi. Başa düşürdü ki, bu gənc, qoçaq, zirək, bacarıqlı, çalışqan dörd cavanın ittifaqı gəzmək, qılınc oynatmaq və az-çox əyləncəli zarafatlardan başqa, özgə bir məqsəd də təqib etməlidır.

Doğrudan da, bir-birinin yolunda pul kisəsindən tutmuş canlarına qədər hər bir şeydən keçməyə hazır olan, bir-birinə sadıq, heç bir şeydən qorxub geri çəkilməyən və birlikdə qəbul etdikləri qərarı həmişə yerinə yetirməyə can atan bu dörd adam, qarşılarında qoyduqları məqsəd nə qədər uzaq və nə qədər çətin olursa-olsun, gizlin və ya aşkar, hiylə və ya qüvvət ilə mütləq ona yetişməli idilər. D'Artanyanı bircə şey təəccübləndirirdı kı, nə əcəb bu fikir bu vaxta qədər onun yoldaşlarının başına gəlməmişdir.

O, bu barədə düşünür, özü də çox ciddi düşünür, bu dörd nəfərlik böyük qüvvəyə istiqamət verməyə çalışırdı. Birdən kimsə yavaşcadan qapını döydü. D'Artanyan Planşenı oyadıb qapını açmağa göndərdı.

"d'Artanyan Plaşeni oyadıb" ifadəsini oxuyan oxucu elə güman etməsın ki, bu əhvalat gecə olmuşdu. Xeyr, gündüz saat dord idi. İki saat bundan əvvəl Planşe öz ağasının yanına gəlib nahar etmək üçün pul istəmişdi. Ağası isə ona cavab vermişdi: "Yatan adam yuxusunda yemək yeyib doyar". Planşe də yuxuda nahar edirdi.

Qapı açıldıqda şəhərli kımı xeyli sadə geyınmiş bir adam içəri daxil oldu.



Planşe yeməkdən sonra çərəz əvəzinə bu söhbətə qulaq asmaq niyyətində idi. Ancaq gələn adam d'Artanyana dedı ki, onunla təkликdə çox mühüm və gizli bir məsələ barəsində danışmaq istəyir.

D'Artanyan Planşeni bayıra göndərdi və gələn adamı oturmağa dəvət etdi.

Araya sükut çökdü. Mənzıl sahibilə qonaq əvvəlcə tanış olmaq istəyirlərmiş kimi bir-birini nəzərdən keçırdilər. Sonra d'Artanyan başı ilə işarə edib, dinləməyə hazır olduğunu bildirdi.

Cənab d'Artanyan, hamı deyır ki, siz çox qoçaq bir cavansınız və bütün gördüklərimi nəzərə aldıqda, təsdiq edirəm ki, haqqınızda söylənən bu fikir, tamamilə, sizə layiqdir. Buna görə də sizə bir sirri açmağa gəlmışəm.

Buyurun, cənab, buyurun, d'Artanyan o saat elə güman etdi kı, bu işin içində bir qazanc olacaq.

Gələn adam bir az susduqdan sonra sözunə davam etdi:

Mənim arvadım kraliçanın yanında xidmət edir. O, ağıllı və gözəl bır qadın kimi tanınmışdır. Onunla üç il bundan əvvəl evlənmışəm. Cehızı o qədər çox deyıldi. Ancaq iş burasındadır kı, kraliçanın saray xidmətçisi cənab de La Port onun xaç atası və hamisidir...

D'Artanyan dedi.

Sizı dinləyirəm, cənab.

Qonaq davam etdi:

– İş burasındadır ki, bu gün səhər xidmət etdiyi evin qapısından çıxdığı zaman onu qaçırmışlar.

Yaxşı, arvadınızı kim qaçırmışdır?

Düzünü bilmirəm, cənab. Ancaq bir adamdan şübhələnirəm.

Kimdən şübhələnirsiniz?

– Bır adam var ki, onu çoxdan bəri izləməkdə idı.

Aha!

Ancaq sizə açıq söyləyim, – qonaq davam etdi – tamamilə arxayınam ki, bu işin içində sevgidən artıq siyasət məsələsi var.

– Sevgidən artıq siyasət məsələsi var? d'Artanyan bir az fikrə gedib soruşdu. – Bəs siz nədən şübhələnırsınız?

Bilmirəm nədən şübhələndiyimi sizə söyləmək olarmı?

– Möhtərəm cənab, deməliyəm ki, mən sizdən heç bır şey soruşmaq niyyətində deyildim. Özünüz mənim yanıma gəlibsiniz. Özünüz dediniz ki, mənə bir sirr açmaq istəyirsiniz. Necə ıstəyirsiniz, elə də edin. İstəsəniz çıxıb gedə bilərsiniz.

Yox, yox, cənab. Mənə elə gəlir ki, siz namuslu bir cavansınız və sizə inanıram. Zənnimcə, arvadımı özünə görə yox, məşhur bir xanımın aşiqanə işlərinə görə qaçırıblar.

– Aha, olmaya xanım de Bua-Trasinın aşiqanə işlərinə görə qaçırıblar? deyə d'Artanyan özünün saray işlərindən xəbərdar olduğunu göstərmək istəyərək soruşdu.

Yuxarı qalxın, cənab, yuxarı.

– Xanım d'Egilyol olmaya?

– Bir az da yuxarı!

- Bəlkə xanım de Şevrözdür?

- Yuxarı, xeyli yuxarı!

Elə isə... – d'Artanyan susdu.

– Bəli, cənab,– qonaq zorla eşidilən bir səslə qorxa-qorxa cavab verdi.

– Bəs o kiminlə sevişir?

– Hersoqdan başqa kimınlə olacaq...

Hersoqlamı?

Bəli, cənab, - qonaq daha boğuq bir səslə cavab verdi.

Yaxşı, bəs siz bütün bunları haradan bılırsiniz?

– Ah, haradanmı bilirəm, cənab?

- Bəli, haradan bilırsınız? Siz, məndən heç bır şey gizlətməməlisiniz... Başa düşürsünüzmü...

Mən arvadımdan eşıtmişəm.

Bəs o, haradan bilir?

– Cənab de La Portdan Sizə söylədiyim kımi, arvadım kraliçanın ən inamlı bir adamı olan cənab de La Portun xaç qızlığıdır. Cənab de La Port arvadımı ülyahəzrət, kraliçanın yanına qulluğa qoymuşdur ki, kralın tərk etdiyi, kardinalın təqib etdıyı və ətrafı xainlərlə dolu olan yazıq kraliçanın yanında inana biləcəyi bir adam olsun.

– Aha! Bir işə bax! – d'Artanyan dilləndı.

Arvadım dörd gün bundan əvvəl mənım yanıma gəlmişdi. Qulluğa girəndə şərt qoymuşdu ki, həftədə ıkı dəfə evə gəlməyə ona icazə versinlər. Bunu da bılməniz lazımdır ki, arvadım məni çox sevır. Bəli, o, yanıma gəlib söylədi ki, kraliça indi çox həyəcanlıdır.

– Doğrudanmı?

Bəli. Görünür ki, cənab kardinal onu təqıb edir və indi həmişəkindən daha çox sıxmışdır. O, sarabanda əhvalatına görə kraliçanı əfv edə bilmir.



Əlbəttə! bu barədə heç bir şey bilməyən d'Artanyan belə cavab verdı ki, özünü hər şeydən xəbərdar kımi qələmə versin.

Belə ki, indi iş daha nifrətdən keçib intiqam halını almışdır.

Doğrudanmı?

– Kraliça bu fikirdədir ki...

Kraliça nə fikirdədir?

Kralıça güman edır ki, onun adından Bekinhem hersoquna məktub yazmışlar.

Kralıçanın adındanmı?

– Bəli, bu surətlə onu Parısə çağırıb tələyə salmaq istəyirlər.

Lənət şeytana! Ancaq, cənab, bəs bu məsələlərin arvadınıza nə dəxli var?

– Arvadımın kraliçaya sadiq olduğu hamıya məlumdur. Buna görə də onu qorxudub kraliçanın sirrini öyrənmək istəyirlər. Bəlkə də arvadımı tovlayıb ondan bır casus kimi istıfadə etməyə çalışacaqlar.

D'Artanyan dedı:

Bu mümkündür. Bəs siz arvadınızı qaçıran adamı tanıyırsınızmı?

– Deyəsən tanıyıram.

Adı nədir?

Bilmirəm. Ancaq onu bilirəm ki, o adam kardinalın sağ əli və onun kölgəsidir.

Siz o adamı görübsünüzmü?

Bəli, bir dəfə arvadım onu mənə göstərmişdi.

Siz onun zahiri görkəmini təsvir edə bılərsınızmi?

Əlbəttə. O, boylu-buxunlu bir kişidir. Saçları qara, üzü qarayanız, gözləri təsirli, dişləri ağappaq, gicgahında bır çapıq yeri var...

Gicgahında çapıq yeri var! – d'Artanyan çığırdı. – Qarayanız, qarasaç və boylu-buxunlu! Bu ki, mənə Menqdə rast gələn həmin naməlum adamdır!

Deyirsiniz ki, sizə rast gələn naməlum adamdır?

Bəli, bəli, əgər bu, doğrudan da, mənim çoxdan bəri axtarıb tapa bilmədiyim həmin adamdırsa, onda arxayın ola bılərsınız kı, mən sızın əvəzinizə də, öz əvəzimə də ondan intiqam almağı bacararam Vəssalam. Ancaq o adamı haradan tapmaq olar?

Bilmirəm.

– Onun harada yaşadığı barədə heç bir məlumatınız yoxdurmu?

Yox. Bir dəfə mən arvadımı Luvr sarayına ötürdükdə, o adamı oradan çıxan gördüm və arvadım onu mənə göstərdi.

Lənət şeytana! d'Artanyan mırıldandı. Dediyiniz ünvan çox da müəyyən deyildir. Söyləyin görüm, arvadınızın qaçırıldığını sizə kim xəbər verdi?

Cənab de La Port.

Bu barədə heç bir təfsilat söyləmədimi?

Özü də heç bir şey bilmir.

Bəs siz kənardan da bir şey öyrənə bilmədinizmi?

Yox, bildim.

Nə bildiniz?

Qorxuram ki, bu, çox ehtiyatsızlıq ola.

Yenə başladınız? Ancaq sizə söyləməliyəm ki, indi daha geri çəkilmək vaxtı keçmişdır.

– Yox, mən geri çəkilmirəm, lənət şeytana! - Səsini ucaldan qonaq bu söyüşlə özünə ürək-dirək vermək istədi.

Amma Bonasyenin namusuna and içirəm ki. .

Sizin adınız Bonasyedirmi? – d'Artanyan onun sözünü kəsib soruşdu.

– Bəli, mənim adım Bonasyedir.

Siz dediniz ki, Bonasyenin namusuna and içirsiniz... Bağışlayın, mən sizin sözünüzü kəsdim. Ancaq bu ad mənə tanış gəlir.

Çox mümkündür, cənab, mən sizin ev sahibiyəm.

Aha, – d'Artanyan yerindən qalxıb ona baş əydi. Siz mənim ev sahibimsinizmi?

– Bəli, cənab. Yeri gəlmişkən yadınıza salım ki, üç aydır evimə köçmüsünüz, hələ bir dəfə də mənzil kirəsi verməyibsiniz. Yəqin ki, başınız çox mühüm işlərlə qarışıq olduğundan bu boş şeyi unudubsunuz. . Ümid edirəm ki, hər halda mənim nəzakətli olduğumu təsdiq edərsiniz... Bir dəfə də gəlib sizdən pul istəməmişəm.

D'Artanyan cavab verdi:

- Buyurun, mehriban cənab Bonasye Belə münasibətinizdən ötrü sizə çox minnətdaram. Əgər bu işdə sizə xidmət edə bilsəm...

Sizə inanıram, cənab, inanıram və Bonasyenin namusuna and içirəm ki, sizə arxayın oluram.

Elə isə əhvalatı danışıb qurtarın.

Bonasye cibindən bir vərəq kağız çıxarıb d'Artanyana verdi.



Məktubdurmu? – qaskoniyalı soruşdu.

– Bu məktubu bu gün səhər almışam.

D'Artanyan məktubu açdı. Gün batmaqda olduğundan pəncərəyə yaxınlaşdı. Qonaq da ardınca getdi.

D'Artanyan məktubda bu sözləri oxudu: "Arvadınızı axtarmayın. O, bizə lazım olmadığı zaman qayıdıb gələcək. Onu axtarmağa azacıq təşəbbüs etsəniz, məhv olacaqsınız!"

D'Artanyan dedi:

Qısa, lakin nə istədikləri aydındır! Ancaq bu, hələ ki, yalnız təhdiddir.

Bəli, amma bu təhdid məni qorxutmur. Mən dinc bir şəhərliyəm və Bastiliyadan çox qorxuram.

Hm! Mən də elə Bastiliyanı sizdən çox sevmirəm. Əgər məsələ bir adamla qılınc davası olsaydı, o başqa iş...

Amma mənim bir ümidim sizə idi!

Eləmi?

– Mən sizi həmişə şanlı muşketyorlarla bir yerdə görmüşəm. Bilirəm ki, onlar cənab de Trevlin muşketyorlarıdır. Deməli, kardinalın düşmənləridirlər. Mən güman edirdim ki, siz və dostlarınız yazıq kraliçanı müdafiə etməklə, eyni zamanda, kardinal həzrətlərilə gözəl bir oyun oynardınız.

Əlbəttə.

Bundan başqa, siz mənə üç ayın pulunu borclusunuz və mən bu pulu bircə dəfə də sizdən istəməmişəm...

Bəli, bəli. Siz bu barədə bayaq söylədiniz və elə güman edirəm ki, bu, tamamilə, inandırıcı bir dəlildir.

Bundan əlavə, sizə vəd edirəm ki, gələcəkdə də nə qədər mənim evimdə yaşasanız, sizi mənzil kirəsi barədə narahat etməyəcəyəm.

Çox yaxşı.

– Nəhayət, bəlkə bir az da çətinlik çəkirsiniz deyə, mən sizə əlli pistol da pul təklif etmək istərdim.

Çox gözəl. Deməli, möhtərəm cənab Bonasye, siz dövlətlisiniz.

Yoxsul deyiləm, cənab, vəssalam. Ticarətdən iki-üç min ekü gəlirim var. Bundan başqa, mən məşhur dəniz səyyahı Jan Mokenin son ekspedisiyasına bir qədər pul qoymuşam ki, bu da qazancsız deyil. Belə ki... Özünüz başa düşürsünüz də... O kimdir? qonaq gozlənilmədən çığırdı.

– Nə? – d'Artanyan soruşdu.
– Orda, orda. .
– Hanı?
– Küçədə, sizin pəncərənizin qarşısında, odur, o qapının ağzında plaşa bürünmüş bir adam durub...
– Özüdür ki var! – d'Artanyan ilə qonaq hər ikisi müştərək düşmənlərini tanıyıb bir ağızdan çığırdılar.
D'Artanyan qılıncını qaparaq çığırdı:
– Daha bu dəfə əlimdən qurtara bilməyəcəkdir!
Bu sözləri deyib, sıyırmaqılınc otaqdan çıxıb yüyürdü.
Pilləkən üstündə o, Atos ilə Portosa rast gəldi. Onlar yol verdilər və d'Artanyan ox kimi aradan ötüb keçdi.
– Hara belə uçursan? – Hər iki muşketyor onun ardınca çığırdı.
– Menqdəki adam! – d'Artanyan cavab verib yox oldu.
D'Artanyan naməlum adama rast gəlməsi barədəki əhvalatı, o adamın səyahət edən gözəl bir xanımla görüşdüyünü və ona mühüm bir tapşırıq verdiyini dəfələrlə yoldaşlarına daşınmışdı.
Atos elə güman edirdi ki, d'Artanyan məktubunu bir vuruşma zamanı itirmişdi. Onun fikrincə, d'Artanyanın təsvir etdiyi naməlum adam əsilzadə idi, ancaq o, məktubu oğurlamaq kimi bir alçaqlığa enməzdi
Portos bütün bu əhvalatı xanımın öz adamına və ya o adamın xanımına təyin etdiyi aşiqanə bir görüşdən ibarət olduğunu bilirdi. D'Artanyanın orada olması onlara mane ola bilərdi.
Belə ki, d'Artanyanın söylədiyi iki kəlmədən muşketyorlar işin nə yerdə olduğunu başa düşdülər və d'Artanyanın həmin adama çatdıqdan sonra və ya onu gözdən itirdikdən sonra, hər halda axırı evinə qayıdacağını güman edib pillələrlə yuxarı çıxmağa başladılar.
Onlar d'Artanyanın otağına girdilər. Otaq bomboş idi. Bonasye bu cavan oğlanla naməlum adamın rastlaşmasının nəticəsindən qorxduğundan, çıxıb getməyi daha ağıllı bir hərəkət hesab etmişdi.



## IX

## D'ARTANYAN ÖZÜNÜ BÜRUZƏ VERİR

Atos ilə Portosun təxmin etdikləri kimi, d'Artanyan yarım saatdan sonra qayıtdı. Bu dəfə də naməlum adamı gözündən qaçırmışdı. O, möcüzəli bir surətdə yoxa çıxmışdı. D'Artanyan əlində siyirmə qılınc bütün ətraf küçələri dolanıb ona azacıq da bənzəyən heç bir kəsə rast gəlməmişdi. Nəhayət, ən əvvəldən etməli olduğu işi etdi. Önündə naməlum adamı gördüyü qapını döydü. Ancaq d'Artanyan qapının toxmağını on-on iki dəfə vurdusa da, heç kim cavab vermədi. Taqqıltının səsinə qonşu qapıların ağzında və pəncərələrdə görünən qonşular onun inandırdılar ki, bu evdə yarım ildən bəri heç kəs olmur.
D'Artanyan küçələri gəzə-gəzə bütün rast gələn qapıları döydüyü müddətdə Aramis də gəlib öz yoldaşlarına qoşulmuşdu. D'Artanyan qayıdıb evə gəldikdə bütün yoldaşlarını orada gördü.
– Hə, necə oldu? – üç muşketyor d'Artanyanı görcək bir ağızdan soruşdu.
– Necə olacaq! – d'Artanyan qılıncını yatağın üstünə atıb çığırdı. – Görünür, bu adam iblisin özüdür. Bir xəyalat kimi, bir kölgə kimi yoxa çıxdı.
– Siz xəyalata inanırsınızmı? – Atos Portosdan soruşdu.
– Mən ancaq gördüyümə inanıram. Xəyalatı isə heç bir zaman görməmişəm, buna görə inanmıram.
– Hər nə olursa-olsun, insan və ya şeytan, bədən və ya ruh, xəyal və ya varlıq, nə olursa-olsun, bu adam hər halda məni məhv etmək üçün doğulmuşdur, – d'Artanyan sözünə davam etdi, – çünki, o qaçıb qurtarmaqla bizim üçün düşmən olan böyük bir işi pozdu. Cənablar, bu elə bir iş idi ki, min pistol və bəlkə daha artıq qazanmaq olardı.
– Bu nə olan işdır? – Portos ilə Aramis bir ağızdan soruşdular.
Öz adətlərinə sadiq olan Atos isə, yalnız sualedici bir baxışla kifayətləndi.
Bir neçə söz eşitmək ümidilə başını tez-tez yarıaçıq qapıdan içəri soxan nökəri Planşeni görüb d'Artanyan dedi:
– Planşe, mənim ev sahibim cənab Bonasyenin yanına gedib söyləyin ki, bizə altı şüşə Bojansi şərabı göndərsin. Söyləyin ki, mən məhz bu şərabı xoşlayıram.

Belə de! Deməli ki, sizin ev sahibi ilə öz xüsusi hesabınız var? Portos soruşdu.

– Bəli, d'Artanyan cavab verdi, - bu gündən var və arxayın olun, əgər göndərdiyi şərab pis olsa, başqa şərab istərik.

Aramis nəsihətamiz bir əda ilə dedi:

Müvəffəqiyyətdən istifadə etmək olar, amma sui-istifadə etmək yaramaz.

Atos dedi:

– Mən həmişə deyirdim ki, d'Artanyan bizim hamımızdan ağıllıdır.

D'Artanyan ona baş əydi.

Axı, bir deyin görək bu nə məsələdir? Portos soruşdu.

Aramis dedi:

– Hə, əziz dostum, əgər bu, bir xanımın şərəfinə toxunmazsa, əhvalatı bizə danışın.

Arxayın olun. Mənim sizə danışacağım əhvalatdan heç bir kəsin şərəfinə zərər dəyməz.

Bu sözlərdən sonra o, cənab Bonasye ilə olan söhbəti yoldaşlarına danışdı.

Atos şərabdan daddı və başı çıxan bir adam kimi başı ilə işarə edib şərabın xoşuna gəldiyini bildirərək dedi:

Pis deyil, bu qoçaqdan əlli-altmış pistol qopartmaq olar. Ancaq indi bir məsələ var ki, görək bu əlli-altmış pistoldan ötrü dörd başdan keçməyə dəyərmi?

– Ancaq nəzərə alın ki, d'Artanyan çığırdı, – işin içində bir qadın məsələsi var. Bu qadını qaçırıblar. Yəqin ki, onu hədələyirlər, incidirlər, bəlkə də, bunların hamısını ona görə edirlər ki, o öz xanımına sadıqdir.

Aramis dedi:

– Özünüzü gözləyin, d'Artanyan, özünüzü gözləyin. Mənə elə gəlir ki, siz əhvalatı bir qədər şişirdirsiniz. Qadınlar bizim fəlakətimiz üçün doğulublar. Bizim bütün bədbəxtliklərimizin baisi qadınlardır.

Aramısin bu sözlərinin müqabilində Atos qaşlarını çatdı və dodaqlarını gəmirdi.

– Mən xanım Bonasye üçün narahat olmuram, d'Artanyan dilləndi, – kraliça üçün narahat oluram. Kral onu atmışdır. Kardinal onu təqib edir və yazıq qadın dostlarının bir-bir başı vurulduğunu öz gözlərilə görür.



Axı, o, niyə bizim dünyada ən çox zəhləmiz gedən ispaniyalıları və ingilisləri sevir?

İspaniya onun vətənidir, d'Artanyan cavab verdi. Tamamılə təbiidir ki, öz vətəninin oğulları olan ispaniyalıları sevir. Sizin ikinci töhmətinizə gəlincə, mənim bildiyimə görə o, ingilisləri deyil, bir nəfər ingilisi sevir.

Atos dedi:

Etiraf etmək lazımdır ki, bu ingilis, doğrudan da, sevilməyə layiq adamdır. Mən onun qədər nəcib görkəmli bir adam görməmişəm.

- Hələ bundan başqa, o, hamıdan yaxşı geyinir. O, ətrafa mirvari səpələdiyi gün mən Luvrda idim və boynuma alıram ki, özüm də mirvari götürdüm və bunların hərəsini on pistola satdım, - deyə Portos əlavə etdi.

Atos dedi:

– D'Artanyan, o tacir sizə söylədi ki, kraliçanın fikrincə, hersoqu bura saxta bir məktubla çağırıblar, eləmi?

Bəli.

Bir az dayanın, – Aramis dilləndi.

– Nə var ki, Portos soruşdu.

– Danışın, mən bəzi şeyləri yadıma salmağa çalışıram.

D'Artanyan dedi:

İndi mən inanıram ki, bu saray xidmətçisi – qadının qaçırılması bizim danışdığımız hadisələrlə, bəlkə də, Bekinhem hersoqunun Parisdə olması ilə əlaqədardır.

Portos heyran-heyran dedi:

Bu qaskoniyalının başı ideyalarla doludur.

Cənablar, Aramis onların sözünü kəsdi. – Bir qulaq asın, görsizə nə deyəcəyəm.

Dostlar bir ağızdan dedilər:

Gəlin Aramisin sözlərinə qulaq asaq.

Dünən mən bəzən öz işlərim barədə məsləhətləşdiyim ilahiyyat alimi olan bir doktorun yanında idim.

Atos gülümsündü.

- O uzaq bir məhəllədə yaşayır, – Aramis davam etdi. Onun zövqü və işləri belə tələb edir. Mən onun evindən çıxdığım dəqiqədə ...

Burada Aramis dayandı.

Yaxşı, bəs sonra? yoldaşları soruşdular. Siz onun evindən çıxdığınız dəqiqədə?..

Aramis yalan söyləməyə başlayan və gözlənilməz maneə qarşısında duran bir adam kimi nə isə çətinliyə düşdu. Ancaq yoldaşlarının gözləri ona dıkılmişdi. Hər üçü acgözlüklə onu dınləyirdı. Artıq geri çəkilmək mümkün deyildi.

O doktorun bir bacısı qızı var... Aramis davam etdi.

Aha, onun bacısı qızı varmış! Portos onun sözunü kəsdi.

- O çox hörmətli bir xanımdır, – Aramis davam etdi.

Yoldaşları gülüşdülər.

Aramis dedi:

Əgər siz gülməyə və ya şübhə etməyə başlasanız, onda heç bir şey söyləmərəm.

- Bız Məhəmməd ümməti kimı inanan və tabut kimi lal olacağıq, deyə Atos cavab verdi.

Aramıs dedi:

- Mən davam edirəm. Bu xanım bəzən dayısının yanına gəlir. Dünən o, dayısının yanına gələndə, təsadüfən, mən də oradaydım və onu öz karetasına ötürməli oldum

– Aha! Deməlı, doktorun bacısı qızının karetası da varmış? – dilini saxlamağı heç cür bacarmayan Portos onun sözünü kəsdi. Bu çox yaxşı tanışlıqdır, dostum.

Aramıs cavab verdi:

– Portos, mən dəfələrlə demişəm ki, siz çox nəzakətsiz adamsınız.

İşin mahıyyətini başa düşən d'Artanyan çığırdı:

Cənablar, cənablar! Məsələ ciddidir. Mümkünsə, gəlin zarafatı bir yana qoyaq. Davam edin, Aramis, davam edin.

Bırdən ucaboylu, qarayanız, əsilzadə ədalarına malik olan, d'Artanyan, sizın təsvır etdiyiniz o naməlum şəxsə bənzəyən bir adam, ardınca ondan on addım aralı gələn beş-altı nəfərlə yaxınlaşıb ən nəzakətli bır tərzdə mənə müraciətlə: "Cənab, hersoq" və qoluna gırıb apardığım xanıma müraciətlə: "Şövkətli xanım.. " deyə sözə başladı...

- Bunu doktorun bacısı qızınamı dedi?

Yavaş, Portos, Atos dilləndi, heç özünüzü saxlaya bilmirsınız?

Bu karetaya buyurun və xahiş edirəm ki, əsla müqavimət gostərməyib səsinizi çıxarmayasınız.

O sızı hersoq Bekınhem bilib! d'Artanyan səsləndi.



– Güman edirəm ki, belədir, Aramis cavab verdi

– Bəs o xanım? Portos soruşdu.

D'Artanyan dedi.

Onu da kraliça zənn edib!

Əlbəttə, - Aramis cavab verdi.

Məlun qaskoniyalı! – Atos çığırdı Heç bir şey gözündən qaçmır!

Portos dedi.

– Doğrudan da, Aramisin boyu gözəl hersoqun boyuna bərabərdir və özü də nə isə bir az ona bənzəyir. Ancaq mənə elə gəlır ki, muşketyor paltarı ...

Mənim əynimdə uzun bir plaş vardı, Aramis dılləndı.

Portos dedi:

İyul ayındamı? Lənət şeytana! Məgər doktor sənin tanınmağından qorxurmu?

Məncə, casus ola bilər ki, boy-buxun cəhətcə yanılaydı, Atos qeyd etdi, – ancaq bəs üzün...

– Mənim başımda iri bir şlyapa var idi, Aramis cavab verdi.

- Of, aman Allah, Portos çığırdı. - İlahıyyat ılə məşğul olmaq uçün nə qədər ehtıyatlı olmaq lazımmış!

Cənablar, cənablar, zarafatla vaxtımızı itırməyək, d'Artanyan davam etdi. - Yaxşısı budur dağılıb bizim tacırın arvadını axtarmağa gedək. Bütun fitnənin açarı ondadır.

Belə alçaq təbəqəyə mənsub bir qadındamı? Portos təhqiredici tərzdə dodaqlarını büzdü

O qadın kraliçanın inanmış saray xıdmətçisi de La Portun xaç qızlığıdır. Məgər mən onu sizə deməmişdimmi?

Portos dedi.

Elə isə tacir ilə bu işi yaxşı bır qıymətə danışıb sövdələşmək lazımdır.

D'Artanyan dedi.

Lazım deyil, o verməsə də, başqasından pul alarıq.

Bu zaman pılləkəndən tələsik ayaq səsləri eşidildi. Qapı gurultu ılə açıldı və yazıq tacır muşketyorların məsləhətləşməkdə olduqları otağa girdi.

– Aman, cənablar! O çığırdı. Mənı xilas edin! Allah xatirinə məni qurtarın! Dörd adam məni həbs etməyə gəlmişdir. Məni xilas edin, məni qurtarın!

Portos ilə Aramis ayağa qalxdılar.

Bircə dəqiqə! d'Artanyan əli ilə onlara qılınclarını qına qoymalarına işarə etdi. Bircə dəqiqə dayanın! Burada igidlik deyil, ehtiyat lazımdır.

Lakin, Portos çığırdı, biz razı ola bilmərik...

Atos dedi:

Qoyun d'Artanyan necə lazım bilirsə, elə də olsun. Təkrar edirəm: o, bizim hamımızdan ağıllıdır. Mən öz tərəfimdən bildirirəm ki, ona tabe olacağam. D'Artanyan, necə lazım bilirsən elə də et!

Elə bu dəqiqədə dəhlizdə dörd əsgər göründü. Onlar silahlı muşketyorları görüb qapının ağzında durdular.

Buyurun, cənablar, buyurun! – d'Artanyan uca səslə onları dəvət etdi. Siz burada mənim evimdəsiniz və biz hamımız kral və kardinalın sadiq nökərləriyik.

Elə isə, cənablar, gərək aldığımız əmrin yerinə yetirilməsində bizə mane olmayasınız, – dəstənin başçısı hesab olunan əsgər dilləndi.

– Əksinə, lazım olsa, biz sizə kömək də edərik.

O nə danışır? Portos mırıldandı

Atos dedi?

– Sən axmaqsan, sus!

– Axı siz mənə vəd etmişdiniz ki... yazıq tacir yavaşcadan pıçıldadı.

Əgər biz özümüz azad qalmış olsaq, sizi xilas edə bilərik, – d'Artanyan tələsik ona pıçıldadı. Əgər biz indi sizi müdafiə etməli olsaq, onda bizi də sizinlə birlikdə həbs edərlər.

– Ancaq mənə elə gəlir ki...

D'Artanyan ucadan dedi:

Buyurun, cənablar, buyurun. Mənim bu cənabı müdafiə etməyim üçün heç bir səbəb yoxdur. Mən bu gün onu birinci dəfə görmüşəm. Özü də məndən mənzil kirəsi tələb etməyə gəlmişdi. Düz demirəmmi, cənab Bonasye? Cavab verin!

Tamamilə doğrudur! tacir uca səslə cavab verdi. Ancaq bu cənab sizə demir ki...

Nə mənim barəmdə, nə dostlarım barəsində, nə də xüsusən kraliça barəsində bircə kəlmə də danışmayın. Yoxsa bizim hamımızı məhv edərsiniz, öz canınızı da qurtara bilməzsiniz. Buyurun, cənablar, bu adamı aparın!



Bu sözləri deyib d'Artanyan qorxudan özünü itirmiş taciri əsgərlərə tərəf itələyə-itələyə ona dedi:

Əzizim, siz yaramaz bir adamsınız! Siz gəlib məndən mənzil kirəsi tələb edirsiniz, aparın cənablar. Sizə deyirəm, onu həbsxanaya aparın, özü də mümkün qədər çox saxlayın. Beləliklə, mən ev kirəsi vermək üçün pul tapmağa vaxt taparam.

İntizam gözətçiləri bilmədilər ki, d'Artanyana necə təşəkkür etsinlər.

Onları dustağı aparırkən pillələrdən enməyə başladıqları dəqiqədə d'Artanyan əlini onların başçısının çiyninə vurub dedi:

Bu tanışlığımız münasibətilə birgə içək? Bu sözləri deyib o, cənab Bonasyenin səxavəti sayəsində aldığı Bojansi şərabından iki qədəh doldurub birini ona uzatdı.

Əsgərlərin başçısı dedi:

Mənim üçün böyük bir şərəfdir. Böyük minnətdarlıqla qəbul edirəm.

İçək sizin sağlığınıza, cənab... Sizin adınız nədir?

Buarenar.

Sizin sağlığınıza, cənab Buarenar!

Sizin sağlığınıza, cənab əsilzadə! Adınızı soruşmağa icazə verərsinizmi?

D'Artanyan.

Sizin sağlığınıza, cənab d'Artanyan!

D'Artanyan sanki cuşa gəlibmiş kimi, ucadan çığırdı:

Hər şeydən əvvəl, kralın və kardinalın sağlığına!

Əgər şərab pis şərab olsaydı, əsgərlərin başçısı, bəlkə də, d'Artanyanın səmimiyyətindən şübhələnə bilərdi. Ancaq şərab əla olduğundan ona inandı.

Əsgərlərin başçısı çıxıb öz yoldaşlarının dalınca getdikdə və dörd yoldaş otaqda özləri qaldıqda Portos soruşdu:

Bu nə işdir gördünüz? Bu nə murdar hərəkətdir! Üç muşketyor onlara pənah gətirən bir bədbəxtin əsir olunmasına razı olur! Əsilzadə casusla qədəh-qədəhə vurub şərab içir!

Aramis dedi:

– Portos, Atos dedi ki, sən axmaqsan, mən də onun fikrilə tamamilə şərikəm. D'Artanyan, sən böyük adamsan və sən cənab Trevilin yerini tutduqda xahiş edəcəyəm ki, mənə kömək edib bir abbatlığa təyin edəsən.

Portos dedi:

– Heç bir şey başa düşmürəm! Siz d'Artanyanın hərəkətini bəyənirsinizmi?

Atos dedi:

– Əlbəttə, nəinki bəyənirəm, hətta bu hərəkətinə görə onu təbrik edirəm.

D'Artanyan Portosa heç bir izahat vermədən dedi:

– İndi isə, gəlin belə bir şüar qəbul edək: Hamımız birimizin yolunda, birimiz hamımızın yolunda! Doğru deyilmi?

Portos dedi:

– Axı...

– Əlini qaldır və and iç! – Atos ilə Aramis bir ağızdan çığırdılar

Portos yoldaşlarından geri qalmaq istəməyib əlini qaldırdı; dörd yoldaş bir ağızdan d'Artanyanın təklif etdiyi andı təkrar etdi.

– Hamımız birimizin yolunda, birimiz hamımızın yolunda!

– Yaxşı indi evlərinizə dağılışın, – d'Artanyan elə bir əda ilə əmr verdi ki, guya o, bütün ömrü uzunu əmr veribmiş. – Ancaq bilin ki, bu dəqiqədən etibarən biz kardinal ilə müharibə vəziyyətindəyik.

## X

## XVII ƏSRDƏ SİÇAN TƏLƏSİ

Siçan tələsi bizim zamanımızda ixtira edilməmişdir. İnsan cəmiyyəti polisi ixtira edən kimi, polis də siçan tələsini ixtira etmişdir.

İndi siçan tələsinin nədən ibarət olduğunu izah edək.

Bir evdə hər hansı bir cinayətdən şübhəli olan adamı həbs etdikdə onun həbs olunmasını gizlin tutarlar. Birinci otaqda dörd, ya beş nəfər adamı pusquda qoyub qapını açıq saxlarlar, hər kəs qapını döymüş olsa, onu da tutarlar. Beləliklə, iki və ya üç günün ərzində həmin evə daim gəlib-gedənlərin, demək olar ki, hamısını ələ keçirmiş olarlar.

Bax, siçan tələsi bu deməkdir.

Bonasyenin mənzilini də belə bir siçan tələsinə çevirmişdilər. Ora gələn hər bir adamı kardinalın adamları tutub istintaq edirdilər. Öz-özünə aydındır ki, d'Artanyanın yanına gəlib-gedən adamlara bu axtarış və istintaqın dəxli yox idi. Onun mənzilinin yerləşdiyi ikinci



mərtəbənin ayrıca yolu var idi. Ancaq d'Artanyanın yanına gəlib-gedənlər yalnız üç muşketyordan ibarət idi. Onlardan hər biri axtarışla məşğul idi. Amma heç biri heç bir şey tapmamışdı. Hətta Atos bir məlumat ala bilmək üçün de Trevilin yanına getmişdi və bu ləyaqətli muşketyorun həmişə qaradınməz olduğunu nəzərə aldıqda onun bu halı kapitanı xeyli heyrətləndirmişdi. Ancaq cənab de Trevilin heç bir şeydən xəbəri yox idi. O yalnız bir şey bilirdi ki, axırıncı dəfə o, kardinalı, kralı və kraliçanı gördükdə kardinal çox fikirli idi, kralda narahatlıq əlamətləri görünürdü, kraliçanın gözlərinin qızarması isə onun ya gecə yatmamış, ya da ağlamış olduğunu göstərirdi. Ancaq bu hal de Trevili çox təəccübləndirmirdi; çünki kraliça ərə getdiyi gündən bəri tez-tez gecələr yuxusuz qalar və çox ağlardı.

D'Artanyana gəlincə o, heç evdən bayıra çıxmamışdı. O, öz otağını müşahidə məntəqəsinə çevirmişdi. Bonasyenin evinə gələn və tələyə düşənlərin hamısını öz pəncərəsindən görürdü. Bundan başqa, otağın döşəməsindən bir neçə parket çıxarmışdı. Beləliklə, aşağı mərtəbədəki otaqda danışılanların hamısını eşidirdi. Evə gələn adamlar hamısı diqqətlə axtarıldıqdan sonra onlardan həmişə eyni ifadə ilə aşağıdakı şeyləri soruşurdular:

– Xanım Bonasye öz ərinə və ya başqa bir adama vermək üçün sizə bir şey verməmişdirmi?

– Cənab Bonasye öz arvadına və ya başqa bir şəxsə vermək üçün sizə bir şey verməmişdirmi?

– Onlar sizə şifahi olaraq bir tapşırıq verməyiblər ki?

D'Artanyan öz-özünə deyirdi:

"Əgər bu adamların bir şeydən xəbərləri olsaydı, istintaqı tamamilə başqa cür aparardılar. Bəs, belə olduqda onlar nə öyrənmək istəyirlər? Yəqin ki, Bekinhem hersoqunun Parisdə olub-olmadığını və kraliça ilə görüşüb-görüşmədiyini bilmək istəyirdilər"

D'Artanyan bütün eşitdiklərinə nəzərən əsassız olmayan bir fikrin üstündə durdu.

Bütün bu müddətdə siçan tələsi fasiləsiz fəaliyyətdə idi. D'Artanyanın da sayıqlığı azalmamışdı.

Yazıq Bonasyenin tutulduğunun ertəsi gün Atos, d'Artanyanın yanından çıxıb cənab de Trevilin yanına getmişdi. Saat doqquzu vurdu. Planşe öz ağasına yataq hazırlamağa başladı. Birdən kim isə bayır qapısını döydü. Qapı açılıb o saat örtüldü, kim isə siçan tələsinə düşdü.

D'Artanyan qulağını döşəmədə açdığı yerə qoyub dinləməyə başladı. Bir azdan sonra bir çığırtı və daha sonra boğuq iniltilər eşıtdi. Heç bır sorğu-sual yox idi.

D'Artanyan oz-özünə dedi:

"Lənət şeytana! Deyəsən, bu gələn qadındır, onu axtarırlar. O isə müqavimət göstərır. Ax, məlunlar!"

Axı, cənablar, mən sizə deyirəm ki, bu evin xanımıyam. Sizə deyirəm ki, mən xanım Bonasyeyəm. Sizə deyırəm ki, mən kralıçanın yanında qulluq edirəm! yazıq qadın çığırırdı.

Biz elə sizi gözləyirdik, ona cavab verdilər.

D'Artanyan öz-özünə pıçıldadı:

Xanım Bonasye! Görəsən mənim bəxtim elə gətırıb ki, hamının axtarıb tapa bilmədıyi qadını mən tapmışam.

Aşağıdan gələn səs-küy boğulurdu. Orada nə isə bir şey guruldadı. Qadın onlara müqavimət göstərirdi. Ancaq bir qadın dörd kişiylə nə qədər mübarizə apara bilərdi?

– Mənə rəhm edin, cənablar, yazığınız gəlsin .. Aşağıdan qadın səsi eşidilirdi.

Ağzını bağlayırlar! Onu aparırlar! d'Artanyan çığırdı: Qılıncımı! Aha! Yanımdadır. Planşe!

Nə buyurursunuz?

Tez ol, Atosun, Portosun və Aramisın dallarınca yüyür. Bu saat qaçaraq bura gəlsinlər! Aha, yadıma düşdü! Atos cənab de Trevilin yanındadır. Mən pəncərədən atılsam, daha tez olar. Parketı yerinə qoy, döşəməni süpür və tez sənə tapşırdığım yerə yüyür.

– Ah, cənab, cənab, yıxılıb ölərsıniz! deyə Planşe çığırdı.

D'Artanyan:

Sus, axmaq! ona acıqlandı.

D'Artanyan əli ilə pəncərənin qırağından yapışıb düz küçəyə atıldı. Xoşbəxtlikdən heç bir yerı əzilmədi.

Sonra d'Artanyan qapını taqqıldadıb öz-özünə pıçıldadı:

"İndi mən özüm də siçan tələsinə duşəcəyəm. Vay mənim kimi sıçanı tutmaq istəyən pişiklərin halına!"

Qapının toxmağı taqqıldayan kımi otaqdakı səslər kəsildi; ayaq səsləri gəldi. Qapı açıldı. D'Artanyan əlində siyirmə qılınc içəri atıldı. Qapı öz-özünə bağlandı.



Bədbəxt Bonasyenin evindəki kirayənişinlər bərk çığırtı, ayaq tappıltısı, qılınc cingiltısi və o tərəf bu tərəfə atılan avadanlıq səsləri eşidirdilər. Bir dəqiqə sonra qapı yenə açıldı. Qara geyımlı dörd nəfər hürkmüş qarğalar kimi bayıra qaçdı. Otağın döşəməsi üzərində və masaların üstündə onların paltar və plaşlarının parçaları tökülüb qalmışdı.

D'Artanyan onlara çox zəhmət çəkmədən qalıb gəlmişdi; çünki yalnız əsgərlərin başçısında silah var idi. O da ancaq zahirən özünü müdafiə edirdi. Qalan üç nəfər isə, stul və kətil qapıb qaskoniyalının üstünə hücum etmişdilər Lakın d'Artanyan məharətlə qılınc işlədib onları qaçmağa məcbur etmişdi. Döyüş meydanı onun ixtiyarına qalmışdı.

Cənab Bonasyenin qonşuları sakitcə pəncərədən çəkilıb getdilər. Fasiləsiz üsyanlar və daimi vuruşmalar baş verən o zamanlarda Paris əhalisi çox soyuqqanlı idi.

Gecə yaxınlaşırdı, indı olduğu kimı, o zamanlar Lüksemburq ətrafında yaşayanlar axşamdan yatırdılar.

D'Artanyan, xanım Bonasyeyə yaxınlaşdı. Yazıq qadın huşsuz halda kresloya yıxılıb qalmışdı. D'Artanyan sürətlə onu nəzərdən keçirtdi.

Bu, iyirmi beş-ıyirmi altı yaşlarında gözəl bir qadın idi. Saçları qara, burnunun ucu azacıq dik, dişləri ağappaq, üzünün rəngi çəhrayı rəngində idı.

D'Artanyan, xanım Bonasyeni gözdən keçirəndə, yerdə zərif bir batist yaylıq gördü Yaylığı qaldırıb, onun küncündə həmin əlaməti gördü ki, bir zaman onun üstündə az qala Aramislə vuruşmalı olmuşdu.

Hələ o zamandan bəri d'Artanyan üstündə gerb olan yaylıqlardan ehtıyat edirdi. Buna görə də o, götürdüyü yaylığı, bircə kəlmə də danışmadan xanım Bonasyenin cibinə qoydu.

Bu dəqiqədə xanım Bonasye gözlərini açdı, otaqda öz xilaskarı ilə tək qaldığını görüb gülümsədi və əlini ona uzadıb dedi:

Cənab, siz məni xilas etdiniz, icazə verin sizə təşəkkür edim.

Xanım, d'Artanyan cavab verdi, – mənim yerımdə hər kəs olsaydı, yalnız belə hərəkət edə bilərdi. Sizin mənə təşəkkür etməyiniz üçün heç bir səbəb yoxdur.

Siz səhv edirsiniz, cənab, güman edirəm ki, siz mənim minnətdarlığıma inanırsınız. Oğru zənn etdiyim bu adamlar kim idı? Cənab Bonasye hanı?

Xanım, bu adamlar oğrudan da qorxuludur. Onlar kardinalın adamlarıdır. Əriniz ısə burada yoxdur. Dünən gəlib onu Bastiliyaya apardılar.

– Mənim ərim Bastiliyadadırmı? xanım Bonasye çığırdı. Aman Allah, o nə etmışdır? Yazıq kişi! Onun heç bir təqsırı yoxdur.

Bu sözləri deyıb gənc qadın gülümsündü.

D'Artanyan dedı:

O nə etmışdırmı, xanım? Məncə, onun yeganə təqsiri bundan ibarətdir kı, sizin ərınız olmaq kımi bir xoşbəxtliyə, həm də bədbəxtliyə naıl olmuşdur.

Deməlı, siz bilirmişsiniz...

Xanım, mən bılirəm ki, sizi qaçırmışdılar.

– Kım qaçırmışdı?

– Sizi qaçıran adam qır-qırx beş yaşlarında olar Onun sol gıcgahında bır çapıq yeri var.

Düzdür! Onun adı nədir?

- Adını mən də bilmırəm!

Mənim qaçırıldığımdan ərimin xəbəri varmı?

– O, sizı qaçıran adamdan məktub almışdı.

Deməlı ki, mehriban Bonasye məndən bir dəqiqə də şübhələnməmişdır?

Xanım, o, öz arvadının sədaqət və məhəbbətilə fəxr edir. O deyırdi ki, sızin qaçırılmağınızın səbəbi siyasi bir fitnədir. Söyləyin görüm, bəs necə qaça bildiniz?

Məni tək qoyduqları bir dəqiqədən ıstıfadə etdim. Döşəkağılarını bir-birinə bağlayıb pəncərədən bağçaya düşdüm və ərimin evdə olduğunu zənn edib qaçaraq buraya gəldim.

Yəqin ki, ondan kömək gözləyirsınız?

Yox, yox! Mən bilirəm kı, o yazıq məni müdafiə etməkdə acizdir. Ancaq o, başqa bır işdə mənim üçün faydalı ola bilərdi. Mən onu xəbərdar etmək istəyirdim.

Nə barədə?

Bu özgənın sirrıdır. Bu sirri açıb deyə bilmərəm.

Xanım, d'Artanyan onun sözünü kəsdi. – Məni bağışlayın, sizi xəbərdar etməliyəm ki, ehtiyatlı olasınız. Biz elə bir yerdə yaşamırıq ki, insanlar bir-birinə inanıb sirr verə bilsinlər. Mənim qovduğum adamlar özlərınə kömək gətirib gələcəklər, əgər bizi burada tapsalar,



ikimiz də məhv olarıq. Yaxşı ki, mən öz yoldaşlarımı xəbərdar etmişəm. Ümid edirəm ki, onlar tezliklə gələrlər.

Bəli, bəlı, siz haqlısınız! xanım Bonasye qorxmuş halda çığırdı. – Buradan gedək, qaçaq!

O, d'Artanyanın - qoluna girdı

– Ancaq hara qaçaq? d'Artanyan soruşdu. – Harada gizlənək?

- Əvvəl bu evdən çıxıb gedək, sonra baxarıq.

Bu danışıqdan sonra cavanlar tez evdən çıxıb sürətlə Məzarçılar küçəsinə döndülər və yalnız Sen-Sülpis meydanında durdular.

Bəs indi biz nə edək? – d'Artanyan soruşdu. – Sizı hara ötürüm?

Xanım Bonasye dedi:

– Özüm də bilmirəm. Gərək cənab de La Portu xəbərdar edək. Üç gün ərzində Luvrda baş vermiş bütün hadisələri o danışa bilər.

Məni cənab La Portun yanına göndərin, d'Artanyan təklif etdi.

– Bu, çox yaxşı olardı Amma siz saraya girə bilməzsiniz.

D'Artanyan dedı:

Bu, bır şey deyil. Yəqin ki, Luvr qapılarının birində sizə sadiq olan bır qapıçı var, əgər siz mənə parolu söyləmiş olsanız. .

Xanım Bonasye diqqətlə cavan oğlanın üzünə baxdı.

Əgər mən sizə parolu söyləmiş olsam, ondan istifadə etdikdən sonra o saat parolu yadınızdan çıxararsınızmı?

Bu barədə sizə namuslu əsilzadə sözü verirəm! – d'Artanyan elə bir əda ilə cavab verdi ki, səmimiyyətinə şübhə etmək olmazdı.

– Mən sizə inanıram. Mənə elə gəlir ki, siz sədaqətli bir cavansınız. Çox ola bılər kı, sizin səadətiniz sədaqətinizdən asılı olacaqdır.

D'Artanyan dedi:

– Mən krala xidmət etmək və kraliçanın rəğbətini qazanmaq üçün əlimdən gələn hər bir şeyi təmənnasız və vıcdanla edərəm.

Bəs siz bu müddət məni harada gızlədərsiniz?

D'Artanyan dedi:

Dayanın, bız Atosun evinin yaxınlığındayıq. Bəli, elədir. Biz onun mənzilindən uzaq deyılik.

Bu Atos kimdir?

Mənim dostlarımdan biri.

Bəlkə o, evdə oldu?

O, evdə deyil.

– Bəlkə o gəldi?

– Yox, gəlməz Əgər gəlmiş də olsa, ona xəbər verərlər ki, mən bura qadın gətirmişəm.

Axı bu, mənim əxlaqım üçün bir ləkə ola bilər.

Sizə nə dəxli var ki? Sizi burada tanımırlar. Bir də ki, belə bir vəziyyətdə biz bəzi ədəb qaydalarını gözləməyə bilərik.

– Yaxşı, dostunuzun evinə gedək. O, harada olur?

– Feru küçəsində. Buradan iki addımlıq yoldur.

Onlar yola düzəlib getdilər.

Atos evdə yox idi.

Qapıçı d'Artanyanı tanıdığından açarı ona verdi: d'Artanyan pillələrlə yuxarı qalxıb xanım Bonasyeni kiçik bir mənzilə gətirib dedi:

– Burada özünüzü evinizdə olan kimi hiss edin. Qapını içəridən bağlayın və yalnız, bax, bu cür, üç dəfə döyüldükdə açarsınız. Belə deyib d'Artanyan qapını üç dəfə döydü.

Xanım Bonasye dedi:

– Yaxşı, indi mən də sizə tapşırığımı verim.

Mən dinləyirəm.

Luvra gedin. Eşel küçəsinə çıxan qapıdan Jermeni soruşun.

Yaxşı. Bəs sonra?

O, sizdən nə istədiyinizi soruşacaqdır. Siz bu iki kəlmə ilə cavab verərsiiz: "Tur və Brüssel". Onda o sizin bütün əmrlərinizi yerinə yetirər. Əmr edin ki, kraliçanın saray xidmətçisi cənab de La Portu çağırsın.

Bəs cənab de La Port gələndə neyləyim?

Onu yanıma göndərin.

Yaxşı, bəs mən sizi sonra harada görə bilərəm?

– Məgər siz məni görməyi çoxmu arzu edirsiniz?

Əlbəttə.

Bu işi mənə həvalə edin və heç narahat olmayın.

Mən sizin sözünüzə arxayın oluram.

Yaxşı.

D'Artanyan, xanım Bonasye ilə vidalaşıb ona aşiqanə bir nəzər saldı. İki dəqiqədə gəlib Luvra çatdı. Eşel qapısının ağzında durduqda saat onu vurdu.

Hər bir şey xanım Bonasyenin dediyi kimi oldu. Jermen parolu eşitcək təzim etdi və ona verilən tapşırığı yerinə yetirməyə getdi. On



dəqiqədən sonra La Port gəldi. D'Artanyan bütün işi ikicə kəlmə ilə ona söyləyib, xanım Bonasyenin harada olduğunu bildirdi. La Port ünvanı iki dəfə soruşub xanım Bonasyenin ardınca qaçdı. Ancaq on addım getməmiş geri qayıdıb d'Artanyana dedi:

Cavan oğlan, mən sizə bir şey tövsiyə etməliyəm.

Nə barədə?

Sizi narahat edə bilərlər.

Eləmi güman edirsiniz?

Bəli. Sizin elə bir tanışınız yoxdurmu ki, onun saatı geri qala?

Niyə ki?

Həmin dostunuzun yanına gedin və lazım gələndə, sizin saat onun yanında öz yanında olduğunuzu təsdiq edə bilsin. Hüquqşünaslıqda buna *alibi*[1] deyərlər.

D'Artanyan bu tövsiyənin ağıllı bir tövsiyə olduğunu təsdiq etdi. O, tələsik cənab de Trevilin yanına getdi. Dəhlizdə adam çox olduğundan ora girməyib kabinetə keçməyə icazə istədi. D'Artanyan de Trevilin evinə tez-tez gəldiyindən onun xahişi o saat yerinə yetirildi. Cənab de Trevilə xəbər verdilər ki, cavan həmyerlisi ona mühüm bir xəbər verməli olduğundan görüş istəyir. Beş dəqiqə sonra cənab de Trevil öz kabinetinə gəldi.

De Trevil gələnə qədər d'Artanyan divar saatının əqrəblərini qırx beş dəqiqə geri çəkməyə macal tapmışdı.

D'Artanyan de Trevilə dedi:

Bağışlayın, cənab kapitan, indi saat yalnız ona iyirmi beş dəqiqə işləmiş olduğundan, mən elə güman etdim ki, sizin yanınıza gəlmək olar.

Ona iyirmi beş dəqiqə işləmişmi? - cənab de Trevil çığıraraq saata baxdı. Ola bilməz.

Buyurun, cənab kapitan.

Doğrudanmı? cənab de Trevil ikinci dəfə heyrətlə saata baxdı. Yaxşı, bəs siz mənə nə xəbər vermək istəyirdiniz?

D'Artanyan kardinalın kraliçaya və Bekinhemə nə cür fitnə hazırladığı barədə uzun əhvalatı de Trevilə danışdı. Bu sözləri o, elə bir inamla deyirdi ki, cənab de Trevil inanmaya bilməzdi.

Kapitan verdiyi məlumat üçün ona təşəkkür edib vidalaşdı.

[1] *Alibi* (latınca) "başqa yerdə". Hüquq istilahıdır. *Alibi* isbat etmək müttəhimin cinayət edildiyi zaman başqa yerdə olduğunu isbat etmək deməkdir.

D'Artanyan cənab de Trevildən düz saat on tamamda ayrıldı. Pilləkənlərdən düşəndə xatırladı ki, əl ağacı yadından çıxıb kabinetdə qalmışdır D'Artanyan sürətlə geri qayıtdı, qaçaraq kabinetə girdi və əlinin bir hərəkətilə saatın əqrəblərini irəli çəkdi, sonra yenə pillələrlə enib küçəyə çıxdı.

## XI

## FİTNƏNİN QIZIŞMASI

D'Artanyan küçə ilə gedir, ulduzlara baxa-baxa gah köksünü ötürür, gah da gülümsəyirdi. Ona elə gəlirdi ki, xanım Bonasyenin görüş təyin edən məktubunu gətirən adam ona yaxınlaşır, məktubla birlikdə ona qızıl bir zəncir və ya brilyant üzük də verir.

D'Artanyan Şerş-Midi və ya o zaman Şass-Midi adlanan küçə ilə gedirdi. Qaskoniyalının fikrinə gəldi ki, o, öz yoldaşının yanına getsin. D'Artanyan istəyirdi ki, Planşeni nə üçün onun yanına göndərdiyini və nə üçün onu sıçan tələsinə çağırdığını Aramisə danışsın. Bundan başqa, o istəyirdi ki, öz dostuna xanım Bonasye haqqında məlumat versin.

Paris küçələrinə qaranlıq çökməsindən artıq iki saat keçirdi, ətraf bomboş idi. Sen-Jermen məhəlləsinin saatı on biri vurdu. Hava çox gözəl idi.

D'Artanyan indi Assa küçəsinin olduğu yerdə bir yerdə döngəni döndü və burada axşam şehindən ətirlənmiş bağların gözəl ətrini və gecənin sərin küləyini doyunca tənəffüs etdi. Meyxanalardan, qalın pəncərə qapılarının ardından keflilərin tutqun nəğmə səsləri gəlirdi. D'Artanyan döngənin axırına çatanda sola döndü Aramisin yaşadığı ev Kasset və Servandoni küçələrinin arasında idi.

D'Artanyan Kasset küçəsini keçdi. Dostunun ağacları dalında gizlənmiş olan qapısının ağzında birdən bir kölgə gördü. Əvvəl d'Artanyan elə güman etdi ki, bu kişidır. Ancaq sonra boyunun kiçikliyindən və addımlarını qorxa qorxa atmasından bildi ki, qadındır. O, d'Artanyanın çatmış olduğu evin qabağında gah durur, gah da geri qayıdıb uzaqlaşırdı. Bu əhvalat d'Artanyanı maraqlandırdı.

"Görəsən mən ona öz xidmətimi təklif edimmi? deyə düşündü. – Yerişindən görünür ki, cavandır. Kim bilir, bəlkə də gözəldir. Bəli, bəli! Ancaq gecənin bu vaxtında küçədə gəzən xanım, yəqın ki, öz sevgilisini axtarır. Mən onların görüşünə mane ola bilərəm. Bu isə ilk tanışlıq üçün yaxşı bir əlamət deyildir. Lənət şeytana! d'Artanyan ruhanının bacısı qızını yadına saldı. Bu gecikmiş göyərçinin bizim dostumuzun evini axtarması çox qəribə olardı. Amma, deyəsən, doğrudan da belədir ki, var. Aha, əzizim Aramis, bu dəfə hər bir şeyi öyrənəcəyəm".

D'Artanyan qaranlıq bir guşədə qapının tağı altında qoyulmuş daş skamyanın yanında gizləndi.

Cavan qadın yavaşca öskürdü. D'Artanyan düşündü ki, bu öskürmə yəqin ki, bir işarədir. Sonra qadın qəti addımlarla Aramisin pəncərəsinə yaxınlaşıb üç dəfə döydü.

"Bu, yəqin Aramisin yanına gedır!" deyə d'Artanyan öz özünə mırıldandı. "Aha, cənab riyakar, demək siz ilahiyyatla belə məşğul olursunuz!"

Pəncərənin dal qapısı açıldı, qapının arasından işıq göründü.

D'Artanyan öz-özünə dedi: "Aha, yəqin ki, bu qadının gəlməsini gözləyirmiş. Yəqin qadın indi pəncərədən içəri girəcək".

Ancaq d'Artanyan böyük bir heyrətlə gördü ki, pəncərə açılmadı, işıq söndü və evə yenə qaranlıq çökdü.

D'Artanyan düşündü ki, bu hal belə davam edə bilməz. O daha da diqqətlə baxıb dinləməyə başladı. Gözləyirdi ki, görsün işin axırı necə olacaq.

Bir neçə saniyədən sonra içəridən pəncərəni iki dəfə taqqıldatdılar. Qadın da bu taqqıltıya cavab verdi və pəncərə açıldı.

D'Artanyanın necə böyük bir acgözlüklə baxdığını və dinlədiyini təsəvvür etmək mümkundür.

Bədbəxtlikdən şamı o biri otağa apardılar. Ancaq cavan oğlanın gözləri qaranlığa alışmışdı. Bir də ki, qaskoniyalılar pişiksayağı gecələr də, gündüz kimi yaxşı görürlər. Cavan qadın cibindən ağ bir şey çıxartdı. Bu, yaylıq idi. Qadın yaylığı açıb onun çəkili ucunu həmsöhbətinə göstərdi.

D'Artanyan, xanım Bonasyenin ayağının altından tapdığı yaylığı xatırladı. Şübhəsiz, bu zaman Aramisin yaylığı da yadına düşdü.

Bu, nə deməkdir?

D'Artanyan durduğu yerdən Aramisin üzünü görə bilmədi. Biz "Aramisin üzünü" deyirik, çünki cavan oğlan xanımla danışan adamın

öz dostu olduğuna şübhə etmirdi. Hər şeyi bilmək arzusu d'Artanyanın ehtiyatı gözləmək hissinə qalib gəldi və onların başlarının yaylığa qarışmasından istifadə edib gizləndiyi yerdən çıxdı. O, divarın küncünə qısıldı. Buradan otağın içində olan işləri asanlıqla görə bilirdi.

D'Artanyan heyrətindən çığırmaqdan özünü zorla saxladı. Bu xanımla danışan Aramis deyil, bir qadın idı. D'Artanyan onun üzünü görə bilmədi.

Pəncərədəki qadın da öz cibindən bir yaylıq çıxardıb həmin yaylığı o biri qadının gətirdiyi yaylıq ilə dəyişdi, bundan sonra pəncərə örtüldü. Pəncərənin qabağında dayanmış qadın geri döndü və d'Artanyanın dörd addımlığından keçib getdi. Bu zaman qadın plaşın başlığını üzünə çəkdi, ancaq iş işdən keçmışdı. D'Artanyan bu qadının xanım Bonasye olduğunu tanımışdı.

"Xanım Bonasye!" Qadın hələ cibindən yaylığı çıxararkən bu fikir d'Artanyanın başına gəlmişdi. Ancaq kim güman edə bilərdi ki, onu Luvra aparmaq üçün cənab de Portun dalınca adam göndərmiş xanım Bonasye gecə saat on ikinin yarısında yenidən tutulmaq təhlükəsini gözünün altına alaraq Paris küçələrində gəzib-dolaşa bilər! Deməli ki, onu bura gəlməyə məcbur edən iş çox mühüm imiş. Görəsən iyirmi beş yaşında qadın üçün nə kimı vacıb iş ola bilər? Əlbəttə, eşq! Amma görəsən bu qadın kimin xatirinə özünü belə təhlükəyə atır? Artıq ürəyinə qısqanclıq iblisi girmiş olan cavan oğlan bunu fikirləşdi.

Ancaq xanım Bonasyenin hara getdiyini bilmək üçün ən sadə bir vasitə var idi. Bu da onun dalınca düşüb getməkdən ibarət idi. D'Artanyan da belə etməyi qərara aldı.

Cavan oğlan divardan aralandı. Xanım Bonasye onu gördükdə çığırıb qaçdı.

D'Artanyan onun dalınca yüyürdü. Plaşı əl-ayağına dolaşan bir qadına çatmaq onun üçün çətin deyildi. Yazıq qadın həm yorğunluqdan, həm də qorxudan taqətdən düşmüşdü. Bu zaman d'Artanyan əlini onun çiyninə qoydu. Qadın diz çöküb çığırdı:

İstəyirsiniz, məni öldürün. Amma məndən heç bir şey öyrənə bilməzsiniz!

D'Artanyan onu ayağa qaldırdı. Qadın az qalmışdı ki, huşunu itirsin. D'Artanyan tələsik onu sakitləşdirməyə çalışdı, onu inandırmaq üçün söylədiyi sözlər xanım Bonasyeyə heç bir təsir etmədi, çünki belə sözləri ən pis məqsədlə də söyləyə bilərdilər. Ancaq onun



səsi o saat qadını özünə gətirdi. Görünür, cavan qadın onun səsini tanımışdı. O, gözlərini açdı. Onu qorxutmuş olan adama bir nəzər saldı və şadlığından gülümsündü.

– Ah, sizsinizmi, sizsinizmi? qadın səsləndi. Allaha çox şükür!

D'Artanyan dedi:

Bəli, mənəm. Məni tale özü sizi qorumağa göndərmişdir.

Siz bu fikirləmi mənim ardımca gəlirdiniz? cavan qadın nazlı bir təbəssümlə gülümsündü. O, d'Artanyanı görən kimi bütün qorxusu yox olub getmişdi.

D'Artanyan dedi:

Yox, yox, boynuma alıram ki, mənim sizə rast gəlməyim bir təsadüfdür. Gördüm ki, bir qadın dostumun pəncərəsini döyür.

– Dostunuzun pəncərəsinimi? xanım Bonasye onun sözünü kəsdi.

Əlbəttə, Aramis mənim ən yaxşı dostlarımdan biridir.

Aramismi? O kimdir?

Bəsdır! Yəqin indi deyəcəksiniz ki, Aramisi tanımırsınız?

Bu adı birinci dəfə eşidirəm.

Siz bu evə birinci dəfəmi gəlirsiniz?

Bəli.

Sız bılmırdınızmi ki, bu evdə cavan bir oğlan yaşayır?

Yox.

Deməli, siz onun yanına gəlməmişdiniz?

Əlbəttə, yox. Siz özünüz gördünüz ki, mən bir qadınla danışırdım.

Bu düzdür. Onda yəqin o qadın Aramisin dostudur.

Bundan mənim xəbərim yoxdur.

Axı o qadın onun yanında yaşayır.

– Bunun mənə dəxli yoxdur.

Yaxşı, bəs o qadın kimdir?

Bu özgənin sırrıdır.

– Əziz xanım Bonasye, sız çox cazibəli qadınsınız. Ancaq dünyanın ən əsrarəngiz xanımısınız.

Məgər bunun mənə bir zərəri varmı?

Yox, əksinə, sizi daha cazibəli edir.

Di mənim qoluma girin.

– Məmnuniyyətlə. Bəs sonra?

– Sonra məni aparın.

Hara?

Getdiyim yerə.
– Bəs siz hara gedirsiniz?
İndi bilərsiniz; çünki mənimlə qapıya qədər gedəcəksiniz.
– Orada sizi gözləyimmi?
– Zəhmət çəkməyin.
– Deməli, siz tək qayıdacaqsınız?
Ola bilər, hə, ola bilər yox.
Bəs sonra sizi kim ötürəcək? Kişimi, qadınmı?
– Hələ bilmirəm.
– Amma mən bilərəm.
Necə?
Mən sizin kiminlə çıxdığınızı bilmək üçün orada gözlərəm.
Elə isə əlvida!
– Niyə ki?
– Siz mənə lazım deyilsiniz.
– Axı indicə özünüz xahiş etmişdiniz...
Mənim bir əsilzadənin köməyinə ehtiyacım var, casusa ehtiyacım yoxdur.
– Bu ifadəniz çox kəskindir!
– Bəs adamın arzusu xilafına onu güdən adama nə ad verərlər?
Təvazökar olmayan adam.
Bu ifadə çox yumşaqdır.
– Xanım, görürəm ki, sizin bütün arzularınızı yerinə yetirmək lazımdır.
– Bəs niyə birdən-birə bu qərara gəlmədiniz?
Məgər tövbə etmək yaxşı iş deyilmi?
– Doğrudanmı tövbə edirsiniz?
Özüm də bilmirəm. Ancaq getdiyiniz yerə sizi ötürmək üçün mənə icazə versəniz, söz verirəm ki, nə arzu etsəniz, yerinə yetirəcəyəm.
Sonra məni qoyub gedərsinizmi?
Bəli.
– Məni güdməzsiniz ki?
– Yox.
Sədaqətləmi deyirsiniz?
- Bir əsilzadə kimi söz verirəm!
– Elə isə, qoluma girin, gedək.



D'Artanyan xanım Bonasyenin qoluna girdi və onlar La Qarp küçəsinə sarı getdilər.
Bu küçədə cavan qadın uca bir evin qapısında durdu.
O, d'Artanyana dedi:
İndi isə mən bu evə getməliyəm. Sizə min dəfə təşəkkür edirəm. Siz məni bütün təhlükələrdən qorudunuz. İndi isə vədinizə əməl etməlisiniz. Mən istədiyim yerə gəlib çatdım.
Bəs siz geri qayıdarkən qorxmazsınızmı?
Oğrulardan başqa heç kəsdən qorxum yoxdur.
Məgər bu, az şeydirmi?
– Onlardan da bir elə qorxmuram; çünki yanımda qiymətli bir şey yoxdur.
Bəs, üstü gerbli o gözəl yaylığınız?
Nə yaylıq?
Ayağınızın altından tapıb cibinizə qoyduğum yaylıq.
– Susun, susun, bədbəxt! cavan qadın çığırdı. – Siz məni məhv etmək istəyirsiniz!
Özünüz görürsünüz ki, sizin üçün hələ təhlükə var. Bura baxın, xanım, – d'Artanyan onun əlindən tutub davam etdi, – mənə inanın. Məgər qəlbimdəki səmimiyyət və sədaqəti gözlərimdən görmürsünüzmü?
Xanım Bonasye cavab verdi:
– Mən öz sirlərimi məmnuniyyətlə sizə danışaram. Amma özgələrinin sirrini söyləmək olmaz.
D'Artanyan dedi:
Yaxşı, o sirləri mən özüm öyrənərəm. Bu sirlərin sizin həyatınıza da təsiri ola bilər. Ona görə də mən o sirləri bilməliyəm.
Özünüzü gözləyin! - cavan qadının səsindəki dəhşətdən d'Artanyan qeyri ixtiyari titrədi. – Yox, yox, heç bir şeyə qarışmayın. Mənə kömək etməyə çalışmayın. Sizə yalvararaq rica edirəm! Sizin mənə bəslədiyiniz duyğuya and verirəm, mənə göstərdiyiniz və ömrümdə unutmayacağım o xidmətlərə and verirəm, özünüzü gözləyin! Artıq mənimlə məşğul olmayın. Məni unudun!
D'Artanyan incimiş bir əda ilə dedi:
- Aramis də sizi unutmalıdırmı?
Budur, indi ikinci və ya üçüncü dəfədir ki, siz bu adı çəkirsiniz. Bu ad mənə tanış deyil.

Pəncərəsini döydüyünüz adamın adını bilmirsinizmi? Xanım, siz məni çox sadədil hesab edirsiniz.

Boynunuza alın ki, siz məndən söz almaq üçün bu əhvalatı uydurursunuz. Aramis adlı bir adam heç yerli-dibli yoxdur.

– Mən heç bir şey uydurmuram Əsl həqiqəti söyləyirəm.

- Deyirsiniz ki, sizin dostunuz bu evdə yaşayır?

Bir də təkrar edirəm, bu evdə mənim dostum olur. O dostumun adı Aramisdir.

Bütün bunlar sonra məlum olar, cavan qadın pıçıldadı. İndi isə susun!

D'Artanyan dedi:

Əgər siz mənim qəlbimin içinə girə bilsəydiniz, orada nə qədər böyük maraq olduğunu görər və mənə rəhminiz gələrdi; orada nə qədər məhəbbət olduğunu görər və mənim marağımı təmin edərsiniz.

Cavan qadın başını yırğalayaraq cavab verdi:

Siz eşq barəsində danışmağa çox tələsdiniz!

– Çünki sizi bircə anda sevdim. Mən ömrümdə ilk dəfə sevirəm. Hələ iyirmi yaşım da tamam olmayıb

Cavan qadın diqqətlə onun üzünə baxdı.

Bura baxın, mən daha izi tapmışam, d'Artanyan davam etdi. Üç ay bundan əvvəl mən üstündə eyni bir nişan olan bir yaylıqdan ötrü az qalmışdım ki, Aramis ilə vuruşam!

Cavan qadın dedi.

– Sizin bu sorğu sualınız məni lap təngə gətirdi!

Lakin özünüz bir düşünün, xanım. Sizi tutub bu yaylığı əlinizdən alsalar, halınız necə olar? Axı, siz rüsvay olarsınız!

– Niyə? Məgər yaylığın üstündəki "K.B." işarələri mənə aid deyilmi? Konstansiya Bonasye.

Ya da ki, Kamilla de Bua-Trasi.

Susun! Susun! Əgər mənim həyatımın sizin üçün bir qiyməti yoxsa, öz həyatınızı düşünün!

Öz həyatımımı?

Bəli, öz həyatınızı. Mənimlə tanışlığınız sizin azadlığınız və həyatınız üçün bir təhlükədir.

– Elə isə mən sizdən əl çəkən deyiləm.

Cavan qadın yalvarıcı səslə dedi:



– Bura baxın, sizi göylərə, hərbi adamın şərəfinə, əsilzadə namusuna and verirəm, çəkilin gedin! Eşidirsinizmi? Saat on ikini vurdu, məni gözləyirlər.

Cavan oğlan ikiqat əyilib təzim edərək dedi:

Xanım, belə bir xahişi mən rədd edə bilmərəm. Arxayın olun, mən gedirəm.

– Siz məni güdməyəcəksiniz ki?

Mən bu saat öz evimə gedirəm.

Ah, mən bilirdim ki, siz sədaqətli cavansınız! – xanım Bonasye çığıraraq əlini ona uzatdı.

D'Artanyan bu əli qapıb hərarətlə öpdü:

Ah, kaş ki, mən sizə heç rast gəlməyəydim! o qaba bir sadədilliklə çığırdı. Belə qabalığı qadınlar çox zaman ən zərif nəzakətdən artıq xoşlayırlar; çünki bu qabalıq ən gizli fikirləri büruzə verir və hissin ağla qalib gəldiyini sübut edir.

Xanım Bonasye d'Artanyanın əlini sıxaraq, demək olar ki, oxşayıcı bir səslə cavab verdi:

Mən isə, belə deməzdim. Bu gün mümkün olmayan şey sabah mümkün ola bilər! Kim bilir, bəlkə bir zaman mən azad ola bildim...

Bu bir vəddirmi? – d'Artanyan özünü itirmiş bir halda çığırdı.

- Of, mən özümü heç bir şeylə bağlamaq istəmirəm. Hər bir şey sizin mənə təlqin edəcəyiniz hissiyyatdan asılıdır.

– Deməli ki, bu gün, xanım...

– Bu gün hələlik mən sizə özümü yalnız minnətdar bilirəm.

D'Artanyan kədərli bir səslə dedi:

Of, siz mənim eşqimdən sui-istifadə edirsiniz.

- Yox, mən yalnız sizin alicənablığınızdan istifadə edirəm. Ancaq, inanın, dünyada elə adamlar var ki, heç bir şeyi unutmurlar.

Ah, siz məni dünyada ən xoşbəxt bir insan edirsiniz. Bu axşamı unutmayın. Verdiyiniz vədi yaddan çıxarmayın.

– Arxayın olun. Lazım gələndə mən hər şeyi yadıma salaram. Gedin, siz allah gedin. Məni düz saat on ikidə gözləyirdilər. Mən artıq gecikmişəm.

Cəmisi beş dəqiqə.

– Bəli, amma bəzi hallarda beş dəqiqə əsrə bərabərdir.

– Bəli, insan sevəndə!

Sizə kim demişdir ki, bu işin içində sevgi yoxdur?

Sizi gözləyən kişidirmi? d'Artanyan çığırdı. Kişidırmi?

Xanım Bonasye dedi:

– Budur, yenə mübahisə başlandı.

– Yox, yox, mən gedirəm! Mən sizə ınanıram. Mən istəyirəm ki, mənim sədaqətim hətta axmaqlıq da olmuş olsa, sız onun qədrini biləsiniz. Əlvıda, xanım!

D'Artanyan nəzakətlə xanım Bonasyenin əlini öpdü və qaçaraq getdı.

Cavan qadın qapını üç dəfə ağır-ağır döydü. D'Artanyan tinə çatıb dönəndə qadın artıq evə girmişdi.

D'Artanyan öz yoluna davam edirdi. O,ı söz vermişdi ki, xanım Bonasyeni güdməyəcək Onun hətta həyatı bundan asılı olsaydı, yenə də sözündən dönməz və öz evinə qayıdardı, çünki bu barədə söz vermışdı. Beş dəqiqə sonra o artıq Məzarçılar küçəsində idi.

D'Artanyan öz-özü ilə danışırdı: "Yazıq Atos! O, əlbət ki, bütün bunların nə demək olduğunu bilmir. O, yəqin ki, məni gözləyə gözləyə ındi yuxuya gedib, ya da evinə qayıdıb xəbər tutub ki, ora qadın gəlibmiş. Atosun evində qadın! Axı Aramisin də evində qadın var idi. Bütün bunlar çox qəribədir. Mən bütün bunların necə qurtaracağını bilmək ıstərdim".

Çox pıs, cənab, çox pis, bir səs ona cavab verdi.

Cavan oğlan Planşenin səsini tanıdı, çünki öz-özü ilə ucadan danışa-danışa, qayğılı adamlarda çox zaman olduğu kımi, özünün xəbəri olmadan otağına gedən pilləkənə gəlib çatmışdı.

Nə pısdır? Nə demək istəyirsən, axmaq? – d'Artanyan soruşdu. Nə olub ki?

– Bədbəxtlık üz verib, cənab.

Necə məgər?

- Cənab Atosu tutublar.

Tutublar? Atosu tutublar? Niyə ki?

– Onu sizın otağınızda görüb elə biliblər kı, sizsiniz.

– Onu kımi tutdu?

Sızın qovduğunuz qarapaltar adamların gətirdikləri qarovul.

Bəs niyə o, öz adını demədi?

O, heç bunu ağlına da gətirmədi. Əksinə, o, mənə yan alıb dedi ki, "Bu saat sənın ağanın azad olması mənim azad olmağımdan vacıbdir, çünkı o, hər şeyı bilir, amma mən heç bir şey bilmirəm. Onlar elə



biləcəklər ki, o həbs edılmişdir və bu ona vaxt qazanmağa kömək edəcəkdir. Üç gündən sonra mən öz adımı söyləyərəm və məni buraxarlar"

– Sağ ol, Atos! Nə nəcib bir qəlbi var! - d'Artanyan pıçıldadı. Mən onun belə bir adam olduğunu bilirdim! Bəs gələn nəzarətçilər nə etdilər?

Dörd əsgər onu Bastiliyaya və ya Ford-Levekə apardı. İkısi o qara iblislərlə burada qaldı. Onlar evi alt-ust edib, bütün kağızları apardılar. Bunlardan başqa axtarış zamanı ikisi də qapıda keşik çəkirdi. İşlərini qurtardıqdan sonra hamısı getdi.

Bəs Portos ilə Aramısdən nə xəbər var?

Mən onları evlərində tapmadım. Onlardan bura gələn olmayıb

– Axı onlar hər dəqiqə gələ bilərdilər. Sən tapşırmışdınmı ki, mənim gözlədiyimi onlara söyləsinlər?

Bəli, cənab.

Bax, buradan bircə addım də kənara tərpənməzsən! Onlar gəlsələr, mənim başıma gələn bütün əhvalatı onlara danışarsan. Tapşırarsan ki, mənı "Şam Qozası" meyxanasında gözləsinlər. Burada qalmaq qorxuludur. Yəqin ki, bu evi pusurlar. Mən tez cənab de Trevilin yanına gedib olan işlərdən onu xəbərdar edim, sonra onların yanına gedəcəyəm.

Planşe cavab verdi.

Baş üstə, cənab!

D'Artanyan bir neçə addım gedib qayıtdı və soruşdu:

- Sən burada qalmaqdan qorxmazsan ki?

Planşe cavab verdi:

Arxayın olun, cənab. Siz məni hələ tanımırsınız. Yeri gələndə ıstəsəm mən də igıd ola bilərəm.

D'Artanyan dedi:

– Deməli, qət etdik. Sən ölsən də öz mövqeyini tərk etməyəcəksən!

Bəli, cənab, mən öz sədaqətımi sizə sübut etmək üçün əlımdən gələni edəcəyəm.

D'Artanyan öz özünə dedi: "Yaxşı, deyəsən, mən bu qoçağın boş damarını tapmışam. Görünür ki, onunla belə rəftar etmək lazımdır. Bundan sonra yeri gələndə bu üsuldan istifadə edərəm".

Sonra d'Artanyan sürətlə "Göyərçin hini" küçəsinə sarı qaçdı.

Cənab de Trevil evdə yox idı. Onun dəstəsi Luvrda növbədə idi. muşketyorlar kapitanı da öz dəstəsinin yanında idi. D'Artanyan Luvra

getmək istədi. Onun Dezessarın bölüyünə mənsub qvardiyaçı geyimi buraxılış vəsiqəsi ola bilərdi.

O, Pti-Oqyusten küçəsilə gedib çayın sahilinə, oradan da Yeni körpüyə çıxdı. Bərə ilə keçmək istəyirdi. Ancaq sahilə çatdıqda əlini cibinə salıb gördü ki, verməyə pulu yoxdur.

O, Geney küçəsindən keçərkən Dofin küçəsindən iki nəfərin çıxdığını gördü. Bu adamların görkəmi onu heyrətə saldı.

Bunlardan biri kişi, biri qadın idi. Qadın xanım Bonasye, kişi isə, lap Aramisə bənzəyirdi.

Qadının əynində artıq d'Artanyanın tanıdığı qara plaş, kişinin əynində muşketyor geyimi var idi.

Qadın plaşın başlığını üzünə çəkmiş, kişi isə üzünü yaylıqla tutmuşdu. Bunların ikiqat ehtiyatlı olması göstərirdi ki, ikisi də çalışır ki, onları tanıyan olmasın.

Onlar körpüyə çıxdılar. D'Artanyan onların ardınca düşdü.

O lap yəqin etdi ki, bu qadın – xanım Bonasye, kişi isə Aramisdir. Bu dəqiqə öz qəlbində qısqanclıq həyəcanı duydu. Deməli, həm dostu, həm də bir az əvvəl öz sevgilisi hesab etdiyi qadın ona xəyanət etmişdir. Xanım Bonasye and içmişdi ki, Aramisi tanımır. Üstündən on beş dəqiqə keçmişdi ki, d'Artanyan onu Aramislə qol qola görürdü.

Cavan qaskoniyalı artıq özünü təhqir edilmiş, aldadılmış, lağa qoyulmuş bir aşiq hesab edirdi. Qan beyninə vurdu. Hər bir şeyi aydınlaşdırmağı qərara aldı.

Cavanlar təqib olunduqlarını duyub, addımlarını sürətləndirdilər. D'Artanyan yüyürüb onları keçdi, sonra qabağında fənər yanan su tulumbasının yanından keçərkən körpünün bu işıqlanmış hissəsində onlarla üz-üzə gəldi.

Xanım Bonasye ilə onu ötürən adam dayanmağa məcbur oldular.

– Nə istəyirsiniz, cənab? – muşketyor bir addım geri çəkilib soruşdu Onun danışığında xarici ləhcəsi hiss olunduğundan, d'Artanyan başa düşdü ki, öz zənninin bir hissəsində yanılmışdır.

Bu, Aramis deyildir! o çığırdı.

– Yox, cənab, mənim adım Aramis deyil, sizin çığırtınızdan başa düşürəm ki, məni özgə bir adama bənzədibsiniz. Mən sizi əfv edirəm.

Siz məni əfv edirsiniz! d'Artanyan çığırdı.

- Bəli, - xarici cavab verdi. Yol verin, keçim gedim.

D'Artanyan dedi:



Haqlısınız, cənab, mənə siz yox, bu xanım lazımdır.

Bu xanımmı? Siz onu tanımırsınız, xarici cavab verdi.

– Səhv edirsiniz, cənab, mən onu tanıyıram.

Xanım Bonasye məzəmmətli bir əda ilə dedi:

Ax, mən sizin bir əsgər və əsilzadə kimi verdiyiniz sözə inanmışdım!

D'Artanyan utanmış halda cavab verdi:

Xanım, siz mənə vəd etmişdiniz ki...

Xarici, xanım Bonasyeyə dedi:

– Qoluma girin, xanım gedək.

Başına gələn əhvalatdan dili ağzı tutulmuş, ölümcül bir hala gəlmiş, məhv olmuş d'Artanyan qollarını çarpazlayıb muşketyor ilə xanım Bonasyenin qarşısında durmuşdu.

Muşketyor iki addım irəliləyib əli ilə d'Artanyanı kənara itələdi

D'Artanyan sıçrayıb qılıncını çəkdi.

Həmin saniyədə xarici də ildırım sürətilə öz qılıncını çəkdi.

Xanım Bonasye ikisinin arasına atılıb iki əli ilə hər iki qılıncdan yapışaraq çığırdı:

Siz allah, milord!

Milord! d'Artanyan çığırdı. – Milord! Bağışlayın, cənab, siz...

– Bekinhem hersoqudur, xanım Bonasye pıçıldadı İndi siz bizim hamımızı məhv edə bilərsiniz.

Milord, xanım, siz allah bağışlayın Lakin mən onu sevirəm, milord və mən qısqancam. Siz eşqin nə olduğunu bilirsiniz, milord, məni bağışlayın, mən sizin yolunuzda canımdan keçməyə hazıram.

Bekinhem hersoqu əlini d'Artanyana uzadaraq dedi.

Siz qoçaq bir cavansınız, mənə öz xidmətinizi təklif edirsiniz; mən də qəbul edirəm. Bizi Luvra qədər ötürün. Əgər bir yaramaz bizi pusursa, onu öldürün.

D'Artanyan sıyrılmış qılıncını qoltuğuna vurub xanım Bonasye ilə Bekinhem hersoqunu iyirmi addım irəli buraxdı və özü İngiltərənin nəcib nazirinin əmrini eynən yerinə yetirməyə hazır halda onların ardınca getdi.

Təəssüf ki, qoçaq cavan üçün hersoqa öz sədaqətini göstərməyə fürsət düşmədi. Cavan qadınla qəşəng muşketyor kimsə tərəfindən görünmədən Luvra daxil oldular.

D'Artanyan isə o saat Portos ılə Aramisin onu gözləməkdə olduq ları meyxanaya getdi.

Onları nə üçün yanına çağırdığını izah etmədən, sadəcə söylədi ki, onların köməyilə görmək istədıyı işı özü təkbaşına görüb qurtarmışdır.

Indi isə dostlarımız evlərinə getməkdə olsunlar, biz də Luvr sarayının dolanbac yollarında Bekinhem hersoqu ilə onu ötürən xanımın ardınca gedək.

## XII

## BEKİNHEM HERSOQU CORC VİLYERS

Xanım Bonasye ilə hersoq çətinlik çəkmədən Luvra daxil oldular. Xanım Bonasyeni sarayda hamı tanıyırdı. Hersoqun əynində cənab de Trevilin muşketyorlarına məxsus geyim var idi. İrəlidə söylədiyimiz kimi, bu muşketyorlar bu axşam novbədə ıdilər. Bundan başqa Jermen kraliçanın tərəfində ıdı, əgər bir şey aşkara çıxmış olsaydı, xanım Bonasyeni öz aşıqini Luvra gətirməkdə təqsirləndirəcəkdilər. Bununla da iş qurtarıb gedəcəkdi. Xanım Bonasye bütün təqsırı öz üzərinə götürəcəkdi. Doğrudur, beləliklə, onun adı ləkələnmiş olacaqdı. Am ma bir alverçi arvadının şərəfi kimi maraqlandırırdı!

Hersoq ilə cavan xanım həyətə girdikdən sonra divarın dibi ılə iyirmi beş addıma qədər getdilər. Xanım Bonasye, adətən, gündüzlər açıq, gecə isə bağlı olan bir qapını itələdi. Qapı açıldı, onlar içəri girdilər. Bura qapqaranlıq idi. Ancaq xanım Bonasye Luvrun saray xidmətçilərinə məxsus olan bu hissənin hər tərəfinə bələd idı. Qapını bağlayıb hersoqun qoluna girdi, bir neçə addım atdıqdan sonra əlhavasına pilləkənin məhəccərindən yapışıb yuxarı qalxmağa başladı. İkinci mərtəbəyə çıxdıqdan sonra sola döndü, uzun bir dəhlizdən keçdı, bır mərtəbə aşağı endi, bir neçə addım da atıb, bır qapıya açar saldı, qapı açıldı, hersoqu çıraqla işıqlanmış bir otağa salıb dedi· "Burada gözləyin, cənab hersoq, bura gələcəklər". Sonra özü həmin qapıdan çıxıb qapını açarla bağladı. Beləliklə, hersoq sözün tam mənasında bir dustaq olub qaldı.

Ancaq hersoq tamamilə tək qalmış olduğu halda, əsla qorxu hıss etmirdi. Onun şəxsıyyətinin gözə çarpan cəhətlərindən biri bu idi kı, qeyrı-adi və romantık şeyləri xoşlayırdı. Qoçaq, cürətli və zirək bır adam olan hersoqun belə vəziyyətlərdə həyatını təhlükəyə qoyması ilk dəfə deyildı. O bilirdi kı, avstriyalı Annanın ona yazılıb Parısə gəlməsinə səbəb olan məktub bir tələ idi. Bununla belə, İngiltərəyə qayıtmaq əvəzinə kralıçaya bıldirmişdi ki, onu görməyincə qayıdıb getməyəcəkdir. Kralıça əvvəl bunu qəti surətdə rədd etmişdi, sonra hersoqun dəlicəsinə bir hərəkət etməsindən qorxub, onu qəbul etməyə razı olmuşdu. Ancaq hersoqun ardınca gedib onu Luvra gətirməsi tapşırılan xanım Bonasye qaçırılmışdı. Onun başına nə gəldiyindən iki gün heç kəsin xəbəri olmamışdı.

Xanım Bonasye qaçıb qurtaran kimi o saat tapşırılan işi yerinə yetirməyə başlamışdı. Bu təhlükəli tapşırığı o, indi yerinə yetirməyə müvəffəq olmuşdu.

Bekinhem hersoqu tək qaldıqda, güzgüyə yaxınlaşdı. Muşketyor geyimi ona çox yaraşırdı.

O zaman hersoqun otuz beş yaşı olardı və haqlı olaraq Fransanın və İngiltərənin ən gözəl əsilzadəsi və zərif bir cavanı hesab olunurdu. O, güzgünün qabağında şlyapanın azacıq əzdiyi dalğalı, sarışın saçlarını düzəltdi, bığlarını səliqəyə saldı, çoxdan gözlədiyi dəqiqənin gəlib çatdığından, özünü xoşbəxt hesab edib güzgüdəkı əksinə baxaraq qürurla gülümsündü. Qəlbi qürur və ümidlə dolu idi.

Elə bu dəqiqədə dıvara çəkilmiş kağızların arasında gizli bır qapı açıldı, bir qadın içəri gırdi. Bunu hersoq güzgüdə gördü. O, ixtiyarsız çığıran kimi oldu. Bu gələn qadın kralıça idi.

O zaman avstriyalı Annanın ıyırmı altı iyirmi yeddi yaşı vardı. O, gözəlliyinin çiçəklənmiş bir çağında idi.

Bekinhem hersoqu heyran qalmışdı. O heç bir zaman, ən dəbdəbəli ballarda belə, avstriyalı Annanı bugünkü kımi sadə ağ atlat paltarında olduğu qədər gözəl görməmişdı

Kralıçanın yanınca xanım Estefaniya gəlirdi. Bu xidmətçi qadın kralın və kraliçanı təqib edən kardinal Rişelyenin qovmamış olduqları yeganə ispaniyalı xidmətçi idi.

Avstriyalı Anna iki addım ırəli atdı. Bekinhem hersoqu onun ayaqlarına düşdü. Kralıça ona mane olmağa macal tapmamış, hersoq onun paltarının ətəyindən öpdü.

Hersoq, siz artıq bilirsınız kı, aldığınız məktub mənim tərəfimdən yazılmamışdır.

– Bəlı, ülyahəzrət kraliça! · hersoq dilləndı. Mən bilirəm ki, buzun qıza biləcəyinə, mərmərin canlana biləcəyinə ınanmaqla sərsəm, dəli bır iş görmüşəm. Ancaq nə çarə! İnsan sevəndə sevgiyə asanlıqla inanır. Mən bu səyahəti boş yerə etməmişəm: mən sizi görürəm.

Bəli! – Anna cavab verdi. Lakin bılirsinizmi sizi bura nə üçün çağırmışam, milord? Ona görə kı, sız mənim bütün əməllərimə biganəsiniz. Ona görə ki, sizin həyatınız və mənim şərəfim təhlükədə olduğu bir halda siz inadla bu şəhərdə qalırsınız. Sizi çağırmışam deyim ki, hər bir şey dənizin dərinliyi, dövlətlər arasındakı düşmənlik, andların müqəddəslıyi bızi bır bırımızdən ayırır. Bütün bunlara müqavimət etmək günah kimi bir şeydir. Sözün qısası, mən sizi axırıncı dəfə görürəm. Mən sizi ona görə görürəm ki, bizim bir daha görüşməli olmadığımızı sizə söyləyim

Danışın, kralıça, danışın! Bekinhem hersoqu cavab verdi. Sizin səsinizin şirinliyı sözlərınızin acılığını yuyub aparır! Söyləyirsiniz ki, bu, günah kimı bır şeydir, məncə, ən böyük günah – bır bırı üçün yaranmış qəlbləri bır-birindən ayırmaqdır.

– Milord, · kraliça səsləndı. Mən heç bir zaman sizə öz eşqimdən danışmamışam!

Lakın heç bir zaman məni sevmədiyinizi də söyləməmişsiniz. Doğrudan da, bu, siz ülyahəzrət tərəfindən çox böyük naşükürlük olardı. Zira, söyləyın görüm, mənim eşqim kimi bir eşqi – nə zamanın, nə ayrılığın, nə məyusluğun söndürə bilmədiyi bir eşqi siz harada tapa bilərsiniz? Bu elə bir eşqdir ki, təsadüfən yaddan çıxardığınız bir lent ilə, ötəri bir baxışınızla, təsadüfən yaddan çıxardığınız bır kəlmə ilə kifayətlənır Üç ıl bundan əvvəl mən sizi ilk dəfə gördüm və bu üç ildən bəri sızi daima sevirəm. İstəyirsiniz sizi ilk dəfə gördüyüm zaman necə geyınmiş olduğunuzu söyləyim? İstəyirsiniz geyiminizin bütün bəzəklərini təsvir edim. Elə bil sizi bu saat görürəm Siz İspaniya qaydasınca, döşəkcələr üstündə oturmuşdunuz, əynınızdə zər və gümüş işləməli yaşıl atlas paltar var idi. Paltarın sallanan qolçaqları ırı brilyantlarla qollarınıza, o zərif və gözəl qollarınıza bənd olmuşdu. Başınızda paltarınız rəngində kiçik bir şlyapa və onun üzərındə bir vağ lələyı var idi. Of, mən gözlərimi yumanda sizi eynən o zaman olduğunuz kimi görürəm. Gözümü açanda isə, indıkı kimi, yəni əvvəlkindən yüz qat gözəl görürəm.



Bu nə dəlilikdir! – Avstriyalı Anna pıçıldadı. Öz surətini qəlbində bu qədər dürüstlüklə saxlamış olduğu üçün hersoqa heç bir vəchlə acığı tuta bilmirdi. Bu cür xatirələrlə faydasız bir ehtırasa qapılmaq nə qədər dəlilikdir!

Bəs mən nə ümidlə yaşaya bilərəm? Mənə qalan yalnız bu xatirələrdir. Bunlar mənim səadətim, mənim xəzinəm, mənim umidimdir. Sızinlə hər bir görüş qəlbimin xəzinəsində sanki yeni bır gövhərdir; çünkı bu üç ildə mən sızi yalnız üç dəfə görmüşəm. İlk dəfə – indicə sizə nağıl etdiyım kimi, ikinci dəfə hersoginya de Şervözgildə, uçüncü dəfə Amyen bağlarında...

Kraliça qızararaq dedı:

Hersoq, o görüş barəsində danışmayın!

Rica edirəm, yox, gəlın bu barədə danışaq: o axşam mənim həyatımda ən məsud bir axşam ıdi. Gecənin nə qədər gözəl olduğu yadınızdadırmı? Hava nə qədər ilıq, nə qədər rayihədar, gömgöy səmada ulduzlar necə parıldaşırdı! Ax o axşam mən bir an sizinlə tək qala bilmişdim. Siz bu barədə mənə danışmağa hazırdınız: həyatınızdakı yalqızlıqdan, qəlbinizin ələmlərındən danışırdınız. Siz mənim qoluma söykənmişdiniz. Sizın gözəl saçlarınızın üzümə toxunduğunu hiss edirdim... Ax, kraliça, kraliça! Bütün var dövlətimi, şöhrətimı, bütün yaşayacağım günləri belə bir an üçün, belə bir gecə üçün fəda etməyə hazıram, çünki o gecə, sizə and ıçırəm ki, o gecə siz məni sevirdiniz.

– Bəlı, milord, ehtimal kı, gecənin gözəllıyı, sizin baxışlarınızın təsiri və bəzən bir qadını məhv etmək üçün birləşən min cür vəziyyət o məşum gecə mənə qarşı silahlanmışdı. Lakin, milord, siz gördünüz ki, kraliçalıq şərəfi zəif bir qadının dadına çatdı.

– Bəli, bəli, bu doğrudur, mənim eşqimdən başqa heç bir başqa eşq bu sınaqdan çıxa bilməzdı. Lakin mənım eşqım bu sınaqdan daha artıq alovlanmış və daha artıq bərkimiş çıxdı. Sız Parisə qayıtmaqla məndən qaçıb gizlənmək istədiniz. Siz güman edırdiniz ki, padşahımın mənə tapşırdığı xəzinələri tərk etməyə cürətim çatmaz Ax, mənım üçün bütün dünyanın xəzinələri, bütün dünyanın kralları nədir ki? Bır həftədən sonra mən qayıdıb gəldim. Bu dəfə sız mənə söyləməyə söz tapmadınız. Mən sizi bir saniyə görmək üçün kralın mərhəmətini də, həyatımı da fəda etməyə razı olmuşdum. Mən hətta sızin əlınizə toxunmağa da nail ola bilmədim və siz itaətkarlığımı, peşmanlığımı görüb məni əfv etdiniz.

– Bəli, lakın iftiraçılar mənə dəxlı olmayan bütün bu dəliliklərdən istıfadə etdilər. Sız bunu bilirsiniz, milord. Kardinalın qəzəbləndirdıyı kral çox bərk qəzəblənmişdi. Xanım Verneni qovdular, Pütanjı sürgün etdilər, xanım de Şevröz kralın qəzəbinə düçar oldu və siz bir səfir sifətilə Fransaya qayıtmaq istədikdə, kral, yadınızda saxlayın, milord, kral özü buna mane oldu.

Bəlı, Fransa öz kralının bu rədd cavabı üçün muharıbə etməyə məcbur olacaqdır. Mən artıq sizi görə bilməyəcəyəm. Ona görə də istəyirəm kı, sız hər gün mənim barəmdə eşidəsiniz.

Milord, milord, özünüzu müdafiə etmək məqsədilə söylədiyiniz bu sözlər sizin özünüzü təqsirləndirir.

– Sizə ona görə belə gəlir ki, məni sevməyirsiniz. Sevmiş olsaydınız, hər bir şeyə başqa bir gözlə baxardınız. Əgər siz məni sevsəydınız, of, əgər məni sevsəydiniz, bu mənim üçün həddindən artıq bir səadət olardı və mən ağlımı itirərdim! Ax, xanım de Şevröz, sizin bu saat yad etdiyiniz xanım de Şevröz sızin qədər amansız deyildi. Qolland onu sevirdı, o da ona eşq ilə müqabilə etdi.

Xanım de Şevröz kraliça deyildi, – avstriyalı Anna bu dərin ehtirasın ifadəsindən məğlub olmuş halda pıçıldadı.

– Deməli, sız kraliça olmasaydınız, məni sevərdiniz, eləmi? Güman edə bilərəmmi ki, mənə qarşı amansızlığınızın səbəbi yalnız sizin mənsəbinizdir? Guman edə bilərəmmi ki, əgər siz xanım de Şevröz olsaydınız, yazıq Bekinhem hersoqu sevilməyə ümidvar ola bilərdi? Bu şirin sözlər üçün sizə təşəkkür edirəm. Ax, gözəl kraliçam, min dəfə təşəkkür edirəm!

– Aman Allah! Aman Allah! avstriyalı Anna səsləndi. Buna taqətim çatmır. Bura baxın, hersoq, siz allah, gedin, bu ölkədən gedin! Sizi sevib-sevmədiyimi bilmirəm, yalnız onu bilirəm ki, öz andımı pozmayacağam. Mənə rəhminiz gəlsin və çıxıb gedin. Of, əgər sizi Fransada, həm də mənə olan eşqiniz üstündə öldürmüş olsalar, heç bır zaman təsəlli tapa bilmərəm, mən dəli olaram! Gedin, sizə yalvarıram, gedin!

Elə isə rəğbətinizin bir rəhni olaraq, bizim görüşümüzün röya olmadığını sübut etmək üçün, mənə bir yadigar verın, elə bir şey ki, onu siz taxmış olasınız və mən də taxa biləm, məsələn: üzük, boyunbağı, zəncir kimi bir şey...

- Bu saatmı?



Bəli.

- Onda siz Fransanı tərk edib Ingiltərəyə qayıdarsınızmı?

Bəli, sizə and içirəm!

– Məni gözləyin.

Kraliça öz otağına qayıtdı və o saat, əlində çəhrayı ağacdan qayırılmış kiçik bir mücrü ilə qayıtdı. Mücrünün üstündə qızıldan onun adının baş hərfləri nəqş edilmişdi.

Bunu alın, hersoq, məndən yadigar saxlayın.

Hersoq mücrünü aldı və ikinci dəfə diz çökdü.

Kraliça dedi:

Siz mənə çıxıb getməyinizi vəd etmişdiniz!

Mən sözümün üstündə dururam. Əlinizı verın, kraliça, əlinizi verin, mən çıxıb gedirəm.

Kralıça əlini uzatdı, o, özünün taqətdən düşdüyunü hiss edırdi

Bekinhem hersoqu bu gözəl əli hərarətlə öpdü, sonra ayağa qalxıb söylədi:

Əgər sağ qalmış olsam, yarım ildən daha az bir müddətdən sonra, bütün dünyanı alt-üst etmək lazım gəlsə də, sizi görəcəyəm, kraliça!

Bu sözlərdən sonra öz vədinə sədaqətlə əməl edib sürətlə otaqdan çıxdı.

Dəhlızdə o, xanım Bonasyeyə rast gəldi. O da əvvəlki kimi ehtiyatla hərəkət edib, hersoqu müvəffəqiyyətlə Luvr sarayından kənara çıxartdı.

## XIII

## CƏNAB BONASYE

Oxucular gördüyü kimi, bütün bu əhvalatda bir adam da iştirak edırdi ki, vəziyyətinin pis olduğuna baxmayaraq, heç kəs onun qeydinə qalmırdı. Bu adam cəngavərlik və aşiqanə macəralarla dolu olan o zamanlarda bir-birinə dolaşmış aşiqanə və siyası fitnələrin qurbanı – zavallı cənab Bonasye idı.

Xoşbəxtlikdən bız bu hörmətlı burjuanı yaddan çıxarmamağı vəd etmişdik.

Nəzarətçılər onu Bastılıyaya gətirıb gəldilər. Burada o, öz tüfən gini doldurmaqda olan bir dəstə əsgərin yanından qorxa-qorxa keçdi.

Sonra onu yarımzirzəmi bir dəhlizə saldılar. Burada o saat dustaqxana xidmətçiləri onunla ən qaba zarafatlar və ən sərt istehzalar etməyə başladılar. Casuslar onun əsilzadə olmadığını görüb, yazıqla bir fırıldaqçı kimi rəftar edirdilər.

Təxminən, yarım saat keçdikdən sonra katib gəldi və bu onun iztirablarına son verdisə də, həyəcanını azaltmadı. Katib onu istintaq otağına aparmalarını əmr etdi. Adət üzrə dustaqları öz kameralarında dindirərdilər. Ancaq cənab Bonasye ilə çox da qayda üzrə rəftar etmirdilər.

İki əsgər tacirin qollarından yapışıb, onu həyətdən keçirib bir dəhlizə apardı. Burada üç keşikçi durmuşdu. Bir qapını açıb, onu alçaq bir otağa saldılar. Bu otağın bütün müxəlləfatı bir miz ilə bir kürsüdən ibarət idi. Mizin arxasında bir komissar oturub yazı yazırdı. Əsgərlər dustağı mizin yanına gətirdilər və komissarın işarəsi ilə istintaqı eşitməmək üçün kənara çəkildilər.

Komissar başını aşağı salıb kağızlarla məşğul idi. O, qarşısındakı adamın kim olduğunu görmək üçün başını qaldırdı. Onun görkəmi çox da xoş deyildi: burnu nazik, irəli çıxmış almacıqları sapsarı, gözləri xırdaca, amma təsirli idi. Üzü eyni zamanda həm dələ, həm də tülkü sifətinə bənzəyirdi. Uzun və oynaq boynu üzərindəki başı qara gen paltarının içərisindən çanaqdan boylanmış tısbağa başı kimi yırğalanırdı.

Komissar Bonasyedən adını, yaşını və harada yaşadığını soruşdu O cavab verdi ki, adı Jak Mişel Bonasyedir. Yaşı əlli bir, özü xırdavat taciridir, indi isə ticarətdən əl çəkib Məzarçılar küçəsində on bir nömrəli evdə yaşayır.

Komissar istintaqı davam etdirmək əvəzinə ona uzun bir nitq söyləyib, adi bir alverçinin dövlət işlərinə qarışmasının nə qədər təhlükəli olduğunu söylədi. Bununla bərabər, komissar ona bütün keçmiş nazirlərə qalib gəlmiş və gələcək nazirlərə nümunə olan indiki misilsiz nazirin, yəni cənab kardinalın qüdrətindən, onun işlərinə və hakimiyyətinə heç bir kəsin cəzasız müqavimət edə bilməyəcəyindən danışdı.

Komissar öz nitqinin ikinci hissəsindən sonra qırğı gözlərinə bənzəyən gözlərini yazıq Bonasyeyə zilləyib, ona məsləhət gördü ki, öz vəziyyətinin nə qədər ciddi olduğu barədə düşünsün.

Ancaq tacir artıq öz-özlüyündə qərarını vermişdi· o, cənab de La Portun öz xaç qızlığını ona ərə vermək fikrinə düşdüyü dəqiqəni, xüsusilə onu kraliçanın yanında xidmətçi qoyduğu dəqiqəni lənətlə yad edirdi.



Bonasyenin əsas xüsusiyyətləri – onun çox xudbin, yaman xəsis, son dərəcə qorxaq olması idi

Bonasye ona bu saat söylənilən sözlər barədə çox ciddi düşünməyə başlayıb soyuqqanlıqla komissara söylədi:

- Ancaq, cənab komissar, inanın ki, mən kardinal həzrətlərinin misilsiz üstünlüklərini hamıdan artıq qiymətləndirirəm.

Doğrudanmı? Komissar şübhəli-şübhəli soruşdu. Doğrudan da bu belə isə, bəs siz Bastiliyaya necə düşübsünüz?

Bonasye cavab verdi:

Bura nə cür düşduyumu, daha doğrusu, nə səbəbə düşdüyümü heç bir surətlə söyləyə bilmərəm; çünki mən özüm də bunu bilmirəm. Ancaq, hər halda bura düşməyimin səbəbi cənab kardinalın əleyhinə olmağım deyildir.

– Ancaq sizi dövlətə xəyanətdə töhmətləndirirlər!

Dövlətə xəyanətdəmi? Bonasye qorxmuş halda ucadan soruşdu. Lakin necə ola bilər ki, quqenotlardan zəhləsi gedən və ispaniyalıları görməyə gözü olmayan yazıq bir tacir dövlətə xəyanət etməkdə töhmətləndirilsin? Özünüz bir fikirləşin, bu, əsla mümkün deyil.

– Cənab Bonasye, deyə komissar müttəhimə elə bir baxışla baxdı ki, elə bil onun xırdaca gözləri insan qəlbinin dərinliyində olan şeyləri görməyə qadir idi. – Cənab Bonasye, sizin arvadınız varmı?

– Bəli, cənab, – tacir qorxa-qorxa cavab verdi. Hiss edirdi ki, burada işləri dolaşmağa başlayacaqdır. Yəni mənim arvadım var idi.

Necə yəni var idi? Bəs onu neyləyibsiniz?

Qaçırıblar.

Qaçırıblar? – Komissar soruşdu. Aha!

Bu "aha" nidasından Bonasye anladı ki, onun işləri artıq dolaşır.

– Arvadınızı qaçırıblarmı? Komissar davam etdi. – Siz onu qaçıran adamı tanıyırsınızmı?

Güman edirəm ki, tanıyıram.

– Kimdir?

Nəzərə alın ki, mən heç bir şeyi təsdiq etmirəm, cənab komissar, yalnız təxmin edirəm.

Nəyi təxmin edirsiniz? Ancaq açıq danışın.

Cənab Bonasye özünü tamamilə itirmişdi. Bilmirdi ki, hər bir şeyi açıb söyləsin və ya heç bir şeyi boynuna almasın. Əgər heç bir şeyi boynuna almasa, güman edəcəklər ki, o, çox şey bilir. Buna görə heç

bir şey söyləmir. Hər bir şeyi açıb söyləməklə, xeyirxah bir adam olduğunu sübut edəcəkdır. Buna görə də o, hər şeyi açıb söyləməyi qərara aldı.

Mən ucaboylu, qarayanız və zahirən təmkinli görünən bir kişidən şübhələnirəm. Zahiri cəhətdən o, əyana bənzəyir. Arvadımı evə ötürmək üçün Luvr sarayının qapısında gözlədiyim zaman o, bir neçə dəfə məni təqib etmişdi.

Bu sözlərdən komissar, deyəsən, bir qədər narahat oldu.

Bəs onun adı nədir? deyə soruşdu.

Adını bilmirəm. Ancaq ona bir zaman rast gəlmiş olsam, sizə söz verirəm ki, min adamın içində də olsa, tanıyaram.

Komissar yenidən üzünü turşutdu.

Deyirsiniz ki, onu min nəfərin içindən də tanıyarsınız, eləmi? – deyə davam etdi.

Bonasye səhv etdiyini başa düşüb dilləndi:

Yəni ki... Yəni ki...

Komissar dedi:

Siz cavab verdiniz ki, həmin adamı görsəniz tanıyarsınız. Yaxşı, bu günlük bu qədər kifayətdir. İstintaqın dalını davam etdirmək üçün biz gərək bəzi adamları xəbərdar edək ki, arvadınızı qaçıran adamı tanıyırsınız.

Bonasye məyus halda çığırdı:

Yox, mən sizə deməmişəm ki, onu tanıyıram! Əksinə, mən sizə dedim ki...

Dustağı aparın, komissar əsgərlərə müraciət etdi. Hara aparaq? – katib soruşdu.

– Kameraya.

Hansı kameraya?

Hansına olursa olsun, ancaq təki qapısı möhkəm bağlansın. – Komissar elə laqeyd bir əda ilə cavab verdi ki, yazıq Bonasyenin canına qorxu düşdü.

O, öz-özünə dedi:

“Of, başıma nə bəlalar gəlir! Arvadım, yəqin ki, dəhşətli bir cinayət etmişdir. Məni də onunla əlbir hesab edib bir yerdə cəzalandıracaqlar. O, yəqin ki, bunu boynuna alıb, hər bir şeyi açıb dediyini onlara söyləyib. Qadınlar nə qədər zəifdirlər! “Kamera”, “Hansı olursa-olsun!”. Məsələ aydındır! Gecələr yaman qısadır, sabah isə



boynumu vuracaqlar, ya da dara çəkəcəklər! Ay Allah, ay Allah, mənə rəhmin gəlsin!”

Belə fəryadlara Bastiliyada çoxdan alışmış olduqlarından keşikçilər onun ah-zarına əsla əhəmiyyət verməyib, dustağın qollarından yapışıb kameraya apardılar. Bu zaman komissar tələsik bir məktub yazırdı. Katib onun yazıb qurtarmasını gözləyirdi.

Bonasye gözlərini yuma bilmədi. Çox həyəcanlı idi. Bütün gecəni çarpayısının üstündə oturub ən kiçik bir səs eşitdikdə diksinirdi. Nəhayət, günəşin ilk şüaları kameraya düşdü. Yazıq tacirə bu səhər şəfəqi çox məşum görünürdü.

Birdən o, qapının cəftəsinin çəkildiyini eşitdi, dəhşət içində yerindən sıçradı, güman etdi ki, onu boynunu vurmaq üçün aparmağa gəliblər. Gözlədiyi cəllad əvəzində dünənki komissar ilə katibi gördükdə, az qaldı boyunlarına atılıb onları qucaqlasın.

Komissar dedi:

Dünəndən bəri sizin işiniz xeyli mürəkkəbləşmişdir, möhtərəm cənab, mən sizə məsləhət görürəm ki, bütün həqiqəti açıb söyləyəsiniz. Kardinalın qəzəbini yalnız səmimi peşmanlıq və etiraf yumşalda bilər.

Mən bildiyim hər bir şeyi söyləməyə hazıram. Xahiş edirəm, zəhmət çəkib soruşasınız.

– Hər şeydən əvvəl söyləyin, arvadınız haradadır?

Mən sizə söylədim ki, onu qaçırıblar.

Ancaq gündüz saat beşdə o sizin köməyiniz sayəsində qaçıb qurtarmışdır!

– Mənim arvadım qaçmışdır? – Bonasye çığırdı. – Vay bədbəxt! Cənab komissar, əgər o qaçıbsa, sizə and içirəm ki, mənim bunda heç bir təqsirim yoxdur.

Bəs siz qonşunuz d’Artanyanın yanına nə üçün getmişdiniz? Siz həmin gün onunla xeyli müddət nə barədə məsləhət etmişdiniz?

Bəli, bəli, cənab komissar, bu doğrudur, mən müqəssirəm. Mən cənab d’Artanyanın yanına getmişdim.

Siz onun yanına nə məqsədlə getmişdiniz?

– Xahiş edirdim ki, arvadımı tapmaqda mənə kömək etsin; elə güman edirdim ki, arvadımı geri tələb etməyə haqqım var. Görünür mən səhv etmişəm. Xahiş edirəm məni bağışlayasınız.

- Bəs cənab d’Artanyan sizə nə cavab verdi?

Cənab d'Artanyan öz köməyini vəd etdi. Ancaq sonra tezliklə başa düşdüm ki, o məni aldadırmış.

Siz ədalət, məhkəməsini yanıltmağa çalışırsınız! Cənab d'Artanyan sizinlə şərtləşibmiş və bu şərtə görə də o, arvadınızı tutmuş olan polisləri qovub və arvadınızı qaçırıb gizlətmişdir.

Cənab d'Artanyan arvadımı qaçırtmışdır? Siz nə danışırsınız?

Xoşbəxtlikdən cənab d'Artanyan bizim əlimizdədir və onu sizin üzünüzə durğuzacaqlar.

Bonasye ucadan dedi:

– Namus haqqı, mənə də bundan artıq bir şey lazım deyil. Mən tanış bir üz görməkdən məmnun olaram.

D'Artanyanı gətirin! komissar iki əsgərə əmr verdi.

Əsgərlər Atosu içəri gətirdilər.

Cənab d'Artanyan, – komissar Atosa müraciət etdi, söyləyin görək, sizin ilə bu cənab arasında nə danışıq olmuşdur?

– Axı bu ki, cənab d'Artanyan deyil! - Bonasye çığırdı.

Necə? Bu d'Artanyan deyilmi? komissar acıqlı-acıqlı soruşdu.

Əsla, – Bonasye cavab verdi.

Bəs bu cənabın adı nədir? komissar soruşdu.

– Bunu deyə bilmərəm. Mən onu tanımıram.

- Necə, siz onu tanımırsınız?

Yox.

Siz onu heç bir zaman görməyibsinizmi?

Görmüşəm. Ancaq adını bilmirəm.

– Sizin adınız nədir? komissar soruşdu.

– Atos, muşketyor cavab verdi.

Axı, bu ki, adam adı deyil, dağ adıdır! başını itirməkdə olan yazıq müstəntiq çığırdı.

– Bu, mənim adımdır, Atos sakit bir səslə cavab verdi.

- Bəs siz deyibsiniz ki, adınız d'Artanyandır?

Mənmi?

Bəli, siz.

Bağışlayın, məndən soruşdular ki, "Siz cənab d'Artanyansınızmı?!" Mən də cavab verdim ki, "Siz eləmi güman edirsiniz?" Əsgərlər çığırdılar ki, onlar buna əmindirlər. Mən onların zıddınə getmək istəmədim, bir də ola bilər ki, mən səhv edə bilərdim.

Möhtərəm cənab, siz ədalət məhkəməsini təhqir edirsiniz.



– Əsla, Atos sakit cavab verdi.

Siz cənab d'Artanyansınız!

Görürsünüz ki, siz özünüz də bunu təsdiq edirsiniz!

Bonasye davam edə bilməyib çığırdı:

– Ancaq, cənab komissar, mən sizə deyirəm ki, bu barədə heç bir şübhə ola bilməz. Cənab d'Artanyan mənim evimdə olur və deməli ki, hərçənd o mənə ev kirəsini verməmişdir, yaxud bəlkə elə buna görə də mən onu tanımalıyam. Cənab d'Artanyan on doqquz və iyirmi yaşlarında bir cavandır. Bu cənabın isə, yaşı hər halda otuzdan əskik olmaz. Cənab d'Artanyan cənab Dezessarın qvardiya bölüyündə xidmət edir. Bu isə cənab Trevilin muşketyorudur. Bir onun geyiminə baxın, cənab komissar, geyiminə baxın!

– Bu düzdür, – komissar deyindi, vallahi düzdür!

Bu zaman qapı sürətlə açıldı və Bastiliya dustaqxanasının xidmətçilərindən birinin gətirdiyi adam komissara bir məktub verdi.

Vay, bədbəxt qadın! – komissar çığırdı.

Nə dediniz? Siz kimdən danışırsınız? Ümid edirəm ki, bu sözlər mənim arvadıma aid deyil?

Onun özünə aiddir. İşiniz çox yaxşı gedir. Heç söz ola bilməz.

Özündən çıxmış tacir çığırdı:

– Bura baxın, söyləyin görüm, dustaqxanada olduğum bir halda arvadımın gördüyü işlər mənim işlərim nə sayaq xarab edə bilər?

Çünki onun hərəkətləri əvvəlcə sizinlə birlikdə hazırlanmış olduğu məlun planın nəticəsidir.

Cənab komissar, and içirəm ki, tamamilə yanılırsınız. Arvadımın görə biləcəyi işlərdən əsla xəbərim yoxdur və əgər o, sarsaq işlər görürsə, mən ondan tamamilə əl çəkirəm, onu rədd edirəm, ona lənət edirəm.

Atos komissara dedi:

Bura baxın, əgər artıq burada sizə lazım deyiləmsə, məni başqa bir yerə göndərin. Sizin bu Bonasye lap zəhləmi apardı.

Komissar Atos ilə Bonasyeni göstərərək dedi:

– Dustaqları kameralarına aparın və onları ciddi nəzarət altında saxlayın.

Atos öz adi soyuqqanlığı ilə dedi:

İndi ki, sizin işiniz cənab d'Artanyana aiddir, onda bilmirəm nə cəhətdən onu əvəz edə bilərəm?

Komissar çığıraraq dustaqxana xidmətçilərinə əmr etdi:

– Əmri yerinə yetirin! Özünüz də bütün bunların gizli qalması üçün əlinizdən gələni edin, eşidirsinizmi?

Atos çiyinlərini ataraq nəzarətçilərin ardınca getdi, Bonasye isə, elə bir fəryad etdi ki, pələngi də rəhmə gətirərdi.

Taciri gecə qaldığı kameraya gətirdilər və bütün günü orada saxladılar. Bonasye bütün günü hönkür-hönkür ağladısa da, heç bir şey çıxmadı.

Axşam saat doqquzda o, nəhayət, bir qədər uzanmaq istədikdə, dəhlizdən ayaq səsləri eşitdi. Bu ayaq səsləri onun kamerasına yaxınlaşdı və qapı açıldı. Keşikçilər içəri girdilər.

Onların ardınca gələn polis məmuru ona dedi.

– Ardımca gəlin!

– Ardınızca gəlim? – Bonasye çığırdı. – Gecənin bu vaxtında ardınızca gəlim! Ay Allah, görəsən bunlar məni hara aparırlar?

– Hara əmr edilmişsə, ora!

– Axı bu ki, bir cavab deyil.

– Bu, bizim sizə verə biləcəyimiz yeganə cavabdır.

– Aman Allah, aman Allah, – yazıq tacir mırıldandı. – Daha mənim işim bitdi.

Bu sözlərdən sonra o, mexaniki olaraq əsla müqavimət göstərmədən, keşikçilərin ardınca getdi.

Onlar dəhlizdən keçdilər, həyətdən çıxdılar, sonra fligeldən keçib qabaq həyətin darvazasına çatdılar. Burada dörd nəfər atlı tərəfindən əhatə olunmuş bir kareta gözləyirdi. Bonasyeni həmin karetaya mindirdilər, bir polis onun yanında əyləşdi, qapını açarla bağladılar, tacir səyyar bir dustaqxananın içində qaldı.

Kareta tabut arabası kimi ağır gedirdi. Dustaq barmaqlığın arasından yalnız evləri və küçənin yerini görürdü. Ancaq Bonasye əsl parisli olduğundan, gördüyü daş səkilərdən, lövhələrdən, fənərlərdən hər bir küçəni tanıyırdı. Onlar Bastiliya dustaqlarını edam edildikləri müqəddəs Pavel küçəsinə çatdılar. Bonasye az qaldı ki, huşunu itirsin; iki dəfə xaç vurdu. Güman edirdi ki, kareta duracaqdır. Ancaq kareta ötüb keçdi.

Bir azdan sonra yenə qorxudan canına üşütmə düşdü. Onlar müqəddəs İoan qəbiristanının yanından keçirdilər. Bu qəbiristanda dövlət işlərində cinayətkar olanları basdırardılar. Bircə şey Bonasyeyə bir az təskinlik verirdi. Bu da ondan ibarət idi ki, caniləri basdırmamışdan əvvəl, adət üzrə, onların boyunlarını vurardılar. Onun başı isə, hələlik çiyinlərinin üstündə idi. Ancaq Bonasye karetanın Qrev meydanından dönüb keçdiyini, şəhər idarəsi binasının dik ucalan damını gördükdə və kareta tağın altına girdikdə, bu qərara gəldi ki, artıq işi bitmişdir. İstədi ki, polis məmuruna tövbə-istiğfar edib iqrar versin. Polis bu təklifi rədd etdi. Onda Bonasye ümidsiz halda elə çığırmağa başladı ki, polis məmuru əgər susmasa, ağzını yummalı olduğunu bildirdi.

Bu təhdid Bonasyeni bir az sakitləşdirdi. Əgər onu Qrev meydanında edam etmək istəsəydilər, onda ağzını yummağa ehtiyac qalmazdı, çünki kareta artıq, demək olar ki, edam yerinə çatmışdı. Xoşbəxtlikdən bu dəhşətli meydanda durmadan ötüb keçdilər. Bircə Trauar Xaçı qalırdı. Doğrudan da, kareta elə o tərəf döndü.

Trauar Xaçının yanında xırda cinayətkarları edam edirdilər. Bonasye özünü müqəddəs Pavel kilsəsi və ya Qrev meydanında edam edilməyə layiq bilmək ümidi ilə lovğalanırdı. Ancaq belə görünür ki, onun müqəddəratı Trauar xaçının yanında qurtarmalı imiş. O, hələ bu dəhşətli yeri görmürdü. Ancaq yaxınlaşmaqda olduğunu hiss edirdi. Kareta iyirmi addım da irəlilədikdən sonra Bonasye səs-küy eşitdi, kareta durdu. Onsuz da başına gələnlərdən tamamilə üzülmüş olan yazıq Bonasye artıq buna tab gətirə bilmədi. O, ölən bir adamın son nəfəsinə bənzər bir səslə zarıdı və özündən getdi.

## XIV

## MENQDƏKİ NAMƏLUM ADAM

Camaat bura asılmalı adam gözləmək üçün deyil, artıq asılmış olan bir adama tamaşa etmək üçün yığışmışdı.

Kareta bir dəqiqə durdu, sonra hərəkət edib Sent-Onore küçəsindən keçdi. Mehriban Uşaqlar küçəsinə döndü və alçaq bir kilsənin qapısında durdu.

Qapı açıldı, iki nəfər polis məmuru Bonasyeni qoltuqlayıb pilləkənlə yuxarı qaldırdı və dəhlizdə oturtdu.

Bonasye yuxuda gəzən adam kimi gedirdi. O, hər şeyi bir duman pərdəsi altından görürdü. Eşitdiyi səslərin mənasını anlamırdı. Əgər

bu dəqiqə onu edam etsəydilər, özünü müdafiə üçün heç bir hərəkət etməz, aman diləmək üçün heç bir səs çıxarmazdı.

Bonasye onu qoyduqları yerdə oturub arxasını divara söykəmiş, qollarını yanına salmışdı. Yavaş-yavaş ətrafa göz gəzdirməyə başladı. Yan-yörəsində qorxulu heç bir şey yox idi, heç bir şey burada bir təhlükə olduğunu göstərmirdi. Oturduğu skamya xeylı yumşaq idi. Divarlara gözəl Kordov dərisi çəkilmişdi. Pəncərələrdə qırmızı ipək pərdələr yellənirdi. Yavaş-yavaş başa düşdü kı, bu dərəcədə qorxu çəkməsi nahaqdır; başını sağa, sola, yuxarı və aşağı çevirməyə başladı.

Bu hərəkətləri edərkən kimsənin mane olmadığını görüb bir az ürəkləndi. Əvvəl bir ayağını, sonra da o biri ayağını düzəltməyə cürət etdi. Sonra əllərinin köməyilə skamyadan qalxıb ayağa durdu.

Həmin bu dəqiqədə gözəl görkəmli bir zabit qonşu otaqdakı adamla danışa-danışa pərdəni qaldırdı, sonra dustağa müraciətlə dedi:

– Bonasye sizin adınızdırmı?

– Bəli, cənab zabit, - tacir qorxudan yarımcan halda cavab verdi, – qulluğunuzda hazıram.

Zabit dedi:

İçəri girin.

O, Bonasyeni qabağına saldı. Tacir etiraz etmədən tabe olub otağa girdi. Yəqin ki, burada onu gözləyirdilər.

Bu otaq geniş bir kabinet idi. Divarlarda hər cür silah asılmışdı. Sentyabr ayının son günləri olmağına baxmayaraq, buxarıda od yanırdı.

Otağın ortasında dördkünc bir masa var idi. Masanın üstü kitab və kağızlarla dolu idi. Bunların üzərinə Laroşel şəhərinin iri bir xəritəsi sərilmışdı.

Buxarının qabağında orta boylu, məğrur və mütəkəbbir bir adam durmuşdu. Bunun gözləri təsirli, alnı geniş, üzü arıq idi. Çənəsinin ucundakı İspaniya qaydası ilə qoyulmuş ucu iti saqqal üzünü bir az da uzun göstərirdi. Yaşı otuz altı, otuz yeddidən çox olmazdısa da, saçları, bığları və çənəsinin ucundakı İspaniya sayağı saqqalı çallaşmışdı. Yanında qılınc yox idisə də, hər cəhətdən hərbi adama bənzəyirdi. Azca tozlu olan uzunboğaz çəkmələri onun bu gün at üstündə yol gəldiyini göstərirdi.

Bu adam Arman-Jan dü Plessi, kardinal de Rişelye idi. O, adətən daima təsvir etdikləri kimi, hələ taqətdən düşmüş, zəif, iztirab çəkən, səsi batmış, yalnız fikrinin gərginliyi sayəsində yaşayan bir qoca deyildi. O zamanlar o, zirək və mehriban bir cavan idi.



Beləliklə, ilk baxışda heç bir əlamət bu adamın kardinal olduğunu göstərmirdi və üzdən tanımayanlar kimin qarşısında olduqlarını bilməzdilər.

Qorxmuş tacir qapının ağzında durdu, kardinalın təsirli gözləri ona zilləndi.

Kardinal bir dəqiqə susduqdan sonra soruşdu:

Bonasye budurmu?

– Bəli, monsinyor, zabit cavab verdi.

– Yaxşı, lazım olan kağızları verin və bizi tək buraxın.

Zabit masa üzərindən bir neçə kağız götürüb kardinala verdi və ikiqat əyilib təzim edərək çıxdı.

Bonasye bu kağızları tanıdı. Bunlar Bastiliyada aparılan istintaqın protokolları idi. Buxarının qabağında durmuş adam arabir gözlərini qaldırıb qarşısındakı müttəhimin üzünə baxır və bu zaman sankı yazıq tacirin qəlbinə iki iti xəncər batırdı.

Kardinal on dəqiqə kağızları oxuduqdan və on saniyə müşahidədən sonra artıq qabağındakı adamın kim olduğunu bilirdi.

O, öz-özünə düşündü: “Bu baş heç bir zaman sui-qəsdlərdə iştirak etməmişdir, amma hər halda bir baxaq”.

Nəhayət, kardinal dilləndi:

– Sizi dövlətə xəyanət etməkdə təqsirləndirirlər

Mənə bunu artıq söyləmişlər, monsinyor, deyə Bonasye zabitdən eşitdiyi “monsinyor” sözünü təkrar ilə cavab verdi, sizə and içirəm ki, bu barədə mən heç bir şey bilmirəm!

Kardinal özünü gülümsünməkdən saxladı.

– Siz arvadınızla, xanım de Şevröz ilə və Bekinhem hersoqu ilə birlikdə sui-qəsddə iştirak edibsiniz.

Tacir cavab verdi:

Mən, doğrudan da, arvadımdan butun bu adları eşitmişəm, monsinyor.

Nə kimi bir vəziyyətdə?

O deyirdi ki, kardinal Rişelye Bekinhem hersoqunu Parisə gətirmişdir ki, onu və onunla birlikdə kraliçanı məhv etsin.

O, beləmi dedi, kardinal qəzəblə çığırdı

Bəli, monsinyor, ancaq mən ona dedim ki, nahaq yerə belə şeylər danışır və kardinal həzrətləri belə şeylər..

Susun! Siz axmaqsınız! Kardinal acıqlandı.

– Arvadım da belə dedı.
– Arvadınızı kim qaçırdığını bilırsinizmi?
Yox.
– Ancaq gərək kı, siz şübhələnirsiniz?
Bəli, monsinyor. Ancaq bu şübhələr, deyəsən, cənab komissarın xoşuna gəlmədi. Buna görə də mən daha bu şübhələrdən əl çəkdim.
– Sizin arvadınız qaçmışdır.Bundan sizin xəbəriniz varmı?
Xeyr, monsınyor, mən bunu artıq dustaqxanada olduğum zaman eşitdim. Hamısını da mənə çox mehriban bir adam cənab komıssar xəbər verdi.
Kardinal yenə özünü gülumsünməkdən saxladı.
- Deməlı ki, sizin arvadınız qaçandan sonra başına nə gəldıyındən xəbəriniz yoxdur!
Əsla xəbərim yoxdur. Ancaq o, yəqin ki, Luvra qayıtmışdır.
Gecə saat birdə o, hələ orada yox idi.
– Of, aman Allah! Bəs görəsən onun başına nə gəlib?
Narahat olmayın. Bunu bilərlər. Kardinaldan heç bir şey gizlətmək olmaz. Kardinal hər şeyi bilir.
Elə ısə, monsinyor, bəlkə kardinal arvadımın başına nə gəldiyini mənə söyləməyə razı olar?
Bəlkə də... Ancaq əvvəlcə gərək siz arvadınızın xanım de Şevröz ilə əlaqəsi barədə bütün bildıklərinizi söyləyəsiniz.
– Ancaq mən bu əlaqə barədə heç bir şey bilmirəm, monsinyor. Mən xanım de Şevrözü heç bir zaman görməmışəm.
– Siz arvadınızın dalınca Luvra gəlirdiniz. O, birbaş evəmi qayıdırdı?
Demək olar ki, heç bir vaxt düz evə getmirdi. Onun katan alverçilərilə işi olurdu. Mən onu ötürürdüm.
– Bu alverçilər neçə nəfər olardı?
– İkı nəfər monsinyor.
Onlar harada yaşayırlar?
Biri Vojirar küçəsində, o biri Laqarp küçəsində.
Siz onların evlərinə gırıbsınizmi?
Xeyr, monsınyor, mən qapının ağzında gozləyirdım.
– Arvadınız evə tək gırməsinin səbəbini nə ilə izah edirdi?
Heç bir şeylə izah etmirdi. O, mənım gözləməyimı xahiş edirdi, mən də gözləyirdim.



Siz çox mülayım bır ərsiniz, əzizim cənab, Bonasye!
Tacir öz-özünə belo düşündü: "O, məni "əzizim Bonasye" çağırdı. Deyəsən, işlər düzəlir, lənət şeytana!"
– Siz o qapıları tanıyırsınızmı?
Bəli, monsınyor.
Onların nömrələrını bılirsinizmi?
Vojirar küçəsində nömrə iyirmi beş, Laqara küçəsində yetmiş beş.
– Yaxşı, kardınal gümüş zəngı çaldı.
Zabit içəri girdi.
Rişelye tələsık dedi.
– Roşfor gəlmışsə, onu yanıma çağırın!
Zabit dedi:
Qraf buradadır və təkidlə kardinal həzrətlərilə görüşmək istəyir.
Rişelye tələsik halda dedi:
Çox yaxşı. Onu çağırın.
Zabit kardinalın xıdmətçılərınə xas bır sürətlə otaqdan çıxdı.
Bonasye hürkmüş halda ətrafına göz gəzdirərək öz özünə mırıldandı: "Kardinal həzrətləri!"
Beş saniyə də keçmədən qapı açıldı və yenı gələn adam içəri girdi.
– Bu odur! Bonasye çığırdı.
– O, yəni kim? kardinal soruşdu.
Mənim arvadımı qaçıran adam.
Kardinal ikinci dəfə zəngi çaldı. Zabıt gəldı.
- Bu adamı bura gətirən əsgərlərə təslım edin. Orada gözləsin.
Bonasye çığırdı:
Yox, monsinyor, yox. Bu o deyil! Yox, mən səhv etmişəm! O, tamamilə, başqa adamdır, ozü də buna heç bənzəmir. Bu cənab namuslu bir adamdır.
Kardinal dedi:
Bu axmağı aparın!
Zabit Bonasyenin qolundan yapışıb onu dəhlızə apardı. Əsgərlər orada gözləyirdilər.
Kardinalın yanına gəlmiş adam Bonasyenın dalınca qapının örtülməsini çox səbirsizliklə gözləyirdi.
Həmin adam tələsik kardinala yanaşıb dedı:
Onlar görüşmuşlər.

Kraliça ilə hersoqmu?
Bəli.
Harada?
– Luvrda.
- Siz buna əminsinizmi?
Tamamilə əminəm.
Sizə bunu kim dedi?
Kardinal həzrətlərinə tamamılə sadiq olan xanım de Lannua.
– Bəs niyə bunu əvvəlcədən xəbər vermənişdi?
Kraliça bütün günü onu öz yanından kənara buraxmamışdı.
Biz məğlub olmuşuq. İndi gərək yenidən mubarizəyə başlayaq.
Mən bütün qəlbımlə sizə kömək etməyə hazıram, monsinyor.
– Bu əhvalat nə vaxt olmuşdur?
– Saat birin yarısında kralıça öz xidmətçilərinin yanında imiş...
- Harada?
Yataq otağında.
Belə.
– Ona camaşırlara baxan xıdmətçi qadın tərəfindən göndərilmiş bir yaylıq vermişlər...
Yaxşı, sonra?
Kralıça həyəcanlanmağa başlayıb. Üzündə ənlik olduğuna baxmayaraq, rənginin qaçdığı aşkar duyulurmuş.
– Bəs sonra?
– Sonra o ayağa qalxıb, həyəcandan titrəyən bir səslə deyib kı: "On dəqiqə gözləyin, mən indi qayıdıram". O, qapını açıb çıxıb...
Kraliça nə qədər müddətdən sonra qayıdıb?
Qırx beş dəqiqə sonra.
- Xidmətçi qadınlardan onun yanınca gedən olubmu?
Yalnız xanım Estefaniya gedibmiş.
Kraliça sonra qayıdıbmı?
– Bəlı, ancaq kiçik çəhrayı mücrünü götürmək üçün qayıdıb, yenə də çıxıb.
Qayıdanda mücrünü gətirib gəlibmi?
Xeyr.
Xanım de Lannua o mücrüdə nə olduğunu bilirmi?
– Bəli, orada əlahəzrət kralın kraliçaya bağışladığı brilyant boyunbağı var imiş.



Kraliça qayıdarkən bu mücrünü gətirməyib, eləmi?
Bəli.
– Xanım de Lannua zənn edır ki, ülyahəzrət kraliça boyunbağını hersoqa verib, eləmi?
O, buna əmindir.
Nə səbəbə?
- Bu gün xanım de Lannua ülyahəzrət kralıçanın baş xidmətçisi kimi bu mücrünü axtarmağa başlayıb, tapmadığı üçün özünü narahat olmuş kimi göstərib; nəhayət, bu barədə kralıçadan soruşubdur.
Bəs kraliça nə cavab verib?
– Kraliça qızarıb və cavab verib kı, bir gün əvvəl boyunbağının pərəklərindən biri qırılıbmış, təmir etmək üçün öz zərgərinə göndərmişdir.
Gedib zərgərdən bunu öyrənmək lazımdır.
Mən getmişdim.
– Yaxşı, bəs zərgər nə deyir?
Zərgərin heç bir şeydən xəbəri yoxdur.
Yaxşı, yaxşı, Roşfor! Hələ tamamilə uduzmamışıq. Bəlkə də... Kim bılir, bəlkə də, bu daha yaxşıdır. Siz bilirsınızmi hersoginiya de Şevröz və Bekinhem hersoqu harada gizlənibləmiş?
Xeyr, monsinyor. Bu barədə adamlarım mənə dürüst bir məlumat verə bilməyiblər.
- Amma mən bilirəm.
– Sizmi? Monsinyor?
Bəli. Hər halda təxmin edirəm. Budur onların ünvanı: Vojirar küçəsi nömrə iyirmi beş və Laqarp küçəsi nömrə yetmiş beş
Kardinal həzrətləri, əmr edirsiniz hər ıkisini tutaq?
– Yox, çox gecdir, onlar, yəqin ki, çıxıb gediblər.
Hər halda bu barədə yəqin bir məlumat əldə etmək olar.
Mənim mühafizlərimdən on nəfər götürün və hər ıkı evi yoxlayın
Baş üstə, monsinyor.
Roşfor sürətlə otaqdan çıxdı.
Kardinal tək qaldı. O, bir az düşündükdən sonra üçüncü dəfə zəngı çaldı
Həmın zabit ıçəri girdi.
Kardinal dedi:

Dustağı bura gətirin!
Cənab Bonasyeni yenidən gətirdilər və kardinalın işarəsi ilə zabit çıxıb getdi.
Kardinal ciddi bir səslə dedi:
– Siz məni aldadıbsınız.
– Mənmi? - Bonasye həyəcanla səsləndi. – Mən kardinal həzrətlərini aldatmışammı?
- Sizin arvadınız Vojirar və Laqarp küçələrində katan tacirlərinin evinə getmirmiş.
– Bəs kimin yanına gedirmiş? Aman Allah!
Hersoginya de Şevrözün və Bekinhem hersoqunun yanına.
– Bəli, – Bonasye fikrə gedərək nə isə xatırlamağa çalışdı, bəli, kardinal həzrətləri düz buyururlar. Mən bir neçə dəfə öz arvadıma demişdim ki, qəribədir, bəs niyə bu katan tacirləri yaşadıqları evlərdə heç bir lövhə asılmamışdır. Hər dəfə arvadım mənim sözlərimə gülərdi. Of, kardinal həzrətləri! Bonasye Rişelyenin ayaqlarına düşüb sözünə davam etdi: – Siz, həqiqətən, kardinalsınız! Böyük, dahi kardinalsınız! Hamı sizə təzim edir.
Bonasye kimi miskin bir məxluqun üzərində qələbə çalmaq nə qədər əhəmiyyətsiz bir şey olsa da, kardinal yenə bircə anlıq bu qalibiyyətdən zövq aldı. Birdən-birə onun ağlına yeni bir fikir gəldi. O gülümsünərək əlini tacirə uzadıb dedi:
Durun, dostum, siz sədaqətli bir adamsınız.
– Kardinal mənim əlimdən tutdu! Mənim əlim bu böyük adamın əlinə dəydi, – deyə Bonasye səsini ucaltdı. – O böyük adam məni öz dostu adlandırdı!
– Bəli, dostum, bəli, kardinal bəzən işlətdiyi atalıq ədasılə ona müraciət etdi. Bu, elə bir əda idi ki, yalnız Rişelyeni yaxşı tanımayan adamları aldada bilərdi. – Sizdən nahaq yerə şübhələniblər. Buna görə də sizi mükafatlandırmaq lazımdır. İçində yüz pistol olan bu kisəni alın və məni bağışlayın.
Mənmi, siz kardinal həzrətlərinimi bağışlayım? - Bonasye bunun bir zarafat olduğunu güman edib kisəni götürməyə cürət etmirdi. Axı, siz məni həbs etdirə bilərsiniz. Siz mənə işgəncə verdirə bilərsiniz, məni asa bilərsiniz, siz bizim başımızın böyüyüsünüz, mən sizə heç bir barədə etiraz edə bilmərəm. Mənmi kardinal həzrətlərini bağışlayım? Lütf edin, nə buyurursunuz?



– Əzizim cənab Bonasye, siz çox alicənabsınız. Mən bunu görürəm və sizə təşəkkür edirəm. Deməli, siz bu kisəni alıb ürəyinizdə mənə əsla kin bəsləmədən gedəcəksiniz, eləmi?
– Mən böyük bir minnətdarlıqla gedəcəyəm, monsinyor.
Elə isə, əlvida, daha doğrusu, hələlik xudahafiz; çünki, yəqin, yenə də görüşəcəyik.
– Kardinal həzrətləri nə vaxt əmr etsə, hüzurunda bütün varlığımla qulluq etməyə hazıram.
Arxayın olun Mən sizin ilə söhbət etməkdən böyük bir zövq alıram.
– Nə buyurursunuz, kardinal həzrətləri?
Xudahafiz, cənab Bonasye, xudahafiz!
Kardinal əli ilə ona işarə etdi. Buna müqabil Bonasye yerə qədər əyilib ona təzim etdi. Sonra geri-geri çəkilib otaqdan çıxdı. Bonasye dəhlizə keçdikdə isə, kardinal onun böyük bir həyəcanla bu sözləri bağırdığını eşitdi:
– Yaşasın monsinyor! Yaşasın kardinal həzrətləri! Böyük kardinal var olsun!
Bonasyenin həyəcanlı duyğularının ifadəsi olan bu çığırtıları kardinal təbəssümlə dinlədi. Tacirin səsi uzaqlaşıb itdikdə isə özözünə dedi:
"Çox yaxşı. Bu elə bir adamdır ki, bu gündən etibarən mənim üçün canından keçməyə hazırdır".
Kardinal Laroşelin miz üzərinə sərilmiş xəritəsini böyük bir diqqətlə gözdən keçirməyə başladı. O, karandaşla məşhur səddin keçəcəyi yerə işarə etdi. Həmin bu sədd on səkkiz aydan sonra mühasirə olunan şəhərin limanını qorumağa kömək etdi.
Kardinal oturub strateji hesablamalarla məşğul idi ki, birdən qapı açıldı və Roşfor içəri girdi.
Hə, necə oldu? – kardinal ayağa qalxıb böyük bir maraqla soruşdu. Onun bu halı qrafa tapşırılmış işə nə qədər böyük əhəmiyyət verdiyini göstərirdi.
Qraf cavab verdi:
- Doğrudan da, iyirmi altı-iyirmi yeddi yaşlarında cavan bir qadın və otuz beş-qırx yaşlarında bir kişi ilə kardinal həzrətlərinin göstərdiyi bu evlərdə olub; kişi dörd, qadın beş gün yaşayıb. Ancaq qadın bu axşam, kişi isə bu gün səhər çıxıb getmişlər.

Saata baxan kardinal çığırdı:

– Yəqin ki, onlarmış! İndi daha onları təqib etmək üçün vaxt keçmişdir. Hersoginiya Turda, hersoq isə Bulondadır. Onları daha Londonda tutmaq lazımdır.

Kardinal həzrətləri nə əmr edirlər?

– Bu əhvalat barədə bircə kəlmə də danışmayın. Qoy kraliça heç bir şeydən şübhələnməsin Qoy sirrinin bizə məlum olduğunu bilməsin. Qoy elə güman etsin ki, biz bir sui-qəsd izini axtarırıq. Kansler Seqyeni mənim yanıma göndərin.

Bəs kardinal həzrətləri, siz o adamı nə etdiniz?

– Hansı adamı?

– Həmin o Bonasyeni

Mümkün olan hər bir şeyi etdim. Onu öz arvadının casusu ol mağa məcbur etdim.

Qraf Roşfor öz ustadının bütün üstünlüklərini dərk edən bir adam kimi təzim edib çıxdı.

Kardinal tək qaldıqda oturdu, bir məktub yazdı, ona öz şəxsi mö hürünü basıb zəngi çaldı. Zabit dördüncü dəfə içəri girdi.

Kardinal dedi:

Vitreni yanıma çağırın və ona tapşırın ki, yola çıxmağa hazır olsun.

Bir dəqiqə sonra kardinalın xəbər göndərdiyi həmin adam, əynində yol paltarı, ayağında mahmızlı uzunboğaz çəkmə, onun qarşısında durmuşdu.

Kardinal ona dedi:

Vitre, siz yubanmadan Londona getməlisiniz. Yolda bir dəqiqə də ləngiməyin. Bu məktubuılediyə verərsiniz. Bu da iki yüz pistolluq çek. Mənim xəzinədarımın yanına gedin, deyin ki, bu pulu sizə versin. Əgər altı günə qədər qayıtsanız və mənim tapşırığımı yaxşı yerinə yetirmiş olsanız, bir bu qədər də alacaqsınız.

Qasid dinmədən baş əydi, məktubu və iki yüz pistolluq çeki alıb getdi.

Məktubda belə yazılmışdı:

*"Miledi! Siz Bekinhem hersoqunun iştirak edəcəyi ilk balda olmalısınız. Hersoqun kamzolunda on iki brilyantı olan bir boyunbağı görəcəksiniz. Hersoqa yaxınlaşın, boyunbağının pərəklərinin ikisini kəsin. Bu pərəklər əlinizə keçər-keçməz, məni xəbərdar edin".*



## XV

## MƏMURLAR VƏ HƏRBİ ADAMLAR

Bu əhvalatın ertəsi günü Atos evə qayıtmadı. D'Artanyan və Portos onun yox olduğunu cənab de Trevilə xəbər verdilər. Aramis isə beş günlük məzuniyyət alıb, öz dediyinə görə ailə işləri üçün Ruana getdi.

Cənab de Trevil öz əsgərlərinin atası idi. Əynində onun bölüyünün rəsmi geyimi olan ən naməlum və ən axırıncı bir əsgər də öz kapitanının köməyinə əmin ola bilərdi.

Cənab de Trevil o saat baş cinayət işləri hakiminin yanına getdi. Uzun axtarışlardan sonra Atosun For-Levekdə[1] dustaq olduğu aşkar edildi.

Atos da Bonasyenin keçdiyi bütün sınaqlardan keçmişdi. Biz hər iki dustağın bir-birilə üzləşdirildiyi səhnənin şahidi olmuşuq. Bu dəqiqədən etibarən Atos elan etdi ki, onun adı d'Artanyan deyil, Atosdur. O, əlavə etdi ki, nə cənab Bonasyeni, nə də xanım Bonasyeni tanımır və onlarla heç bir zaman görüşüb danışmamışdır. O, axşam saat on tamamda öz dostu cənab d'Artanyanın yanına gəlibmiş, ondan əvvəl isə cənab de Trevilin evində naharda olubmuş. Onun bu sözlərini iyirmi şahid təsdiq edə bilər. Bu şahidlər sırasında o, məşhur əyanlardan neçəsini və o cümlədən hersoq de La Tremulun da adını çəkdi.

İkinci komissar muşketyorun göstərişlərinin sadəlik və möhkəmliyinə heyran qaldı. Bu komissar, adətən, məmurların hərbi adamlara qarşı olan kininin acığını həvəslə Atosdan çıxardı. Ancaq cənab de Trevil və hersoq La Tremulun adları onu öz hərəkətini ölçüb-biçməyə məcbur etdi.

Atosu da kardinalın yanına istintaqa aparmışdılar. Ancaq bədbəxtlikdən kardinal Luvrda kralın hüzurunda idi.

Bu həmin o dəqiqədə idi ki, cənab de Trevil baş cinayət işləri hakiminin və For-Levek komendantının yanına gedib Atosu tapmadığından, əlahəzrət kralın yanına qayıtmışdı.

Cənab de Trevil muşketyorların kaptanı olduğundan, hər bir zaman kralın hüzuruna getmək ixtiyarına malik idi.

Kralın kraliça əleyhinə əvvəlcədən yaranmış qənaətinin nə dərəcə möhkəm olduğu məlumdur. Bu qənaəti kardinal süni bir surətdə daha

[1] For Levek həbsxana, Bastiliyanın şöbəsi.

da qüvvətləndirməyə çalışırdı; çünki o, fitnə məsələsində kişilərdən artıq qadınlardan qorxurdu. Bu qənaətin əsas səbəblərindən biri avstriyalı Annanın (yəni kraliçanın) xanım de Şevröz ilə dostluq etməsi idi. Bu iki qadın kralı İspaniya ilə müharibədən, İngiltərə ilə çəkışmələrdən və maliyyə işlərinin pozulmasından daha artıq narahat edirdi. O, arxayındı ki, de Şevröz kraliçaya yalnız siyasi işlərdə deyil, aşıqanə macəralarında da kömək edir.

Kardinal Tura sürgün edilmiş və orada yaşamaqda olan xanım de Şevrözün Parisə gəldiyini və orada polisdən gizlin beş gün yaşadığını söylər-söyləməz, *kral* son dərəcə qəzəblənmişdi. Xəyanətkar və sədaqətsiz bir ər olan kral istəyirdi ki, onu yalnız Adil Lüdovik deyil, həm də namuslu Lüdovik adlandırsınlar.

Kardinal XIII Lüdovikə xəbər verdi ki, kraliça xanım de Şevröz ilə gizlincə məktublaşırmış. Bu gizlin fitnənin sirlərini müvəffəqiyyətlə açmalı olduğu bir zamanda ona mane olmuşlar. Kraliça və sürgündə olan bu xanım arasında vasitəçilik edən xanım cinayət başında yaxalanmalı olduğu bir dəqiqədə muşketyorlardan biri ədalətin yerinə yetirilməsinə zor işlədib mane olmuşdur.

XIII Lüdovik o saat sarayda kraliçanın yaşadığı hissəyə getmək qərarına gəlmişdi. Onun bənizi ağarmışdı. Qəzəb, adəti üzrə, bu hökmdarı son dərəcə amansız edirdi. Halbuki kardinal hələ Bekinhem hersoqu barəsində heç bir söz söyləməmişdi.

Həmin bu dəqiqədə cənab de Trevil içəri girdi.

Cənab de Trevil kralın üzündəki qəzəb əlamətlərindən və yanında kardinalın olmasından burada baş verən bütün əhvalatı başa düşüb sakit görünməyi qərara aldı.

Kral artıq əlini qapının dəstəsinə atmışdı. İçəri girən cənab de Trevilin ayaq səslərini eşidib başını çevirdi və dedi:

– Siz lap vaxtında gəlibsiniz. Mən sizin muşketyorlar barəsində çox gözəl xəbərlər eşitmişəm.

– Mən isə, cənab de Trevil soyuqqanlıqla cavab verdi, – əlahəzrətin hüzuruna cənab kardinalın məmurları barəsində çox gözəl məlumat ərz edə bilərəm.

– Nə dediniz? – kral əzəmətli bir əda ilə soruşdu.

Əlahəzrətin hüzuruna ərz edə bilərəm ki, cənab de Trevil həmin sakit əda ilə davam etdi, – bəzi məmurlar, komissarlar, polislər nə qədər hörmətə layiq olsalar da, görünür, xeyli qəzəblənmiş olduqlarından, mənim muşketyorlarımdan, yaxud, daha doğrusu, sizin muşketyorlarınızdan birini, həm də çox təmiz əxlaqlı, məşhur nüfuz sahibi olan və əlahəzrətin ən yaxşı cəhətdən tanımaq lütfündə olduğu birini, yəni cənab Atosu həbs etməyə cəsarət etmişlər. Həm də bütün bunları, mənə göstərdikləri bir əmri yerinə yetirərək icra etmişlər.

Atosumu? kral mexaniki bir surətdə təkrar etdi. – Bəli, bu ad mənə, doğrudan da, tanışdı.

De Trevil dedi:

Əlahəzrət, yadınıza salın ki, həmin bu muşketyor cənab de Kayuzakı *ağır yaralamaq kimi bədbəxt bir hərəkət etməyə məcbur* olmuşdu. Yeri gəlmişkən, icazə verin soruşum, o, kardinala müraciətlə davam etdi: – Cənab de Kayuzak tamam sağalmışdır, deyilmi?

Təşəkkür edirəm, kardinal acığından dodaqlarını gəmirə gəmirə cavab verdi.

Cənab Atos, cənab de Trevil davam etdi, – öz dostlarından biri olan cavan bearnlının, əlahəzrətin qvardiya kadeti olub, Dezessarın bölüyündə xidmət edən bir dostunun yanına gedibmiş. Dostu evdə yox imiş. Birdən-birə bir dəstə polis və əsgər evi əhatə edib, bir neçə qapını sındırmışlar...

Kardinal krala işarə ilə sanki: "Bu, həmin işdir" demək istədi.

Biz bütün bunları bilirik, kral cavab verdi, çünki bütün bu işlər bizim xeyrimizə icra edilmişdir.

De Trevil dedi.

– Deməli ki, mənim muşketyorlarımdan heç bir günahı olmayan birini əlahəzrətin xeyrinə olaraq bir cani kimi həbsxanaya salmışlar, eləmi? Həm də siz əlahəzrətin yolunda on dəfə qanını axıtmış və lazım gəlsə yenə axıtmağa hazır olan ən sədaqətli bir adamla belə rəftar etmişlər!..

Kral mütərəddid bir əda ilə soruşdu:

Necə, məgər iş beləmi olmuşdu?

Cənab de Trevil orasını söyləmir ki, deyə kardinal böyük bir soyuqqanlıqla söhbətə qarışdı, həmin bu məsum muşketyor, həmin bu sədaqətli adam bir saat ondan əvvəl, əlində siyirmə qılınc, mənim çox mühüm bir işi istintaq etmək üçün göndərdiyim dörd komissarın üzərinə hücum etmişdir.

De Trevil qaskoniyalılara məxsus bir açıqlıq və hərbi qətiyyətlə dedi:

Kardinal həzrətləri, siz bunu sübut edə bilməzsiniz; çünki ondan bir saat əvvəl Atos mənim evimdə nahar yeyib, mənim qonaq otağımda hersoq de La Tremul və qraf de Şalü ilə söhbət edirdi.

Kral kardinala baxdı.

– Bu barədə protokol var, kralın sözsüz sualına cavab verdi. O, zərərdidələr tərəfindən tərtib edilmişdır və mən bunu əlahəzrətin hüzuruna təqdim edə bilərəm.

Demək, belə çıxır ki, bir məmurun yazdığı protokol, - de Trevil məğrur bir əda ilə cavab verdi, hərbi bir adamın namuslu sözündən üstün imiş!

Kral dedi:

Bəsdir, bəsdir, Trevil, susun!

Trevil dedi:

– Əgər kral həzrətləri mənim muşketyorlarımdan şübhələnibsə, mən özüm xahiş edirəm ki, istintaq aparılsın.

– Bu axtarış aparılan evdə, – kardinal sakit bır əda ilə davam etdi, gərək ki, bu muşketyorun dostu olan bir bearnlı yaşayır.

Kardinal həzrətləri cənab d'Artanyanımı nəzərdə tutur?

– Cənab de Trevil, mən sizin himayə etdiyiniz bir cavanı nəzərdə tuturam.

Bəli, kardinal həzrətləri, bu, tamamilə doğrudur.

Siz necə bilirsiniz, həmin bu cavan öz dostlarına pis məsləhətlər görmürmü?

– O, cənab Atosamı pis məsləhətlər görəcək? Halbukı, Atos ondan iki qat yaşlıdır, de Trevil onun sözünü kəsdi. Xeyr, bir də ki, həmin axşam cənab d'Artanyan da mənim evimdə idi.

Kardinal dedi.

Bu necə işdir? Deyəsən, bütün dünya o axşam sizin evinizə yığışıbmış?

Kardinal həzrətləri, siz mənim sözlərimin doğruluğuna şübhəmi edirsiniz? Trevil qəzəbdən qızarmış halda dilləndı.

Allah eləməsin - kardinal cavab verdi. Ancaq onlar sizin evinizdə saat neçədə olublar?

– Mən bu barədə kardinal həzrətlərinə tamam dürüst cavab verə bilərəm. Cənab d'Artanyan mənim yanıma gələndə saat onun yarısı olduğunu özüm görmüşdüm.

Bəs o sizin yanınızdan saat neçədə getdi?



On birin yarısında.

Kardinal de Trevilin sözlərinin səmimi olduğundan əsla şübhələn məyərək və qalıbiyyətin öz əlindən çıxmaqda olduğunu duyaraq dedi:

Lakin cənab Atos Mozarçılar küçəsində olan həmin evdə həbs edilmişdir.

Məgər mənim bölüyümdə olan bir muşketyorun cənab Dezessarın bölüyündə olan bir qvardiyaçı ılə dostluq etməsı qadağandırmı?

Bəli, onun öz dostu ılə vaxt keçırdıyı ev şübhəli bır ev olarsa...

Kral dedi:

Bəli, bu ev şübhəlidir, Trevil. Bəlkə sizin bundan xəbəriniz yoxmuş?

- Doğrudan da, əlahəzrət, mənim bundan xəbərim yox ıdı. Hər halda evdə cənab d'Artanyanın yaşadığı mənzildən başqa, bütün mənzillər şübhəlı ola bilər; çünkı həmın adam barəsində mən əlahəzrətin hüzurunda zamin ola bilərəm. Əlahəzrətın ondan sadiq bir xidmətçisi və cənab kardinalın həmin cavandan daha səmimı bir pərəstişkarı yoxdur.

Bu həmin Karmelıtlər monastırı yanındakı məşum vuruşmada Jüssakı yaralayan d'Artanyan deyılmi? deyə kral kardinala baxaraq soruşdu

Kardinal dedı:

Bu ış məndən artıq siz əlahəzrətə aiddir. Mən dustağın müqəssir olduğunda təkid edırəm.

De Trevil dedi:

Mən isə bunu ınkar edirəm. Lakin əlahəzrətin hakimləri var. Qoy onun hakimləri kimin haqlı və kimin müqəssir olduğunu mühakimə ilə müəyyən etsinlər.

Kral dedi:

Bu doğrudur Işi hakimlərə tapşıraq. Onların vəzıfəsi mühakimə etməkdır. Qoy onlar bunu müəyyən etsinlər.

Onda mən əlahəzrət kraldan xahiş edirəm ki, ıcazə versin özüm dustağı müdafiə edim.

Kral ışin böyüməsindən qorxub dedi:

– Əgər kardinal həzrətlərinin şəxsi mülahizələri yox isə...

Bağışlayın, lakin əlahəzrət mənim tərəfkir bir hakim olduğumu güman edirsə, onda mən kənara çəkilirəm.

Kral dedi:

Bura baxın. Siz mənim atamın şərəfinə and içərmisiniz ki, Atos bu hadisə zamanı sizin yanınızda olub və buna görə də bu işdə iştirak edə bılməzdi?

– Sizin atanızın şərəfinə və dünyada hamıdan çox sevdiyim və hamıdan yüksək tutduğum sizin canınıza and içirəm!

Kardinal dedi:

– Bir düşünün, hökmdar. Əgər biz bu dustağı buraxmış olsaq, onda həqiqət həmişəlık əlimizdən çıxmış olacaqdır.

De Trevil dedi:

– Cənab Atos heç bir yana qaçmaz, cənab kardinal, ondan arxayın olun. Siz nə zaman arzu etsəniz, onu istintaq edə bilərsiniz.

Kral dedi:

– Doğrudur, o qaçmaz. Cənab de Trevilin dediyi kimi, onu həmişə tapmaq olar, həm də ki, o, səsini alçaldaraq kardinala baxa-baxa davam etdi, – muşketyorları sakit etmək lazımdır. Bu, ən yaxşı bir siyasətdir.

Rişelye gülümsündü və dedi:

– Əmr edin, hökmdar, əfv etmək haqqı sizindir.

De Trevil son sözü söyləmək arzusu ilə dedi:

Əfv etmək haqqı müqəssirlərə qarşı tətbiq edilər. Mənim muşketyorum isə günahsızdır. Buna görə də, kral həzrətləri, lütf deyil, ədaləti yerinə yetirmiş olursunuz.

Kral soruşdu:

– O, For-Levekdədirmi?

Bəli, hökmdar, ən pis canilər kimi zindanda və gizlində saxlanır.

– Lənət şeytana! – kral deyindi. – Bəs biz nə edək?

Kardinal dedi:

Onun buraxılması barədə əmrnamə imzalayın, vəssalam. Mən güman edirəm ki, cənab de Trevilin zəmanəti kifayətdir.

Trevil hörmətlə təzim etdi. Ancaq onun şadlığına bir qorxu da qarışmışdı. O, kardinalın belə gözlənilməz güzəştə getməsindənsə, inadla müqavimət etməsini daha üstün tutardı.

Kral dustağın azad edilməsi barədə əmrnaməni imzaladı. Trevil o saat onu alıb getdi.

O, bayıra çıxdıqda kardinal dostcasına gülümsəyərək krala dedi:

– Sizin muşketyorların başçısı ilə əsgərləri arasında tam bir həmrəylik var. Bu isə, hökmdar, xidmət üçün çox faydalıdır və sizin bölüyün şərəfini artırır.



Trevil öz-özünə dedi:

"O, bu günlərdə mənim üçün, yəqin ki, bir fitnə hazırlayır. Belə bir adamla işə girişdikdə işin nə cür qurtaracağını əsla bilmək olmaz. Ancaq tələsmək lazımdır ki, kral hər dəqiqə öz rəyini dəyişə bilər. Hər halda Bastiliyada və ya For-Levekdə olub oradan çıxmış bir adamı təkrar tutub ora salmaq daha çətindir."

Cənab de Trevil dəbdəbəli bir surətdə For-Levekə daxil olub muşketyoru azad etdi. Sonra d'Artanyanla ilk görüşündə cənab de Trevil ona dedi:

– Bu dəfəlik siz yaxşı qurtardınız. Bu sizin Jüssaka vurduğunuz qılınc zərbəsinin əvəzidir. Hələ sizin Bernajuya vurduğunuz zərbənin əvəzi qalır. Buna görə də ehtiyatlı olsanız yaxşıdır.

Doğrudan da, cənab de Trevil kardinala inanmamaqda haqlı idi. Muşketyorlar kapitanı çıxıb ardınca qapını örtən kimi, kardinal həzrətləri krala dedi:

İndi ikimiz təklikdə ikən, əlahəzrət razı isə, gəlin ciddi danışaq, hökmdar. Bekinhem hersoqu beş gün ərzində Parisdə olub, yalnız bu sabah çıxıb getmişdir.

## XVI

## KANSLER SEQYENİN HƏMİŞƏKİ KİMİ ÇALMAQ ÜÇÜN DƏFƏLƏRLƏ GÖZLƏRİLƏ ZƏNGİ AXTARMASI BARƏDƏ

Bu sözlərin XIII Lüdovikə nə cür təsir etdiyini təsəvvür etmək mümkün deyildir. O gah qızarır, gah ağarırdı və kardinal görürdü ki, tək bir müvəffəqiyyətli hərəkətlə bütün uduzduğunu udmuşdur.

– Bekinhem hersoqu Parisdə imiş! kral çığırdı. – O, niyə gəlibmiş?

– Yəqin ki, sizin düşmənləriniz olan quqenotlar və ispaniyalılarla sui-qəsddə iştirak etmək üçün...

- Yox, and içirəm ki, yox! O, xanım de Şevröz, xanım de Lonqvil və bütün Konde nəsli ilə birlikdə mənim namusuma qarşı sui-qəsddə iştirak etmək üçün gəlibmiş!

– Ah, hökmdar, bu nə fikirdir! Kraliça olduqca namusludur və hər şeydən əvvəl o, əlahəzrəti olduqca çox sevir.

Kral dedi:

– Qadınlar zəif məxluqdurlar, kardinal, kraliçanın məhəbbətinə gəlincə, bu barədə nə düşünmək lazım gəldiyini mən özüm bilirəm.

Kardinal dedı:

Hər halda mən təsdiq edirəm ki, Bekinhem hersoqu Parisə tamamilə siyasi bir məqsədlə gəlibmiş.

– Mən ısə əminəm ki, o, tamamilə, başqa bir məqsədlə gəlibmış, kardinal. Əgər kralıça müqəssir isə, vay onun halına!

Kardınal dedı:

Doğrudan da, belə bır xəyanəti təsəvvür etmək mənim üçün nə qədər ağır olsa da, sız əlahəzrət məni bu fikrə gətirırsınız. Siz əlahəzrətin tapşırığı ılə istintaq etdiyim xanım de Lannua bu gün səhər mənə söylədı kı, srağa gecə kraliça həzrətləri uzun müddət yuxusuz qalıb və bu sabah xeylı ağlayıb, bütün günü yazı yazıb...

Kral dedi:

Belə, belə. Yəqin ki, hersoqa yazırmış. Kardinal, kraliçanın məktubları mənə lazımdır!

Ancaq bunları necə əldə edək, hökmdar? Gərək ki, onu nə siz əlahəzrət, nə də mən öhdəmizə götürə bilmərik.

Bəs marşal d'Ankrın arvadı ilə nə cür rəftar etdilər? deyə kral son dərəcə qəzəblə çığırdı. Onun ki, bütün şkaflarını və özünü axtardılar.

Marşal d'Ankrın arvadı yalnız marşal d'Ankrın arvadı və bir Florensiya macərapərəstindən artıq bir şey deyildi, hökmdar. Amma siz əlahəzrətin şövkətli zövcəsi olan avstriyalı Anna Fransanın kraliçasıdır. Yəni dunyanın ən böyük hökmdar qadınlarından biridir.

– Buna görə onun təqsiri daha da böyükdür... Hersoq! O məhz özünün bu yüksək vəziyyətini unutduğu üçün bu dərəcə alçalmışdır. Həm də ki, mən bu xırda-xuruş aşiqanə və siyasi fitnələrə çoxdan bəri nəhayət vermək qərarına gəlmişəm. Deyəsən, onun La Port adlı bir adamı var...

Kardinal dedi:

Doğrusu, mən bütün bu işlərdə ən başlıca cinayətkar onu hesab edirəm.

– Deməli, siz mənim fikrimlə razısınız? Kraliça məni aldadır, eləmi?

– Mən elə güman edirəm və təkrar edirəm ki, ülyahəzrət kraliça öz kralının hakimiyyəti əleyhinə sui-qəsddə iştirak edir. Lakin onun kralın namusuna qarşı hərəkət etdiyini söyləyə bilmərəm.



Mən isə sizə söyləyirəm ki, həm ona, həm də buna qarşı hərəkət edir. Mən sizə söyləyirəm ki, kraliça məni sevmir Mən sizə söyləyirəm ki, o, başqasını sevir. Mən sizə söyləyirəm kı, o, həmin mənfur hersoqu sevir! Bəs, siz nıyə Parisdə ikən tutulmasını əmr etmədiniz?

Hersoqu tutmaqmı? İngiltərə kralının birinci nazirini həbs etməkmi? Bu mümkündürmü, hökmdar? Bundan böyük bir həngamə çıxa bilər! Bır də ki, mənim hələ də şübhə etdiyim və siz əlahəzrətin təxmin etdiyiniz məsələ azacıq da doğru olarsa, bundan nə böyük rüsvayçılıq, nə dözülməz bir biabırçılıq çıxa bilər!

Madam ki, o, öz özünü adi bir sərsərı, oğru vəzıyyətinə salıb, deməli, buna görə də...

XIII Lüdovık özü öz deyəcəyi sözlərdən dəhşətə gəlib durdu. Amma Rişelye boynunu uzadıb kralın dodaqlarında donub qalmış olan sözlərin söyləməsini gözləyirdı.

Ona görə də?.

Kral dedı:

– Heç, heç... Lakin Parisdə ikən, yəqin kı, onu gözdən qoymayıbsınız, eləmi?

Xeyr, hökmdar

O, harada yaşayırdı?

– Laqarp küçəsində, yetmiş beş nömrəli evdə.

Siz əminsinizmi ki, o, kraliça ılə görüşməmişdir?

Mən kralıçanı öz vəzifəsinə son dərəcə sədaqətli hesab edirəm, hokmdar.

– Yəqin ki, onlar məktublaşırlar! Yəqin ki, kraliça bütün günü ona məktub yazırmış. O məktublar mənə lazımdır!

Lakin, hökmdar...

Hersoq, nə olursa-olsun, o məktublar mənim əlimə gəlməlidir.

– Mən cürət edib demək istəyirəm ki, hökmdar..

Deməli, siz də mənim iradəmin əksinə gedirsiniz? Siz də ispaniyalılarla, ingilislərlə, xanım de Şevröz ılə və kraliça ilə əlbırsiniz, eləmi?

– Hökmdar! kardinal köksünü ötürərək cavab verdı. – Mən özümü belə şübhələrdən qorunmuş hesab edirdim.

Cənab kardinal, siz mənim dediklərimı eşitdinizmi? Mən istəyirəm ki, o məktublar mənim əlimdə olsun!

- Onun yalnız bircə yolu var.
Nədir?
– Bu işi kansler Seqyeyə tapşırmalı. Bu, onun işidir.
– Bu saat onun dalınca adam göndərin.
Sizin əmriniz yerinə yetiriləcəkdir, ancaq...
Nə ancaq?
Ancaq kraliça ona tabe olmaya bilər.
– Mənim əmrlərimməmi?
– Bəli, əgər bu əmrlərin kral tərəfindən verildiyinə şübhə edərsə...
Elə isə şübhə etməməsi üçün bunu ona mən özüm söylərəm.
- Əlahəzrət, yadınızdan çıxarmayın ki, mən işin bu dərəcəyə çıxmasının önünü almaq üçün əlimdən gələn hər bir şeyi etdim.

– Bəli, hersoq, bəli Mən bilirəm ki, siz kraliçaya qarşı həddindən artıq hörmətkarsınız, həddindən artıq... Sizi xəbərdar edirəm ki, bəlkə də biz hələ bu barədə danışmalı olacağıq. Mən kraliçanın yanına gedirəm.

Bu sözlərdən sonra XIII Lüdovik qapını açıb sarayda onun hissəsini avstriyalı Annanın otaqlarından ayıran dəhliz ilə getməyə başladı.

Kraliça öz yaxın adamları olan xanım de Gito, de Sable, de Monbazon və de Gemene ilə oturmuşdu. Kraliça ilə birlikdə Madriddən gəlmiş ispaniyalı xidmətçi qadın xanım Estefaniya bir küncdə oturub ucadan kitab oxuyurdu. Hamı diqqətlə dinləyirdi. Ancaq bu qiraəti öz xəyallarına dalmaq üçün bir bəhanə kimi təşkil edən kraliça heç bir şey eşitmirdi.

Kraliçanın bu xəyalları çox kədərli idi. Kral öz arvadına inanmırdı. Kardinalın nifrəti onu təqib etməkdə idi. Kraliça Rişelyenin daha zərif olan digər bir təmənnasını rədd etdiyi üçün kardinal onu əsla əfv etmirdi. Avstriyalı Anna ətrafındakı ən sadiq xidmətçilərinin, ən yaxın və inanılmış adamlarının, ən əziz və ən sevimli adamlarının bir-bir tələf olduğunu görürdü. O, bütün ətrafdakılara fəlakət gətirirdi. Onun dostluğu təqib edilməyə səbəb olan fəlakətli bir əlamət idi. Xanım de Şevröz və xanım de Verne sürgün edilmişdilər. La Port hər dəqiqə həbs ediləcəyini gözləməkdə olduğunu öz hökmdar xanımından gizlətmirdi.

Gözlənilmədən otağın qapısı açıldı və kral içəri girdi.

Xanım de Gemene o saat susdu, bütün xanımlar ayağa durdular, ortalığa dərin bir sükut çökdü.



Kral salam vermədi. O, kraliçanın qarşısında durub dəyişmiş bir səslə ona dedi:

Xanım, bu saat kansler bura gələcəkdir. O, mənim tapşırdığımı sizə söyləyəcəkdir.

Yazıq kraliçanı daim boşamaq, sürgünə göndərmək və hətta məhkəməyə verməklə hədələyirdilər. Onun rəngi hiss ediləcək dərəcədə ağardı və o, sakit bir səslə soruşdu:

- Bu gəlişin mənası nədir, hökmdar? Cavan kansler siz əlahəzrətin özünün mənə söyləyə bilmədiyi nə kimi sözlər söyləyə biləcəkdir?

Kral heç bir cavab vermədi. O, dabanları üstündə hərlənib çıxdı. Həmin dəqiqə qvardiya kapitanı cənab de Gito kanslerin gəldiyini xəbər verdi.

Kansler tutulmuş halda, ancaq gülümsəyərək içəri girdi. Biz hələ hekayənin gələcək hissələrində buna rast gələcəyik. Ancaq oxucunun onunla indidən tanış olması pis olmaz.

Kansler çox qəribə bir adamdı. Əvvəllər kardinalın kamerdineri olmuş, indi isə Paris Məryəm ana kilsəsinin baş ruhanisi olan de Roş Le Mal onu kardinal həzrətlərinə sadiq bir adam kimi təqdim etmişdi. Kardinal ona inanmış və peşman olmamışdı.

Onun barəsində cürbəcür əhvalat nağıl edirdilər ki, onlardan biri də budur:

O, cavanlıqda coşqun bir həyat keçirdikdən sonra öz cavanlıq günahlarını yumaq üçün monastıra çəkilmişdi, ancaq bu yazıq tövbəli adam bu müqəddəs yerə girdikdə, qapını tez örtmədiyindən, xatakar hissiyyat da onun ardınca içəri girmişdi. Bu hissiyyat onu daim narahat etməkdə idi. O, kilsənin ruhanisinə iqrar verib öz günahlarını etiraf etdikdə, ruhani ona məsləhət görmüşdü ki, xəbis iblisi qovmaq üçün var gücü ilə kilsə zəngini çalsın. Kilsə zənginin səsindən öz yoldaşlarının iblis tərəfindən yoldan çıxarıldığını xəbər tutan rahiblər hamısı onun üçün dua etməli idilər.

Bu məsləhət gələcək kanslerin xoşuna gəlmişdi. O da rahiblərin duasının köməyilə iblisi qovmağa başlamışdı. Ancaq iblis bir kərə hakim olduğu qaladan çox da asanlıqla çəkilən deyildi. Ruhanilərin duası artdıqca o da öz aldadıcı vəsvəsələrini artırırdı. İş elə bir hal almışdı ki, kilsə zəngi gecə-gündüz çalınmaqda olub öz bədən hissiyyatını boğub istiğraf etməkdə olan adamın arzularını xəbər verirdi.

Rahıblər bır dəqiqə də rahatlıq bilmirdilər. Gündüzlər işləri-gucləri ibadətxanaya gedən pilləkənləri çıxıb-düşmək idi, gecələr isə, axşam duasından sonra azı iyirmi dəfə yataqlarından qalxıb, daş döşəmələr üzərində əyilıb səcdə etməli olurdular.

İblisin öz ovundan əl çəkib-çəkmədiyi, yaxud rahiblərin yorulduğu məlum deyil. Ancaq üç ay keçəndən sonra tövbəli adam yenidən kübar aləminə çıxdı və misilsiz dərəcədə azğın ehtiras düşkünü kimi şöhrət qazandı.

O, monastırdan çıxıb məhkəmə xadimi mənsəbini qazandıqdan sonra kardinalın tərəfdarı oldu ki, bu da onun kifayət qədər nüfuz sahibi olduğunu sübut edirdi. Kansler olduqdan sonra ürəklə kardinal həzrətlərinə xidmət edib kardinalın dul kraliça və avstriyalı Anna əleyhinə olan bütün fitnələrində ona hər cür kömək etməyə başladı.

Kraliça kresloya oturub, qadın xidmətçilərə də oturmalarını işarə etdi və son dərəcə təkəbbürlü bir əda ilə kanslerdən soruşdu:

Möhtərəm cənab, nə istəyirsiniz və nə uçün bura gəlibsiniz?

Ülyahəzrət kraliçaya bütün varlığımla hörmət bəsləməklə bərabər, kral naminə axtarış aparmaq üçün gəlmişəm

Necə? Axtarışmı? Mənim otağımdamı? Bu nə alçaqlıqdır?

Məni bağışlayın, ülyahəzrət kraliça, ancaq mən yalnız kralın buyruq quluyam. Məgər əlahəzrət kral sizdən mənim gəlməyimə hazırlaşmağı xahiş etməmişdimi?

Axtarın, cənab, görünür mən cinayətkaram. Estefaniya, mənim mızlərimin və qutularımın açarlarını ona verin.

Kansler zahirən mızləri də axtardı. O, bilirdi ki, kraliçanın bu gün yazdığı o mühüm məktub orada deyildir.

O nə qədər tərəddüd edirdisə də, ancaq kraliçanın özünü axtarmağa başlamaq lazımdı. O, kraliçaya yaxınlaşıb tamamilə mütərəddid bir əda ilə söylədi:

İndi mən əsas axtarışı aparmalıyam.

Kraliça onun sözlərini anlamırmış və ya anlamaq istəmirmiş kimi soruşdu:

Nə axtarış?

– Əlahəzrət krala məlumdur ki, siz bu gün bır məktub yazıbsınız və onu hələ göndərməyə macal tapmayıbsınız. Bu məktub nə mizlərdə, nə də qutularda yoxdur.



Avstriyalı Anna yerindən dik qalxaraq kanslerə hədəli bir nəzər salıb dedi:

– Siz öz kraliçanıza əl qaldırmağa cürət edirsinizmi?

– Ülyahəzrət kraliça, mən kralın sadiq bir təbəəsiyəm və əlahəzrət mənə nə əmr edirsə, yerinə yetirməliyəm.

Kraliça dedi:

Bəli, bu düzdür. Kardinalın casusları yanılmamışlar. Mən bu gün məktub yazmışam və bu məktub hələ göndərilməmişdir. O buradadır.

Bunu deyib kraliça öz gözəl əlini korsajına uzatdı.

Kansler dedi:

Elə isə, o məktubu mənə verin.

Anna dedi:

– Mən o məktubu yalnız krala verərəm.

Kral özü o məktubu almaq istəsəydi, özü də sizdən tələb edərdi. Ancaq ülyahəzrət kraliçaya təkrar edirəm ki, o həmin məktubu sizdən tələb etməyi mənə tapşırmışdır. Əgər siz onu verməsəniz...

Onda nə olar ki?

Ülyahəzrət kraliça, mənə əmr edilmişdir ki, o məktubu sizdən alam.

Necə? Sız nə demək istəyirsiniz?

Mən onu demək istəyirəm ki, mənə çox böyük bir səlahiyyət verilmişdır. Hətta sız ülyahəzrəti şəxsən axtarmaq ixtiyarı da verilmişdır.

Aman, nə dəhşət! kraliça çığırdı.

Yəqin ki, ülyahəzrət kraliça məni bu işə məcbur etməz.

- Nə namussuz bir zorakılıq! Siz nə etdiyinizi anlayırsınızmı, cənab?

Buyuruq kraldandır, ülyahəzrət kraliça, məni bağışlayın.

Mən buna dözə bılmərəm. Yox, yox! Bundansa, ölməyə razıyam! – kraliça çığırdı. Onun damarlarında İspaniya və Avstriya hökmdarlarının qanı cuşa gəlmişdi.

Kansler ikiqat əyilib təzim etdi və özünə tapşırılan işi yerinə yetirməkdən çəkinməyəcəyini göstərib kraliçaya yaxınlaşdı. Kraliçanın gözlərindən bır anda qəzəb yaşları axmağa başladı.

Kraliça sarsılmışdı. Onun rəngi elə ağarmışdı ki, elə bil bu saat yerindəcə öləcək. O, yıxılmamaq üçün əlini arxasında olan mizə dayadı. Sağ əli ilə isə korsajından məktubu çıxarıb kanslerə verdi.

Budur, məktub! kraliça titrək və qırıq bir səslə çığırdı. Alın və məni mənfur üzünüzü görmək əzabından qurtarın!

Kansler məktubu alıb, yerə qədər təzim etdi və çıxıb getdi.

Onun ardınca qapı örtülər-örtülməz, kraliça huşunu itirib öz xidmətçilərinin qucağına yıxıldı.

Kansler məktubu oxumadan, krala apardı. Kral titrək əllərilə məktubu alıb ünvanı axtarmağa başladı. Lakin ünvan yox idi. Onun rəngi ağardı. Məktubu ağır-ağır açdı. Sonra məktubun ilk sözlərindən onun İspaniya kralına yazılmış olduğunu görüb sürətlə oxudu. Bu məktub kardinala qarşı mükəmməl bir hücum planı idi. Kraliça Rışelyenin siyasəti ilə təhqir edilmiş olan öz qardaşına və Avstriya imperatoruna məsləhət görürdü ki, onlar guya Fransaya müharibə elan edəcəklərini bildirib, sülh üçün şərt olaraq kardinalın işdən götürülməsini tələb etsinlər; çünki kardinalın daim fikri-zikri Avstriya sülaləsini nüfuzdan salmaqdan ibarət idi. Lakin bu məktubda məhəbbət barədə bircə kəlmə də yazılmamışdı.

Kral buna sevinib kardinalın hələ Luvrda olub-olmamasını soruşdu. Ona cavab verdilər ki, kardinal həzrətləri iş kabinetində oturub əlahəzrətin əmrlərini gözləyir. Kral o saat onun yanına getdi və dedi:

– Siz haqlı imişsiniz, hersoq! Mən isə haqsız çıxdım. Bütün fitnə siyasi mahiyyətdədir. Bu məktubda məhəbbət barəsində bircə kəlmə də yoxdur. Budur, məktub. Amma bu məktubda sizin barənizdə çox şey yazılmışdır.

Kardinal məktubu alıb böyük bir diqqətlə oxudu. Qurtardıqdan sonra təkrar oxudu.

– Əlahəzrət, görürsünüz ki, mənim düşmənlərim işi nə yerə gətirib çıxarırlar! Əgər məni işdən kənar etməsəniz, sizi iki müharibə ilə təhdid edirlər. Padşahım, mən sizin yerinizdə olsaydım, doğrusu, bu qədər qüvvətli təkidlər qarşısında güzəştə gedərdim. Mən isə, öz tərəfimdən işdən çəkilməyi özüm üçün böyük, həqiqi bir səadət bilərdim.

Siz nə danışırsınız, hersoq?

Padşahım, onu deyirəm ki, bu fasiləsiz mübarizə və daimi işlər səhhətimi tələf etməkdədir. Çox ehtimal ki, Laroşelin mühasirəsinə aid olan işlərə dözə bilmərəm. Yaxşısı budur ki, ora cənab de Kondeni və ya cənab de Bassompyeri təyin edin. Mən zəif bir kilsə xadimiyəm



və məni əsla meylim olmadan cürbəcür işlərlə öz həqiqı vəzifəmdən ayırırlar. Daxili işlərinizdə sizə səadət yar olacaqdır. Şübhə etmirəm ki, xaricdə də şöhrətiniz artacaqdır.

Kral dedi:

– Cənab hersoq, mən sizin fikrinizi başa düşürəm Arxayın olun, bu məktubda adları çəkilən adamların hamısı, o cümlədən kraliça özü də, layiq olduqları cəzanı görəcəklər.

- Nə buyurursunuz, padşahım! Allah eləməsin ki, kraliça həzrətləri mənim ustumdə azacıq da incidilmiş olsun! O, məni həmişə öz düşməni hesab etmişdir. Amma siz, əlahəzrət, özünüz şahidsiniz ki, mən həmişə, hətta sizə qarşı da onun tərəfini saxlamışam. Of, əgər o siz əlahəzrətə xəyanət etmiş olsaydı, tamamilə başqa bir iş olardı. Onda mən özüm birinci olaraq deyərdim ki: "Yox, padşahım, bu müqəssir həbs edilməyə bilməz!" Ancaq xoşbəxtlikdən siz əlahəzrət bu saat ülyahəzrət kraliçanın namuslu olduğunu təsdiq edən yeni bir dəlil gördünüz.

Kral dedi:

Doğrudur, cənab kardinal, siz həmişəki kimi yenə də haqlısınız. Ancaq bununla bərabər, kraliça mənim qəzəbimə düçar olmuşdur.

Padşahım, o özü də sizə qəzəblənmişdir və mən bunun mənasını bilirəm. Siz əlahəzrət onunla çox sərt rəftar etdiniz.

Hersoq, mən özümün və sizin düşmənlərimizə qarşı, onlar nə qədər yüksəkdə durmuş olsalar və məni nə qədər böyük təhlükə təhdid etsə də, daim belə rəftar edəcəyəm.

Padşahım, kraliça sizin düşməniniz deyil, yalnız mənim düşməni mdir. Əksinə, o çox sədaqətli, itaətkar və tamamilə təmiz bir zövcədir. İcazə verin, sizin hüzurunuzda onu müdafiə edim.

– Qoy o, özü ram olub, mənə müraciət etsin.

Yox, padşahım, siz özünüz nümunə göstərin. Kraliçadan şübhələnməklə ilk dəfə siz özünüz haqsızlıq etmişsiniz.

İlk olaraq mənmi ona yanaşım? Əsla!

– Sizə yalvarıram, padşahım.

Axı, mən onunla necə barışım?

Onun xoşuna gələn bir iş görün.

Nə cür iş?

– Bir bal düzəltdirin. Siz bilirsiniz ki, kraliça rəqsi xoşlayır. Mən əminəm ki, onun qəzəbi belə bir nəzakətin qarşısında yumşalacaqdır.

Cənab kardinal, bilirsınız kı, mən bütün bu kübar əyləncələrdən xoşlanmıram.

Buna görə də kraliça sizə daha artıq mınnətdar olacaqdır. Bu, sizin ad günündə ona bağışladığınız gözəl brılyant boyunbağını tax maq üçün kraliçaya münasib bir fürsət verəcəkdir. Ülyahəzrət kraliça o boyunbağını hələ bir dəfə də taxmamışdır

Baxarıq, cənab kardınal, baxarıq, kral cavab verdi. Kralıçanın onu narahat etməyən bir cınayətdə müqəssır olması ən çox qorxduğu məsələdə məsumluğu kralı sevindırırdı. O, kraliça ilə barışmağa tama milə hazır idi. Kral sözlərinə davam etdi: Baxarıq, ancaq namusuma and içirəm ki, siz çox mərhəmətlisınız.

Kardinal dedi:

Padşahım, qoyun sərt rəftarı nazırlər etsinlər. Mərhəmət ısə, kral lara məxsus bir məziyyətdır.

Kardinal saatın on biri vurduğunu eşidib ikiqat əyılərək təzim ilə kraldan ayrıldı və ondan rica etdı ki, kraliça ilə barışsın.

Kraliça məktub əhvalatından sonra məzəmmət ediləcəyını gözləyirdi. Ancaq ertəsi gun kralın onunla barışmaq üçün bəhanə axtardığını görüb təəccübləndi. Əvvəlcə bu təşəbbüsü rədd etmək istəyirdi. Qadınlıq qüruru və kraliçanın heysiyyəti amansız bir surətdə təhqir edilmişdi. Bunu belə tezliklə unuda bılməzdı. Ancaq öz qadın xidmətçılərinin məsləhətlərini dinləyib, nəhayət, edılən həqarəti unutmağa başladığını bildirəcək bir surətdə rəftar etdi Kral bundan istifadə edərək, dedi ki, bu yaxınlarda bir şənlik keçırmək ıstəyir

Yazıq kraliça üçün hər cür əyləncə elə nadir bir şey idi ki, gələcək şənlik barəsində söylənən ılk sözlər kardinalın güman etdiyi kımı, kefini durultdu. Kraliça şənliyin hansı günə təyin edildiyını soruşdu. Kral cavab verdi ki, bu barədə hələ kardinal ilə məsləhətləşəcəklər.

Doğrudan da, kral hər gün kardinaldan şənliyin nə vaxt təşkıl ediləcəyini soruşurdu. Kardinal isə hər gün bir bəhanə tapıb şənliyi təxirə salırdı.

Bu surətlə on gün keçdi.

Yuxarıda təsvir etdiyimiz səhnədən səkkız gün sonra kardinal Londondan bir məktub aldı. Orada aşağıdakı sətirlər yazılmışdı:

*"Onlar məndədır. Ancaq Londondan çıxa bilmirəm; çünki pulum çatışmır. Mənə beş yüz pistol göndərin. Pulu aldıqdan dörd, ya beş gün sonra Parisdə olaram".*



Kardinal bu məktubu aldığı gün kral yenə ona həmin sualı verdi. Kardinal barmaqlarını sayıb ürəyındə fikirləşdi:

"O pulu aldıqdan dörd, ya beş gün sonra gələcək. Pulun ona çatması üçün də dörd-beş gün lazımdır. Onun bura gəlməsı üçün də bır o qədər. Cəmisı on gün. İndı qadın zəifliyinin gözlənilməz təsadüfləri üçün də vaxt ayıraq..."

Kral dedi:

– Necə oldu, cənab hersoq, sayıb qurtardınızmı?

Bəli, padşahım! Bu gün sentyabrın iyirmisidır. Oktyabrın üçündə şəhər ağsaqqalları şənlık tərtib edəcəklər Bu, çox gözəl bır təsadüfdür. Heç bir kosin ağlına gəlməz ki, siz kraliça ilə barışmaq üçün bəhanə axtarırsınız.

Sonra kardinal əlavə etdi:

Padşahım, yeri gəlmişkən deyim: həmin gün ərəfəsində kraliçaya xəbər verməyi unutmayın kı, siz onun birlyant boyunbağını taxmasını arzu edirsiniz.

## XVII

## ƏR-ARVAD BONASYELƏR

Artıq ıkinci dəfə idi kı, kardinal bu boyunbağı barədə danışırdı. Bu, XIII Lüdovikı təəccübləndirdı və o, belə qərara gəldi ki, yəqın burada bir sirr var.

Kral dəfələrlə təəssüflənmişdı ki, kardinal onun ailəsindəki işləri özündən yaxşı bilir. O ümid edirdi ki, kraliça ilə söhbətindən bəzi şeylər aydınlaşdıra bilər.

O, kralıçanın yanına getdı və adəti üzrə təhdidlərlə sözə başladı. Kraliça başını əyib bu coşqun selin axıb qurtarmasını gözləyır və cavab verməyib ümid edirdi ki, sel gec tez qurtaracaqdır. Ancaq XIII Lüdovik bunu istəmirdi. Arzu edirdi ki, arada mübahisə olsun və bu mübahisə vasitəsilə bəzı şeylər aşkara çıxsın. Əmin idi ki, kardinal onun üçün dəhşətlı bir sürprız hazırlayırdı. Bu cəhətdən kardinal həzrətləri, doğrudan da, çox usta idı.

Ərinin eyhamlarından təngə gəlmiş kraliça həyəcanla dedi:

– Padşahım, siz ürəyinizdə olan əsl mətləbi mənə demirsiniz! Axı, mən nə eləmişəm, söyləyin görüm, mənim cinayətim nədən ibarətdir? Heç ola bilməz ki, siz əlahəzrət bütün bu hay-küyü mənim öz qardaşıma yazdığım məktubdan ötrü qaldırmış olasınız.

Kral nə cavab verəcəyini bilmirdi. Bu qərara gəldi ki, şənlikdən bir gün əvvəl kraliçaya söyləyəcək sözün vaxtı gəlmişdir.

Kral təkəbbürlə dedi:

Xanım, bu yaxınlarda bələdiyyə binasında bal olacaqdır. Mən arzu edirəm ki, bizim mehriban ağsaqqallara hörmət etmək üçün siz həmin bala rəsmi paltarda gələsiniz və ad gününüzdə bağışladığım brilyant boyunbağı taxasınız. Mənim sizə cavabım bundan ibarətdir.

Bu cavab çox dəhşətli idi. Avstriyalı Anna bu qərara gəldi ki, XIII Lüdovik hər şeyi bilir. Rəngi yaman ağardı və gözəl əlini arxasındakı kiçik mizə dayayıb heç bir cavab vermədən qorxmuş nəzərlərlə krala baxdı.

Kral onun özünü itirməsinin səbəbini bilməsə də ləzzət alaraq dedi:

Eşitdinizmi, xanım, eşitdinizmi?

Bəli, padşahım, – kpaliça pıçıldadı.

– Siz bala gələcəksinizmi?

– Bəlı.

Brilyantları taxacaqsınızmı?

Bəlı.

Kraliçanın rəngi daha da ağardı. Kral bunu sezdi və dedi:

Deməli qərara aldıq. Mənim sizə söyləyəcəyim elə bundan ibarət idi.

Bəs bal hansı günə təyin edılmişdir? kraliça soruşdu.

XIII Lüdovik sövqi-təbii hissilə duydu ki, bu suala cavab verməlidir, dedi:

Bu yaxında, ancaq günü yadımda deyildır. Kardinaldan soruşaram

Kraliça həyəcanla soruşdu:

Deməli bu şənliyi tortib etməyi sızdən kardinal xahiş etmişdır, eləmı?

Bəlı, heyrətlənmiş kral cavab verdi. Ancaq bunu niyə soruşursunuz?

Brilyant boyunbağını taxmağı da onun tələbiləmi buyurursunuz?



– Ya o, ya mən, nə fərqi var kı? Siz bu xahışi bir cinayətmi hesab edirsiniz?

Xeyr, padşahım.

Deməli, siz gələcəksiniz?

Bəlı, padşahım.

Yaxşı, – kral gedə-gedə cavab verdi. Yaxşı, mən sizin sözləri nizə ınanıram.

Kraliça saray ədəb qaydalarına görə deyıl, dizlərində taqət qalmadığı üçün oturdu.

Kral çox məmnun halda çıxıb getdi.

Kralıça öz-özünə pıçıldadı:

“Mən məhv oldum, məhv oldum; çünkı kardinal sirlərimi bilir. Heç bir şeydən xəbəri olmayan kralı təhrik edən odur Ancaq yaxın zamanda kral da hər şeyi biləcəkdır, mən məhv oldum! Aman ya rəbbı!”

O, bır döşəkcənin üzərinə diz çöküb, başını tıtrək əllərinə dayayaraq dua etməyə başladı.

Doğrudan da, vəziyyət olduqca qorxulu idi. Bekınhem hersoqu Londona qayıtmışdı. Xanım de Şevröz Turda idi. Ətrafı casuslarla dolu olan kraliça dumanlı da olsa, hiss edirdi ki, yanında xidmət edən qadınlardan bıri ona xəyanət edir. Ancaq bunun kim olduğunu bilmirdi. La Port Luvru tərk edib gedə bilməzdi. Dünyada heç bir kəsə inanmaq olmazdı.

Kraliça onu gözləməkdə olan fəlakəti və köməksizliyini yadına salıb hönkürtü ilə ağlamağa başladı.

– Mən ülyahəzrət kraliçaya heç bir şeylə kömək edə bilmərəmmi?

Kralıça tez dönüb baxdı. Yanılmaq mümkün deyildi. Eşitdiyi bu səs dost səsi idi.

Doğrudan da, kraliçanın otaqlarına gedən qapılardan birinin ağzında xanım Bonasyenin mehriban başı göründü. Kraliçanın camaşırlarına baxan bu qadın qonşu otaqda onun camaşırlarını yığışdırırdı. Kral içəri gırdiyi zaman çıxıb gedə bilməmiş və bütün danışıqları eşitmişdi.

Kraliça ucadan qışqırdı. O, La Portun zamin olduğu cavan qadını birdən-birə tanıya bilməmişdi.

Cavan qadın dua edirmiş kimi əllərini bir-birınə bitişdirib, kraliçanın məyusluğunu görərək ağlaya-ağlaya dedi:

Qorxmayın, şövkətli xanım. Mən bütün ruhum və bədənimlə sizə sadiqəm. Nə qədər kiçik adam olsam da, güman edirəm ki, siz ülyahəzrəti fəlakətdən qurtarmaq üçün bir çarə tapmışam.

– Sizmi! Aman Allah, kraliça çığırdı. Ancaq bir mənim gözlərimin içinə baxın. Hamı mənə xəyanət edir. Mən sizə etibar edə bilərəmmi?

Cavan qadın diz çöküb dedi:

Aman, şövkətli xanım! Bütün müqəddəs olan şeylərə and içirəm! Mən siz ülyahəzrətin yolunda ölməyə də hazıram!

Bu səs qəlbin dərinliklərindən qopub gələn bir səs idi.

Bəli, xanım Bonasye davam etdi, bəli, Məryəm ananın müqəddəs adına and içirəm! Mən siz ülyahəzrətə sadıqəm. Kralın sizdən tələb etdiyi boyunbağını siz Bekinhem hersoquna vermişsiniz. Onu çəhrayı mücrüdə saxlayırdınız. Elə deyilmi? Mən səhv etmirəm ki?

Dəhşətdən dişləri bir-birinə dəyən kraliça pıçıldadı:

Aman ya rəbbim, aman!

Deməli, bu boyunbağını – xanım Bonasye davam etdi, geri qaytarmaq lazımdır.

Bəli, əlbəttə, qaytarmaq lazımdır! kraliça səsləndi. Ancaq bunu necə etməli? Onu necə ələ keçirməli?

Hersoqun yanına bir adam göndərmək lazımdır!

Ancaq kimi? Kimi? Kimə inanmaq olar?

Mənə, şövkətli xanım, mənə etibar edin, göndərməyə mən adam taparam.

Axı onda mən məktub yazmalı olacağam!

Bəli, xanım, bu zəruridir. Öz xəttinizlə ikicə kəlmə yazıb, öz möhürünüzü vurmalısınız.

Axı, bu sözlər mənim üçün bir ölüm qərarı, boşanma və sürgün hökmünə çevrilə bilər!

Bəli, bu məktub namussuz bir adamın əlinə düşərsə, belə ola bilər. Ancaq mən sizə zəmanət verirəm ki, yazdığınız bu iki kəlmə hersoqun özünə çatdırılacaqdır

Axı, necə? Heç olmazsa bunu mənə söyləyin!

– Mənim ərimi iki və ya üç gün bundan əvvəl buraxıblar Hələ onunla görüşməyə vaxt tapmamışam. O, heç kəsə nə məhəbbət, nə də ədavət bəsləməyən mehriban bir adamdır. O, mənim bütün istədiyimi yerinə yetirər. O özü də nə üçün getdiyini, nə apardığını bilmədən, Londona gedər və siz ülyahəzrətin məktubunu göstərilən ünvana çatdırar.

Kraliça qızğın bir həyəcanla cavan qadının əllərindən yapışdı. Fikirlərini oxumaq istəyirmiş kimi, üzünə baxdı və gözlərində səmimiyyətdən başqa bir şey görməyib, onu nəvazişlə öpdü.



– Dediyini elə, kraliça səsləndi, beləliklə, sən mənim həyatımı və şərəfimi xilas etmiş olarsan!

Mənim sizə etmək şərəfinə nail olduğum xidmətləri şişirtməyin. Siz ülyahəzrət yalnız xain sui-qəsdlərin qurbanı olubsunuz

Kraliça dedi:

– Doğrudur, doğrudur, qızım, sən haqlısan.

Şövkətli xanım, o məktubu mənə verin. Vaxt azdır.

Kraliça üstündə mürəkkəb, qələm və kağız olan kiçik mizə doğru yüyürdü. O, iki xətt yazıb məktuba öz möhürünü basdı və xanım Bonasyeyə verib dedi:

İndi biz ən mühüm bir şeyi unutmuşuq.

- Nəyi?

Pulu.

Xanım Bonasye qızardı və dedi:

– Bəli, doğrudur. Mən siz ülyahəzrətə etiraf etməliyəm ki, ərim. .

Yəqin ki, ərinin pulu yoxdur, yəqin ki, sən bunu demək istəyirsən?

Yox, pulu var, amma çox xəsisdir. Bu da onun nöqsanıdır. Ancaq narahat olmayın, ülyahəzrət. Bir çarə taparıq...

İş burasındadır ki, mənim də pulum yoxdur, – kraliça cavab verdi, ancaq bir dayan.

Avstriyalı Anna cavahiratını saxladığı mücrüyə doğru yüyürdü və dedi:

Budur, deyirlər ki, bu üzük çox qiymətlidir. Onu mənə öz qardaşım İspaniya kralı bağışlamışdır. Bu üzüyü sat pul elə və qoy ərin getsin.

– Bir saatdan sonra sizin əmriniz yerinə yetiriləcəkdir.

– Ünvanı görürsənmi? soruşan kraliça elə yavaşdan danışırdı ki, səsini zorla eşitmək olurdu.

"Londonda milord Bekinhem hersoquna".

Məktub şəxsən onun özünə veriləcəkdir.

– Ax, alicənab övladım! avstriyalı Anna səsləndi.

Xanım Bonasye kraliçanın əlini öpdü və məktubu korsajına qoyub qaça-qaça otaqdan çıxdı.

On dəqiqədən sonra evdə idi. Biz artıq bilirik ki, əri buraxıldıqdan sonra hələ onunla görüşməmişdi. Ona görə də bu möhtərəm tacirin fikrində əmələ gələn dəyişiklikdən xəbəri yox idi Özünü cənab

Bonasyeyə ən yaxın dost kimi tanıtmış qraf Roşforun ıkı-üç ziyarətindən sonra tacirin kardinala olan sədaqətı daha da artmışdı.

Xanım Bonasye ərini evdə tək gördü. Yazıq kişi evi zorla səliqəyə salırdı. Evin bütün avadanlığı, demək olar ki, sınmışdı. Dolablar bomboş idi; çünki ədalət, Süleyman peyğəmbərın söylədiyı kımı, getdıkdən sonra heç bir izi qalmayan o üç şeydən heç bırı deyıldi.

Ləyaqətli tacır evə qayıtdıqdan sonra özünün sağ salamat gəlməsi barədə arvadına xəbər göndərmişdi.

Arvadı da xəbər göndərərək onu təbrik etmiş və bıldirmişdı kı, xidmətdən bır dəqıqə başı ayılan kımı onun görüşünə gələcəkdir.

Bu dəqiqənı beş gün gözləmək lazım gəldı. Başqa vaxt olsaydı, bu müddət cənab Bonasyeyə bir qədər uzun görünə bilərdi. Ancaq onun kardinalla görüşməsi və Roşforun yanına gəlıb-getməsı xəyalatına xeylı qıda vermışdı Məlum olduğu kımı, heç bır şey xəyalat kimi vaxtı qısalda bılməz. Bir də Bonasyenın xəyalından çox şeylər keçirdi. Roşfor onu öz dostu, öz əziz Bonasyesi adlandırır və daim söyləyirdi ki, kardinal ona çox hörmət bəsləyir. Tacir özünü artıq şərəf və sərvətə yetişməkdə olduğunu görürdü.

Xanım Bonasye də düşüncələrə dalmışdı. Onun fikirlərı məftun görünən həmin igid cavanın yanında idi. Xanım Bonasye on səkkiz yaşında ikən cənab Bonasyeyə ərə gedib, həmışə ərinin dostları arasında vaxt keçirmişdi, onlar da özlərindən xeyli yüksək bir qəlbə malık olan cavan qadına heç bir hiss aşılaya bilməmışdilər. Xanım Bonasye bayağı nəvazişlərdən çəkinirdi. Ancaq o zamanlar əsilzadə rütbəsi orta təbəqələrdən olan adamlar uçun çox qiymətli idi. D'Artanyan isə əsilzadə idi. Bundan başqa, onun əynində qvardiyaçı mundiri vardı ki, bu da muşketyor mundirindən sonra qadınlara dünyada hər şeydən xoş gəlirdı. Biz təkrar edirik kı, d'Artanyan gözəl, cavan və cürətli idi. O, eşqdən elə danışırdı ki, ürəkdən sevdiyi və eşq üçün yandığı hıss olunurdu. Bu – iyırmi beş yaşlı bir qadının başını gicəlləndirmək üçün kifayət idi. Xanım Bonasye isə həmın bu xoşbəxt yaşa yenicə qədəm qoymuşdu.

Buna görə də ər-arvad bir həftədən artıq bir-birilə görüşmədiklərinə və bu müddətdə onların həyatında mühüm hadisə baş verdiyinə baxmayaraq, bir-birilə bir qədər soyuq görüşdülər. Bununla bərabər, cənab Bonasye arvadını görəndə ürəkdən sevındi. Qollarını açaraq arvadını qarşıladı.



Xanım Bonasye öpmək üçün alnını ona yaxın tutub dedi:

Gəlin bir az söhbət edək.

Nə barədə? cənab Bonasye heyrətlə soruşdu.

Mən sizə çox mühüm bir şey söyləməlıyəm.

– Mən də sizə bir neçə mühüm sual verməliyəm. Söyləyin görüm sizi niyə qaçırmışdılar?

Xanım Bonasye dedi:

İndi bu söhbətin yeri deyil.

– Bəs hansı söhbətin yeridir? Mənim həbs olunmağımınmı?

Mən elə həmin gün bundan xəbər tutmuşdum. Ancaq siz heç bir cinayətdə müqəssir deyilsiniz. Heç bir fitnədə iştirak etməmışdiniz, xülasə, heç bir elə ış tutmamışdınız ki, sizi pis vəziyyətdə qoymuş olsun... Buna görə də mən bu hadisəyə əhəmiyyət verməmışdim.

Cənab Bonasye arvadının onun qayğısına belə az qaldığından incimiş halda dedi:

– Xanım, bu sözlərı söyləmək sizin üçün asandır. Siz heç bilirsinizmi kı, bütün bir günü Bastiliyada keçirmək nə deməkdir?

Bır gün çox tez gəlib keçir, gəlin sizin həbs olunmağınızdan danışmayaq. Məni bura gətirən ış barəsində danışaq.

– Sizi mənim yanıma gətirən işdənmi? Məgər sizi bura gətirən bir həftədən bəri görüşmədiyiniz ərinizlə görüşmək arzusu deyilmi? – ürəyi sınmış tacır soruşdu.

– Birinci səbəb budur, sonra da bir başqa səbəb var.

Söyləyin!

Bu, çox mühüm bir şeydir. Bizim gələcək vəziyyətimizin yaxşılaşması bəlkə də bundan asılıdır.

Xanım Bonasye, mən sizi görmədiyim müddətdən bəri bızim vəziyyətimiz xeyli dəyişmişdir. Əgər bir neçə aydan sonra bu vəziyyətə bır çoxları paxıllıq edərsə, buna əsla təəccüblənmərəm.

Bəlı, xüsusilə, əgər mənım söyləyəcəyım məsləhətlərə əməl etsəniz, doğrudan da, belə olar.

Mənmi?

Bəli, siz. Çox xeyirxah və müqəddəs bir iş görüb, bununla bərabər, çoxlu pul qazanmaq mümkündür.

Xanım Bonasye bılirdi ki, ərılə puldan danışanda, onun zəif damarlarına toxunmuş olacaqdır. Ancaq hər bir adam, hətta sadəcə bır tacir də olmuş olsa, kardinal Rişelye ilə onca dəqiqə söhbət etdikdən sonra dəyişilib tamamilə başqa bir adam olur.

Çoxlu pul qazanmaqmı? Bonasye dodaqlarını uzadaraq soruşdu.

Bəli, lap çox.

Məsələn, nə qədər?

Ola bilər ki, min pistol.

Bəs mən hara getməliyəm?

Siz bu saat yola düşməlisiniz. Mən sizə bir məktub verəcəyəm. Siz bunu heç bir vəchlə əlinizdən verməyib düz göndərilən adama təqdim edəcəksiniz.

Bəs mən hara getməliyəm?

Londona.

Mənmi? Londonamı? Məni ələ salırsınız. Mənim Londonda nə işim var?

Lakin sizin ora getməniz başqa bir adama lazımdır...

Bu başqa adam kimdir? Sizi xəbərdar edirəm ki, mən bundan sonra heç bir işi kor-koranə görməyəcəyəm və yalnız nəyi təhlükəyə qoyduğumu deyil, kimdən ötrü təhlükəyə qoyduğumu da bilmək istəyirəm.

– Sizi məşhur bir xanım göndərir və məşhur bir xanım gözləyir Mükafat sizin umduğunuzdan çox-çox artıq olacaqdır. Sizə vəd edə biləcəyim şey bundan ibarətdir.

– Yenə də fitnə! Daim fitnə! Cənab kardinal bu barədə mənim ağlımı başıma gətirmişdır.

– Kardinal! xanım Bonasye çığırdı. Siz kardinalı görübsünüzmü?

O, mənim dalımca adam göndərmişdi, tacir qürurla cavab verdi

– Siz də onun dəvətinə əməl etdinizmi?

Etiraf etməliyəm ki, mənim üçün başqa yol yox idı.

– O sizinlə rəsmi rəftar etdi? Hədələdimi?

O·mənə əl verib məni öz dostu adlandırdı. Öz dostu, eşidirsinizmi, xanım? Mən böyük kardinalın dostuyam!

Siz kardinalamı xidmət edirsiniz?

– Bəli, xanım və mən onun bir xidmətkarı olmaq etibarilə dövlətin təhlükəsizliyinə qarşı sui-qəsdlərdə iştirak etməyə və qəlbi ispaniyalı qəlbi olan bir qadının fitnələrinə kömək etməyə yol verə bilmərəm. Xoşbəxtlikdən böyük kardinalın sayıq nəzərləri hamını təqib edir və qəlblərin dərinliklərini görür.

Cənab Bonasye qraf Roşfordan eşitdiyi sözləri eynən təkrar edirdi. Lakin oz ərinə güvənib onun əvəzinə kraliçaya zəmanət vermiş olan



qadın az qala düşəcəyi təhlükədən dəhşətə gəldi. Ancaq, bununla bərabər, öz ərinin acgözlüyünü bildiyindən, istədiyinə nail olmaqdan ümidini kəsməmişdi.

Aha, cənab, deməli ki, siz kardinalçısınız! o çığırdı. – Siz arvadınızı incidən və kraliçanızı təhqir edən bir firqəyə xidmət edirsiniz!

– Xüsusi mənfəətlər ictimai mənfəətlər qarşısında heçdir. Mən dövləti xilas edənlərdən biriyəm, - Bonasye dəbdəbəli bir əda ilə cavab verdi.

Bu cümlə də qraf Roşforun söylədiyi cümlələrdən biri idi və Bonasye bunu yadında saxlayıb indi təkrar etməyi yerli bir hərəkət saymışdı.

Siz dediyiniz o dövlətin nə olduğunu heç bilirsinizmi? xanım Bonasye çiyinlərini çəkərək soruşdu. Yaxşısı budur ki, sadəcə bir tacir olaraq qalın və sizə böyük mənfəətlər təmin edən adamların dalınca gedin.

Cənab Bonasye əlini dolu bir kisəyə vuraraq dedi:

Eh, ay mənə öyüd-nəsihət verən xanım, bəs siz buna nə deyirsiniz?

– Bu pullar haradandır?

Başa düşmürsünüzmü?

- Kardinalmı vermişdir?

Həm o, həm də dostum qraf Roşfor vermışdir.

– Qraf Roşfor! Ah, o ki məni qaçırmışdı.

– Məgər mənə deməmişdiniz ki, sizi xalis siyasi səbəblərə görə qaçırmışlar?

Elədir, ancaq bundan məqsəd o idi ki, məni öz xanımıma xəyanətə məcbur etsinlər. Mənə işgəncə verib boynuma elə şeylər qoysunlar ki, bunlar mənim ülyahəzrət xanımımın şərəfini, bəlkə də həyatını təhlükəyə salmış olsun.

Xanım, - Bonasye cavab verdı, – sizin ülyahəzrət xanımınız xain və ispanıyalıdır, kardinal da düzgün hərəkət edir.

Cavan qadın cavab verdi:

Cənab, mən sizin qorxaq, xəsis və axmaq olduğunuzu bilirdim. Ancaq sizin alçaq olduğunuzdan xəbərim yox idi.

Öz arvadını heç bir zaman belə qəzəbli görməmiş və arvad qəzəbindən qorxan Bonasye dedi:

Xanım, nə dediniz?

– Dedim ki, siz alçaqsınız. Sız təxırsız yola düşməlisiniz və sizə həvalə etmək istədiyim tapşırığı sədaqətlə yerinə yetirməlisiniz. Yalnız bu şərtlə mən sözlərimi yaddan çıxarıb, sizı bağışlaya bılərəm və bundan əlavə, o, əlini uzatdı, dostluğumu da sizə qaytararam.

Bonasye qorxaq və xəsis ıdı. Ancaq öz arvadını sevirdi. Əlli yaşında olan bir kişı ıyirmı beş yaşında olan qadına uzun müddət qəzəblənə bilməz. Xanım Bonasye onun tərəddüd etdıyını gördü.

- Necə oldu, qərara gəldınızmi? soruşdu.

Axı, əzızim, bır özünüz düşünün ki, məndən nə tələb edirsiniz? London Parisdən uzaqdır, çox uzaqdır .. Mənə verəcəyiniz tapşırıq isə, bəlkə də təhlükəli bir tapşırıqdır...

Sız özünüzü təhlükədən qoruduqdan sonra bunun nə fərqi var?

Tacir dedi:

– Bura baxın, xanım Bonasye. Mən qəti surətdə imtina edırəm. Mən fitnədən qorxuram. Mən Bastiliyanın nə olduğunu görmüşəm. Of, aman! Bastılıya çox dəhşətli şeydir. Yadıma düşəndə canımı üşütmə alır. Məni işgəncə ilə qorxutdular. İşgəncə nə olduğunu bılirsinizmi? Yox, mən əsla gedən deyiləm. Axı, bəs siz özünüz niyə getmirsiniz? Mən, doğrudan da, bu fikirdəyəm ki, bu vaxtacan sizin barənizdə səhv etmişəm. Məncə, siz kişisiniz, özü də ən cürətli bir kışi...

– Siz isə arvadsınız! Miskin, axmaq və beyinsiz bir arvad! Ah, qorxağın biri! Yaxşı! Siz əgər bu dəqiqə yola düşməsəniz, mən kraliça naminə əmr edərəm ki, sizi tutub bu qədər qorxduğunuz Bastiliyaya salsınlar.

Bonasye dərin düşüncələrə daldı. O, öz fikrində hansı tərəfin: kardinalınmı, yoxsa kraliçanınmı üstün olduğunu götür-qoy edırdi. Kardinalın qəzəbi üstün gəlirdi.

– Nə olar ki, sız məni kraliça naminə həbs etdirmək istəsəniz, mən də kardinal həzrətlərinə müraciət edərəm!

Bu zaman xanım Bonasye başa düşdü ki, çox uzaq getmişdir və qorxuya düşdü. O, qorxmuş halda ərinin küt üzünə baxırdı.

Bu üzdə yenilməz bir qətıyyət yazılmışdı. Ancaq axmaq adamlar qorxduqları zaman qətiyyətli olurlar.

Xanım Bonasye dedı:

Çox yaxşı, qoy belə olsun. Bəlkə də siz haqlısınız. Siyasət işlərıni kişilər, xüsusən siz, cənab Bonasye yaxşı bilirsiniz. Axı, siz



kardınalla söhbət etmişsiniz. Hər halda mənə çox ağır gəlir ki, – o əlavə etdi, mənim ərim, mənə bağlı olduğuna güvəndiyim bır adam, mənimlə bu qədər sərt rəftar edir və mənim arzumu yerinə yetirmək ıstəmir

Çünkı sızın arzunuz bızi çox uzaqlara aparıb çıxara bilər və mən o arzulara inanmıram, Bonasye qalıb gəlmiş bir əda ilə cavab verdi.

Cavan qadın köksünü ötürərək cavab verdi:

Mən bu arzudan ımtına edirəm. Daha bu barədə danışmağa dəyməz.

– Heç olmasa bir mənə söyləyın görüm, axı mən Londonda nə etməliyəm? Bonasye, bir qədər gec də olsa, qraf Roşforun ona öz arvadının sirlərini öyrənməyi tapşırdığını yadına salıb soruşdu.

İndi artıq sövqi-təbii duyğusu ilə ehtiyat etməyə başlayan cavan qadın cavab verdi.

Bunu bilməsəniz də olar. Əhəmiyyətsız bır ış idi, qadın şıltaqlığı idi, orada bir şey almaq lazım idi kı, bu vasitə ilə xeyli pul qazanmaq olardı.

Ancaq cavan qadın cavab verməkdən nə qədər təkidlə boyun qaçırırdısa, əri onun gizlətdiyı sirrin bir o qədər əhəmiyyətlı olduğunu güman edirdi. Ona görə də o saat qraf Roşforun yanına gedib kraliçanın Londona göndərməyə bir adam axtardığını xəbər verməyı qərara aldı və arvadına dedi:

Əzizim xanım Bonasye, bağışlayın ki, mən sizi tərk etməli olacağam. Sizin yanıma gələcəyinizi bilmədiyimdən, bir dostumla görüş təyın etmişdim. Bu saat qayıdaram. Bircə dəqiqə gözləsəniz, dostumla söhbətimi qurtarıb gələrəm. Daha gecdir, gəlib sizi Luvra apararam.

– Təşəkkür edirəm, cənab, – xanım Bonasye cavab verdi. Siz o qədər qoçaq deyilsiniz ki, mənə bir xeyriniz dəyə. Luvra özüm tək də gedərəm.

Tacir dedi:

Necə istəyirsiniz, elə olsun, xanım Bonasye. Sizi tezmi görə bılərəm?

– Əlbəttə, ümid edirəm ki, gələn həftə boş vaxtım olar və o zaman bizim belə bərbad olmuş təsərrüfatımızı, ehtimal ki, səliqəyə salaram.

- Yaxşı, mən sizi gözlərəm. Mənə acığınız tutmur ki?

Mənimmi? Əsla!

– Elə isə, hələlik xudahafiz!
– Xudahafiz!
Bonasye arvadının əlini öpüb tez otaqdan çıxdı.
Əri küçəyə çıxıb, xanım Bonasye tək qaldıqda, öz-özünə dedi:
"Gözümüz aydın! Elə bircə bu qalmışdı ki, bu axmaq da kardinalçı olsun! Mən isə kraliçaya zəmanət verib, yazıq xanıma kömək vəd etmişdim... Aman Allah, aman Allah! Yəqin ki, məni də bütün sarayı doldurmuş xain qadınlardan biri hesab edəcək. Onun ətrafına o qədər casus düzmüşlər ki, of! Cənab Bonasye! Mən sizi heç bir zaman o qədər də sevməmişəm. Ancaq onu bilin ki, indi sizdən zəhləm gedir Sizə and içirəm ki, bunun əvəzini çıxacağam".
Xanım Bonasye öz-özü ilə danışdığı zaman birdən səqfə vurulan bir zərbə onun başını yuxarı qaldırmağa məcbur etdi. Yuxarıdan bir səs ona dedi:
Əziz xanım Bonasye, yan qapını açın, yanınıza gəlim!

## XVIII

## OYNAŞ VƏ ƏR

Cavan qadının açdığı qapıdan içəri girərkən d'Artanyan dedi:
Ax, xanım, icazə verin sizə söyləyim ki, nə miskin əriniz var imiş!
Deməli, siz bizim söhbətimizi eşidibsiniz, eləmi? xanım Bonasye narahat halda həyəcanla ona baxaraq soruşdu.
Başdan-ayağa bütün danışığınızı eşitdim.
Axı bunu necə eşidə bildiniz?
Vaxtı ilə sizin kardinalın adamları ilə olan həyəcanlı danışığınızı eşitdiyim kimi: mən parketi çıxarmışdım.
Yaxşı, bizim danışığımızdan nə başa düşdünüz?
Min cür şey. Əvvələn, onu başa duşdüm ki, əriniz mənim xoşbəxtliyimdən, olduqca miskin və axmaq bir adamdır. Siz çətin bir vəziyyətə düşübsünüz və mən buna çox şadam. Bu, mənə imkan verir ki, sizə öz xidmətlərimi təklif edim və Allah şahiddir ki, sizin yolunuzda mən özümü oda atmağa da hazıram. Bundan başqa, mən bunu da başa düşdüm ki, kraliçaya Londona gedə biləcək cəsur, zirək və sadiq bir



adam lazımdır. Məndə bu keyfiyyətlərdən heç olmazsa ikisi vardır və sizin qulluğunuzda hazıram.
Xanım Bonasye dinmirdi. Ancaq şadlıqdan ürəyi bərk-bərk döyünürdü.
Əgər bu tapşırığı sizə etibar etsəm, mənə nə kimi zəmanət verə bilərsiniz? – o soruşdu.
– Sizə olan məhəbbətimi. Deyin, əmr edin, nə lazımdırsa, etməyə hazıram!
Aman Allah, aman Allah! - cavan qadın pıçıldadı.
Mən belə bir sirri sizə inana bilərəmmi? Axı, siz lap uşaq kimi bir şeysiniz!
– Görürəm ki, bir adamın zəmanəti olmasa, siz mənə inanmayacaqsınız.
- Etiraf edirəm ki, belə bir adam olsaydı, mən xeyli arxayın olardım.
– Siz Atosu tanıyırsınızmı?
Xeyr
Portosu necə?
Yox.
Bəs Aramisi?
Yox. Bu cənablar kimdir?
Kral muşketyorları. Siz onların kapitanı cənab de Trevili tanıyırsınızmı?
Bəli, bəli, onu tanıyıram Özüm onunla tanış deyiləm, amma kraliça onun cəsarətli və nəcib bir əsilzadə olduğunu tez-tez söyləyirdi.
Onun sizə xəyanət edib sizi kardinalın əlinə verəcəyindən ehtiyat etmirsiniz, elə deyilmi?
– Əlbəttə, yox.
Elə isə, sirrinizi açıb ona söyləyin və soruşun, bu sirr nə qədər qiymətli, dəhşətli olursa-olsun, onu mənə etibar etmək olar, ya yox?
Ancaq bu sirr mənim sirrim deyildir. Mən onu cənab de Trevilə aça bilmərəm.
– Siz ki, həmin sirri cənab Bonasyeyə söyləmək istəyirdiniz? d'Artanyan incimiş halda qeyd etdi.
Bir məktubu bir ağacın oyuğuna, bir göyərçinin qanadına, bir itin xaltasına inanan kimi inanırdım...

Ancaq siz görürsünüz ki, mən sizi sevirəm.

Bu sözdür.

Mən sədaqətli bir adamam!

Mən buna inanıram.

Mən cürətliyəm.

Bəli. Mən buna artıq inanmışam.

Elə isə, məni sınayın.

Xanım Bonasye cavan oğlanın üzünə baxdı; lakin hələ də tərəddüd edirdi. Ancaq cavanın gözlərində elə bir atəş, səsində elə bir düzlük vardı ki, xanımı inanmağa vadar edirdi. Bir də xanım Bonasye elə bir vəziyyətdə idi ki, risk etməyə məcbur idi. Kralıçanı həm həddən artıq inanmaq, həm də həddən artıq ehtiyat məhv edə bilərdi. Nəhayət, etiraf edirik ki, xanım Bonasyenin cavan himayəkarına qarşı olan qeyri-ixtiyari duyğuları onu qərara gəlməyə məcbur etdi və o, cavan oğlana dedi:

Bura baxın, mən təkidlərinizə güzəşt edib sizə inanıram. Ancaq bütün bunları eşidən Allaha and içirəm ki, əgər xəyanət etmiş olsanız, özümü öldürüb qanımı sizin boynunuza atacağam.

D'Artanyan dedi:

Allaha and içirəm ki, sizin əmrlərinizi yerinə yetirdiyim zaman məni tutmuş olsalar, ölərəm, ancaq heç bir kəsə zərər verə biləcək heç bir şey nə söyləyərəm, nə də edərəm.

Bu sözlərdən sonra cavan qadın o dəhşətli sirri açıb d'Artanyana söylədi. Bu sirrin bir hissəsini o artıq təsadüfi olaraq "Samarityanka" körpüsündə eşitmişdi.

Bununla da onlar bir-birinə eşq izhar etmiş oldular.

D'Artanyan qürurundan və xoşbəxtliyindən yerə-göyə sığmırdı. İnam və məhəbbət onu bir nəhəngə çevirmişdi O dedi:

Mən gedirəm, lap bu saat gedirəm.

Necə? Necə gedirsiniz? Xanım Bonasye həyəcanla səsləndi Bəs sizin alayınız? Bəs sizin kapitanınız?

– And içirəm ki, əziz Konstansiya, siz məni dünyada hər şeyi unutmağa məcbur etdiniz. Bəli, siz haqlısınız. Mən gərək məzuniyyət alım

– Yenə də əngəl! – Xanım Bonasye qəmgin halda pıçıldadı.

Eh, bu əngəli, d'Artanyan azacıq düşündükdən sonra çığırdı, bu əngəli mən aradan qaldıraram! Buna arxayın olun.

– Nə sayaq?



Mən elə bu axşam cənab de Trevilin yanına gedib xahiş edərəm ki, cənab Dezessardan mənim üçün bu lütfü xahiş etsin.

Axı bir şey də var!

D'Artanyan xanım Bonasyenin sözünü söyləməyə tərəddüd etdiyini görüb soruşdu:

– Nə var ki?

– Bəlkə sizin pulunuz yoxdur?

D'Artanyan gülümsəyərək dedi:

– "Bəlkə" sözü artıqdır.

Elə isə, xanım Bonasye dolabı açıb oradan yarım saat əvvəl ərinin sevə-sevə bağrına basdığı pul kisəsini çıxartdı və d'Artanyana verdi, elə isə bu kisəni götürün.

Kardinalın kisəsinimi? d'Artanyan ucadan gülərək çığırdı. Burada təkrar bir şeyi qeyd edək ki, d'Artanyan çıxartdığı parketi sayəsində tacir ilə arvadı arasında olan söhbətdən bircə kəlməni də qulağından qaçırmamışdı.

Bəli, kardinalın kisəsini, xanım Bonasye təsdiq etdi. Görürsünüz ki, bu kisə xeyli tutarlı kisədir.

Lənət şeytana! d'Artanyan çığırdı. Bu ikiqat məzəli olar: kraliçanı kardinal həzrətlərinin pulunun köməyilə xilas etmiş olarıq!

Xanım Bonasye dedi:

- Siz mehriban və nəvazişkar bir adamsınız. İnanın ki, kraliça sizin bu xidmətinizi mükafatsız qoymaz.

- Yox, mən onsuz da mükafatımı almışam! d'Artanyan çığırdı. - Mən sizi sevirəm və siz bunu söyləməyə mənə icazə verirsiniz. Mən belə bir xoşbəxtliyə ümid bəsləməyə cəsarət edərdimmi...

Yavaş! xanım Bonasye diksinmiş halda səsləndi.

Nə var ki?

– Küçədən danışıq səsi gəlir.

Bu səs...

Mənim ərimin səsidir

D'Artanyan qapıya tərəf yüyürüb daldan cəftəni vurdu və dedi.

– Nə qədər ki, mən buradayam o içəri girməməlidir. Mən gedəndən sonra qapını açarsınız.

Axı mən də gərək gedəydim. Bəs, mən burada qalmış olsam, pulların yox olduğunu ona necə izah etmək olar?

- Doğru deyirsiniz. Sizin də getməniz lazımdır.

Gedəkmi? Ancaq necə? Əgər bayıra çıxsaq, o bizi görər.

Elə isə, gərək mənim otağıma gedək.

Ax, xanım Bonasye çığırdı, siz bunu elə bir səslə deyirsiniz ki, canımı dəhşət alır.

D'Artanyan dedi:

Mənim otağımda sizin üçün heç bir təhlükə ola bilməz. Sizə bir əsilzadə kimi söz verirəm

Gedək, mən sizə inanıram, dostum.

D'Artanyan ehtiyatla cəftəni açdı və hər ikisi kölgə kimi səssizcə iç qapıdan dəhlizə çıxdılar, ehtiyatla pillələri qalxdılar və d'Artanyanın otağına girdilər.

Cavan oğlan öz otağına girdikdən sonra hər bir ehtimala qarşı qapının dalını bərkitdi. Sonra hər ikisi pəncərəyə yanaşdılar və pəncərə qapısının arasından cənab Bonasyenin küçədə plaşlı bir adamla danışdığını gördülər.

D'Artanyan plaşlı adamı görən kimi yerindən sıçrayıb qılıncını yarıya qədər çəkərək qapıya doğru yüyürdü.

Bu plaşlı adam onun Menqdə rast gəldiyi adam idi.

– Nə edirsiniz? – xanım Bonasye çığırdı, siz bizi məhv edirsiniz!

D'Artanyan dedi:

Axı, mən and içmişəm ki, bu adamı öldürəm

– İndi artıq sizin həyatınız öz ixtiyarınızda deyil. Kraliçanın adından özünüzü qarşıdakı səyahət ilə əlaqəsi olmayan hər hansı bir təhlükəyə atmağı sizə qadağan edirəm.

– Bəs öz adınızdan mənə heç bir şey əmr etmirsinizmi?

Öz adımdanmı? xanım Bonasye böyük bir həyəcanla dilləndi. Sizdən rica edirəm ki, xahişi yerinə yetirəsiniz. Ancaq bura baxın, mənə elə gəlir ki, onlar mənim barəmdə danışırlar.

D'Artanyan pəncərəyə yaxınlaşıb dinləməyə başladı.

Cənab Bonasye qapını açdı və içəridə heç kəs olmadığın görüb plaşlı adamın yanına qayıtdı və dedi:

Arvadım getmişdir, yəqin ki, Luvra qayıtmışdır.

Naməlum adam dedi:

– Siz əminsinizmi ki, o nə üçün getdiyinizi başa düşməmişdir?

Yox, Bonasye özündən razı halda cavab verdi. O, çox saya bir qadındır.

Bəs qvardiyaçı evdədirmi?



Güman edirəm ki, yox. Görürsünüz ki, pəncərə qapıları örtülüdür və qapı arasından içəridə işıq görünmür.

Gərək bunu lap yəqin bilək.

– Nə sayaq?

Gedin qapısını döyün.

Yaxşısı budur gedib onun nökərindən soruşaram

Bonasye d'Artanyan ilə xanım Bonasyenin çıxdıqları qapıdan keçib d'Artanyanın qapısına yaxınlaşdı və qapını döydü.

Ona cavab verən olmadı. Bu axşam Portos d'Artanyandan xahiş etmişdi ki, Planşeni onun yanına göndərsin. D'Artanyan özü isə, aydın şeydir ki, əsla səsini çıxarmırdı.

Bonasye dedi:

– Onun otağında heç kəs yoxdur.

Elə isə, sizin otağınıza gedək. Ora qapı ağzından təhlükəsiz olar.

Of, aman Allah, xanım Bonasye pıçıldadı, biz daha heç bir şey eşidə bilməyəcəyik.

D'Artanyan cavab verdi:

– Əksinə, biz daha yaxşı eşidəcəyik.

D'Artanyan döşəmədən üç-dörd parket çıxarıb xalçanı yerə saldı və dizi üstə oturub xanım Bonasyeyə də döşəmədəki dəliyə yaxınlaşmasını işarə etdi.

Aşağı otaqda naməlum adam dedi:

Siz arxayınsınızmı ki, bizim danışığımızı heç kəs eşitməz?

Arxayın olun, Bonasye cavab verdi.

Siz güman edirsiniz ki, arvadınız...

– Luvra qayıtmışdır.

– O sizdən başqa heç bir kəslə danışmamışdır ki?

Mən buna əminəm.

Bu çox mühümdür, başa düşürsünüzmü?

– Deməli, mənim sizə verdiyim xəbər əhəmiyyətli xəbərmiş.

Bunun əhəmiyyəti çox böyükdür, əzizim Bonasye. Bunu sizdən gizlətmirəm.

Kardinal məndən razı qalacaqmı?

– Şübhə etmirəm.

Böyük kardinal!

Siz əminsinizmi ki, arvadınız sizinlə danışanda heç bir kəsin adını çəkmədi?

– Mənə elə gəlir ki, yox.
– O, xanım de Şevrözün, Bekinhem hersoqunun, xanım de Vernenin adlarını çəkmədi ki?
Yox, yalnız bunu dedi ki, məni məşhur bir xanıma xidmət etmək üçün Londona göndərmək istəyir.
– Xain! – xanım Bonasye pıçıldadı.
D'Artanyan nəvazişlə onun əlini tutub dedi:
Susun!
Xanım Bonasye əlini onun əlindən çəkmədi.
*Hamısı birdir, plaşlı adam davam etdi, siz axmaqsınız* ki, özünüzü bu tapşırığı qəbul edirmiş kimi göstərməmişsiniz. Belə etsəydiniz, indi məktub sizin əlinizdə olardı. Dövlət təhlükədən xilas edilmiş olardı, sizə isə...
Bəs mənə?
Sizə isə, kardinal əsilzadəlik verərdi.
– Arxayın olun, – Bonasye cavab verdi, arvadım mənə Allah kimi pərəstiş edir və biz hələ uduzmamışıq.
Axmaq! Xanım Bonasye pıçıldadı.
D'Artanyan onun əlini daha da bərk sıxaraq dedi:
– Susun!
– Necə, hələ uduzmamışıqmı? – Plaşlı adam davam etdi.
Mən bu saat Luvra gedib xanım Bonasyeni soruşaram, ona deyərəm ki, fikrimi dəyişmişəm; tapşırığı boynuma götürərəm və məktubu alıb birbaş kardinalın yanına qaçaram.
Tez olun gedin! Bir azdan sonra mən gəlib sizin hərəkətlərinizin müvəffəqiyyətlərindən xəbər tutaram.
Bu sözlərdən sonra naməlum adam çıxıb getdi.
– Əclaf! xanım Bonasye dilləndi.
Yavaş! d'Artanyan yenidən təkrar etdi.
Birdən dəhşətli bir fəryad d'Artanyan ilə xanım Bonasyenin düşüncələrini dağıtdı. Cənab Bonasye pul kisəsinin yox olduğundan xəbər tutub "vay-haray" edərək hay-kuy qoparmışdı.
Aman Allah! xanım Bonasye çığırdı: indi bütün məhəlləni bura yığacaq!
Bonasye xeyli çığırdı, lakin Məzarçılar küçəsində belə çığırtılar qəribə bir şey deyildi. Qonşulardan heç biri onun çığırtısına gəlmədi. Tacirin evi bir müddətdən bəri pis ad qazanmışdı. Bonasye fəryadına



heç kəsin yetişmədiyini görüb "vay-haray" edərək çığıra-çığıra küçəyə çıxdı.
Xanım Bonasye d'Artanyana dedi:
İndi ki, o evdən çıxıb getdi, bizim üçün də getmək vaxtıdır. Mərd olmalı və başlıca olaraq ehtiyatlı davranmalı! Yadınızdan çıxarmayın ki, siz kraliçanın ixtiyarındasınız.
– Onun və sizin ixtiyarınızda! – d'Artanyan çığırdı. Arxayın olun, gözəl Konstansiya, mən ülyahəzrət kraliçanın təşəkkürünə layiq qayıdacağam. Ancaq bilmirəm sizin məhəbbətinizə də layiq ola biləcəyəmmi?
Bu sözlərin cavabında cavan qadının yanaqları qıpqırmızı qızardı. Bir neçə saniyə sonra d'Artanyan böyük bir plaşa bürünüb evdən çıxdı. Plaşın altında uzun bir qılıncın döyüşə hazır siyrilmiş tiyəsi görünürdü.
Xanım Bonasye onu elə bir baxışla müşayiət etdi ki, elə bil qadın sevdiyi bir adamı yola salırdı. D'Artanyan döngəni dönüb gözdən itdikdə, xanım Bonasye diz çöküb əllərini bir-birinə sıxaraq çığırdı:
– Aman Allah, kraliçanı hifz elə, məni hifz eylə!

## XIX

## SƏFƏRİN PLANI

D'Artanyan düz cənab de Trevilin yanına getdi. O düşünürdü ki, məlun naməlum adam kardinalı tezliklə hər bir şeydən xəbərdar edəcəkdir və haqlı olaraq bu qərara gəlirdi ki, bircə dəqiqə də itirmək olmaz.
Cavan şadlığından özünü itirmişdi. Nəhayət, şöhrət və pul qazanmağa əlinə fürsət düşmüşdü. Bundan başqa, bu macəra onu sevdiyi bir qadınla yaxınlaşdırmışdı.
Cənab de Trevil öz otağında idi. Yanında bir neçə əsilzadə var idi.
D'Artanyanı xidmətçilər yaxşı tanıdıqlarından, o, birbaş ev sahibinin kabinetinə gedib tapşırdı ki, gəldiyini kapitana xəbər versinlər.
Aradan beşcə dəqiqə keçməmiş, cənab de Trevil içəri girdi.
O, d'Artanyanın sevincək üzünə baxar-baxmaz başa düşdü ki, yeni bir hadisə üz vermişdir.
D'Artanyan bütün yol uzunu nə cür hərəkət edəcəyini fikirləşib tərəddüd edirdi. Bilmirdi ki, bu sirri cənab de Trevilə açsınmı, yoxsa,

sadəcə gizli bir işi yerinə yetirmək üçün ondan kömək istəsin. Ancaq de Trevil həmişə onunla elə yaxşı rəftar edir və krala, həm də kraliçaya o qədər sədaqət bəsləyir və kardinaldan, həqiqətən, o qədər zəhləsi gedirdi ki, cavan qaskoniyalı bütün əhvalatı ona söyləməyi qərara aldı.

Cənab de Trevil soruşdu:

Sız mənimi soruşdunuz, dostum?

Bəlı, cənab, - d'Artanyan cavab verdı, ümid edirəm ki, necə mühüm bır ış üçün yanınıza gəldiyimi bildikdə, sizi narahat etdiyim üçün məni bağışlarsınız.

Söyləyın, mən dinləyirəm.

D'Artanyan səsini alçaldaraq dedi:

– Məsələ kraliçanın şərəfi və bəlkə də ölüm-dirim məsələsidir.

De Trevil onların söhbətlərinin heç bir kəs tərəfindən eşidilmədi yindən arxayın olmaq üçün, ətrafına göz gəzdirərək soruşdu:

Nə deyirsiniz?

Cənab! Təsadüf bir sırrin açarını mənim əlimə vermişdir..

– Siz də bu sirri həyatınız bahasına da olsa qorumalısınız, cavan oğlan.

-- Ancaq, əvvəlcə, mən bu sırri sizə inanıb söyləyirəm, cənab; çünki kraliçadan aldığım buyruğu yerinə yetirməyə yalnız siz mənə gömək edə bılərsiniz.

– Bu sirr sizin öz sirrinizdirmi?

Yox, bu sirr kraliçanındır.

Ülyahəzrət kraliça bu sirri inanıb mənə söyləməyə icazə vermışdirmi?

Yox, cənab. Əksinə, mənə tapşırılmışdır ki, bu sirri mümkün qədər möhkəm saxlayım.

Sirrinizi möhkəm saxlayın, cavan oğlan, mənə ancaq söyləyin görüm, sizə nə lazımdır?

– Mən istərdım ki, siz cənab Dezessardan mənə iki həftəlik məzunıyyət alasınız.

Nə vaxt?

Elə indicə.

Sız Parisdən çıxıb gedirsinizmi?

Mənı başqa bır şəhərə göndərirlər.

Mənə söyləyə bilərsinizmı hara?

Londona.



Sizin məqsədinizə çatmanıza mane olmağa çalışan varmı?

Mənə elə gəlir ki, kardinal mənim müvəffəqiyyətsizliyə düçar olmağımdan daha yaxşı bir şey arzu etmir.

– Təkmi gedirsiniz?

– Bəli, tək gedirəm.

Elə isə, heç Bondiyə qədər də gedib çıxmazsınız. Trevilin sözlərinə inanın.

Niyə ki?

– Sizi öldürərlər.

– Nə olar ki? Mən vəzifəmi yerinə yetirərkən ölərəm.

Ancaq sizə tapşırılmış iş də yerinə yetirilməmiş qalar.

Bu doğrudur, d'Artanyan cavab verdi.

İnanın, – Trevil davam etdi, – belə hallarda dördlükdə yola çıxmaq lazımdır ki, heç olmazsa biri gedib mənzilə çatsın.

D'Artanyan dedi:

Haqlısınız, cənab, siz Atosu, Portosu və Aramisi tanıyırsınız və onu da bilirsiniz ki, mən onlara inana bilərəm.

- Mənim öyrənmək istəmədiyim sirri onlara da açmayacaqsınız ki?

– Biz and içmişik ki, bır-birimizə həmişəlik inanaq və sədaqətli olaq. Yalnız onlara söyləyin ki, mənə tamamilə inanırsınız. Elə bu, kifayətdir.

Mən onların hər birinə iki həftəlik məzuniyyət verə bilərəm, vəssalam. Atos hələ də aldığı yaradan əziyyət çəkməkdədir. Buna görə də o, Forj sularına getməlidir. Portos və Aramis də öz yoldaşlarını ötürmək üçün gedərlər; çünki onu belə ağır vəziyyətdə tək buraxmağa razı olmazlar. Məzuniyyət məktubları mənim onlara bu səyahət üçün icazə verdiyimi sübut edər.

– Təşəkkür edirəm, cənab. Siz son dərəcə mehribansınız.

Elə isə, onların dalınca gedin və elə bu axşam yola düşün. Hə... Yalnız əvvəlcə cənab Dezessara bir ərizə yazın. Bəlkə də sizin dalınızca göz qoymuşlar və kardinal sizin bura gəldiyinizdən xəbər tutmuşdur. Bu ərizə ilə sizin bura gəlməyinizin səbəbini izah etmək olar.

D'Artanyan ərizə yazdı və cənab de Trevil ərizəni ondan alıb vəd etdi ki, səhərə hələ iki saat qalmış onların dördünün də məzuniyyət kağızları evlərinə göndəriləcəkdir.

– Zəhmət çəkin, mənim kağızımı Atosun evinə göndərin. Mən gözlənilməz bir əngələ rast gəlməmək üçün evə qayıtmaq istəmirəm.

Narahat olmayın. Xudahafiz! Yaxşı yol! Bır dəqiqə dayanın, de Trevil onu saxladı.

D'Artanyan gerı qayıtdı.

– Pulunuz varmı?

D'Artanyan cibində pul ilə dolu olan kisəni cingildətdi

Nə qədərdir? – cənab de Trevil soruşdu.

Üç yüz pistol.

Çox yaxşı, bu qədər pulla dünyanın o başına gedib çıxmaq olar. Gedin!

D'Artanyan cənab de Trevilə təzim etdi; o isə əlini ona uzatdı. D'Artanyan onun əlını hörmət və təşəkkür hissilə sıxdı. D'Artanyan Parisə gəldiyi gündən bəri bu mehrıban, nəcıb, sədaqətlı və alicənab adamı tərifləməkdən doymurdu.

Hər şeydən əvvəl d'Artanyan Aramisin yanına getdi. O, xanım Bonasyenın ardınca düşdüyü unudulmaz gecədən bəri onun yanına getməmişdi O vaxtdan bərı cavan muşketyoru heç görməmişdı də.

Aramis kədərli və dalğın idı. D'Artanyan onun bu qədər pəjmürdə olduğunun səbəbini soruşdu. Aramis bunu belə izah etdi kı, guya müqəddəs Avqustının əsərlərinin XVIII fəslinə latınca izahat yazmaq məcburıyyətındədır.

Dostlar söhbət etdikləri zaman Trevilin göndərdıyı qasid möhürlənmiş zərflərı gətirib gəldi.

Bu nədir? Aramis soruşdu.

Sizin xahiş etmək lütfündə olduğunuz məzuniyyət kağızlarıdır, qasid cavab verdi.

– Mənmi? Mən məzunıyyət istəməmişdım.

D'Artanyan dedi:

Susun, dinməyin və götürün. Alın, bu da sizin olsun, – o, qasidə yarım pistol pul verdi. - Bu da sizin zəhmət haqqınız. Cənab de Trevilə deyərsiniz ki, cənab Aramis ona ürəkdən təşəkkür edır. Gedin!

Məktubları gətirən adam təzim edıb getdı.

Bu nə deməkdir? – Aramıs soruşdu.

- Sizə iki həftəlik səyahət üçün nə lazımdırsa, götürün və ardımca gəlin.

Ancaq mən indi Parisə tərk edə bilmərəm, bir də kı, bilmirəm...

Aramis sözünü kəsib dayandı.

D'Artanyan soruşdu:



- Yəqin ki, o xanımın başına nə gəldiyini bilmirsiniz, eləmi?

Kimin? - Aramis soruşdu.

– Burada olan xanımın. Naxışlı yaylığı olan xanımın.

– Sizə kim demişdir ki, burada xanım olmuşdur? – Aramis rəngi ölü kimi ağarmış halda soruşdu.

- Mən onu görmüşəm.

Siz onun kım olduğunu bilirsinizmi?

– Mənə elə gəlır ki, təxminən, bilirəm

Aramis dedı:

Bura baxın, sızın nə çox şeydən xəbərınız var! Deyə bılməzsinizmi o xanım necə olmuşdur? Hara getmişdır?

– Elə güman edırəm ki, Tura qayıtmışdır.

– Turamı? Elədir. Siz haqlısınız, ancaq necə olub ki, mənə bircə kəlmə də söyləmədən Tura getmışdır?

Qorxub kı, onu tutarlar.

Bəs niyə mənə məktub yazmayıb?

- Çünki sizi əngələ salmaqdan çəkinmişdir.

D'Artanyan, sız həyatımı mənə qaytarırsınız! – Aramıs çığırdı Mən özümü unudulmuş, aldadılmış hesab edirdim. Onu o qədər görmək istəyirdım ki! İnana bilmirəm ki, mənim üçün öz azadlığını təhlükəyə qoymuş ola Onun Parisə qayıtmasının səbəbini duşünədüşünə başımı sındırırdım.

Bızı bu gün İngiltərəyə getməyə məcbur edən də həmin səbəbdir.

Bu nə deməkdir?

Bir zaman bilərsiniz, Aramis. Hələlik mən istəyirəm kı, bu əhvalat da ılahiyyat doktorunun bacısı qızının əhvalatı kimi gizli bir sırr olaraq qalsın.

Aramis gülümsündü. O bir axşam öz dostlarına danışdığı nağılı yadına saldı.

– Yaxşı! İndı ki, o, Parisdə yoxdur və siz buna əminsiniz, d'Artanyan, onda mənim Parisdə qalmağım üçün heç bir səbəb yoxdur, deməli ki, yola düşürük...

- Hələlik Atosun yanına gedək. Siz mənimlə getmək istəyirsınızsə, xahiş edirəm tələsəsiniz. Çünki xeyli vaxt itirmişik. Hə, bir də Bazeni xəbərdar edin...

Aramis soruşdu:

Bazen bızimlə gedirmi?

Ola bılər ki, getsin. Hər halda hələlik ona tapşırın kı, bizi Atosun evinə ötürsün.

Aramis Bazenı çağırdı və uzaq yola hazırlaşmağa başladı. Plaşını, qılıncını və üç tapança götürdü. Bir neçə qutunu alt-üst etdi ki, bəlkə oradan yaddan çıxıb qalmış bir pistol pul tapa. Ancaq bu axtarışların boşa çıxdığını gördükdən sonra d'Artanyanın ardınca getdı.

Aramis bu cavan qaskoniyalının onun evində qalmış qadının adını və başına gələnləri haradan bildiyini başa düşə bilmırdi.

Küçəyə çıxdıqda Aramis əlini d'Artanyanın çiynınə qoyub diqqətlə onun üzünə baxaraq soruşdu:

– Sız bu qadın barəsində kimsəyə bir söz deməyibsiniz ki?

– Əsla.

Hətta Atosa və Portosa da deməyibsiniz?

Bircə kəlmə də deməmişəm.

· Çox gözəl!

Bu barədə arxayın olduqdan sonra o, d'Artanyanın ardınca getdi və bir az sonra dostlar Atosun evinə çatdılar.

Atos bir əlində məzuniyyət kağızını, o biri əlində cənab de Trevilin məktubunu tutub durmuşdu.

Atos heyrətlə soruşdu:

– Bəlkə sız aldığım bu məzuniyyət vəsiqəsi və məktubun nə demək olduğunu mənə izah edəsiniz?

*"Əzizim Atos, sizin səhhətiniz müalicəyə möhtac olduğundan, arzu edərdım ki, bir iki həftə dincələsiniz. Forj sularına yaxud öz arzunuzla istədiyiniz bir yerə gedin və tezliklə sağalın.*

*Sizə sadiq olan Trevil".*

– Atos, bu məzuniyyətlə məktubun mənası budur ki, siz mənim dalımca gəlməlısiniz.

Hara, Forj sularına?

– Ora, ya da başqa bir yerə.

– Krala xidmət etmək üçünmü?

Krala və kraliçaya xidmət üçün. Məgər biz o əlahəzrətlərin xidmətçiləri deyilikmi?

Elə bu dəqiqədə Portos da içəri girdi və dedi:

– Lənət şeytana, bu nə qəribə işdir! Nə vaxtdan bəri muşketyorlara özləri xahiş etmədikləri halda məzuniyyət verməyə başlayıblar?



D'Artanyan dedi:

Onların xeyri üçün çalışan dostları olduqdan bəri...

Portos dedi:

– Aha! Görünür burada yeni bir iş var.

Aramıs dedi:

Elədir, biz yola düşürük.

Hara? Portos soruşdu.

Atos dedi:

Doğrusu mən də bilmirəm, bunu d'Artanyandan soruş.

D'Artanyan dedi:

Londona gedirik, dostlar!

– Londona! Portos çığırdı. Yaxşı, bəs orada nə edəcəyık?

– Bunu sizə söyləyə bilməyəcəyəm, cənablar. Siz gərək hər barədə mənə inanasınız.

Ancaq Londona getmək üçün pul lazımdır, mənim ısə pulum yoxdur.

Aramis dedi·

– Mənim də yoxdur.

Atos dedi:

Mənim də.

– Məndə pul var. D'Artanyan öz xəzinəsini cıbından çıxarıb mızın üstünə qoydu. Bu kısədə üç yüz pistol var. Bu Londona gedib qayıtmaq üçün kıfayət edər. Bir də ki, arxayın olun, biz hamımız gedib Londona çıxa bılməyəcəyık.

Niyə kı?

– Çünkı yəqin bizlərdən bəzısi yolda düşüb qalacaq.

Deməli, döyüş səfərinə çıxırıq, eləmi?

Özü də sızı xəbərdar edirəm kı, bu çox təhlükəli bir səfər olacaqdır.

Portos dedı:

Madam ki, canımızı təhlükəyə qoymaq ehtimalı var, heç olmasa bır bılək ki, bunu nə üçün edirik?

Atos soruşdu·

Bununla sənin vəziyyətın yüngülləşəcəkmi?

Aramis dedı:

Hər halda mən Portosun rəyinə şərikəm.

Məgər kral öz işləri barədə haqq-hesab verməyə adət etmişdırmı? Yox, o, sadəcə deyir ki, "Cənablar Qaskoniyada və Flandriyada

vuruşurlar. Buyurun, siz də vuruşun!" Siz də gedırsınız. Nıyə bu barədə əsla soruşmursunuz?

Atos dedi:

D'Artanyan haqlıdır. Budur, bu, cənab de Trevilin göndərdiyı üç məzuniyyət vərəqəsi, bu da kimin göndərdiyini bilmədiyim üç yüz pistol! Bizi ölümə göndərsələr də getməlıyik. Həyat onun barəsində bu qədər sorğu-sual etməyə dəyərmi? d'Artanyan, mən sənın ardınca getməyə hazıram!

Portos dedi:

Mən də hazıram!

Aramis dedi:

Mən də! Bir də kı, mən Parisdən getməyimə sevınırəm. Mənim əylənməyə ehtiyacım var.

Əyləncəmız çox olacaq, cənablar, bu barədə arxayın olun! – d'Artanyan onlara cavab verdi.

Atos soruşdu:

– Nə vaxt yola düşürük?

Elə bu saat, Aramis cavab verdi. Bircə dəqiqə də itirmək olmaz.

Ey, Qrımo, Planşe, Muşketon, Bazen! – dörd yoldaş hərə öz nökərini səslədi. – Bizim çəkmələrımizı təmizləyın və atlarımızı gətirin.

Hər bir muşketyor öz atını və nökərinin atını, adətən, baş muşketyorlar mənzilində saxlardı.

Planşe, Qrimo, Muşketon və Bazen tələsik atların dalınca getdilər.

Portos dedi:

İndi gəlin səfərin planını düzəldək. Bız buradan hansı tərəfə gedəcəyik?

D'Artanyan dedi:

Kaleyə. Bu, Londona getmək üçün ən qısa yoldur.

Elə isə mənım fikrimcə... – Portos sözə başladı

– Söylə görək.

– Birlikdə yola çıxan dörd adam şübhə oyada bılər. D'Artanyan bizim hər birimizə təlimat versin. Mən hamıdan qabaq Bulon yolu ilə gedib yolu yoxlayım. Məndən iki saat sonra Atos Amyen yolu ılə getsin. Bizdən sonra Aramis Nuayon yolu ilə getsin, d'Artanyan Planşenin paltarını geyinib istədiyi yol ilə getsin. Planşe ısə d'Artanyanın paltarını geyinib bizim ardımızca gəlsin.

Atos dedi:



- Cənablar, mənım fikrımcə, belə bır ışı nökərlərə etıbar etmək olmaz. Hətta bəzən əsilzadə də təsadüfən sirri aça bilər. Nökər ısə həmişə sirri açar.

Portosun planı xoşuma gəlmir, d'Artanyan cavab verdi. – Bilmirəm sizə nə cür təlimat verim. Mən bircə məktub aparıram, vəssalam. Bu məktubun üç surəti yoxdur və bu üç surəti çıxara bilmərəm; çünki məktub möhurlüdür. Deməlı, mənim fikrimcə, hamımız bir yerdə yola çıxmalıyıq. Məktub burada, bax, bu cibimdədir. Əgər məni öldürsələr, sizdən birinız bu məktubu götürüb yolunuza davam etməlisiniz. Onu da öldürsələr, üçüncü biriniz götürməlisiniz və beləliklə, yolunuza davam etməlisiniz. Hər necə olsa, birimiz gedib mənzıl başına çatmalıyıq. Bizdən tələb olunan şey yalnız budur.

Atos dedi:

Əhsən, d'Artanyan! Mən sənin fikrinlə, tamamilə, razıyam. Bir də ki, ışdə ardıcıl olmaq lazımdır. Mən sulara gedirəm, siz də məni ötürürsünüz. Forj suları əvəzinə dəniz sularına gedirəm. Bunu seçməkdə sərbəstəm. Bizi yolda saxlamaq istəsələr, mən cənab de Trevilin məktubunu, sız də öz məzuniyyət vəsıqələrinizi göstərərsiniz Bizə hücum etsələr, özümüzü müdafiə edərik. Bizi mühakimə etməli olsalar, öz sözümüzün üstündə möhkəm durub deyərik ki, bir neçə dəfə dənizdə çimməkdən başqa heç bir məqsədimiz yox idi. Dörd nəfəri ayrılıqda tələf etmək asandır. Amma dörd nəfər birlikdə bir dəstədır. Biz dörd nökərimızi də tapança və muşketlə sılahlandırarıq. Bızə qarşı ordu göndərmiş olsalar, müharibəyə başlarıq və d'Artanyanın söylədiyi kimi, kim sağ qalsa, aparıb məktubu yerinə çatdırar.

Çox gözəl sözdür! Aramis çığırdı. Sən çox danışan adam deyilsən, Atos, amma danışanda ağzından dürr-gövhər tökülür! Mən Atosun planını qəbul edirəm, sən necə, Portos?

– Mən də qəbul edirəm, Portos cavab verdi, bu şərtlə kı, bu planı d'Artanyan da bəyənmiş olsun. Məktubu d'Artanyana ınanıb vermişlər. Buna görə də bu səfərin başçısı o olmalıdır. Qoy qərarı o versin, biz isə onun əmrlərini yerinə yetirək.

D'Artanyan dedi:

Deməli, qərara aldıq: dördümüz da Atosun planını qəbul edib yarım saatdan sonra yola düşürük.

Razıyıq! Üç muşketyor bir səslə cavab verdi.

Sonra hər birı kisədən yetmiş beş pistol götürüb təyin edilmiş vaxtda yola düşmək üçün hazırlaşmağa başladı.

## XX

## SƏYAHƏT

Bizim macəra axtaran cavanlar gecə saat ikidə Sen-Deni darvazasından yola düşüb Parisdən çıxdılar. Nə qədər ki, qaranlıq idi, dostlar dınmırdilər, onlar qeyri ixtiyari qaranlıqdan qorxurdular. Onlara elə gəlirdi ki, hər tərəfdə pusqu qoyulmuşdur.

Günəşin ılk şüaları ilə bərabər dostların dilləri açıldı. Günəşlə birlıkdə onların qəlblərinə fərəh gəldi. Döyüş ərəfəsində olduğu kimi, ürəkləri şıddətlə döyünür, gözlən gülürdü. Hamısı hiss edirdi ki, bəlkə də vıdalaşmalı olduqları həyat, doğrudan, da pis şey deyildir.

Şantilyaya qədər yaxşı gəlib çıxdılar. Bura səhər saat səkkizdə yetişib qəlyanaltı etməyi qərara aldılar. Onlar, lövhəsində plaşının yarısını bır dilənçiyə verən müqəddəs Martinin şəklı çəkilmiş bir meyxananın qabağında atdan düşdülər. Nökərlərinə əmr etdilər ki, atların yəhərlərini açmayıb tezliklə yola düşməyə hazır olsunlar.

Dostlar ümumi otağa keçıb masanın arxasında oturdular.

Damerten yolu ilə yenicə gəlmiş bir əsilzadə də həmin masanın arxasında oturub qəlyanaltı edirdi. O, bunlarla hava barəsində söhbət etməyə başladı. Yolçular ona cavab verdılər. Əsilzadə onların sağlığına içdi Onlar da onun kimi etdilər.

Ancaq Muşketon gəlib atların yola hazır olduğunu söylədiyi və hamısı masa arxasından ayağa qalxdıqları dəqiqədə naməlum adam Portosa təklif etdi ki, onunla bərabər kardinalın sağlığına içsin. Portos cavab verdi ki, əgər, bu naməlum adam kralın sağlığına da içməyə razı olarsa, buna etirazı yoxdur. Naməlum adam çığırıb cavab verdi ki, o, kardinal həzrətlərindən başqa heç bir kral tanımır. Portos onu sərxoş adlandırdı. Naməlum adam qılıncını çəkdi.

Atos Portosa dedi:

Siz axmaq iş gordünüz, ancaq daha geri çəkilmək üçün gecdir. Bu adamı öldürüb çaparaq ardımızca gəlın.

Hər üçü ata minib bərk çapmağa başladı. Bu zaman Portos öz düşməninə deyirdı kı, qılınc oynatmaq sənətində məlum olan bütün üsullarla vurub onun sinəsini dəlməyə hazırdır.

- İçimizdən bıri əskildı. Atos beş yüz addım çapdıqdan sonra dilləndı.



Aramis soruşdu:

– Bəs niyə bu adam başqa birimızə deyil, elə Portosdan yapışdı?

– Çünki Portos hamımızdan bərk danışırdı və həmin adam onu bizım başçımız hesab etmişdir, d'Artanyan cavab verdi.

Mən həmişə deyirdim ki, bu qaskonıyalı ağıl dəryasıdır. – Atos mırıldandı

Bu sözlərdən sonra yolçular öz yollarına davam etdilər.

Onlar Bovda Portosu gözləmək və atlarını dincəltmək üçün iki saat dayandılar. Portos gəlib çıxmadı; ondan heç bir xəbər-ətər yox idi. Yolçular yollarına davam etdilər.

Bovdan bır mil aralı, yolun iki qaya arasında daraldığı bir yerdə onlar səkkiz və ya on nəfər adam gördülər. Yolun bu yerdə qazılmış olduğunu bəhanə edərək həmın adamlaı özlərini elə göstərirdilər ki, guya yolu düzəldirlər; onlar bir çala qazıb böyük bir cidd-cəhdlə palçıq hazırlayırdılar.

Aramis bu süni bataqlıqda çəkmələrinin bulaşmasından qorxaraq ucadan onlara çığırdı. Atos onu saxlamaq istədi. Ancaq daha iş-işdən keçmişdi. İşləyən adamlar yolçuları ələ salmağa başladılar. Öz həyasız istehzaları ilə onlar hətta soyuqqanlı Atosu da özündən çıxartdılar və o, atını onların birinin üstünə sürdü. Yolda işləyən bu adamlar yolun kənarındakı xəndəyə tərəf geri çəkilıb oradan muşketlərini götürdülər. Bızim yeddi yolçu, demək olar ki, atəş yağmuru içindən keçməli oldular. Güllə Aramısı çıynından yaraladı. Muşketonun isə, sağrısından bir az aşağı yumşaq yerindən dəydi. O, ağır yaralandığı üçün deyil, qorxusundan yerə yıxıldı. Muşketon öz yarasını görə bilmirdi. Ona görə də bu yara ona həqiqətdə olduğundan xeyli qorxulu gəlirdi.

Bu bizim üçün qurulmuş bir pusqudur! – deyə d'Artanyan çığırdı. – Dostlar, irəlı! Güllə atmayın

Yaralanmış Aramıs atının yalından yapışıb yoldaşlarının ardınca çapdı. Muşketonun atı da sahıbsız onlarla yanaşı çapmaqda ıdi.

Atos dedi:

Bu da bızım üçün ehtıyat at olsun.

– Mən istərdim kı, ehtiyat bir şlyapa olaydı, d'Artanyan cavab verdi. Güllə mənim şlyapamı apardı. Yaxşı ki, məktub onun içində deyildi.

Aramis dedi:

Axı, onlar yazıq Portosu buradan gəlıb keçdikdə öldürərlər.

Atos dedı:

– Əgər Portos ayaq üstə durmağa taqəti qalsaydı, o yəqın kı, çoxdan gəlıb bizə çatmışdı. Görünür o sərxoş özünü müdafiə edən zaman ayılmışdır.

Hərçənd atlar taqətdən düşmüşdülərsə də, dəstə dincəlmədən iki saat da çaparaq getdi.

Yolçular daha az əngələ rast gəlmək üçün kənar yollar ilə gedirdilər. Ancaq Krevkerə çatdıqda, Aramis bildirdi ki, o daha gedə bilmir. Doğrudan da, bu gözəl muşketyor buraya qədər gəlib çıxmaq üçün həddindən artıq dözüm göstərmişdi. Aramis hər dəqiqə huşunu itirirdi və onu atın üstündə tutub saxlamaq lazım gəlirdi. Meyxananın qabağında atdan düşmək üçün ona kömək etdilər. Döyüş zamanı kömək etməkdən artıq işə mane olan Bazeni onun yanında qoydular. Beləliklə, onlar əskilib dörd nəfər qaldılar və yollarına davam etdilər. Dostlar ümid edirdilər ki, gecəyə qədər Amyenə çatarlar.

Atos dedi:

– Əgər Kalenin özünə çatana qədər bircə dəfə də ağzımı açsam və ya qılıncımı çəksəm, şeytan mənə qənım olsun! Bu, lap böyük bir axmaqlıq olar! And içirəm.

Yaxşısı budur and içməyin, d'Artanyan cavab verdi. – Əgər atlarımızda taqət qalıbsa, gəlin çaparaq gedək.

Yolçular mahmızlarını atların böyürlərinə sıxdılar, beləliklə, atlara sankı yeni bir qüvvə gəlmiş oldu. Onlar gecəyarısı Amyenə çatıb "Qızıl Zanbaq" meyxanasına düşdülər. Meyxanaçı dunyada ən sədaqətli bir adam kimi göründü. Bır əlində şam, o biri əlində papağı qonaqları qəbul etdi. Yolçuların hərəsinə gözəl bir otaq təklif etdı. Ancaq təəssüf ki, bu otaqların hər biri evin uzaq guşəsində və bir-birindən xeyli aralı idi. D'Artanyan və Atos bundan imtina etdilər. Meyxana sahibı cavab verdi ki, ağalara layiq başqa bir otağı yoxdur. Ancaq yolçular dedilər ki, döşəmə üzərində yatsalar da, bır otaqda qalmaq istəyirlər. Meyxana sahibi təkid etdi. Yolçular öz sözlərinin üstündə durdular və axırda öz istədiklərinə nail oldular.

Onlar öz yataqlarını düzəldıb qapının dalını yenicə bərkitmişdilər ki, həyətdən pəncərəni döydülər. Kim olduğunu soruşdular və öz nökərlərinin səsini tanıyıb pəncərəni açdılar.

Doğrudan da Planşe ilə Qrimo idi.

Planşe dedi:



Atların keşiyini çəkmək üçün bircə Qrimo kifayətdir, ağalar, ıcazə versələr, mən qapının ağzında uzanaram. Beləliklə, onlar arxayın ola bilərlər ki, heç kim içəri girə bilməz.

- Bəs sən nəyin üstündə yatacaqsan? d'Artanyan soruşdu.

Budur mənim yatağım, Planşe cavab verdı və gətirdiyi bır qucaq otu göstərdı.

Sözün haqdır, gol, d'Artanyan cavab verdi. Meyxana sahibinin sır-sifəti mənim heç xoşuma gəlmir. Həddındən artıq mehribanlıq göstərir.

Mənim də xoşum gəlmir, Atos cavab verdı.

Planşe pəncərədən içəri gırib qapının ağzında uzandı. Qrimo isə tövləyə getdi ki, orada qapını içəridən bağlayıb yatsın O, ağalara söz vermişdi ki, səhər saat beşdə atlar hazır olacaq.

Gecə xeyli sakit keçdi. Doğrudur, saat ikiyə yaxın kım isə qapını açmaq istədi. Ancaq Planşe ayılıb: "Kımsən?" çığırdı; ona cavab verdilər ki, yanlış gəliblər və yenidən sakitlik çökdü.

Səhər saat dörddə tövlədə yaman hay-küy qopdu. Qrimo mehtərləri oyatmaq istəyib, onlar isə ayağa durub onu döyməyə başlayıblar. Pəncərəni açanda gördülər ki, yazıq nökər başı yarılmış, huşsuz yerə yıxılmışdır.

Planşe həyətə çıxıb atları yəhərləmək istədi. Ancaq gördü ki, atların ayaqlarında taqət qalmamışdır. Bırcə Muşketonun dünən beş-altı saat miniksiz çapmış olan atı yol gedə bilərdı. Ancaq anlaşılmaz bir yanlışlıq nətıcəsində mehtərlərin söylədiklərinə görə, meyxana sahibinin atından qan almağa çağırılmış baytar Muşketonun atından qan almışdı.

İşlər tamam korlanmışdı. Bütün bu fəlakətlər təsadüf nəticəsində ola bilərdi. Ancaq eyni zamanda bəlkə də burada pis bir niyyət vardı. Atos və d'Artanyan bayıra çıxdılar. Planşe getdı kı, yaxın bir yerdən üç at satın almaq mümkün olub-olmadığını öyrənsin. Qapının ağzında iki sağlam və qüvvətli yəhərli at vardı. Onlara da elə bu lazımdı. Planşe bu atların sahıblərinin harada olduqlarını soruşdu. Ona cavab verdilər ki, onlar gecəni bu meyxanada qalıblar və indı haqq-hesab etmək üçün meyxana sahibinin yanına gedıblər.

Atos haqq hesab etmək üçün aşağı düşdü. D'Artanyan ilə Planşe küçəyə çıxan qapının ağzında durdular. Meyxana sahibi uzaqda olan alçaq bir otaqda idi; Atosdan xahiş etdılər ki, onun yanına getsin.

Atos heç bir şeydən şübhələnməyib ora getdi və meyxana sahibinə vermək üçün cibindən iki pistol çıxartdı. Meyxana sahibi Atosun ona verdiyi pulu alıb əlində o üz-bu üzə çevirdi və birdən çığırmağa başladı ki, pullar qəlpdir və bu saat Atos ilə yoldaşını qəlp pul kəsən adamlar kimi həbs etdirəcəkdir.

– Heyvan! – deyə çığıraraq Atos onun üstünə yeridi. Bu saat sənin qulaqlarını dibindən kəsərəm.

Elə bu dəqiqədə başdan-ayağa silahlı dörd nəfər yan qapıdan içəri girib Atosun üzərinə atıldı.

Atos var səsilə bağırdı:

– Məni tutdular! Çap get, d'Artanyan! İrəli! İrəli! çığırıb iki tapançasını da birdən atdı.

D'Artanyan ilə Planşe bu təklifin təkrar edilməsini gözləmədilər. Onlar qapı ağzındakı atları açıb bellərinə sıçradılar və mahmızlayıb dördnala çapdılar.

Bilmirsənmi Atosun başına nə gəldi? d'Artanyan atı dördnala çapa-çapa Planşedən soruşdu

Ay ağa! Planşe cavab verdi. – Mən onun atdığı güllələrdən iki adamın yerə yıxıldığını gördüm və mənə elə gəldi ki, o, yerdə qalanlarla vuruşmağa başladı.

Əhsən, Atos! d'Artanyan deyindi. Bir işə bax ki, mən onu qoyub getməli oldum! Ancaq çox ola bilər ki, yolun elə birinci döngəsində bizim də başımıza həmin iş gəlsin. Çap, Planşe, sən qiyamət oğlansan!

Planşe cavab verdi:

Mən sizə söylədim ki, ağa, pikardıyalının qiymətini ancaq işdə bilmək olar, bir də ki, buralar mənim vətənimdir. Bu məni daha da coşdurur.

Onlar çapa-çapa gedərək, əsla dincəlmədən gəlib Sent-Omerə çatdılar. Orada ehtiyat üçün atların cilovlarını əllərindən buraxmayaraq, onlara bir qədər dinclik verdilər, özləri də elə küçədə ayaqüstü bir şey yeyib yenə yola düşdülər.

Kaleyə yüz addım qalmış d'Artanyanın atı yıxıldı; nə qədər çalışdılarsa, onu ayağa qaldırmaq mümkün olmadı Atın burun pərələrindən qan gəlirdi. Bircə Planşenin atı qalırdı. Ancaq daha o da yol getmək istəmirdi. Xoşbəxtlikdən, söylədiyimiz kimi, yolçular artıq şəhərdən uzaqda deyildilər. Onlar atları yolun ortasında qoyub kör-



püyə sarı yüyürdülər. Planşe d'Artanyanın diqqətini onlardan əlli addıma qədər irəlidə gedən bir əsilzadəyə cəlb etdi Görünür, öz nökərilə birlikdə yenicə gəlmişdi. Yaman qayğılı görünürdü. Çəkmələri toz içində idi. İngiltərəyə keçmək mümkün olub olmadığını soruşurdu.

Yola çıxmağa hazır olan bir geminin sahibi ona cavab verdi:

Bu çox sadə və asan bir şey idi. Ancaq bu səhər əmr gəlib ki, cənab kardinalın icazəsi olmadan heç kəsi buraxmasınlar.

Mənim icazənaməm var, deyə əsilzadə cibindən bir kağız çıxartdı. – Budur.

Gəmiçi dedi:

Aparın körpü rəisi təsdiq etsin, onda sizi apararam.

Körpü rəisi haradadır?

Öz bağında

– Bəs onun bağı haradadır?

– Şəhərdən dörddə bir mil kənarda. Odur ha, baxın, buradan o təpənin döşündəki kirəmitli damı görürsünüzmü?

Hə, gördüm. Bu saat qayıdaram, deyə əsilzadə cavab verdi.

Bu sözlərdən sonra o nökəri ilə birlikdə körpü rəisinin yanına getdi. D'Artanyan ilə Planşe də beş yüz addım aralı onların dalınca getdilər.

Şəhərdən çıxdıqdan sonra d'Artanyan addımlarını sürətləndirib, kiçik bir meşənin talasında həmin əsilzadəyə çatıb dedi:

Möhtərəm cənab, siz gərək ki, tələsirsiniz?

– Çox tələsirəm, möhtərəm cənab.

Çox təəssüf, çox təəssuf ki, – d'Artanyan davam etdi, - mən də tələsirəm və istərdim xahiş edəm ki, mənə bir yaxşılıq edəsiniz.

Nə cür yaxşılıq?

İcazə verin, əvvəlcə mən gedim.

Bu mümkün deyildir, naməlum adam cavab verdi. Mən qırx dörd saata altmış mil yol gəlmişəm və sabah günorta üçün Londonda olmalıyam.

Mən isə həmin yolu qırx saata gəlmişəm və sabah saat onda Londonda olmalıyam.

Təəssüf edirəm. Ancaq mən birinci gəlmişəm və ikinci getmək istəmirəm.

Mən də təəssüf edirəm, ancaq mən ikinci gəlsəm də, birinci gedəcəyəm.

Əsilzadə dedi.

Mən kralın əmrilə gəlmişəm.

Mən isə öz kefimlə gəlmişəm! – d'Artanyan cavab verdi.

Ancaq mənə elə gəlir ki, siz vuruşmağa bəhanə axtarırsınız?

Bəs nə bilirdiniz?

– Nə istəyirsiniz?

– Mənə sizdə olan icazənamə lazımdır; çünki mənim icazənaməm yoxdur.

Yəqin ki, siz zarafat edirsiniz.

- Mənim heç zarafatla aram yoxdur.

– Məndən əl çəkin.

Əl çəkmirəm!

Əziz cavan! Bu saat sizin beyninizi tökərəm. Hey, Lüben, tapançalarımı ver!

Planşe, d'Artanyan çığırdı. Sən nökərilə məşğul ol, ağa mənim boynuma.

Planşe çox düşünmədən Lübenin üstünə atıldı, onu yerə yıxıb dizini sinəsinin üstünə basdı və dedi:

Ağa, siz öz işinizlə məşğul olun. Mən işimi gördüm.

Əsilzadə bunu görüb qılıncını çəkdi və d'Artanyanın üzərinə atıldı. Ancaq qarşısındakı məharətli bir döyüşçü idi. Üç saniyənin içində d'Artanyan bu sözləri deyə deyə ona üç zərbə vurdu: "Bu Atos üçün, bu Portos üçün, bu da Aramis üçün!"

Üçüncü zərbədən sonra əsilzadə kötük kimi yerə sərildi.

D'Artanyan bu qərara gəldi ki, o ya ölmüşdür, ya da heç olmazsa huşunu itirmişdir. Əyilib icazənəmi götürmək istədi. Ancaq əlini uzadıb yaralını axtarmaq istədikdə, o, əlində tutduğu qılıncını qaldırıb birdən d'Artanyanın sinəsinə bir zərbə vurdu və dedi:

– Bu da sizin üçün!

– Bu da özüm üçün! Qızmış d'Artanyan düşmənini dördüncü zərbə ilə yerə mıxladı. Bu dəfə artıq əsilzadə gözlərini yumub huşunu itirdi.

D'Artanyan icazənaməni onun cibindən çıxartdı. Bu vəsiqə qraf de Vardın adına yazılmışdı. Sonra d'Artanyan o gözəl cavana bir nəzər saldı. Onun ancaq iyirmi beş yaşı olardı. D'Artanyan taleyin cilvəsini düşünüb köksünü ötürdü. Çox zaman insanlar tamamilə yad adamların xatirinə bir-birini tələf etməyə məcbur olurlar.

Ancaq bir az sonra var səsilə bağırıb imdada çağıran Lübenin çığırtısına bu düşüncələrdən ayrılmalı oldu.



Planşe onun boğazından yapışıb dedi:

– Ağa, nə qədər ki, mən onu belə tutmuşam, arxayınam ki, səsi çıxmayacaq, ancaq boğazını əlimdən buraxan kimi yenə bağırmağa başlayacaq. Bu adam normandiyalıdır. Normandiyalılar isə yaman tərs olurlar.

- Dayan, d'Artanyan cibindən bir yaylıq çıxarıb Lübenin ağzına tıxadı.

Planşe dedi:

- İndi gəlin onu ağaca sarıyaq.

Bunu da etdilər. Sonra onlar qraf de Vardı da gətirib Lübenin yanına qoydular. Hava qaralırdı. Məlumdur ki, bu əli-qolu bağlanmış və ağır yaralanmış adamlar səhərə qədər meşədə qalacaqdılar.

D'Artanyan dedi:

İndi isə körpü rəisinin yanına gedək.

Planşe soruşdu:

Ancaq deyəsən siz yaralısınız?

- Elə şey deyil. Əsas iş ilə məşğul olaq. Sonra mənim yaram barəsində də düşünərik. Güman edirəm ki, elə qorxulu yara deyil.

Bu sözlərdən sonra onlar sürətli addımlarla möhtərəm mənsəb sahibinin bağına sarı getdilər.

Qapı qulluqçusu körpü rəisinə xəbər verdi ki, qraf de Vard gəlmişdir və d'Artanyanı o saat içəri apardılar.

Körpü rəisi soruşdu:

Sizdə kardinalın imza etdiyi icazənamə varmı?

- Bəli, cənab, – d'Artanyan cavab verdi, budur.

- Hər şey öz yerindədir, körpü rəisi cavab verdi. Kardinal həzrətləri buyururlar ki, sizə hər cür kömək edək.

Əlbəttə, d'Artanyan cavab verdi. – Mən onun tapşırığı ilə gedirəm.

– Deyəsən kardinal həzrətləri kiminsə İngiltərəyə keçməsinə mane olmaq istəyir?

- Bəli, o adam d'Artanyan adlı bir Bearn əsilzadəsidir. Dünən üç dostu ilə birlikdə Londona getmək qəsdilə Parisdən çıxmışdır.

– Siz şəxsən onu tanıyırsınızmı? – rəis soruşdu.

– Kimi?

- D'Artanyanı.

- Bəli.

Elə isə onun əlamətlərini mənə təsvir edin.
Bundan asan nə var ki?
Bu sözləri deyib d'Artanyan qraf de Vardın əlamətlərini eynən təsvir etdi.
Rəis soruşdu:
Onun yanında bir adam vardımı?
Bəli, Lüben adında bir nökəri var.
Onların dalınca göz qoyduracağam. Əgər rast gəlmiş olsalar, kardinal həzrətləri arxayın olsun, onları möhkəm nəzarət altında düz Parisə aparacaqlar.
Əgər siz bunu etmiş olsanız, cənab rəis, kardinal sizdən çox razı qalmış olar.
Siz qayıtdıqdan sonra onu görəcəksinizmi, qraf?
Əlbəttə.
Xahiş edirəm ona söyləyəsiniz ki, mən onun ən sadiq quluyam.
Yəqin söylərəm.
Körpü rəisi icazənaməni təsdiq edib d'Artanyana verdi.
D'Artanyan daha vaxtını itirmədi. Baş əyib təşəkkür etdi və çıxdı.
D'Artanyan ilə Planşe körpü rəisinin yanından çıxdıqdan sonra yüyürə-yüyürə meşənin kənarından keçib başqa bir qapıdan şəhərə girdilər.
Gəmi yola çıxmağa hazır vəziyyətdə durmuşdu. Gəmiçi sahildə gözləyirdi.
O, d'Artanyanı gördükdə soruşdu:
– Hə, necə oldu?
D'Artanyan dedi:
– Budur, mənim icazənaməm. Təsdiq edilmişdir.
Bəs o cənab necə oldu?
O, bu gün getmir, d'Artanyan cavab verdi. Ancaq siz arxayın olun, mən ikimizin də yol kirəsini verərəm.
Gəmiçi dedi:
– Elə isə gedək.
Gedək, d'Artanyan təkrar etdi.
O, Planşe ilə birlikdə atılıb qayığa mindi. Beş dəqiqədən sonra onlar artıq gəminin göyərtəsində idilər.
Gəmi vaxtında yola düşmüşdü. Yarım mil qədər getdikdən sonra d'Artanyan limanın bağlandığını xəbər verən top səsini eşitdi.



İndi artıq yaranı yada salmaq vaxtı çatmışdı. D'Artanyanın təxmin etdiyi kimi, xoşbəxtlikdən yara çox təhlükəli deyildi. Qılıncın ucu qabırğaya toxunub sümüyün üzərilə sürüşmüşdü. Bir də, köynək yaraya yapışmışdı. Belə ki, cavan oğlanın cəmi bir neçə damcı qanı axmışdı.
D'Artanyan çox yorulmuşdu. Planşe onun üçün göyərtəyə bir döşək gətirdi. Cavan qvardiyaçı uzanıb o saat yuxuya getdi.
Səhər şəfəq sökərkən gəmi İngiltərə sahillərindən vur-tut üç-dörd mil aralı idi.
Saat doqquzda gəmiçi Duvr limanında lövbər saldı.
Saat on birin yarısında d'Artanyan İngiltərə sahilinə çıxıb çığırdı:
- Axır ki, gəlib çatdım!
Ancaq bununla iş bitmirdi. Hələ Londona getmək lazım idi. Xoşbəxtlikdən İngiltərədə poçt çox yaxşı işləyirdi. D'Artanyan və Planşe hərəsi bir at kirə etdi. Poçtalyon irəlidə çapırdı. Saat dörddə onlar London darvazasına çatdılar.
D'Artanyan Londona bələd deyildi. İngiliscə bilmirdi. Ancaq hersoqun adına bir kağız yazdı və ona o saat lazım olan yolu göstərdilər.
Hersoq kral ilə birlikdə Vindzora ova getmişdi. D'Artanyan hersoqun inanılmış yavərinə müraciət etdi. O, həmişə hersoqla bərabər səyahət etdiyindən, fransızca çox gözəl danışırdı. D'Artanyan yavərə söylədi ki, çox mühüm bir iş üçün Parisdən gəlmişdir və bu dəqiqə hersoqu görməlidir.
D'Artanyan elə bir inam ilə danışırdı ki, Patriki (yavərin adı belə idi) o saat inandırdı. O əmr etdi iki at yəhərləsinlər və özü cavan qvardiyaçını ötürməyi öhdəsinə götürdü. Planşe Londonda qaldı. O yazığı atdan zorla düşürdülər. D'Artanyanın isə bədəni sanki dəmirdəndi.
Patrik ilə d'Artanyan Vindzora çatdıqda, məlum oldu ki, kral ilə hersoq qızılquşlarla ova çıxıblar və qəsrdən iki-üç mil aralı olan bataqlıqda ov edirlər.
Atlılar iyirmi dəqiqə içində gedib həmin yerə çatdılar. Bir azdan Patrik öz ağasının qızılquşu çağıran səsini eşitdi.
Patrik soruşdu:
- Hersoqa sizin barənizdə nə məlumat verim?
- Söyləyin ki, bir dəfə axşamüstü onunla "Samarityanka" önündə yeni körpü üzərində dalaşan cavandır.
– Bu qəribə məlumatdır.

Görərsiniz ki, bu məlumat hər bir başqa məlumatdan yaxşıdır.

Patrik atını çapıb hersoqa çatdı və d'Artanyanın xahiş etdiyi ifadə ilə ona məlumat verdi.

Hersoq o saat başa düşdü ki, gələn adam kimdir və Parisdə bir fəlakət baş verdiyini zənn edib qorxuya düşdü. Uzaqdan d'Artanyanın qvardiyaçı paltarını görüb, düz cavan qaskoniyalının yanına çapdı. Patrik təvazökarlıqdan atını kənara sürdü.

Kraliçanın başına bir fəlakət gəlməyib ki? – Bekinhem hersoqu həyəcanla soruşdu.

Xeyr, elə güman edirəm ki, onu böyük bir təhlükə gözləyir. Bu təhlükədən onu yalnız cənabınız qurtara bilər, deyə d'Artanyan cavab verdi Buyurun, məktubu alın.

– Məktubdurmu? Kimdəndir?

– Elə güman edirəm ki, ülyahəzrət kraliçadandır.

Ülyahəzrət kraliçadanmı? – Bekinhem hersoqu elə ağardı ki, d'Artanyan onun bu saat huşunu itirəcəyini güman etdi. Hersoq məktubun möhürünü qopartdı.

– Bəs bu dəlik nədir? hersoq məktubun üzərində dəlinmiş bir yeri göstərərək d'Artanyandan soruşdu.

Ax, d'Artanyan cavab verdi. – Mən bunu görməmişdim. Bunu yəqin qraf de Vardın qılıncı mənim köksümü dəldiyi zaman dəlmişdir.

Siz yaralanıbsınızmı? hersoq soruşdu.

Elə şey deyil! d'Artanyan cavab verdi. – Bir balaca sınəmi cızıbdır.

– Aman, ey adil Allah! Burada nələr yazılmışdır! hersoq çığırdı. – Patrik, sən burada qal. Yox, yaxşısı budur harada olursa olsun, kralı tap və əlahəzrətə söylə ki, mən böyük bir hörmətlə yalvarıb üzr istəyirəm. Çox mühüm bir iş üçün Londona qayıtmalıyam. Gedək, cənab, gedək!

Bu sözlərdən sonra onlar atlarını dördnala çapdılar.



## XXI

## QRAFİNYA VİNTER

Yol gedə-gedə hersoq d'Artanyandan xahiş etdi ki, baş verən bütün əhvalatı ona danışsın. Bu cavandan eşidəcəyi sözlərlə öz xatirələrini tutuşdurub, hersoq baş verən hadisələr haqqında özü üçün xeyli dürüst bir təsəvvür yarada bilərdi. Ancaq hersoqu hər şeydən artıq bir şey təəccübləndirirdi: necə olmuşdu ki, cavan oğlanın İngiltərəyə gəlməsinə mane olmaq üçün əlində bu qədər mühüm səbəblər olduğu halda, kardinal onu yolda saxlamamışdı? Bu zaman d'Artanyan hersoqun heyrət içində olduğunu görüb, nə qədər ehtiyat tədbirləri gördüklərini və öz dostlarının fədakarlığı sayəsində canını yalnız kraliçanın məktubunu dəlmiş olan bir qılınc zərbəsilə qurtarıb bura gəldiyini danışdı. Böyük bir sadəliklə nağıl edilmiş bu əhvalatı dinlərkən, hersoq heyrətlə cavan oğlana nəzər yetirdi. O, başa düşə bilmirdi ki, belə cavan bir qəlbdə bu qədər ehtiyatkarlıq, mərdlik və fədakarlıq necə yerləşə bilmişdir.

Atlar yel kimi uçurdu və bir neçə dəqiqədən sonra atlılar London darvazasına yetişdilər. D'Artanyan güman edirdi ki, şəhərin içində hersoq atını yavaş sürəcəkdir. Ancaq o səhv etmişdi. Hersoq rast gəldiyi adamları vurub yıxdığına əsla əhəmiyyət vermədən atını çox bərk çapırdı. Yolda ona rast gəlmək bədbəxtliyinə düçar olmuş adamların başına nə gəldiyini görmək üçün bircə dəfə də olsun üzünü döndərib baxmırdı. D'Artanyan da atını hersoqun ardınca çapırdı. Onların ardınca lənət və qarğışa bənzər səs-küy eşidilirdi.

Bekinhem hersoqu öz evinin həyətinə girdikdə, atdan sıçrayıb cilovu buraxdı və tələsik artırmaya sarı yönəldi. D'Artanyan da onun kimi etdi. Mətbəxdən və tövlədən atlara sarı bir neçə mehtər yüyürüb gəldi.

Hersoq elə sürətlə yeriyirdi ki, d'Artanyan ona zorla çatırdı. Onlar bir neçə salonun içindən keçib getdilər. Bu salonlar o qədər nəfis döşənib bəzənmişdi ki, Fransanın ən məşhur əyanları bu barədə heç bir təsəvvürə də malik deyildilər. Nəhayət, onlar yataq otağına çatdılar. Bu otaq zövq və dəbdəbənin ecazı idi. Hersoq boynundan asılmış kiçik qızıl açarla divara çəkilmiş kağızların arasındakı gizli qapını açdı. D'Artanyan təvazökarlıqdan arxa tərəfdə dayandı. Ancaq hersoq astanadan içəri girdikdə geri dönüb cavan oğlanın tərəddüd etdiyini görərək ona dedi:

İçəri girin və əgər siz ülyahəzrət kraliça ılə görüşmək şərəfinə nail olsanız, burada gördüklərinizi ona danışarsınız.

Bu dəvətdən ürəklənmiş d'Artanyan hersoqun ardınca getdı

Onlar divarlarına İran ıpəkləri və zərli naxışlar çəkilmiş, şamlarla işıqlanmış kiçik bır ibadət otağına daxil oldular. Mehraba bənzər kiçik bir guşədə üzərinə qırmızı və ağ lələklər taxılmış göy məxmər bir pərdənin altında avstriyalı Annanın bütün boyu bərabəri bir şəkli asılmışdı. Şəkıl əslınə o qədər bənzəyirdi k, d'Artanyan heyrətdən çığırdı. Elə güman etmək olardı ki, kraliça bu saat danışacaq. Mehrabda şəklin altında, içərisində brilyant boyunbağı olan mücrü qoyulmuşdu.

Hersoq mehraba yaxınlaşıb diz çökdü və qutunu açdı. O, üzərinə başdan-başa parıldayan brilyantlar düzülmüş göy şəriddən düzəlmiş enli bantı qutudan çıxarıb d'Artanyana dedı:

Alın, alın! Bu həmin qiymətli boyunbağıdır ki, bunu özümlə bərabər qəbrə aparmağa and içmişdim. Bunu mənə kraliça vermişdi, indi də özü geri tələb edir. Qoy onun arzusu yerinə yetsin.

Sonra o, boyunbağının brılyantlarını bir bir öpməyə başladı, birdən dəhşətlə çığırdı.

Nə oldu ki? . d'Artanyan nigarançılıqla soruşdu. Sızə nə oldu, milord?

– Hər şey məhv oldu! – Hersoq ölü kimi saraldı. – Silsilənin iki brilyantı əskikdir. Ancaq onu qalmışdır.

Onları itiribsiniz, yoxsa güman edirsiniz ki, onları sizdən oğurlayıblar?

Onları oğurlayıblar və bu kardınalın işidir. Budur, baxın, onların asıldığı şəridləri qayçı ilə kəsiblər.

Əgər kim oğurladığını bilmiş olsaydınız... Bəlkə onlar hələ də oğurlayanın əlindədir?

Dayanın, dayanın! – hersoq çığırdı. Mən bu silsiləni yalnız bircə dəfə bir həftə bundan əvvəl kralın Vindzorda tərtib etdıyi balda taxmışdım. Çoxdan bəri küsülü olduğum qrafinya Vinter həmin balda mənə yanaşmışdı. İndi başa düşürəm ki, bu barışıq qısqanc bir qadının intiqamı imış. O vaxtdan bəri qrafinyanı görməmişəm. Bu qadın kardınalın agentıdir.

– Deməli, onun hər yerdə agentlərı varmış! d'Artanyan çığırdı.

– Əlbəttə, əlbəttə! hersoq qəzəbdən dişlərini bır-bırınə sıxaraq cavab verdi. O, çox qorxunc bir rəqibdir. Bal ayın neçəsinə təyin edılmişdir?



– Gələcək bazar ertəsi gününə.

– Gələcək bazar ertəsi! Hələ beş gün var. Bu vaxt gen-bol çatar. Patrik! Hersoq ibadət otağının qapısını açıb çığırdı: – Patrik!

Yavər ıçəri girdi

Zərgər ılə katıbı bura çağır.

Zərgər əvvəl çağırıldığına baxmayaraq birinci katib gəldi. Bu təəccüblü deyıldi; çünki katib hersoqun evində olurdu. O gələndə Bekınhem hersoqu otağında mizin arxasında oturub öz əlı ilə nə isə bir sərəncam yazırdı.

Cənab Cekson! – o katibinə müraciət etdi. – Siz bu saat lord-kanslerin yanına gedib ona söyləyin ki, bu əmrin yerinə yetirilməsı məsulıyyətini ona həvalə edirəm. Əmr bu saat elan edilməlidir.

Əgər lord-kansler soruşsa ki, cənabınız bu fövqəladə tədbirlərı nə üçün görür, ona nə cavab verim?

Ona söylərsinız ki, mənim kefim belə isteyir və öz işlərim barədə haqq-hesab verməyə öyrənməmişəm.

– Lord-kansler bu cavabı əlahəzrətə də söyləməlidirmi? Zira əlahəzrət Böyuk Britaniya limanlarından nə səbəbə bircə gəminin də çıxa bılməməsilə maraqlana bilər.

Siz haqlısınız. – Hersoq cavab verdi. - O halda qoy kansler krala söyləsın ki, müharibə etmək qərarına gəlmişəm və bu tədbir Fransaya qarşı ilk düşmənçilık hərəkətidir.

Katıb təzım edib çıxdı.

Bu surətdə biz bir cəhətdən arxayın ola bilərik, hersoq d'Artanyana müraciət etdi. Əgər kəsilmiş brilyantlar hələ Fransaya göndərilməyibsə, onlar yalnız sizdən sonra gedib çıxa bilər.

Nə sayaq?

Mən bu dəqiqə əlahəzrət kralın limanlarında olan bütün gəmilərin dənizə çıxmasını qadağan etdim və xüsusi icazə olmadan heç bir gəmi lövbərini qaldıra bilməz.

D'Artanyan kralın etimadı ilə bu adama verilmiş hədsiz hakimiyyətdən öz eşqi üçün istifadə edən hersoqa heyrətlə baxırdı. Hersoq cavanın üzündəkı ifadədən onun fikrini başa düşüb gülümsündü və dedi:

Bəli. Bəlı! Mənim əsl kraliçam avstriyalı Annadır. O, bircə kəlmə söyləmiş olsa, mən öz vətənimə, öz kralıma, öz Allahıma da xəyanət edərəm. O, Laroşel protestantlarına vəd etdiyim köməyı göndərməməyı xahiş etdi, mən də onun xahişini yerinə yetirdim. Mən öz

əhdimi pozdum, ancaq təki onun arzusu yerinə yetsin. Söyləyin, ona etdiyim bu itaət üçün layiqilə mükafatlanmamışammı? Bu portreti mənə bu itaətim üçün hədiyyə etmişdir.

D'Artanyan heyranlıqla düşündü ki, bəzən bütün bir xalqın müqəddəratı nə qədər incə və gözəgörünməz tellərdən asılmış olur.

Zərgər içəri girdiyi zaman o, hələ fikirli idi. Zərgər öz sənətində xeyli mahir bir irlandiyalı idi. Özü etiraf edirdi ki, hersoqun ona verdiyi sifarişlərdən ildə yüz min livr qazanır.

Hersoq ibadət otağına girərək zərgərə müraciətlə dedi:

Cənab O'Reyli, bu brilyant boyunbağıya baxın və mənə söyləyin görüm, onun hər pərəyi neçəyə dəyər?

Zərgər boyunbağının zərif haşiyələrinə ötəri bir nəzər salıb brilyantların orta qiymətini təyin etdi və tərəddüdsüz cavab verdi:

Hər biri min beş yüz pistola, milord.

– Bu brilyantlardan ikisini neçə günə qayırmaq olar? Görürsünüz ki, burada iki brilyant əskikdir.

Səkkiz günə, milord.

– Mən hər brilyant üçün üç min pistol verirəm. Onlar sabah yox, biri gün mənə lazımdır.

Hazır olar, milord.

Siz çox qiymətli bir adamsınız, cənab O'Reyli. Ancaq bununla iş bitmir. Heç kəsə etibar etmək olmaz. Onlar burada sarayın içində qayırılmalıdır.

Mümkün deyildir, milord. Onları yalnız mən qayıra bilərəm. Özü də elə qayıraram ki, köhnələrlə yenilərini bir-birindən əsla seçmək olmaz.

Deməli, əzizim cənab O'Reyli, siz mənim dustağımsınız. İndi əgər mənim evimdən çıxmaq istəsəniz də, bacarmazsınız. Sizə lazım olan əlaltılarınızın adlarını mənə söyləyin və hansı alətləri gətirmək lazım gəldiyini göstərin.

Zərgər hersoqu tanıyırdı. Bilirdi ki, heç bir etirazın faydası olmayacaqdır. Buna görə də öz taleyinə tabe oldu.

Mən bu barədə arvadıma xəbər göndərə bilərəmmi? – zərgər soruşdu.

Hətta istəsəniz onunla görüşə də bilərsiniz, cənab O'Reyli. Arxayın olun, bu əsarət sizin üçün əzablı olmayacaqdır. Ancaq hər bir



narahatlığın müqabilində mükafat verilməlidir. Brilyantlar üçün verəcəyim puldan əlavə, buyurun, bu da min pistolluq bir çek.

D'Artanyan insanlar və milyonlarla bu qədər sərbəst rəftar edən bu naziri görüb, duyduğu heyrətdən özünə gələ bilmirdi. Zərgər arvadına bir məktub yazıb min pistolluq çeki göndərməklə bərabər, xahiş etdi ki, bunun əvəzində ən yaxşı əlaltılarından birini, filan qədər brilyant və lazım olan alətləri ona göndərilsin.

Hersoq zərgəri onun üçün ayrılmış otağa ötürdü. Bu otaq yarım saatın içində zərgər emalatxanasına çevrildi. Sonra o, hər qapının ağzına bir növbətçi qoyub əmr etdi ki, öz yavəri Patrikdən başqa zərgərin yanına heç bir kəsi buraxmasınlar Demək artıqdır ki, zərgər O'Reyliyə və onun köməkçisinə nə bəhanə ilə olursa-olsun, kənara çıxmaq bərk qadağan edildi.

Hersoq bütün bu əmrləri verdikdən sonra d'Artanyanın yanına qayıtdı və dedi:

Cavan dostum, indi İngiltərə bizim ikimizin ixtiyarındadır. Sizə nə lazımsa, istəyin!

D'Artanyan cavab verdi:

– Yatmaq. Etiraf edirəm ki, bu, mənim üçün hər şeydən vacibdir.

Hersoq əmr verdi ki, d'Artanyanı öz otağının yanındakı otağa aparsınlar. Bu cavan oğlanın öz yaxınlığında olmasını istəyirdi ki, onunla həmişə kraliçadan söhbət edə bilsin.

Bir saat sonra Londonda limanlardan Fransaya heç bir gəminin buraxılmaması barəsində əmrnamə elan edildi. Hətta poçt aparan paketbot da dayandırılmışdı. Bu iki krallıq arasında müharibə elan etmək deməkdi.

Üçüncü gün səhər saat on birdə hər iki brilyant pərək artıq hazır idi. Hersoq özü də bu təzə brilyantları köhnələrdən seçə bilmirdi. Hersoq o saat d'Artanyanı çağırmalarını əmr etdi və ona dedi:

Ardınca gəldiyiniz brilyant boyunbağı budur. Siz şahid olun ki, insan iqtidarı daxilində nə mümkünsə, hamısını etdim.

– Milord, mən bütün gördüklərimi nağıl edərəm. Ancaq, cənab, boyunbağını mənə mücrüsüzmü verirsiniz?

– Mücrü sizə mane olar, bir də ki, mənə mücrüdən başqa heç bir şey qalmır. Söyləyərsiniz ki, mücrünü özüm üçün saxladım.

– Əmrlərinizi eynən yerinə yetirərəm, milord.

Hersoq cavan oğlana diqqətlə bir nəzər salıb dedi:

İndi isə mən sizin xəcalətinizdən nə cür çıxım?

D'Artanyan qıpqırmızı qızardı. Gördü ki, hersoq ona bir şey bağışlamaq üçün bəhanə axtarır, öz yoldaşlarının və özünün qanı bahasına ona ingilis qızılı vermək istədiklərini düşündü və bu onda dərin bir nifrət oyatdı.

- Milord, gəlin hər bir şeyi indi müzakirə edək ki, sonra aramızda ixtilaf olmasın. Mən Fransa kralı və kraliçanın xidmətindəyəm. Özüm də cənab Dezessarın qvardiya bölüyündə xidmət edirəm. Həm bu cənab, həm də onun qohumu cənab de Trevil əlahəzrətlərə son dərəcə sadiq adamlardır. Deməli ki, mən əlimdən gələn bütün işləri yalnız kraliça üçün etmişəm. Mən cənabınız üçün heç bir şey etməmişəm. Əlavə, əgər sizin ürəyinizin sultanı hesab etdiyiniz kraliça kimi mənim də ürəyimin sultanı olan bir xanım bunu tələb etməsəydi, bəlkə də mən heç bir şey etməzdim.

Hersoq gülümsəyərək dedi:

Bəli, deyəsən, mən bu xanımı tanıyıram. O xanım...

Milord, mən o xanımın adını çəkmədim, – cavan tez onun sözünü kəsdi.

Hersoq dedi:

– Siz haqlısınız. Deməli, sizin fədakarlığınız üçün mən həmin xanıma borcluyam?

Bəli, milord. Təkrar edirəm ki, cənabınız mənə bu ikinci görüş zamanı etdiyi işlər üçün də, birinci görüş zamanı etdiyi işlər üçün olduğu kimi, çox az təşəkkür edə bilər.

D'Artanyan hersoqa təzim edib getmək istədi.

Necə, siz gedirsinizmi? Ancaq hara? Siz necə gedə bilərsiniz?

Doğrudur, mən hələ bu məsələni həll etməmişəm.

Lənət şeytana! Fransızların heç bir şey veclərinə deyil!

Mən unutmuşdum ki, İngiltərə bir adadır və siz buranın kralısınız.

Limana gedin, "Zund" gəmisini axtarın, bu məktubu gəminin kapitanına verin, o sizi aparıb elə kiçik limana çıxardar ki, ora yalnız balıqçı qayıqları yan alır və sizin ora gələcəyinizi heç kim güman etməz.

Bu limanın adı nədir?

Sen-Valeri.. Ancaq iş bununla qurtarmır. Ora çatdıqda, adsız və lövhəsiz, əsl dənizçi meyxanası olan çox pis bir meyxanaya gedərsiniz. Yanılmayacaqsınız; çünki orada yalnız bircə meyxana var.

Sonra?



– Meyxana sahibini tapıb ona deyərsiniz: "Forward".

Bu nə deməkdir?

"İrəli". Bu paroldur. Meyxana sahibi sizə yəhərlənmiş bir at verib yolu göstərəcəkdir. Yolda dörd mənzilə rast gələcəksiniz. İstəsəniz onlardan hər birində öz Paris ünvanınızı qoyarsınız. Ora sizin üçün dörd at göndəriləcəkdir. Bunlardan ikisini siz görübsünüz və gərək ki, bəyənibsiniz. Bunlar bizim minib gəldiyimiz atlardır. İnanın ki, o biri atlar bunlardan heç də pis deyil. Bu dörd at səfərə hazırdır. Siz nə qədər qürurlu olsanız da, bunlardan birini özünüz üçün, qalanlarını da yoldaşlarınız üçün qəbul edərsiniz ümidindəyəm.

D'Artanyan dedi:

Çox gözəl, milord, mən razıyam. Ümid edirəm ki, sizin bu hədiyyələrinizdən biz yerində və məharətlə istifadə edəcəyik.

İndi əlinizi verin, cavan oğlan, ola bilər ki, biz yaxında döyüş meydanında görüşək. Ancaq hələ ki, dost olaraq ayrılırıq.

- Bəli, milord, ümid edirəm ki, yaxında bir-birimizlə düşmən kimi görüşəcəyik.

Arxayın olun, mən bunu sizə vəd edirəm.

D'Artanyan hersoqa təzim edib sürətlə limana getdi.

O, göstərilən gəmini axtarıb tapdı və məktubu kapitana verdi Kapitan məktubu liman komendantına təsdiq etdirib o saat yola çıxdı.

Limanda əlli gəmi yola düşməyə hazır durub icazə gözləyirdi. "Zund" gəmisi bunlardan birinin lap yanından keçdi. D'Artanyana elə gəldi ki, bu gəminin göyərtəsində Menqdə gördüyü və naməlum adamın miledi dediyi həmin sarışın xanım durmuşdu. Ancaq dəniz axınının meyli və küləyin istiqaməti nəticəsində d'Artanyanın mindiyi gəmi o qədər sürətlə gedirdi ki, dayanmış gəmi bir dəqiqə sonra d'Artanyanın gözündən itdi.

Ertəsi gün səhər saat doqquzda d'Artanyanın mindiyi gəmi Sen-Valeri sahilinə yan aldı.

D'Artanyan o saat göstərilən meyxanaya gedib, səs-küydən onu asanlıqla tapdı.

Meyxanada şən dənizçilər kef etməkdə idilər.

D'Artanyan camaatın arasından özünə yol açıb meyxana sahibinin yanına çatdı və "Forward" sözünü söylədi. Meyxana sahibi o saat onunla bərabər, həyətə çıxıb tövləyə getdi. Orada yəhərli bir at var idi. Meyxana sahibi ona daha nə lazım olduğunu soruşdu.

D'Artanyan soruşdu:

Mən hansı yol ılə getməlıyəm?

– Buradan Blanjiyə, Blanjidən Nevşatelə gedərsiniz. Nevşateldə "Qızıl Mala" meyxanasına gedib meyxana sahibinə parolu söylərsiniz. Burada olduğu kimi orada da sizə yəhərli bir at verərlər.

D'Artanyan soruşdu:

Sizə borcum neçədir?

Meyxana sahıbi cavab verdi:

Hamısının pulu verilmişdir. Özü də çox səxavətlə verilmışdır. Gedin, Allah köməyiniz olsun!

Amin! – cavan oğlan cavab verib atını çaparaq sürdü.

Dörd saatdan sonra o, Nevşatelə çatdı.

O, aldığı təlimata bütün dürüstlüyü ilə əməl etdı. Sen Valeridə olduğu kimi, ona Nevşateldə də yəhərli bir at verdilər. O, əvvəlkı yəhərdə olan tapançaları çıxarıb yenı yəhərə taxmaq ıstədi. Ancaq yenı yəhərin də qoburlarında eynən onlar kimi tapançalar olduğunu gördü.

Paris ünvanınızı verin.

– Qvardıyaçılar evi, Dezessarın bölüyü.

– Çox yaxşı, meyxana sahibi ona cavab verdi.

D'Artanyan soruşdu:

Hansı yol ilə gedim?

- Ruan yolu ilə gedin. Ancaq şəhərin solundan keçin. Ekuı kəndində dayanırsınız. Orada "Fransanın Gerbi" adlı tək bırcə meyxana var. Zahirinə baxıb o meyxana barəsində pıs fikrə düşməyın. Həmın meyxananın tövləsində olan at bu atdan pis deyıldır

- Parol yenə həmin paroldurmu?

Həmin paroldur.

D'Artanyan atı dördayaq çapdı. Ekuidə də həmın əhvalat təkrar olundu. Yenə öz ünvanını qoyub çaparaq Pontuaza yola düşdü. Orada axırıncı dəfə atını dəyişdi və o, saat doqquzda çaparaq cənab de Trevilin həyətinə girdi.

D'Artanyan on iki saatda altmış milə qədər yol getmişdi.

Cənab de Trevil onu elə qarşıladı ki, elə bil onunla bır gün səhər görüşmüşdü. Ancaq əlini həmişəkindən azacıq bərk sıxıb xəbər verdi ki, cənab Dezessarın bölüyü Luvrdadır və o, öz vəzifəsi başına gedə bılər.



## XXII

## MERLEZON BALETİ

Ertəsi gün Parisdə hamı şəhər ağsaqqallarının kral və kraliçanın şərəfinə təşkil etdikləri baldan danışırdı. Əlahəzrət kralın sevdiyi Merlezon baletini oynayacaqdılar.

Bələdiyyədə düz bir həftə bu təntənəli gecə üçün hazırlıq aparılmışdı. Şəhər dülgəri dəvət edilən xanımların oturması üçün xüsusi skamyalar qayırmış, şəhər rəngsazı salonları iki yüz ağ mum şamla bəzəmişdi ki, bu da o zaman üçün görünməmiş bir zinət idi. Nəhayət, iyirmi nəfər skripkaçalan tutub onlara ikiqat artıq muzd vəd etmişdilər; çünki bütün gecəni çalmalı idilər.

Səhər saat onda kral qvardiyasının kiçik zabiti olan cənab de La Kost ikı polis məmuru və bir neçə nişançı əsgərlə bələdiyyə katibi Klemanın yanına gəlib, şəhər idarəsinin bütün bina və otaqlarının açarlarını tələb etmişdi. Açarlar o saat ona verilmişdi. Hər açardan xüsusi bir yarlıq asılmışdı ki, onları tanımaq mümkün olsun və bu dəqiqədən bütün qapı və girişləri mühafizə etmək cənab de La Kosta həvalə edilmişdi.

Saat on birdə qvardiya kapıtanı Düalye əlli nəfər nışançı əsgərlə gəldi və bu əsgərlər o saat bələdiyyənin qapılarına qoyuldular.

Saat üçdə bırı fransız, digəri isveçlilərdən ibarət iki qvardiya bölüyü gəldi. Fransız bölüyünün yarısı cənab Düalyenin, yarısı cənab Dezessarın adamlarından ibarət idi.

Dəvət olunanlar axşam saat altıdan yığışmağa başladılar. Adamlar gəldikcə hərəni – böyük salonda qabaqcadan hazırlanmış yerlərdə oturdurdular.

Saat onda birinci prezidentin arvadı gəldi. Kraliçadan sonra bu xanım şənlikdə ən yüksək bir zat olduğundan şəhər nümayəndələri onu qarşılayıb kraliça üçün hazırlanmış lojanın müqabilindəki lojaya apardılar.

Saat onda binanın müqəddəs İoann kilsəsinə tərəf olan kiçik salonunda dörd nəfər nişançı əsgər tərəfindən mühafizə olunan gümüş şəhər bufetinin qarşısında kral üçün süfrə hazırladılar.

Gecə yarısı ucadan hay-küy və təbrik səsləri eşidildi. Kral Luvrdan bələdiyyə binasına qədər rəngbərəng fənərlərlə bəzənib aydın işıqlanmış küçələrlə gəlirdi.

Bu zaman əllərində məşəl tutmuş atlı serjantın ardınca gedən və əyinlərində mahud mantiyalar geymiş şəhər ağsaqqalları kralı qarşılamaq üçün pillə başına çıxdılar. Tacirbaşı kralı təbrik etdi. Əlahəzrət təbrikə cavab verib, belə gec gəldiyi üçün üzr istəyərək təqsiri cənab kardinalın boynuna qoydu; çünki o, dövlət işləri barədə söhbətlərlə kralı saat on birə qədər ləngitmişdi.

Rəsmi libas geymiş əlahəzrətin ardınca Orlean hersoqu, de Suasson qrafı, baş ruhani, hersoq de Lonqvil, hersoq d'Elbef, qraf d'Akur, qraf de La Roş-Quyon, cənab de Liankur, cənab de Barada, qraf de Kramayl və kavaler de Suvre gəlirdi.

Hamı kralın kədərli və qayğılı olduğunu gördü.

Bir kabinet kral üçün, digər bir kabinet Orlean hersoqu üçün ayrılmışdı. Bu kabinetlərdən hər birində maskarad paltarları var idi. Kraliça və prezidentin arvadı üçün də həmin bu şeylər hazırlanmışdı. Əlahəzrətlərin məiyyətlərinə mənsub kişi və qadınlar əvvəlcə hazırlanmış otaqlarda iki-iki geyinməli idilər.

Kral kabinetə girmədən əvvəl əmr etdi ki, kardinal gələn kimi onu xəbərdar etsinlər.

Kralın gəlməsindən yarım saat sonra yenidən təbrik səsləri ucaldı. Bu səslər kraliçanın gəldiyini xəbər verirdi.

Serjantların ardınca gedən şəhər ağsaqqalları kraliçanı qarşılamaq üçün çıxdılar.

Kraliça salona daxil oldu. Onun da qəmgin olduğunu və xüsusən çox yorğun göründüyünü hamı duydu.

Kraliça içəri girdiyi dəqiqədə kiçik bir lojanın o vaxta qədər örtülü olan pərdəsi aralandı və əyninə İspaniya əyanları qiyafəsi geymiş kardinalın solğun üzü göründü. Onun gözləri kraliçaya dikildi və dodaqlarında məmnun bir təbəssüm oynadı. Kraliçanın brilyant boyunbağısı yox idi.

Kraliça şəhər ağsaqqallarının təbriklərini qəbul edib xanımların salamlarına cavab verirdi.

Birdən kral kardinal ilə birlikdə salonun qapısında göründü. Kardinal ona pıçıltı ilə nə isə deyirdi. Kralın bənizi tamam ağarmışdı.

Kral maskasız və kamzolu bircə şəridlə azacıq bağlı olduğu halda kraliçaya yaxınlaşdı və dəyişmiş səslə ona dedi:

Xanım, bəs niyə brilyant boyunbağını taxmamısınız? Bilirsiniz ki, onu sizin boynunuzda görmək mənim xoşuma gəlir.



Kraliça ətrafa göz gəzdirib iblis gülüşü ilə gülümsəyən kardinalı gördü.

Kraliça həyəcanlı səslə cavab verdi:

– Padşahım, qorxdum ki, yolda boyunbağıya bir şey ola bilər.

Nahaq yerə, xanım, onu sizə bağışlamışam ki, boynunuza taxasınız. Nahaq yerə taxmamısınız.

Kralın səsi qəzəbdən titrəyirdi. Hamı işin nə yerdə olduğunu bilmədən, heyrətlə onlara baxıb dinləyirdi.

Kraliça dedi:

Padşahım, boyunbağını gətirmək üçün Luvra adam göndərə bilərəm və siz əlahəzrətin arzusu yerinə yetmiş olar.

– Göndərin, xanım, göndərin və cəld olun; çünki bir saatdan sonra balet başlanacaq.

Kraliça itaət əlaməti olaraq krala baş əydi və onu öz kabinetinə ötürməli olan xanımların ardınca getdi.

Kral da öz kabinetinə getdi.

Bir müddət salonda tutqunluq və qarışıqlıq hiss olundu.

Hamı gördü ki, kral ilə kraliça arasında nə isə bir iş var. Ancaq əlahəzrətlər o qədər yavaşdan danışırdılar ki, heç kəs bir şey eşidə bilməmişdi. Bundan əlavə, hamı hörmət əlaməti olaraq bir neçə addım geri çəkilmişdi. Skripkalar isə ucadan çalınırdı. Odur ki, onların danışıqlarını heç kəs eşidə bilmədi.

Kral birinci olaraq kabinetdən çıxdı. O, əyninə çox gözəl bir ovçu paltarı geymişdi. Orlean hersoqu və sair əyanlar da onun kimi geyinmişdilər.

Kardinal krala yaxınlaşıb ona kiçik bir mücrü verdi. Kral mücrünü açıb içində boyunbağının iki brilyant pərəyini gördü.

O, kardinaldan soruşdu:

Bu nə deməkdir?

Kardinal cavab verdi:

Heç bir şey, əgər kraliça boyunbağını taxmış olsa, (buna şübhə edirəm), padşahım, onun üstündəki brilyantları sayın. Əgər orda on brilyant olsa, onda ülyahəzrət kraliçadan soruşun ki, bu iki brilyantı ondan kim oğurlamış ola bilər?

Kral bir şey soruşmaq istəyirmiş kimi kardinala baxdı. Ancaq sual verməyə macal tapmadı. Kraliça salona daxil oldu.

Ovçu paltarı ona həddindən artıq çox yaraşırdı. Kraliçanın başında göy ləlekli mahud şlyapa, əynində brilyant düymələri olan sədəfə

çalan rəngdə məxmər gödəkcə və üstü gümüş işləməli göy atlas tuman var idi. Sol çiynində başındakı lələk və tuman rəngində bir banta bənd olunmuş silsilə parıldayırdı.

Kral sevindiyindən titrədi. Kardinal qəzəbindən özünü itirmişdi. Ancaq kraliçadan xeyli aralı olduqlarından, onlar silsilənin üstündəki brilyantları saya bilmirdilər Görəsən onlar neçə idi? Onmu ya on ikimi?

Bu dəqiqədə skripkalar baletin başlandığını xəbər verdi Kral birlikdə oynamalı olduğu prezidentin arvadına, Orlean hersoqu isə kraliçaya yanaşdı. Onlar öz yerlərini tutdular, balet başlandı.

Kral kraliça ilə üz-üzə rəqs edirdi və hər dəfə onun yanından keçdikdə brilyantlarını saya bilmədiyi silsiləyə gözləri ilə yeyəcəkmiş kimi baxırdı, kardinalın alnını soyuq tər basmışdı.

Balet bir saat davam etdi. Rəqs qurtardıqda bütün salonun alqışları altında hər kavaler oynatdığı xanımı öz yerində ötürdü. Ancaq kral öz imtiyazından istifadə edərək, oynadığı xanımdan ayrıldı və sürətlə kraliçanın yanına gəlib brilyantı kraliçaya verdi.

– Bu nə sözdür, padşahım? kraliça özünü heyrətlənmiş kimi göstərərək səsləndi. Mənə iki brilyant da bağışlayırsınız? Onda brilyantlarımın sayı on dörd olacaq.

Doğrudan da kral sayıb gördü ki, on iki brilyantın hamısı ülyahəzrət kraliçanın çiynindədir.

Kral kardinalı çağırıb ciddi bir səslə soruşdu:

Bu nə deməkdir, cənab kardinal?

Kardinal cavab verdi:

Əlahəzrət, o deməkdir ki, mən bu brilyantları ülyahəzrət kraliçaya bağışlamaq istəyirdim. Ancaq özüm təklif etməyə cürət edə bilmədiyimdən, belə bir vasitə seçdim.

Kardinal həzrətlərinə təşəkkür edirəm, kraliça kardinala elə bir təbəssümlə baxdı ki, onun bu hiyləgər mehribanlığına aldanmadığını sübut etdi. – Mən əminəm ki, o, istehza ilə əlavə etdi, on iki brilyant əlahəzrət krala neçəyə oturmuşsa, bu iki brilyant da sizə o qiymətə oturmuşdur.

Sonra kraliça krala və kardinala təzim edib paltarını dəyişmək üçün öz kabinetinə getdi.

Bu fəslin başında səhnəyə çıxartdığımız məşhur zatlara verdiyimiz diqqət bizi kraliçanın kardinal üzərində qələbəsinə bais olan adamdan bir o qədər uzaq saldı. O, utancaq bir halda, heç kəsin gözünə görünmədən, camaatın arasına qarışıb bir qapının ağzından mənası yalnız dörd adama: krala, kraliçaya, kardinala, bir də onun özünə məlum olan bu səhnəyə tamaşa edirdi.



Kraliça öz otağına qayıtdı və d'Artanyan getmək istəyirdi ki, birdən bir əl onun çiyninə toxundu. O dönüb baxdıqda işarələrlə onu öz ardınca çağıran cavan bir qadını gördü. Cavan qadının üzündə qara məxmər yarımmaska var idi. Ancaq bu ehtiyat tədbirinə baxmayaraq, d'Artanyan o saat gözəl xanım Bonasyeni tanıdı.

Dünən onlar Jermenin yanında ötəri görüşmüşdülər. Cavan qadın göndərdiyi qasidin müvəffəqiyyətlə qayıtdığı barədə şad xəbəri kraliçaya yetirməyə o qədər tələsirdi ki, bir birini sevən bizim bu cavanlar yalnız iki-üç kəlmə danışa bildilər. D'Artanyan iki hissin məhəbbət və maraq hisslərinin təsiri ilə xanım Bonasyenin ardınca getdi.

Onlar dolama dolaşıq saray dəhlizləri ilə xeyli getdikdən sonra xanım Bonasye bir qapını açıb cavan oğlanı tamamilə qaranlıq bir kabinetə saldı. O, pərdənin dalındakı gizli qapını açdı və oradan içəri güclü işıq doldu. Xanım Bonasye o otağa girib yox oldu.

D'Artanyan otaqda tək qaldı. Xanım Bonasyenin onu hara gətirdiyini bilmirdi Lakin qonşu otaqdan gələn işıq və ətirli hava, bir də eşitdiyi danışıq səsləri aydın göstərirdi ki, o kraliçanın kabinetinə bitişik olan otaqdadır

Cavan durub gözləyirdi.

Kraliça şad və xoşbəxt idi. Bu hal onu həmişə qəmgin görən ətrafdakı qadınları, deyəsən, heyrətə salmışdı. Kraliça şadlığının səbəbini müsamirənin gözəlliyi və baletdən aldığı ləzzət ilə izah edirdi. Kraliça ağlasa da, gülsə də, rəyinə müxalifət etmək mümkün olmadığından, hamı Paris şəhəri ağsaqqallarının bu mehribanlığını tərif edirdi.

Bir azdan sonra d'Artanyan kraliçanın səsini o biri səslərdən seçməyə başladı. Əvvəlcə onun danışığında olan yüngülcə xarici ləhcəsindən, sonra isə, danışığındakı amiranə ifadədən onu tanıdı. O, kraliçanın açıq qalmış qapıya gah yaxınlaşdığını, gah uzaqlaşdığını hiss edirdi. Bir-iki dəfə hətta işığın qabağını tutan bir kölgə də gördü.

Birdən pərdənin arasından gözəl, zərif bir əl uzandı. D'Artanyan başa düşdü ki, bu, ona veriləcək mükafatdır. O diz çöküb bu əli tutdu. Hörmətlə öpdü. Sonra bu əl d'Artanyanın ovcuna bir şey qoyub yox oldu. D'Artanyan bunun bir üzük olduğunu gördü. Qapı o saat örtüldü və d'Artanyan tamam qaranlıq otaqda qaldı.

D'Artanyan üzüyü barmağına taxıb yenə gözləməyə başladı. Aydın idı ki, hələ iş qurtarmamışdır. Sədaqət üçün verilən mükafatdan sonra məhəbbət üçün də mükafat verılməli idi. Bundan başqa şənlık hələ yenicə başlanmışdı. Yemək gecə saat uçə təyin edilmişdi. Müqəddəs İoann kilsəsinin qülləsındəki saat isə üçə on beş dəqiqə qaldığını bildirdi.

Doğrudan da, qonşu otaqdakı səslər yavaş-yavaş azalıb uzaqlaşmağa başladı. Nəhayət, d'Artanyanın gözləməkdə olduğu otağın qapısı açıldı və xanım Bonasye sürətlə ıçəri girdi.

Sizsinizmi?! Axır ki, gəlib çıxdınız! d'Artanyan çığırdı.

Susun! – gənc qadın d'Artanyanın ağzını tutdu. Susun və gəldiyiniz yol ilə də gedin.

– Bəs mən sizi harada və nə vaxt görə bilərəm? – d'Artanyan soruşdu.

– Öz otağınızda bir məktub görəcəksiniz, orada hər şey yazılmışdır. Gedin, gedin!

Xanım Bonasye dəhlizə gedən qapını açıb d'Artanyanı bayıra itələdi.

D'Artanyan uşaq kimi, heç bir kəlmə söz söyləmədən və müqavımət etmədən çıxdı. Bu, sübut edir ki, o doğrudan da, aşiq idi.

## XXIII

## GÖRÜŞ

D'Artanyan yüyürə-yüyürə evə qayıtdı. Artıq səhər saat dörd idi. O, Parisın ən təhlükəli yerlərındən keçıb getməli idı.

Yolda heç kəsə rast gəlmədı. Məlum şeydir ki, tale sərxoşları və aşiqləri qoruyar.

Dəhlizə açılan qapı aralı idi. Pilləkənlərlə yuxarı qalxıb nökəri Planşe ılə şərtləşdıyı qayda üzrə yavaşcadan qapını döydü. İki saat əvvəl şəhər bələdiyyəsindən evə göndərmış olduğu Planşe qapını açdı.

D'Artanyan həyəcanla soruşdu:

– Mənə məktub gətiriblərmı?

Planşe cavab verdı·

- Heç bir kəs gətirməmişdir Ancaq bır məktub var ki, öz-özünə gəlmışdır.



Nə demək ıstəyirsən, ay axmaq?

Onu demək ıstəyirəm ki, evə qayıtdıqda sizın yataq otağınızda mizın üstündə bir məktub gördüm. Ancaq mənzilin açarı mənim cıbimdə idi.

Bəs o məktub hanı?

Onu elə olduğu yerində qoydum. Bu iş düz işə oxşamır. Məktub özbaşına gələ bilməz Yenə pəncərə açıq və ya heç olmazsa aralı olsaydı, dərd yarı ıdi. Ancaq pəncərə möhkəm bağlanmışdı. Özünüzü gözləyin, cənab. Burada, yəqın ki, bir şeytan əməli var.

D'Artanyan otağa yüyürüb məktubu açdı. Məktub xanım Bonasyedən ıdi və orada bu sözlər yazılmışdı:

*"Sizə ürəkdən təşəkkur etmək istəyirlər Bu gecə saat onda Sen-Kluda, cənab d'Estrenın evinın tinində pavılyonun qarşısında olun. K.B."*

D'Artanyan bu məktubu oxuyarkən həyəcandan qəlbinin sanki duracağını hıss etdı.

Bu, onun aldığı ilk məktub idi. Bu, onun üçün təyin edilmiş birinci görüş idi.

Planşe ağasının gah qızarıb, gah ağardığını görəndə dedi.

Nə var, ağa? Mən bu işin şeytan əməlı olduğunu söyləmədimmi?

D'Artanyan cavab verdi:

Səhv edırsən, Planşe, bunu subut üçün al, sənə bir ekü verim, bununla mənim sağlığıma şərab alıb içə bılərsən.

Verdiyiniz ekü üçun sizə təşəkkür edirəm və söz verirəm ki, tapşırığınızı eynən yerinə yetirəcəyəm Ancaq hər halda qapı-pəncərəsi bağlı olan bır evə özbaşına gəlıb çıxan bir məktub...

Bu məktub göydən düşmüşdür, dostum, göydən..

Planşe soruşdu:

Deməli, siz buna şadsınız, ağa?

Əzizim Planşe, mən insanların ən xoşbəxtiyəm.

Mən sızin bu xoşbəxtlıyınızdən istifadə ilə gedib yata bılərəmmi?

– Hə, get.

Allah sizın köməyiniz olsun! Ancaq hər halda bu məktub...

Bu sözləri deyib Planşe başını yırğalaya-yırğalaya çıxdı. D'Artanyanın səxavətı onun şübhələrini aradan qaldırmamışdı.

D'Artanyan tək qaldıqda məktubu dəfələrlə, təkrar-təkrar oxudu. Sonra sevdıyı qadının əlı ilə yazılmış sətırləri iyirmi dəfə öpdü. Nəhayət, uzanıb yatdı və çox şırın yuxular gördü.

Səhər saat yeddidə oyanıb Planşeni çağırdı:

– Planşe, mən gedirəm, bəlkə bütün günü gəlmədim. Sən axşam saat yeddiyə qədər azadsan. Ancaq saat yeddidə iki atla bərabər hazır ol.

Görünür yenə xatırınıza bədənimizin dəlık-deşık edilməsi düşmüşdür! Planşe deyindi.

Muşket və tapançaları da götürərsən.

Elə mən bunu bilirdim də! – Planşe çığırdı. Budur ha! Mən elə bilirdim ki, o məlun məktubun nəticəsi belə olacaq.

– Bir sakit ol, ay axmaq! Balaca bir gəzintidən başqa heç bir şey etməyəcəyik.

Bəli, bu da bizim axırıncı əyləncəli səyahətimiz kimi bir şey olacaq... Yolda başımıza güllə dolu kimi yağırdı, hər addımda bizə tələ qururdular.

D'Artanyan dedi:

Cənab Planşe, bura bax. Əgər qorxursansa, mən tək gedərəm. Qorxudan titrəyən bir yoldaşla getməkdənsə, tək getmək yaxşıdır.

Planşe cavab verdi:

– Siz mənim qəlbimə toxunursunuz. Gərək ki, məni iş vaxtı görübsünüz.

Elədir, ancaq mənə elə gəldi ki, sən o bir dəfədə bütün var-yox qoçaqlığını sərf edib qurtarmısan.

Yeri düşəndə görərsiniz ki, məndə hələ yenə də qoçaqlıq tapılar. Ancaq sizdən xahiş edirəm ki, ay ağa, əgər mənim bu qoçaqlığımın çox davam etməsini istəyirsinizsə, onu hədsiz səxavətlə sərf etməyin.

– Qoçaqlığın bu axşam üçün kifayət edərmi?

Ümid edirəm.

Deməli, sənə arxayın oluram.

– Dediyiniz saatda hazır olacağam. Ancaq mənə elə gəlir ki, qvardiyaçılar tövləsində sizin bircə atınız var.

Hələlik bəlkə də bircə atdır. Amma axşama qədər dörd at olacaq.

Deməli, biz o səyahətə at almaq üçün çıxmışdıq, eləmi?

Əlbəttə, əlbəttə, – d'Artanyan cavab verdi və çıxıb getdi.

Cənab Bonasye qapının ağzında durmuşdu. D'Artanyan bu hörmətli tacirlə söhbət etmək istəmədiyindən, ötüb keçmək istədi. Ancaq o, d'Artanyana elə yumşaqlıq və mehribanlıqla təzim etdi ki, d'Artanyan niyyətini dəyişməli oldu. Bir də ki, arvadı sizinlə görüş təyin etmiş bir ərə qarşı necə nəzakətli olmaya bilərsiniz?



D'Artanyan mehriban bir tövr ilə Bonasyeyə yaxınlaşdı

Söhbət, əlbəttə, yazıq Bonasyenin dustaq olması barədə idi. Cənab Bonasye d'Artanyanın onunla Menqdəki adam arasındakı söhbəti eşitmiş olduğunu bilmədiyindən, öz kirayənişinə o vəhşi cənab de Laffemin həyasızlıqlarından danışır və onu kardinalın cəlladı adlandırırdı. Cənab Bonasye Bastiliya barəsində, onun qapılarındakı cəftələr, qıfıllar, pəncərə nəfəslikləri, barmaqlıqlar və işgəncə alətləri barədə uzun-uzadı danışdı.

D'Artanyan nümunəvi bir səbirlə onun danışıqlarını dinlədi. O qurtardıqda isə d'Artanyan soruşdu:

Siz öyrənə bilmədinizmi ki, xanım Bonasyeni qaçıran kim idi? Yadımdan çıxmamışdır ki, mənim sizinlə tanışlıq şərəfimə bu xoşagəlməz hadisə bais olmuşdu.

Of, cənab Bonasye cavab verdi. – Əlbəttə, bunu mənə söyləmədilər. Arvadım da and içib deyir ki, onun kim olduğunu bilmir. Siz isə, cənab Bonasye ən sadədil bir əda ilə davam etdi. – Bəs bu günlərdə siz harada idiniz? Sizi və dostlarınızı, neçə gündür ki, görmürəm və güman etmək olar ki, dünən Planşenin çəkmələrinizdən sildiyi toz Paris küçələrindən qonmamışdır.

Bəli, əzizim cənab Bonasye. Mən yoldaşlarımla bir səyahətə çıxmışdım.

Uzağamı getmişdiniz?

Yox, canım! Vur-tut qırx milə qədər yol getmişdik. Biz cənab Atosu Forj sularına ötürdük və yoldaşlarım orada qaldılar.

– Siz isə qayıdıb gəldiniz, eləmi? Cənab Bonasye ən hiyləgər bir ifadə ilə soruşdu. – Sizin kimi gözəl oğlanlara məşuqələriniz çox da uzun məzuniyyət verməzlər Yəqin ki, sizi Parisdə səbirsizliklə gözləyirdilər, eləmi?

D'Artanyan gülərək cavab verdi:

Nə deyə bilərəm ki, bunun belə olduğunu etiraf etməliyəm. Bir də ki, əzizim Bonasye, görürəm, sizdən heç bir şeyi gizlətmək olmaz Bəli, məni səbirsizliklə gözləyirdilər. Buna inanın.

Bonasyenin üzündən xəfif bir kölgə keçdi. Bu kölgə o qədər xəfif idi ki, d'Artanyan bunu sezmədi.

Yəqin ki, bu tələsməyinizə görə sizi mükafatlandıracaqlar? tacir həyəcanlı səslə davam etdi. Lakin d'Artanyan onun səsindəki bu həyəcana da, bu möhtərəm kişinin bir az əvvəl üzündən keçən xəfifi kölgə kimi diqqət yetirmədi.

Siz isə özünüzü müqəddəs bir adam kimi göstərirsiniz! d'Artanyan gülərək cavab verdi.

Yox; ona görə deyirəm ki, bu gün evə gec qayıdıb qayıtmayacağınızı bilim.

D'Artanyan soruşdu:

– Bu sual nə üçündür, möhtərəm cənab? Məgər siz məni gözləmək niyyətindəsiniz?

– Yox, mən həbs olunduğumdan və evimə oğru gəldiyindən bəri hər dəfə, xüsusən gecələr qapı açılanda qorxuram. Neyləyim, axı, hərbi adam deyiləm.

Elə isə, əgər mən gecə saat birdə, ikidə və ya üçdə qayıtmalı olsam, heç qorxub eləməyin. Qayıtmasam da, yenə heç qorxmayın.

Bu dəfə Bonasyenin rəngi ağardı. D'Artanyan bunu hiss edib, ona nə olduğunu soruşdu..

– Heç bir şey, Bonasye tutqun səslə cavab verdi. Heç bir şey... Başıma gələn fəlakətlərdən sonra bəzən huşumu itirirəm. İndi də bir üşütmə hiss etdim. Buna əhəmiyyət verməyin. Arzu edirəm ki, vaxtınızı xoş keçirəsiniz!

D'Artanyan cənab de Trevilin yanına getdi.

Cənab de Trevil çox nəşəli idi. Kral və kraliça balda onunla çox mehribanlıqla söhbət etmişdilər. Kardinal isə son dərəcə kədərli idi. Gecə saat birdə kardinal xəstələndiyini bəhanə edib baldan getmişdi. Əlahəzrətlərə gəlincə isə, Luvra yalnız səhər saat altıda qayıtmışdılar.

Cənab de Trevil otaqda heç bir kəs olmadığını yəqin bilmək üçün hər guşəyə göz yetirib səsini alçaldaraq d'Artanyana dedi:

İndi isə, cavan dostum, gəlin sizin barənizdə danışaq; çünki yəqin sizin müvəffəqiyyətlə qayıtmanızla kralın şadlığı, kraliçanın qələbəsi və kardinal həzrətlərinin alçalması arasında bir münasibət var. İndi özünüzü gözləyin!

Mən nədən qorxacağam, d'Artanyan cavab verdi. İndi ki, əlahəzrətlərin mərhəmətlərini qazanmaq şərəfinə nail olmuşam, daha mənim nədən qorxum ola bilər?

Mənə inanın, sizin üçün qorxu var. Kardinal fitnəni törədən adamla haqq-hesab üzmədən kini unudan adamlardan deyil. Mənə elə gəlir ki, bu fitnənin törədən adam tanış qaskoniyalıdır.

Yəni güman edirsiniz ki, kardinal da bu işdən sizin qədər xəbərdardır və mənim Londona getdiyimi bilir?



- Vay şeytan! Siz Londonamı getmişdiniz? Yoxsa barmağınızda parıldayan o gözəl almazı də siz Londondan gətirib gəlmisiniz? Özünüzü gözləyin, əzizim d'Artanyan. Düşmənin hədiyyəsi yaxşı şey deyildir. Bu barədə deyəsən bir latın şeri var... Bir dayanın...

– Mən bu almazı düşməndən almamışam, d'Artanyan cavab verdi. – Onu mənə kraliça vermişdir.

Kraliçamı! Oho! cənab de Trevil çığırdı, bu doğrudan da, şahanə bir hədiyyədir. Ən azı min pistol qiyməti var. Bu üzüyü kraliça sizə kimin vasitəsilə verdi?

– Özü verdi!

– Harada?

Geyindiyi otaqla yanaşı olan kabinetdə.

Nə sayaq?

Əlini öpmək üçün mənə uzadaraq...

– Siz kraliçanın əlini öpmüsünüzmü? de Trevil d'Artanyana baxaraq səsini ucaltdı.

Ülyahəzrət kraliça məni bu lütfə nail etmişdir.

– Bunu görən oldumu? Nə ehtiyatsızlıq etmişdir! Çox yaman ehtiyatsızlıq etmişdir!

– Yox, cənab kapitan, arxayın olun, bunu heç bir kəs görmədi, d'Artanyan bütün əhvalatı de Trevilə nağıl etdi.

Of, qadınlar, qadınlar! qoca döyüşçü səsləndi. Onları romantik xəyalpərəstliklərindən tanıyıram. Sirrə bənzəyən bir şey onları məftun edir. Deməli ki, siz kraliçanın yalnız əlini görübsünüz, vəssalam! Siz kraliçaya rast gəlsəniz, tanımayacaqsınız, o da rast gəldikdə sizi tanımayacaqdır.

Xeyr, bu almaz vasitəsilə tanıyar... Cavan oğlan cavab verdi.

De Trevil ona dedi:

– Bura baxın, istəyirsiniz sizə gözəl bir dost məsləhəti verim?

Məni şərəfləndirmiş olarsınız, cənab kapitan, d'Artanyan cavab verdi.

Elə isə, bu saat zərgərin yanına gedib bu almazı satın, hər bir sərraf buna ən azı səkkiz yüz pistol verər. Pistolların adı yoxdur, cavan oğlan, ancaq bu üzüyün çox müdhiş bir adı var və bu ad üzüyü barmağında gəzdirən adamı bəlaya salar.

Bu üzüyü satmaqmı?! Mənim kraliçamın bağışladığı üzüyü satmaqmı! Yox, əsla! – d'Artanyan cavab verdi.

– Onda heç olmasa, a dəli, üzüyün qaşını içəri çevirin. Axı hər kəs bilir ki, Qaskoniya əsilzadəsi öz anasının mücrüsündən belə bir üzük tapa bilməz.

Deməli, güman edirsiniz ki, mən nədən isə ehtiyat etməliyəm, eləmi? - d'Artanyan soruşdu.

– Mən demək istəyirəm ki, əzizim, barıt anbarında yatan bir adam özünü sizdən daha təhlükəsiz hiss edə bilər.

Cənab de Trevilin ədasındakı qətiyyət d'Artanyanı narahat etməyə başladı. O dedi:

– Lənət şeytana! Lənət şeytana! Bəs mən neyləyim?

– Hər şeydən əvvəl ehtiyatlı olun. Kardinalın yaddaşı möhkəm və əlləri uzundur. İnanın ki, o sizin başınıza bir iş gətirməmiş olmayacaq.

Ancaq necə bir iş?

Mən nə bilim! İblis özü bütün hiylələrilə ona xidmət edir. Başınıza gələ biləcək işlərin ən yüngülü budur ki, sizi həbs edə bilərlər.

– Necə! Əlahəzrətin qulluğunda olan bir adamı həbs etməkmi?

– Məgər Atosun başına belə bir iş gətirmədilərmi? Hər halda, ey cavan dəliqanlı, otuz ildən bəri sarayda olan bir adamın sözlərinə inanın, başısoyuqluq etməyin, yoxsa məhv olarsınız. Əgər bir adam sizinlə bəhsə girişsə, hətta on yaşlı bir uşaq olsa da, ondan çəkinin. Əgər gündüz və ya gecə sizə hücum etsələr, utanmadan geri çəkilin. Körpüdən keçdikdə, ayağınızın altındakı taxtalardan birinin sökülüb düşməməsi üçün taxtaları əvvəldən yoxlayın. Tikilməkdə olan bir evin yanından keçərkən, yuxarı baxın ki, başınıza bir daş düşməsin. Gecə evinizə qayıtdıqda, əgər xidmətçinizə inanırsınızsa, o, əlində muşketlə ardınızca gəlsin. Hamıdan ehtiyat edin. Özünüzü dostunuzdan, qardaşınızdan, məşuqənizdən, xüsusən məşuqənizdən gözləyin!

D'Artanyan qızardı:

Məşuqə! o, mexaniki bir surətdə təkrar etdi. Axı, mən niyə başqalarına görə ondan çox ehtiyat edim?

Çünki məşuqə kardinalın ən sevdiyi vasitələrdən biridir Onun üçün bundan daha təsirli bir vasitə yoxdur. Qadın adamı on pistola satar.

D'Artanyan bu axşam xanım Bonasyenin onunla təyin etdiyi görüş barəsində düşündü. Ancaq qəhrəmanımızın xeyrinə olaraq qeyd etməliyik ki, cənab de Trevilin qadınlar barəsindəki bu mənfi rəyi onda öz gözəl xanımına qarşı heç bir şübhə oyatmadı.



Yeri gəlmişkən soruşum, cənab de Trevil davam etdi. Bəs yoldaşlarınızın başına nə gəlib?

Özüm bunu sizdən soruşmaq istərdim.

– Bu barədə heç bir şey bilmirəm.

– Mən onları yolda itirdim. Portos Şantiliyada qaldı, gözlənilməz bir duel onu orada saxladı. Aramisi çiynindən yaralamış halda Krevkerdə qoyub getdim. Atos isə Amyendə qaldı. Onu qəlp pul işlətməkdə taqsırlandırmışdılar.

– Budur, görürsünüzmü, · Trevil əlavə etdi. – Bəs siz özünüzü necə qurtardınız?

Möcüzə ilə, cənab kapitan. Kaleyə gedərkən yolda qraf de Vardı kəpənəyi divara mıxlayan kimi yerə mıxladım.

– Bu da bir dərd! De Vard kardinalın xidmətçisi və Roşforun əqrəbasındandır! Bilirsinizmi, dostum, mənim başıma nə fikir gəlmişdir?

Söyləyin, kapitan.

Kardinal sizi Parisdə axtarmaqda ikən siz gizlincə Pikardiyaya gedib yoldaşlarınızdan xəbər tutun. Lənət şeytana, axı onlar sizin tərəfinizdən belə bir diqqətə layiqdirlər.

Çox gözəl məsləhətdir, cənab kapitan, mən sabah yola düşürəm.

Sabahmı, bəs niyə bu gün getmirsiniz?

– Bu gün Parisdə çox vacib bir işim var.

– Ax, ey cavan oğlan, cavan oğlan! Yəqin ki, bir eşq macərasıdır? Təkrar edirəm ki, özünüzü gözləyin. Qadınlar bizi məhv etmişlər və bizdən sonra gələnləri də məhv edəcəklər. Sözümə qulaq asın, elə bu axşam yola düşün.

– Bu mümkün deyil, cənab kapitan.

Sözmü veribsiniz?

Bəli, cənab kapitan.

– Elə isə, başqa məsələ. Ancaq mənə söz verin ki, əgər bu gecə sizi öldürməsələr, sabah çıxıb gedirsiniz.

Söz verirəm.

D'Artanyan cənab de Trevil ilə vidalaşıb onun göstərdiyi atalıq qayğısından qəlbinin dərinliklərinə qədər razı qalmışdı.

O növbə ilə Atosun, Portosun və Aramisin mənzillərinə getdi. Onlardan heç biri qayıtmamışdı, nökərləri də yox idi Heç birindən xəbər-ətər verən olmadı.

D'Artanyan qvardiyaçılar qışlasının yanından keçəndə tövləyə baxdı. Dörd atdan üçü gəlmişdi. Planşe onları böyük həvəslə qaşovlayırdı. Atlardan ikisi qaşovlanmışdı.

Planşe d'Artanyanı görüb dedi:

– Ax, ağa, sizi gördüyümə nə qədər şadam!

Nə olub kı, Planşe? d'Artanyan soruşdu.

- Siz ev sahibi cənab Bonasyeyə inanırsınızmı?

Mənmı? Əsla inanmıram. Ancaq bunu niyə soruşursan?

– Çünki siz onunla danışanda, mən o qoca təlxəyın üzündən gözümü ayırmırdım

O uzdə sən nə gördün kı?

Xəyanət!

- Doğrudanmı?

- Ondan başqa siz tindən dönüb yox olan kimi, cənab Bonasye şlyapasını götürüb qapını bağladı və qarşı səkiyə tərəf qaçaraq getdı.

– Doğrudan da, sən haqlısan, Planşe. Bütün bunlar mənə çox şübhəli görünür və arxayın ol, bütün bu məsələlər lazımınca aşkar olmamış, biz ona ev kirəsi verməyəcəyik.

- Siz zarafat edirsiniz, cənab. Ancaq tezliklə özünüz görərsiniz ki, mən haqlıyam.

- Nə etməli, Planşe? Olacağa çarə yoxdur.

- Deməli, siz bu axşamkı səyahətdən əl çəkmirsiniz?

- Əksinə, Planşe, mənim cənab Bonasyeyə acığım nə qədər artırsa, səni narahat edən məktubda təyin edilmiş görüşə o qədər böyuk həvəslə gedirəm. Deməli saat doqquzda məni burada qışlaqda gözləyirsən; mən sənin ardınca gələrəm.

Planşe öz ağasını ıstəyindən çəkindirməyə ümid olmadığını gördükdə, dərindən köksünü ötürdü və üçüncü atı qaşovlamağa başladı.

Əslində ehtiyatlı bir adam olan d'Artanyan evə qayıtmaq əvəzinə, dörd yoldaş pulsuz olduğu zaman onları şokolada qonaq etmış həmin qaskonıyalı keşişin evınə nahar etməyə getdi.



## XXIV

## PAVİLYON

Saat doqquzda d'Artanyan qvardiyaçılar qışlasına gəlib Planşeni orada hazır bir vəziyyətdə gördü. Dördüncü at da gəlib çıxmışdı. Planşe muşket və tapança ilə silahlanmışdı. D'Artanyanın belində bir qılınc, iki də tapança vardı. Ağa ilə nökər ata minib səssiz yola düşdülər. Onların getdiyini görən olmadı. Gecə çox qaranlıq idi. Planşe ağasından on addım aralı arxadan atını sürürdü.

D'Artanyan sahil boyundan keçib Konfrans darvazasından ötərək Sen-Klu yoluna döndü.

Atlılar şəhər küçələrindən getdikləri zaman Planşe özünün təyın etdiyi məsafəni gözləməkdə idi. Ancaq yol tənhalaşdıqca o öz ağasına daha da yaxınlaşırdı. Belə ki, Bulon meşəsində ağa ilə nökər artıq yan-yana gedirdilər. Etiraf etmək lazımdır kı, ağacların yırğalanan başları və qaranlıq meşənin içınə düşmüş ay işığı Planşenı qorxudurdu.

Planşe soruşdu:

Biz bütün gecəni belə yolmu gedəcəyik?

Yox, Planşe. Sən gəlib çatmısan.

Necə yənı, mən çatmışam? Ağa, bəs sız?

– Mən hələ bır neçə addım piyada gedəcəyəm.

Sız məni burada təkmi qoyursunuz?

Qorxursanmı, Planşe?

Yox, ancaq hiss edirəm ki, gecə çox soyuqdur. Soyuqdan da adamı yel azarı tutar Yel azarı olan bır nökər isə, sizin kimı zırək bir əsılzadə üçün çox pıs nökər olar.

Yaxşı, Planşe, indi kı, üşüyürsən, ən yaxın meyxanalardan bırınə get və səhər saat altıda məni darvazanın ağzında gözlə.

- Ağa, sızın mənə səhər lütf etdiyiniz ekünü böyük bir hörmətlə sərf edib doyunca yeyıb-ıçmışəm. Belə ki, əgər üşümüş olsam, cıbımdə bırcə quruş da yoxdur.

Al, bu da sənə yarım pistol. Sabah görüşərik!

D'Artanyan atdan düşüb cılovu Planşeyə atdı və plaşa bürünüb sürətlə getdı.

Ağası gözdən ıtən kımi, Planşe "Aman Allah, nə soyuqdur!" deyə səsləndi.

O, qızınmağa tələsdiyindən, şəhər kənarındakı meyxanalara bənzər bir evin qapısını döydü.

Bu zaman d'Artanyan qəsəbəyə sarı dönüb irəli getməkdə idi. Nəhayət, o, Sen-Kluya çatdı. Lakin böyük yol ilə getmək əvəzinə sarayın yanından keçib, tənha bir dalana döndü, bir azdan sonra tamamilə boş bir yerdə olan və məktubda ona göstərilmiş pavilyonun qarşısında durdu. Pavilyonun yaxınlığında olan divar dalanın bir tərəfini uzununa bütün tutmuşdu. O biri tərəfdən isə təbii kolların əmələ gətirdiyi çəpər kiçik bağçanı yolçulardan qoruyurdu. Bağın içərisində yoxsul bir daxma var idi.

D'Artanyan görüş təyin edilən yerə gəlib çıxdı. Öz gəldiyini bir əlamətlə bildirməsi tapşırılmadığından səbirlə gözləməyə başladı

Ancaq d'Artanyanın qəlbi şad idi. Görüş saatı yaxınlaşırdı.

Doğrudan da, bir neçə dəqiqə sonra Sen-Klu qülləsinin saatı ağır-ağır on zərbə vurdu.

Bu tunc səsində nə isə məşum bir şey var idi. Ancaq d'Artanyanın gözlədiyi saatın bir hissəciyi olan hər zərbə cavan oğlanın qəlbində fərəh oyadırdı. Onun gözləri kiçik pavilyona zillənmişdi. Pavilyonun bütün pəncərələrinin dal qapıları örtülü idi. Yalnız ikinci mərtəbədə qapıları açıq bir pəncərə var idi. Bu pəncərədən düşən zəif işıq evin qabağında olan parkın içərisində yarımdairə şəklində bitmiş iki-üç ağacın yarpaqlarını gümüşü rəngə boyamışdı. Yəqin k, belə mehriban işıq saçan bu kiçik pəncərənin ardında gözəl xanım Bonasye onu gözləyirdi.

Bu şirin xəyal ilə təsəlli tapan d'Artanyan əsla səbirsizlik əlaməti göstərmədən, gözlərini bu kiçik və gözəl binaya zilləyib yarım saat gözlədi. Pəncərədən otağın zərli bəzəklərlə naxışlanmış tavanının bir hissəsi görünür və bu, pavilyonun müxəlləfatının çox zərif olduğunu sübut edirdi.

Sen-Klu qülləsinin saatı on birin yarısını vurdu.

Bu dəfə d'Artanyanın damarlarından bir titrəyiş keçdi. Bəlkə də o, üşüməyə başlayırdı və bu fiziki duyğunu səhvən mənəvi həyəcan hesab edirdi.

Sonra bu qərara gəldi ki, görüş saat on birə təyin edilmişdir. Bəlkə məktubu oxuyanda səhv edibmiş?..

O, pəncərəyə yaxınlaşıb kağızı cibindən çıxartdı, bir də oxudu. Səhv etməmişdi. Görüş saat ona təyin edilmişdi.



O yerinə qayıtdı. Səssizlik və tənhalıq onu narahat etməyə başladı.

Saat on biri vurdu.

D'Artanyan xanım Bonasyenin başına bir fəlakət gəldiyindən nigaran qalıb, doğrudan da, narahat olmağa başladı.

O, sevgililərin ümumi işarəsi olan qayda üzrə üç dəfə əl çaldı. Ancaq buna cavab verən olmadı. Hətta əks səda da eşidilmədi. Onda cavan incimiş halda elə güman etdi ki, gənc qadın onu gözləyə-gözləyə yuxuya getmişdir.

O, divara yaxınlaşıb dırmaşmaq istədi Ancaq divarı yenicə malalamışdılar və d'Artanyan əbəs yerə dırnaqlarını qırıb tökdü.

Bu zaman o, işıqdan gümüşü rəng almış ağaclara diqqət yetirdi. Yolun lap ağzında uca bir ağac bitmişdi. Güman etdi ki, bu ağacın budağından pavilyonun içərisini görmək olar Ağaca çıxmaq çətin bir iş dyeildi Bundan başqa iyirmi yaşında olan d'Artanyan məktəbdə oxuduğu zaman məşğul olduğu əyləncələri yadında yaxşı saxlamışdı. Bir anda o, ağacın ən uca budağına çıxdı.

D'Artanyanın gözləri qarşısında qəribə bir mənzərə göründü. Bu, zərif işıq, bu sakit lampa dəhşətli bir talan mənzərəsini işıqlandırırdı. Pəncərənin şüşələrindən biri sınmışdı. Yarı sınmış qapı həncamalarından asılı qalmışdı. Üstündə görünür ki, zərif bir axşam yeməyi süfrəsi hazırlanmış masa böyrü üstə yıxılmışdı. Döşəmədə sınmış şüşələr, ayaq altında əzilmiş meyvələr görünürdü. Bu otağın içində olan hər bir şey burada inadlı və möhkəm bir mübarizə getdiyini göstərirdi. D'Artanyanın gözlərinə bu qəribə səliqəsizlik içərisində hətta cırılmış paltar parçaları, süfrə və pərdələrdə bir neçə qan ləkəsi də görünürdü.

O tələsik ağacdan yerə atıldı, ürəyi şiddətlə döyünürdü. Daha başqa cinayət əlamətləri olub-olmadığını axtarmaq istədi.

Sakit bir gecədə zərif işıq hələ də parıldamaqda idi. D'Artanyan əvvəlcə diqqət yetirmədən bir şey gördü. Yumşalmış və bellənmiş torpaqda aydın olmayan insan və at ləpirləri vardı. Bundan başqa, görünür Paris tərəfdən gəlmiş bir karetanın təkərləri yumşaq torpaqda dərin iz buraxmışdı. Bu iz pavilyondan o tərəfə getməyib yenə Parisə dönmüşdü.

Nəhayət, d'Artanyan axtarışlarına davam edərək, divarın dibində cırılmış bir qadın əlcəyi tapdı. Əlcəyin palçıqlı yerə toxunmamış hissəsi tərtəmiz idi.

D'Artanyan bu axtarışlarına davam etdiyi müddətdə alnını soyuq tər basmışdı. Qəlbi böyük bir həyəcanla sıxılırdı, nəfəsi tutulurdu, lakin o, sakıt olmaq üçün özünü inandırmağa çalışırdı ki, bu pavilyonun xanım Bonasye ilə heç bir əlaqəsi yoxdur. Cavan qadın onunla pavilyonun içində deyil, qabağında görüş təyin etmişdi. Bəlkə xidmət işləri, bəlkə də hətta ərinin qısqanclığı onun Parisdən çıxıb gəlməsinə mane ola bilərdı.

Lakin bəzi hallarda bütün varlığımıza hakim olub bizi müdhiş bir fəlakətin gözlədiyini xəbər verən daxili bir narahatlıq hissi onun bütün bu düşüncələrini alt-üst edirdi.

D'Artanyan özünü tamamilə itirdi. O, böyük yola tərəf yüyürüb bərəyə çatdı və bərəçidən sorğu-sual etməyə başladı.

Bərəçi xəbər verdı ki, axşam saat yeddi radələrində Sena çayından qara plaşa bürünmüş bir xanımı bu taya keçirmişdir. O, görünür tanınmamağa çalışırmış, buna görə də bərəçi ona xüsusi diqqət yetirmiş, cavan və gözəl bir qadın olduğunu görmüşdü. İndi olduğu kimi o zamanlar da bir çox gənc və gözəl qadınlar tanınmamağa çalışaraq Sen-Kluya gələrdilər. Bununla bərabər, d'Artanyan əsla şübhə etmirdi ki, bərəçinin dediyi qadın xanım Bonasye imiş.

D'Artanyan bərəçinin daxmasında yanan lampanın işığında xanım Bonasyenin məktubunu bir də oxudu və arxayın oldu ki, səhv etməmişdir. Görüş Sen-Kluda cənab d'Estrenin pavilyonunun qabağında təyin edilmişdi.

Hissiyyatı onu aldatmırdı. Böyük bir fəlakət baş vermişdi.

O geri dönüb qaçaraq qəsrin yanına gəldi.

Döngə əvvəlki kimi tənha idi. Pəncərədə həmin sakit və zərif işıq parlamaqda idi.

D'Artanyan qəsrin qabağında olan səssiz-səmirsiz, lal-kar daxmanı yadına saldı. Bu daxma hər halda bəzi şeylər görmüşdü. Bəlkə bir şey söyləyə bilərdi də.

Çəpərdə olan qapı bağlı idi. Lakin d'Artanyan zəncirli köpəyin hürməsinə baxmayıb barıdan atıldı və daxmaya yaxınlaşdı.

O, pəncərəni döydü, əvvəlcə cavab verən olmadı. Pavilyonda olduğu kimi, daxmaya da ölü bir sakitlik çökmüşdü. Ancaq bu daxma onun son ümidi idi və o, pəncərəni döyməyə davam etdi.

Bir az sonra içəridən xəfif və qorxaq bir səs eşidildi. Sanki bu səs eşidilməkdən çəkinirdi.



D'Artanyan pəncərəni döyməkdən əl çəkib həyəcanlı, inandırıcı, qorxu dolu və mehriban, yalvarıcı bir səslə elə xahiş etməyə başladı ki, ən qorxaq bir adam da bundan çəkinməyə bilərdi. Nəhayət, köhnə, yarıçürümüş pəncərə açıldı, daha doğrusu, azacıq aralandı və həmin saat örtüldü. Bucaqda yanan tutqun bir lampanın işığı d'Artanyanın gərdənliyini, qılıncının və tapançalarının dəstələrini aşkara çıxartdı. D'Artanyan bir qocanın başını görə bildi. Həmin qocaya müraciətlə dedi:

– Allah xatirinə, mənim sözlərimi dınləyin! Mən bir adam gözləyirdim, o gəlib çıxmamışdır, nigaranlıqdan ölürəm. Sizin qonşuluğunuzda bir fəlakət üz verməyib ki?

Pəncərə ağır ağır aralandı və həmin üz yenidən göründü. Lakın onun rəngi əvvəlkindən daha çox ağarmışdı.

D'Artanyan səmimi bir ifadə ilə əhvalatı ona danışdı. Cavan bir qadının onunla bu pavilyonun qarşısında görüş təyin etdiyini, onun qadını gözlədiyini, ağaca çıxdığını və lampanın işığında talan edilmiş otağı gördüyünü bir-bir nağıl etdı.

Qoca onun sözlərını dıqqətlə dınlədi. D'Artanyan danışıb qurtardıqda qoca başını yırğaladı.

Sız nə demək ıstəyırsiniz? d'Artanyan çığırdı. – Allah xatirinə, ızah edin!

Qoca dedi:

– Ax, ey cənab, məndən heç bir şey soruşmayın; çünki gördüklərimi sizə söyləsəm, xeyir görmərəm.

D'Artanyan soruşdu:

Deməli, siz nə isə görübsünüz? Allah xatirinə, elə isə, – o, qocaya bir pistol tullayıb davam etdi. – Gördüklərınizi danışın, sizə bir əsilzadə kimi söz verirəm ki, sirrinizi heç kəsə açmaram.

Qoca d'Artanyanın səsində səmimi bir kədər olduğunu duydu. Ona inanıb aşağıdakı əhvalatı danışdı.

Axşam saat doqquz radələrində mən küçədən hay-küy eşitdim. Nə olduğunu bilmək üçün qapıya yanaşdıqda, gördüm ki, bir neçə adam daxmama girmək istəyir. Mən yoxsul bir adamam və oğrulardan qorxum yoxdur. Qapını açdım və bir neçə addımlıqda üç adam gördüm. Qaranlıqda at qoşulmuş bir kareta və bir neçə at durmuşdu. Atlar, yəqin ki, əyinlərində süvari paltarı olan bu kişilərin ıdı. – Möhtərəm cənablar, deyə dilləndım, – nə istəyirsiniz? – Onların

başçısı olduğu anlaşılan bir adam mənə dedi: “Yəqin sizdə nərdivan var”. Bəli, cənab. – “Onu bizə ver, özün də evinə qayıt. Zəhmətin üçün, budur, sənə bır ekü verirəm. Əvvəla, mənə məlumdur ki, səni nə qədər hədələsək də, hər halda baxacaq və dinləyəcəksən. Ancaq yadında saxla ki, əgər sən gördüyün və eşitdiklərin barədə bircə kəlmə danışmış olsan, özünü ölmüş bıl”. Bu sözləri deyib o mənə bir ekü tulladı və nərdivanı götürüb getdi. Doğrudan da, onların ardınca qapını bağlayıb, özümü elə göstərdim ki, guya evimə qayıdıram. Ancaq dal qapıdan qaranlıqda gizlincə kolun dibinə yaxınlaşdım və gördüm. Kareta səssizcə yaxınlaşdı. İçındən qısa boylu, yoğun, saçları çallaşmış və əynində tünd rənglı xeyli ucuz paltar olan bır kişi düşdü. Ehtiyatla nərdivana çıxıb otağın içinə baxdı və səssizcə aşağı enib pıçıltı ilə dedi: “Özüdür ki, var” Bundan sonra onların başçısı pavilyonun qapısına yanaşıb açarla açdı və ıçəri girib yox oldu. Həmın bu zaman qalanları nərdivanla çıxmağa başladılar. Qoca kışı karetanın qapısında dayandı, sürücü cilovları əlində tutmuş, nökər də atları saxlamışdı. Bırdən pavilyondan bərk çığırtı eşıdılməyə başladı. Bir qadın pəncərənin qabağına yüyürüb özünü bayıra atmaq istəyirmiş kimi pəncərəni açdı; ancaq bayırda iki kişını görüb gerı qayıtdı. Bunlar da onun ardınca otağa soxuldular. Mən daha heç bir şey görmədim. Ancaq vurub sındırdılan ev müxəlləfatı taqqıltısı eşıdirdim. Arvad çığırtı ilə imdada çağırırdı. Ancaq bir azdan sonra onun səsi kəsildi, iki kişi qadını gətirib karetaya qoydu. Qoca da onun dalınca mindı. Pavilyonun içərisində qalan adam pəncərəni örtdü. Sonra da çıxdı. Qadının artıq karetada olduğunu yəqin etdikdən sonra o atılıb atın yəhərinə mindi. Nökər sürücünün yanında oturdu. Kareta üç atlının müşayiətilə sürətlə hərəkət etdi, bir dəqiqə sonra gözdən itdi. O dəqiqədən bəri mən artıq heç bir şey görüb eşitmədim

Bu dəhşətli xəbərdən dili-ağzı qurumuş d’Artanyan bircə kəlmə də dinmədi. Onun qəlbində qəzəb və qısqanclıq iblisləri coşub-daşmaqda idi.

Bura baxın, cənab, – qoca davam etdi, - məyus olmayın. Onlar qadını öldürmədilər, bu isə, ən mühüm məsələdir.

D’Artanyan soruşdu:

– Siz, təxminən də olsa, bilirsinizmi ki, bu amansız işlərin başçısı kımdır?

Əlbəttə, bilmirəm.



– Axı sız ki, onunla danışıbsınız, onu görübsünüz!

- Deməli, siz istəyırsınız mən onun əlamətlərini söyləyim?

Bəlı

- Uca boylu, arıq, qaraşın, qara bığlı, qara gözlü, zahirən əsilzadəyə bənzəyən bir adamdı.

– Özüdür ki, var, – d’Artanyan çığırdı. Yenə həmin o adam! Hər yerdə ona rast gəlirəm! O mənim iblisimdır! Bəs o bırısı?

Hansı?

- Gödək boylu adam.

Yox, sizə söz verirəm ki, o əyan-filan deyildi. Heç qılıncı da yox idi. Onunla çox saymazyana rəftar edirdılər.

- Yəqin ki, nökərdən zaddanmış, d’Artanyan mırıldandı. Of, yazıq qadın, yazıq qadın! Görəsən onun başına nə gətirdilər?

Qoca dedi:

Siz söz veribsiniz ki, məni ələ verməyəcəksiniz.

– Öz vədimı təkrar edirəm, arxayın olun, mən əsilzadəyəm. Əsilzadənin sözü bir olar.

D’Artanyan çox qəmgin və məyus halda bərəyə sarı yönəldı. Bəzən ona elə gəlirdi ki, bu qadın xanım Bonasye deyilmiş. O, min cür müəmma içində çaşıb qalır, iztirab çəkir və məyus olurdu

“Ax, heyf, gərək dostlarım yanımda olaydılar! Heç olmazsa o zaman xanımı axtarıb tapmağa ümid bəsləyə bılərdım. Ancaq kım bilir, onun başına nələr gəlmişdir.”

Gecə yarı olardı. D’Artanyan Planşeni axtarmağa getdi. Ancaq işıq gələn bütün meyxanaların qapısını döydüsə də, heç bir şey çıxmadı. Planşe onların heç birındə yox idi.

Altıncı meyxananın qabağına çatdıqda d’Artanyan başa düşdü ki, bu axtarışlarının bir faydası olmayacaq. O, nökərinə tapşırmışdı ki, səhər saat altıda gəlsin. O vaxta qədər onu axtarıb tapmağa heç bir ümid yox idi.

Cavan oğlanın başına belə bir fikir gəldi ki, həmin hadisənin baş verdiyi yerin yaxınlığında qalmaqla bəlkə də bu əsrarəngiz ış barəsində bir şey öyrənə bilər. D’Artanyan altıncı meyxananın qapısında dayandı, sonra içəri girib bir şüşə yaxşı şərab istədi. Ən qaranlıq bir guşədə oturdu və səhərə qədər gözləməyi qərara aldı. Ancaq bu dəfə onun ümidi boşa çıxdı. Meyxanada nökər və faytonçuların söyüşmə, zarafatlaşma və hay-küylərindən başqa yazıq qaçırılmış qa-

dının izini tapmasına kömək edə biləcək heç bir şey eşitmədi. Qeyri-ixtiyarı bir şüşə şərabını içib, oturduğu guşədə mümkün qədər rahat yerləşib, yuxuya getməkdən başqa çarəsi qalmadı. D'Artanyanın yaşı iyirmi olardı. Bu yaşda yuxu insan bədəninə hökmranlıq edir və ən məyus zamanlarda da bu hökmranlığını yerinə yetirir.

Səhər saat altı radələrində d'Artanyan yuxudan ayıldı. O, pis keçirilmiş yuxudan sonra, həmişə olduğu kimi, bədənində bir ağırlıq hiss etdi. Yatdığı zaman onu soyub-soymadıqlarını bilmək üçün əllərilə üst-başını yoxladı. Üzüyünü barmağında, pul kisəsini cibində və tapançalarını belində görüb arxayın oldu. Ayağa qalxıb içdiyi şərabın pulunu verdi və səhər öz nökərini axtarmaq işində gecəkindən müvəffəqiyyətlı olmaq ümidi ilə bayıra çıxdı. Doğrudan da, o, səhərin rütubətli və dumanlı havasında sədaqətli Planşenin iki atın cilovundan tutub uçuq-sökük bir meyxananın qapısı ağzında durduğunu gördü. D'Artanyan gecə neçə dəfə bu meyxananın qapısından keçmiş, lakin onu heç seçməmişdi.

## XXV

## PORTOS

D'Artanyan birbaş evinə getmək əvəzinə de Trevilin evinin qabağında atdan düşdü və sürətlə pillələri çıxdı. Bu dəfə o, bütün əhvalatı cənab de Trevilə danışmağı qərara almışdı. Şübhəsiz ki, cənab de Trevil ona ağıllı məsləhətlər verə bilərdi. Bundan başqa, cənab de Trevil hər gün kraliça ilə görüşdüyündən, ülyahəzrət kraliçadan o yazıq qadın barəsində bir şey eşitmiş ola bilərdi. Şübhə yoxdur ki, bu qadın öz hökmdar xanımına sədaqətli xidmət etdiyi üçün indi bu cəzanı çəkirdi.

Cənab de Trevil cavan oğlanın danışdığı əhvalatı böyük bir ciddiyyətlə dinləndi. Bu da göstərirdi ki, bu hadisəni sadəcə, aşiqanə bir macəra hesab etmirdi. D'Artanyan sözlərini qurtardıqda cənab de Trevil dedi:

Bəli, bu işdə yəqin ki, kardinalın əli var.

D'Artanyan soruşdu:

– Yaxşı, bəs necə edək?



İndi heç bir şey etmək olmaz. Hamısından yaxşısı budur ki, sizə söylədiyim kimi mümkün qədər tezliklə Parisdən çıxıb gedin. Mən kraliça ilə görüşüb xanım Bonasyenin yox olmasını təfsilatı ilə ona danışaram; yəqin onun bu işlərdən xəbəri yoxdur. Bu təfsilat sayəsində kraliça yəqin bir iz tapar və siz qayıtdıqdan sonra, bəlkə də, mən sizə xoş bir xəbər söyləyə bilərəm. Mənə arxayın olun.

D'Artanyan bilirdi ki, de Trevil boş-boşuna vədə verən adamlardan deyil. Cavan oğlan həm keçmişdəki, həm də gələcəkdəki yaxşılıqlarına görə qəlbi minnətlə dolu bir halda ona təzim etdi. Bu cavan, cürətli və qətiyyətlı oğlanın həyatında fəal iştirak etmiş olan ləyaqətli kapitan isə onun əlini dostcasına sıxıb yaxşı yol arzuladı.

D'Artanyan cənab de Trevilin məsləhətindən istifadə etməyi qərara alıb, həmin saat Məzarçılar küçəsindəki evinə getdi ki, çamadanların yığışdırılmasına nəzarət etsin. Həmin xanımın evinə yaxınlaşdıqda cənab Bonasyeni qapı ağzında, əynində xalat durmuş gördü. Dünən ehtiyatlı Planşenin həmin bu ev sahibinin hiyləgər olması barəsindəki sözlərini yadına saldı və ona həmişəkindən daha artıq bir diqqətlə nəzər yetirdi. Doğrudan da, Bonasyenin üzündə ödün yayılması əlaməti olan sarımtıl bir solğunluqdan başqa bir də hiyləgərlik və rəzalət əlamətlərini gördü.

Bu adama nifrət duyduğundan, onunla danışmadan ötüb keçmək istədi. Ancaq dünən olduğu kimi, cənab Bonasye özü onu səsləyib dedi:

– Hə, cavan oğlan, deyəsən, gecələrimizi pis keçirmirik, axı! Lənət şeytana, axı səhər saat yeddidir! Mənə elə gəlir ki, siz başqaları evdən çıxdıqları zaman evə qayıtmağı adət etmişsiniz.

Cavan oğlan ona cavab verdi:

– Cənab Bonasye, sizi isə belə bir şeydə təqsirləndirmək olmaz. Siz hər barədə mötədil bir insan idealısınız. Doğrudur, arvadı gözəl olan bir adam üçün səadət dalınca qaçmağa ehtiyac yoxdur; çünki xoşbəxtlik özü onun ayağına gəlmişdir, elə deyilmi, cənab Bonasye?

Bonasyenin rəngi ölü kimi ağardı, o ağzını əyib gülə-gülə cavab verdi:

Yaman zarafatçısınız ha! Bu gecə harada veyllənirdiniz? Axı qaranlıqda aralıq yollarda gəzmək çox da xoşa gələn bir şey deyil.

D'Artanyan palçığa bulaşmış çəkmələrinə baxdı və eyni zamanda tacirin ayaqqabılarını və uzunboğaz corablarını da gördü. Deyəsən onlar da həmin gölməçələrə girmişdi; həm d'Artanyanın çəkmələrində, həm də tacirin ayaqqabı və corablarındakı ləkələr eyni ləkələr idi.

Bu zaman d'Artanyanın ağlına gələn ani bir fikir onu heyrət içində qoydu. Deyəsən əynində tünd rəngli paltar olan, qısa boylu, yoğun, saçları ağarmış nökərə bənzəyən və atlıların saymazyana rəftar etdikləri adam həmin bu Bonasye imiş. Ər öz arvadının qaçırılmasına rəhbərlik edirmiş.

D'Artanyan dəhşətlə istədi ki, bu adamın boğazından yapışıb boğsun. Ancaq əvvəlcədən söyləmişdik ki, bu cavan qaskoniyalı çox tədbirli bir oğlan idı. O, özünü saxladı.

Ancaq üzü elə doyişdi ki, Bonasye qorxuya düşdü və bır addım geri çəkilmək istədı. Lakin o, qapının bağlı tayının qabağında durduğundan geri çəkılə bilmədi.

D'Artanyan dedi:

Bəsdir, zarafat etdiniz, əzizim. Mənə elə gəlir ki, əgər mənim çəkmələrimı təmizləmək lazım isə, sizin də ayaqqabı və corablarınızı təmizləməyiniz heç pis olmaz. Cənab Bonasye, deyəsən, siz də şəhər kənarında bır yerə gəzməyə gedıbmişsiniz? Lənət şeytana! Siz yaşda bir adama, həm də ki, elə gözəl arvadı olan bır adama belə işlər əsla yaraşmaz.

Bonasye dedı:

– Yox, yox, Allah eləməsın! Mən dünən xıdmətçı qadın barəsində məlumat almaq üçün Sen-Mandeyə getmişdim. Yol yaman pis ıdı, gördüyünüz kimi, ayaqlarım bulandı və hələ də vaxt tapıb təmızləyə bilməmişəm.

Bonasyenin göstərdiyi yer d'Artanyanın şübhəsini daha da artırdı. Bonasye Sen-Mandenin adını çəkdi; çünkı Sen-Mande Sen-Klunun tamamilə əksi tərəfində olan uzaq bir yer idı.

Deməli, Bonasye arvadının harada olduğunu bilirdi. Yəqın kı, bu taciri bir az bərk qısnasaydı, onun dilini açmaq və sırrını söyləməyə məcbur etmək mumkün olardı.

D'Artanyan dedi:

- Əzizım cənab Bonasye, sizinlə belə sadə rəftar etdıyımə görə məni bağışlayın. Adam yuxusuz qalanda yaman susayır, mən də indi bərk susamışam. İcazə verin sizin otaqda bir stəkan su içim. Yəqin kı, öz qonşunuzun bu xahişini rədd etməzsiniz.

D'Artanyan bu sözlərdən sonra ev sahibinin icazəsini gözləmədən, evə girib yatağa bır nəzər saldı. Yataq əsla əzilməmişdı. Deməli, Bonasye bu gecə yatmamışdı. Yəqin ki, o da yenicə qayıdıb gəlmişdı.



Əlbəttə, o öz arvadını apardıqları yerə və ya heç olmazsa birinci mənzilə qədər ötürmüşdü.

D'Artanyan bir stəkan su içib dedi:

- Sağ olun, cənab Bonasye. Mənim sizdən istədiyim elə bircə bu idi. İndi öz mənzilimə gedim Planşeyə tapşıraram ki, çəkmələrimi təmizləsin Əgər arzu etsəniz, tapşırım mənimkiləri silib qurtardıqdan sonra gəlib sizin ayaqqabılarınızı da təmizləsin.

Pıllə başında d'Artanyan Planşeyə rast gəldi. O, çox həyəcanlı idi:

Ah, cənab, Planşe ağasını görən kimi çığırdı. –Yenə təzə xəbər var!

– Nə var kı? d'Artanyan soruşdu.

And ıçırəm kı, siz burada olmayanda bura kimin gəldiyini tapa bılməzsınız.

Saat neçədə?

Yarım saat əvvəl, siz cənab de Trevılin yanında olduğunuz zaman.

– Axı kim gəlmişdi? Tez söylə görüm!

Cənab de Kavua.

Kardınal həzrətlərinin qvardiya kapitanımı?

Özüdur ki, var.

– O mənı həbs etməyəmi gəlmişdı?

Onun şırın-şırin danışdığına baxmayaraq mənə elə gəlir ki, bunun üçun gəlmışdi.

Deyirsən ki, şirın-şırın danışırdı?

Lap bal kimı, cənab?

– Doğrudanmı?

O deyırdi ki, sizə xüsusi hörmət bəsləyən kardinal həzrətlərı tərəfindən sizı Pale-Royala dəvət etməyə gəlmişdir.

Bəs sən nə cavab verdin?

– Mən dedım kı, siz evdə yoxsunuz.

Bəs buna nə dedi?

- O, sizdən xahiş etdı ki, necə olsa, gündüz onun yanına gedəsiniz. Sonra pıçıltı ılə əlavə etdi: "Öz ağana söylərsən ki, kardinal həzrətləri ona xüsusı rəğbət bəsləyir və çox ola bilər ki, onun gələcək mənsəbi bu görüşdən asılıdır".

Çox da məharətlə qurulmuş bir tələ deyil. Kardinal bundan daha mürəkkəb bir şey düzəldə bilərdı, – cavan oğlan gülümsəyərək cavab verdi

Mən də bunu başa düşüb cavab verdim ki, siz evə qayıtdığınız zaman onunla görüşmədiyinizə çox təəssüf edəcəksiniz. Cənab de Kavua məndən soruşdu: "Bəs o, hara getmişdir?" Mən cavab verdim ki, - Truaya, Şampana. – "Nə vaxt getmişdir?" – Dünən axşam.

– Dostum Planşe, d'Artanyan onun sözünü kəsdi, – doğrusu, sənin heç qiymətin yoxdur.

– Bilirsinizmi, cənab, mən güman etdim ki, əgər siz cənab de Kavua ilə görüşmək istəsəniz, çox asanlıqla ona söyləyə bilərsiniz ki, heç bir yana getməmişsiniz. Bu halda mən yalançı çıxmış olardım. Mən isə əsilzadə deyiləm və yalan danışa bilərəm.

Arxayın ol, Planşe. Sən doğruçu bir adam olaraq qalacaqsan. On beş dəqiqə sonra biz yola düşürük.

– Mən də sizə elə bunu məsləhət görmək istəyirdim, cənab. Soruşmaq olarmı ki, hara gedirik?

– Aydındır ki, sənin məni göndərmiş olduğun yerin əksi tərəfinə. Bir də mənə elə gəlir ki, mən Atos, Portos və Aramisi görmək istədiyim kimi, sən də Qrimo, Muşketon və Bazeni görmək istəyirsən.

Planşe dedi:

Əlbəttə, cənab. Hara buyursanız, getməyə hazıram. İndiki halda, çöl-bayır havası bizim üçün Paris havasından sağlamdır; çünki...

– Ona görə də tez ol, Planşe, şeyləri yığışdır, gedək. Mən heç bir şübhə oyatmamaq üçün əllərimi cibimə qoyub qabaqca piyada gedəcəyəm. Sən dalımca atları gətirib qvardiyaçılar qışlasının yanına gələrsən. Bir də ki, Planşe, bizim ev sahibi barəsində düşündüklərin doğru imiş. O, doğrudan da, çox alçaq bir adammış.

Mənə inanın, cənab, mənim sözlərimə inanın. Mənim sima elmindən bir az başım çıxır.

Şərtləşdikləri kimi, d'Artanyan əvvəlcə çıxıb getdi.

Sonra özünü heç bir şeydə müqəssir görməmək üçün, axırıncı dəfə üç dostunun evlərini gəzdi. Onlardan heç bir xəbər yox idi. Yalnız Aramisin adına zərif, gözəl bir xətt ilə yazılmış və ətirlənmiş bir məktub gəlmişdi. D'Artanyan bu məktubu aparıb sahibinə çatdırmaq üçün götürdü. On dəqiqədən sonra Planşe gəlib qvardiyaçılar qışlasının yanına çıxdı. D'Artanyan artıq öz atını yəhərləyirdi.

Planşe yükü atın belinə bağladıqda d'Artanyan ona dedi:

– Yaxşı, indi qalan üç atı yəhərlə gedək.

Planşe zarafatla soruşdu:



Elə bilirsiniz ki, hərəmizin iki atı olsa daha sürətli gedərik?

Yox, d'Artanyan cavab verdi. Ancaq biz üç dostumuzu sağ-salamat tapsaq, onları dörd atla gətirib gələ bilərik.

Planşe cavab verdi:

Bu, çox gözəl bir müvəffəqiyyət olar. Ancaq heç bir zaman Allahın mərhəmətindən şübhələnmək lazım deyil.

– Amin! d'Artanyan cavab verib atına mindi.

Qvardiyaçılar qışlasında onlar ayrılıb hərəsi bir tərəfə getdi. Parisdən biri Lavil'et qapısından, o birisi isə Monmartr qapısından çıxmalı idi. Sen-Denidən o tərəfdə birləşməyi qərara almışdılar. Bu strateji hərəkət böyük bir dürüstlüklə yerinə yetirilib müvəffəqiyyətlə başa çatdırıldı. D'Artanyan ilə Planşe ikisi də bir vaxtda gəlib Pyerfittə çatdılar.

Qeyd etmək lazımdır ki, Planşe gecəyə nisbətən gündüz daha cəsarətli idi. Ancaq heç bir zaman ehtiyatkarlığı unutmazdı. Birinci səyahətlərində başlarına gələn təhlükələrin heç birini yadından çıxarmamışdı. Ona görə də rast gələn hər bir adamı düşmən hesab edirdi. Bu səbəbdən Planşe bütün yol uzun şlyapasını əlində hazır tutmuşdu. Bunun üstündə d'Artanyan onu yaman danladı. O qorxurdu ki, Planşenin həddindən artıq hörmətkar olmasına görə, onu əhəmiyyətsiz bir adamın nökəri hesab etsinlər.

Ancaq ya yoldan ötənlər, doğrudan da, Planşenin nəzakətinə məftun olmuşdular, ya da bu dəfə yollarda pusqu yox idi, hər halda yolçular heç bir maneəyə rast gəlmədən Şantilyaya çatdılar və birinci səyahətlərində düşdükləri "Böyük Men-Marten" meyxanasına düşdülər.

Meyxana sahibi, yanınca iki at gətirən bir nökərlə bərabər gələn cavan oğlanı görüb, onu qapı ağzında hörmətlə qarşıladı. On bir lye yol gəlmiş d'Artanyan Portosun burada olub-olmadığına baxmadan bu meyxanada qalmağı qərara almışdı. Bir də ki, gələr-gəlməz muşketyor barəsində sorğu suala başlamaq ehtiyatsız bir hərəkət olardı. Buna görə də d'Artanyan heç kəs barəsində soruşmadan atdan düşdü, atları nökərə verib ümumi salonda oturmaq istəməyən yolçulara məxsus kiçik bir otağa keçdi və meyxana sahibindən ən əla şərab ilə ən əla bir yemək istədi.

Əmrləri dərhal yerinə yetirildi. Qvardiya alayında krallığın ən yaxşı əsilzadə nəsillərinə mənsub cavanlar xidmət edərdi. Buna görə

də yanında nökəri və gözəl atlar olduğu halda gələn d'Artanyan, paltarının sadəliyinə baxmayaraq, meyxanada çox yaxşı bir təsir bağışlamışdı. Meyxana sahibi özü ona xidmət edirdi. D'Artanyan bunu görüb iki stəkan tələb etdi və aşağıdakı söhbəti başladı:

– Əzizim, d'Artanyan hər iki stəkanı doldurub meyxana sahibinə müraciət etdi, mən sızdən ən əla şərab istədim. Əgər siz məni aldatmışsınızsa, bunun cəzasını özünüz də çəkəcəksiniz; çünki mənim tək içməkdən zəhləm gedir. Siz də mənimlə içəcəksiniz. Stəkanı götürün, içək. Heç bir kəsin izzəti-nəfsinə toxunmamaq üçün kimin sağlığına içək? İçək sizin meyxananın varlanması eşqinə.

Meyxana sahibi cavab verdi:

Bu mənim üçün böyük bir şərəfdir. Bu arzunuza görə siz cənaba ürəkdən təşəkkür edirəm.

D'Artanyan dedi:

– Ancaq gözləyin səhv etməyəsiniz; çünki mənim dediyim bu sağlıqda, bəlkə də, sizin zənn etdiyinizdən daha artıq bir xudbinlik var. Yalnız işləri yaxşı gedən mehmanxanalarda isə, qonağı hər cür gəldi qarşılayırlar və yolçu mehmanxana sahibinin puldan çətinlik çəkməsinin qurbanı olur. Mən isə çox səyahət etdiyimdən və çox zaman bu yol ilə gəlib-getdiyimdən, arzu edərdim ki, sizin meyxananız varlı bir meyxana olsun.

Meyxana sahibi dedi:

Doğrudan da, mənə elə gəlir ki, siz cənabı görmək şərəfinə nail olduğum ılk dəfə deyildir.

– Əlbəttə! Mən azı on dəfə Şantilyaya getmişəm və üç-dörd dəfə sizin meyxanada qalmışam. Gərək ki, on-on iki gün bundan əvvəl bura düşmüşdüm. Öz dostlarım – muşketyorları ötürürdüm. Yadınızda varmı? Onlardan biri onu təhqır edən kənar bir adamla mübahısəyə başladı.

Əlbəttə, yadımdadır! meyxana sahibi cavab verdi Lap yaxşı yadımdadır. Siz gərək ki, cənab Portosu deyirsiniz, eləmi?

Bəli, mənim yoldaşımın adı Portos idi. Ümid edirəm kı, onun başına bir iş gəlməmişdir, deyilmi?

– Ancaq, cənab, bilirsiniz ki, o, yoluna davam edə bilməmişdi.

Doğrudur, o söz vermişdi gəlib bizə çatsın, ancaq onu bır də görə bilmədik.

- O, bizim meyxanada qalmaqla buranı şərəfləndirmişdir.



Necə?

- Bəlı, cənab. O, bizim meyxanadadır və biz çox narahatıq.

Nə üçün?

– Çünki bızə bır az borcludur.

O, bütün borcunu ödəyər.

- Ah, cənab, siz mənim yaralarıma məlhəm qoyursunuz. Biz ona inanıb xeylı nisyə vermişik. Bu gün səhər isə bizim doktor xəbər verdi ki, əgər cənab Portos onun pulunu verməsə, öz pulunu məndən tələb edəcəkdir; çünki onu mən çağırtdırmışam.

– Məgər Portos yaralıdırmı?

Bunu sizə söyləyə bilmərəm, cənab.

Necə söyləyə bilməzsiniz? Axı siz bunu hamıdan yaxşı bilməlisiniz.

– Ancaq bizim peşəmiz elədir ki, bildiyimiz hər şeyi söyləyə bilmərik, cənab. Bir də ki, dilimizin cəzasını qulaqlarımızın çəkəcəyi barədə bizi xəbərdar edəndən sonra dilimiz qısa olmalıdır.

– Yaxşı! Mən Portosu görə bilərəmmi?

- Əlbəttə, cənab, pilləkənlə ikinci mərtəbəyə qalxın və birinci nömrənin qapısını döyün. Ancaq özünüzü əvvəlcə nişan verin.

Özümü əvvəlcə nişan verim?

– Bəli; çünki nişan verməsəniz böyük bir fəlakətə düçar ola bilərsiniz.

– Nə cür fəlakətə?

– Cənab Portos elə bilər ki, siz mənim ev adamlarımdan birisiniz. Qəzəblənib sizi ya güllə, ya da qılıncla vura bilər.

Axı siz ona neyləyibsiniz kı?

- Biz ondan pul istəmişik.

– Aha, lənət şeytana! Başa düşdüm. Portosun belə şey xoşuna gəlməz. Xüsusən pulu olmadıqda... Ancaq mən qəti bilirəm ki, onun pulu var.

Biz də elə güman edirdik, cənab. Biz bir qayda üzrə hər həftə haqq-hesabımıza yekun vururuq. Yeddı gün keçdikdən sonra ona hesab təqdim olundu. Ancaq, deyəsən, ovqatının təlx vaxtına düşmüşdü; çünki ağzımızı açıb pul söhbəti edən kimi, bizə lənət yağdırmağa başladı. Düzü, bir gün əvvəl qumar oynamışdı.

Deməli, bir gün əvvəl qumar oynayıbmış? Kiminlə?

– Aman Allah! Nə bilım. Yol ötüb keçən bir adamla. Portos ona bır əl landsknext oynamağı təklif etdı.

Elədir ki var! Yazıq yəqin var yoxunu uduzub!

– Atını da uduzub, cənab; çünki həmin naməlum adam gedəndə gördük ki, nökəri cənab Portosun atını da yəhərləyir. Biz o saat cənab Portosa xəbər verdik. O isə bizə cavab göndərdi ki, biz özümüz nadürüst adamlarıq; çünki əsilzadənin sözlərindən şübhələnməyə cürət etmişik. Madam ki, naməlum adam atın özününkü olduğunu söyləyir, deməli, at onundur.

– Portosdan belə şey gözləmək olar! – d'Artanyan mırıldandı.

Meyxana sahibi sözlərinə davam etdi:

Onda cənab Portosa xəbər göndərdim ki, biz onunla pul barəsində razılaşa bilmədiyimiz üçün, zəhmət olmasa mənim qonşuluğumdakı "Qızıl Qartal" meyxanasına köçsün. Ancaq cənab Portos cavab göndərdi ki, mənim meyxanam daha yaxşıdır və burada qalmaq istəyir. Bu cavab məni o qədər xoşlandırdı ki, onun getməsi barədə təkid edə bilmədim. Yalnız xahiş etdim ki, meyxanamın ən yaxşı otağı olan otağı boşaldıb dördüncü mərtəbədəki balaca, amma gözəl otağa köçsün. Bunun müqabilində cənab Portos cavab göndərdi ki, ən məşhur saray xanımlarından biri olan sevgilisinin hər dəqiqə gəlməsini gözləyir. Buna görə mən başa düşməliyəm ki, içərisində yaşamaq lütfündə olduğu həmin otaq da elə bir xanım üçün çox na-layiq bir otaqdır. Mən onun sözlərinin tamamilə haqlı olduğunu qəbul etməklə bərabər, öz təklifimdə təkid etdim. Ancaq bu barədə heç mənimlə danışmağa da zəhmət çəkməyib, tapançasını çıxarıb mizin üstünə qoydu və xəbərdar etdi ki, köçmək barəsində bir söz danışan və onun işlərinə burnunu soxan adamın beynini yerə tökəcəkdir. O vaxt-dan bəri öz nökərindən başqa heç kəs onun yanına getmir, cənab.

- Deməli Muşketon da buradadır?

– Bəli, cənab. O getdikdən beş gün sonra çox pis halda qayıdıb gəldi. Deyəsən yolda onun da başına bir fəlakət gəlmişdi. Bədbəxt-likdən o, öz ağasından da zirəkdir və onun xatirinə burada hər şey alt-üst edir. İstədiyi şeyi ona verməyəcəklərini güman edib lazım olan şeyi kimsədən soruşmadan özbaşına götürür.

D'Artanyan cavab verdi:

– Doğrudan da, mən Muşketonun çox zirək və sədaqətli olduğunu görmüşəm.

- Bu mümkündür, cənab. Ancaq mənə elə gəlir ki, bu il bir neçə dəfə bu cür zirək və sədaqətli nökərə rast gəlsəm, yəqin ki, sınıq çıxacam.



Belə şey ola bilməz; çünki Portos sizin pulunuzu verəcəkdir.

Hm! – meyxana sahibi inamsızlıqla mırıldandı.

Məşhur bir xanım onu himayə etməkdədir. Həmin xanım belə boş bir şeydən ötrü onu əsla çətin vəziyyətdə qoymaz.

– Bu barədə düşündüyümü sizə söyləməyə cürət edə bilsəydim...

– Bu barədə nə düşünürsünüz ki?

Mən deyərdim ki, bu məşhur xanımı tanıyıram.

- Haradan tanıyırsınız?

- Aman, ey cənab! Əgər sizin sirr saxlamanıza inana bilsəydim...

– Söyləyin, söyləyin. Sizə bir əsilzadə kimi sədaqətlə söz verirəm ki, mənə inanmağınıza peşman olmazsınız.

– Siz bilirsiniz ki, nigaranlıq adamı çox şeyə vadar edir.

Siz neyləmisiniz ki?

– Cənab Portos həmin hersoginyaya yazdığı məktubu mənə verib poçta aparmağı əmr etdi. Onda hələ nökəri gəlməmişdi. Özü isə otaqdan çıxa bilmirdi. Buna görə mənə müraciət etməli olmuşdu.

– Sonra?

– Mən də məktubu poçta aparmaq əvəzinə bizim adamlarımızdan birinin Parisə getməsindən istifadə etdim, məktubu ona verdim ki, şəxsən hersoginyaya çatdırsın. Beləliklə, öz məktubu barədə çox çalı-şan cənab Portosun arzusu eynən yerinə yetirilmiş olardı. Elə deyilmi?

Yəqin!

– Heç bilirsinizmi həmin məşhur xanım kim imiş?

– Yox. Mən onun barəsində yalnız Portosdan eşitmişəm. Vəssalam.

Cənab, bu xanım Şatledə mülki işlər prokurorunun xeyli yaşlı arvadı xanım Koknardır. Yaşı ən azı əlli olar. Özü də çox qısqanc görünür. Mən özüm hersoginyanın Ayı küçəsində yaşadığına təəccüb etmişdim.

– Siz bütün bunları haradan bilirsiniz?

Çünki xanım Koknar məktubu aldıqda bərk qəzəblənib demişdi ki, cənab Portos yelbeyin bir adamdır, yəqin ki, bir qadın üstündə duelə çıxıb yaralanmışdır.

Deməli, o yaralıdır.

Aman Allah, mən nə söyləyirəm!

– Söylədiniz ki, Portos yaralıdır.

– Bəli, ancaq o mənə bu barədə danışmağı qadağan etmişdi.

Niyə ki?

Hm, niyə! Axı, cənab, o lovğalanırdı ki, sizin yanınızda bəhsə girişdiyi naməlum adamı vurub öldürəcək; ancaq iş tərsinə oldu. Naməlum adam onu yaraladı. Cənab Portos isə öz hersoginyasından başqa hamı ilə çox lovğa rəftar edir. Hersoginyanın könlünü isə başına gələn macəranı nağıl etməklə ələ almaq istəyirdi. Yaralanmasını heç kəsin yanında etiraf etmək istəmir.

Deməli, onun yataqdan qalxmasına yarası mane olur, eləmi?

Bəli, özü də çox ağır yaradır. Yəqin dostunuzun ruhu bədəninə möhkəm yapışıbmış.

Deməli, onlar vuruşanda sən orada idin?

– Mən maraqlanıb onların ardınca getmişdim, cənab, onlar məni görmürdülər, amma mən onların vuruşmasını görürdüm.

Danış görüm necə oldu ki?

– Sizi inandırıram ki, vuruşma uzun çəkmədi. Onlar vəziyyət alıb durdular. Naməlum adam birdən elə irəli atıldı ki, cənab Portos onun zərbəsini rədd etməyə macal tapmamış, qılıncın ucu artıq üç düymə onun sinəsinə yerimişdi O arxası üstə yerə yıxıldı. Naməlum adam qılıncın ucunu o saat onun boğazına dirədi. Cənab Portos canının onun əlində olduğunu görüb özünü məğlub elan etdi. Bu vaxt naməlum adam onun adını soruşdu və adının cənab d'Artanyan deyil, cənab Portos olduğunu bildikdə ona kömək əlini uzadıb meyxanaya gətirdi, özü isə atına minib yox oldu.

– Deməli, o naməlum adam d'Artanyanı axtarırdı, eləmi?

– Deyəsən elədir.

Bilirsinizmi o kimdir?

– Xeyr, onu birinci dəfə görürdüm.

Yaxşı, deyirsiniz ki, Portosun otağı ikinci mərtəbədə bir nömrəli otaqdır?

Bəli, cənab. O otaq mənim mehmanxanamın ən yaxşı otağıdır. Mən onu bu vaxta qədər azı on dəfə kirayə vermiş olardım.

– Sakit olun, d'Artanyan gülərək cavab verdi. – O, sizin pulunuzu hersoginya Koknarın hesabına verəcəkdir.

Aman, ey cənab! Onun prokuror arvadı və ya hersoginya olmasının mənim üçün heç bir fərqi yoxdur. Təki pul kisəsinin ağzı açıq olsun. Ancaq o xanım qəti cavab vermişdi ki, cənab Portosun pul istəməsi və daim xəyanət etməsi onu təngə gətirmişdir. Və onun üçün bircə su da göndərməyəcəkdir.



Siz bu cavabı cənab Portosa çatdırdınızmı?

– Bunu heç ağlıma da gətirmədim. Axı belə etsəydim, məktubu nə cür göndərdiyimi bilərdi.

– Deməli, o hələ də pul gözləyir, eləmi?

Əlbəttə! Dünən ikinci dəfə məktub yazdı, ancaq bu dəfə məktubu öz nökəri poçta apardı.

– Deməli, sizin sözlərinizə görə prokurorun arvadı qoca və kifirdir, eləmi?

Hər halda yaşı əlli olar. Özü də Patonun dediyinə görə heç də gözəl deyil.

– Elə isə arxayın olun. O xanımın ürəyi yumşalar. Yəqin ki, Portosun sizə borcu o qədər çox deyil?

– Necə yəni çox deyil?! Hələ doktorun pulunu hesaba qatmasaq, iyirmi pistol borcu var. Dostunuz ürəyi istəyən heç bir şeydən imtina etmir. Görünür yaxşı yaşamağa adət etmişdir.

Əgər sevgilisi ondan əl çəkmiş olsa da, inanın ki, dostları tapılar. Buna görə də möhtərəm cənab, heç narahat olmayın. Ona vəziyyətinin tələb etdiyi kimi qulluq göstərin.

– Cənab, mənə söz verdiniz ki, prokuror arvadı və yaralanmaq barəsində heç bir kəlmə danışmayacaqsınız.

Əlbəttə, mən söz vermişəm.

– Əgər bunu bilsə, məni öldürər.

Qorxmayın, o göründüyü qədər də qorxulu adam deyildir.

Bu sözlərdən sonra d'Artanyan pillə ilə yuxarı çıxmağa başladı.

Yuxarıda, bütün dəhlizdə ən görkəmli bir qapının üstündə qara rənglə 1 nömrəsi yazılmışdı. D'Artanyan qapını döyüb içəri girdi.

Portos yataqda uzanıb Muşketon ilə landsknext oynayırdı. Şişdə bir keklik qızarmaqda, böyük buxarının hər iki guşəsində ocaq üstündə isə iki qazan qaynamaqda idi. Bu qazanlardan iki cür gözəl qoxu gəlirdi. Biri dovşan ətindən bişirilən frikase qoxusu, o biri isə ağ şərabda bişirilən balıq qoxusu idi. Buxarının üstündəki ləmədə və mərmər döşəmə üzərində xeyli boş şüşə düzülmüşdü.

Portos dostunu gördükdə sevincindən çığırdı. Muşketon isə hörmətlə ayağa qalxıb yerini d'Artanyana verdi və qazanları yoxlamağa getdi.

Portos d'Artanyana dedi:

– Aha, gəlib çıxdınız! Xoş gəldiniz, bağışlayın ki, dura bilmirəm. Ancaq, – o, narahat bir nəzərlə d'Artanyana baxıb əlavə etdi: – heç bilirsinizmi başıma nə gəlib?

- Yox.
- Meyxana sahibi sizə bir şey söyləmədimi?
Mən sizin burada olduğunuzu soruşub, düz yuxarı gəldim.

Deyəsən, bu sözlərdən Portosun ürəyi sakit oldu. D'Artanyan soruşdu:

– Əzizim Portos, bir danışın görək, başınıza nə gəlmişdir?

Mən öz düşmənimə hücum edib ona üç zərbə vurdum, dördüncü zərbə ilə onun işini bitirmək istədikdə, ayağım bir daşa ilişdi, yıxıldım və dizim bərk əzildi.

– Doğrudanmı?

Düz sözümdür! O nadürüstə xoşbəxtlik üz verdi. Yoxsa sizi inandırıram ki, onu oradaca öldürəcəkdim.

Bəs o necə oldu?

Bilmirəm. Cəzasını alıb, sağ-salamat çıxıb getdi. Yaxşı, dostum d'Artanyan, bəs siz necəsiniz?

– Bəs niyə tapşırmadınız sizi Parisə aparsınlar. Yeqin ki, burada yaman darıxıbsınız?

– Mən belə etmək istəyirdim, ancaq, əziz dostum, sizə etiraf etməliyəm ki...

– Nə olub ki?

– O olub ki, söylədiyiniz kimi çox darıxırdım. Cibimdə isə sizdən aldığım yetmiş beş pistol dururdu. Bir az əylənmək üçün tapşırdım ki, buradan gəlib keçən bir əsilzadəni yanıma çağırsınlar və ona bir əl zər oynamağı təklif etdim. Razı oldu və yetmiş beş pistolum mənim cibimdən onun cibinə keçdi. Bundan əlavə, atımı da uddu. Yaxşı, bəs siz necəsiniz, əzizim d'Artanyan.

D'Artanyan cavab verdi:

– Nə olar ki, əzizim Portos. Adamın hər işdə bəxti gətirməz ki. – Bilirsiniz ki, belə bir məsəl var: "Qumarda uduzan sevgidə qazanar". Taleyin cilvəsinə nə demək olar? Siz ki, xoşbəxt bir adamsınız, hersoginya kimi bir xanımınız var, əlbət ki, sizi köməksiz qoymaz?

Ancaq, bir görün bədbəxtlik məni necə izləyir, Portos əsla tutulmadan cavab verdi. – Hersoginyaya yazmışdım ki, vəziyyətdən çıxmaq üçün mənə əlli luidor[1] pul göndərsin.

[1] Luidor iyirmi dörd livr qiymətində qədim qızıl pul. Luidorlar ilk dəfə XIII Lüdovikin vaxtında buraxılmışdır.



– Bəs nə oldu?

– Yəqin ki, öz malikanəsinə getmişdir. Hələ cavab almamışam.

– Doğrudanmı?

– Bəli. Ancaq yenə dünən əvvəlkindən daha təsirli bir məktub yazmışam. Axır ki, siz də gəlib çıxdınız! Gəlin bizim işlərimizdən danışaq, əzizim. Doğrusu, sizdən nigaran qalmağa başlamışdım.

D'Artanyan dolu qazanları və boş şərab şüşələrini göstərib gülə-gülə dedi:

Ancaq, deyəsən, hərdənbır çapqın da edırsınız.

– Bədbəxtlikdən edə bılmirəm, Portos cavab verdi. Ayağımdakı bu məlun yara məni yataqdan qalxmağa qoymur. Ancaq Muşketon hərdənbir kəşfiyyata gedib ərzaq əldə edir. Muşketon, əzizim, Portos davam etdi, - görürsünüz ki, bizə yardım qüvvəsi gəlmişdir, buna görə ərzaq ehtiyatını artırmaq lazımdır.

D'Artanyan dedi:

– Muşketon, siz mənə bir yaxşılıq etməlisiniz.

– Nə yaxşılıq, cənab?

Öz üsulunuzu Planşeyə öyrədin. Mən özüm mühasirəyə düşə bilərəm. O da sizin öz ağanıza təmin etdıyiniz belə rahatlığı mənə təmin edə bilərsə, çox məmnun qalaram.

Muşketon qondarma bir təvazökarlıqla dedi:

Aman Allah, bundan asan nə var ki, cənab! Bir az zirək olmaq lazımdır, vəssalam. Mən kənddə böyümüşəm, atam da boş vaxtlarında icazəsiz ov ilə məşğul olardı.

– Bəs qalan vaxtı neylərdi?

Elə bir peşə ilə məşğul olardı ki, mən bunu həmişə qazanclı bir peşə hesab etmişəm.

– Necə məgər?

– O zaman katoliklər ilə quqenotlar bir-birilə vuruşurdular. Atam görürdü ki, katoliklər quqenotları, quqenotlar isə katolikləri qırır və hər iki tərəf bunu din naminə edir. O da özü üçün qarışıq bir din düzəltmişdi. Bu din ona gah katolik, gah da quqenot olmağa imkan verirdı O da çiyninə bir muşket salıb yolların ətrafında hərlənirdi. Təklikdə bir katolıkə rast gəldikdə, o saat protestant dini qəlbinə hakim olurdu, muşketini yolçuya dikləyirdi, yolçu on addım qədər yaxınlaşdıqdan sonra atam onunla söhbətə başlayır və həmişə iş elə qurtarırdı kı, yolçu canını xılas etmək üçün pul kisəsindən əl çəkməli

olurdu. Söyləməyə ehtiyac yoxdur ki, atam quqenota rast gəldikdə, katolik hissiyyatı o qədər coşurdu ki, on beş dəqiqə bundan əvvəl bizim müqəddəs dinimizin üstünlüyünə necə şübhə etdiyini özü də başa düşə bilmirdi. Mən katolikəm, cənab; çünki atam öz prinsipinə sadiq qalıb böyük oğlunu quqenot etmişdi.

D'Artanyan soruşdu:

Bəs bu möhtərəm adamın axırı necə oldu?

Axırı çox acı qurtardı, cənab. Bir dəfə o, dar bir cığırda bir katolik ilə bir quqenota rast gəlir. Əvvəllər bu adamların da başına söylədiyim işi gətiribmiş. Onlar ikisi də atamı tanıyıb birləşir və onu bir ağacdan asırlar. Sonra ilk təsadüf etdikləri kənd meyxanasında bu barədə danışıb lovğalanırlar. Mən də həmin meyxanada qardaşımla birlikdə şərab içirdim.

D'Artanyan soruşdu:

– Bəs siz nə etdiniz?

Heç səsimizi çıxarmadıq, – Muşketon davam etdi. Sonra onlar meyxanadan çıxıb hərəsi bir tərəfə getdi. Qardaşım quqenot olduğundan, katolikin dalınca, mən də quqenotun dalınca getdik. İki saatdan sonra işimizi qurtardıq. Qardaşımla mən, hər birimizi ayrı dində tərbiyə etmiş bədbəxt atamızın ehtiyatkarlığına heyran olub, ikisinin də işini bitirdik.

– Doğrudan da, Muşketon, mənə elə gəlir ki, atanız çox zirək adammış. Deyirsiniz ki, o möhtərəm adam boş vaxtlarında icazəsiz ov ilə məşğul olardı, eləmi?

– Bəli, cənab. O? mənə də gizlincə cələ qurmağı və tilovla balıq tutmağı öyrətmişdi. İndi bu yaramaz meyxana sahibinin bizim kimi adamların zərif mədəsinə deyil, yalnız kobud heyvərələrə yaraşan qaba mal ətilə bəslədiyini görüb, mən əlaltı öz köhnə peşəmə başladım. Prinsin meşələrini gəzib cələlər qurdum və o şövkətməabın göllərinin kənarında yerə yatıb tilov atmağa başladım. Beləliklə, Allaha şükür, gördüyünüz kimi kəkliyimiz, dovşanımız və ləzzətli balıqlarımız boldur. Xəstə adamlar üçün çox yüngül və sağlam bir yemək olan bu cür şeylərdən əsla korluq çəkmirik.

D'Artanyan soruşdu:

– Bəs şərab haradan? Onu sizə kim verir? Meyxana sahibimi?

Necə deyim, həm bəli, həm də xeyir.

- Bu nə deməkdir?



Doğrudur, bu şərabı bizə o verir, ancaq özünün bundan xəbəri yoxdur.

– Açıq danışın, Muşketon, sizin sözləriniz çox ibrətlidir.

– İcazə verin, cənab. Bir zaman səyahət etdikdə mən, təsadüfən, bir ispaniyalıya rast gəlmişdim. O, bir çox ölkələri və o cümlədən Yeni Dünyanı da görmüşdü.

Yaxşı. Yeni Dünya ilə şərab şüşələri arasında nə münasibət var?

– Bir az səbir edin, cənab. Hər şeyin öz vaxtı var. Bu ispaniyalının yanında onunla bərabər Meksikaya getmiş bir nökəri var idi. Bu nökər mənim yerlim idi və biz tez bir zamanda onunla dostlaşdıq. Hər ikimiz dünyada ovu hər şeydən artıq xoşlayırdıq. O, mənə danışmışdı ki, Cənubi Amerika düzlərində yerlilər pələng və vəhşi öküz ovuna sadəcə kəmənd ilə gedib kəməndi bu qorxunc heyvanların boyunlarına atırlar. Əvvəlcə, mən iyirmi-otuz addımlıq məsafədən kəməndi istədiyin yerə ata bilmək kimi bir məharəti qazanmağın mümkün olacağından şübhələndim. Ancaq sonra dostumun danışıqlarının doğruluğuna inanmalı oldum. Dostum iyirmi addımlıqda bir şərab şüşəsi qoyub, hər dəfə kəməndi atıb düz onun boğazına salırdı. Mən də bunu təcrübə etdim və təbiət mənə bu dərəcəyə qədər qabiliyyət vermiş olduğundan, indi kəməndi heç də həmin yerlilərdən pis atmıram. İndi başa düşürsünüzmü? Anbarda bolluca əla şərablar var. Ancaq meyxana sahibi açarı daim öz yanında gəzdirir. Lakin anbarın hava çıxmaq üçün bir kiçik pəncərəsi var. Mən həmin pəncərədən kəmənd atıram. Cənab, indi özünüz görürsünüz ki, Yeni Dünya ilə ləmədə gördüyünüz şərab şüşələri arasında nə kimi bir münasibət var imiş. İndi arzu buyursanız, bizim şərabın bir dadına baxın və xoşunuza gəlib-gəlmədiyini söyləyin.

Sağ ol dostum, sağ ol. Heyf ki, mən nahar etmişəm.

Portos dedi:

– Di süfrəni sal, Muşketon. Biz yeməyimizi yeyək, d'Artanyan da bizdən ayrıldığı bu on gündə nə iş gördüyünü danışsın.

Məmnuniyyətlə, d'Artanyan cavab verdi.

Portos ilə Muşketon xəstəlikdən yeni sağalmış adamlara məxsus bir iştaha ilə yemək yedikləri zaman d'Artanyan yaralanmış Aramisin Krevkerdə qalmağa məcbur olduğunu, qəlp pul kəsməkdə təqsirləndirilən Atosu Amyendə qoyub getdiyini, İngiltərəyə gedib çıxa bilmək üçün de Vardı yaralamağa məcbur olduğunu onlara danışdı.

D'Artanyanın söhbəti bununla qurtardı. Bundan əlavə o, Portosa söylədi ki, İngiltərədən dörd gözəl at gətirmişdir və Portos üçün gətirdiyi at meyxananın tövləsində onu gözləyir.

Bu zaman Planşe içəri girdi. O, ağasına söylədi ki, atlar dincəlmişdir və gecə düşənə qədər gedib Klermona çatmaq olar.

Portosdan, demək olar ki, tamamilə arxayın olmuş d'Artanyan o biri dostlarını düşünməyə başladı. O, xəstənin əlini sıxıb söylədi ki, gedib axtarışlarına davam edəcəkdir. Qayıdanda həmin bu yoldan keçəcəyindən, Portosa təklif etdi ki, əgər bu meyxanada qalacaqsa, onun dalınca gəlsin.

Portos söylədi ki, ayağının yarası yəqin ki, d'Artanyan qayıdana qədər onun buradan çıxıb getməsinə mane olacaqdır. Bundan əlavə, öz hersoginyasının cavabını gözləmək üçün Şantilyada qalmalı olacaqdır.

D'Artanyan onun tezliklə sağalmasını və xoş bir cavab almasını arzu edib Muşketona tapşırdı ki, ağasına yaxşı baxsın. Sonra meyxana sahibi ilə haqq-hesabı üzüb yola düşdü.

## XXVI

## ARAMİSİN DİSSERTASİYASI

D'Artanyan Portosa nə yarası, nə də prokuror arvadı barədə heç bir kəlmə söyləmədi. Bizim qaskoniyalı çox cavan olduğuna baxmayaraq, ağıllı bir oğlan idi. O, özünü lovğa muşketyorun bütün danışıqlarına inanırmış kimi göstərirdi. Bilirdi ki, ən yaxşı bir dost da öz izzəti-nəfsinə toxunulmasına dözməz. Bundan başqa, həyatı sənə məlum olan bir adam üzərində həmişə özünü üstün hiss edirsən. D'Artanyan öz gələcək planlarını qurduqda, üç yoldaşını öz müvəffəqiyyətlərinə alət edəcəyindən, bu üç muşketyoru idarə etmək üçün əvvəlcədən onların taleləri ilə bağlı olan görünməz telləri öz əlində toplamaq istəyirdi.

Ancaq bütün yol uzunu qəlbini dərin bir qüssə sıxmaqda idi. O, cavan və gözəl xanım Bonasyeni düşünürdü. Bu xanım verdiyi tapşırığı yerinə yetirdiyi üçün onu mükafatlandırmalı idi. Ancaq burasını da qeyd etməliyik ki, onun qüssəsinin səbəbi yalnız bu xoş fürsətin əlindən çıxması deyildi. O daha artıq gələcək üçün qorxurdu. Şübhə



etmirdi ki, yazıq qadın kardinalın qurbanı olmuşdur. Məlum idi ki, kardinal həzrətlərinin intiqamı çox dəhşətli olur. Qaskoniyalı, kardınalın onun özünə nə üçün aman verdiyini başa düşə bilmirdi. Yəqin ki, cənab Kavua onu evdə tapmış olsaydı, bunun səbəbini izah etmiş olacaqdı.

D'Artanyan belə düşüncələrə dalmış olduğundan, Şantilya ilə Krevker arasındakı altı və ya səkkiz lye yolu necə getdiyindən xəbər tutmadı.

Ancaq gəlib çatdıqda özünə gəldi. O, Aramisi qoyub getdiyi meyxananı gördü və atını çaparaq onun qapısı ağzında dayandı.

Bu dəfə onu meyxana sahibi deyil, onun arvadı qarşıladı. D'Artanyan sima elmindən xəbərdar idi. Arvadın dolğun və mehriban üzünə bir nəzər salıb bu qənaətə gəldi ki, onunla düz düzünə danışmaq olar.

D'Artanyan ona müraciət etdi:

– Mehriban xanım, siz mənə söyləyə bilməzsiniz ki, on gün bundan əvvəl burada qoyub getməyə məcbur olduğum dostlarımdan biri necə olmuşdur?

– O iyirmi üç iyirmi dörd yaşlarında gözəl, mehriban və təndürüst cavanımı deyirsiniz?

Bəli, bunlardan başqa o bir də çiynindən yaralanmışdı.

– Hə, o hələ də buradadır, cənab.

– Ax, ey əziz xanım, – d'Artanyan çığıraraq atdan sıçrayıb cilovu Planşeyə tulladı, siz məni dirilddiniz! Əziz Aramis haradadır, mən onu qucaqlamaq istəyirəm.

Bağışlayın, cənab, ancaq güman edirəm ki, bu saat o sizi qəbul edə bilməz.

– Niyə ki? Yanında qadınmı var?

– Aman, ya həzrət İsa, siz nə danışırsınız! Ay yazıq oğlan! Xeyr, cənab, onun yanında qadın yoxdur.

Bəs elə isə nə var?

– Mondidye ruhanisi və Amyen iezuit monastırının keşişi onun yanındadırlar.

D'Artanyan çığırdı:

– Aman Allah! Məgər o yazığın halı o dərəcədə pisdir?

– Xeyr, cənab, əksinə, xəstə olduğu zaman ona Allahdan vəhy nazil olub, o da ruhaniliyə daxil olmağı qərara alıb.

D'Artanyan dedi:

Bəli, bəlı, mənim yadımdan çıxmışdı. O, çoxdan əsgər paltarını ruhani paltarı ilə dəyişmək fikrində idi.

Siz yenə onu görmək fikrində təkid edirsinizmı?

Həmişəkindən daha artıq təkid edirəm

– Elə ısə, buyurun həyətdəki pıllə ılə çıxıb üçüncü mərtəbədə, sağ tərəfdə beş nömrəli otağa gedin.

D'Artanyan sürətlə göstərilən tərəfə getdı və hələ ındi də bəzi köhnə mehmanxanaların həyətində qalmış eşik pilləkənini gördü. Ancaq gələcək abbatın yanına daxıl olmaq o qədər də asan bır iş deyildı. Dəhlizdə keşik çəkən Bazen qətı bır hərəkətlə onun qabağını kəsdı. Uzun illər boyu sınaqdan çıxdıqdan sonra Bazen, nəhayət, görürdü kı, onun xoş arzuları bu yaxında yerinə yetəcəkdir.

Doğrudan da, yazıq Bazen həmişə bu arzuda idı ki, bir ruhanının yanında xidmət etsın və Aramısın, nəhayət, muşketyor plaşından əl çəkib ruhani paltarı geyəcəyi günu səbırsizliklə gözləyirdi Onu muşketyorun qulluğunda saxlayan da bu günün yaxın olduğu barədə ona hər gün vəd edilməsi idi. O inanırdı kı, indiki xidmətdə qalmış olsa, yəqin ki, ruhu məhv olacaqdır

Beləliklə, Bazenin ürəyi sevınclə dolu idi. Çox ehtimal ki, bu dəfə *onun ağası, doğrudan da, ruhaniliyə daxil olacaqdı. Mənəvi* əzabla cismani əzab birləşərək çoxdan bəri arzu edilən təsiri göstərmişdı. Aramis, eyni zamanda, həm mənəvi, həm də bədən cəhətındən ıztırab çəkdiyindən, nəhayət, bütün fikirlərini dinə həsr etmiş və elə güman etmişdi ki, onun başına gələn ikiqat fəlakət, yəni həm sevdiyi qadının yox olması, həm də çiynindən yaralanması Allah tərəfindən edilən bir xəbərdarlıqdır.

Aydın şeydir ki, belə bir vəziyyətdə Bazen üçün d'Artanyanın gəlməsi ən xoşagəlməz bir hadisə idi. Çünki d'Artanyan ağasını yeni dünya işlərinin tufanına çəkib apara bilərdı. Bazen qapını cürətlə müdafiə etməyi qərara almışdı. Meyxana sahibinin arvadı xəyanət edıb hər şeyi d'Artanyana xəbər verdiyindən, o, ağasının evdə olmadığını d'Artanyana söyləyə bilməzdi. O, d'Artanyanı başa salmağa çalışdı kı, bu dini mübahisəyə mane olmaq həddən artıq ədəbsizlikdır. Bazenin söylədiyinə görə, bu müsahibə səhər tezdən başlanmış və yalnız axşam qurtara biləcəkdi.

Ancaq d'Artanyan Bazenin bu şirin sözlərinə əsla əhəmiyyət vermədi. Öz dostunun nökəri ılə mübahisəyə girişmək istəmədiyindən,



Bazeni sadəcə əli ilə kənara itələyib, beş nömrəli otağın qapısının dəstəyini burdu. Qapı açıldı və d'Artanyan otağa girdi.

Aramis, əynində qara bir libas, başında yastı dəyirmi papaq, uzunsov bir masanın arxasında oturmuşdu. Masanın üstündə xeyli burulmuş kağız və irı kitablar var idi. Aramisin sağ tərəfində isə Mondidye keşişi oturmuşdu Otağın pərdələri yarı örtülmüş olub azacıq işıq buraxırdı və dini xəyalat üçün münasib bir vəziyyət əmələ gətırirdi. Cavan muşketyorun otağına girəndə adamın diqqətını cəlb edəcək bütün dünyəvi şeylər sankı sehrkar bır əl tərəfindən, tamamilə, yoxa çıxarılmışdı. Doğrudan da, Bazen öz ağasının bunları gördükdə yenə qarmaqarışıq fikirlərə qapılacağından qorxub, qılıncı, tapançaları, lələkli şlyapanı, üstü naxışlı paltarları və hər cür krujevaları götürüb aparmışdı. D'Artanyana elə gəldı kı, bütün bunların əvəzində qaranlıq bir guşədə divardan asılmış bir qamçı görür.

Aramis başını döndərıb öz dostunu tanıdı Ancaq d'Artanyan böyük bır heyrətlə gördü ki, onun gəlməsi öz muşketyor dostuna çox da xoş gəlmədı O, bütün dünya ışlərindən əl çəkdiyindən fikri yalnız dını məsələlərlə məşğul idi.

Aramıs dedı:

*Xoş gördük, əzizim d'Artanyan. Sizi gordüyümə çox məmnunam.*

D'Artanyan cavab verdi:

Mən də çox şadam. Ancaq düzü, hələ də danışdığım adamın Aramis olub-olmadığına çox möhkəm əmin deyiləm.

Mənəm, əzizim, mənəm! Ancaq nə səbəbə şübhə etdiniz?

Mənə elə gəldi ki, başqa bır adamın otağına gırmışəm. Əvvəl elə bildim ki, bir ruhani otağındayam. Ancaq sonra yanınızda bu cənabları gördükdə, fikrim azdı, elə guman etdim ki, siz ağır xəstəsiniz.

Qara geyimli hər iki adam d'Artanyanın niyyətini başa düşüb ona hədələyici bir nəzərlərlə baxdılar, ancaq d'Artanyan buna əsla əhəmiyyət vermədi.

Bəlkə sizə mane oluram, əzizim Aramis? d'Artanyan davam etdi. Yəqın ki, bu cənabların hüzurunda tövbə və istiğfar edirsiniz?

Aramıs azacıq qızardı:

Mane olursunuz? Əksinə, əziz dostum. And içirəm ki, sizi belə sağ və salamat gördüyümə çox məmnunam.

D'Artanyan düşündü: "Deyəsən yavaş-yavaş özünə gəlir. Bu bəd deyil".

Aramis nəzakətli bir əda ilə d'Artanyanı hər ıkı ruhaniyə göstərib davam etdi:

- Çünki mənim dostum böyük bir təhlükədən qurtarmışdır.

- Allaha şükür edin, cənab, onlar hər ikisi təzim edib cavab verdilər.

Şükür etmişəm, möhtərəm ruhani atalar, cavan onların hər ikisinə təzım etdı.

Aramis dedı:

– Lap vaxtında gəlmişsiniz, əzizim d'Artanyan. Cənab vaiz, cənab keşiş və mən bəzi dini məsələlər barədə müzakirə edirik. Bir məsələ çoxdan bızim diqqətimizi məşğul etməkdədir. Bu barədə sizin rəyinizi bılmək mənim üçün son dərəcə xoş bir şey olardı.

Hərbi adamlar dinı məsələləri çox pis bilərlər, – d'Artanyan düşəcəyi vəziyyətdən narahat olmağa başlayıb cavab verdi: sızi inandırıram ki, bu cənabların alımliyinə arxayın ola bilərsiniz.

Qara geyimli hər iki adam yenə təzim etdi.

Əksinə, - Aramis davam etdi, sizin rəyiniz bızim üçün çox qiymətlidir. İş belədir. Cənab vaizin rəyinə görə mənim dıssertasiyam əsas etibarilə doqmatık[1] və didaktik[2] olmalıdır.

Sizin dissertasiyanız?! Deməli siz dissertasiya yazırsınız?

Əlbəttə, iezuit cavab verdi. – Ruhaniliyə daxil olmaq üçün saçları kəsdirmədən əvvəl dissertasiya vacibdir.

– Saçları kəsdirmək? – deyə d'Artanyan çığırdı. O, hələ də bunun mümkün olacağına inanmır və qarşısında oturmuş adamlara heyrətlə baxırdı.

Aramis kübar aləminə mənsub bir xanımın yataq otağında səhər qəbul mərasimində imiş kimi oturduğu kresloda nəzakətli bir vəziyyət alıb, qadın əli kimi ağ və totuq əllərinə baxaraq həzz alırdı; qan yı ğılmamaq üçün o, əlini yuxarı qaldırıb sözünə davam etdi:

Deməli ki, d'Artanyan, eşitdiyiniz kimi, cənab vaiz istəyir ki, mənim dissertasiyam doqmatik olsun. Ancaq mən nəzəri olmasını daha üstün tutardım. Buna görə də cənab vaiz mənə hələ bu vaxta qədər heç bir kəs tərəfindən işlənməmiş bir mövzunu təklif edir.

[1] Doqmatık (*yunanca*) – bir hadisəyə tənqidsiz münasibət. Dində, tənqidsiz qəbulu lazım gələn mulahızələr deməkdir. Belə mülahizələr dini elmlərin əsasını təşkil edir.

[2] Didaktik (*yunanca*) – ibrətamız



D'Artanyan, bizə məlum olduğu kimi, bu barədə heç bir məlumat sahibi olmadığından bu ayəni mat mat dinlədi.

Aramis öz dostunu bu çətin vəziyyətdən qurtarmağa çalışaraq sözlərinə davam edib dedi:

Bunun mənası belədir: "Aşağı dərəcəli kilsə xadimləri təqdis üçün hər iki əlindən istifadə etməlidir".

Çox gözəl mövzudur! yezuit çığırdı.

– Çox gözəl və doqmatik bır mövzudur, – keşış təsdiq etdı. O da latınca d'Artanyandan bir azca yaxşı bilirdi. Buna görə də vaizdən geri qalmamaq üçün onun sözlərinin diqqətlə izləyir və əks-səda kimi təkrar edirdi.

D'Artanyana gəlincə bu qara geyimli adamların coşqunluğuna tamamilə, laqeyd idi.

Aramis dedi:

– Əlbəttə, mən bu mövzunun gözəlliklərini təqdir edirəm. Ancaq eyni zamanda, mənim üçün ağır olduğunu boynuma alıram. Mən aşağıdakı mətni seçmişəm: "Özünü Allaha fəda edən adama kədər və məğmunluq ən layiq sifətlərdir". Necədir, əzizim d'Artanyan, xoşunuza gəlirmi?

– Susun, yezuit çığırdı, çünkı bu hədıs küfrə yaxındır Bu cür sözlərə mürtəd Yanseninin əsərində də rast gəlmək olar. Bu kitab gec-tez cəlladın əli ilə odda yandırılacaq. Özünüzü gözləyin, cavan dostum. Siz saxta elmə qapılmış olarsınız, mənim əziz cavan dostum, siz özünüzü məhv edərsiniz!

– Siz özünüzü məhv edərsiniz, keşiş kədərli halda başını yırğalaya-yırğalaya təkrar etdi.

– Siz insanı fəlakətə aparan mənfur iradənin azadlığı maddəsinə toxunursunuz. Siz necə sübut edirsiniz ki, özünü Allaha həsr etdikdə dünyaya təəssüf etmək lazımdır? Bu mütəarifədir ki, Allah Allahdır, dünya isə – iblis. Dünya üçün təəssüf etmək, iblis üçün təəssüf etmək deməkdir. Mənim çıxardığım nəticə belədir!

Mən də bu fikirdəyəm – keşiş səsləndi.

– Ancaq müsaidə edin, Aramis sözə başlamaq istədi.

- İblis üçün təəssüf etməkmi? Ay bədbəxt! yezuit çığırdı.

D'Artanyan sərsəmləşməyə başladığını hiss edirdi. Ona elə gəlirdi ki, dəlixanaya düşüb, özü də bu adamlar kimi dəli olacaqdır.

– Axı bir mənim sözlərimi dinləyin, Aramis yenidən nəzakətlə sözə başladı. Ancaq bu nəzakət ıçərisində səbırsizlik əlamətləri də

hıss olunurdu. – Mən demırəm ki, təəssüf edirəm: yox, həqiqi dinin ehkamına zıdd olan bu cümləni məni heç bir zaman işlətmərəm.

Yezuet əllərıni göyə qaldırdı, keşiş də onun kimi etdi.

Axı heç olmazsa bu fikrə razı olun ki, artıq təkrar oluna-oluna zəhlə tökən şeylərı Allaha həsr etmək layiq iş deyildir. Doğru deyilmi, d'Artanyan?

– Əlbəttə, lənət şeytana! d'Artanyan çığırdı.

Keşiş ılə yezuit yerlərındə diksinib atıldılar.

Mənim istinad etdiyim nöqtə budur; dünya gözəllikdən məhrum deyildir, mən bu dünyanı tərk edırəm, deməli ki, qurban verirəm. Müqəddəs kıtab da söyləyir ki, Allaha qurban verin.

Bu doğrudur, hər ıkı muxalif cavab verdi.

Mən hiss edirəm ki, məhz bu tezısi sübut etməliyəm, Aramis davam etdi. – Başqa bir şeyi deyıl, yalnız bunu sübut etməliyəm. Mən bu mövzunu işləməyə davam edəcəyəm və ümid edirəm ki, sizin göstərişlərinizlə elədiyim təshihlər sabah sizi, tamamilə, təmin edəcəkdir.

Keşiş dedi:

Tələsmədən işləyin, biz sizi çox gözəl bir əhvali ruhiyyə ilə tərk edib gedirik.

İezuet dedi:

– Bəli, tarlaya toxum səpilmişdir. Biz bu toxumlardan bəzisinin bərəkətsiz torpağa düşməsındən əsla qorxmamalıyıq.

D'Artanyan, tamamilə, taqətdən düşdüyünü hiss edib ürəyində de yindi: "Sən özün də bu ruhanilərlə birlıkdə şeytanın lənətinə gələsən!"

Keşiş dedi:

Xudahafiz, oğlum, sabah görüşərik.

İezuet dedi:

Sabah görüşərik, qocaq cavan, ümıdvaram ki, siz kılsənin görkəmli xadimlərindən biri olacaqsınız. Ancaq Allah eləsin ki, qəlbınizdəki bu işıq yaxıb-yandıran bir alova çevrılməsin.

Darıxdığından dırnaqlarını gəmirən d'Artanyan ındi barmaqlarını çeynəməyə başladı.

Ruhanilər ayağa qalxıb, Aramis və d'Artanyana təzım edərək qapıya tərəf getdilər. Qapıda durub bütün bu müddətdə mübahisələrı ləzzətlə dınləyən Bazen ruhanilərə tərəf yüyürüb keşişin əlindən rısaləni və iezuitin əlindən bayazı alıb onlara yol açırmış kimı hörmətlə qabaqlarına düşüb getdi.



Aramis ruhaniləri pilləkənin axırına qədər ötürüb o saat gerı, d'Artanyanın yanına qayıtdı.

Hər iki dost tək qaldıqda bir müddət narahat sükut içində da yandılar. Ancaq hər halda ikisindən biri bu sükutu pozmalı idi. D'Artanyan bu şərəfi öz dostuna verməyi möhkəm qərara aldığından, Aramis sözə başlayıb dedi:

Görürsünüz ki, ən böyük arzum, nəhayət, yerinə yetməkdədir.

Bəli, indicə bu cənablar söylədikləri kimi sizə allahın inayəti nazil olmuşdur.

Yox, bu dünyadan əl əkmək fikri mənim qəlbimdə çoxdan oyanmışdı. Dostum, siz kı, bu barədə birinci dəfə eşitmirsinız?

Əlbəttə, ancaq boynuma alıram ki, mən bütün bunları zarafat bilirdim.

Belə şeylərlə zarafat olarmı?

Niyə olmur ki? Bəs ölümlə zarafat etmirlərmı?

Nahaq edirlər, d'Artanyan. Ölüm elə bır qapıdır ki, ınsanı həm tələf, həm də xilas edə bilər.

– Razıyam. Ancaq, Aramis, xahiş edirəm dını mübahisəyə girişməyək. Bugünkü söhbətlər elə bilirəm ki, sizə kifayət edər. Mən isə, əvvəllər də heç yaxşı bilmədiyim bütün bu şeylərı, demək olar ki, tamamilə unutmuşam. Bir də boynuma alıram ki, səhər saat ondan bəri heç bir şey yeməmişəm və acından ölürəm.

Bu saat yemək yeyərik, əzız dostum. Ancaq bılin ki, bu gün cümədir. Pəhriz günüdür. Mən nəinki ət yeyə bılmərəm, hətta ona baxa da bilmərəm. Əgər mənim naharımla kıfayətlənməyə razısınızsa, bilin ki, o göyərti və meyvədən ibarətdir.

– Çox da doyumluq yemək deyil, amma sızinlə bir yerdə qalmaq üçün hər bir şeyə razıyam.

Aramis cavab verdi:

Təşəkkür edirəm. Əgər bu fədakarlıq sızın bədəninizə bır fayda verməsə, hər halda arxayın olun ki, ruhunuz üçün faydalı olar.

Aramis, deməli ki, siz ruhaniliyə daxil olmağı tamam qət etmişsiniz? Bəs dostlarımız, bəs cənab de Trevil buna nə deyər? Sizi xəbərdar edirəm ki, onlar sizi qaçqın hesab edəcəklər.

– Mən ruhaniliyə yeni daxil olmuram ki, ora qayıdıram. Mən dünya işləri üçün kilsəni tərk etdiyim zaman qaçqın olmuşdum. Siz ki, muşketyor paltarını geyməyə məni nə vadar etdıyini bılirsiniz.

Mənmi? Mən heç bir şey bilmirəm.

Bəs siz mənim ruhanilik məktəbini tərk etdiyimi bilmirsiniz?

Heç bir şey bilmirəm.

– Mənim sərgüzəştim belə olmuşdur. Bir də müqəddəs kitablarda yazılıb ki, "öz günahlarınızı bir-birinizə etiraf edin". Buna görə də mən sizə etiraf edirəm, d'Artanyan.

– Mən isə əvvəlcədən sizin günahlarınızı əfv edirəm. Görürsünüz ki, mən mehriban bir adamam.

– Əziz dostum, müqəddəs şeylərə istehza etməyin.

– Danışın, mən sizi dinləyirəm.

Doqquz yaşından başlayaraq, mən on bir il ruhani məktəbində oxumuşam. Məktəbi qurtarmağıma ancaq üççə gün qalmışdı. Bundan sonra mən abbat olmalı idim. Bir dəfə axşam vaxtı adət üzrə vaxtımı xoş keçirdiyim bir evə getmişdim. Nə çarə, cavan idim və zəif cəhətlərim var idi. Birdən bir zabit xəbərdarlıq etmədən içəri girdi. Mən ev xanımına övliyaların həyatına dair kitab oxumaqla o adamın qısqanclığına bais olmuşdum. O axşam mən "Yudif"dən[1] bir parça tərcümə etmişdim. Bu şerləri xanıma yenicə oxumağa başlamışdım. Xanım şerlərimi bərk tərifləyir və çiynimə sarı əyilib mənimlə birlikdə bu şerləri oxuyurdu. Etiraf edirəm ki, bir az sərbəst görünən bu vəziyyət zabitin xoşuna gəlməmişdi. O bircə kəlmə də danışmadı. Ancaq mən evdən çıxıb getdikdə, dalımca gəlib mənə çatdı və dedi: "Cənab abbat, sizi ağacla kötəkləyəndə xoşunuza gəlirmi?" Bunu söyləyə bilmərəm, cənab, cavab verdim, çünki bu vaxta qədər hələ heç kəs məni döyməyə cürət etməmişdir. – "Elə isə, cənab abbat, bilin ki, bir də bu evə gəlsəniz, mən buna cürət edəcəyəm". Mənə elə gəldi ki, qorxdum, rəngim qaçdı, dizlərim əsdi, ona cavab verə bilmədim. Zabit gözləyib məndən cavab almadıqda güldü, qayıdıb getdi və evə girdi. Mən məktəbə qayıtdım Mən əsilzadəyəm və siz bilirsiniz ki, cənab d'Artanyan, qanım da coşqundur. Onun mənə etdiyi həqarət çox dəhşətli idi. Bu həqarət heç kəsə məlum deyildisə də, ancaq mən onu dərindən hiss edirdim. Məktəb başçılarına bildirdim ki, özümü hələ abbatlıq mənsəbi qəbul etməyə tamamilə layiq bilmirəm və xahişimə görə bu mərasimi bir il təxirə saldılar. Mən Parisdə ən yaxşı qılınc təlimi verən bir müəllimin yanına gedib, bir il müddətində ondan hər

[1] "Yudif" kitabı Bibliyanın ən poetik yerlərindən biri



gün dərs aldım. Sonra təhqir edildiyim həmin günün ildönümündə ruhani paltarımı çıxarıb mıxdan asdım, əsilzadəyə layiq bir şəkildə geyinib tanış bir xanımın tərtib etdiyi bala getdim. Məni təhqir edən zabit də orada olmalı idi. Bu ev Fors həbsxanasının yaxınlığında Fran Burjua küçəsində idi. Zabit, doğrudan da, orada idi. O, zərif ədalarla bir xanımın üzünə baxa-baxa aşiqanə nəğmələr oxuduğu zaman, ona yanaşıb ikinci kupletin ortasında onu dayandırdım. Zabit heyrətdən bərəlmiş gözlərilə mənə baxdı və dedi: "Nə istəyirsiniz, cənab? Mən sizi tanımıram."

– Mən həmin cavan abbatam ki, övliyaların həyatına dair kitablar oxuyur və "Yudif" kitabını şerlə tərcümə edirdim, - deyə cavab verdim. "Aha, yadıma düşdü, - zabit istehza ilə cavab verdi. Yaxşı, nə istəyirsiniz ki?" – Mən istərdim ki, siz mənimlə gəzməyə buyurasınız. "İstəsəniz sabah səhər böyük məmnuniyyətlə gedərəm." Yox, sabah səhər yox, xahiş edərdim ki, indi gedəsiniz. "Əgər siz mütləq tələb edirsinizsə..." Bəli, tələb edirəm – "Elə isə, gedək. Möhtərəm xanımlar, – zabit yanındakı qadınlara müraciət etdi, – narahat olmayın, mən indicə bu cənabı öldürüb qayıdıram və ikinci kupleti oxuyub qurtararam." Biz çıxdıq. Onu Payen küçəsinə apardım Bu həmin o yer idi ki, düz bir il bundan əvvəl həmin bu saatda o zabit mənə həyasızcasına istehza etmişdi. Aylı bir gecə idi. Biz qılınclarımızı çəkdik və mən ilk həmlədə onu yerindəcə öldürdüm.

D'Artanyan dilləndi:

– Lənət şeytana!

Aramis davam etdi:

– Bu əhvalat böyük səs-küyə səbəb oldu. Mən bir müddət ruhanilikdən əl çəkməli oldum. O zaman tanış olduğum Atos və qılınc təlimi dərslərindən əlavə mənə bəzi mahiranə üsullar öyrədən Portos məni dilə tutub muşketyorluğa cəlb etdilər. Kral Arras mühasirəsində öldürülmüş atamı çox sevirdi. Buna görə də məni muşketyorluğa qəbul etdilər. İndi başa düşürsünüz ki, daha mənim kilsə ağuşuna qayıtmaq vaxtım yetişmişdir?

Axı bəs niyə bir az əvvəl və ya bir az sonra yox, elə indi yetişmişdir?

Əzizim d'Artanyan, aldığım bu yara göylərin xəbərdarlığıdır.

Yaramı? Bəsdir, canım! O, demək olar ki, tamamilə sağalıb və mən arxayınam ki, sizi ən çox incidən yara bu yara deyildir.

– Bəs nədir? - Aramis qızararaq soruşdu.

– Sizin ürəyiniz yaralıdır, Aramis. Bu yara çox yaman ağrıdır. Bu qadın tərəfindən vurulmuş bir yaradır.

Aramisin gözləri qeyri-ixtiyari parladı. O, öz həyəcanını qondarma bir laqeydlik pərdəsi altında gizlətməyə çalışaraq:

– Yox canım, belə şeylərdən danışmağa dəyməz. Yoxsa elə güman edirsiniz ki dəli olmuşam? Kimdən ötrü? Hərbi qulluqda olduğum zaman dalınca düşdüyüm bir qulluqçu və xidmətçi qız üçünmü? Eh. .

D'Artanyan cavab verdi:

– Yaxşı, gəl bu barədə danışmayaq və yəqin ki, sizin qulluqçu və ya xidmətçi qızınızın yeni bir xəyanətindən xəbər verən bu məktubu yandıraq.

Aramıs həyəcanla soruşdu:

Nə məktub?

Siz evdə olmadığınız zaman gələn və sizə vermək üçün gətirdiyim məktub.

– Məktub kimdəndir?

Bilmirəm Yəqin ki, sizin üçün ağlamaqdan gözləri qızarmış bir qulluqçudan və ya məyus olmuş bir xidmətçi qadından olacaq. Bəlkə də xanım de Şevrözün qulluqçusundandır ki, o da öz xanımı ilə birlikdə Tura qayıtmağa məcbur olmuşdur. Yəqin ki, o sizi aldatmaq üçün ətirli bir kağız tapıb, məktubu hersoq tacı ilə möhürləmişdir.

Siz nə danışırsınız?

Dayanın, deyəsən, o məktubu itirmişəm, – d'Artanyan hiyləgər bir surətdə guya məktubu axtarıb tapmırmış kimi hərəkət etməyə başladı.

Aramis çığırdı:

Ah, d'Artanyan, d'Artanyan! Siz məni öldürürsünüz!

Axır ki, tapdım, budur ha! – d'Artanyan cibindən məktubu çıxartdı.

Aramis yerindən sıçrayıb, məktubu onun əlindən qapdı və oxudu, daha doğrusu, uddu Onun üzündə işıq saçılırdı.

– Sağ ol, d'Artanyan! şadlıqdan dəli olmuş kimi, Aramis çığırdı. O xanım Tura qayıtmağa məcbur olubmuş, o mənə sadiqdir, məni sevir! Dostum, gəlin sizi qucaqlayım, şadlığımdan boğuluram!

Dostlar masanın ətrafında atılıb-düşərək oynamağa başladılar və dissertasiyanın yerə tökülmüş vərəqələrini ayaq altında tapdaladılar.

Həmin bu dəqiqə Bazen əlində göyərti və meyvə içəri girdı.



Tez ol, bədbəxt! çığıraraq Aramis oz ruhani papağını onun üzünə çırpdı. Gəldiyin yerə qayıt və bu şeyləri rədd elə; qızardılmış dovşan əti, yağlı balıq, sarımsaqlı qoyun budu və dörd şüşə köhnə Burqon şərabı gətir gəl.

Ağasına baxa-baxa qalıb, bu dəyişiklikdən heç bir şey anlamayan Bazenin əlindəki meyvələr və göyərtı bir-birinə qarışıb yerə töküldü.

Aramis bu zaman uca səslə d'Artanyana dedi:

Əzizim d'Artanyan, lənət şeytana, gəlın içək! Gəlin bol-bol, doyunca içək və görüşmədiyimız müddətdə nə baş vermişsə, hamısını mənə danışın.

## XXVII

## ATOSUN ARVADI

D'Artanyan paytaxtdan ayrıldıqdan sonra orada baş verən bütün hadisələr barədə danışıb qurtardıqda Aramisə dedi:

– İndi gərək Atosdan bır xəbər bilək.

Ləzzətli xörək dostlardan birinə dissertasiyasını, o birinə isə yorğunluğunu unutdurdu.

Aramis soruşdu:

Yəni elə güman edırsınız ki, başına bir iş gələ bilər? Atos çox soyuqqanlı, qoçaq adamdır və çox məharətlə qılınc işlədir.

– Bəli, Atosun qoçaqlıq və məharətini mən hamıdan çox bəyənirəm. Ancaq məncə qılıncla qılınc zərbəsini rədd etmək ağac zərbələrini rədd etməkdən yaxşıdır. Qorxuram ki, Atosu nökərlər döymüş olsunlar. Nökərlər çox yaman vuruşurlar. Buna görə də etiraf edirəm ki, mümkün qədər tez yola düşüb getmək istərdim.

Aramis dedi:

Hər nə qədər özümü yəhərdə oturmağa taqətsiz hiss edırəmsə, ancaq sizinlə getməyə çalışaram. Dünən o divarda asılı gördüyünüz o qamçı ilə özümü döyməyə çalışdım. Ağrının şiddətindən bu dını məşğələni tərk etməli oldum.

Ah, əziz dostum. Hələ bu vaxta qədər heç kəs güllə yarasını qamçı ilə müalicə etməyə çalışmamışdır. Ancaq xəstəlik insanın beynini zəiflədir. Ona görə sizi əfv edırəm.

– Nə vaxt gedırsiniz?

Sabah səhər tezdən. Yaxşısı budur ki, bu gecə dıncəlin, sabah isə taqətiniz olsa, bir yerdə gedərik.

Aramis dedi:

- Deməli, sabah görüşərik. Hərçənd siz dəmirdənsiniz, amma sizə də dincəlmək lazımdır.

Ertəsi gün d'Artanyan Aramisin yanına gəldikdə onu pəncərənin qabağında gördü.

D'Artanyan soruşdu:

Bu qədər diqqətlə nıyə baxırsınız?

Odur, orada mehtərin cilovlarından tutub saxladığı üç gözəl ata baxıb ləzzət alıram. Belə atlara minib gəzmək adı insanlara deyil, yalnız prinssessalara nəsib olan bir şeydir

– Əzizim Aramıs, nə vaxt ıstəsənız bu ləzzəti ala bilərsiniz. O atlardan biri sizindir!

– Nə danışırsınız? Mənimki hansıdır?

Hansı xoşunuza gəlsə, o.

O yaraşıqlı, bahalı, yəhər də mənimkidirmi?

– Əlbəttə.

Mən o sarışın mehtərin tutduğu atı götürürəm.

Çox gözəl.

– Lənət şeytana! Aramis çığırdı. Bu xəbərdən mənim bütün ağrım yox oldu. Bədənimdə otuz güllə də olmuş olsa, belə bir ata həvəslə minərəm. Hey, Bazen, tez ol, bura gəl!

Bazen ruhdan düşmüş, kədərli halda qapının ağzında göründü.

Aramis əmr etdi:

– Mənim qılıncımı ver, şlyapamı və plaşımı təmizlə, tapançalarımı doldur!

Tapançaları doldurmaq lazım deyil, – d'Artanyan onun sözünü kəsdi, – atın yəhərindəki qoburlarda tapança var.

Bazen köksünü ötürdü.

D'Artanyan dedi:

Bəsdır, Bazen, sakit ol. Axı hərbi adam da cənnətə gedə bilər!

Bazen köksünü ötürərək cavab verdi:

Heyhat, bilirəm, cənab, indi dünyada hər bir şey alt-üst olmuşdur.

Cavanlar bu ruhdan düşmüş nökərin müşayiəti ılə aşağı endılər.



Aramis dedi:

- Bazen, mənim üçün üzəngini tut.

O, öz həmişəki zirəkliyilə yəhərə sıçradı. Ancaq nəcib atın bir neçə atlayışından sonra Aramis bədənində elə şiddətli bir ağrı hıss etdi ki, rəngi qaçdı və atın üstündə yırğalandı.

Aramisdən gözünü çəkməyən d'Artanyan vaxtında köməyinə çatıb onu öz otağına apardı və dedi:

Yaxşı, əzizim Aramis, siz müalicənızı davam etdirin. Atosu tapmağa mən tək gedərəm.

Aramis dedi:

– O barədə arxayın olun. Geri qayıtdığınız zaman bir yerdə yola düşərik.

Onlar xudahafizləşdilər və on dəqiqədən sonra d'Artanyan öz dostunu Bazenə və meyxana sahıbının arvadına tapşırıb Amyenə yola düşdü.

Görəsən o, Atosu nə vəziyyətdə tapacaq və ümumiyyətlə, tapa biləcəkmi?

D'Artanyan Atosu ən çətin və çıxılmaz bir vəziyyətdə qoyub getmişdi. "Bəlkə də Atosu artıq öldürmüşlər?" Bu fikir d'Artanyanı kədərləndirdı. O, bir neçə dəfə dərindən köksünü ötürüb özünə söz verdi ki, onun ıntiqamını alacaqdır.

D'Artanyanın bütün dostları içərisində ən böyüyü Atos idi. Elə görünürdü ki, bu adam öz zövq və meyllərinə görə cavan qaskonıyalıya hamıdan uzaq olmalı idi Ancaq d'Artanyan Atosu hamıdan çox sevirdi. Atos adət üzrə qəsdən özünü büruzə verməzdı. Atosun əhvalı həmişə müvazınətli olduğundan, ən yaxşı və xoşa gələn bir dost idi. Onun qoçaqlığı ən nadir bir soyuqqanlığın nəticəsi olmasaydı, bu qoçaqlığı kor-koranə bir qoçaqlıq adlandırmaq olardı. Bütün bu sifətlərə görə d'Artanyan ona yalnız dostluq duyğusu deyil, həm də hörmət bəsləyirdı. Bu sifətlər d'Artanyanı heyran etmişdi.

Doğrudan da, Atosun kefi kök olduğu zamanlarda onu cənab de Trevil kimi zərif və nəcib bir saray adamı ilə müqayisə etmək olardı. Atos ortaboylu idi, ancaq onun bədəni o qədər mütənasib və qıvraq idi kı, Portos ilə güləşdikdə bu nəhəngi dəfələrlə məğlub etmişdi. Portosun gücü isə, muşketyorlar arasında zərbi-məsəl olmuşdu.

O zamanın bütün əsilzadələri kimi, Atos çox yaxşı at minər və məharətlə qılınc oynadardı. Bundan başqa, elə gözəl bir tərbiyə almışdı kı, hətta sxolastik elmlərdən də başı çıxardı. Bu ısə o zamankı

əsilzadələr arasında çox nadir bir şey idi. Atos Aramisin latın dilini azacıq bilməklə lovğalanmasına istehza edərdi.

Bütün bunlara baxmayaraq, zərif və həssas bir qəlbə, hər tərəfli və yüksək istedada malik olan bu adam öz mənəvi sərvətini boş-boşuna sərf edirdi. Qocalar, özlərinin xəbəri olmadan, yavaş-yavaş fiziki və zehni qüvvələrini itirdikləri kimi, Atos da xəbəri olmadan həyatın maddi cəhətinə həddindən artıq əhəmiyyət verməyə başlamışdı. Bizim muşketyorlar üçün çox tez-tez baş verən yoxsulluq günlərində Atosun mənəvi simasında olan bütün gözəl və şərəfli cəhətlər sönərdi və sankı o, bütün varlığı ilə küt bir alətə qapılıb qalardı. Belə hallarda onun yarımallah kimi görünən bütün cəhətləri ortadan qalxar və o, başı aşağı, nəzərləri tutqun və sözlərini zorla söyləyə bilən bir adama çevrilərdi. Atos saatlar uzunu gah şərab şüşəsinə, gah stəkana, gah da Qrimoya baxardı. Qrimo isə onun işarələrinə itaət etməyə alışdığından, ağasının nuru sönmüş gözlərindən ən kiçik arzularını başa düşərdi. Əgər üç dostu belə bir dəqiqədə təsadüfən yanına toplaşmış olsaydı, Atosdan bircə gəlməni də zorla çəkib qopara bilməzdilər. Ancaq bunun müqabilində o, dörd adamın payını içər və bundan əsla nəşələnməzdi. Atosun kefləndiyini yalnız ondan bilmək olardı ki, qaşları həmişəkindən artıq çatılar, üzünün ifadəsi bir az da kədərli olardı.

Müşahidəçiliyi bizə məlum olan d'Artanyan nə qədər çalışardısa, dostunun bu qəmginliyinin səbəbini öyrənə bilməzdi. Atos heç bir zaman məktub almazdı. Onun hər bir addımı qalan üç dostuna məlum idi. Demək olmaz ki, şərab onun dərdinin artmasına səbəb olardı; çünki o yalnız fikirlərini dağıtmaq üçün içərdi.

Onun bu kədərini qumarda uduzması ilə də izah etmək olmazdı, çünki Portosun əksinə, Atos udsa da, uduzsa da, həmişə eyni dərəcədə soyuqqanlı olardı. Portosun isə udduğunu və ya uduzduğunu o saat əhvali-ruhiyyəsindən bilmək olardı.

Hal-hazırda onun heç bir dərdi yox idi. Onunla gələcək barədə danışdıqda, laqeydliklə çiyinlərini atardı. Deməli ki, onun kədərinin əsrarəngiz səbəbi keçmişdə idi.

Atosun hər bir hərəkətində hiss olunan bu əsrarəngizlik onu daha maraqlı bir adam edirdi. Bunu da əlavə etmək lazımdır ki, nə qədər içib keflənmiş olsa da, əsla artıq-əskik danışmazdı və yoldaşları nə qədər məharət və hiylə işlətsələr də, heç bir sirrini öyrənə bilmirdilər.



D'Artanyan düşünürdü ki, "Budur, bəlkə indi yazıq Atos ölmüşdür... Buna da mən səbəb olmuşam; çünki onu, özü üçün əsla faydası olmayan və nə əvvəlini, nə də axırını bilmədiyi bir işə mən cəlb etmişəm".

Səhər saat on bir radələrində Amyen göründü. On ikinin yarısında yolçular artıq meyxananın qapısında idilər.

Axır günlər d'Artanyan çox tez-tez xain meyxana sahibindən necə intiqam alacağı barədə fikirləşirdi. O, şlyapasının gözünün üstünə çəkib meyxanaya girdi. Bir əlini qılıncının qəbzəsinə qoyub, o biri əlində qamçısını oynada-oynada onu hörmətlə qarşılayan meyxana sahibindən soruşdu:

- Məni tanıyırsınızmı?

Meyxana sahibi qorxa-qorxa cavab verdi:

- Bu şərəfə nail olmamışam, monsinyor.

- Elə isə, mən sizin yaddaşınızı təzələrəm! İki həftə bundan əvvəl sizin qəlp pul işə verməkdə töhmətləndirməyə cəsarət etdiyiniz o əsilzadə haradadır?

Meyxana sahibinin rəngi qaçdı, çunki d'Artanyan çox qorxunc bir vəziyyət almışdı. Planşe də ağasını təqlid edirdi.

- Ah, monsinyor, bu barədə heç danışmayın! — meyxana sahibi ağlamsına-ağlamsına səsləndi. – Of, aman Allah! Mən bu səhvim üçün nə bəlalar çəkdim! Of, mən nə bədbəxt adamam!

- Sizdən soruşuram ki, o əsilzadənin başına nə gəlmişdir!

- Lütf edin, mənim sözlərimi dinləyin, monsinyor, mərhəmətli olun, buyurun oturun.

Qəzəbdən və nigaranlıqdan bağrı çatlayan d'Artanyan oturdu. Planşe onun arxasında durdu.

– Əhvalat belə oldu, monsinyor, — meyxana sahibi butun bədəni əsə-əsə davam etdi. – İndi mən sizi tanıdım. Həmin əsilzadə ilə o məşum əhvalat baş verəndə siz buyurub getdiniz.

- Bəli, o gedən mən idim. Görürsünüz ki, bütün həqiqəti açıb söyləməsəniz, mərhəmət gözləməyə haqqınız yoxdur.

Mənim sözlərimi dinləyin və əsl həqiqəti öyrənərsiniz.

– Dinləyirəm.

– Hökumət adamları mənə xəbər vermişdilər ki, meyxanama bir neçə yoldaşı ilə bərabər, əyinlərinə qvardiyaçı və muşketyor paltarları geymiş məşhur qəlp pul kəsənlər gəlmişdir. Monsinyor, sizin

atlarınız, adamlarınız, zahiri görkəminiz hamısı mənə verilən təlimata uyğun idi.

D'Artanyan bu təlimatın haradan gəlmiş olduğunu o saat başa düşüb dedi:

Sonra, sonra?

– Buna görə də mən hökumət adamları tərəfindən köməyə göndərilmiş altı əsgərlə bilikdə mənə "qəlp pul kəsənlər" kimı tanıtdıqları adamları tutmaq üçün tədbir gördüm.

Yenə başladın! d'Artanyan acıqlandı; çünki "qəlp pul kəsən" sözləri onu əsəbiləşdirirdi.

Monsinyor, belə sözlər danışdığım üçün sizdən üzr istəyirəm, ancaq üzrümün səbəbi elə bunlardan ibarətdir. Hökumət məmurları məni qorxutmuşdular. Siz də bilirsiniz ki, meyxana sahibi gərək hökumətin işinə yarasın.

– Ancaq təkrar edirəm, söylə görüm, o əsilzadə haradadır? Onun başına nə gəlmişdir, o sağdır, ya ölmüşdür?

Bir az səbr edin, monsinyor. Bu saat hamısını söyləyəcəyəm. Sizin bıldıyiniz əhvalat baş verdi. Əlavə etməliyəm ki, – meyxana sahibi hiyləgər bir nəzərlə d'Artanyana baxdı, sizin tələsik çıxıb getməniz, şübhələrimizin doğruluğunu və bununla bərabər rəftarımızın yerli olduğunu təsdiq edən kimi oldu. Biz dostunuzun, üzərinə atıldıq, o, özünü son dərəcə cəsarətlə müdafiə edirdi. Nökəri isə gözlənilməz bir bədbəxtlik nəticəsində, qiyafələrini dəyişib mehtər paltarı geymiş əsgərlərlə dalaşdı.

D'Artanyan qışqırdı:

Ay alçaq, deməli siz hamınız əlbirmişsiniz! Bilmirəm, hamınızı qırıb məhv etməkdən məni saxlayan nədir!

– Xeyr, şövkətməab, biz hamımız əlbir deyildik; indı bu saat özünüz bunu görərsiniz. Dostunuz, bağışlayın ki, mən onun şərəfli adını bilmədiyimə görə demirəm, dostunuz tapança ilə iki adamı vurub yıxdıqdan sonra qılıncla özünü müdafiə edə edə geri çəkilməyə başladı. O, mənim adamlarımdan birini yaraladı, özümü də elə vurdu ki, huşumu itirdim.

D'Artanyan çığırdı:

– Ay naqqal cəllad, bu uzunçuluğun qurtaracaqmı? Söylə görüm Atos necə oldu?



Siz şövkətməaba söylədim ki, o, geri çəkilə-çəkilə anbara gedən pilləkənə çatdı Qapı açıq idı, o, aşağı düşüb qapını bağladı və dalını möhkəmləndirdi. Onu həmişə orada tapa biləcəyimizdən arxayın olub, daha əl çəkdik.

Başa düşdüm, d'Artanyan çığırdı, – siz onu öldürmək istəmirdiniz, yalnız azadlıqdan məhrum etmək istəyirdiniz!

– Aman Allah! Azadlıqdan məhrum etməkmi, monsinyor! And içirəm ki, o, özü özünü azadlıqdan məhrum etdi. Əvvəla, bir çox fəlakətlər törətdi: adamlardan birini elə oradaca öldürdü, ikisini ağır yaraladı. Öləni və iki yaralını yoldaşları götürüb apardılar. Mənim daha onlardan heç bir xəbərim olmadı; özüm isə huşa gəldikdən sonra valinin yanına gedib bütün əhvalatı ona danışdım və əsiri nə etməli olduğumu ondan soruşdum. Vali isə söylədi ki, bu işlərdən əsla xəbəri yoxdur və mənim aldığım əmri o verməmişdir. Əgər mən bütün bu işlərə valinin azacıq da olsa qarışdığını söyləmiş olsam, o məni asmağı əmr edəcəkdir. Görünür ki, mən səhv etmişdim. Tutulmalı olan adamın əvəzinə başqasını tutmuşdum. Tutulmalı adam isə xilas olmuşdu.

Axı Atos necə oldu? d'Artanyan çığırdı. Atosun başına nə gəldi?

Mən dostunuzun qarşısında günahımı təmizləmək üçün, – meyxana sahibi davam etdi, – anbarın yanına getdim ki, o cənabı azad edim. Of, cənab, iş tamam başqa cür imiş! Mən ona anbardan çıxmasını təklif etdikdə dedi ki, bu tələdir və yalnız o zaman çıxar ki, söylədiyi bütün şərtləri qəbul edək. Mən əlahəzrət kralın muşketyorları üzərinə əl qaldırmaqla üzərimə çox böyük bir məsuliyyət aldığımı başa düşüb, dedim ki, bütün şərtlərinə əməl etməyə hazıram. Dostunuz dedi ki: "Əvvəla tələb edirəm ki, nökərimi yanıma göndərib bütün silahlarımızı qaytarasınız". Onun bu şərtini o saat yerinə yetirdik. Başa düşürsünüz ki, cənab, bundan başqa da hər cür tələbləri yerinə yetirməyə hazır idik... Cənab Qrimo, hərçənd çox az danışırdı, ancaq öz adını söylədi, cənab Qrimo bütün bədəni yaralanmış halda anbara düşdü. Dostunuz onu içəri buraxdıqdan sonra yenə qapını bağlayıb bizə əmr etdi ki, onu rahat qoyaq.

D'Artanyan çığırdı:

Axı bir söylə görüm, bəs o haradadır?

Anbardadır, cənab

Nə danışırsan, ay bədbəxt! Siz o vaxtdan onu anbarda saxlamısınız?

Allah eləməsin! Əsla yox, cənab! Onu bizmi saxlamışıq? Bircə bilsəydiniz orada o, nə işlər törədir! Of, əgər onu bir təhər tovlayıb oradan çıxarmaqda mənə kömək etsəniz, sizə öz xilaskar mələyimdən daha artıq minnətdar olaram.

Deməli, o, anbardadır? Mən onu orada taparammı?

– Əlbəttə, cənab! O, təkidlə orada qalıb əsla çıxmaq istəmir. Hər gün ona yaba ilə anbarın bacasından çörək və arzu etdikdə ət də veririk. Ancaq, heyhat, onun əsas qidası çörəklə ətdən ibarət deyildir. Bir kərə iki xidmətçimlə birlikdə anbara düşmək istədim. Ancaq dustaq bundan yaman qəzəbləndi. Onun tapançalarını, nökərin isə muşketini doldurduğunun səsini eşitdim. Onların nə etmək istədiklərini soruşduqda, dostunuz cavab verdi ki, onların qırx atımlıq sursatları var və bunların hamısını axırıncı gülləyə qədər atıb heç bir kəsin anbara düşməsinə yol verməyəcəklər. Onda mən yenə də valinin yanına gedib şikayət etdim. O isə mənə dedi ki, layiq olduğum cəzanı çəkirəm və bu hadisə bundan sonra meyxanamda qalan nəcib cənabları təhqir etməmək üçün mənə bir dərs olar.

Deməli o vaxtdan bəri... d'Artanyan sözə başladısa da, sözünü deyib qurtarmadı, çünki meyxana sahibinin kədərdən eybəcərləşmiş üzünü görüb qəhqəhə ilə güldü.

– Belə ki, o vaxtdan bəri, cənab, – meyxana sahibi davam etdi, bizim vəziyyətimiz yaman ağırlaşdı. Sizə söyləməliyəm ki, bizim bütün ərzaq ehtiyatımız o anbardadır. Çəlləklərdə, şüşələrdə şərab, pivə, yağ, şirniyyat, piy, kolbasa, hamısı oradadır. Anbara düşmək bizə qadağan edildiyindən, meyxanamıza düşən yolçulara yemək-içmək verə bilmirəm. Gün-gündən meyxanam boşalmaqdadır. Dostunuz bir həftə də anbarda qalmış olsa, biz sınıq çıxacağıq

– Sənə lap yeridir, fırıldaqçının biri! Məgər zahirimizdən görmürdünmü biz qəlp pul kəsən deyilik, nəcib adamlarıq?

Meyxana sahibi dedi:

Bəli, cənab, bəli, siz haqlısınız. Ancaq bir qulaq asıq, qulaq asın, eşidirsinizmi, o yenə coşub!

Yəqin ki, ona toxunublar, d'Artanyan dilləndi.

Axı necə toxunmasınlar? meyxana sahibi cavab verdi. Bizim meyxanaya iki ingilis əsilzadəsi gəlmişdir.

– Yaxşı, nə olsun ki?

Sizə məlum olduğu kimi, ingilislər yaxşı şərab xoşladıqlarından, bu cənablar da ən əla şərab istəyiblər. Arvadım, yəqin ki, bu cənab



ların tələblərini yerinə yetirmək üçün cənab Atosdan anbara girməyə icazə istəmişdir. O isə adəti üzrə rədd etmişdir... Allah, özün rəhm elə! Bir gör nə hay-küy qaldırıb!

Doğrudan da, d'Artanyan anbar tərəfdən yaman hay-küy gəldiyini eşitdi. O, yerindən qalxıb öndə həyəcandan özünü itirmiş meyxana sahibi, arxada, muşketi hazır tutmuş Planşe, hadisənin baş verdiyi yerə sarı getdilər.

Hər iki ingilis məyus idi. Onlar uzun yol gəlmiş olduqlarından yemək və içmək üçün əldən gedirdilər.

*Bu özbaşınalıqdır!* deyə onlar xarici ləhcəylə təmiz fransız dilində deyirdilər. Bu dəli yazıqlara öz şərablarını satmağa icazə vermir! Biz qapını sındırarıq. Həddindən artıq dəlilik etsə, özünü də öldürərik!

Bir az yavaş, cənab d'Artanyan belindən tapançalarını çəkdi. Siz heç kəsi öldürə bilməzsiniz!

– Bəsdir, bəsdir! qapının dalından Atosun sakit səsi eşidildi. Bu qoçaqları içəri buraxın, onda görərik!

Hər iki əsilzadə mütərəddid halda bir-birinə baxdı. Sanki anbarda ac bir adamyeyən, əfsanəvi nəhəng bir qəhrəman oturmuşdu ki, heç kəs cəzalanmadan onun mağarasına girə bilməzdi.

Bir dəqiqə sakitlik çökdü. Ancaq, nəhayət, hər iki ingilis öz tərəddüdlərindən utandılar. Onlardan biri pillələrlə aşağı enib ayağı ilə qapıya elə şiddətli bir təpik vurdu ki, bu zərbə daş divarı da uçura bilərdi.

D'Artanyan tapançasını ayağa çəkib dedi:

Planşe, yuxarıdakı mənim öhdəmə, sən də aşağıdakı ilə məşğul ol! Aha cənablar, vuruşmaq istəyirsiniz? Buyurun, biz hazırıq!

Aman Allah! – Atosun tutqun səsi eşidildi. Deyəsən, bu d'Artanyanın səsidir?

Bəli, – d'Artanyan ucadan cavab verdi. – Mənim, dostum!

Atos dedi:

– Elə isə, biz bu quldurların öhdəsindən yaxşıca gələrik.

Əsilzadələr qılınclarını çəkdilər. Ancaq iki atəş arasında qaldıqlarından yenə də özlərini itirdilər. Lakin birinci dəfə olduğu kimi yenə də onların qüruru üstün gəldi. İkinci təpikdən anbarın qapısı uzununa çatladı.

– Kənara çəkilin, d'Artanyan, kənara çəkilin! Atos çığırdı. Mən güllə atacağam.

Heç bir zaman qəzəbin mühakiməyə üstün gəlməsinə yol verməyən d'Artanyan çığırdı:

Cənablar! Cənablar, nə etdiyinizi bir düşünün! Atos, səbir edin! Cənablar, siz pis bir işə qarışırsınız! Bir tərəfdən mən və nökərim, o biri tərəfdən dostum sizi güllə ilə deşik-deşik edərik. Bundan başqa, bizim qılıncımız da var. Sizi inandırıram ki, mən də, dostum da qılınc oynatmağı pis bacarmırıq. İcazə verin sizin işlərinizi yoluna qoyum. Sizə söz verirəm ki, bu saat şərab gətirərlər!

Əgər şərab qalmış olsa, - Atos qapının dalından səsləndi.

Meyxana sahibinin alnını soyuq tər basdı.

– Necə?.. Necə yəni "Əgər qalmış olsa", deyə o mırıldandı.

Di yaxşı, qalmış olar, – d'Artanyan davam etdi. Onlar ikisi anbardakı bütün şərabları içib qurtarmayacaqdılar ki! Arxayın olun, cənablar, qılınclarınızı qınlarına qoyun!

Siz də tapançalarınızı belinizə taxın!

Çox yaxşı.

D'Artanyan özü nümunə göstərərək tapançasını belinə taxdı. Sonra üzünü Planşeyə çevirib işarə ilə muşketi boşaltmasını əmr etdi.

İngilislər də deyinə-deyinə qılınclarını qınlarına qoydular D'Artanyan Atosun həbs olunmasının macərasını onlara danışdı və əsilzadə ingilislər hər bir cəhətdən meyxana sahibini müqəssir gördülər

D'Artanyan dedi:

İndi isə, cənablar, öz otağınıza gedin Sizə söz verirəm ki, on dəqiqədən sonra bütün istədiklərinizi gətirərlər.

İngilislər təzim edib getdilər.

D'Artanyan dedi:

– İndi isə, əzizim Atos, xahiş edirəm mənim üçün qapını açasınız.

Bu saat! - Atos cavab verdi

Qapının dalından yerə tökülən çırpı dərzləri və şalbanların gurultusu eşidildi. Bunlar Atosun istehkamının ləvazımatı idi, indi özü öz əli ilə bunları söküb-tökürdü.

Bir dəqiqə sonra qapı açıldı, oradan Atosun solğun üzü göründü. O sürətlə həyəti gözdən keçirtdi.

D'Artanyan yüyürüb onun boynuna atıldı və hərarətlə dostunu qucaqladı. Ancaq o, dostunu bu rütubətli sığınacağından kənara çıxartdıqda, gördü ki, Atos ayaq üstə zorla durur.

D'Artanyan soruşdu:



Siz yaralısınızmı?

Mənmi? Əsla! Ancaq möhkəm sərxoşam, vəssalam, hələ bu vaxta qədər heç bir insan bu dərəcəyə çatmaq üçün bu qədər səy etməmişdir, Allaha and içirəm! Mən özüm təkbaşına azı yüz əlli şüşə şərab içmişəm.

– Allah, özün rəhm elə! – meyxana sahibi çığırdı. – Əgər nökər də heç olmasa ağasının yarısı qədər içmiş olsa, mən sınıq çıxdım.

Qrimo yaxşı nökərdir, özünə mənimlə bərabər dərəcədə içməyə icazə verməz. O, birbaş çəlləkdən içirdi. Ancaq, deyəsən, çəlləyin dəliyini bağlamağı yadından çıxartmışdır. Eşidirsənmi, orada nə isə axır.

D'Artanyan qəhqəhə çəkib güldü. Meyxana sahibinin isə üşütməsi kəsilib canına od düşdü. Bu zaman Qrimo, çiynində muşket, anbardan çıxdı. Onun başı əsirdi, paltarı başdan-başa yağlı mayeyə bulaşmışdı. Meyxanaçı bunun ən əla zeytun yağı olduğunu tanıdı.

Dostlar oradan çıxıb meyxananın böyük salonundan keçərək, d'Artanyanın zorla tutduğu ən yaxşı otağa getdilər.

Bu zaman meyxana sahibi arvadı ilə, əllərinə çıraq alıb uzun müddətdən bəri qapısı üzlərinə bağlı olan anbara getdilər. Onların gözlərinin qabağında dəhşətli bir mənzərə açıldı. Çırpı dərzlərindən, taxtalardan və boş çəlləklərdən ibarət müdafiə fənninin bütün qaydası ilə düzəldilmiş istehkamın ardında, orada-burada yağ və şərab gölməçələri içində yeyilmiş budların sür-sümüyü görünürdü. Anbarın sol küncü sınıq şüşə ilə dolu idi. Açıq qalmış çəlləkdən mayenin son damcıları axırdı. Qədim şairlərin söylədiyi kimi orada, müharibə meydanında olduğu kimi, talan və ölüm hökmfərma idi.

Tavandan asılmış əlli kolbasadan cəmisi on dənəsi qalmışdı

Meyxana sahibinin və arvadının qopardığı fəryad anbarın tağlarını titrətdi. Onların bu dərdi d'Artanyanın qəlbinə toxundu. Ancaq Atos başını da çevirmədi.

Bir azdan sonra meyxana sahibinin kədəri azğınlığa çevrildi. O, şişi qapıb iki dostun çəkildiyi otağa girdi.

Atos meyxana sahibini görən kimi əmr etdi:

- Şərab!

– Şərabmı? özünü itirmiş meyxana sahibi çığırdı, şərabmı?! Siz yüz pistolluqdan artıq şərab içibsiniz. Mən dağılmışam, məhv oldum.

Bəsdir, bəsdir. Biz yalnız atəşimizi söndürmüşük.

Əgər siz yalnız içmiş olsaydınız dərd yarıydı! Axı bütün şüşələri sındırıbsınız!

Məni o anbara kim salmışdı ki? Təqsir özünüzdədir!

Bütün yağlarım zay olub!

Yağ yaranı sağaltmaq uçün ən yaxşı dərmandır Yazıq Qrimo sızin ona vurduğunuz yaraları sağaltmalı deyildimı?

Bütün kolbasalarım yeyılib.

Sızin anbar siçovul ilə doludur.

Meyxana sahıbi məyus halda çığırdı:

Siz mənə bütün bunların pulunu ödəməlisıniz!

Sən üçqat axmaqsan! Atos ayağa qalxmaq ıstədı. Ancaq o saat yenə stula yıxıldı. Onda taqət qalmamışdı.

Meyxana sahibi bır addım gerı çəkilib gözlərinın yaşını tökməyə başladı.

D'Artanyan ona dedi:

Bu sizə Allah tərəfindən göndərilən qonaqları hörmətlə qarşılamağı öyrədər.

– Allah tərəfindənmi? Yaxşısı budur, deyin ki, şeytan tərəfindən!

D'Artanyan dedi:

Əziz dost, əgər bu fəryadlarınla bizim zəhləmizi aparmağa başlasan, onda dördümüz də gedib anbara girər və qapısını bağlarıq. Onda baxıb görərik orada sənə vurulan ziyan doğrudan da söylədiyin qədərdir, ya yox!

Meyxana sahibi dedi.

Nə olar ki, cənablar. Mən təqsirkaram, boynuma alıram. Ancaq hər bir günahdan keçmək olar. Siz hörmətli cənablarsınız, mən isə yoxsul bir meyxanaçıyam. Gərək mənə rəhm edəsiniz.

Atos dedi:

Bu, başqa söhbət! Bu sözlərinlə mənim ürəyimi yumşaltdın. Az qaldı ki, mənim gözlərimdən sənin çəlləyindən axan şərab kimi göz yaşları axsın. Şeytan deyildiyi dərəcədə də qorxunc deyildir. Bizdən qorxma, yaxın gəl!

Meyxana sahibi qorxa-qorxa yaxınlaşdı.

Sənə deyirəm ki, qorxma, – Atos davam etdı. Mən səninlə haqq-hesabı üzmək istədiyim zaman masanın üstünə bir pul kisəsi qoymuşdum.

– Bəli, monsinyor.



Bu kisədə altmış pistol var idi. Onlar hanı?

Məhkəməyə verilmişdir, monsinyor. Axı güman edirdim ki, onlar qəlpdir...

– Di get, həmin pul kisəsini geri al və altmış pistolu özün üçün götür.

Monsinyor, sizə yaxşı məlumdur ki, məhkəmə məmurlarının əlinə keçən bır şeyi bir də geri almaq olmaz. Pullar qəlp olsaydı, yenə ümid etmək olardı. Bədbəxtlikdən onlar qəlp deyilmiş.

– Əzizim, məhkəmə ilə özün işini istədiyin kimi yoluna qoyarsan! Bunun mənə nə dəxli var? Ancaq mənim cibimdə bircə livr də qalmamışdır.

D'Artanyan dedi:

– Bəs Atosun atı haradadır?

– Tövlədə.

O neçəyə dəyər?

Ən yuxarısı əlli pistola.

Onun düz səksən pistol qiyməti var. Onu da özün üçün götür, haqq-hesabımızı üzək!

Atos soruşdu:

Məgər atı satırsan? Mənim Bayəzidimi satırsan? Bəs mən geri qayıdanda nəyi minəcəyəm? Qrimonumu?

– Sənin üçün başqa at gətirmişəm, – d'Artanyan cavab verdi.

– Başqa atmı?

Özü də çox gözəl və cavan atdır! – Meyxana sahibi əlavə etdi.

- İndi ki, bu at həm yaxşı, həm də cavandır, onda köhnəsini özün üçün götür və bizə şərab ver.

– Hansı şərabdan? – meyxana sahibi tamam sakitləşmiş halda soruşdu.

Anbarın lap dərinliyində, barmaqlığın qabağında olan şərabdan. Orada hələ iyirmi beş şüşə qalmışdır. Onlardan altısını bura gətir.

Meyxana sahibi öz-özünə düşündü: "Bu adam dibsız bir çəlləkdir. Əgər iki həftə də burada qalsa və bütün içdiklərinin pulunu versə, mənim işlərim lap düzələr!"

Yadından çıxmasın ha, d'Artanyan tapşırdı: – həmin şərabdan dörd şüşə də o iki ingilisə ver.

Atos dedi:

D'Artanyan, indi o şərab gətirib gələnə qədər sən dostlarımızın başlarına gələnləri mənə danış.

D'Artanyan Portos və Aramıs barədə ona danışdı. Yenicə danışıb qurtarmışdı ki, meyxana sahibi sifariş edilən şərab və budu gətirib gəldi.

Atos özünün və d'Artanyanın stəkanını şərabla dolduraraq dedi:

Portos və Aramis barədə danışdıq. Bəs, dostum, sən özün necəsən? Söylə görüm, necə dolanırsan və başına nələr gəlmişdir? Mənə elə gəlir ki, tutqun görünürsən.

– Heyhat, d'Artanyan cavab verdi, – mən sizin içinizdə hamınızdan bədbəxtəm!

Bədbəxtsənmi? Atos heyrətlə soruşdu. Söylə görüm nə uçün? Danış görüm nə olmuşdur?

– Sonra, – d'Artanyan cavab verdi.

– Sonramı?.. Sonra niyə? d'Artanyan, güman edirsən ki, mən kefliyəm? Bunu yaxşı yadında saxla ki, heç bir zaman mənim fikrim kefli vaxtımdakı kimi açıq olmur. Danış, mən dinləyirəm.

D'Artanyan xanım Bonasye ilə aralarında olan macəranı danışdı. Atos gözlərini qırpmadan onun söhbətini dinlədi. D'Artanyan qurtaran kimi o dedi:

Boş şeydir, bunlar hamısı boş şeydir!

Bu sözləri o, tez-tez söyləməyi xoşlardı.

D'Artanyan cavab verdi:

– Əzizim Atos, deyirsiniz ki, bunlar boş şeydir. - Axı sizin belə işlərdən nə başınız çıxır? Siz ki, heç bir zaman sevməmisiniz!

Atosun gözlərində bir şimşək parladı. Lakin həmin saniyə də söndü.

Bəli, düzdür, – o, sakitcə cavab verdi, mən heç bir zaman sevməmişəm.

D'Artanyan dedi:

Elə isə, mənə bir şey öyrədin, kömək edin. Gərək həqiqəti biləm, mənə təsəlli lazımdır.

– Təsəllimi? Nə üçün?

– Bədbəxtliyim üçün.

Sizin "bədbəxtliyiniz" ancaq təbəssüm doğura bilər, – deyə Atos çiyinlərini çəkdi. – Mən istərdim biləm ki, bir eşq macərasını sizə danışsam, siz ona nə deyərdiniz.

– Bu sizinmi başınıza gəlmişdir?

– Ya mənim, ya da dostlarımdan birinin, bunun nə fərqi var?



Danışın, danışın, Atos!

– Yaxşısı budur içək.

İçin və danışın.

– Bu, da doğru sözdür, Atos stəkanı içib bir də doldurdu. Bu iki işi eyni vaxtda görmək olar.

Atos fikirlərini toplayırmış kimi susdu D'Artanyan onun rənginin get-gedə ağardığını gördü. Atos o dərəcədə sərxoşlaşmışdı ki, adi əyyaşlar bu dərəcəyə çatdıqda yuxulayırlar O isə sanki ayıqlıqda sayıqlayırdı. Onun vəziyyətində nə isə qorxunc bir şey var idi.

O soruşdu:

- Siz mütləq bu macəranı eşitmək istəyirsinizmi?

D'Artanyan cavab verdi:

Əlbəttə!

Qoy siz deyən olsun. Mənim bir dostum, başa düşürsünüzmü, mən özüm yox, bir dostum, Atos özü öz sözünü kəsərək acı-acı gülümsündü, əsli bizim yerdən, yəni Berridən olan bir qraf, məşhur nəslə mənsub olan bir adam, iyirmi beş yaşlarında olanda on altı yaşında, eşqin özü qədər gözəl bir qıza aşiq olmuşdu. O qız nəinki adamın xoşuna gəlir, hətta insanı məst edirdi O, kiçik bir qəsəbədə öz keşiş qardaşı ilə yaşayırdı. Hər ikisi Berri mahalına kənardan gəlmişdilər. Hamı qızın gözəlliyinə və qardaşının əxlaqına heyran olmuşdu. Heç kəsin ağlına gəlmirdi bu adamların haradan gəlib çıxdıqları ilə maraqlansın. Ancaq deyirdilər ki, onlar yaxşı bir ailədəndirlər. Həmin bu yerin senyoru olan mənim dostum o qızı xoşluqla və ya istəsə, zorla ələ gətirə bilərdi. Onun buna gücü çatardı. Heç bir kəsə məlum olmayan bu adamları kim mudafiə edəcəkdi? Bədbəxtlikdən dostum namuslu bir adam idi və həmin qızla evləndi. Axmaq! Səfeh! Sərsəm!

D'Artanyan soruşdu:

Bundan pis nə var ki? Bir halda ki, qızı sevirmiş?

Dayanın, – Atos cavab verdi. O, həmin qızı öz qəsrinə gətirdi. Həmin cəmiyyətin birinci xanımı dərəcəsinə yüksəltdi və ona haqq vermək lazımdır, xanım da özünü öz dərəcəsinə layiq aparmağı bacarırdı.

D'Artanyan soruşdu:

Bəs sonra?

Bir dəfə həmin qadın öz əri ilə ova getmişdi, Atos pıçıltılı bir səslə və çox sürətlə sözünə davam etdi. – Qadın atdan yıxılıb huşunu itirmişdi. Qraf tez ona kömək etməyə yüyürdü. Paltar qadını sıxırdı, o,

xəncər ilə paltarı cırıb qadının çiynini açdı. D'Artanyan, tapın görək qadının çıyninda nə var idı? –Atos soruşub ucadan güldü.

D'Artanyan cavab verdi

- Mən nə bilim nə varmış?

- Kral zanbağı! – Atos pıçıldadı. – Bu qadın damğalanmışdı!..

Bu sözləri deyib, Atos bir stəkan şərabı birdən başına çəkdi.

D'Artanyan çığırdı:

- Nə dəhşət!

Dostum, bu mələk, iblis imiş! Qız damğalı imiş!

- Bəs qraf nə elədi?

– Qraf səlahiyyətli bir senyor idi və öz təbəələrinə ölüm cəzası verməyə ixtiyarı var idi. O, qrafinyanın paltarını cırdı, qollarını qarıb dalına bağladı və onu bir ağacdan asdı.

D'Artanyan çığırdı:

- Aman Allah! Atos, bu kı, qətldir!

- Bəli, qətldir, - rəngi ölü kimı ağarmış Atos cavab verdi. – Ancaq deyəsən bizim şərabımız qurtarıb...

Atos axırıncı şüşəni qapıb dodaqlarına yaxınlaşdırdı və birnəfəsə hamısını içdi. Sonra başını yumruqlarının üstünə dirəyib qaldı. D'Artanyan dəhşət içində onun qarşısında dayanmışdı.

– Bu əhvalat məni gözəl, şairanə və sevən qadınlara inanmaq azarından qurtardı, – Atos dilləndi. – Allah eləsin siz də mənim kimi olasınız. Gəl içək!

Atos həyəcanlanmış olduğundan, başladığı söhbəti artıq birinci şəxs adından söylədiyinin fərqinə varmırdı. O, daha özünü uydurma bir dost adı altında gizlətməyə çalışmırdı.

D'Artanyan soruşdu:

Bəs onun qardaşı?

Qardaşımı? Atos təkrar etdi.

Hə, o ruhanı.

- Mən onu da asmaq istədim. Ancaq o, duyuq düşmüşdü. Bir gün əvvəl öz vəzifəsini qoyub qaçmışdı.

- Bəs sonra onun kim olduğunu öyrəndınızmi?

- Əlbəttə, öyrəndim. O, həmin gözəlin aşiqı və iş ortağı imiş. Ruhani paltarı geymiş bir rəzil imiş. Bəlkə də bunu öz məşuqəsini ərə vermək üçün edirmiş. Ümıd edirəm kı, onu bu vaxta qədər çarmıxa gərmiş olarlar!..



– Aman Allah, aman Allah! – bu dəhşətli etirafdan özünü itirmiş d'Artanyan çığırdı.

D'Artanyan, bəs siz niyə donuz ətindən yemirsiniz? Çox dadlıdır! Atos ətdən bir tıkə kəsib d'Artanyanın boşqabına qoydu. Heyf kı, anbarda belə buddan dörd-beşı qalmamışdır! Mən əlli şüşə də şərab içərdim!

D'Artanyan onu dəli edən bu söhbətə daha davam edə bilmədi. Başını qolları üstünə qoyub özünü yatmış kimi göstərdi...

– Bizim cavanlar içməyi bacarmırlar, – Atos ona baxaraq təəssüflə söyləndi, hələ bu, cavanların ən yaxşısıdır.

## XXVIII

## DÖNÜŞ

Atosun bu etirafı d'Artanyanı sarsıtmışdı. Ancaq bu yarım etirafda onun üçün bır çox anlaşılmayan cəhətlər də var idi. Hər şeydən əvvəl, onlar hər ikisi – özü də, Atos da keflənmişdılər. Hər halda iki-üç şüşə Burqund şərabının beynində əmələ gətirdiyi dumana baxmayaraq, d'Artanyan səhər ayıldıqda, Atosun söylədiyi sözlərin hər bır kəlməsini yadında yaxşı saxlamışdı. Sanki bu sözlər danışıldıqca onun beyninə nəqş olunmuşdu. Bu hal cavan qaskoniyalının qəlbində həqiqəti öyrənmək üçün daha böyük bir arzu yaratdı. O, dünənki söhbəti davam etdirmək məqsədilə, dostunun yanına getdi. Ancaq Atos qaradinməz olmuşdu.

O, d'Artanyana dedi:

- Əzizim d'Artanyan, dünən yaman keflənmişdim. Hələ bu gün səhər dilimi ağzımda zorla tərpədirdim. Yəqin ki, dünən xeylı cəfəngıyat danışmışam

Atos bu sözləri söyləyib dostunun uzünə elə diqqətlə baxdı ki, o, tutuldu.

D'Artanyan cavab verdi:

– Əsla yox! Sız dünən heç elə bir şey danışmamısınız

- Qəribədir! Mənə elə gəlir ki, dünən sizə dəhşətli bir macəra nağıl etmişəm.

Bu sözlərdən sonra Atos dostunun üzünə elə baxdı ki, sanki qəlbinin dərinliklərinə vaqif olmaq istəyirdi.

D'Artanyan dedi:

Yəqin ki, mən dünən sizdən də artıq sərxoş olmuşam. Heç bir şey yadıma gəlmir.

Ancaq bu cavab Atosu təmin etmədi.

Əziz dostum, siz, yəqin, müşahıdə etmişsiniz ki, bizim hər biri mizdə sərxoşluq özünü bir cür büruzə verir: kimi qüssəli olur, kimi nəşələnir. Mən sərxoş olduqda, adət üzrə, qüssələnirəm və cürbəcür dəhşətli nağıllar danışmağa başlayıram ki, bunları da vaxtilə beynimə qoca dayəm doldurmuşdur. Bu mənim nöqsanımdır, etiraf edirəm ki, böyük nöqsandır.

Atos bu sözləri elə təbii bir əda ilə söylədi ki, d'Artanyan əvvəlki inamında tərəddüd etməyə başladı.

Cavan oğlan həqiqəti öyrənməyə çalışaraq dedı:

– Doğrudan da, indi yadıma gəlir. Qarışıq bir yuxu kimi yadıma gəlir ki, guya siz asılan adamlardan danışırdınız.

Elədir ki, var! – Atos rəngi ağarmış halda cavab verdi. - Mən buna əmin idim; çünki asılan adamlar həmişə mənim gözümə görünən dəhşətli bir xəyalatdır.

D'Artanyan dedi:

Bəli, bəli, indi yadıma düşdü... Gərək ki, siz... Dayanın... Gərək ki, qadın barəsində danışırdınız.

Atos dedı:

Gördünüzmü! Sarışın bir qadın barəsində danışmaq mənim ən çox sevdiyım bir macəradır. Nə vaxt mən bu söhbətı etsəm, bılın ki, son dərəcə sərxoşam

D'Artanyan dedi:

Bəli, ucaboylu, gözəl, göy gözlü sarışın bir qadın haqqında bir macəra.

Həmin qadın ki, onu asmışdılar.

Onun əri sızın dostlarınızdan məşhur bır senyor imiş, – d'Artanyan diqqətlə Atosun üzünə baxaraq davam etdı.

- Görürsünüzmü? Adam nə danışdığını bilməyəndə başqa bırını rüsvay edə bilər, – Atos çiyinlərini çəkdi. – Bundan sonra heç bir zaman bu dərəcədə içməyəcəyəm, d'Artanyan. Bu, çox pis vərdışdir.

D'Artanyan dınmədı



Atos birdən-birə söhbətin mövzusunu dəyişdirərək dedi:

– Hə, yeri gəlmişkən deyim. Mənə bağışladığınız at üçün təşəkkür edırəm. Bu, doğrudan da, çox gözəl bir hədiyyədir. Ancaq heyf ki, bu atla uzun səfərə çıxmaq olmaz.

Səhv edirsiniz. Mən bu atla saat yarımdan bir az müddətdə on lye yol getmişəm. At da əsla yorulmamışdı.

– Eləmi? Elə isə, o at üçün təəssüf etməliyəm.

Təəssüfmü?

Bəli, mən onu uduzdum.

Nə vaxt? Necə?

– Bax belə: bu gün səhər saat altıda yuxudan oyandım, hamı ölü kimi yatmışdı. Mən darıxdım. Hələ dünənki sərxoşluqdan sonra əməlli-başlı özümə gəlməmişdim. Aşağı salona endim, orada bir at dəllalından at almaq istəyən ingilisi gördüm. Həmin ingilisə yanaşıb kürən bir yabıya yüz pistol verdiyini gördükdə, söylədim ki, mənim də satlıq bir atım var. "Siz onu mənə satmaqmı istəyirsiniz?" Yox uduzmaq istəyirəm. – "Nə oynayaq?" Zər oyunu. – Dediyimi elədim. Atı uduzdum, amma hər halda yəhərini və saır ləvazimatını təkrar uddum.

D'Artanyan narazı halda üz-gözünü turşutdu.

Atos soruşdu:

– Bu, sizin acığınızamı gəlir?

– Etiraf edirəm ki, elədir. Müharibə günü bizi bu atlar sayəsində tanımalıydılar. Onu bizə hədiyyə etmişdilər. Atos, yaxşı iş görməmişsiniz.

Atos cavab verdi:

– Ancaq, dostum, bir özünüzü mənim yerımdə təsəvvür edin. Darıxmaqdan bağrım çatlayırdı. Bır də, doğrusu, mən ingilis atlarını xoşlamıram. Əgər məsələ yalnız birinin bu atlardan bizi tanımasından ibarətdirsə, onda elə yəhər dəsgahı da kifayət edər. Onun görkəmi elə bəsdir.

D'Artanyanın qaşqabağı açılmırdı.

– Çox heyf... Atos davam etdi. – Görünür bu atları siz çox əzizləyirmişsiniz. Ancaq mən hələ söhbətimi qurtarmamışam.

– Daha neyləyibsınız ki?

– Öz atımı uduzduqdan sonra sizin atınızı da qumara qoymağı qərara aldım.

– Yəqin ki, bunu etmədiniz?

Etdim.
D'Artanyan narahat halda çığırdı:
– Vay səni!
Oynadım və uduzdum.
- Mənim atımımı?
Sizin atınızı Mənimki yeddi xal oldu, ingilisinki isə səkkiz. Bircə xal artıq oldu. Bir işə baxın ha!
Atos, and içirəm ki, dəli olubsunuz!
Dostum, bunu mənə bu gün səhər yox, dünən sizə o sarsaq macəranı danışdığım zaman söyləməliydiniz. Mən sizin atınızı yəhəri və bütün dəsgahı ilə bərabər uduzdum.
Aman Allah!
Hələ dayanın, hamısını danışıb qurtarmamışam. Əgər tərslik etməsəydim, ən yaxşı oyunçu olardım. Ancaq mən tərsəm. Qumar da sərxoşluq kimi bir şeydir .. Mənim tərsliyim tutmuşdu.
– Daha nəyi uduza bilərdiniz ki? Axı heç bir şeyiniz yox idi.
Vardı, dostum, vardı. Hələ sizin barmağınızda parıldayan o brilyant üzüyünüz qalmışdı. Bunu dünən görmüşdüm.
D'Artanyan əlini üzüyünə ataraq çığırdı:
Brilyantımı!
Mən onu min pistol qiymət eləmişdim.
D'Artanyan qorxudan ölümcül halda və ciddi bir səslə dedi:
– Ümid edirəm ki, siz mənim üzüyüm barədə bir kəlmə də danışmamısınız?
– Əksinə, əziz dostum, bu brilyant, özünüz bilirsiniz ki, bizim sonuncu ehtiyatımız idi. Bunun sayəsində mən yəhərləri və atlarımızı, hətta yol üçün bir az pul da uda bilərdim.
D'Artanyan səsləndi:
Canıma uşütmə düşdü, Atos!
– Deməli ki, brilyant barəsində mənimlə qumar oynayan hərifə məlumat verdim. O da üzüyü barmağınızda görübmüş, lənət şeytana! Axı elə şey ola bilməz ki, siz parlaq bir ulduzu barmağınıza taxıb gəzdirəsiniz və güman edəsiniz ki, heç kəs görməz
Danışın, qurtarın görək, əzizim, qurtarın! – d'Artanyan yalvarıcı bir səslə ona müraciət etdi. – Namusuma and içirəm ki, sizin soyuqqanlığınız mənim canımı alır.
– Biz həmin brilyantı, hərəsi yüz pistol olmaq üzrə on yerə böldük.



Yəqin ki, mənim səbrimi sınamaq üçün zarafat edirsiniz.
– Yox, lənət şeytana, zarafat etmirəm! İstərdim biləm ki, siz mənim yerimdə olsaydınız, nə edərdiniz? İki həftədir insan üzü görməmişdim. Nəhayət, keflənib şərab şüşələrilə söhbət etməkdən təngə gəlmişdim.
D'Artanyan cavab verdi:
– Mənim brilyantımı qumara qoymaq üçün bu heç də kafi bir səbəb deyildir.
Bir söhbətimin axırına qulaq asın. Deməli ki, mənim hərəsi yüz pistoldan on dəfə oynamağa imkanım vardı. On üç əldə mən hamısını uduzdum. On üç əldə! On üç rəqəmi mənim üçün həmişə məşum olmuşdur. İyulun on üçündə mən...
Lənət şeytana! – d'Artanyan çığıraraq mizin arxasından qalxdı.
Atos dilləndi:
Səbir edin! Hələ söhbətimi qurtarmamışam. İngilis qəribə bir adam idi. Onun dünən Qrimo ilə söhbət etdiyini görmüşdüm. Qrimoya təklif edirmiş ki, onun yanında qulluğa girsin. Mən, Qrimonu, o dilsiz-ağızsız Qrimonu on hissəyə böldüm.
D'Artanyan qeyri-ixtiyari güldü:
– Bax, bu, böyük hünərdir!
– Qrimonun özünü, eşidirsinizmi? Düz on yerə! Halbuki Qrimo özü bütün vücudu ilə on dukaton pula dəyməz!.. Beləliklə, mən brilyantı təkrar uddum. İndi bundan sonra deyin ki, inadkar olmaq yaxşı şey deyilmiş!
– Vallah, bu, çox qəribədir! d'Artanyan bir az şənləndi.
Başa düşürsünüzmü, əlimin yaxşı gətirdiyini görüb, həmin saat yenə brilyantı qumara qoydum.
Vay şeytan! – d'Artanyan hirslənərək yenidən qaşqabağını tökdü.
– Sizin yəhər dəstgahınızı, sonra atınızı, sonra öz yəhərimi, sonra öz atımı uddum, sonra yenə uduzdum. Sözün qısası, sizin yəhər dəsgahınızı, sonra özümünkünü uddum. Bununla oyunumuz bitdi. İndi bizim vəziyyətimiz sizə aydındırmı?
D'Artanyan çiynindən bir dağ götürülmüş kimi dərindən nəfəs aldı.
Yaxşı, bəs biz atsız bu yəhər dəsgahlarını neyləyəcəyik?
Bu barədə düşünmüşəm
Atos, siz məni qorxudursunuz!
– Bura baxın, d'Artanyan, siz çoxdanmı qumar oynamırsınız?

– Heç zərrə qədər həvəsim də yoxdur.
İmtina etməyin, siz çoxdan oynamamısınız, yəqin ki, əliniz gətirər.
– Yaxşı, nə olsun ki?
– Məsələ belədır. İngilis də, yoldaşı da hələ buradadırlar. Mən gördüm ki, onun yəhər dəsgahlarına çox heyfi gəlır. Siz də yəqin ki, atlar üçün heyfsilənirsiniz. Mən sizin yerinizdə olsaydım, ata müqabil yəhər dəsgahını qumara qoyardım.
– Axı o razı olmaz.
– Razı olmaz, bir atın müqabilinə ikisini qoyarsınız. Mən sizin kimi xudbin deyiləm.
D'Artanyan dedi:
Doğrusu, əzizim Atos, mən daha heç bir şeyi təhlükəyə qoymaq istəmirəm.
Atos soyuq bir əda ilə dedi:
– Çox təəssüf!.. İngilisin cibi pulla doludur. A kişi, nə olacaq? Bir dəfə risk edin!
- Bəlkə uduzdum?
– Yox, udarsınız.
– Birdən uduzdum?
Nə olar ki! Yəhər dəsgahlarını verərsiniz.
Di yaxşı! Bir əl oynamağa nə var ki! d'Artanyan cavab verdi.
Atos ingilisi axtarmağa getdi, onu tövlədə tapdı. Bu, çox münasib bir təsadüf idi. Muşketyor öz şərtlərini təklif etdi: ingilis bır atın müqabilində və ya yüz pıstolun müqabılində iki yəhər dəsgahını seçməli idi. İngilis razı oldu.
D'Artanyan əli əsə-əsə zərləri atdı. Üç xal düşdü. Onun rəngi qaçdı. Atos ona söylədi:
– Bu, çox pis əl oldu, dostum
Sonra ingilisə dönüb dedı:
Sızın atlarınız tamam dəsgah olacaq, cənab...
Özünü qalıb gəlmiş hesab edən ingilis zərləri heç qarışdırmayıb atdı. O, öz qələbəsinə həddindən artıq inanmışdı.
D'Artanyan hırsləndiyini göstərməmək üçün üzünü yana çevirdi.
– Bir bax ha! Atos həmişə olduğu kimi sakıt səslə dılləndi - Heç görünməmiş bir hadisə: iki xal!
Ingilis baxıb heyrət içində qaldı.
İngilis soruşdu:



Deməli cənab, siz öz atınızı geri alacaqsınız?
D'Artanyan cavab verdi:
Əlbəttə!
– Bəs əvəzə-əvəz oynaya bilmərəm?
– Bizim şərtimizə görə bu olmamalıdır. Yadınızdadırmı?
Doğrudur. At sizin nökərinizə qaytarılacaqdır.
Atos ingilisə müraciət edərək dedi:
İcazə verin dostuma bir neçə sual verim.
– Buyurun.
Atos d'Artanyanı kənara çəkib soruşdu:
Siz atı götürəcəksiniz, deyilmi?
Əlbəttə.
Nahaq yerə. Mən sizin yerinizdə olsam, yüz pıstolu götürərdım. Axı siz yəhər dəsgahını öz arzunuza görə ya bir atın müqabilində və ya yüz pistol müqabilində qoymuşdunuz.
Mən atı götürürəm.
Təkrar edırəm ki, nahaq yerə. Biz ikimız bir atla neyləyəcəyik? Mən bir saniyə də tərəddüd etmədən yüz pıstolu götürərdim. Parısə qayıtmaq üçün bızə pul lazımdır.
Atos, bu at mənim üçün qiymətlidir.
Nahaq yerə. At büdrəyə, ayağı sınar, xəstə bır atın yediyi axurdan yem yeyib xəstələnər və at, daha doğrusu, yüz pıstol əldən gedər. At sahibi öz atını yedırtməlidir. Ancaq yüz pistol öz sahibini yedirib-içirdər.
Yaxşı, bəs biz nəyə mınıb geri qayıdarıq?
Lənət şeytana, nökərlərimizin atlarına Hamı onsuz da görür ki, biz nəcib adamlarıq.
– Aramis ilə Portos öz gözəl atlarını minıb çapdıqda biz də yabıların üstündə çox qəşəng görünərık
Aramıs, Portos! – Atos çığıraraq güldü.
– Nə olub kı, d'Artanyan dostunun nəşələnməsinin səbəbini anlamayıb soruşdu.
Yaxşı, yaxşı! Sonra! – Atos davam etdi.
Deməlı, siz məsləhət görürsünüz ki...
Yüz pistolu götürün, d'Artanyan. Bu pul ilə bız bu ayın axırına qədər çox gözəl yaşaya bilərik, hamımız yorulmuşuq və bir az dincəlsək, heç pıs olmaz.

– Dincəlməkmi? Yox, Atos, Parisə qayıdan kimi mən o bədbəxt qadını axtarmağa başlayacağam.

Siz elə bilirsiniz ki, at sizin üçün luidorlardan faydalı olar? Yüz pistolu götürün, dostum, yüz pistolu götürün.

D'Artanyan üçün yalnız inandırıcı bir dəlil lazımdı. Buna görə də o, yüz pistolu götürəcəyini söylədi və ingilis o saat pulu verdi.

Bundan sonra dostlar yola hazırlaşmağa başladılar

Onlar meyxana sahibinə Atosun əvvəlki atından başqa, altı pistol da verib onunla haqq-hesabı üzdülər. D'Artanyan ilə Atos, Planşe ilə Qrimonun atlarını mindilər. Nökərlər yəhərləri dallarına atıb piyada getdilər.

Atlar nə qədər pis olsa da, yenə dostlar öz nökərlərini ötüb keçdilər və Krevkerə onlardan əvvəl çatdılar.

Meyxanaya çatdıqda, Aramisin başını pəncərədən çıxarıb uzaqdan qalxan tozu həzin-həzin seyr etdiyini gördülər.

Hər iki dost birdən çığırdı:

– Hey, Aramis! Burada neyləyirsiniz?

– Aha, d'Artanyan! Atos! - Aramis səsləndi. Mən bütün dünya nemətlərinin necə sürətlə puça çıxdığını fikirləşirəm. Çapa-çapa gedib toz dumanları içində gözdən itən ingilis atını bütün dünya nemətlərinin fani olduğuna mənim üçün canlı misaldır.

İşin nə yerdə olduğunu başa düşən d'Artanyan soruşdu:

– Bu nə deməkdir?

Bu o deməkdir ki, məni aldadıblar. Saatda beş mil çaparaq gedən bir atı məndən altmış luidora aldılar!

D'Artanyan ilə Atos qəhqəhə çəkib güldülər.

Aramis dedi:

– Əzizim d'Artanyan, xahiş edirəm mənə acığınız tutmasın; çünki mənim cəzam sizin hamınızdan ağır olmuşdur. Məlun dəllal məni aldadıb ən azı əlli luidor əskik vermişdir. Budur, siz məndən daha qənaətkar və haqq-hesab bilənsiniz. Siz nökərlərinizin atlarını minib öz atlarınızı isə, yedəkdə aram-aram və qısa yol ilə sürərək gətirmələrini əmr etmişsiniz.

Bir neçə dəqiqə bundan əvvəl Amyen yolunda görünən furqon bu zaman gəlib dayandı. Planşe ilə Qrimo, başlarında yəhər dəsgahı furqondan düşdülər. Furqon Parisə boş qayıdırdı. Nökərlər şərtləşmişdilər ki, pul əvəzinə bütün yol uzunu furqonçuya su daşısınlar.



Aramis onları gördükdə soruşdu:

– Bu nə deməkdir? Təkcə yəhərləri görürəm.

Atos soruşdu:

İndi işi başa düşdünüzmü?

– Deyəsən dostlarım da eynən mənim kimi ediblər. Mən də sövqitəbii hiss ilə yəhər dəsgahını saxlamışam. Bazen, mənim yəhərlərimi də o cənabların yəhərlərinin yanına qoy!

D'Artanyan soruşdu:

Bəs öz keşişlərinizi neylədiniz?

Aramis cavab verdi:

– Ertəsi gün onları nahara çağırdım, – yeri gəlmişkən deyim ki, burada çox əla şərab var. Onları o qədər içirtdim ki, abbat hərbi qulluqdan əl çəkməyi mənə qadağan etdi, iezuit isə özü muşketyor olmağı arzu etdi.

D'Artanyan çığırdı:

Rədd olsun dissertasiya! Mən tələb edirəm ki, dissertasiya qadağan edilsin!

O vaxtdan bəri, – Aramis sözünə davam etdi. - Mən günümü çox xoş keçirirəm. Sillabik vəzndə yeni bir poema başlamışam. Çox çətindir. Ancaq hər bir əsərin başlıca ləyaqəti onun çətin olmasındadır. Poemanın məzmunu aşiqanədir. Birinci nəğməsini sizə oxuyaram. Bu hissə dörd yüz misradan ibarətdir. Bir dəqiqə oxuyub qurtarmaq olar.

Latın dilindən də, şerdən də zəhləsi gedən d'Artanyan dedi:

Əzizim Aramis, şerin çətinliyi məsələsinə bir də qısalığı əlavə edin, onda şübhə yoxdur ki, sizin poemanızın azı iki məziyyəti olar.

– Bundan əlavə, - Aramis davam etdi. – Poemanın ideyaları ən yüksək ideyalardır. Şübhə yoxdur ki, siz bunu bəyənərsiniz. Bura baxın, dostlar, deməli ki, Parisə qayıdırıq? Əhsən! Mən hazıram! Yenə mehriban Portosu görəcəyikmi? Daha yaxşı! Heç bilmirsiniz mən o böyük uşaq üçün nə qədər darıxmışam? Öz atını yəqin ki, bir səltənət ilə də dəyişməz! Portosu öz yeni atının belində görmək üçün nə qədər tələsirəm!

Atları dincəltmək üçün dostlar karvansarada bir saatadək qaldılar Aramis meyxana sahibilə haqq-hesabını üzüb, Bazeni iki digər nökər ilə birlikdə furqona mindirdi və hamısı Portosun yanına yola düşdülər.

Onlar Portosu, demək olar ki, sağalmış gördülər. Bu ləyaqətli muşketyor d'Artanyanın son dəfə gördüyündən bəri xeyli yaxşılaşmışdı.

O, dörd nəfərlik qab-qacaq düzülmüş bir masanın arxasında tək oturmuşdu. Nahar çox gözəl qarnirli ətdən, əla şərablardan və dadlı meyvələrdən ibarət idi.

Portos ayağa qalxaraq yoldaşlarına dedi:

– Lap vaxtında gəlib çıxmısınız. Mən elə indicə süfrəyə oturmuşam. Oturun, bərabər nahar edək!

– Oho! O saat görünür ki, bu şüşələr Muşketonun kəmənd ilə çəkib çıxartdığı şüşələrdən deyil! Budur, dana əti və miyantən də var.

Portos dedi:

Mən bədənimi bərkidirəm Bu məlunzadə adamı lap əldən salır. Atos, heç yıxılıb zədələnmisinizmi?

Yox, əsla!

Aramis soruşdu:

– Bəs bu nahar tək sizin üçünmü tərtib olunmuşdur, əzizim Portos?

– Yox, mən qonşularımı gözləyirdim. Ancaq xəbər göndəriblər ki, gəlməyəcəklər. Siz onları əvəz edərsiniz və mən bundan çox razı qalaram Ey, Muşketon, səndəlyə gətir və şərab şüşələrinin sayını ikiqat artır.

Bir neçə dəqiqədən sonra Atos dedi:

Xəbəriniz varmı ki, biz nə yeyirik?

D'Artanyan dedi:

Lənət şeytana, mən göyərti və beyin ilə qızarmış dana əti yeyirəm.

Portos dedi:

– Mən qoyun miyantənı.

Aramis dedi:

– Mən isə cücə qızartması.

Atos sakit bir əda ilə dedi:

– Hamınız səhv edirsiniz. Yediyiniz at ətidir!

Bəsdir! – d'Artanyan çığırdı.

At ətimi? – Aramis iyrənmiş halda təkrar etdi. Bircə Portos cavab vermədi.

– Bəli, at əti. Elə deyilmi, Portos, biz at əti yeyirık; hələ bəlkə də yəhər qarışıq?

Portos cavab verdi:

Yox, cənablar, mən yəhəri saxlamışam.

Aramis dedi:



– Elə biz hamımız bir-birinin tayıyıq. Elə bil ki, bir-birimizlə sözləşmişik!

Portos dedi:

Nə çarə! Bu at həddindən artıq gözəl idi. O mənim qonaqlarımı utandırırdı. Mən isə, onları utandırmaq istəmirdim.

D'Artanyan soruşdu:

Sizin hersoginya yəqin ki, hələ də yaylaqdan qayıtmamışdır, eləmi?

Hələ oradadır, – Portos cavab verdi. Bir də mənim atım bir mahal valisinə o qədər xoş gəlmişdi ki, atı ona bağışladım. Həmin qubernator bu gün bura gəlməli idi.

– Bağışladınmı? d'Artanyan çığırdı.

Portos dedi.

Aman Allah, əlbəttə, bağışladım; çünki o atın qiyməti ən azı üç yüz pistol idi. O xəsis isə, mənə yüz əlli pistoldan artıq vermədi.

Yəhərsizmi? – Aramis soruşdu.

– Bəli, yəhərsiz.

Atos dedi:

– Görürsünüzmü, cənablar, Portos bizim hamımızdan çox qazanmışdır.

Dostlar qəhqəhə ilə güldülər. Portos işin nə yerdə olduğunu bilmirdi. Ancaq dostları bu gülüşmənin səbəbini ona danışdılar; o da onlara qoşulub ürəkdən güldü.

D'Artanyan dedi:

Deməli ki, indi hamımızın pulu var?

Atos dedi:

– Yalnız mənim yoxdur. Aramisin İspaniya şərabı o qədər xoşuma gəldi ki, bunlardan altmış şüşə nökərlərin getdiyi furqona yükləmələrini tapşırdım və buna xeyli pul sərf etdim.

Aramis dedi:

Təsəvvür edin ki, mən bütün pulumu axırıncı suya qədər Mondidye kilsəsinə və iezuit monastırına bəxş etdim. Bundan başqa, bəzi borclarım da var idi. Özüm üçün və sizin üçün dua oxunmasını sifariş etmişdim. Şübhəsiz, bu duanın bizim hamımıza xeyri olacaqdır.

Portos dedi:

Elə bilirsiniz ki, mənim ayağımın əzilməsi müftə başa gəlmişdir? Hələ Muşketonun yarasını demirəm. Mən onun üçün həftədə

iki dəfə həkim çağırırdım. Həkim isə, məndən ikiqat artıq pul alırdı; çünki güllə axmaq Muşketonun elə bir yerindən dəymişdi ki, onu ancaq nüsxəbəndlərə göstərmək olardı.

Atos Aramisin və d'Artanyanın üzünə baxıb dedi:

Hə, hə, görürəm ki, siz bu yazıq oğlanla çox alicənab rəftar etmışsiniz. Əlbəttə, bu mehriban ağaya yaraşan bir hərəkətdir.

Müxtəsər, - Portos davam etdi, bütün borclarımı verdikdən sonra təxminən otuz ekü qədər pulum qalacaqdır.

Aramis dedi:

– Mənimki isə, on pistol.

Atos dedi.

– Yaxşı, demək olar ki, biz dünyanın ən varlı adamlarıyıq. D'Artanyan, bəs sizin yüz pistoldan nə qədər pulunuz qalır?

D'Artanyan dedi:

İyirmi beş pistol.

Mənımkı isə, – Atos cibindən bir neçə xırda pul çıxartdı, – mənimki isə...

Sizin heç bir şeyiniz qalmamışdır.

Deyəsən elədir. Hər halda o qədər azdır ki, bunu ümumi kassaya daxil etmək olmaz.

İndi hesablayaq görək, hamımızın nə qədər pulu var? Portos, sizinkı nə qədərdir?

Otuz ekü.

– Aramis, bəs sizinki?

– On pistol.

– Bəs sizinki, d'Artanyan?

– İyirmi beş.

Atos soruşdu:

– Cəmisi neçə elədi?..

D'Artanyan dedi:

- Dörd yüz yetmiş beş livr. Parisə çatdıqda yəhərlərdən başqa bizim düz dörd yüz livr pulumuz olar.

Aramis soruşdu:

– Bəs bizim eskadron atlarımız?

– Nə olsun ki! Bız nökərlərimizin dörd atını verıb özümüz üçün iki at alarıq və bunları qumara qoyub oynarıq. Dörd yüz livrə piyada qalanlardan birinə də at alarıq, qalan xırda-xuruşu d'Artanyana verərik. Onun əli yaxşı gətirir. Gedib bir qumarxanaya qumar oynar, vəssalam.

Portos dedi:

– Gəlin yeməyimizi yeyək. Axı soyuyur...

Dörd dost gələcək barədə heç bir qayğı çəkmədən, nahar etməyə başladılar. Qabaqlarından artıq qalanı isə Muşketona, Bazenə, Planşeyə və Qrimoya verdilər.

D'Artanyan Parisə gəldikdə, ona cənab de Trevildən bir məktub olduğunu gördü. Bu məktubda yazılmışdı ki, cənab de Trevilin xahişinə görə kral lütf edib d'Artanyanın muşketyorluğa qəbul edilməsinə razılığını vermişdir.

Əlbəttə, xanım Bonasyeni axtarıb tapmaq arzusunu nəzərə almasaq, bu, d'Artanyanın ən başlıca arzusu idi. O, böyük bir şadlıqla öz dostlarının yanına getdi. Onlardan yarımca saat bundan əvvəl ayrılmışdı. D'Artanyan dostlarını qəmgin və qayğılı gördü. Onlar məsləhət üçün Atosun yanına yığışmışdılar. Bu isə vəziyyətin çox ciddi olduğunu göstərən bir əlamət idi.

Cənab de Trevil onları yenicə xəbərdar etmişdi ki, əlahəzrət kralın mayın birində hərbi hərəkata başlamağa qəti arzusu olduğundan muşketyorlar tezliklə özlərinə zəruri yaraq-yasaq tədarük etməlidirlər.

Dörd filosof özlərini itirmiş halda bir-birinin üzünə baxırdılar. İntizam məsələsində cənab de Trevil zarafat xoşlamazdı.

D'Artanyan soruşdu:

Siz biləni yaraq-yasaq neçəyə başa gələr?

Aramis cavab verdi:

Nə deyim! Spartalılara məxsus bir qənaətkarlıqla hesab etdikdə, adama heç olmazsa min beş yüz livr lazımdır.

Atos cavab verdi:

- Dörd dəfə on beş altmış edər. Cəmi altı min livr.

D'Artanyan dedi:

– Mənə elə gəlir ki, adama min livr kifayətdir. Düzdür, mən bir spartalı kimi deyil, bir sərrac kimi hesab edirəm.

"Sərrac" sözü Portosu ayıldan kimi oldu və o dedi:

Bura baxın, ağlıma bir fikir gəlib.

Bu özü elə böyük işdir. Mənimsə beynimdə fikrə bənzər heç bir kölgə də yoxdur, – Atos soyuqqanlıqla sözə qarışdı. D'Artanyana gəlincə, onun bizim aramızda olmaqdan duyduğu səadət ağlını əlindən

almışdır. Min livr! Sizi xəbərdar edirəm ki, tək mənim özümə ən azı iki min livr lazımdır.

Aramis dedi:

Dörd dəfə iki elər səkkiz. Deməli ki, bizim yaraq-yasağımız üçün səkkiz min lazımdır. Doğrudur, bizim yəhər dəsgahımız hazırdır.

Atos cənab de Trevilə təşəkkür etmək üçün gedən d'Artanyanın qapını örtməsini gözləyib, o getdikdən sonra dedi:

Bir də bizim dostumuzun barmağında parıldayan çox gözəl bir brilyantımız var. Lənət şeytana! d'Artanyan çox mehriban bir yoldaşdır. O, heç razı olmaz ki, barmağında bir kralı əsarətdən qurtarmağa kifayət edəcək qiymətdə bir üzük ola-ola, öz qardaşlarını ehtiyac içində qoysun.

## XXIX

## YARAQ-YASAQ TƏDARÜKÜ

D'Artanyanın bir qvardiyaçı kimi özünə pal-paltar tədarük etməsi cənab muşketyorlara nisbətən xeyli asan olduğuna baxmayaraq, o dörd yoldaşın içində hamısından artıq qayğı çəkirdi. Ancaq cavan qaskoniyalı bir qədər xəsis və bununla bərabər, (bu ziddiyyəti necə izah etməli?) Portos qədər şöhrətpərəst idi. Bir məsələ də onu narahat etməkdə idi. O, xanım Bonasye barəsində nə qədər sorğu-sual etmişsə də, heç bir şey öyrənə bilməmişdi. De Trevil onun qaçırıldığını kraliçaya danışmışdı. Kraliça bu cavan qulluqçusunun harada olduğunu bilmirdi. O vəd etmişdi ki, onu axtarıb tapsın. Ancaq bu vəd həddindən artıq qeyri-müəyyən idi və d'Artanyanı əsla sakit etməmişdi.

Atos öz otağından kənara çıxmırdı. O qərara almışdı ki, özünə yaraq-yasaq tədarükü üçün heç bir şey etməyəcək. Öz dostlarına deyirdi:

– Hələ iki həftə vaxtımız var. Əgər bu müddətdə mən heç bir şey tapmasam, yaxud, daha doğrusu, heç bir şey məni tapmasa, onda etiqadlı bir katolik olduğum üçün, öz başıma güllə vurmaq istəmədiyimdən, kardinal həzrətlərinin dörd qvardiyaçısı ilə və ya səkkiz ingilis ilə mübahisəyə girişərək, onlardan biri məni öldürüncəyə qədər vuruşacağam. Onda deyərlər ki, kral yolunda öldüm. Beləliklə, yaraq-yasaq tədarükünə ehtiyac qalmadan, öz xidməti borcumu yerinə yetirmiş olaram.



Portos əllərini dalına qoyub, otaqda o baş-bu başa gedib gələrək, başını yırğalaya-yırğalaya deyirdi:

Mən öz planımı yerinə yetirəcəyəm.

Aramis səliqəsiz geyinmiş və saçlarını burdurmamış halda otaqda o baş-bu başa gedib gəlir və dinmirdi.

Dostların qəlbinə tam bir ümidsizlik hakim idi.

Nökərlər də öz ağalarının dərdlərinə şərik olmuşdular. Muşketon suxarı tədarük edirdi. Həmişəki kimi dindarlığa mail olan Bazen kilsədən kənara çıxmırdı. Planşe milçəkləri sayırdı, ümumi bədbəxtliyini də dilə gətirə bilmədiyi Qrimo isə, ağasının tapşırığına əməl edərək, əsla dinmir və daşları da rəhmə gətirən yanıqlı ahlar çəkirdi.

Üç dost – çünki yuxarıda söylədiyimiz kimi, onlardan dördüncüsü olan Atos yaraq-yasaq tədarükü üçün heç bir iş görməyəcəyinə and içmişdi, – üç dost səhər tezdən evdən çıxıb gecə qayıdırdı. Onlar küçələri gəzib döşəmənin hər bir daşına diqqətlə nəzər yetirirdilər ki, bəlkə yerə düşmüş bir pul kisəsi tapsınlar. Onlar ayaqlarının altına o qədər diqqətlə baxırdılar ki, kənardan baxanlar onların bir iz axtardıqlarını güman edirdilər. Dostlar bir-birinə rast gəldikdə, məyus nəzərlərlə baxışıb sanki soruşurdular: "heç bir şey tapmamısanmı?".

Nəhayət, Portos hərəkətə başladı. Bizim bu ləyaqətli Portos iş adamı idi Bir dəfə d'Artanyan öz dostunun Sen-Le kilsəsinə sarı getdiyini görüb onun dalınca düşdü. Portos kilsəyə girib bığlarını eşməyə və saqqalını tumarlamağa başladı. Bu isə həmişə onun döyüşkən bir niyyətdə olduğunu göstərən əlamət idi. D'Artanyan gözə görünmədən bir sütunun dalında gizləndi.

Bu zaman keşiş vəz edirdi. Kilsə ağzına qədər dolu idi. Portos bu əlverişli təsadüfdən istifadə edib qadınları nəzərdən keçirirdi. Muşketonun qayğısı sayəsində bu şanlı muşketyorun üst-başı çox səliqəli idi. Doğrudur, şlyapasının kənarı bir az sürtülmüş, lələyinin rəngi solmuş, bafta taftası köhnəlmiş, krujevaları bir qədər sökülmüşdü, ancaq kilsənin içindəki alaqaranlıqda bütün bu xırda-xuruş şeylər nəzərə çarpmırdı və Portos ən yaxşı günlərində olduğu kimi həmin qəşəng Portos idi.

D'Artanyan Portosun dayandığı yerin yaxınlığında bir skamyada, başında qara bir şlyapa, yaşı azacıq ötmüş və rəngi saralmış, arıqca, lakin özünü dik və məğrur tutan bir xanımın oturmuş olduğunu gördü.

Portosun nəzərləri bir anlığa həmin xanımın üzərində durur, sonra yenə kilsənin dərinliyinə zillənirdi.

Xanım da şimşək kimi sürətli nəzərlərlə hərdən bu yelbeyin muşketyora baxırdı. Görünür Portosun rəftarı bu vaxtı ötmüş gözəli xeylı qəzəbləndirirdi. O, dodaqlarını qanayıncaya qədər gəmirir və səbirsiz halda ətrafa göz gəzdirirdi.

Portos bunu görüb yenə də bığlarını burdu, saqqalını tumarladı və mınbərın yaxınlığında oturmuş digər gözəl bir xanıma işarə etməyə başladı. Bu xanım nəinki gözəldi, hətta görünür məşhur bir xanım idi. Onun arxasında bir zənci balası durmuşdu. O, xanıma diz çökmək üçün döşəkcə gətirmişdi. Bir qulluqçu qız isə, əlində bayaz qoyulmağa məxsus üstü gerb nəqşli bir kisə tutmuşdu.

Başında qara şlyapa olan xanım, Portosun bütün hərəkətlərini izləyirdi. O, görürdü ki, Portos az qala o gözəl xanımı, məxmər döşəkcəsi, zəncı balası və qulluqçu qızı ılə bırlıkdə gözlərilə yemək istəyir.

Bunu duyan Portos oyunu daha da irəli apardı: o göz vurur, barmaqlarını dodaqlarına aparır və yanıqlı ahlar çəkirdi.

Qara şlyapalı xanım bunu gördükdə, dua edirmiş kımi əlini sinəsinə vurub elə bərk öskürdü ki, bütün kilsədə olanlar, o cümlədən, qırmızı döşəkcəli xanım da dönüb ona baxdılar.

Portos buna əsla etina etmədı.

Qırmızı döşəkcəli gözəl xanım qara şlyapalı xanıma çox böyük təsır etmişdi və d'Artanyan həmin xanıma dıqqət etdikdə, onun Menqdə gördüyü və öz köhnə düşməni alnında çapıq yeri olan adamın "miledi" çağırdığı həmin gözəl qadın olduğunu tanıdı.

D'Artanyan qırmızı döşəkcəli xanımı gözdən qoymadan Portosun da çox əyləndirici hərəkətlərinə nəzər yetirməkdə idi. Qaskoniyalı işi başa düşmüşdü. Qara şlyapalı xanım Ayı küçəsində yaşayan prokuror arvadı idi. O, başa düşdü ki, Portos Şantılyada olduğu zaman ona pul göndərmədiyi üçün ındı həmın xanımdan intıqam almağa çalışır.

Moizə qurtardı. Prokuror arvadı içində müqəddəs su olan qaba yaxınlaşdı Portos onu qabaqlayıb barmağının əvəzinə bütün əlını suyun içinə soxdu. Prokuror arvadı Portosun onun üçün can yandırdığını güman edib gülümsündü. Ancaq, heyhat, o məyus olmalı idi; Portos gözlərılə həmin naməlum gözəl qadını yeməkdə idi. Həmin xanım yanında zənci balası və qulluqçu qız, Portosa yaxınlaşdı.



Xanım Portosa tamamilə yaxınlaşdıqda, Portos əlini qabdan çıxartdı. Gözəl qadın gülümsəyərək əlini muşketyorun yekəpər əlinə toxundurdu və xaç vurub kilsədən çıxdı.

Bu daha həddını aşmaq ıdı! Prokuror arvadı şübhə etmirdi ki, bu xanım ilə Portos arasında bir eşq macərası var. Əgər prokuror arvadı kübar bir xanım olsaydı, yəqin ki, özündən gedərdi. Ancaq bu qartımış gözəl adicə bir prokuror arvadı idi. O, qəzəbini boğaraq, muşketyora bu sözləri deməklə kifayətləndı:

- Cənab Portos, nıyə müqəddəs sudan mənə təklif etmirsiniz?

Portos onun səsini eşitdikdə, uzun sürən yuxudan ayılmış bir adam kimi özünə gəldi.

Xanım, – o, səsləndi, – sizsınizmi? Əziz əriniz cənab Koknar necədir? Yenə əvvəlkı kımi xəsisdirmi? Necə olub ki, sizi görməmişəm? Görəsən gözlərım harada imiş?

- Mən sizdən ıkıcə addım aralı oturmuşdum, cənab, prokuror arvadı cavab verdi. Ancaq siz məni görmürdünüz; çünki gözlərinizi ındicə müqəddəs su verdiyiniz o gözəl xanımdan çəkmirdiniz!

Portos özünü tutulmuş kimi göstərdi və dedi:

Ah, siz bunu gördünüzmü?..

– Bunu görməmək üçün adam gərək kor ola.

Portos laqeyd bir əda ilə dedi:

Bəli, bu mənım dostum olan bir hersoginyadır. Biz çox çətin görüşə bilirik. Əri yaman qısqancdır. O, mənə xəbər göndərmişdi ki, yalnız mənimlə görüşmək xatırınə bu yoxsul kilsəyə gələcəkdir.

Prokuror arvadı dedi:

Cənab Portos, lütfən qolunuzu mənə təqdim edərsinizmi? Sizinlə bir qədər söhbət etmək istərdim.

Portos özü-özlüyündə gülərək, məharətli bir oyun oynamağa hazırlaşan bir qumarbaz kimı dedı:

Məmnunıyyətlə, xanım.

Bu zaman miledinin dalınca getməkdə olan d'Artanyan onun yanından keçdi. Əyri-əyri Portosa baxdı.

D'Artanyan öz-özünə düşündü: "Aha, deyəsən bu, öz yaraq-yasağını vaxtında tədarük edəcəkdir".

Qayıq sükana tabe olan kimi, Portos da xanım Koknarın qoluna tabe olaraq, yanlarında turniketlər düzülmüş tənha bır yerdə olan Sen-Maqluar monastırına qədər gəldi.

Gündüzlər burada yalnız dilənçilərə, bir də oynayan uşaqlara rast gəlmək olardı. Prokuror arvadı bu yerin daimi gəlib-gedənlərdən başqa heç bir kəsin onların danışdığını eşitməyəcəyindən arxayın olub dedi:

Ax, cənab Portos, ax cənab Portos, görünür siz qadınların ürəyinə hökm edən qadir bir adamsınız!

– Mənmi, xanım? – Portos özündən məmnun bir əda ilə soruşdu. – Nə deyirsiniz?

Bəs sizin o nazlı ədalarınız, bəs o müqəddəs su? Yəqin ki, yanında zənci balası və qulluqçu qız olan o xanım bir prinsessa qızdır.

– Səhv edirsiniz, Portos cavab verdi. O, sadəcə bir hersoginyadır.

Bəs onu karetanın ayaq yerində gözləyən xidmətçi, bəs mərasimə məxsus bafta-taftalı libas geymiş sürücü?

Portos nə karetanın yanındakı xidmətçini, nə karetanı görməmişdi. Ancaq xanım Koknar görmüşdü.

Portos əvvəlcədən qırmızı döşəkcəli xanımı prinsessa qələmə vermədiyinə təəssüf etdi.

Prokuror arvadı köksünü ötürərək dedi:

Cənab Portos, siz, deyəsən, gözəl qadınları yoldan çıxarırsınız.

Siz başa düşürsünüz ki, Portos cavab verdi. Təbiətin verdiyi bu xoş zahiri görkəm sayəsində mənim üçün sevgi macəraları əskik deyil.

Prokuror arvadı gözlərini göyə zilləyib dedi:

– Aman Allah, bu kişilər nə qədər vəfasız olurmuş!

Mənə elə gəlir ki, hər halda kişilər arvadlar dərəcədə vəfasız olmazlar, Portos cavab verdi. Çünki, xanım, siz məni taleyin ixtiyarına buraxmışdınız. Mən ölümcül halda yaralanmışdım. Həkimlər daha yanıma gəlib getmirdilər; çünki pulum yox idi. Mən məşhur nəsildənəm. Sizin dostluğunuza inandığımdan, az qalmışdı ki, əvvəlcə aldığım yaradan, sonra Şantilyadakı o sarsaq meyxanada acından öləm. Siz isə, yazdığım o atəşin məktublara bir dəfə də olsun cavab verməyə tənəzzül etmədiniz.

– Ancaq, cənab Portos... xanım Koknar özünü müqəssir hesab edərək pıçıldadı.

Mən ki, sizin yolunuzda baronessanı qurban etdim...

Bilirəm.

– Qrafinyadan əl çəkdim...

– Cənab Portos, mənə rəhminiz gəlsin!

Hersoginyanı buraxdım...



Cənab Portos, alicənab olun!

– Yaxşı, xanım, daha dalısını demirəm.

– Ancaq ərim pul barədə bir kəlmə də eşitmək istəmir.

Portos dedi:

Xanım Koknar, yazdığınız birinci məktubu yadınıza salın. O məktubun məzmunu mənim yadımdadır.

Xanım Koknar dərindən köksünü ötürdü və dedi:

– Bir də ki, sizin istədiyiniz pul, doğrudan da, həddindən çox idi.

Xanım Koknar, mən sizi başqalarından üstün tutdum. Mən hersoginya de . adını çəkmirəm, çünki bir qadını nüfuzdan salmaq istəmirəm. Əgər mən həmin hersoginyaya bircə dəfə yazsaydım, o saat mənə min beş yüz göndərərdi.

Xanım Koknar içini çəkə-çəkə dedi:

Cənab Portos, and içirəm ki, siz məni ağır cəzalandırdınız. Əgər gələcəkdə bir də sizin başınıza belə bir iş gəlsə, mənə bircə dəfə müraciət etməniz kifayətdir...

Portos özünü utanmış kimi göstərərək dedi:

Bəsdir, xanım! Gəlin daha pul söhbəti etməyək; bu, insanı alçaldır.

Prokuror arvadı ağır-ağır və kədərli səslə dedi:

– Deməli siz daha məni sevmirsiniz?

Portos təntənəli sükutu pozmurdu.

Görürsünüzmü, mənə cavab da vermirsiniz. Heyhat, mən başa düşürəm!

Xanım, məni nə dərəcədə incitdiyinizi bir düşünün. Sizin bu hərəkətiniz mənim, bax, buramda yer etmişdir, - deyə Portos əlini bərk-bərk köksünə sıxdı.

Mən bunun əvəzini çıxaram, əzizim Portos!

Portos çiyinlərini ataraq dedi:

– Axı mən sizdən nə istəmişdim? İstədiyim yalnız bir borc idi! Hər halda mən bilirəm ki, xanım Koknar, siz çox da varlı deyilsiniz. Əriniz yazıq müştərilərinin canına zəli kimi yapışıb onlardan bir neçə ekü qoparmağa çalışır. Əgər siz qrafinya, markiza və ya hersoginya olsaydınız, o başqa məsələ.

Bu sözlər prokuror arvadının qəlbinə toxundu və o dedi:

Cənab Portos, onu bilin ki, mənim sandığım prokuror arvadının sandığı olsa da, orada sizin var-yoxdan çıxmış bütün o bəzək-düzəkli xanımların sandığından bəlkə daha çox pul var.

Portos cavab verdi:
– Elə isə siz məni iki qat artıq incitmisiniz. Xanım Koknar, əgər siz varlısınızsa, onda imtina etmənizi heç cür bağışlamaq olmaz.
Xanım Koknar dediyinə peşman olub özünü topladı:
Mən özümü məgər dövlətli adlandırdım? Bu sözləri hərfi mənada başa düşmək lazım deyil. Doğrusu, mən varlı deyiləm, ancaq lüt də deyiləm.
Bura baxın, xanım, xahiş edirəm daha bu barədə danışmayaq. İndi aramızda hər şey qurtarıb getmişdir.
– Ax, naşükür!..
Portos cavab verdi:
– Necə istəyirsiniz, elə də düşünün!
– Buyurun, öz gözəl hersoginyanızın yanına gedin. Daha mən sizə mane olmuram.
Nə olar ki! O, o qədər də pis deyil!
– Bura baxın, cənab Portos! Axırıncı dəfə sizdən soruşuram: məni hələ sevirsinizmi?
Portos bacardığı qədər kədərli bir əda ilə dedi:
Heyhat, xanım! Ürəyimə dammışdır ki, biz müharibəyə getdikdə məni mütləq öldürəcəklər.
Ax, belə sözlər danışmayın! prokuror arvadı çığırdı və hönkürtü ilə ağlamağa başladı.
– Mənim ürəyimə dammışdır, – Portos daha qəmgin əda ilə davam etdi.
Yaxşısı budur deyin ki, sizin yeni bir eşq macəranız başlanır.
- Yox, yox! Məni indi heç bir qadın maraqlandırmır. Düzünü deyim, mənim ürəyim əvvəlki kimi sizdədir. Ancaq iki həftədən sonra bu məlun müharibə başlanacaq. Özümə yaraq-yasaq düzəltmək üçün başım yaman qarışıq olacaq. Gərək Bretana öz qohum-əqrəbamın yanına gedəm ki, səfərə hazırlaşmağa pal-paltar almaq üçün pul gətirim.
Prokuror arvadının ürəyində xəsislik ilə məhəbbət hələ də bir-birilə mübarizə etməkdə idi.
Bir də ki, Portos davam etdi – həmin hersoginyanın mülkü mənim mülkümlə qonşuluqdadır. Biz bir yerdə yola düşəcəyik. Bilirsiniz ki, ikilikdə gedəndə, yol adamın gözünə görünmür.
Prokuror arvadı soruşdu:



Cənab Portos, məgər sizin Parisdə dostlarınız yoxdurmu?
Elə güman edirdim ki, var, - Portos yenə özünü kədərli göstərməyə çalışaraq cavab verdi. – Ancaq indi inandım ki, mən səhv etmişəm.
Cənab Portos, var, burada sizin dostlarınız var! prokuror arvadı özünü də heyrətə salan bir həyəcanla çığırdı. - Sabah yanıma gəlin, deyəcəyəm ki, siz mənim əmim oğlusunuz. Pikardiyadan, Nuazondan gəlibsiniz. Parisdə vacib bir işiniz var, ancaq hökumət məmurlarından tanışınız yoxdur. Bunu yadınızda yaxşı saxlarsınızmı?
– Lap yaxşı saxlaram, xanım.
– Nahara gələrsiniz.
Çox əla!
Bir də ərimlə ehtiyatlı olun. O, yetmiş altı yaşında olduğuna baxmayaraq, çox hiyləgər bir adamdır.
– Yetmiş altı yaş, lənət şeytana! Çox gözəl yaşdır! Portos ona söz atdı.
Cənab Portos, siz demək istəyirsiniz ki, onun yaşı ötmüşdür. Deməli ki, mən hər dəqiqə dul qala bilərəm, – xanım Koknar Portosa çox mənalı bir nəzər saldı. Xoşbəxtlikdən kəbin kağızımızda yazılmışdır ki, bütün irs sağ qalana çatacaqdır.
Portos soruşdu:
Hamısını?
– Hamısı.
– Əzizim xanım Koknar, görünür siz çox uzaqgörən bir qadınsınız, Portos mehribanlıqla prokuror arvadının əlini sıxdı.
Bax, gördünüzmü, əzizim Portos, biz barışdıq, – prokuror arvadı nazla dilləndi.
– Ömürlük barışdım, – Portos da həmin əda ilə ona cavab verdi.
Hələlik xudahafiz, vəfasız!
Xudahafiz, nazlı xanım!
– Sabah görüşərik, ay mənim mələyim!
– Sabah görüşərik, ay ömrümün işığı!

## XXX

## MİLEDİ

D'Artanyan gözə görünmədən miledini təqib edirdi. O, miledinin karetaya mindiyini gördü və sürücüyə Sen-Jermenə sürməsini əmr etdiyini eşitdi.

İki qüvvətli at qoşulmuş karetanın dalınca piyada getməyin mənası yox idi. D'Artanyan Feru küçəsinə sarı yönəldi

Sena küçəsində Planşeyə rast gəldi. Yazıq bir çörəkçi dükanının qarşısında durub, iştaha gətirən şirin bir qoğala baxıb ləzzət alırdı.

D'Artanyan Planşeyə əmr etdi ki, cənab de Trevilin tövləsinə gedib iki at yəhərləsin və onları götürüb Atosun evinə gəlsin. Cənab de Trevil öz tövləsini çoxdan d'Artanyanın ixtiyarına vermişdi. Planşe Göyərçin hini küçəsinə, d'Artanyan isə Feru kuçəsinə sarı getdilər. Atos evdə idi. O, Pikardiyadan gətirdiyi məşhur İspaniya şərabının bir şüşəsini qəmli-qəmli içib qurtarmaqda idi. Qrimoya işarə etdi ki, d'Artanyan üçün bir stəkan gətirsin. Qrimo da, adəti üzrə, dinməz-söyləməz əmri yerinə yetirdi. D'Artanyan kilsədə Portos ilə prokuror arvadı arasında olan bütün əhvalatı Atosa danışdı. Onların dostu indi yəqin özü üçün pal-paltar almışdı.

Atos dedi:

– Mən isə tamam arxayınam. Əlbət ki, mənim pal-paltarımın xərcini qadınlar öz öhdələrinə götürməyəcəklər.

Amma, əzizim Atos, istəsəydiniz sizin gözəlliyiniz, istiqanlılığınız və şöhrətiniz, eşq oxlarınız qarşısında heç bir prinssessa xanım, heç bir kraliça dura bilməzdi.

Atos çiyinlərini ataraq belə fikirləşdi: "Bu d'Artanyan hələ nə qədər gəncdir!" O, Qrimoya yenə bir şüşə şərab gətirməsinə işarə etdi.

Elə bu dəqiqədə Planşe çəkinə-çəkinə başını qapıdan içəri uzadıb ağasına xəbər verdi ki, atlar hazırdır.

– Nə atlar? – Atos soruşdu.

Bu atları cənab de Trevil gəzintiyə çıxmaq üçün mənə borc vermişdir Mən gəzə gəzə Sen-Jermenə sarı getmək istəyirəm.

Atos soruşdu:

Sen-Jermendə nə işiniz var ki?



D'Artanyan kılsədə rast gəldiyi qadın barədə Atosa danışdı. O, gicgahında çapıq yeri olan həmin o adam ilə bərabər əsla yadından çıxara bilmədiyi o qadına yenidən rast gəlmişdi.

Atos həqarətlə çiyinlərini ataraq soruşdu:

Deməli, əvvəl xanım Bonasyeyə aşiq olduğunuz kimi, indi də bu xanıma vurulubsunuz?

– Mənmi? Əsla yox! – d'Artanyan çığırdı. - Mən yalnız bu naməlum gözəl qadının büründüyü sirlərin üstünü açmağı çox arzu edirəm. Bilmirəm niyə? Ancaq mənə elə gəlir ki, bu gözəl qadının mənim həyatım üzərində bir təsiri vardır.

– Ola bilər. Ola bilər ki, siz haqlısınız. Xanım Bonasye yox olmuşsa, nə eləmək olar: vay halına!

Yox, Atos, yox, səhv edirsiniz. Mən yazıq Konstansiyanı sevirəm. Onun harada olduğunu bilsəm, lap dünyanın o biri ucunda da olsa, onu düşmənlərin əlindən xilas etməyə gedərəm. Ancaq bilirsiniz ki, bu vaxta qədər bütün axtarışlarımdan bir fayda olmamışdır, nə çarə! Gərək bir təhər başımı qarışdıram.

Əzizim d'Artanyan, öz miledinizlə vaxtınızı xoş keçirin. Bunu sizə ürəkdən arzu edirəm.

Bura baxın, Atos, burada dustaq kimi qalmaqdansa, gəlin ata minin, bir yerdə Sen-Jermenə gedək.

Əzizim, mənim öz atım olanda minərəm, olmayanda piyada gəzərəm.

D'Artanyan gülümsəyərək cavab verdi.

- Mən isə, mən isə sizin kimi məğrur deyiləm. Nə rast gəlsə, minib gedirəm. Hələlik xudahafiz, əzizim Atos.

Xudahafiz, Atos cavab verərək Qrimoya işarə etdi ki, yenicə gətirdiyi şüşənin ağzını açsın.

D'Artanyan ilə Planşe atları minib Sen-Jermenə sarı yola düşdülər.

Bütün yol uzunu Atosun xanım Bonasye haqqında söylədiyi sözlər d'Artanyanın fikrindən çıxmadı. Doğrudur, d'Artanyan çox sentimental bir gənc deyildisə də, ancaq tacirin gözəl arvadı, doğrudan da, onun qəlbinə təsir etmişdi. O, xanımın dalınca dünyanın o biri ucuna getməyə hazır olduğunu söylədikdə doğru deyirdi. Ancaq dünya şar şəklindədir və d'Artanyan bilmirdi ki, onu axtarmaq üçün hansı tərəfə getsin. Hələlik isə o, miledinin kim olduğunu bilmək istəyirdi. Miledi, o qara plaşlı adamla söhbət edirdi. Deməli ki, onu tanıyırdı.

D'Artanyan bu qərara gəlmişdi ki, xanım Bonasyeni bu qara plaşlı adam qaçırmışdır. Buna görə də d'Artanyan miledinin ardınca düşdüyü zaman eyni vaxtda Konstansıyanın izini axtardığını söylərkən yalnız yarıya qədər yalan deyirdi

D'Artanyan bunları düşünə düşünə, arabir atını mahmızlayaraq, özü də hiss etmədən gəlib Sen-Jermenə çatdı. On ildən sonra içərisində XIV Lüdovikin doğulduğu həmin o pavilyonun yanından yenicə keçib tənha bir küçəyə çıxmışdı ki, d'Artanyan birdən gözəl bir evin həyətində tanış bir adam gördü. Həmin o adam, o zamanın adətinə görə, küçəyə heç bir pəncərəsi olmayan evin bağçasında gəzişirdi. Onu əvvəl Planşe tanıdı, d'Artanyana müraciətlə dedi:

Ağa, bu adamı tanıdınızmı?

Yox, amma mənə elə gəlır ki, haradasa görmüşəm.

Mənə elə gəlir ki, lənət şeytana, bu ki, sizın bir ay bundan əvvəl valinin bağına gedərkən Kaledə, yolda məharətlə vurub yerə sərdiyiniz qraf de Vardın nökəri yazıq Lübendır.

Hə, hə! İndi yadıma düşdü. Necə bilırsən, o səni tanıdımı?

Doğrusu ağa, o zaman o yaman bərk qorxmuşdu, heç ınanmıram ki, mən onun yadında qalmış olam.

– Elə isə, get onunla söhbətə girış, söz arasında öyrən, gör, ağası sağdır, ya yox.

Planşe atdan düşüb Lübenə yaxınlaşdı. Lüben, doğrudan da, onu tanımadı. Nökərlər bir-birilə mehriban-mehriban söhbətə başladılar.

D'Artanyan atını sürüb evin dövrəsinə hərləndı, qayıdıb gəldi və çəpərin dalında gizlənib onların danışığını dınləməyə başladı.

Bir azdan sonra kareta taqqıltısı eşidildi və kareta gəlib qapının ağzında durdu. Səhv etmək olmazdı. Karetada oturan miledı idi.

D'Artanyan yaxşı görmək üçün atın boynuna sarı əyıldı. Karetanın pəncərəsindən gözəl, sarışın bir baş baxırdı. Miledı öz qulluqçusuna nə isə bir əmr etdi.

O zamanın adətinə görə, karetanın ayaqyerisındə oturan, məşhur bir xanıma yaraşan iyirmi yaşlarında, gözəl, zirək, oynaq, qəşəng əsl bir qız qulluqçu yerə atıldı və evin eyvanına sarı getdi.

D'Artanyan gözünü bu qulluqçu qızdan çəkmirdi. Lüben harasa getmişdi. Bağçada yalnız Planşe qalmışdı.

Qulluqçu qız ona yaxınlaşdı və yəqin ki, onu Luben bilib, bir məktub uzadaraq dedi:



Ağanıza çatacaq.

Planşe heyrətlə soruşdu:

Mənim ağama?

Hə, özü də çox tələsikdir, tez olun, alın!

Bu sözləri deyıb qulluqçu qız karetaya sarı qaçdı və ayaqyerinə atıldı. Kareta yola düşdü.

Planşe məktubu əlində o üz-bu üzə çevirdi, sonra, verilən əmrlərə sözsüz-sovsuz itaət etməyə alışdığından, eyvandan atıldı, və iyirmi addım getdikdən sonra d'Artanyana rast gəldi. Bütün bunları görmüş olan d'Artanyan özü atını ona sarı sürürdü.

Planşe məktubu d'Artanyana uzadaraq dedi:

- Sizə çatacaq, ağa!

D'Artanyan soruşdu

Mənəmi?! Bunu yəqin bılırsənmi?

Lənət şeytana! Nə bilim! Qulluqçu qız dedi ki, "ağana çatacaq". Mənimsə sizdən başqa bir ağam yoxdur. Deməli ki... Nə qəşəng qızdı!

D'Artanyan məktubu açıb bu sözləri oxudu:

*"Sizinlə ifadə edə biləcəyindən daha artıq maraqlanan bir xanım nə vaxt meşəyə bir gəzintiyə çıxmağa imkanınız olacağını bilmək istəyir Sabah "Qızıl Səhra" mehmanxanasında qara geyimli və qırmızı şəridli nökər cavabınızı gözləyəcəkdir".*

D'Artanyan fikirləşdi: "Oho! Bu qəribə işdır! Deyəsən miledi ilə mən hər ikimiz həmin adamın səhhəti barəsində məlumat almağa gəlmişik! Qoy olsun!"

Planşe, mehriban cənab de Vardın halı necədir? Hələ ölməyib ki?

Yox, cənab, sağ-salamatdır, bədənində dörd yarası olan adam özünü nə dərəcədə yaxşı hiss edirsə, o da özünü o dərəcədə yaxşı hıss edir. Acığınıza gəlməsin, bu mehriban cənabı düz dörd yerindən yaralamışdınız. Xeylı qanı axmışdır, yaman zəifdir. Sızə söylədiyim kimi, Lüben məni tanımadı, bizım macəramızı başdan-ayağa mənə danışdı.

Çox gözəl, Planşe, sən nökərlərin kralısan, tez ol indi ata min, gedib karetaya çataq.

Bu o qədər də vaxt almadı, beş dəqiqə sonra onlar yolun döngəsində durmuş karetanı gördülər. Zəngin geyimli bir atlı karetanın qapısı ağzında durmuşdu.

Miledi ilə bu adamın başları söhbətə o qədər qarışmışdı ki, d'Artanyanın gəlib karetanın o biri tərəfində durduğunu qəşəng qulluqçu qızdan başqa heç biri görmədi.

Miledi ilə həmin adam ingiliscə danışırdılar. D'Artanyan isə bu dili bilmirdi. Ancaq d'Artanyan gözəl ingilis xanımının səsindən başa düşdü ki, yaman qəzəblənmişdir. Onun axırıncı hərəkəti danışıqlarının mahiyyəti barəsində heç bir şübhəyə yer qoymurdu. Miledi əlindəki yelpiyi karetanın qapısına elə çırpdı ki, o xırdaca qadın oyuncağı parça-parça olub yerə töküldü.

Atlı qəhqəhə çəkib güldü. Görünür onun bu hərəkəti miledini daha da qəzəbləndirdi.

D'Artanyan fikirləşdi ki, söhbətə qoşulmaq vaxtı yetişmişdir. Karetanın o biri qapısına yanaşıb, hörmətlə şlyapasını çıxarıb dedi:

Xanım, icazə verin qulluğunuzda olum. Mənə elə gəlir ki, bu cənab sizi qəzəbləndirmişdir. Xanım, bircə kəlmə söyləyin, ona ədəbli olmağı öyrədim.

D'Artanyan ilk sözləri söyləyən kimi miledi çevrilib heyrətlə gənc oğlana baxdı. O, çox gözəl fransızca dedi:

Cənab, təklifinizi məmnuniyyətlə qəbul edərdim. Ancaq məni qəzəbləndirən bu adam öz qardaşımdır

D'Artanyan dedi·

- Elə isə, bağışlayın. Bilirsiniz ki, mənim bundan xəbərim yox idı.

Mıledinin öz qardaşı adlandırdığı atlı çığırdı:

Bu yelbeyin niyə özünə dəxli olmayan işlərə qarışır? Qoy öz yolu ilə getsin. Burada nahaq durmuşdur.

D'Artanyan cavab verdi:

– Yelbeyin siz özünüzsünüz. Mən burada ona görə durmuşam ki, kefim belə istəyir.

Atlı öz bacısına ingiliscə bir neçə söz dedi.

D'Artanyan dedi:

– Sizinlə fransızca danışıram, zəhmət çəkın, mənə həmın dildə cavab verin. Siz bu xanımın qardaşısınız, çox gözəl; xoşbəxtlikdən mənim ki, qardaşım deyilsiniz!

Gözləmək olardı ki, bütün qadınlar kimi qorxaq olan miledi bu iki adamın arasındakı mübahisəni yatırmağa çalışacaq. Ancaq o, karetanın içinə çəkilib soyuq bir əda ilə sürücüyə dedi:

– Sür evə!

Qulluqçu qız həyəcanlı nəzərlərlə d'Artanyana baxdı. Görünür cavan oğlanın nəcib siması ona təsir etmişdi.



Kareta hərəkət edib getdi və iki kişi uz-üzə qaldı. İndi onları bir-birindən heç bir maneə ayırmırdı.

Atlı, görünür karetanın ardınca çapıb getmək niyyətilə ayaqlarını üzəngiyə basdı. Ancaq d'Artanyanın qəzəbi get-gedə artırdı; çünki bu naməlum adamın Amyendə Atosun atını udan həmin ingilis olduğunu tanıdı və onun yolunu kəsib dedi:

Bura baxın, cənab, mənə elə gəlir ki, siz məndən də artıq yelbeyinsiniz. Görünür aramızda kiçik bir mübahisə çıxdığını unutmuşsunuz.

İngilis dilləndi:

Aha! Sizsinizmi cənab? Görünür oyunsuz yaşaya bilmirsiniz.

Bəli, mənim də yadıma düşdü ki, sizinlə oyunumuzun mabədi qalmışdır. İndi görərik, cənab, siz qılıncı da zər stəkanı kimi məharətlə oynada bilirsinizmi!

Görürsünüz qılıncım yoxdur. Bəlkə silahsız adamın qarşısında qoçaqlıq göstərib lovğalanmaq istəyirsiniz.

D'Artanyan cavab verdi:

Güman ki, evdə qılıncınız var, hər halda mənim iki qılıncım var. Buyursanız, onlardan birini sizə uduzaram.

İngilis dedi:

Lazım deyil, məndə bu cür ev əşyası kifayət qədərdir.

Elə isə, möhtərəm cənab, d'Artanyan davam etdi, ən uzun qılıncınızı seçin və onu bu axşam mənə göstərin.

Buyurun, yer təyin edin.

Lüksemburq. Bu yer belə gəzintilər üçün münasibdir.

Yaxşı. Mən ora gələrəm.

Saat neçədə?

Saat altıda.

Yəqin ki, sizin bir-iki dostunuz da tapılar?

Bəli, üç dostum var ki, mənimlə birlikdə gəlməyi özləri üçün şərəf bilərlər.

Üç nəfərmi? Çox əla. Nə yaxşı bir təsadüf! d'Artanyan cavab verdi. Mənim də düz üç nəfər dostum var.

İngilis soruşdu:

Yaxşı, bir deyin görüm, siz kimsiniz axı?

Mən Qaskonıya əsilzadəsi, həm də cənab Dezessarın bölüyünə mənsub qvardiyaçı d'Artanyanam. Bəs siz?

Mən lord Vinter, baron Şeffildəm.

D'Artanyan dedi:

Hər nə qədər adınız çətin yadda qalırsa da, qulluğunuzda hazıram, cənab baron.

Bu sözlərdən sonra d'Artanyan atını mahmızlayıb çaparaq Paris yoluna döndü.

Həmişə belə hallarda olduğu kimi düz Atosun yanına getdi.

D'Artanyan cənab de Varda yazılmış məktubdan başqa bütün əhvalatı Atosa danışdı.

Atos ingilislə vuruşmalı olacaqlarını bildikdə çox sevindi.

Nökərləri o saat Portos və Aramisin dalınca göndərdilər. Dostlar bir azdan gəlib yığışdılar.

Portos qılıncını çəkib rəqs zamanı olduğu kimi atılıb-düşərək divarla vuruşmağa başladı. Öz poeması üzərində işləməkdə olan Aramis Atosun kabinetinə çəkilib xahiş etdi ki, qılıncları siyirmək vaxtı gəlməyincə onu narahat etməsinlər.

D'Artanyan isə zehnində kiçik bir plan qururdu. Şübhə etmirdi ki, gələcəkdə onu maraqlı bir macəra gözləyir.



I

## İNGİLİSLƏR VƏ FRANSIZLAR

Təyin edilən vaxtda dörd dost, əvvəldən kəsilən şərt üzrə, öz xidmətçilərilə bərabər, düşmənlərini Lüksemburqun kənarında gözləyirdi.

Çox keçmədi ki, ingilislər də dinməz-söyləməz gəldilər. Hər iki tərəf özünü təqdim etdi. Fransızların adı, zadəgan nəslindən olan ingilislərə çox qəribə göründü.

Lord Vinter dedi:

- Biz hər halda sizin kim olduğunuzu bilmirik. Biz, belə qəribə adları olan adamlarla vuruşmayacağıq: sizin söylədiyiniz adlar tamam çoban adlarıdır.

Atos dedi:

– Milordlar, bunlar uydurma adlardır.

Lord Vinter dedi:

Bu, bizim marağımızı daha da artırır. Biz sizin əsl adınızı bilmək istərdik.

Atos dedi:

– Siz ki, bizim adlarımızı bilmədən bizimlə qumar oynadınız, bizim atlarımızı uddunuz.

Bu, doğrudur. Onda olsa-olsa biz ancaq pulumuzu uduza bilərdik, lakin indi məsələ ölüm-dirim məsələsidir. Qumarı hər kəslə oynamaq olar, lakin vuruşmağa gələndə, hər kəs öz tayı ilə vuruşmalıdır.

Atos onun sözünü təsdiq etdi:

Düzdür.

O, öz rəqibi ingilisi kənara çəkib adını ona söylədi.

Portosla Aramis də onun kimi elədilər.

Atos öz düşmənindən soruşdu.

Bu, sizi təmin edirmi?

İngilis baş əyərək cavab verdi:

– Bəli, cənab.

Atos dişlərini qıcıyaraq dedi:

İstəsəniz mən sizə başqa şeylər də deyə bilərəm: məni ölmüş hesab edirlər; mən istəyirəm ki, heç kəs buna şübhə eləməsin. Buna görə də mən bu sirri saxlamaq üçün sizi öldürmək məcburiyyətindəyəm.

İngilis elə zənn etdi ki, Atos zarafat edir, lakin Atos ciddi deyirdi.

Atos soruşdu:

Hamı hazırdırmı?

İngilislər də, fransızlar da bır ağızdan cavab verdılər:

Hazırıq.

– Başlayaq.

Elə bu anda səkkiz qılınc batan günəşin şüaları altında parladı.

Atos qayda ılə, tələsmədən vuruşurdu, elə bil ki, qılınc təlimı zalında məşq edirdi.

Portos isə çox ehtiyatla və hiyləgərcəsinə hərəkət edirdi; çünki bu yaxında o, özünə həddindən artıq güvəndiyindən məğlub olduğunu hələ unutmamışdı.

Aramis yazdığı poemanın üçüncü nəğməsini qurtarmalı ıdi. Buna görə də o, vaxtı çatışmayan bır adam kimı tələsirdı.

Hamıdan əvvəl, Atos öz düşməninin ışini bıtırdı: qılıncı ürəyinə soxaraq onu bircə zərbə ilə öldürdü. Portos vuruşduğu ingilisin ombasını yaraladı, ingilis yıxıldı və müqavimət göstərmədən qılıncını Portosa verdi. Portos onu götürüb karetaya apardı.

Aramis bir-birinin ardınca zərbə endırərək düşmənini sıxışdırırdı, ingilis əlli addıma qədər geri çəkilib bıabırcasına qaçmağa başladı, xidmətçilər daldan bərk hay-kuy qopararaq onu lağa qoydular

D'Artanyan özünü müdafiə edirdi. Düşməninin yorulduğunu görüb cəld bir zərbə ilə onun qılıncını vurub əlindən saldı. İngilis iki-üç addım geri çəkildı, ayağı sürüşüb üzüstə yıxıldı.

D'Artanyan bir sıçrayışla özünü onun yanına atdı, qılıncı onun boğazına dirəyib dedi:

Mən sizi öldürə bilərəm. İndi sizin həyatınız mənim əlimdədır. Lakin bacınızı sevdiyimdən sizə aman verirəm.

D'Artanyan son dərəcə sevinirdi: düşündüyü planı yerinə yetirə bilmişdı.

İngilis də heyrət içində idi qarşısındakı düşmən heç demə yaxşı adammış. D'Artanyanı qucaqlayıb bağrına basdı və muşketyorlara bol bol nəzakətli sözlər söylədi.

Artıq Portosun düşməni karetada idi. Aramisin düşməni isə qaçmışdı. İndi onlar hamısı öldürülmüş ingilislə məşğul olmağa başladılar.

Portosla Aramıs onun yarasının nə vəziyyətdə olduğunu bilmək məqsədilə paltarını çıxartdıqda yaralının belındən ağzına kımı dolu pul kisəsi düşdü. D'Artanyan kisəni götürüb lord Vıntərə verdi.



İngilıs soruşdu:

– Bu pulu mənə niyə verırsiniz? Mən bunu neyləməliyəm?

D'Artanyan:

- Siz bunu onun ailəsinə verərsiniz, - dedi.

Bu nədi axı? Bu, onların nəyinə lazımdır? Onun ailəsinin bundan sonra ildə on beş min luidor gəliri olacaq. Siz bunu öz xidmətçilərinizə saxlayın.

D'Artanyan pul kisəsini cibinə qoydu.

Lord Vinter d'Artanyana müraciət edib dedi:

– Mənim cavan dostum, – sizi belə adlandırmağa yəqın ki, icazə verirsiniz?.. Bəli, mənim cavan dostum, bu axşam mən sizi bacım ledi Klarikin yanına apararam. Mən istəyirəm ki, o, sizə qarşı lütfkar olsun. O, saraya yaxındır. Onun sizə köməyi dəyə bilər.

D'Artanyan sevincindən qızardı və razılıq əlaməti olaraq baş əydi.

Bu vaxt Atos d'Artanyanın yanına gəldı

Siz pul kisəsini neyləmək istəyirsiniz?

- Atos, istəyirəm ki, onu sizə verəm.

Mənə? Mənə niyə?

– Ona görə ki, qalib gələn sizsınız. Bu kisə də düşmən malıdır.

Atos acıqlandı:

Mən düşmənin varisiyəmmi? Siz məni nə hesab eləyirsiniz?

D'Artanyan:

– Hərbi adət belədir, dedi.

– Hətta vuruşma meydanında da mən heç vaxt belə şey etməmişəm.

Portos çıyınlərını çəkdı. Aramis razılıqla gülümsədi.

D'Artanyan belə bir təklif etdi:

– Lord Vınterin məsləhətini yerinə yetirək; bu pulu xidmətçilərə verək.

Atos:

Mən da buna razıyam, dedi, ancaq bizim xidmətçilərə yox, ingilislərin xidmətçilərinə.

Pul kisəsini götürüb arabaçının üstünə atdı:

Sızə və sizin yoldaşlarınıza verilir.

Belə bir səxavət Qrimodan, Muşketondan, Planşedən və Bazendən başqa, hamıya çox böyük təsir bağışladı. Sonraları lord Vinter və yoldaşları bu səxavətdən çox-çox danışardılar.

Lord Vinter d'Artanyanla görüşüb ayrılarkon öz bacısının ünvanını ona söylədi. O, Kral meydanında, altı nömrəli evdə yaşayırdı. O zamanlar Kral meydanı məşhur bir məhəllə idi. Lord Vinter d'Artanyanın dalınca gələcəyini vəd etdi. Onlar saat səkkizdə Atosun evində görüşəcəkdilər.

Miledi ilə görüşmək bizim qaskoniyalını bir qədər həyəcanlandırırdı. Bu qadın onun həyatında qəribə bir rol oynamışdı, bu, onun yadına düşdü. O, öz-özünə yəqin etmişdi ki, miledi kardinalın xidmətindədir. Bununla bərabər, yenə də bir hiss onu qadına doğru cəlb edirdi, bu adamın özünün dərk etmədiyi bir hiss idi. Qorxurdu ki, miledi onun Menq və Duvrda rast gəldiyi adam olduğunu bilsin. Miledi, heç şübhəsiz, onun cənab de Trevilin dostlarından olduğunu biləcək və bundan da onun bütün varlığı ilə krala sədaqətli olduğunu təyin edəcəkdi.

Miledinin qraf de Vardla olan sevgi macərası d'Artanyanı qorxutmurdu; hətta qrafın cavan, gözəl, dövlətli, kardinalın yanında böyük hörmət sahibi olması da onu düşündürmürdü. Buna da səbəb onun iyirmi yaşı olması və Tarbda doğulması idi.

D'Artanyan çox səliqə ilə geyinib Atosun yanına getdi. Atos qaskoniyalının nələr etmək istədiyini bilib başını yellədi və ona ehtiyatlı olmasını məsləhət gördü.

– D'Artanyan, sizi arvaddan yenicə ayırdılar... Siz onu mehriban, nəzakətli və gözəl hesab edirdiniz. İndi də bir başqasının dalınca düşürsünüz.

D'Artanyan bu məzəmmətin düzgün olduğunu başa düşdü.

Mən xanım Bonasyeni qəlbimlə sevirdim. Lakin miledini şüurumla sevirəm. Mən onunla tanış olmaq, bununla da, onun sarayda necə rol oynadığını bilmək istəyirəm.

Onun oynadığı rolu bilmək istəyirsiniz? Bunu bilmək çətin deyil! O, kardinalın casusudur. Mənim əzizim d'Artanyan, o sizi tovlayıb tələyə salar...

– Atos, mən bəzi şeyləri aydınlaşdırmalıyam. Mənə lazım olan şeyləri bildikdən sonra onu tərk edəcəyəm.

Atos sakitcə dedi:

Aydınlaşdırın, aydınlaşdırın...

Lord Vinter düz saat səkkizdə gəldi. Atos o biri otağa keçdi. Lord Vinter d'Artanyanı otaqda tək gördü.



Aşağıda onları iki gözəl at qoşulmuş kareta gözləyirdi. İki dəqiqədən sonra onlar karetaya mindilər; atlar çapa-çapa Kral meydanına sarı getdi.

Ledi Klarikin çox gözəl və bəzəkli bir kaşanəsi vardı. O zamanlar ingilislərlə fransızlar arasında gedən müharibə nəticəsində ingilislərdən çoxu Fransadan çıxıb getmişdi. Lakin miledi yenicə xərc qoyub evini bəzətmişdi. Bu göstərirdi ki, ingilislərin Fransadan çıxarılması haqqındakı əmr ona aid deyildi.

Lord Vinter d'Artanyanı bacısına təqdim edərək dedi:

Mənim həyatım sizin qarşınızda duran cavan adamın əlində idi. Lakin o öz üstünlüyündən istifadə etmədi; mən iki cəhətdən onun düşməni idim: həm ingilis olduğuma görə, həm də onu təhqir etdiyimə görə. Bununla belə, o, məni öldürmədi. Əgər, siz, azacıq da olsa məni sevirsinizsə, ona hörmət edin.

Miledi d'Artanyanı çox soyuq qəbul etdi. Qaşlarını yüngülcə qaldırdı. Üzündə güclə seziləcək bir narazılıq göründü, dodaqlarında isə çox qəribə bir təbəssüm titrədi. Bu təbəssümdən d'Artanyanın bütün bədəni gizildədi.

Lakin miledinin qardaşı heç bir şey duymadı. Qırağa çəkilib bacısının sevdiyi meymunla oynamağa başladı.

Miledi son dərəcə xoş və könülə yatan bir səslə dedi:

– Xoş gəlmisiniz. Bundan sonra mən həmişə sizə minnətdar olacağam.

Lord Vinter keçirdikləri dueli bütün təfərrüatı ilə bacısına söylədi. Lakin miledi bu hadisəyə qarşı olan əlaqəsini gizlətdi; bu danışılan sözlərdən xoşu gəlmədiyini göstərməyə qorxurdu. O, ancaq kiçik ayaqqabısını səbirsizliklə taxta döşəməyə vura-vura qulaq asırdı.

Lord Vinter yenə də bir şey hiss etmirdi. Duel haqqındakı söhbətini qurtarıb mizə yaxınlaşdı. Mizin üstündə bir şüşə İspaniya şərabı vardı. Stəkanı doldurub dinməz-söyləməz d'Artanyana təklif etdi.

İngilisin təklif etdiyi şərabı içməmək – onu ən ağır təhqir etmək demək idi. D'Artanyan bunu bilirdi. Mizə yaxınlaşıb şərab dolu stəkanı götürdü. Eyni zamanda o, miledini də gözdən qoymur, onu müşahidə edirdi: miledinin üzünü güzgüdə görürdü.

Sərt istehzalı təbəssüm onun simasını dəyişirdi. O, indi elə bilirdi ki, heç kəs onu görmür: yaylığının ucunu qəşəng barmaqları ilə acıqlı-acıqlı əzişdirirdi.

Qəşəng bir qulluqçu qız otağa girib lord Vintere ingiliscə bir söz söylədi.

Lord Vinter d'Artanyandan üzr istəyərək dedi:

Məni mühüm bir iş üçün çağırırlar. Əminəm ki, bacım mənim əvəzimdə üzrxahlıq edər.

D'Artanyan lord Vinterin əlini sıxıb miledinin yanına qayıtdı.

Onun üzünə birdən-birə xoş bir ifadə çökdü. Elə bil ki, o, tamamilə sakitləşmişdi. D'Artanyana dedi ki, lord Vinter mənim qardaşım deyil, qaynımdır. Mən onun kiçik qardaşına ərə getmişdim. Ərim öldü. Lord Vinter evlənməsə, mən onun yeganə varisi olub qalaram. D'Artanyan bu sözlərdən başa düşdü ki, miledinin həyatı bir çox cəhətdən sirlər içindədir.

Yarım saatlıq söhbətdən sonra d'Artanyan qəti inandı ki, miledi fransızdır. O, təmiz fransız dilində danışırdı, ifadəsində zərrə qədər də xarici ləhcə duyulmurdu.

D'Artanyan öz sədaqətini gözəl sözlərlə söylədi. Miledi qaskoniyalının boş sözlərinə qulaq asaraq gülümsəyirdi. Nəhayət, getmək vaxtı gəldi. D'Artanyan miledi ilə görüşərək otaqdan çıxdı. O, indi özünü dünyanın ən xoşbəxt bir adamı hesab edirdi.

Pilləkəndən düşərkən qəşəng qulluqçu qıza rast gəldi. Qız onu itələyərək qıpqırmızı qızardı, o saat da elə xoş bir səslə üzr istədi ki, d'Artanyan bu hərəkətini ona dərhal bağışladı.

D'Artanyan ertəsi gün də gəldi; bu dəfə keçən günkündən daha artıq nəzakətlə qəbul olundu. Lord Vinter evdə deyildi; d'Artanyan bütün axşamı miledinin yanında keçirdi. Miledi bu cavan qaskoniyalının həyatilə son dərəcə maraqlanaraq ona bir neçə sual verdi: harada anadan olmusan, kimlərdənsən, dostların kimdir, heç kardinalın yanında qulluq etmək fikrində olmusanmı? d'Artanyan da, məlum olduğu kimi, yaşına görə çox ağıllı bir adamdı; odur ki, kardinal həzrətlərindən çox hörmətlə danışdı; cənab Kavuanı cənab Trevil kimi yaxşı tanımadığına təəssüf etdi, yoxsa kardinalın qvardiyasına qulluğa girərdi.

Miledi sakitcə söhbəti dəyişdi və İngiltərədə olub-olmadığını laqeydcəsinə soruşdu.

D'Artanyan cavab verdi ki, İngiltərədə olmuşam, məni ora de Trevil at almağa göndərmişdi. Mən də döllük üçün dörd yaxşı at alıb gətirdim.



Miledi iki-üç dəfə dodaqlarını dişlədi: onun qarşısındakı qaskoniyalı hiyləgər bir adamdı; o, başladığı oyunu çox ehtiyatla oynayırdı.

D'Artanyan miledidən ayrılanda axşamdan çox keçmişdi. Dəhlizdə o yenə də ev qulluqçusu gözəl Kettiyə rast gəldi. Ketti ona baxıb çox lütfkarlıqla gülümsədi. Lakin d'Artanyanın fikri onun xanımı ilə məşğuldu, buna görə də yenə Kettiyə əhəmiyyət vermədi.

D'Artanyan hər axşam miledinin yanına gəlməyə başladı. Miledi onu get-gedə daha mehribanlıqla qəbul edirdi.

Hər axşam da d'Artanyan gah qəbul otağında, gah dəhlizdə, gah da pilləkəndə gözəl Kettiyə rast gəlirdi. Lakin d'Artanyan yenə də yazıq Kettinin incə təbəssümlərinə əhəmiyyət vermirdi.

## II

## PROKUROR NAHARI

Portosun gözəl bir rol oynadığı duel ona prokuror arvadının verəcəyi naharı unutdurmamışdı. Ertəsi gün saat birdə Muşketon öz ağasının pal-paltarını gözdən keçirdi və ancaq bundan sonra ləyaqətli muşketyor Ayı küçəsinə yola düşdü. O, indi özünü daha artıq xoşbəxt hiss edirdi.

Portos həyəcan içində idi; nəhayət o, əsrarəngiz astananı keçib cənab Koknarın köhnə ekülərinin qalxdığı əsrarəngiz pilləkənlə yuxarı çıxacaqdı. Nəhayət, həsrətini çəkdiyi sandığı görəcəkdi. Bu sandıq neçə dəfə onun yuxusuna girmişdi... Taxta döşəməyə mismarlanmış uzun, hündür bir sandıq... Ağzında da yekəcə bir qıfıl... Bu sandıq haqqında o elə tez tez söhbətlər eşidərdi... İndi birdən prokurorun arvadı bir az arıq, lakin hələ zərifliyini itirməmiş əllərilə bu sandığı, bu gözəl dəfinəni onun üzünə açacaqdı... Portos, ailəsi olmayan, yurdsuz-yuvasız bir sərsəri, vaxtını aşxanalarda, meyxanalarda keçirən bir əsgər, eyni zamanda, şirniyyat sevən bir adamdı, o çox vaxt təsadüfən rast gəldiyi naharla kifayətlənməyə məcbur olurdu. İndi isə ailə naharında iştirak edəcəkdi, ailə rahatlığı içində ləzzət duyacaqdı, az da olsa onun qayğısına ev sahibi qalacaqdı, köhnə əsgərlər demişkən: bu qayğı nə qədər çox olsa adama bir o qədər də xoş gəlirdi.

Hər gün əmioğlu adı ilə gəlib yaxşı yeməklər qoyulmuş miz başında oturmaq, qoca prokurorun üzündə təbəssümlər oyatmaq, cavan mirzələrə qalbıt[1] və landsknext[2] oyununu bütün təfərrüatı ilə öyrədərək onların bir azca "tükünü dıdmək", bir ay içində yığdıqlarını bircə saatda udmaq... Bunlar hamısı Portosun arzu etdiyi şeylərdəndi.

Doğrudur, muşketyor müxtəlif yerlərdən prokurorlar haqqında xoşa gəlməyən sözlər eşitmişdi. Prokurorların bərk xəsis və xırdaçı olduğu, yemək-içməyə son dərəcə qənaət etdikləri onun qulağına çatmışdı. Prokurorun arvadı isə öz adına görə çox səxavətli idi; Portos əmin idi ki, o öz evini böyük bir firavanlıqla dolandırır.

Lakin evə girəndə onun qəlbində bəzi şübhələr oyandı. Binanın xarici görünüşü o qədər gözəl deyildi; dəhliz çirkli idi, özündən də pis bir qoxu gəlirdi; pilləkən alaqaranlıq içində idi; ikinci mərtəbədə iri mismarlar vurulmuş alçaq bir qapı vardı.

Portos qapını döydü. Ucaboy, solğun üzlü bir mirzə qapını açıb baş əydi, onun pırtlaşmış saçı üz-gözünə tökülmüşdü, o, elə baş əydi ki, bundan onun hündür boylu, hərbi geyimli, qırmızı üzlü adamlara hörmət etməyə adət etdiyini bilmək olardı; boyun hündürlüyü adamın qüvvətli olduğunu, hərbi geyim - cəmiyyətdə tutduğu mövqeyini, qırmızı üzü isə – yaxşı yaşamağa alışdığını göstərirdi.

Birinci mirzənin dalında, boyca ondan kiçik ikinci mirzə, ikincinin dalında üçüncü, üçüncünün dalında on iki yaşlı uşaq göründü.

O zamanlar üç mirzə yarım saxlamaq – işin çox yaxşı getdiyini göstərən bir əlamətdi.

Portos saat birdə gəlməli idi, lakin prokurorun arvadı hələ saat on ikidən pəncərədən boylanmağa, onu gözləməyə başladı, ümid edirdi ki, sevgilisinin qəlbi, ya da mədəsi bəlkə görüş saatını yaxınlaşdıra bildi.

Qonaq pilləkəndən qalxmağa başlayanda xanım dərhal bayıra çıxdı və onun gəlməsi Portosu düşdüyü çətin vəziyyətdən qurtardı: mirzələr bir-birinin ardınca pilləkən üstündə durub maraqla ona baxırdılar, o da bir-birindən alçaq-hündür nərdivan kimi duran bu adamlara nə deyəcəyini bilməyərək kirimiş onların qabağında dururdu.

Prokurorun arvadı bərkdən dedi:

[1] Qalbıt – zər oyunu
[2] Landsknext – kart oyunu



- Bu, mənim əmim oğludur! Gəlin, cənab Portos, gəlin!

"Portos" adı mirzələrə qəribə göründü. Hamısı buna güldü. Portos dönüb geri baxdı, mirzələr dərhal səslərini kəsib ciddiləşdilər.

Prokurorun kabinetinə girmək üçün mirzələrin durduğu dəhlizdən və onların işlədiyi kontordan keçmək lazım gəldi. Kontor deyilən otaq hər cür kağız-kuğuz tökülmüş qaranlıq bir zaldan ibarətdir. Onlar kontoru və mətbəxi keçib qonaq otağına girdilər.

Bir-birinə yapışıq olan bu otaqlar Portosa çox da yaxşı təsir bağışlamadı. Mətbəxin yanından keçəndə tez içəriyə bir nəzər saldı, lakin adət üzrə, yaxşı yemək-içmək sevən adamların mətbəxində nahar vaxtı görünən hərəkət, gediş-gəliş, od-ocaq gözünə çarpmadı, o buna çox təəssüf etdi, prokurorun arvadı üçün də, əlbəttə, bu, ayıb bir şeydi, – Portos bunu öz-özünə etiraf etməyə bilməzdi.

Görünür prokurora onun gələcəyi haqqında qabaqcadan məlumat verilmişdi; çünki Portos içəri girəndə o buna zərrə qədər də təəccüb etmədi.

Portos çox sərbəst mizə yaxınlaşıb nəzakətlə baş əydi.

– Cənab Portos, biz deyəsən sizinlə əmioğluyuq? – deyib prokuror qarğı kreslonun qollarına dayanaraq ayağa qalxdı

Prokuror əldən düşmüş bir qoca idi; əynində uzun, qara bir geyim vardı ki, onun zəif bədənini başdan-ayağa örtürdü.

Xırda, boz gözləri bir cüt yaqut kimi parıldayırdı, adama elə gəlirdi ki, onun üzündə həyat əlaməti olaraq qalan ancaq bu gözlərdi.

Bədbəxtlikdən ayaqları da hərəkət etmirdi, beş-altı aydı ki, heç kreslodan qaxmırdı da.

Bir əmioğlu kimi o, ancaq hörmətlə qəbul edilmişdi. Koknar belə zəif və xəstə olmasaydı, Portosla olan qohumluq məsələsi rədd ediləcəkdi.

Lakin Portos prokurorun onu məmnuniyyətlə qəbul edəcəyini heç xəyalına da gətirmədiyindən özünü o yerə qoymur və oynadığı rolu yaddan çıxarmırdı. O dedi:

– Bəli, biz əmioğluyuq.

Prokuror istehza ilə dedi:

– Gərək ki, siz arvadın əmisi oğlusunuz...

Portos bu kinayəni başa düşmədi və qalın bığları altında gülümsədi.

Lakin prokurorun arvadı ərinin hər şeyi çox tez başa düşən bir adam olduğunu bildiyindən bərk qızardı.

Cənab Koknar, Portos gələndən bəri, palıd ağacından qayırılmış hündür yazı stolunun qabağındakı böyük şkafa narahat halda baxmağa başlamışdı. Bundan da Portos prokuror dəfinəsinin burada saxlandığını duymuşdu.

O, bərk sevinir, öz-özünü təbrik edirdi: həqiqət onun xəyalından da qat-qat yüksəkdi!

Cənab Koknar qohumluğa aid olan söhbəti tez kəsdi. Həyəcanlı nəzərini şkafdan ayırdı, Portosa baxıb əlavə etdi.

Mən əminəm ki, bizim əmioğlu müharibəyə getməzdən əvvəl bizdə bir dəfə nahar etmək iltifatı ilə bizi xoşnud edəcəkdir. Belə deyilmi, xanım Koknar?

Prokuror bu dəfə əsl hədəfi vura bilmişdi. Portos gülümsədi. Xanım Koknar isə dedi:

– Bizim bugünkü ziyafətimiz əmioğluna xoş gəlməsə, o bir daha bizim yanımıza gəlməyəcəkdir. Əminəm ki, belə olmayacaq. Cənab Portos Parisdə çox az qalacaq, onunla görüşmək imkanı da çox azdır; buna görə də biz ondan xahiş etməliyik ki, müharibəyə gedənə qədər bütün boş vaxtını bizə həsr etsin.

Koknar öz-özünə:

– Ah, mənim ayaqlarım, mənim yazıq ayaqlarım, siz haradasınız? deyərək gülümsəmək istədi.

Xanım Koknarın bu sözləri çox yerinə düşdü və Portosun lap vaxtında köməyinə çatdı; çünki onun ümidləri təhlükə altına düşürdü, bu sözlər eyni zamanda Portosda prokurorun arvadına qarşı böyük bir minnətdarlıq hissi oyatdı.

Nahar vaxtı çatmışdı. Hamı yemək otağına keçdi; bu, mətbəxlə üzbəüz böyük, qaranlıq bir otaqdı.

Mirzələr adət etmədikləri xörək ətrini duyaraq bu dəfə çox böyük səliqə ilə işə başladılar, dərhal əllərində kürsü yemək otağına gəldilər və miz dalında oturmaq təklifini gözlədilər. Onların çənəsi qabaqcadan hərəkətə gəlmişdi.

Portos bu üç cavan mirzəyə (balaca hələ ailə süfrəsinə oturmağa layiq görülməmişdi) baxaraq öz-özünə dedi: "Vallah əmioğlumun yerinə olsaydım, mən bu qarınquluları bircə saat da öz yanımda saxlamazdım. Elə bil bunlar gəmi qəzasına uğramışlar və beş-altı həftədir ki, dillərinə heç bir şey dəyməmişdir".

Cənab Koknar yemək otağına çarxlı kresloda gəldi.



Portos kreslonu süfrəyə yaxınlaşdırmaq üçün cəld xanım Koknarın köməyinə yetişdi.

Yemək otağına gətirilən kimi cənab Koknarın həm burnu, həm də çənəsi dərhal hərəkətə gəldi.

– Paho! Əcəb ləzzətli iy gəlir!

Portos duru ət suyunu görən kimi öz-özünə dedi: "Çox qəribədir! Bu duru ət suyunda nə var ki, bu adamın belə xoşuna gəlir?! Ət suyu duru da olsa, çox idi. İçində də okean üzündə görünən arxipelaq adaları kimi, bir neçə suxarı parçası üzürdü. Xanım Koknar gülümsədi və hamı onun işarəsilə cəld süfrə başına yığışdı.

Əvvəl cənab Koknara, sonra da Portosa xörək verildi. Bundan sonra da xanım Koknar öz boşqabını doldurdu və suxarını, səbirsizliklə yemək gözləyən mirzələr arasında bölüşdürdü. Onlara ət suyu verilmədi. Elə bu anda qapı açıldı: Portos balaca mirzəni gördü. O, bu ziyafətdə iştirak etmək xoşbəxtliyinə nail olmadığından, əlindəki qara çörəyi həm mətbəxin, həm də yemək otağının qoxusu altında ləzzətlə içəri ötürürdü.

Ət suyundan sonra qulluqçu qadın bişmiş toyuq gətirdi, bunu görən kimi hamı heyrətdən gözlərini bərəltdi.

Prokuror pis-pis gülümsədi:

- Xanım Koknar, görünür ki, siz öz qohumlarınızı sevirsiniz. Əlbət ki, göstərdiyiniz bu iltifata qarşı biz sizin əmioğluya minnətdarıq.

Toyuq arıqdı; dərisi qalın, tükü də yaxşı təmizlənməmişdi. Görünür onu qoca vaxtında rahatca ölmək üçün çəkilib oturduğu hinindən o qədər də asanlıqla çıxara bilməmişlər.

Portos öz-özünə yenə dedi: "Lənət şeytana! Çox kədərli bir haldır! Mənim qocalara qarşı hörmətim var, lakin bu qoca deyilən şey suda bişmiş, ya da yağda qızarmış halda süfrəyə gələndə, heç xoşuma gəlməz"

Ətrafına baxdı, o birilərin də onun kimi düşünüb-düşünmədiyini bilmək istədi. Nə gördü? Süfrə dövrəsində oturanların hamısı, adamın heç üzünə baxmaq istəmədiyi bu arıq toyuğu az qalırdı ki, gözlərilə yesinlər. Xanım Koknar toyuğu öz qabağına çəkdi, onun iri, qara ayaqlarını çox ustalıqla qoparıb ərini boşqabına qoydu; boynunu və başını da özü üçün ayırdı. Sonra da qanadlarını qoparıb Portosun boşqabına qoydu; toyuğun qalanını qulluqçu arvada qaytardı. Portos, ümidləri puç olan mirzələrin üzündəki müxtəlif narazılıq ifadəsini gözdən keçirənə kimi toyuq yox oldu.

Toyuq əvəzinə süfrəyə böyük boşqabda paxla gətirildi. Boşqabın qırağında bir neçə xırdaca qoyun sumüyü vardı. Lakin mirzələr bu dəfə özlərini aldatmadılar; üzlərindəki tutqun ifadə taleyə boyun əydiklərini göstərirdi.

Xanım Koknar paxlanı onlara payladı.

Sonra növbə şəraba çatdı. Cənab Koknar balaca bir bardaqdan mirzələrin hər birinin stəkanına, stəkanın üçdə biri qədər, bir bu qədər də özünə şərab tökdü: şüşə dərhal Portos və xanım Koknar tərəfə keçdi.

*Mirzələr stəkanın başını su ilə doldurdular; yarıya qədər içəndən* sonra yenə də stəkanı su ilə doldurdular. Yemək qurtarana kimi onlar bunu təkrar etdilər, axırda qırmızı yaqut rəngli şərab boz zəbərcəd rənginə düşdü.

Portos bütün bu şeyləri görüb özünü itirmişdi; toyuq qanadını qorxa-qorxa yedi və elə bu anda mizin altında prokuror arvadı dizini onun dizinə toxundurdu. Portos diksindi. Sonra da yarım stəkan şərab içdi. bu qədər qənaət edilən bu şərabın çox pis yerli Montrel şərabı olduğunu dərhal başa düşdü.

Cənab Koknar şərabın su qatılmadan içildiyini görüb ah çəkdi.

Xanım Koknar:

Əmioğlu, Portos, – dedi, – siz bu paxlanın dadına baxmaq istəmirsinizmi?

Lakin bu sözləri o elə bir ifadə ilə söylədi ki, sanki "elə yeməsəniz yaxşıdır" deyirdi.

Portos öz-özünə yavaşca dedi:

Allah mənə qəzəb eləsin, əgər mən onun dadına da baxsam! Sonra bərkdən əlavə etdi:

Təşəkkür edirəm, əmiqızı, mən lap toxam.

Hamı susurdu. Portos nə edəcəyini bilmirdi.

Prokuror bir neçə dəfə təkrar etdi:

Ax, xanım Koknar, sizi təbrik edirəm: siz bizə əməllicə qonaqlıq verdiniz! Allah, mən yaman çox yedim!

Cənab Koknar bir boşqab ət suyu və toyuğun qara ayaqlarını yedi: üstündə azca əti olan qoyun sümüyünü də gəmirdi.

Portos elə bildi ki, onunla zarafat edirlər: bığlarını burmağa, qaşqabağını tökməyə başladı; lakin xanım Koknarın dizi yenə də onun qıçına toxundu; sanki qadın ona səbirli olmağı məsləhət görürdü.



Portos süfrə qırağındakı bu sükut və tənəffüsün mənasını qətiyyən başa düşmürdü; lakin bunun mirzələr üçün çox ciddi bir mənası vardı: prokurorun bircə dəfə baxması və xanım Koknarın bircə təbəssümü ilə onlar öz əl dəsmallarını yavaş yavaş bükdülər, sonra da baş əyərək otaqdan çıxdılar.

Prokuror onların dalınca təşəxxüslə dedi:

Gedin, cavanlar, gedin, işlə məşğul olun! Xörəyi həzm etmək üçün bu, xeyirdir.

Mirzələr gedən kimi xanım Koknar durub bufetdən bir parça pendir, bir az heyva mürəbbəsi və öz əli ilə hazırladığı bir badam çörəyi gətirdi.

Cənab Koknar bunları görüb qaşqabağını salladı; Portos isə dodağını dişlədi; o, ac qalacağını başa düşdü. Miz üstündə paxla qalıb-qalmamasına göz gəzdirdi, lakin paxladan heç əsər də qalmamışdı

Koknar öz kreslosunda əsəbi halda qurdalanaraq çığırdı:

Böyük ziyafətdir! Böyük ziyafətdir!

Portos şərab şüşəsinə baxdı: şərab, çörək və pendirlə o, aclığını birtəhər dəf edə bilərdi. Ancaq şüşə boş idi: şərab qurtarmışdı, ər-arvad Koknarlar özlərini elə göstərdilər ki, guya bunu heç duymurlar.

Portos şərab şüşəsinin boş olduğunu görüb öz özünə düşündü: "Bir baxırsanmı! Məni qabaqlayıblar!"

O, bir balaca qaşıq mürəbbə yedi, badam çörəyini daddıqda dişləri az qaldı ki, yapışqan kimi xəmirə yapışıb qalsın.

O, öz-özünə fikirləşdi: "Yamanca uduzdum! Xanım Koknarın yanına gəlməklə, onun ərinin şkafına baxmaq ümidim boşa çıxdı..."

Cənab Koknar bu zəngin naharın gözəl nemətlərindən doyunca həzz aldıqdan sonra dincəlmək ehtiyacı hiss etdi. Portos elə bildi ki, cənab Koknar elə bu otaqda dincələcəkdir, lakin məlun prokuror bunu heç xəyalına da gətirmirdi. Onu yenə də öz otağına aparmaq lazım gəldi. O ancaq öz şkafını gördükdən sonra rahat oldu və daha artıq arxayınlıq hasil etmək üçün ayaqlarını da şkafın qırağına qoydu. Prokurorun arvadı Portosu yan otağa apardı; barışıq şərtləri haqqında danışıq da burada başladı.

Xanım Koknar sözə başladı:

Siz həftədə üç dəfə bizə nahar etməyə gələ bilərsiniz...

Portos:

Təşəkkür edirəm, dedi. Mən heç bir şeydən sui-istifadə etməyə öyrənməmişəm; bundan başqa, mən öz yaraq-yasağım haqqında lazımi tədbirlər görməliyəm.

Prokurorun arvadı dərdli-dərdli ah çəkdi:

Bəli, bəli! Bu yaraq-yasaq da başa bir bəla olub!

- Əfsus!

Cənab Portos, sizin alayda yaraq-yasaq dediyiniz şey nədən ibarətdir?

Çox şeydən. Sız özünüz bilirsiniz ki, muşketyorlar seçmə qoşundur. Onlara elə şeylər lazımdır ki, bu qətiyyən nə qvardiya, nə də İsveçrə hissələrinə gərək olur.

– Hər halda bunların nədən ibarət olduğunu bir-bir söyləyin. Deyin görüm sizə nə lazımdır və bu lazım olan şeylərin hər biri neçəyə başa gələr.

Portos dedi:

Bütün yaraq yasaq başa gələr... – O, hər xırda şeyı bir-bir sadalamaqdansa, hamısına birdən yekun vurmağı daha əlverişli hesab edirdi.

Prokurorun arvadı əsə əsə cümlənin sonunu gözləyirdi.

Neçəyə? Əminəm ki, bunlar hamısı başa gələr ..

O, sözünü kəsdi: cümləni deyib qurtarmağa qorxurdu.

Portos:

– İki min beş yüz livrə başa gələr, dedi. Artıq lazım deyil. Elə bilirəm ki, bir az qənaətlə ikı mınlə də işi yola verərəm.

Xanım Koknar çığıraraq dedi:

Necə? İki mın lıvr? Bu kı, böyük bır dövlətdır!

Portos üz gözünü turşutdu; xanım Koknar da dərhal bunun mənasını başa düşdü.

Xahiş edirəm, sizə lazım olan şeyləri mənə ayrı-ayrı söyləyəsiniz. Mənim qohum-əqrəbam çoxdur, alver ışində də böyük təcrübəm var. Yəqin bilırəm ki, mən bu şeyləri sizdən ikıqat ucuz ala bılərəm.

Belə deyin! Siz bunun üçün mənə lazım olan şeyləri ətraflı bilmək istəyirsiniz?

– Bəli, əziz Portos! Demək, hər şeydən əvvəl, deyəsən sizə bır at gərəkdir!

Bəli, at gərəkdır.

- Yaxşı, bu barədə mən fikirləşmişəm.



Portos sevinə-sevinə dedi:

– Demək at məsələsi həll olundu. Bundan başqa, mənə bir ata lazım olan mükəmməl bir yaraq-əsbab gərəkdir; bu da elə şeydi ki, bunu ancaq muşketyor özü ala bilər. Hamısının qiyməti üç yüz livrdən çox tutmaz.

Prokurorun arvadı dedı:

– Üç yüz livr! Yaxşı, qoy bu da olsun üç yüz livr, – o ah çəkərək buna da razı oldu.

Portos gülümsədi. Bekınhem hersoqunun ona bir yəhəraltı verdiyi yəqin ki, oxucunun yadındadır. Muşketyor bu üç yüz livri öz cibinə qoymaq fikrində idi.

Portos sözünə davam etdi:

Bundan başqa, bir çamadan və mənim xıdmətçım üçün də bir at lazımdır. Silah haqqında narahat olmaya bılərsiniz, silahım var.

Prokurorun arvadı mütərəddıd halda soruşdu:

Xıdmətçi üçün at? Əziz dost, siz, deyəsən lap əyan olmaq istəyırsınız.

Portos lovğa-lovğa dedi:

Xanım, yoxsa sız elə bilırsınız ki, mən dilənçi-zadam?

Yox, mən ancaq bunu demək istəyirdim ki, bəzən qəşəngcə bir qatır, atı tamamilə əvəz edə bilər. Mənə elə gəlir ki, Muşketon üçün gözəl bır qatır aldıqda...

Yaxşı, mən qatıra da razıyam. Siz haqlısınız; mən bir çox təşəxxüslü İspaniya əyanları görmüşəm ki, bütün məiyyətləri qatıra mınmişdi. Lakin, xanım Koknar, siz bir şeyi də, yəqin ki, başa düşürsünüz: bu qatır bərli-bəzəkli, lələkli-zınqırovlu olmalıdır.

- Bu barədə arxayın ola bilərsiniz...

- İndi çamadan qaldı.

Xanım Koknar:

Bu barədə də arxayın ola bilərsiniz, – dedi. – Mənim ərimin beş-altı çamadanı var. Ən yaxşısını seçib götürərsiniz. Xüsusilə bunların içində biri var, hamısından çox şey tutur; ərim həmişə bunu götürüb səyahətə çıxmağı sevərdi.

Portos sadəlövhcəsinə soruşdu:

– Boş çamadandır?

Prokurorun da arvadı elə sadəlövhcəsinə cavab verdi:

– Əlbət ki, boşdur.

Portos çığıraraq dedi:
Əzizim, mənə lazım olan çamadan ağzına kimi dolu olmalıdır.
Xanım Koknar yenə də ah çəkdi.
Müşavirə onunla qurtardı ki, prokurorun arvadı Portosa səkkiz yüz livr pul verməyi, bundan başqa bir at və bır qatır almağı vəd etdi; bu atla qatır Portosla Muşketonu şöhrətə doğru aparmaq şərəfinə nail olacaqdı.
Danışıq qurtardıqdan sonra Portos, xanım Koknarla vidalaşıb getmək istədi. Lakın xanım Koknar qaş-göz edərək onu saxlamağa çalışdı. Portos isə qulluq yerində çox nəcib işi olduğunu söylədi; buna görə də prokurorun arvadı onu saxlaya bılmədi.
Portos ac və ovqatı təlx evinə qayıtdı.

## III

## QULLUQÇU QIZ VƏ XANIMI

D'Artanyan həm öz vicdanının töhmətlərinə, həm də Atosun ağıllı məsləhətlərinə baxmayaraq, getdikcə miledıyə daha artıq vurulurdu. Hər gün onun yanına gedirdı. Öz-özünə artıq dərəcədə güvənən bu qaskonıyalı yəqın etmişdi kı, miledi də onu sevəcəkdır.
Bir axşam o, mıledinin yanına gedərkən darvaza ağzında qulluqçu qıza rast gəldi. Bu dəfə gözəl Ketti muşketyorun yanından ötərkən ona toxunmaqla kifayətlənməyib nəzakətlə əlindən tutdu.
D'Artanyan öz-özünə düşündü: "Çox gözəl! Yəqın ki, onu xanımı göndərmişdir, mənə deyəcək sözü var. Bəlkə mənimlə görüş təyin edəcək... Özü utanıb mənə deməyıb..."
Gözəl qıza qalib bir nəzərlə baxdı.
Qulluqçu qız yavaşca dedi:
– Cənab zabit, mən sızə ikicə kəlmə söz demək istəyirəm .
De, quzum, de.
- Burada demək olmaz Bu çox gizli bir sırdir. Həm də söhbət uzundur.
– Bəs necə edək?
Ketti çəkinə-çəkinə.
Cənab zabit, - dedi, - mənimlə gedə bilərsinizmı?



Hara istəsəniz, hazıram.
– Gedək, cənab zabit.
Ketti d'Artanyanı kiçik burma-burma pilləkənlə yuxarı apardı və bir otağı göstərib dedı:
Buyurun, ıçəri girin, cənab. Burada bizdən başqa heç kəs yoxdur.
Bu otaq kımindir?
Mənimdir, cənab. Bax, bu qapının o tərəfindəki xanımın otağıdır. Narahat olmayın: xanım bizım danışığımızı eşıdə bılməz. O, heç vaxt saat on ıkidən qabaq yerinə girmır.
D'Artanyan yan-yörəsinə baxdı. Otaq kiçik və təmizdi, səlıqəli idi. O, istər-ıstəməz miledinin otağına açılan qapıya baxdı.
Ketti ah çəkdi.
– Cənab, siz mənim xanımımı çoxmu sevirsiniz?
Kettı, mən ondan ötrü dəliyəm.
Kettı bir də ah çəkdi.
Çox təəssüf, cənab.
Niyə axı?
Ketti:
Cənab, - dedi, mənim xanımım sizi sevmir.
Hm! O, bunu söyləməyi sənə tapşırmışdır?
– Yox, cənab, yox! Mən yaxşılıq məqsədilə bunu sizə deyirəm.
Ketti, bu yaxşılığa görə sənə təşəkkür edirəm. Ancaq sənin bu sözlərındə xoşa gələn heç bır şey yoxdur.
– Siz mən deyənə ınanmırsınızmı?
Belə şeylərə çox çətinliklə ınanmaq olur, çünki necə olsa adamın şəxsiyyətinə toxunur.
- Demək, siz mənə inanmırsınız?
Bir sübut göstərməyincə...
Buna nə deyərsiniz? Ketti korsajından kiçık bir məktub çıxartdı.
D'Artanyan soruşdu:
Mənə yazılıb? Tez məktubu qapdı.
– Yox, başqasına yazılıb.
- Başqasınamı?
Bəlı.
D'Artanyan bərkdən soruşdu:
Onun adı nədir?

Üstündəki ünvanı oxuyun.
Cənab qraf de Varda.
Şöhrətpərəst qaskoniyalı Sen Jermendəki hadisəni dərhal yadına saldı; cəld bir hərəkətlə məktubu açdı.
Aman Allah, cənab zabit, siz nə etdiniz?
Məktubda bu sözlər yazılmışdı:
*"Siz mənim birinci məktubuma cavab vermədiniz. Xəstə deyilsiniz ki? Xanım de Qizin verdiyi ziyafətdə siz mənə necə baxırdınız, bunu xatırlayın. Qraf, fürsət düşəndə əldən buraxmayın, istifadə edin".*
D'Artanyanın rəngi ağardı. Bu hadisə onun heysiyyətinə toxunurdu.
Ketti cavan oğlanın əlini sıxaraq dedi:
– Cənab d'Artanyan, əzizim, sizə yazığım gəlir!
– Mənim xırdaca gülüm, mənə yazığınmı gəlir?
Elə yazığım gəlir. . Çünki mən bilirəm sevgi nə deməkdir.
D'Artanyan diqqətlə ona baxaraq soruşdu:
Sən sevginin nə demək olduğunu bilirsən?
– Əfsus ki, bilirəm!
– Elə isə, mənə yazığın gəlməkdənsə, kömək elə mən sənin xanımından intiqam alım.
– Siz ondan necə intiqam almaq istəyirsiniz?
Mən, mənim rəqibimin yerini tutmaq istəyirəm.
Ketti həyəcanla dedi:
– Cənab zabit, bu barədə mən sizə heç vaxt kömək eləmərəm.
– Niyə?
İki səbəbə görə.
- Bunlar nədir?
Birinci budur ki, mənim xanımım sizi heç vaxt sevməz.
– Sən bunu haradan bilirsən?
- Siz onu çox bərk təhqir eləmisiniz.
Mən? Onunla tanış olandan bəri mən bir qul kimi onun ayaqları altında sürünürəm. Mən onu nə vaxt təhqir elədim?
– Mən bunu ancaq o adama deyərəm ki, o mənim könlümdəkini duya bilsin.
D'Artanyan bir də Kettiyə baxdı.
Ketti, mən sənin könlündəkini duyaram; bu mümkün olan şeydir, deyərək qızı öpdü.



Yazıq qız qıpqırmızı qızardı.
Ketti:
Yox, yox, siz məni sevmirsiniz! dedi. İndicə demədinizmi mən xanımı sevirəm?..
– İkinci səbəbi söyləməyə bu sonə mane olurmu?
İkinci səbəbimi deyirsiniz, cənab zabit? Sevgi məsələsində hər kəs özü üçün əlləşir...
D'Artanyan Kettinin baxışlarını, dəhlizdə, pilləkəndə, koridorda onunla qarşılaşmasını, hər dəfə də qızın əlini onun əlinə toxundurmasını, gizli gizli ah çəkməsini xatırladı və bunun nə demək olduğunu ancaq indi başa düşdü. Onun fikri ancaq bir şeylə məşğul idi: milediyə xoş gəlmək! Buna görə də qulluqçu qıza əhəmiyyət vermirdi. Qaraquş ovuna çıxan sərçə ilə maraqlanmaz.
Ketti öz sevgisini sadə bir qəlblə ona etiraf etmişdi. Bizim qaskoniyalı da bundan öz xeyri üçün yaxşıca istifadə etməyin mümkün olduğunu anladı. O, Varda yazılan bütün məktubları ələ keçirə bilərdi, miledini müşahidə altına alar, istədiyi vaxt Kettinin yanına, – xanımın otağı ilə yanaşı olan otağa girə bilərdi... Vəfasız d'Artanyan miledinin sevgisinə nail olmaq üçün bu cavan qızcığazı qurban verməyə hazırdı.
Əzizim Ketti, sən istəyirsən ki, mən öz sevgimi sənə isbat edim?
Gənc qız soruşdu:
– Hansı sevgini?
– Öz sevgimi.
Siz öz sevginizi mənə necə isbat edə bilərsiniz?
Mən bütün gecəni sənin yanında qalaram, miledinin yanına getmərəm.
Ketti sevinərək əlını əlinə vurdu:
– Ah, nə olar!
D'Artanyan kresloya oturaraq dedı:
Elə isə yanıma gəl Sən bütün qulluqçu qızların hamısından yaxşısan.
O, öz sevgisini qıza elə bir nəzakətlə, elə bir inamla hiss etdirdi ki, qız buna inandı.
Gecə yarısı idı. Miledinin otağında zəng səsləndi.
Allah, görəsən nə var! Xanım məni çağırır. Gedin, tez olun, gedin.
D'Artanyan qalxdı, şlyapasını götürdü, lakin qapını açıb bayıra çıxmaq əvəzinə cəld şkafın qapılarını açdı, şkafa girib miledinin paltarı arasında gizləndi.

Siz nə edirsiniz?

D'Artanyan şkafın qapıların örtüb Kettinin sualına cavab vermədi.

Miledi sərt bir səslə çığıraraq o biri otaqdan dedi:

Siz orada yatmısınız, nədir? Zəng çalanda niyə gəlmirsiniz?

D'Artanyan miledinin otağına olan qapının açıldığını eşitdi

Ketti bərkdən səsləndi:

Gəlirəm, miledi, gəlirəm!

Qapı açıq qaldı. D'Artanyan miledinin yazıq qulluqçu qızı danladığını eşitdi.

Nəhayət, miledi sakitləşdi. Ketti öz xanımına soyunmağa kömək etdi.

Miledi dedi:

Nədənsə mən bu axşam bizim qaskoniyalını görmədim.

Xanım, yoxsa o gəlməmişdi?

– Yox, gəlməmişdi. Yəqin onu ya cənab de Trevil, ya da cənab Dezessar saxlayıb.

– Xanım, siz ona nə etmək istəyirsiniz?

Nə etmək istəyirəm?.. Bizim aramızda, Ketti, bir məsələ var, mən bunun haqq hesabını çəkəcəyəm, onun bundan heç xəbəri də yoxdur. Onun ucundan mən az qalmışdı ki, kardinalın etimadını itirim. Mən öz qisasımı alacağam.

Xanım, mən elə bilirdim ki, siz onu sevirsiniz.

- Necə? Mən onu sevirəm? Mən ona nifrət edirəm! O, axmağın biridir! Lord Vinterin həyatı onun əlində imiş, lakin onu öldürməyib! O, məni ildə üç yüz min livrlık gəlirdən məhrum etmişdir!

D'Artanyan qızdırmaya tutulmuş kimi titrəyirdi.

– Mən ondan qisas alacaqdım, ancaq kardinal buna razı olmadı...

Lakin siz onun sevdiyi o balaca qadından yamanca qisas aldınız.

Hansı qadından? Məzarçılar küçəsindəki o alverçi arvaddan? Yoxsa, d'Artanyan hələ də onun unutmamışdır? Bəli, mən yaxşı qisas aldım.

D'Artanyanın alnını soyuq tər basdı. Doğrudan da, bu dəhşətli bir qadınmış.

Miledinin gecə tualeti qurtardı.

Sonra Kettiyə:

– Gedin öz otağınıza, dedi. Çalışın ki, sizə verdiyim məktubun cavabını sabah mənə çatdırasınız



Cənab Varda yazılan məktubunmu?

Bəli.

D'Artanyan miledinin qapını örtdüyünü eşitdi. Ketti öz otağına girdi. D'Artanyan şkafdan çıxdı.

Ketti ona baxıb yavaşca:

Aman Allah! Sizə nə olub? dedi. Sizin rənginiz ağappaq ağarmışdır.

D'Artanyan pıçıldadı:

– O nə qədər rezil bir məxluqmuş!

Ketti də pıçıldayırdı:

Susun, dedi. Susun, çıxın gedin. Mənim otağımı miledinin otağından ancaq nazik bir bölmə ayırır.

– Elə buna görə də mən buradan getməyəcəyəm.

Bu, qisas almağın başlanğıcı idi.

D'Artanyan xanım Bonasyenin başına nələr gəldiyini bilmək istədi, lakin yazıq Ketti bu barədə heç bir şey bilmirdi. Miledinin nə üçün az qala kardinalın etimadını itirəcəyi haqqında da Kettinin elə bir məlumatı yox idi. D'Artanyan bu barədə ondan çox şey bilirdi. İngiltərəni tərk edərkən o, miledini yola çıxmasına icazə verilməyən gəmidə görmüşdü. Heç şübhəsiz, məsələ brilyant boyunbağı üstündə idi. Lakin d'Artanyan bunu da başa düşürdü ki, miledinin ona qarşı olan dərin nifrəti, onun qaynını öldürməməsindən irəli gəlir.

D'Artanyan ertəsi gün miledinin yanına gəldi. Onun ovqatı təlx idi. D'Artanyan dərhal bunun səbəbini anladı: miledinin gözü yolda idi, – o hər dəqiqə qraf Varddan cavab gözləyirdi. Ketti içəri girdi. Miledi onunla son dərəcə kobud rəftar etdi. Ketti d'Artanyana baxdı: bu gözlər deyirdi: "Görürsünüzmü, sizin təqsiriniz üzündən mən necə əzab çəkirəm!"

Gecəyə yaxın miledi yumşaldı. O, gülümsəyərək d'Artanyanın boşboğazlığına qulaq asırdı; hətta əlini öpməyə də ona icazə verdi.

D'Artanyan qəti bir nəticəyə gəlmədən miledinin yanından getdi. Lakin bu qaskoniyalını yoldan çıxarmaq da asan deyildi. O, yenə də miledinin yanına gəlir və öz planını yadından çıxarmırdı.

O, dünənki kimi, yenə də Kettinin otağına qalxdı. Miledi öz qulluqçusuna bərk acıqlanırdı. Qraf Vardın cavab yazmaması onu çox narahat edirdi. Kettiyə tapşırdı ki, səhər saat doqquzda məni oyadarsan. Miledi qraf Varda üçüncü məktub yazmaq qərarına gəlmişdi.

D'Artanyan Kettiyə dedı kı, sabah mənim yanıma gələrsən, bu məktubu da gətirərsən. D'Artanyan hər nə tələb edirdisə, yazıq qız yerinə yetirəcəyinə söz verırdi. Sanki o, ağlını itirmişdi.

Bu gün də hər şey dünənki kimi oldu D'Artanyan yenə də şkafa girdi, miledi qulluqçu qızı yanına çağırdı. D'Artanyan ancaq səhər saat beşdə öz evinə qayıtdı.

Ketti saat on birdə onun yanına gəldi, miledının qraf de Varda yazdığı məktubunu gətirdı.

D'Artanyan məktubu açıb oxudu. Məktubda bu sözlər yazılmışdı:

*"Budur, sizə üçüncü məktubu yazıb demək istəyirəm ki, mən sizi sevirəm. İndı özünüzü gözləyin: dördüncü məktubumda yazacağam ki, sizə nıfrət edirəm. Əgər, sız peşmansınızsa, bu məktubu sizə verən cavan qız, nəzakətli bır adamın mənim əfvimə layiq olması üçün nə etməli olacağını sizə söylər".*

D'Artanyan məktubu oxuduqca gah qızarır, gah da ağarırdı.

Ketti:

– Ah, siz yenə də onu sevırsiniz! dedi.

Yox, Ketti, sən yanılırsan; mən artıq onu sevmirəm. Lakin ondan qisas almaq istəyirəm.

– Mən bilirəm siz ondan necə qisas almaq istəyirsiniz

– Ketti, sənin üçün təfavütü nədir? Sən çox yaxşı bilirsən ki, mən ancaq səni sevirəm.

Ketti ah çəkdi:

Ah, mən bunu bilsəydim...

D'Artanyan qələmi götürüb aşağıdakı cavabı yazdı:

*"Xanım!*

*Bu ana qədər mən sizin yazdığınız kağızların mənə aid olduğuna şübhə edirdim. Mən özümü belə yüksək bir şərəfə layiq hesab etmirdım; bir də ki, özümü elə xəstə hiss edirdim ki, sizə cavab yazmağa cürət eləmirdim. Lakin bu gün mən sizin mənə qarşı gözəl bır niyyətdə olduğunuza qəti surətdə inandım; çünki yalnız məktubunuz deyil, göndərdiyiniz qulluqçu qız da təsdiq edir ki, siz məni sevirsiniz. Belə. Sizdən əfv diləmək üçün bu axşam saat on bırdə yanınıza gələcəyəm.*

*Dünyanın ən xoşbəxt adamı elədiyiniz*

*Qraf de Vard".*

Çılğıncasına bır ehtiras d'Artanyanı bu qadına sövq edirdi. Bu ehtıras nifrətlə qarışıq məstedici bir ehtirasdı. D'Artanyanın planı



çox sadə ıdı: Kettinin otağından miledinin otağına girmək və bu anda miledinin heyrət və utancaqlığından, duyduğu dəhşətdən istifadə edərək məqsədə çatmaq.. Bəlkə də o buna müvəffəq olmayacaq; lakin vəziyyət bu şəkildə davam edə bilməzdi: qəti bir nəticəyə gəlmək lazımdı! Səkkiz gündən sonra müharibə başlayacaqdı. Sevgi macəralarını qurtarmaq gərəkdi.

D'Artanyan ağzı bağlı məktubu Kettiyə verdi:

Al, dedi, milediyə ver! Bu, cənab de Vardın cavabıdır.

Yazıq qızın rəngi ölü rəngi kimi ağappaq ağardı. O, məktubda nələr yazıldığını hiss edirdi.

D'Artanyan dedi:

Qulaq as, əzizim. Sən özün başa düşürsən ki, bu məsələyə pis-yaxşı son qoymaq lazımdır. Mıledi bəlkə də, bu birinci məktubu qrafın qapıçısına vermək əvəzində, gətirib mənim qapıçıma verdiyini, o biri məktubların da mənə çatdığını bildi. Bu zaman o səni evdən qovar. Sən özün bilirsən ki, o necə qadındır: o öz qısasını bununla bitirməyəcək...

Ketti dedi:

– Əfsus! Mən kimin üçün özümü bəlaya salıram?

Mənim üçün. Gözəlim, mən bunu yaxşı bılirəm. Buna görə də mən sənə çox-çox təşəkkürlər edirəm, and olsun...

Yaxşı, o məktubda nə yazılıb?

– Mıledi sənə deyər.

Ketti bərkdən:

Ah, siz məni sevmirsiniz! dedi. Mən çox bədbəxt bır qızam.

## IV

## BU FƏSİLDƏ ARAMİSLƏ PORTOSUN YARAQ-YASAQ TAPMASINDAN BƏHS OLUNUR

Dörd dost ayrı ayrılıqda yaraq-yasaq dalınca düşdükdən sonra bir yerə yığışmırdılar. Hər kəs harada gırəvə düşsə, daha doğrusu, harada bacarsa, nahar edərdi. Qulluq da onların qiymətli vaxtını çox alırdı. Onlar ancaq həftədə bir dəfə Atosun mənzilində toplaşmağı qərara almışdılar. Bu şanlı muşketyor and içdıyindən evdən bayıra çıxmırdı.

Ketti d'Artanyanın yanına gəldiyi gün dostlar bır yerə yığışmalı idi. Ketti məktubu verib gedən kimi d'Artanyan Feru küçəsinə yola düşdü. Gəlib gördü ki, Atosla Aramis fəlsəfi söhbətlə məşğuldurlar. Aramis yenə də baş qırxdırmaqdan söz açmışdı. Atos da, adəti üzrə, onunla mübahisə etmirdi; o hər kəsə sərbəst hərəkət etmək imkanı verilməsi tərəfdarı idi. O xahiş edilmədən heç kəsə məsləhət verməzdi.

Atos deyirdi:

Məsləhət insanlara ona görə lazımdır ki, bunu yerinə yetirməsinlər; məsləhət dalınca gedən də ona görə gedir ki, sonra töhmətləndirməyə bır adam tapılsın.

D'Artanyandan az sonra Portos da gəldi. Beləlıklə, dörd dostun hamısı bir yerə cəm oldu. Onların üzündə tamamilə başqa-başqa hisslərin ifadəsi vardı: Portosun üzü sakitlik, d'Artanyanınkı ümid, Aramisinkı həyəcan, Atosunku da qayğısızlıq ifadə edirdi.

Portos elə o saat dostlarına bildirdi ki, bir mötəbər qadın çox həvəslə ona düşdüyü çətinlikdən qurtarmağı öhdəsinə götürdü. Bu vaxt Muşketon içəri girdi; o, Portosu çağırmağa gəlmişdi; şikayətli bir səslə dedi ki, sizin mütləq evə getməyiniz lazımdır.

Portos soruşdu:

Olmaya mənim yaraq-yasağım haqqındadır.

Muşketon dedı:

– Həm hə, həm də yox.

Sən daha müəyyən bir söz deyə bilməzsənmi?

Yox, cənab. Buyurun evə.

Portos qalxdı, dostları ilə vidalaşıb Muşketonun dalınca yola düzəldi.

Bir dəqiqə keçməmış Bazen astanada göründü.

Aramıs yumşaq səslə soruşdu:

– Əzizim, nıyə gəlmisən?

Bazen cavab verdı:

– Cənab, sizi evdə bır adam gözləyir.

– Adam? Necə adam?

Dilənçidir.

– Bazen, gedın ona sədəqə verin, deyın kı, mənə dua eləsin.

Bu dilənçi hər necə olursa-olsun, sizınlə danışmaq istəyir; özü də deyir ki, o məni görməkdən çox razı qalacaq: Sonra bunu da əlavə



etdi: "Əgər cənab Aramis tərəddüd eləsə, deyin ki, mən Turdan gəlmişəm".

Aramis çığıraraq dedi:

Turdan gəlib? Ağalar, sizdən çox-çox üzr istəyirəm, heç şübhəsiz ki, bu adam mənə bir xəbər gətirmişdir, – mən bunu gözləyirdim.

Bu sözü deyib cəld qalxdı, otaqdan çıxdı. Otaqda Atosla d'Artanyan qaldı.

Atos:

Deyəsən, bunlar öz işlərini düzəltmişlər, dedı. D'Artanyan, sız bu barədə nə fikirdəsiniz?

D'Artanyan:

– Mən bilirəm ki, Portosun ışı çox yaxşıdır, dedi. O ki qaldı Aramis, düzü, mən onun barəsində heç vaxt ciddı narahat olmamışam. Bəs siz, mənim əzız Atosum?

– Məndən heç danışmağına dəyməz. Yaxşısı budur ki, özünüzdən danışın. Cənab de Trevil dünən iltifat buyurub mənim yanıma gəlmışdı; deyirdi ki, sız kardınalın himayəsi altında olan bəzi şübhəli ıngilislərlə durub-oturursunuz.

Mən bır ıngilis xanımın yanına gedib-gəlirəm. Bu barədə mən, gərək ki, sizə söhbət eləmişəm...

Hə, hə, o sarışın qadın haqqındamı? Sizə məsləhət də vermişdim, siz ki, əlbəttə, buna əməl etmədiniz!

Siz axı bilirsiniz mən onun yanına niyə gedirəm.

– Bəli, gərək ki, siz mənə demişdiniz ki, bu yolla yaraq-yasaq əldə etmək ümidindəsiniz.

Qətiyyən yox. Mənə aydın oldu ki, o qadın xanım Bonasyenin oğurlanmasında iştirak etmişdir.

– Bəli, başa düşürəm! İtirdiyiniz bir qadını tapmaq üçün siz başqa bir qadınla yaxınlıq edirsiniz. Bu, məqsədə doğru ən uzaq, lakin ən maraqlı bir yoldur.

D'Artanyan dostunun sözlərinə etiraz etmədi. O, Atosun namus məsələsində necə vasvası olduğunu bilirdi, buna görə də öz planlarını ona söyləməyi artıq hesab etdi.

İndi biz bu iki dostu burada qoyaq, görək Aramisin başına nə gəldi.

Aramis cəld otaqdan çıxıb yüyürə yüyürə Vojırar küçəsinə getdi.

Evə gəlib burada, doğrudan da, cır cındır geyimli, ortaboylu bir adam gördü, üzdən ağıllı adama oxşayırdı.

Muşketyor ona müraciət edərək dedi:

Siz məni görməkmi istəyirdiniz?

Mən cənab Aramisi görmək istəyirdim. Sizin adınız Aramisdir?

Bəli. Siz gərək ki, mənə nə isə verməlisiniz, eləmi?

– Elədir. Əgər sız mənə – sizə məlum olan çəkili yaylığı göstərsəniz...

Aramis:

Bu saat göstərim, deyərək qoltuq cibindən balaca, qızılı bir açar çıxartdı, qarağacdan qayırılmış, üzü sədəflə bəzədilmiş xırdaca bir mücrünün ağzını açdı, yaylığı çıxarıb göstərdi: – Baxın!

Dilənçi:

Yaxşı, - dedi. –Xidmətçinizə deyin getsin.

Bazen otaqdan çıxdı. Dilənçi, onların söhbətinə heç kəsin qulaq asmayacağını yəqin etdikdən sonra gön qurşaqla çəkilib bağlanmış cındır paltarını qaldırdı, kamzolunun yuxarı hıssəsini söküb bır məktub çıxartdı.

Aramıs məktubun üstündəki möhürü görüb sevıncindən çığırdı, kağızın üstündəki yazını öpüb məktubu açdı.

*"Dostum, tale istəyır ki, biz bir müddət bir birimizdən ayrı olaq; lakın gəncliyin gözəl günləri tamamılə əldən çıxmamışdır. Müharibədə öz vəzifənizi yerinə yetirin, mən də başqa bir yerdə vəzifəmi yerinə yetirirəm. Bu məktubu gətirən adam sizə nə versə, alarsınız Müharibədə özünüzü gözəl və alicənab bir əsılzadə kimi göstərin və məni düşünün. Sizın qara gözlərinizi həsrətlə öpürəm.·*

*Əlvıda, daha doğrusu, xudahafiz!"*

Aramis məktubu oxuduqca dilənçi də kamzolunun döşünü sökürdü. O bir-birinin ardınca yüz əlli İspaniya pistolu çıxarıb mizin üstünə qoydu. Sonra qapını açdı, baş əyərək otaqdan çıxdı; Aramis tamamilə özünü itirmişdi; o macal tapıb dilənçiyə bir kəlmə də söz deyə bilmədi. Məktubu bir də oxudu: məktubun ayağında əlavə bir cümlə vardı:

*"P.S. Siz bu məktubu gətirəni qəbul edə bilərsiniz: bu adam qrafdır və İspaniya əsilzadəsidir".*

Aramis bərkdən dedi:

Ey gözəl xəyallar! Gözəl həyat! Bəli, biz gəncik! Bizim hələ xoşbəxt günlərimiz irəlidədir! Mənim sevgim də, həyatım da, hər şeyim, hər şeyim sənindir, ey mənim gözəl sevgilim!

O, məktubu ehtiramla öpdü, – miz üstündə parıldayan qızıllara heç baxmadı da.



Bazen qapını döydü. Daha elə bir səbəb yox idi ki, Aramis onu ıçəri buraxmasın.

Bazen miz üstündəki qızılları görəndə heyrətdən donub qaldı, d'Artanyanın gəldiyini söyləməyi də unutdu. – O, bunu demək üçün içəri girmişdi.

D'Artanyan Bazendən xəbər çıxmadığını görüb özü içəri girdi. Qızıllara baxaraq təəccüblə dedi:

– Ah, lənət şeytana, əzizim Aramis! Əgər bu gavalıları sizə Turdan göndəriblərsə, bu gavalıları yetirən bağbanı mənim adımdan təbrik edə bilərsiniz.

Aramis qızılın kım tərəfindən göndərildiyini gizlətmək istəyirdi:

– Əzizim, siz səhv edirsiniz! Bunu mənə kitab satanım çoxdan başladığım poemam üçün göndərmişdir.

D'Artanyan:

Eləmi? Daha yaxşı! – dedi. Mənim əzizim Aramıs, sızın kitab satan, görünür, çox əlıaçıq adamdır, – bu barədə mən ancaq bunu deyə bilərəm.

Bazen çığıraraq dedi:

– Ağa, necə? Poemaya belə çox verirlər? Bu mümkün olan şeymi? Ah, cənab Aramis, siz hər nə istəsəniz edə bilərsiniz! Sız məşhur bir adam olacaqsınız! Bu, mənim çox xoşuma gəlir. Şair elə abbat kimi bir şeydir. Ah, cənab Aramıs, sız allah şair olun!

Aramis:

– Bazen, əzizim, mənə elə gəlir kı, siz başqasının işinə qarışırsınız, dedi.

Bazen yaxşı hərəkət etmədiyını anladı, başını sallayaraq otaqdan çıxdı.

D'Artanyan gülümsəyərək sözünə davam etdi:

Siz öz əsərlərinizi yalnız qızılamı satırsınız? Dostum, siz çox xoşbəxt adamsınız. Ancaq ehtiyatlı olun, aldığınız məktubu itirməyin, heç şübhəsiz, bunu da kıtab satan göndərmişdir. Məktub cibinizdən sallanıb durur.

Aramıs qıpqırmızı qızardı. Məktubu cibinə basıb kamzolunun yaxasını düymələdı.

Əzizim d'Artanyan, əgər istəyirsinizsə, dostlarımızın yanına gedək. İndi mən dövlətliyəm. Bu gündən biz yenə də bir yerdə nahar eləməyə başlarıq

Düzünü axtarsan, mən buna lap ürəkdən razıyam. Bu axşam mən çox çətin bir işə girişəcəyəm; buna görə də bir neçə şüşə köhnə Burqund şərabı ilə canımı qızdırsam heç də pis olmaz.

Köhnə Burqund şərabına da razıyam. Mənim də ondan xoşum gəlir.

Aramis qızıldan üçünü-dördünü cibinə, qalanını da qarağacdan qayırılmış sədəfli mücrüyə qoyub ağzını bağladı; tilsım əvəzində olan yaylıq da bu mücrüdə idi.

Onlar hər şeydən əvvəl Atosun yanına getdilər. Atos and içdiyindən yenə də evdən bayıra çıxmırdı, buna görə də o tapşırıq verdi ki, yeməyi evə gətirsinlər.

Yemək-içmək məsələsində o, çox pərgardı. Bunun üçün də nə d'Artanyan, nə də Aramis etiraz etməyib bu nazik məsələni onun öhdəsinə buraxdılar.

Oradan Portosun yanına getdilər. Bak küçəsinin tinində Muşketona rast gəldilər. Muşketon qaşqabağını tökərək, qabağına bir qatırla bir at salıb qova qova aparırdı. D'Artanyan bunu görüb heyrətlə bərkdən dedi:

– Adə, bu mənim kürən atımdır ki! Aramis, bir o ata bax!

Aramis dedi:

Nə pis yabıdır!

Əzizim, bu həmin atdır ki, mən bunun belində Parisə gəlmişəm.

Muşketon soruşdu:

Necə? Cənabınız bu atı tanıyır?

Aramis dedi:

– Bunun da çox qəribə rəngi var. Mən ömrümdə belə at görməmişəm.

Doğru deyirsiniz. Buna görə də mən onu üç ekuyə satdım. Əlbət ki, bu pulu da ona fövqəladə bir rəngi olduğuna görə verdilər. Muşketon, bu at haradan sənin əlinə keçib?

Muşketon:

- Bunu heç soruşmayın, ağa! - dedi. Bizim hersoginyanın əri bu oyunu bizim başımıza açıb.

– Muşketon, necə axı?

– Məsələ belədir. Nəcib bir hersoginya var, o bizə çox gözəl əlaqə bəsləyir... Bağışlayın, ağa, cənab Portos mənə təvazökar olmağı, bu qadının adını söyləməməyi əmr etmişdir. Bu qadın bizi məcbur elədi ki, ondan kiçik bir bəxşiş qəbul edək: bu da bir İspaniya kəhərilə, bir də Əndəlis qatırı idi; bunlar da o qədər gözəldi ki, adamın baxmağa



həvəsi gəlirdi. Əri bundan xəbər tutdu, yoldaca bu iki gözəl heyvanı tutub əlimdən aldı, əvəzində də bu iki kötrüm düşmüş zibili verdi.

D'Artanyan dedi:

- Sən də ki, bunları təzədən geri aparırsan?

Yaxşı bilmisiniz, ağa. Siz özünüz başa düşürsünüz ki, bizə vəd edilən atla qatırın əvəzində bu zibilləri qəbul edə bilmərik.

– Əlbət ki, məlum şeydir! Amma mən Portosu bu kürən atımın belində görmək istərdim! Bu mənə aydınca göstərərdi ki, Parisə gələndə mən necə imişəm. Muşketon, biz səni ləngitməyək. Get, öz ağanın əmrini yerinə yetir. O, evdədirmi?

Muşketon:

Bəli, ağa, evdədir, – dedi. Ancaq ovqatı yaman təlxdır.

Muşketon bunu deyib Böyük Avqustinlərin sahil küçəsinə sarı yollandıqda d'Artanyanla Aramis onun ağasının yanına getdi. Evə çatıb qapının zəngini xeyli basdılar. Portos onları həyətdən keçərkən görmüşdü, ancaq qapını açmaq istəmirdi.

Bu zaman Muşketon yeni körpünü keçib Ayı küçəsinə çatmışdı Prokurorun evinə yaxınlaşdı, ağasının əmrini yerinə yetirərək atla qatırı qapı döyəcinə bağladı: onların başına bir iş gələ biləcəyilə maraqlanmayaraq geriyə qayıtdı, tapşırığın yerinə yetirildiyini Portosa söylədi.

Səhərdən bəri heç bir şey yeməyən bu iki bədbəxt heyvan bir az sonra bərk səs-küy qaldırdı. Prokuror kiçik yaşlı mirzəsini göndərdi ki, bu heyvanların kimə məxsus olduğunu qonşudan öyrənsin.

Xanım Koknar baxan kimi bəxşiş göndərdiyi heyvanları tanıdı. Əvvəl o, heyvanların geri qaytarılmasının səbəbini başa düşmədi. Lakin bir az sonra Portos gəlib məsələni ona söylədi. Muşketyorun gözlərində parlayan hiddət onun həssas sevgilisini yamanca qorxutdu. Məsələ burasındadır ki, Muşketon evə gedəndə d'Artanyanla Aramisə rast gəldiyini, d'Artanyanın yabını tanıdığını, onun bu yabıda Parisə varid olduğunu öz ağasına söyləmişdi.

Portos prokurorun arvadı ilə müqəddəs Maqluar monastırında görüş təyin etdi. Gedərkən prokuror onu bir yerdə nahar eləməyə dəvət etdi, lakin muşketyor, izzət-nəfsi təhqir olunmuş bir adam kimi, onun təklifini rədd etdi.

Xanım Koknar qorxudan əsə-əsə müqəddəs Maqluar monastırına getdi.

İzzət-nəfsı təhqır olunmuş bir kışi nə qədər töhmət və lənət yağdıra bilərdısə, Portos bunun hamısını prokuror arvadının cəmdəyinə döşədi. O da mütı halda başını aşağı salaraq durmuşdu.

Nəhayət, xanım Koknar dedi:

– Əfsus! Mən belə eləmək istəmirdim. Bizim müştərilərdən birisi at alveri eləyir. O, bizə borclu idi, borcunu da vermək istəmirdi. Mən də o atla qatırı ondan borc əvəzinə aldım. Lakın o mənə krala layiq olan atlar verəcəyini vəd etmişdi.

Portos:

– Xanım, – dedi, – əgər o sizə beş eküdən artıq borclu imişsə, demək, o adam haramzadanın biri imiş.

Prokurorun arvadı özünü təmizə çıxarmaq üçün:

– Cənab Portos, – dedi, – axtarıb şeyin ucuzunu almaq, gərək ki, heç kəsə qadağan edilməmişdir.

– Ancaq, xanım, o adamlar ki, şeyin ucuzunu axtarır, onlar başqasına da əliaçıq dost axtarıb tapmasına icazə verməlidir.

Portos dalını qadına çevirib getmək istədi. Prokurorun arvadı onu qolundan tutub saxladı və dərdli bir ürəklə bərkdən dedi:

– Cənab Portos, məgər mənim atdan başım çıxır? Məgər mən yəhər-yüyən deyilən şeyin nə olduğunu bilirəm?

– Onda, xanım, mənə müraciət eləmək lazımdı. Amma siz qənaət eləmək fikrinə düşüb sələmçiyə müraciət etmisiniz.

– Cənab Portos, mən səhv eləmişəm, sizə söz verirəm ki, mən bu səhvimi düzəldərəm.

– Necə düzəldərsiniz?

– Qulaq asın. Bu axşam cənab Koknar hersoq de Şonun yanına gedəcək, – de Şon dalınca adam göndərmişdi. O, azı iki saat evdə olmayacaq. Gəlin, biz ancaq ikimiz olacağıq, məsələni yoluna qoyarıq.

– Allaha şükür! Deyəsən axırda iş düzələsi olur. Bax, əzizim, məsələni belə həll edərlər!

– İndi məni əfv edirsinizmi?

Portos özünü tox tutaraq dedi:

– Baxarıq.

Onlar bir-birinə "xudahafiz, axşam görüşərik" – deyərək ayrıldılar.

Portos gedə-gedə düşündü: "Lənət şeytana, deyəsən axı cənab Koknarın dəfinəsi axırda mənim əlimə keçəcək!"



## V

## GECƏ QARA – CÜCƏ QARA

D'Artanyanla Portos axşamın olmasını səbirsizliklə gözləyirdilər.

Nəhayət, axşam oldu. D'Artanyan adəti üzrə saat doqquzda miledinin yanına gəldi.

Miledinin kefi kök idi. O, hələ bu vaxta qədər d'Artanyanı belə yaxşı qəbul etməmişdi. Qaskonıyalı bundan başa düşdü ki, yazdığı kağız ona çatmış və yaxşı da təsir etmişdi. Kettı şərbət gətirdi. Miledi ona mehribanca baxıb gülümsədi. Lakin yazıq qız o qədər kədərli idi ki, miledinin ona qarşı göstərdiyi bu iltifatı sezmədi. D'Artanyan öz fikrində bu qadınları bir-birilə müqayisə eləyib belə bir nəticəyə gəldi: təbiət bu əsilzadə xanıma alçaq və satqın bir qəlb, qulluqçu qıza isə nəcib hersoginya xasiyyəti verməkdə yanılmışdır.

Saat onda miledi narahat olmağa başladı. D'Artanyan o saat bunun səbəbini başa düşdü. Miledi saata baxır, tez-tez durub-oturur, d'Artanyana baxıb gülümsəyir, eyni zamanda gözlərilə deyirdi: "Siz çox əziz qonaqsınız, lakin durub getsəniz, daha da əziz olarsınız!"

D'Artanyan qalxıb şlyapasını götürdü. Miledi əlini öpməyə ona icazə verdi. D'Artanyan eyni zamanda əlinin sıxıldığını da hiss elədi. Miledi onun əlini işvə satdığından deyil, təşəkkür etdiyindən sıxırdı; çünki d'Artanyan getməyə hazırlaşırdı.

D'Artanyan pıçıldayaraq öz-özünə dedi: "Bu qadın ona... yaman vurulub".

Bu dəfə Ketti d'Artanyanı heç yerdə qarşılamadı: nə dəhlizdə, nə koridorda, nə də darvaza qabağında.

D'Artanyan pilləkəni və Kettinin otağını özü axtarıb tapdı.

Ketti əllərilə üzünü örtərək oturub ağlayırdı.

Yazıq qız d'Artanyanın əlinin toxunmasını hiss edərək başını qaldırdı. Qızın üzü o qədər dəyişmişdi ki, d'Artanyan ona baxıb dik sindi. Ketti qüssədən əlini ovur, ancaq söz deməyə cürət eləmirdi. D'Artanyan o qədər də yumşaq qəlbli bir adam deyildi; lakin qızın bu halı ona da təsir etdi. O, Kettini inandırmağa çalışdı ki, o, bunu ancaq qisas almaq üçün edir.

D'Artanyan bir neçə dəqiqədən sonra miledinin öz otağına gəldiyini eşitdi.

Dərhal şkafa girib gizləndi. Şkafın qapısını təzəcə örtmüşdü ki, zəng səsləndi. Ketti öz xanımının yanına getdi. Otaqların arasındakı divar o qədər nazikdi ki, o üzdə gedən danışığın hamısını eşitmək olurdu.

Miledi bərk sevinirdi. O, Kettini məcbur elədi ki, de Vardla olan görüşünü bir neçə dəfə bütün təfərrüatı ilə təkrar etsin. Sualların da arasını kəsmirdi. "O, nə dedi?", "Üzünün ifadəsi necə idi?", "Onun çox bərk vurulduğu hiss olunurdumu?" Yazıq qız bütün suallara qırıq bir səslə cavab verirdi. Lakin miledi onun səsindəki kədəri duymurdu, xoşbəxtliyin belə xudbinliyi də var! Nəhayət, qrafla görüşmək vaxtı yaxınlaşırdı. Miledi Kettiyə tapşırdı ki, gedib bütün otaqlarda olan şamları söndürərsən; qraf de Vard gələn kimi onu mənim otağıma gətirərsən. Şamların söndürülməsi d'Artanyanın işini yüngülləşdirirdi.

Ketti çox gözləmədi. D'Artanyan şkafın qapısı arasından hər yerin qaranlığa büründüyünü görüb bayıra çıxdı, bu zaman Ketti ara qapını örtürdü.

Miledi bu biri otaqdakı səsi eşidib soruşdu:

– Bu nə səsdır?

D'Artanyan pıçıldayaraq dedi:

Mənəm. Qraf de Vardam.

Ketti də pıçıldadı:

– Allah, Allah! Bu, heç təyin edilən vaxtı da gözləmədi.

Miledi titrək səslə dedi:

Bəs o, niyə gəlmir? Qraf, qraf, mən sizi gözləyirəm.

D'Artanyan Kettini üsulluca qırağa çəkib miledinin otağına girdi.

Miledi onun əllərini öz əlləri içinə alıb nəzakətlə sıxır və mehribancasına deyirdi:

Qraf, sizin sevginizlə mən xoşbəxtəm. Mən də sizi sevirəm. Bu gecənin bir yadigarı olaraq bunu alın...

Bunu deyib barmağındakı üzüyü çıxardıb d'Artanyana verdi.

D'Artanyan üzüyü miledinin barmağında görmüşdü: bu, brilyanta çevrələnmiş, yaqut qaşlı gözəl bir üzük idi

D'Artanyan üzüyü ona qaytarmaq istədi. Lakin miledi həyəcanlı səslə dedi.

Yox, yox, məni sevdiyiniz üçün qəbul edin. Bunu qəbul etməklə siz mənə düşündüyünüzdən daha artıq iltifat göstərmiş olarsınız.

D'Artanyan öz-özünə düşündü: "Bu qadın nə qədər əsrarəngiz bir qadındır!"



Bu anda o bütün məsələni açıb ona söyləmək istədi. Lakin miledi birdən dedi:

Yazıq! Qaskoniyalı yırtıcı az qala sizi öldürəcəkdi.

"Qaskoniyalı yırtıcı" d'Artanyan özü idi.

Miledi sözünə davam etdi:

Yaralarınız yenə də sizə əziyyət verirmi?

D'Artanyan buna nə cavab verə bilərdi?

- Bəli, çox əziyyət verir, dedi.

Miledi pıçıldayaraq:

Mən sizin qisasınızı ondan alaram, dedi, - çox da amansızcasına alaram.

D'Artanyan düşündü: "Lənət şeytana! Bunu aldatdığımı hələ açıb demək olmaz. Tezdir!" Bu qadının onun üzərində təsəvvür edilməz bir təsiri vardı. D'Artanyan ona həm nifrət edir, həm də onu istəyirdi O, öz qisasını tamam unutmuşdu.

Getmək vaxtı idi. Lakin d'Artanyan heç də getmək istəmirdi. İkinci görüş gələn həftəyə təyin edildi.

Yazıq Ketti ümid edirdi ki, d'Artanyan onun otağından keçərkən, heç olmazsa, ona bir neçə söz deyə bilər. Ancaq bu da mümkün olmadı: miledi özü d'Artanyanı pilləkənə kimi ötürdü.

Ertəsi gün d'Artanyan tələsə tələsə Atosun yanına gedib əhvalatı ona nağıl elədi. Atos qaşlarını çataraq dedi:

Mənə elə gəlir ki, sizin miledi alçaq bir qadındır Siz onu nahaq aldadırsınız: bununla siz özünüzə ən qəddar bir düşmən qazanmış oldunuz.

Söhbət arasında Atos d'Artanyanın barmağındakı kraliça üzüyünü əvəz edən yaqut qaşlı üzüyə çox diqqətlə baxırdı.

Qaskoniyalı belə qiymətli bir hədiyyə ilə lovğalanaraq dedi:

Siz, deyəsən, üzüyə baxırsınız?

Atos:

– Bəli, üzüyə baxıram, dedi. Bu üzük mənə bir ailə üzüyünü xatırladır...

Doğrudan da, çox gözəl üzükdür. Elə deyilmi?

Elədir. Demək siz bunu brilyant üzüklə dəyişmisiniz?

D'Artanyan:

– Yox, – dedi. – Bunu mənə mənim o gözəl ingilis xanımım, ya o gözəl fransız xanımım bağışlayıb. O, ingilismi, fransızmı, – bilmirəm,

çünki bunu ondan heç soruşmamışam, ancaq inanıram ki, o, Fransada anadan olmuşdur.

Atos həyəcanla soruşdu:

– Bu üzüyü sizə miledi verib?

– Bəli, miledi verib, özü də bu gecə.

Atos üzüyü alıb baxarkən rəngi ağappaq ağardı. Üzüyü sol əlinin adsız barmağına taxıb yoxladı.

D'Artanyan soruşdu:

– Üzük, deyəsən, sizə tanış gəlir?

Atos:

– Mənə elə gəlir ki, haradasa mən bu üzüyü görmüşəm. Amma mən, heç şübhəsiz, yanılmışam, dedi.

Üzüyü d'Artanyana qaytardı. Az sonra dedi:

– D'Artanyan, sizdən xahiş edirəm, o üzüyü ya barmağınızdan çıxarın, ya da çevirin, qaşı görünməsin O, mənə elə dəhşətli şeylər xatırladır ki, mən sizinlə heç danışa bilmirəm. Siz mənim yanıma məsləhətəmi gəlmisiniz? Çətin bir vəziyyətəmi düşübsünüz? Bir dayanın... O üzüyü bir də mənə verin. O üzük ki, mən deyirəm, onun gərək bir tərəfi balaca cızılmış olsun...

D'Artanyan yenə də üzüyü çıxarıb Atosa verdi. Atos üzüyə baxıb diskindi.

– Bir baxın! Doğrudan da, bu çox qəribədir, – üzüyün üstündəki balaca cızığı d'Artanyana göstərdi.

– Atos, bəs bu üzük haradan sizin əlinizə keçmişdi?

– Anamdan qalmışdı. Bu üzük bizim ailəyə məxsus olan çox qiymətli bir şeydi.

D'Artanyan çəkinə-çəkinə soruşdu:

– Siz də onu satdınız?

Atos sirli halda gülümsəyərək dedi:

– Yox, necə ki, onu sizə bağışlayıblar, elə də mən bir gecə onu birisinə bağışladım...

D'Artanyan fikrə getdi. Üzüyü Atosdan alıb cibinə qoydu.

Atos onun əlindən yapışıb dedi:

– Qulaq asın, d'Artanyan. Siz bilirsiniz ki, mən sizi nə qədər sevirəm! Mənim oğlum olmuş olsaydı, mən onu sizdən artıq sevə bilməzdim. Gəlin siz bu qadından əl çəkin. Mən onu tanımıram, ancaq inanın mənə, o, yaxşı adam deyil.



- Siz haqlısınız. Mən onu ataram. O, mənim özümü də qorxudur. Buna sizin mətanətiniz yetərmi?

D'Artanyan:

– Yetər, dedi. Mən bunu lap bu saat da edə bilərəm.

Atos qaskoniyalının əlini sıxaraq dedi:

– Onda, əzizim, siz doğru hərəkət etmiş olarsınız. Allah eləsin ki, bu qadınla olan görüşdən sizə bir zərər toxunmasın.

Atos d'Artanyana baş əydi; bununla o, tək qalmaq, təklikdə düşünmək arzusun ifadə edirdi. D'Artanyan bunu başa düşdü.

Evinə qayıtdı. Ketti onu gözləyirdi. Yazıq qız yuxusuz və iztirab içində keçən bir gecədə o qədər dəyişmişdi ki, bir ay qızdırmadan yatsaydı, bəlkə heç bu qədər dəyişməzdi.

Miledi guya onu Vadın yanına göndərmişdi. Miledi sonsuz bir sevinc içindəydi. O, qraf de Vardın gələn həftə hansı gün gələcəyini bilmək istəyirmiş.

Yazıq Ketti d'Artanyandan cavab gözləyirdi.

Atosun bu cavan adam üzərində çox böyük nüfuzu vardı. Onun məsləhəti qaskoniyalıya yaxşı təsir etmişdi. O, miledi ilə bir daha görüşməyəcəyini qət etdi. Artıq onun həm izzət-nəfsi xilas edilmiş, həm də arzusu yerinə yetirilmişdi. O cavab vermədən lələk qələmi götürüb yazdı:

*"Xanım, bu yaxın günlərdə mənimlə görüşməyinizə ümid etməyin. Yaram sağalandan bəri mənim o qədər belə işlərim var ki, mən gərək bunları bir az da olsa nizama salım. Sizin növbəniz çatanda mən bu barədə sizə məlumat verəcəyəm.*

*Əllərinizi öpürəm.*

*Qraf de Vard"*

Üzük haqqında bir kəlmə də söz yazmadı. Qaskoniyalı bunu, lazım gələndə miledinin əleyhinə bir silah kimi işlətmək üçünmü saxlayırdı, ya açığını deyək, bəlkə satmaq, əldə etdiyi pulla özünə yaraq-yasaq almaq istəyirdi... Bunu indidən təyin etmək çətindi.

D'Artanyan məktubu Kettiyə verdi. Ketti kağızı oxudu; əvvəl heç bir şey başa düşmədi. İkinci dəfə də oxudu, - sevindiyindən az qaldı ki, dəli olsun.

Elə o saat də gücü yetdikcə Kral meydanına sarı yüyürməyə başladı.

Ən yaxşı qadının da qəlbi öz rəqibinin iztirablarına qarşı mərhəmət duymaz.

Miledi tələsik məktubu açdı. Kağızı oxuyan kimi rəngi göyərdi; məktubu əlində əzişdirib Kettidən hirsli soruşdu:

Bu nə məktubdur?

Ketti:

Bu, sizin məktubunuza cavabdır, dedi. Onun bütün bədəni titrəyirdi.

Miledi çığıraraq:

Ola bilməz! dedi. Centlmen, qadına belə kağız yazmaz!

Birdən o, titrəyərək yavaşca dedi:

Allah! Bəlkə o bilib... Sözünü tamamladı.

Dişlərini bir-birinə qıcayaraq xırçıldatdı, rəngi ölü rəngi kimi ağardı. Pəncərəyə yaxınlaşmaq istədi. Lakin qıçları bükülü kresloya yıxıldı.

Ketti, "özünü pis hiss eləyir" deyərək xanımına sarı yüyürdü ki, korsajının duymələrini açsın. Lakin miledi cəld ayağa qalxdı:

Siz məndən nə istəyirsiniz? Siz necə cəsarət edib mənə toxunursunuz?

Qulluqçu qız qorxmuş halda dedi:

– Xanım, elə bildim ki, siz özünüzü pis hiss edirsiniz. Sizə kömək eləmək istəyirdim...

Mən özümü pis hiss edirəm? Siz yoxsa elə bilirsiniz ki, mən zəif əsəbli bir qadınam? Təhqir olunanda mən özümdən getmirəm, bu təhqirin qisasını alıram. Eşidirsinizmi?

Bunu deyib Kettiyə getmək əmrini verdi.

## VI

## QİSAS ALMAQ XƏYALLARI

Axşam miledi Kettiyə dedi ki, d'Artanyan gələn kimi onu mənim yanıma gətirərsən. Lakin d'Artanyan gəlmədi.

Ketti ertəsi gün d'Artanyanın evinə gedib əhvalatı ona söylədi. D'Artanyan gülümsədi. O, öz qisasını almışdı, miledinin hiddətlənməsi bunu aydınca göstərirdi.

Axşam miledi daha artıq bir səbirsizliklə d'Artanyanı gözləməyə başladı. Yenə də Kettiyə tapşırdı ki, d'Artanyan gələn kimi onu mənim yanına gətirərsən. Miledi ta gecəyə kimi gözlədi, lakin o gəlmədi.



Ertəsi gün Ketti yenə də d'Artanyanın evinə getdi. Yazıq qız bu dəfə çox kədərli görünürdü. D'Artanyan bunun səbəbini soruşdu. Ketti cavab vermək əvəzinə cibindən bir kağız çıxarıb d'Artanyana verdi.

Məktub miledinin öz əli ilə yazılmışdı. Bu dəfə məktub qraf de Varda yox, d'Artanyanın özünə göndərilmişdi. Cavan oğlan məktubu açıb oxudu:

*"Hörmətli cənab d'Artanyan! Adam da öz dostlarını yaddan çıxararmı: – bu heç yaxşı iş deyil; xüsusilə elə bir vaxtda ki, bizi uzun bir ayrılıq gözləyir. Lord Vinter və mən dünən axşam da, srağagün axşam da sizi çox gözlədik, lakin siz gəlmədiniz. Yoxsa, bu, bu gün də təkrar ediləcək?*

*Sizə minnətdar olan ledi Klarik."*

D'Artanyan:

– İndi məsələ aydındır, – dedi. – Mən bu məktubu gözləyirdim. Qrafın qiyməti endikcə, mənim qiymətim qalxır.

Ketti soruşdu:

Gedəcəksinizmi?

Qaskoniyalı:

– Qulaq as, əzizim, – dedi. – Sən özün başa düşürsən ki, belə gözəl dəvəti rədd etmək ağılsızlıq olardı. Miledi mənim getməməyimin səbəbini anlamayacaq. Lakin getməsəm, o şübhələnə bilər. Sonra da bunun qisasını alar; belə bir qadının da qisası çox dəhşətli ola bilər!

Ketti dedi:

– Aman Allah! Siz hər şeyi çox qəribə izah edirsiniz, elə çıxır ki, siz həmişə haqlısınız. Yəqin siz yenə də onun başına dolanacaqsınız. . Əgər siz onun xoşuna gəlsəniz, bu, mənim üçün daha pisdir

Yazıq qız nələr olacağını az da olsa hiss edirdi.

D'Artanyan bacardığı qədər bu fikri onun başından çıxartmağa çalışdı, eyni zamanda miledinin ehtiraslarına qarşı laqeyd qalacağını da vəd etdi.

Sonra o, Kettiyə belə bir tapşırıq verdi: miledıyə deyərsən ki, bu iltifata qarşı təşəkkürlər edirəm və bu gün onun hüzurunda hazıram.

Kağız yazıb verməyə ehtiyat etdi. Xəttini lazımınca dəyişə bilməyəcəyindən qorxdu

D'Artanyan düz saat doqquzda Kral meydanına getdi. Görünür, dəhlizdə növbə çəkən qulluqçular onun gələcəyini bilirdilər: d'Artanyan qapıdan içəri girmiş, hətta miledinin qəbul edib-etmədiyini soruşmamış xidmətçilərdən biri yüyürə-yüyürə miledıyə xəbərə getdi.

Miledi səsi tutula-tutula elə bərkdən.
– Buyursun! – dedi ki, d'Artanyan onun səsini dəhlizdə eşitdi.
Xidmətçilər qaskoniyalını salona apardılar.
Miledi onlara dedi:
Kim gəlsə, mən daha evdə yoxam! Eşidirsinizmi? Kim gəlsə!
Xidmətçilər getdilər.
D'Artanyan maraqla malediyə baxdı. Onun rəngi solmuşdu, gözləri də qızarmışdı: yəqin ki, ya ağlamış, ya da gecə yatmamışdı. Otağa zəif bir işıq çökmüşdü. Gənc qadın həyəcandan titrədiyini gizlədə bilmədi, bu, onu son günlərdə üzürdü.
D'Artanyan, adəti üzrə, onunla çox nəzakətlə sözə başladı. Miledi özünü son dərəcə zorlayaraq məftunedici bir təbəssümlə gülümsədi; lakin bu gülüş onun üzündəki iztirab dolu ifadəni dəyişə bilmədi.
D'Artanyan ondan özünü necə hiss etdiyini soruşdu.
Miledi:
Özümü yaxşı hiss eləmirəm, dedi.
– Siz mütləq dincəlməlisiniz. Mən də, yaxşı olar ki, gedim.
Miledi:
– Yox, yox, dedi, getməyin, cənab d'Artanyan, getməyin! Sizin burada olmanız mənə xoşdur.
D'Artanyan öz-özünə düşündü: "Çox qəribədir! O, hələ bu vaxta qədər mənə qarşı belə nəzakətli olmamışdı. Demək burada bir iş var, ayıq olmaq lazımdır".
Miledi onunla çox mehribanca danışır, eyni zamanda, söylədiyi sözlərə cəzbedici bir məftunluq verməyə çalışırdı. Vücudunu bürüyən titrəyişdən yenə də gözləri parladı, yanaqları alışıb yandı, dodaqları qızardı. Öz gözəlliyi ilə d'Artanyanı məftun edən qadın yenə də onun gözləri önündə canlanıb durdu. D'Artanyanın sönmüş zənn etdiyi məhəbbət yenə də qəlbini ısitdi. Miledi gülümsədi, – d'Artanyan bütün həyatını bu gülüşə qurban etməyə hazırdı. O dedi:
Sizi görəndən bəri mən ancaq sizinlə nəfəs alıram, sizinlə yaşayıram.
Miledinin dodaqlarına qəribə bir gülüş qondu.
Siz məni sevirsinizmi?
Bunu heç demək lazımmı? Özünüz bunu duymursunuzmu?
Ancaq, bilirsinizmi, könül nə qədər məğrur olarsa, onu elə almaq da bir o qədər çətin olar.



Ah, çətinlik məni qorxutmur, məni ancaq bu xam xəyala düşdüyüm qorxudur.
Həqiqi sevgi üçün mümkün olmayan heç bir şey yoxdur.
– Heç bir şeymi?
– Bəli.
D'Artanyan öz-özünə düşündü: "Gör ha! Bütün ifadəsini dəyişdi. Olmaya bu şıltaq qadın məni sevmək fikrinə düşüb? Olmaya mənə də, Vard rolunu oynarkən bağışladığı yaqut qaşlı üzük kimi bir üzük bağışlamaq istəyir?"
D'Artanyan öz stulunu cəld miledinin kreslosu yanına çəkdi.
Miledi:
Lakin görək, dedi, siz öz sevginizi nə ilə isbat edə bilərsiniz?
– Nə ilə desəniz. Nə əmr etsəniz mən ona hazıram.
– Nə əmr etsəm?
D'Artanyan bərkdən dedi:
Bəli! O, qabaqcadan bilirdi ki, burada elə çətin bir şey olmayacaq.
Miledi öz kreslosunu d'Artanyana tərəf çəkərək:
- Dediyiniz doğru isə, onda danışaq... dedi.
Xanım, mən sizi dinləyirəm.
Miledi tərəddüd edirmiş kimi bir anlığa fikrə daldı. Sonra qət etmiş kimi dedi:
– Mənim bir düşmənim var.
D'Artanyan heç bir şey bilmirmiş kimi təəccüblə, həm də bərkdən soruşdu:
Sizin düşməniniz var? Aman Allah! Bu heç mümkün olan şeymi? Sizin kimi gözəl, mərhəmətli bir xanımın düşməni?
Düşmən məni çox amansızca təhqir etdiyindən aramızda ölüm-dirim müharibəsi gedir. Bu məsələdə sizin mənə köməkçi olacağınıza arxayın ola bilərəmmi?
D'Artanyan lovğa-lovğa dedi:
Arxayın ola bilərsiniz, xanım. Mənim qılıncım da qəlbim kimi sizin ixtiyarınızdadır.
Miledi:
Elə isə, dedi, – əgər siz məni sevdiyiniz qədər də mənə sədaqətlisinizsə...
O, sözünü tamamlamadı.

D'Artanyan soruşdu:
– Onda?
Miledi bir an susduqdan sonra:
– Onda, – dedi, – bu gündən etibarən sizin üçün mümkün olmayan heç bir şey yoxdur!
D'Artanyan dizləri üstə düşüb onun əllərini bir neçə dəfə öpdü.
Miledi dişlərini bir-birinə qıcayaraq düşündü: "Sarsağın biri sarsaq! Canlı qılınc! Sən bu alçaq Varddan mənim qisasımı al, sonra mən səni tez başımdan elərəm".
D'Artanyan eyni zamanda öz-özünə deyirdi: "Riyakar və xəbis qadın! Sən özünü könüllü olaraq mənim ixtiyarıma ver, onda mən, mənim əlimlə öldürmək istədiyin adamla birlikdə səni ələ salıb bir yaxşı güləcəm!"
D'Artanyan başını qaldırdı:
– Mən hazıram!
– Demək siz, sizə bu qədər şöhrət qazandıran qılıncınızı məndən ötrü işə salmağa razısınız?
– İstəyirsiniz lap bu saat!
Miledi:
– Göstərdiyiniz bu xidmətə qarşı mən sizə nə verə bilərəm? – dedi. – Bir birini sevən adamların könlü mənə məlumdur. Onlar bir birinə havayı yerə heç bir şey eləmirlər.
D'Artanyan:
– Siz bilirsiniz ki, bunun qarşısında mən ancaq bir şey istərdim... deyib miledini nəzakətlə özünə sarı çəkdi. Miledi müqavimət göstərmədi.
D'Artanyan ehtirasa tutularaq bərkdən dedi:
– Ah! Ah Mən öz xoşbəxtliyimə çox çətinliklə inanıram. Mən həmişə bir şeydən qorxuram, qorxuram ki, bu xoşbəxtlik bir xəyal kimi uçub əlimdən çıxa. Ona görə də tələsirəm, tələsirəm ki, buna mümkün qədər tez nail olum.
Miledi hələ də bu sözlərin doğru olub-olmadığına şübhələnərək soruşdu:
– Siz doğrumu deyirsiniz?
– Sizin o gözəl gözlərinizi yaşla dolduran o alçaq adamın adını mənə deyin...
– Kim sizə dedi ki, mən ağlamışam?
– Mənə elə gəldi...



– Mənim kimi qadınlar ağlamazlar.
– Bu, daha yaxşı. Bir deyin görüm, axı o kimdir?
– Siz onu tanıyırsınız.
– Tanıyıram.
– Bəli.
D'Artanyan:
– Yəqin ki, o mənim dostlarımdan deyil, – dedi.
Miledi ucadan dedi:
– Bu adam sizin dostlarınızdan biri olsa, onda siz tərəddüd edərdinizmi? – Onun gözlərində təhdid ildırım kimi parladı.
D'Artanyan da heyrətli bir coşqunluqla:
– Yox, – dedi, – qoy lap o mənim qardaşım olsun!
Bizim qaskoniyalı belə hərəkət etməklə özünü heç də təhlükəyə atmırdı, çünki o nə elədiyini bilirdi.
Miledi dedi:
– Sizin belə sədaqətli olmağınız mənə xoş gəlir.
– Əfsus! Mən elə bircə bu cəhətdənmi sizə xoş gəlirəm?
Miledi onun əlini sıxaraq:
– Mən sizi sevirəm, – dedi.
D'Artanyan, əlinin belə qızğın surətdə sıxılmasından titrədi:
– Əzizim, demək, siz məni sevirsiniz? Bu həqiqətmi? – deyərək onu qucaqladı, öpməyə başladı. Miledi onun öpüşlərini rədd etmədisə də, özü onu öpmədi.
Onun dodaqları soyuqdu. D'Artanyan elə bil bir qadın deyil, heykəl öpürdü. Bununla belə, xoşbəxtlikdən məst olmuşdu, o, sevgi odu ilə alışıb yanırdı; o az qalırdı ki, miledinin sevgisinə, de Vardın da cinayət işləməsinə inansın. Bu anda de Vard onun əlinə düşsəydi, onu yəqin ki, öldürərdi. Miledi d'Artanyanın belə bir əhvalı-ruhiyyə ilə yaşamasından istifadə edərək yenə sözə başladı:
– Onun adı...
D'Artanyan ucadan dedi:
– De Varddır. Mən bilirəm!
Miledi həyəcanla soruşdu:
– Siz bunu haradan bilirsiniz?
D'Artanyan özünü unudaraq səhv etdiyini anladı.
– Söyləyin, söyləyin... söyləyin də, – deyərək miledi təkrar edirdi. – Siz bunu haradan bilirsiniz?

Dünən bır qoonaqlıqda ona rast gəldim: mənə bir üzük göstərdi, dedı kı, bunu mənə miledi bağışlayıb.

Mıledi hirslənərək ucadan dedi:

Alçaq!

- Mən o yaramazdan sizin qisasınızı alaram!

Mıledı qışqıraraq:

Mənım igid dostum, sizə təşəkkür edirəm, dedi. - Siz nə vaxt mənim qisasımı alacaqsınız?

Sabah, istəyirsiniz lap ındi... nə vaxt istəsəniz onda!

Miledi ıstədi kı, desin: "Lap bu saat!", lakin bu cür tələsməyin d'Artanyana qarşı böyük bır hörmətsizlik olduğunu düşünərək özunü saxladı. Bundan başqa, d'Artanyana min cür tapşırıq və məsləhətlər verməli idi ki, şahıdlər yanında qrafla heç bir izahata-filana girişməsin.

D'Artanyan onun fikrini duymuş kimi:

Sabah, dedi, sabah mən ya öləcəyəm, ya sizin qisasınızı alacağam. Ancaq bır şey də var. Siz məni ölümə göndərirsınız. Heç düzgün olarmı kı, məni indidən mükafatlandırmayıb bunu sonraya qoyasınız, məni dadlı ümidlərlə yaşadasınız?

Miledi nezakətlə ona baxdı:

Siz tamamılə haqlısınız.

Cavan oğlan ucadan dedi:

Ah! Sız mələksiniz!

Miledi ondan soruşdu:

Demək, hər şey həll olundu?

– Ancaq mənim sizdən ıstədiyim şeydən başqa...

Dedim ki, sız mənım sevgimdən arxayın ola bilərsiniz.

– Kim bilır sabah mənim başıma nə gələcək. Mən necə gözləyə bilərəm?..

Susun! Qardaşımın addım səsini eşidirəm. O, sizi burada görməməlidir.

Zəng çaldı. Ketti gəldi.

Balaca, gizli qapını açaraq:

Bu qapıdan gedin, – dedi, saat on birdə yenə qayıdın ki, söhbətimizi qurtaraq. Ketti sizi mənim yanıma ötürər.

Yazıq qız miledının son sözlərini eşidırkən az qaldı ki, özündən getsin.

Miledi Kettiyə.



– Niyə siz belə heykəl kimi dayanıb durmusunuz? – dedi. Cənab d'Artanyanı saat on birdə mənim yanıma gətirərsiniz... Eşidirsinizmı?

D'Artanyan öz-özünə fikirləşdi: "Deyəsən, bu, həmişə görüşü saat on birə təyin edir. Görünür bu onun adətidir".

Miledi əlini ona sarı uzatdı, d'Artanyan da bu əli nəzakətlə öpdü.

D'Artanyan gedə-gedə və Kettinin töhmətli sözlərinə güclə cavab verə-verə düşünürdü: "Birdən məni aldadar ha... Bu qadın yamanca yırtıcı şeydir. Ehtiyatlı olmaq lazımdır"

## VII

## MİLEDİNİN SİRRİ

Kettı nə qədər yalvarıb-yaxardısa d'Artanyan onun otağına qalxmayıb çıxıb getdı. Bununla o həm qızın töhmət və şikayətlərindən canını qurtarmaq, həm də bır az tək qalıb düşünmək, fikrini toplamaq ıstəyırdi.

D'Artanyan miledini dəlicəsinə sevirdi, eyni zamanda, bu qadının onu qətiyyən sevmədiyini də bilirdi. Bir dəqiqəliyə d'Artanyan evə gedib mılediyə bir kağız yazmaq və bütün məsələni açıb ona söyləmək istədı. Kral meydanını beş-altı dəfə hərləndi. Miledinin mənzilindəki işıq xeylı yanandan sonra, nəhayət, söndü.

D'Artanyanın ürəyı sevincdən döyünməyə başladı. Başı elə bil od tutub yanırdı. Gerı qayıdıb Kettının otağına girdi.

Yazıq qızın rəngi meyit kimi ağardı, bütün bədəni tir-tır əsdi, d'Artanyanı öz yanında saxlamaq istədi; lakin miledi onun keşiyində ıdı. Qapını açıb d'Artanyanı çağırdı.

Gəlınız, dedi.

D'Artanyan onun otağına girdi, qapı bağlandı. Ketti özünü qapıya atdı. Qısqanclıq, çılğınlıq və təhqir edilmiş qürur, - bir sözlə, sevən bir qadın qəlbıni həyəcana gətirən bütün ehtiraslar onu d'Artanyanın kələyını ifşa etməyə sövq edirdi. Lakin bu məsələdə o iştirak etdiyini söyləsəydı, özü məhv olacaqdı, d'Artanyanı da həmişəlik itirəcəkdi. Bu fikir onu daha bir qurban verməyə məcbur etdi.

D'Artanyan öz arzusuna nail oldu. Mühakiməsi ona deyirdi ki, sən ancaq qısas almaq üçün bir alətsən. Lakin qürur, heysiyyat və ehtiras

mühakiməni susmağa məcbur edirdi. Bizim qaskoniyalı özünü de Vardla müqayisə eləyir və öz-özünə deyirdi. miledi ki de Vardı sevir, bəlkə elə axırda mənim özümü də sevdi? Niyə də sevməsin?

O, bütün varlığı ilə ehtirasa qapılmışdı; bu qayda ilə iki saat keçdı.

Bir qədər keçmiş miledi özünə gəlib, de Vardı duelə çağırmaq üçün bir bəhanə tapıb-tapmadığını d'Artanyandan soruşdu.

D'Artanyan qrafla duelə çıxacağı haqqında heç vaxt ciddi surətdə düşünmədiyindən söhbəti dəyişmək istədi. Lakin buna müvəffəq olmadığını görüb miledidən de Vardı bağışlamasını xahiş etməyə başladı.

Miledi qaranlıqda qəribə səslənən sərt və istehzalı bir ifadə ilə soruşdu:

Əzizim d'Artanyan, olmaya qorxursunuz?

D'Artanyan:

– Gülüm, siz əlbət ki, belə fikirdə deyilsınız? dedi. Əgər bu yazıq qraf Vard sizin düşündüyünüz qədər müqəssir deyilsə, onda necə olsun?

Miledi sərt dedi:

Hər halda o, məni aldadıb. Məni aldatdığı üçün də ölməlıdır.

D'Artanyan möhkəm və qəti bir səslə dedi:

– Madam ki, siz onu ölümə məhkum etmisiniz, o öləcəkdir!

Miledi dərhal ona yaxınlaşdı.

Günün ilk şüaları pəncərədən içəri süzülməyə başladı, çox çəkmədi ki, bütün otaq solğun bir işıqla işıqlandı.

Miledi d'Artanyanın getməyə hazırlaşdığını görüb bir də ona verdıyi vədi xatırlatdı.

D'Artanyan:

- Nə buyursanız, mən onu yerinə yetirməyə hazıram, – dedi Ancaq sizdən bir şeyi yəqin bilmək istərdim.

Miledi soruşdu:

– O nədir ki?

Siz məni sevirsinizmi?

Mən ki, bunu sizə isbat etdim.

D'Artanyan:

– Əgər, doğrudan da, siz məni sevirsinizsə, dedi, - bəs onda mənım başıma bır iş gələcəyindən qorxmursunuzmu?

Sizın başınıza nə iş gələ bilər?



– Məni bərk yaralaya, hətta öldürə də bilərlər.

Miledi:

Bu ola bilməz, dedi. – Siz çox igidsiniz, həm də qılıncı məharətlə işlətməyi bacarırsınız.

D'Artanyan:

– Bəlkə siz qisas almaq üçün elə bir yol seçəsınız ki, – dedi, orada qan tökmək olmasın?

Miledi dinməz-söyləməz onun üzünə baxıb:

Deyəsən, siz tərəddüd edirsiniz, dedı.

– Yox, tərəddüd etmirəm; ancaq, sizın o yazıq qraf de Vardı sevmədiyinizi biləndən sonra, düzü mənim ona yazığım gəldi; mənə elə gəlir ki, sizin sevginizdən məhrum olmaq özü böyük bir cəzadır, belə bir adamı bundan da artıq cəzalandırmağa daha ehtiyac yoxdur.

Miledi soruşdu:

– Sizə kim dedi ki, mən onu sevirdim?

Cavan oğlan mehribanca dedi:

Mən güman edirəm ki, ındi sız bir başqasını sevirsiniz, buna görə də təkrar edirəm: mənım qrafa yazığım gəlir.

– Niyə?

– Ona görə ki, ancaq mən bilirəm ki...

Nəyi bilirsiniz?

- Bilirəm ki, o sızın qarşınızda o qədər də müqəssir deyil.

Miledi həyəcanlı bır səslə soruşdu:

– Doğrudanmı?

D'Artanyan dedı:

Bəli. Mən nəcıb adamam. Sizin sevginizə nail olandan bəri mən bu sevginin varlığına ınandım... Mən sızin sevginizə inana bilərəm, elə deyilmi?

– Bəli, bəli. Sonra?

Sizin sevginizə nail olandan bəri məni bir sirr çox narahat edir.

Sirr?

– Sız cümə axşamı həmin bu otaqda Vardla görüş təyin etmişdiniz, düzmü deyirəm?

- Mən? Yox, belə bir görüş təyin edilməmişdi. – Miledi bu sözləri elə qəti və elə soyuqqanlıqla dedi ki, əgər d'Artanyan öz sözlərinə tamamilə arxayın olmasaydı, yəqin ki, şübhəyə düşərdi.

D'Artanyan gülümsəyərək:

– Gözəl mələk, yalan söyləməyin, – dedi, bunun sizə heç bır köməyı olmaz.

*Nə? Dı deyın görüm! Siz məni üzüb öldürürsünüz!*

- Yox, sakıt olun. Siz mənim qarşımda müqəssir deyılsiniz! Mən artıq sizi əfv etmişəm.

- Axı sonra? Sonra?

– De Vard heç bir şeylə lovğalana bilməz...

Nıyə? Sız özünüz dediniz kı, üzüyü..

– Bu üzük, mənim sevgım, məndədir. Cümə axşamı sizın yanınıza *gələn qraf de Vard da, bugünkü d'Artanyan da elə bır adamdır*

Bu divanə elə zənn edırdi kı, miledi bunu eşidərkən həm təəccüb edəcək, həm də utanacaq, yüngülcə bır tufan qopacaqdır ki, bu da göz yaşları içində əriyib gedəcəkdır; lakın o yanılırdı. Bu hal uzun surmədı. Rəngi qaçmış və dəhşətlı bır sıfətə düşmüş mıledi qəddini düzəltdi, d'Artanyanın döşünə bərk bir yumruq vurub ıtələdı.

Artıq hava işıqlanmışdı. D'Artanyan miledinin, nazik hınd batıstindən tikilmiş penüarından[3] yapışdı ki, ondan əfv diləsin, lakin o, qəti və qüvvətli bir hərəkətlə d'Artanyanın əllərindən siyrılib çıxdı. Əynindəkti batist paltar cırıldı, çiyni açıldı, d'Artanyan onun gözəl, yumşaq, ağ çiyinlərindən birində zanbaq çiçəyı damğasını gördü bu, cəllad əli ilə vurulmuş həqarət damğası idi!

D'Artanyan bərkdən:

Allah, mən nə görürəm! – deyərək penüarı əlındən buraxdı və yerindəcə donub qaldı.

Miledi ifşa olunduğunu hiss etdi: bu cavan adam indi onun sirrini bilirdi. Lakin bu dəhşətli sirr hələ heç kəsə məlum deyildi. O çığıraraq dedi:

– Ah, mənfur adam! Əvvəl sən alçaqcasına mənə xəyanət etdin, indi də sirrimi öyrəndın? Sən ölməlisən!

O, sədəfli mücrüyə sarı cumdu, əli əsə-əsə mücrünün qapağını açdı, oradan iti və nazik tıyəli bir xəncər götürüb bir sıçrayışla, yarısoyunmuş halda d'Artanyanın üstünə atıldı.

Biz bilirik d'Artanyan igid oğlandı; lakin onu miledinin eybəcərləşmiş sifəti, bərəlmiş gözləri, katan kimı ağarmış üzü və qan kimi qırmızı dodaqları qorxutdu. Divara tərəf geri çəkildi, elə bil ki, üstünə ilan gəlirdi. Əli qılıncın dəstəsinə toxundu. Qılıncı qınından

[1] Penüar – səhər geyımi



çıxartdı. Lakin miledi sıyrılmış qılınca əhəmiyyət verməyərək onu xəncərlə vurmağa çalışırdı. Ancaq qılıncın iti ucunu sinəsində hiss edib dayandı. *Qılıncı əli ilə tutmaq istədi.* Lakin d'Artanyan buna imkan vermirdi: qılıncı gah onun gözünə, gah döşünə sarı uzadaraq Kettinin otağına tərəf çəkilməyə başladı.

Miledi dəhşətli bir qəzəblə ona hücum edirdi. Onların vuruşması lap duelə bənzəyırdi. D'Artanyan, nəhayət, yavaş-yavaş özünə gəldi.

Siz çox gözəl vuruşursunuz, gözəlim, çox gözəl! Allah xatirinə, bəsdir, sakit olun, yoxsa mən sizin o gözəl yanağınızda ıkinci bir zanbaq şəkli çəkərəm.

Miledı çığıraraq:

Alçaq! Alçaq!

D'Artanyan miledinin arası kəsilməyən hücumlarından özünü qoruya-qoruya, yavaş-yavaş qapıya yaxınlaşırdı.

Ketti o biri otaqda aşırılan mebellərin səsini və dəhşətli çığırtıları eşidərək ara qapını açdı. D'Artanyan manevr edə-edə bu qapıya yaxınlaşmağa çalışırdı; qapı açılanda o buradan üçcə addım aralı idı. Bir sıçrayışla Kettinin otağına atıldı, dərhal qapını örtdü, var gücü ilə qapını basdı, açılmağa qoymadı. Ketti tez qapının cəftəsını vurdu. Miledi yenə də əl çəkmədi: o iki otaq arasındakı dıvarı sındırmaq istədi, lakin buna gücü çatmadığını görüb xəncərlə qapını çapmağa başladı, bir neçə yerdən onu dəldı O, hər zərbə ılə dəhşətli lənətlər yağdırırdı.

D'Artanyan pıçıldayaraq:

Tez ol, tez ol, Kettı, dedi, – o biri qapını aç, mən gedim. Sonra özünə gəlıb nökərlərinə əmr edər, məni öldürərlər.

Ketti:

Sız axı bu paltarda hara gedə bilərsiniz, dedi, – sizi tanıyarlar.

D'Artanyan ancaq indi bunu başa düşə bildi:

Doğru deyirsiniz, doğru deyirsiniz, dedi. Öz paltarından mənə ver, mən paltarımı dəyişim. Ancaq tez ol; bunu bil ki, məsələ ölüm-dirim məsələsidir!

Ketti bunu yox yaxşı bilirdi. O, cəld öz güllü donunu d'Artanyanın əynınə geydirdi, mantilını çiyninə atdı, enli qadın qalpağını onun başına qoydu, sonra da otaqdan çıxarıb pilləkənlərlə aşağı endirdi. Bütün bunlar lap vaxtında oldu; çünki miledi bütün evdəkiləri ayağa qaldırırdı. O, pəncərədən uzanıb çığırırdı:

Qapını açmayın. Lakin qapıçı artıq qapını açmışdı.

## VIII

## NECƏ OLDU Kİ, ATOS ZƏHMƏTSİZ-ƏZİYYƏTSİZ ÖZÜNƏ YARAQ-YASAQ ƏLDƏ EDƏ BİLDİ

D'Artanyan qaçıb getdi. O, gözdən itəndə miledi hissiz halda döşəmə üstünə yıxıldı.

D'Artanyan o qədər qorxmuşdu ki, Kettinin vəziyyətini düşünmədən və bu barədə heç də narahat olmadan, Parisin yarısını yüyürə-yüyürə keçib getdi, ancaq Atosun qapısı ağzında dayandı. O, özünü o dərəcədə itirmişdi ki, dalınca cuman keşikçinin çığırtısı, hələ tez də olsa, öz işinə gedən bir neçə adamın fitə basması onu saxlaya bilmədi, daha bərk yüyürməyə təhrik etdi. Həyətdən keçib üçüncü mərtəbəyə qalxdı, var gücü ilə Atosun qapısını döyməyə başladı.

Qrimo yuxulu-yuxulu gəlib qapını açdı. D'Artanyan elə bir halda otağa soxuldu ki, az qaldı Qrimonu vurub yıxsın. Qrimo, adəti üzrə, qaradinməz bir adamdı, lakin bu dəfə danışmağa başladı:

Arvad, sən kimsən? Niyə gəlmisən, yaramazın biri yaramaz!

D'Artanyan başındakı qadın papağını götürdü, qollarını mantilin altından çıxartdı. Qrimo qabağındakı "qadının" bığlarını, əlindəki siyirmə qılıncını görüb bildi ki, bu, kişidir və elə zənn etdi ki, otağa quldur soxulmuşdur.

Çığırmağa başladı:

– Köməyə gəlin! Köməyə gəlin!

D'Artanyan:

– Sus, yaramaz! Mən d'Artanyanam, dedi. – Yoxsa məni tanımırsan? Ağan hanı?

Qrimo çığıraraq:

Siz cənab d'Artanyansınız? dedi. – Ola bilməz!

Atos, əynində xalat, öz otağından çıxıb gəldi.

– Qrimo, deyəsən sən danışa da bilirsənmiş...

– Ah, cənab, ona görə ki...

Sus!

Qrimo səsini kəsib barmağı ilə d'Artanyanı göstərdi.

Atos yoldaşını tanıdı və nə qədər sakit, soyuqqanlı adam olsa da, qəhqəhə ilə gülməyə başladı. Doğrudan da, d'Artanyanı əynindəki qadın geyimi, başındakı əyri qoyulmuş qalpaq çox qəribə göstərirdi.



D'Artanyan:

Gülməyin, dostum, – dedi. Sız allah, gülməyin. Heç bilirsinizmi başıma nə gəlib?..

Bu sözləri o, elə dəhşətli bir ifadə ilə dedi ki, Atos dərhal onun əlindən yapışıb:

– Olmaya yaralanmısınız, dostum? – dedi. Rənginiz elə qaçıb ki!

- Yox, yaralanmamışam, ancaq başıma dəhşətli bir hadisə gəlib... Atos, siz təksinizmi?

Əlbət ki, təkəm! Bu vaxt mənim yanımda kim ola bilər?

– Çox gözəl!

D'Artanyan tez Atosun otağına keçdi.

Atos başqasının mane olmaması üçün qapının cəftəsini vurdu.

Deyin görüm nə olub axı! Kral ölübmü? Yoxsa kardinalı öldürmüsünüz? Sir-sifətiniz təmiz dəyişib, sizi tanımaq olmur. Deyin də! Bağrım çatladı ki!

D'Artanyan əynindəki qadın paltarını çıxara-çıxara:

Atos, dedi, sizə heç ağlıma gəlməyən bir hadisə söyləyəcəyəm, qulaq asmağa hazırlaşın.

Muşketyor öz dostuna:

Əvvəl bu xalatı geyin, dedi.

D'Artanyan elə dərin bir həyəcan içində idi ki, xalatın qollarını tapıb geyə bilmədi.

Danışın görək!

D'Artanyan pıçıltı ilə Atosun qulağına dedi:

– Miledinin çiynində zanbaq çiçəyi damğası var!

Ah! – muşketyor elə çığırdı ki, sanki ürəyinə güllə dəydi.

D'Artanyan:

– Qulaq asın, – dedi, - siz birisinin... doğrudan da, öldüyünə inanırsınızmı?

O birisi?

Atos bu sözü elə boğuq bir ifadə ilə dedi ki, d'Artanyan onu güclə eşitdi.

– Bəli. Siz ki, onun barəsində Amyendə mənə bəzi şeylər danışmışdınız.

Atos inildəyərək başını əlləri içinə aldı.

D'Artanyan sözünə davam etdi:

İndi onun iyirmi altı yaşı olar.

Atos soruşdu:

– O sarışın bir qadındır, eləmi?

– Bəli.

Onun qəribə bir tərzdə parlayan açıq mavi gözləri, qara qaşları və qara kirpikləri var?

Bəli.

Boyu ucadır, qəşəng, mütənasıb bədəni var. Sol tərəfdən də bir dişi düşmüşdür.

Bəli.

Çiynində də xırdaca, sarı-qırmızı zanbaq çiçəyi damğası var, həm də bu damğanı silməyə cəhd edildiyi hiss olunur?

– Bəli.

– Siz deyirsiniz ki, o ingilis qadınıdır.

Onun adı miledi Klarikdir. Bəlkə də o, fransız qadınıdır. Bu daha ağıl kəsəndir; çünki lord Vinter onun qardaşı deyil, qaynıdır.

D'Artanyan, mən onu görmək istəyirəm!

– Ondan uzaq olun, Atos, uzaq olun! O, yırtıcı pələngdir, qaplandır! Ah, əzizim Atos, mən bir şeydən çox qorxuram, qorxuram ki, o, bizim hər ikimizdən dəhşətli qisas alsın.

D'Artanyan gecəki hadisəni, miledinin hədələrini açıb söylədi.

Atos:

– D'Artanyan, and olsun namusuma, siz haqlısınız! – dedi. – Hərçənd mən indi heç qırıq qəpiyə də dəymərəm... ancaq yenə də qorunmaq lazımdır. Xoşbəxtlikdən, sabah yox, o biri gün Parisdən çıxıb gedirik. Yəqin ki, bizi Laroşelə göndərəcəklər. Daha buradan gedəndən sonra...

– Atos, o, sizi tanısa, dünyanın lap o başına da getsəniz, yenə sizi təqib edəcəkdir. Heç olmazsa, siz onun qəzəbinə tutulmayın, o nə eləyəcəksə qoy mənə eləsin!

Atos:

– Ah, mənim əzizim, dedi, – yoxsa elə bilirsiniz mən öz həyatım üçün qorxuram?

D'Artanyan:

Xoşbəxtlikdən biz ancaq sabah yox, o biri günə kimi buradayıq, – dedi. Orada olandan sonra biz ancaq düşməndən qorxa bilərik, ayrı heç kəsdən yox.

Atos:



Hələlik mən öz-özümü könüllü surətdə həbs eləmək qərarımı pozuram, – dedi. – Siz hara getsəniz, mən də sizinlə gedəcəyəm. İndi siz Məzarçılar küçəsinə qayıtmalısınız. Mən sizi ötürəcəyəm.

– Mən axı bu paltarda gedə bilmərəm.

Atos:

Tamamilə doğrudur, – deyib zəngi çaldı.

Qrimo içəri girdi.

Atos işarə ilə ona dedi ki, d'Artanyanın evinə gedib paltarını gətir. Qrimo da deyiləni başa düşdüyünü əl qolu ilə izah etdi.

Atos:

– Əzizim, bunlar hamısı öz yerində; ancaq bizim yaraq-yasaq məsələmiz həll olunmadı, necə ki var, elə də qaldı, – dedi. – Sizin heç olmasa, yaqut üzüyünüz vardır.

– Əzizim Atos, bu yaqut üzük sizindir! Siz dediniz ki, bu üzük sizin ailənin olmuşdur.

Bəli, bu üzüyü atam iki min eküyə aldığını mənə demişdi. Bu onun anam üçün gətirdiyi toy hədiyyələrindən biri idi. Anam da bunu mənə bağışladı. Mən ağılsız, bunu müqəddəs bir şey kimi saxlamaq əvəzinə, götürüb o alçaq qadına bağışladım.

Elə isə bu üzük sizə çatacaq; çünki bu, sizin üçün son dərəcə qiymətli bir şeydir.

– Buna o alçaq qadının əli dəymişdir, mən onu daha geri götürmərəm! Qətiyyən götürmərəm! d'Artanyan, bu üzük murdarlanmışdır.

Onda satın.

– Anamdan mənə qalan yadigarı satmaqmı? Siz məni günah işləməyəmi sövq edirsiniz?

– Elə olan surətdə aparın girov qoyun. Girov qoysanız sizə dinməz min ekü verərlər. Bu pul sizin yaraq-yasağınıza lap artıqlamasilə çatar. Sonra girəvə düşən kimi gedib onu geri alarsınız; sələmçi əlindən keçdiyi üçün də artıq o üzük köhnə ləkələrindən təmizlənmiş olacaqdır.

Atos gülümsədi:

– Əzizim d'Artanyan, siz çox gözəl yoldaşsınız! Siz öz güşadlığınızla mənim qəmli fikirlərimi dağıdırsınız. Yaxşı, üzüyü girov qoyarıq, ancaq bir şərtlə!

– Hansı şərtlə?

Beş yüzünü siz götürərsiniz, beş yüzünü də mən.

Atos, bu nə sözdür deyirsiniz? Mənə heç onun dörddə biri də lazım deyil. Mən qvardiyada qulluq edirəm, elə bir yəhəri satsam, bu pulu çıxardaram. Mənə lazım olan şey nədir? Planşe üçün bir at. Vəssalam Mənim də axı bir üzüyüm vardır, sız bunu yaddan çıxarırsınız.

Mənə elə gəlir ki, siz bu üzüyü daha çox, mən özümünkünü sevəndən də artıq sevirsiniz.

– Doğru deyirsiniz! O üzük mənim üçün çox qiymətlidir; bu, yalnız qiymətli bir daş deyil, həm də sehrli bir tilsimdir.

Mən sizi başa düşmürəm, lakin dediyinizə ınanıram. Yenə qayıdaq mənim üzüyümün, daha doğrusu, sizin üzüyünüzün üstünə. Siz ya üzüyə verilən pulun yarısını götürəcəksiniz, ya da mən onu Senaya atacağam.

Onda razıyam.

Elə bu anda Qrimo ilə Planşe gəldi. Planşe öz ağasından çox nigarandı; onun başına nələr gəldiyini bilmək istəyirdi, buna görə də fürsətdən istifadə edərək paltarı özü gətirmişdi.

D'Artanyan da geyindi, Atos da. İkisi də hazır olandan sonra Atos nişan almaq hərəkətini göstərdi. Qrimo o saat muşketini mıxdan götürdü, ağasının dalınca yola düşdü.

Onlar sağ-salamat Məzarçılar küçəsinə gəlib çıxdılar. Qapı ağzında duran Bonasye istehza ilə d'Artanyana baxdı.

– Ay əziz həmxana, tez olun, bir gözəl qız içəridə sizi gözləyir. Özünüz bılirsiniz ki, arvadlar gözləməyi sevməzlər.

– Kettidir! deyərək d'Artanyan koridora yüyürdü.

Doğrudan da, Ketti onun otağının qabağında qapıya söykənərək durmuşdu. D'Artanyanı görüb dedi:

– Siz məni öz himayənizə alacağınızı, miledidən qoruyacağınızı vəd etmişdiniz. Mənim başıma nə müsibət açdığınızı bir yadınıza salın.

D'Artanyan:

Bilirəm, Ketti, bilirəm, lap arxayın ola bılərsən, dedi. Yaxşı, mən gedəndən sonra nə oldu?

Ketti:

Mən nə bilim? dedi. Miledinin çığırtısına xidmətçilər yüyürüb gəldilər. O, elə bil cin atına minmişdi; dünyada nə qədər lənət-nifrət var, hamısını sizin üstünüzə tökdü. Siz axı onun otağına mənim otağımdan keçib getmişdınız; dedim bu indi onun yadına düşər, məni



də bu iş üstündə sizin köməkçiniz hesab edər. Tez bir az pul, şeylərimdən ən qıymətlisini, ən yaxşısını götürüb qaçdım.

Yazıq qız! Ancaq heç bilmirəm mən səni nə edəcəyəm. Sabah yox, o biri gün mən yola düşürəm.

– Məni nə edəcəksiniz? Bu sizin öz işinizdir, cənab! Məni Parisdən aparın. Aparın məni Fransadan!

D'Artanyan:

Mən səni özümlə Laroşeli mühasirə etməyə apara bilmərəm ki, dedi.

- Hər halda məni əyalətin bir yerində, tanış bir xanımın evində işə düzəldə bilərsiniz. Məsələn, öz vətənınızdə...

Ah, əzizim! Mənim vətənimdə ev xanımları qulluqçusuz dolanırlar. Bir toxta görüm. Mən sizin haqqınızda bəzi şeylər düşünmüşəm. Planşe, get, Aramisdən xahiş elə ki, bu saat bura gəlsin: biz ona çox mühüm bır şey söyləyəcəyik.

Atos:

Mən bilırəm, siz ona nə deyəcəksınız. Portosu çağırsa, məsləhətdir, - dedi. Mənə elə gəlır ki, onun markiz xanımı...

D'Artanyan gülərək:

Onun markiz xanımını ərinin mirzələri geyindirirlər. Bir də ki, Ketti Ayı küçəsində yaşamaq istəməz. Elə deyilmi, Ketti?

Harada desənız, mən orada yaşamağa razıyam. Ancaq başımı soxmağa bır yer olsun ki, özümü gizlədim, heç kəs mənim yerimi bilməsın.

Ketti, bız kı indi ayrılırıq, demək, sən daha mənə qısqanmayacaqsan.

- Cənab d'Artanyan! Siz harada olsanız, yaxında ya uzaqda, mənım üçün fərqi yoxdur, harada olsanız mən sizı sevəcəyəm.

Atos pıçıldayaraq öz-özünə dedi:

Sabitlik gör harada gəlib özünə məskən tapıb!

D'Artanyan:

Mən də, mən də həmişə səni sevəcəyəm. Ancaq sən mənim bır sualıma cavab ver; onu da bil ki, mən bu suala çox əhəmiyyət verirəm. Gecə vaxtı oğurlanan cavan bir qadın haqqında sən bir şey eşitmisənmi?

Ah, Allah! Cənab zabit, yoxsa sız bu arvadı da sevirsiniz?

Yox, onu mənim dostlarımdan biri sevır. Onu sevən bax, bu Atosdur.

– Mən? – Atos elə çığırdı ki, sanki o qəfildən ilan basmışdı.
D'Artanyan Atosun əlini sıxaraq dedi:
Əlbət ki, sən! Sən özün bilirsən ki, biz hamımız bu yazıq balaca qadının, bu xanım Bonasyenin məsələsində necə iştirak edirik? Bir də ki, Ketti bunu heç kəsə deməz. Elə deyilmi, Ketti? Bilirsənmi, əzizim, bu qadın mənim qapımın ağzında duran o çirkinsifət adamın arvadıdır. Sən özün bayaq onu gördün.
Ketti çığırdı:
Aman Allah! Görəsən o, məni tanıdımı?
– Necə? Yoxsa bu adamı qabaq da görmüsən?
– O, iki kərə miledinin yanına gəlib.
Belə de. Nə vaxt gəlmişdi?
– Təxminən on beş-on səkkiz gün bundan əvvəl.
Deməк... belə...
Dünən axşam yenə gəlmişdi.
– Dünən axşam?
– Bəli. Sizdən bir azca qabaq
Əzizim Atos, bizi bir dəstə casus hər tərəfdən əhatə eləyib. Ketti, görəsən o, səni tanıya bilibmi?
- Mən onu görən kimi şlyapamı çəkib gözümün üstünə endirdim. Bəlkə də mən bunu eləyənə kimi o, məni tanıyıbmış.
– Atos, aşağı enin, baxın görün o, yenə də qapının ağzında durub-mu? O alçaq sizdən daha az şübhələnir.
Atos aşağı enib tez qayıtdı:
Gedib, qapını da bərkidib.
– Gedib xəbər versin ki, bütün göyərçinlər öz yuvasındadır.
Atos:
Onda biz də uçub gedək, dedi. Bircə Planşe burada qalsın ki, sonra burada olan əhvalatı bizə söyləsin
– Bircə dəqiqə gözləyək: axı biz Aramisin dalınca adam göndərdik.
Atos:
Doğrudan, dedi. Aramisi gözləyək.
Elə bu anda Aramis gəldi.
Məsələni ona söylədilər, xahiş etdilər ki, öz əsilzadə tanışlarından birinin evində Kettiyə bir qulluq yeri düzəltsin.
Aramis bir az düşündü, sonra qızararaq dedi:
D'Artanyan, doğrudanmı mən bununla sizə bir xidmət etmiş olaram?



– Bunu düzəltsəniz, bütün həyatım boyu sizə minnətdar olacağam.
– Xanım de Bua-Trasi məndən xahiş etmişdi ki, onun üçün bir yaxşı qulluqçu qız tapıb əyalətə göndərim; d'Artanyan, mənə söz versəniz ki, bu mademuazel...
Ketti çığıraraq onun sözünü kəsdi:
– Ah, cənab, bu barədə lap arxayın ola bilərsiniz; o xanım ki, mənim Parisdən getməyimə imkan verir, mən ona ömrüm boyu sədaqətli olacağam.
Aramis:
Əgər belə isə çox yaxşı, dedi.
Miz dalında oturub bir neçə kəlmə söz yazdı; kağıza öz üzüyü ilə möhür vurub Kettiyə verdi.
D'Artanyan:
Quzum, onu bilirsən ki, bizim üçün də burada qalmaq təhlükədir, - dedi. - İndi biz ayrılmalıyıq. İşlərimiz yoluna düşəndə görüşərik.
Ketti:
Harada və nə vaxt siz mənə rast gəlsəniz, – dedi, görəcəksiniz ki, mən sizi yenə də indi sevdiyim kimi sevirəm.
Atos:
– Bu qumarbaz andıdır, – dedi.
D'Artanyan Kettini pilləkəndən yola salıb qayıtdı.
Bir dəqiqədən sonra üç cavan saat dörddə Atosun mənzilində görüşəcəklərini müəyyən edib ayrıldılar, evin keşiyini çəkməyi isə Planşeyə tapşırdılar.
Aramis öz mənzilinə qayıtdı. Atosla d'Artanyan yaqut üzüyü girov qoyub üç yüz pistol aldılar. Hətta sələmçi bunu da demişdi ki, üzüyü məmnuniyyətlə beş yüz pistola alardı, çünki bu üzük bir sırğaya çox gözəl tay ola bilərdi.
Atosla d'Artanyan, hərbi adam cəldliyi ilə, həm də öz işlərini yaxşı bildiklərindən, üç saat içində muşketyora lazım olan yaraq-yasağı alıb qurtardılar. Bir də ki, Atos tez yola gələn, həm də əsl kübar bir adamdı: bir şey ki, ona xoş gəldi, danışıqsız filansız istənilən pulu verib o şeyi alardı. Axırda d'Artanyan ona dedi ki, belə olmaz axı, danışmaq lazımdır; lakin Atos gülümsəyərək əlini d'Artanyanın çiyninə qoydu, heç bir söz demədi. D'Artanyan dərhal başa düşdü ki, o kasıb qaskoniyalı bir mülkədar balasıdır, Atos isə kübar bir senyor idi: ona yaraşan bir şey Atosa yaraşmırdı.

O, qatran kimi qara, od kimi qızğın, nazik, zərif ayaqlı çox gözəl bir Əndəlis atı tapdı. Ata çox dıqqətlə baxdı, heç yerində bir nöqsanı yox idi. Sahibi ata min livr istəyirdi. Bəlkə bir az da ucuz almaq olardı. D'Artanyan çənə bazarına başlamışdı ki, Atos bu yandan yüz pistol sayıb at sahibinə verdı.

Qrimoya da üç yüz lıvrə dolu, möhkəm bir Pikardiya atı aldılar. Lakın Atos Qrimo üçün yəhər və sılah da aldıqdan sonra öz payına düşən yüz əlli pistoldan bircə çet də qalmadı. D'Artanyan öz hissəsindən ona borc vermək ıstədı, lakin Atos cavab vermək əvəzinə ancaq çiyinlərini sıxdı.

– Sələmçi uzüyə nə qədər verırdı?

– Beş yüz pistol.

Yəni girov üçün bızə verdiyindən iki yüz pistol artıq, bundan da yüz pistol sənə düşür, yüzü də mənə. Bu ki, böyük bır dövlətdir! Dostum, qayıdın onun yanına!

Necə? Siz istəyirsiniz ki..

Bu üzük mənə bir çox kədərli şeylər xatırlada bilərdi. Bir də bizim haradan üç yuz pistolumuz olacaq ki, verıb üzüyü girovdan geri götürək. Üzüyü sələmçidə qoymaqla biz lap nahaq yerə iki yüz pistolu itirmiş olacağıq. D'Artanyan, gedın, ona deyin ki, biz üzüyü satmağa razıyıq. İki yüz pistolu da alıb gətirin.

– Atos, bir əməlli fikirləşin...

– Indiki zamanda nağd pul hər şeydən yaxşıdır. Bir də ki, adam gərək bir şeyi qurban etməyi də bacarsın. Gedin, d'Artanyan, gedin! Qrimo sizi ötürər.

D'Artanyan yarım saatdan sonra davasız şavasız cibində iki min livr qayıdıb gəldi

## IX

## XƏYAL

Dörd dost saat dörddə Atosun mənzilinə toplaşdı. Onların yaraq-yasaq məsələsi həll olunub qurtarmışdı, bununla belə hamısının üzündə daxili bir narahatlıq ıfadəsi oxunurdu. Bu narahatlıq sanki onları gələcək haqqında düşünməyə vadar edirdi.



Birdən Planşe ıçəri girib d'Artanyana iki məktub verdi.

Məktubun bıri balaca və uzunsov şəkildə ıdi; yaşıl mum möhürlə möhürlənmişdi; möhürün üstündə uçan bir goyərçin şəkli, göyərçinin də dimdiyində balaca bir fidan vardı.

O biri də böyük, dördbucaq bir məktubdu. Məktubun üstü müqəddəs hersoq-kardinal həzrətlərinin qorxunc gerblərilə möhürlənmişdi.

D'Artanyan balaca, uzunsov məktubu görəndə sevincindən ürəyi döyünməyə başladı; çünki kağızın üstündəki xətt ona tanış gəldi.

Məktubu tez açıb oxumağa başladı:

*' Gələn çərşənbə, axşam saat altı ılə yeddi arasında Şalyo yoluna gəlin və gəlib keçən karetalara dıqqətlə baxın; lakin əgər siz öz həyatınızın və sizı sevən adamların həyatının qədrini bilirsinizsə, bir kəlmə də olsa söz söyləməyin və elə bir hərəkət eləməyin ki, bu hərəkətinizdən sizi bir anlığa görmək üçün hər şeyə hazır olan qadını tanıdığınızı duysunlar."*

Məktubun altında imza yox idi.

Atos:

– Sizi tora salmaq ıstəyırlər, d'Artanyan, getməyin, - dedi.

D'Artanyan dedi:

Amma, bu xətt mənə tanış gəlir.

Ola bilər ki, sənin tanıdığın xəttə oxşadıblar. Axşam saat altı ılə yeddidə Şalyo yolunda gediş-gəliş kəsilir. Bu vaxt yola getmək Bondi meşəsinə gəzməyə getmək kimi şeydi.

Yaxşı, hamımız bır yerdə getsək necə olar? Dördümüzü də birdən tutub yeməyəcəklər ki? Yanımızda dörd xidmətçimiz olacaq. .

Portos sözə qarışdı:

– Bir də ki, təzə əldə etdiyimiz yaraq-yasağı göstərib lovğalanmaq üçün bu yaxşıca bir fürsətdir.

Aramis də öz fikrini dedi:

Bəlkə bu qadın istəmir ki, onu görsünlər? d'Artanyan, bir əməlli fikırləşin: siz onu rusvay eləyə bilərsiniz, bu isə əsilzadəyə yaraşmayan bır hərəkətdir.

Portos:

Bız dalda dayanarıq, – dedi, – d'Artanyan isə tək qabağa gedər.

– Lakin sürətlə gedən bir karetadan güllə atmaq uzun bir vaxt tələb eləmir...

D'Artanyan:

- Qəribə söz deyirsiniz! Məni vura bilməzlər, – dedi. – Əgər güllə atmış olsalar, atları səyirdib karetanın içindəki adamların hamısını qırarıq. Bununla da düşmənimizin heç olmasa bir neçəsi əskilmiş olar.

Portos:

D'Artanyan haqlıdır, – dedı. – Təzə silahlarımızı bir yoxlamalıyıq ya yox?

Aramıs də onlarla razılaşdı:

– Yaxşı da. Bu da kefdir. Gedək!

Atos da artıq etıraz etmədi:

- Necə deyırsınız, eləyək.

D'Artanyan:

– Ağalar, dedi, saat beşin yarısıdır; indi getsək, biz ancaq saat altıya Şalyo yoluna çata bilərik.

Portos dedı:

Bir də ki, çox gec getsək, hava qaralar, heç kəs bızi görə bilməz, dedı. Ağalar, gəlın hazırlaşıb yola düşək.

Atos:

Siz deyəsən ikinci məktubu yaddan çıxarmısınız, – dedi. – Onun üstündəki möhürlər göstərir ki, açıb oxumağına dəyər.

D'Artanyan dedı:

- Oxuyaq görək bu kardinal həzrətləri məndən nə ıstəyır.

Məktubu açıb oxumağa başladı:

*"Dezessar bölüyündən olan kral qvardiyaçısı cənab d'Artanyanı bu gün axşam saat səkkizdə kardinalın sarayında gözləyirlər.*

*Qvardıya kapitanı la Udinyer".*

Atos.

Lənət şeytana! dedi. Bu görüş o birındən də vacib oldu!

D'Artanyan:

– Mən əvvəl ora gedəcəyəm, sonra da bura, dedi. Birinci görüş saat yeddiyə təyin olunub, bu isə səkkizə; hər ikisinə çatarıq.

Aramis dedi:

Hə!.. Mən ki getməzdim Nəzakətli bir kavaler qadın tərəfindən təyin edilən görüşə getməyə bilməz. Lakin ağıllı bır əsılzadə kardinal həzrətlərinin yanına getmək üçün bir bəhanə tapıb üzr ıstəyə bılər: xüsusilə o zaman kı, bu əsilzadənin əlində kardinalın onu mehrıbanlıqdan dəvət etmədiyini subut edən bəzı əsasları vardır.

Portos:



Mən sizinlə razıyam, – dedi.

D'Artanyan dedi:

Ağalar! Mən əvvəllərı də cənab de Kavua vasitəsilə kardinal həzrətlərindən belə bir kağız almışdım Lakin mən ona əhəmiyyət vermədim; ertəsi gün mənim başıma böyük bir müsibət gəldi: Konstansiya əllı-ayaqlı yox oldu Hər nə olursa-olsun, mən ora getməlıyəm.

Atos:

Əgər möhkəm surətdə qət etmisınızsə, gedin, – dedi.

Aramis ondan soruşdu:

Bəs Bastılıya?

D'Artanyan cavab verdi ki:

Siz məni oradan xilas edərsiniz.

Aramislə Portos bır ağızdan dedı:

Şubhəsiz! Bu sözü onlar elə bir arxayınlıqla söylədilər ki, sanki söhbət ən adi bir şey üstündə gedirdi. Şübhəsiz, bız sizi oradan xilas edərik. Ancaq sabah yox, o biri gün səfərə çıxacağımızdan, yaxşı olardı ki, siz təhlükəli şeylərə əl atmayasınız.

Atos belə bir məsləhət gördü:

– D'Artanyan bu axşam hara getsə, biz də onun dalınca gedərik. Kardinalın da yanına gedəndə, bizim hər birimiz üç muşketyorla bərabər, kardinal sarayından çıxan yolları tutarıq. Elə ki, gördük qapısı örtülü şübhəlı bir kareta gəlir, dərhal ona hücum edərik. Çoxdandır bizim cənab kardınalın qvardiyaçıları ilə toqquşmamız olmur, yəqin ki, cənab de Trevil bizi ölmüş hesab edir.

Aramis:

Atos, siz, həqiqətən, ordu komandiri olmaq üçün yaranmısınız, – dedi. Ağalar, siz Atosun planı haqqında nə fikirdəsiniz?

Cavanlar bir ağızdan dedilər:

Çox gözəl plandır!

Portos:

Mən tez gedib yoldaşlara xəbərdarlıq eləyim ki, saat səkkizə hazır olsunlar, dedi. – Kardinalın sarayı qabağındakı meydanda toplaşırıq. Xidmətçilərə tapşırın ki, atları yəhərləsinlər.

D'Artanyan dedi:

- Mənım atım yoxdur. Ancaq eyb etməz, – at üçün mən cənab Trevilə adam göndərərəm.

Aramis:

Göndərməyin, dedi, – lazım deyil Mənım atlarımdan birini götürün

D'Artanyan soruşdu:

Sizin neçə atınız var ki?

Aramis gülümsədi:

Üç.

Atos sözə qarışdı:

– Əzizim Aramis, siz yəqin bütün Fransada və Navarrada ən varlı şairsiniz!

– Öz aramızdır, Aramis, siz yəqin ki, heç bilmırsınız bu atları neyləyəsiniz. Eləmı? Heç başa düşmürəm ki, siz bu üç atı niyə almısınız?

Üçüncü atı bu gün mənə tanımadığım bir ağanın xidmətçisi gətirdi, pul-zad da almadı. Kimin xidmətçisi olduğunu da mənə söy ləmədı Ancaq bunu dedi ki, ağam belə buyurdu...

D'Artanyan onun sözünü kəsdı:

Ya xanım belə buyurdu.

Atos ciddı bır əda ilə dedi:

Belə hadisələr ancaq şairlərin başına gəlir.

D'Artanyan Aramisdən soruşdu:

Elə ısə deyin görüm: siz bu atlardan hansını minəcəksiniz? Aldığınızı, ya bağışlananı?

Əlbət kı, bağışlananı... d'Artanyan, siz başa düşürsünüz kı, mən onun... xatırınə deyə bilmərəm...

D'Artanyan gülərək onun sözünü tamamladı:

– Atı, bağışlayanın xatirinə...

Deməк, aldığınız at artıq sizə gərək deyil?

– Buyurun. Götürə bilərsiniz. Əzizim d'Artanyan, mən indicə bunu sizə təklif etmək istəyirdim. Pulunu da nə vaxt imkanınız olsa verərsiniz.

Siz onu neçəyə almısınız?

- Səkkız yüz livrə.

D'Artanyan cibindən qızıl pulları çıxartdı:

– Əziz dost, bu da sizə qırx dənə iki pistolluq. Mən bilirəm ki, sızin şerləriniz də bu cür qızıl pula gedir.

Siz belə varlısınız?

Varlıyam, əzızim, çox varlıyam!



D'Artanyan bunu deyib cibındə qalan qızıl pulları əlı ılə cingildədırdi

Yəhərinizi muşketyorlar duşərgəsinə göndərin, o atı da bizim atlarla gətirərlər.

Çox gözəl. Saat beşin tamamına az qalıb. Tələsmək lazımdır.

On beş dəqiqədən sonra Portos Feru küçəsının ayağında, qəşəng bir İspaniya atı üstə göründü. Muşketon da onun dalınca balaca, qıvraq bir Overn atında gəlirdi. Portosun üzü sevinc və qürurdan gülümsəyirdi. Elə bu zaman küçənin o biri başında Aramis gözəl bir ıngılıs atı üstündə göründü Bazen da Ruan atın belındə, onun ardınca yorturdu. O, öz yedəyində qüvvətlı bir Meklenburq atı gətirirdi; bu da d'Artanyana çatacaqdı.

Hər iki muşketyor bir zamanda gəlib çatdı. Atosla d'Artanyan pəncərədən onlara baxırdılar.

Aramıs dedi:

Əzizim Portos, sizin nə gözəl atınız var!

Portos:

– Bəli, – dedi, bu, həmın atdır ki, mənim dostum olan bir xanım tərəfindən mənim üçün peşkəş alınmışdı. Ancaq əri zarafata salıb onu bir başqa atla dəyişmişdi; o yaxşıca cəzalandı, mənsə, istədiyımə nail oldum.

Sonra Planşe ılə Qrımo göründü: o da öz ağasının atını yedəyə alıb gətirirdi. D'Artanyanla Atos evdən aşağı düşdülər, hərə öz atına mindı. Dörd yoldaşın dördü də yola düzəldi. Xidmətçiləri də atlarını onların dalınca səyirtdilər.

Onlar Luvrun yaxınlığında cənab de Trevilə rast gəldilər. De Trevil onları saxlayıb gözəl yaraq yasaq əldə etmələri münasibətilə təbrik elədi. Bir an içində atlıların başına bir yığın avara toplandı

D'Artanyan kardinalın göndərdiyi böyük, qırmızı möhürlü, gerb şəkilli məktub haqqında məlumat verdi, lakin o biri məktub barədə heç bir söz demədi.

Cənab de Trevil onların qəbul etdiyi qərarı bəyəndi və dostlarını arxayın etdi ki, əgər d'Artanyan səhərısı onun yanına gəlməsə, onu harada olursa-olsun axtarıb tapar. Elə bu anda "Samarıtyanka"nın saatı altını vurdu; dörd dostun dördü də görüşə tələsdiklərini söyləyərək cənab de Trevıldən üzr ıstədi, onunla salamatlaşıb yola düzəldi.

Atlarını çapa çapa gəlib Şalyo yoluna çıxdılar.

Axşam olurdu. Yolda gah bu yana, gah da o yana karetalar gedirdi. D'Artanyan gəlib keçən karetaların içinə baxır, heç bir tanış adam görmürdü; yoldaşları bir az ondan aralıda hazır durmuşdular: bir şey olsa, dərhal d'Artanyanın köməyinə gedəcəkdilər.

On beş dəqiqədən sonra, hava qaralmağa başlayırdı ki, Sevr tərəfdən sürətlə gələn bir kareta göründü. Dəruni bir hiss elə bil d'Artanyana dedi ki, görüş təyin eləyən qadın bu karetanın içindədır. Ürəyinin bərk-bərk döyünməsinə o, özü də təəccüb elədi. Elə bu anda karetanın qapısından bir qadın başı göründü. O, iki barmağını ağzına qoymuşdu. bununla da d'Artanyana ya susmağı məsləhət görürdü, ya da ona öpüş göndərirdi. D'Artanyan sevincindən qışqırdı: bu qadın xanım Bonasye idi: lakin kareta elə bərk gedirdi ki, o, insandan artıq bir xəyala bənzəyirdi.

D'Artanyana tapşırılmışdı ki, ehtiyatlı olsun, lakin o qeyri ixtıyarı olaraq atı bərk çapıb bir neçə saniyədə karetaya çatdı; ancaq karetanın qapısındakı şüşədən qalın bir pərdə asılmışdı. Xəyal yox oldu.

D'Artanyan ona edilən xəbərdarlığı xatırladı: "Əgər siz öz həyatınızın və sizi sevən adamların həyatının qədrini bilirsinizsə, hərəkət etməyin, sanki heç bir şey görməmisiniz". D'Artanyan öz həyatından deyil, o yazıq qadının başına bir iş gələcəyindən qorxaraq atını saxladı; görünür o qadın belə bir görüş təyin etməklə çox təhlükəli bir iş tutmuşdu.

Kareta sürətini azaltmadan yoluna davam etdi və Parisə girdikdən sonra gözdən itdi.

Dostları d'Artanyanın yanına gəldilər. Onlar da karetanın pəncərəsindən uzanan qadın başını görmüşdülər; lakin Atosdan başqa heç kəs xanım Bonasyeni üzdən tanımırdı. Atosun fikrincə bu həmin qadındı. Atos karetanın dib tərəfində bir kişi də görmüşdü.

D'Artanyan belə düşünürdü: "Orada, doğrudan da, bir kişi varmışsa, demək qadını bir dustaqxanadan başqa bir dustaqxanaya aparırmışlar. Axı onlar bu yazıq qadına nə eləmək istəyirlər? Mən bir də öz sevgilimi görəcəyəmmi?"

Atos fikirli-fikirli dedi:

– Dostum, bu dünyada ancaq ölüb getmiş adamlarla görüşmək olmaz. Bunu siz özünüz də bilirsiniz, deyilmi? – Sonra da ona xas olan kədərli bir əda ilə əlavə etdi: – Ona görə də əgər sizin sevdiyiniz qadın ölməyibsə, onda siz gec-tez, bəlkə də arzu etdiyinizdən daha tez onu tapacaqsınız.



Saat səkkizin yarısı oldu.

Dostları d'Artanyana bir görüşə də gedəcəyini xatırlatdılar; eyni zamanda, ona dedilər ki, nə qədər gec deyil, bu fikirdən əl çəksin. Lakin d'Artanyan inadkar və hər şeylə maraqlanan bir adamdı. O, kardinalın sarayına getməyi qət etmişdi: bu adamın nə deyəcəyini bilmək istəyirdi.

Kiçik dəstə Parisə, Sent Onore küçəsinə qayıtdı və kardinal sarayı meydanında on iki nəfər muşketyora rast gəldi. Nə üçün çağırıldıqlarını onlara izah etdilər.

Kral muşketyorları alayında d'Artanyanı tanımayan yox idi; hamı bilirdi ki, d'Artanyan gec-tez muşketyorlar sırasına daxil ediləcəkdir; buna görə də qabaqcadan ona öz yoldaşları kimi baxırdılar. Bundan başqa, məsələ cənab kardinalın və onun yaxın adamlarını acıqlandırmaq üstündəydi; odur ki, bu ləyaqətli əsilzadələr təklifi məmnuniyyətlə qəbul etdilər.

Atos onları üç dəstəyə böldü. Dəstənin birinə özü başçılıq etməyi boynuna götürdü, digərini Aramisə, üçüncüsünü də Portosa tapşırdı.

D'Artanyan baş qapıdan içəri girdi. O, həyəcan içində, böyük bir pilləkənlə addım-addım yuxarı qalxmağa başladı. Başını bulaya-bulaya öz özünə deyirdi: "Əgər de Vard aramızda olan toqquşmanı kardinala deyibsə və əgər o, məni tanıyıbsa, demək mən özümü məhv olmuş hesab etməliyəm. Bəs nə üçün kardinal bu günə kimi gözləyib? Bu, tamamilə aydın bir məsələdir: hiyləgər miledi özünü riyakarcasına kədərli göstərərək məndən şikayət etmiş və mənim bu son cinayətim kardinalın səbrini tükətmişdir. Xoşbəxtlikdən, dostlarım aşağıdadır, bir şey olsa, onlar məni müdafiə edər, məni aparmağa qoymazlar. Lakin cənab de Trevilın bir bölük muşketyoru kardinala qarşı müharibə edə bilərmi?! Bütün Fransanın qüvvələri kardinalın hökmündədir; kraliça özü onun öhdəsindən gələ bilmir, onun əlində acizdir; hətta kral belə onu öz hökmü altına ala bilmir. D'Artanyan, dostum, sən igidsən, ağıllısan, sənin bir çox gözəl məziyyətlərin var, ancaq qadınlar səni məhv edəcəklər".

O, belə ağır fikirlərlə dəhlizə girdi, məktubu qapıçıya verdi. Qapıçı onu qəbul salonuna apardı, özü isə iç otağa getdi.

Salonda kardinalın beş-altı qvardıyaçısı vardı. Onlar d'Artanyanı tanıdılar. D'Artanyanın Jüssakı yaraladığını onlar bilirdilər, buna görə də d'Artanyana baxaraq qəribə bir təbəssümlə gülümsəyirdilər.

Bu təbəssum d'Artanyana çox məşum göründü. Lakin bizim qaskoniyalını qorxutmaq o qədər də asan deyildı. O, qürurla *qvardiyaçıların yanından ötüb getdi və əllərini belinə vurub, əzəmətli* halda dayanıb qapıçının gətirəcəyi cavabı gözləməyə başladı.

Növbətçi yavər içəri girdi və işarə ilə d'Artanyana ardınca gəl məsini təklif etdi. D'Artanyan onun dalınca getdi, bu vaxt ona elə gəldi ki, qvardiyaçılar onun getdiyini görüb bir-birilə pıçıldaşırlar. O, böyük bir zaldan keçib, kitabxanaya girdi və qarşısında bir adamın yazı mizı arxasında oturub yazı yazdığını gördü.

Növbətçi onu qoyub getdi, heç bir söz demədi. D'Artanyan yazı mizi ardında oturan adama diqqətlə baxmağa başladı.

Əvvəl ona elə gəldi ki, bu adam bir məhkəmə hakimidir, kiminsə işini gözdən keçirir; lakin az sonra gördü ki, o barmaqları ılə beytlərini saya-saya əlyazmasını düzəldir. D'Artanyan bıldı kı, qarşısındakı şairdir. Şair əlyazmasını bükübb başını qaldırdı; əlyazmasının üstündə bu sözlər yazılmışdı: "Miram", beş pərdəli faciə".

D'Artanyan onu tanıdı: miz arxasında oturan kardinal Rişelye idi.

## X

## DƏHŞƏTLİ XƏYAL

Kadinal üzünü əlinə dayayaraq qabağındakı cavana xeyli baxdı. Kardinal Rişelyenin heç kəsdə olmayan dərin, nufuzedici baxışları vardı.

D'Artanyan bu mənalı baxışlar altında özünü birtəhər hiss etdi; bununla belə, yenə özünü sərbəst tutmağa çalışdı.

O, fetr şlyapasını əlində tutaraq, təkəbbürlə, həm də sakitcə durub kardınal həzrətlərinin ona nə deyəcəyini gözləyirdi.

Kardinal soruşdu:

Cənab, bearnlı d'Artanyan sızsinizmi?

Bəli, monsinyor, mənəm.

– Tarbda və onun cəvarında bir çox d'Artanyanlar nəsli vardır. Siz bunların hansına mənsubsunuz?

Mən əlahəzrət kralın atası böyük kral Henrixlə bir yerdə dini müharibədə iştirak edən d'Artanyanın oğluyam.



– Belə. Deməк, təxminən, yeddi-səkkiz ay bundan əvvəl səadət axtarmaq üçün öz vətənindən paytaxta gələn sizsiniz?

Bəli, monsinyor.

Siz Menqdən keçib gəlmisiniz; orada da sizin başınıza bir hadisə gəlmişdir. Bunun nədən ibarət olduğunu mən yaxşı bilmirəm, ancaq orada nə isə bir hadisə olmuşdur...

D'Artanyan dedi:

Mənim başıma belə bir iş gəlmişdi...

Bunu söyləməniz artıqdır, artıqdır. – Kardinal gülümsəyərək onun sözünü kəsdı. Bu gülüş göstərirdi ki, bu hadisəni o, hadisəni nağıl etmək istəyəndən heç də pis bilmir. Sizdə cənab de Trevilə sizin haqqınızda yazılmış bir məktub da varmış. Düzdürmü?

- Bəli, monsinyor. Həmin Menqdə o mənhus hadisə ki, mənim başıma gəldi...

Onda siz o məktubu itirmisiniz. Mən bunu bılirəm. Cənab de Trevil adamı ilk baxışda tanıyan çox mahır simaçıdır. O, sizı öz yeznəsi cənab Dezessarın bölüyünə düzəltmiş və əmin etmış ki, bır az sonra siz muşketyorlar sırasına daxil olarsınız.

Monsinyorun əldə etdiyı məlumat çox düzgündür.

– O vaxtdan da sizin başınıza bir çox hadisə gəlmişdir. Bir dəfə sız karmelitlər monastırı dalında gəzirmişsiniz; sonra öz yoldaşlarınızla bərabər Forj sularına gəzməyə getmisiniz. Yoldaşlarınız yolda dayanıb, siz isə öz yolunuza davam etmisiniz. Bu, çox təbıi bir şeydir; çünkı sizin İngiltərədə ışiniz varmış.

D'Artanyan özünü itirmiş halda:

– Monsinyor, dedi, mən...

Demək istəyirsiniz kı, sız Vındzora və ya başqa bir yerə ova getmişdiniz; bunun heç kəsə dəxli yoxdur Mən bunu ancaq ona görə bilirəm ki, mənim borcum hər şeyi bilməkdir. Geri qayıdanda sizi həşəmətli bir xanım qəbul etmiş; mən görürəm ki, siz onun, bir yadigar olaraq, bağışladığı şeyi hələ də saxlayırsınız.

D'Artanyan, kraliçanın bağışladığı üzüyü barmağında tez çevirdi kı, qaşı görünməsin; lakin artıq gec idi. Kardinal üzüyü görmüşdü.

Kardinal sözünə davam etdi:

– Bu hadisənin səhərısı de Kavua sizın yanınıza gəlır O, sizi saraya dəvət etməyə gəlıbmiş. Siz getməyə razı olmamısınız və nahaq yerə də getməmisınız

Monsinyor, qorxdum ki, yəqın sız əlahəzrətin yanında bir günah iş gormüşəm

Niyə axı? Ona görəmi kı, sız öz rəisinizin əmrini heç kəsin görə bilməyəcəyi məharət və igidliklə yerınə yetirmişdiniz? Siz qorxmusunuz ki, mənim gözümdən düşərsiniz, halbuki siz bu hərəkətinizə görə ancaq təqdır oluna bılərdiniz. Mən, mənə boyun əyməyənləri cəzalandırıram, lakin əmri sizin kimı yerinə yetırənləri... çox yaxşı... yerinə yetirənləri yox. Buna sübut olmaq üçün sizin dalınızca adam göndərdiyimi və həmın axşam sizin başınıza nələr gəldiyini yadınıza salın.

Bu, xanım Bonasyenin oğurlandığı axşam idi.

D'Artanyan diksindi: o yarım saat əvvəl yazıq arvadın karetada yanından ötüb getdiyini xatırladı, şübhəsiz kı, indi onu apartdıran adam – onun itməsinə səbəb olan adam özü idı!

Kardinal sözünə davam etdı:

– Lakin bir qədər var ki, mən sizin barədə heç bir şey eşitmirdim; dedim görüm nə qayırırsınız. Bir də ki, siz mənə minnətdar olmalısınız; bunu yəqin siz özünüz də bilirsiniz ki, nə kımı ışə düşsəniz, sizi bərkə çəkmirdilər.

D'Artanyan hörmətlə baş əydi.

– Bu, ancaq ədalətli olmaq hissindən irəli gəlmirdi. Sizin haqqınızda mənim bəzi planlarım da vardı.

D'Artanyan get-gedə daha çox təəccüblənirdı.

- Mən sizə öz planımı ilk dəfə dəvətnamə göndərdiyim gün söyləmək istəyirdim. Lakin siz gəlmədiniz. Xoşbəxtlikdən bız heç bir şey itirməmişik. Bu planı indi sizə deyərəm. Cənab d'Artanyan, bax ora da, mənim qabağımda oturun. Siz elə bir nəcıb əsilzadə ailəsindən siniz ki, oturub da mənə qulaq asa bilərsiniz.

Kardinal bir əli ilə stulu göstərdi. Bu deyilənlər d'Artanyanı son dərəcə heyrətə salmışdı; belə ki, kardınal ikinci dəfə stulu göstərəndən sonra o gedib deyilən yerdə oturdu.

– Cənab d'Artanyan, siz igidsiniz, ağıllısınız, ağıllı olmağınız, şübhəsiz, daha yaxşıdır. Mən ağlı və qəlbi olan adamları sevirəm – kardinal gülümsədi. Ancaq sizin ürəyinizə ayrı şey gəlməsin: mən "qəlbi olan adam" deyəndə igid adamları nəzərdə tuturam. Sız cavansınız, həyata yeni qədəm qoyursunuz, bununla belə, sizın çoxlu və qüvvətli düşməniniz vardır. Ehtiyatlı olmasanız onlar sızı məhv edərlər.



– Əfsus ki, belədir, monsinyor. Onlar məni həm də çox asanlıqla məhv edərlər. Onlar güclüdürlər, çox güclü də arxaları var, mən isə təkəm.

Düz deyirsiniz. Lakın sız tək də olsanız çox şeylər eləmisiniz, hələ bundan sonra da eləyəcəksiniz, – mən buna şübhə etmirəm. Ancaq siz ki, belə bır təhlükəli yola qədəm qoymusunuz, mənim fikrimcə, sizə bir rəhbər lazımdır. Sız Parısə şöhrətpərəstlik məqsədilə gəlmisiniz ki, özünüzə mənsəb qazanasınız. Eləmi? Gərək ki, mən səhv etmirəm?!

– Monsinyor, mənim yaşımda olan adamlar çox vaxt çılğın ümidlər əsiri olurlar.

Çılğın ümidlər ancaq axmaq adamlarda olur, siz isə ağıllısınız. Qulaq asın, sizə bir söz deyəcəyəm: mən sizə mənim qvardiyamın bayraqdarı olmanızı təklif etsəm, müharibədən sonra da sizə bir bölük tapşırsam, siz buna nə deyərsiniz?

– Ah, monsinyor!

Siz razısınız, elə deyilmi?

D'Artanyan özünü itirdi və dili dolaşa-dolaşa dedi:

– Monsinyor...

Kardinal təəccüblə:

Necə, siz bunu rədd edirsiniz? dedi.

Mən əlahəzrət kralın qvardıyasında qulluq eləyirəm, monsinyor. Narazı olmağa əsasım yoxdur.

– Mənə elə gəlir ki, mənim qvardiyam, eyni zamanda əlahəzrət kralın öz qvardiyasıdır; siz Fransa ordusunun hansı bir alayında qulluq etsəniz, krala qulluq etmiş olursunuz

Kardinal həzrətləri məni ayrı cür başa düşdü.

– Sizə bir bəhanə lazımdır, eləmi? Mən bunu başa düşürəm. Yaxşı da, sizin ki, belə bir bəhanəniz var rütbənizın artması, müharibənin başlanması mənim sizə etdiyim təklif... Bunlar hamısı yüksək cəmiyyət üçündür; o ki qaldı şəxsən sizin özünüzə, - sizə mütləq möhkəm və güclü hamilər lazımdır; çünkı cənab d'Artanyan, bunu bilməyiniz pis olmaz ki, sizın bütün cinayətləriniz mənə məlumdur, siz müqəssirsiniz: siz ki, bütün gecə-gündüzünüzü krala xidmətdə keçirməyinizi ıddia edə bilməzsiniz'

D'Artanyan qızardı.

Kardinal əlini bir kağız bağlaması üstünə qoyub sözünə davam etdi:

Bunu da deyim ki, sizin haqqınızda bax, burada böyük bir iş düzəlib. Ancaq bunu oxumadan qabaq sizinlə bir danışmaq istədim. Mən sizı qəti adam kimı tanıyıram, sızın üzərinizdə yaxşı rəhbərlik olsa, etdiyiniz qulluq sizin başınıza əngəl açmaz, əksinə, sizə çoxlu xeyir gətirə bilər. Özünüz fikirləşin və həll edin.

Monsinyor, sizin bu yaxşılığınız məni utandırır; siz əlahəzrətin qəlbinin böyüklüyü və əzəməti mənə öz miskınliyimi hiss etməyə məcbur edir. Ancaq, monsinyor, madam ki, mənə açıq danışmağa ıcazə verirsiniz...

D'Artanyan sözünü yarımçıq qoydu.

- Danışın, danışın.

– Onda mən siz əlahəzrətə deməliyəm ki, mənim bütün dostlarım kral qvardiyasında, lakin bütün düşmənlərim qəza-qədərdənsə, nədənsə, siz əlahəzrətin qvardiyasında qulluq edirlər. Əgər sizin təklifinizi qəbul etsəm, həm sizin qvardiyasında məni yaxşı qəbul etməzlər, həm də kral qvardiyasında mənə pis nəzərlə baxarlar.

Kardinal nifrətedıcı bır təbəssümlə dedi:

Olmaya sizdə elə bır fikir əmələ gəldı kı, mən sızə layıq olmayan pis bir qulluq təklif edirəm və bununla da sizın ızzət-nəfsınizi təhqir eləyirəm?

Siz əlahəzrətləri mənə layiq olduğundan yüz qat artıq iltifat göstərirsıniz. Əksinə, mən hələ elə bir şey eləməmişəm kı, sizin bu iltıfatınıza layiq olum, - mən bunu düşünürəm. Monsinyor, bu yaxında Laroşelin mühasırəsı başlanacaq; mənim işim siz əlahəzrətın gözü qabağında olacaqdır. Əgər bu vuruşmada mən özümü göstərib, sizın diqqətinizi cəlb etmək xoşbəxtliyinə nail ola bilsəm, onda heç olmasa sizin mənə qarşı iltifat etdiyiniz hamiliyi doğruldacaq, bir igidlik etmiş olacağam. Hər şey öz vaxtında olmalıdır, monsinyor. Bəlkə də bır az sonra mən sizin xıdmətçiniz olmaq hüququna nail olacağam, lakin mən indi bunu etsəm, elə çıxacaq ki, mən satılmışam.

Kardinal narazı halda:

Başqa bir sözlə, siz mənə qulluq etməkdən boyun qaçırırsınız, dedi. O, narazı da olsa, səsində və ifadəsində d'Artanyana qarşı bır hörmət duyulurdu. Yaxşı da, öz nifrət və sevginizdə sərbəst qalın.

Monsinyor...

Kardinal onun sözunü kəsdi:



Yaxşı, yaxşı, mənim sizə acığım tutmur, siz bilirsiniz ki, biz ancaq öz dostlarımızı müdafiə etməli və mükafatlandırmalıyıq, düşməni yox, bununla belə, mən sizə məsləhət görürəm ki, ehtiyatlı olun, özünüzü yaxşı aparın. O dəqiqədən ki, mən sizi daha mühafizə etməyəcəyəm, sizin həyatınızın heç para qəpik də qiyməti olmayacaqdır...

Qaskoniyalı:

- Çalışaram, monsinyor, – dedi.

Rişelye qəti bir ifadə ılə:

– Sonralar sizin başınıza bir iş gəlsə, sizə bir bədbəxtlik üz versə, - dedi – yadınıza salın ki, mən sizi öz yanıma çağırdım, sizin bu bədbəxtlikdən qorumaq üçün hakimiyyətim daxilində olan hər şeyı etdim.

D'Artanyan əlini döşünün üstünə qoyub baş əydi:

Hər nə olursa olsun, siz əlahəzrətin bu anda mənə etdiyi yaxşılığa qarşı həmişə minnətdar olacağam.

– Demək, cənab d'Artanyan, necə ki, özünüz söylədiniz, biz müharibədən sonra görüşəcəyik. Mən sizı gözdən qoymayacağam, çünki mən özümdə Laroşelin ətrafında olacağam. O, hazırlanmış gözəl yaraq-yasağı əli ilə d'Artanyana göstərdi. – Qayıdandan sonra da... məsələni yoluna qoyarıq.

D'Artanyan uca səslə dedi:

Ah, monsınyor, məni öz nəzərinizdən salmayın! Əgər siz elə hesab edirsiniz ki, mən həqiqi bir əsilzadə kimi hərəkət edirəm, onda mənə qarşı bitərəflik göstərın.

Rişelye:

Cavan oğlan, dedi, mən ancaq o zaman bitərəflik göstərə bilərəm kı, əgər sizə söylədiyim sözləri bir daha təkrar etmək imkanına nail olam.

Rışelyenin bu axırıncı sözləri d'Artanyanı ən dəhşətli bir təhdiddən də artıq qorxutdu; çünki bununla o xəbərdarlıq edirdı: kardınal sənı böyük bir bədbəxtlıkdən qorumaq istəyirdi.

D'Artanyan ağzını açıb nəsə demək istədi. Lakin kardinal əmredici və məğrurcasına bir hərəkətlə ona görüşün qurtardığını bildirdı.

D'Artanyan otaqdan çıxdı. Elə o saat da ağciyərlik göstərərək geri qayıtmaq, kardinalın təklifini qəbul etmək istədi. Lakin Atosun ciddi və sərt siması onun gözləri önündə canlandı. Əgər o, kardinalın təklifini qəbul etsəydi Atos ona heç əl də verməzdi, ondan tamamilə üz çevirərdı.

D'Artanyan bundan qorxaraq özünü saxladı, geri dönmədi, qalxdığı pilləkənlə də aşağı düşdü. Atosa və dörd muşketyora rast gəldı.

Onlar narahat olmağa başlayıblarmış. D'Artanyan onları sakit elədi. Planşe də ağasının sağ-salamat kardinalın sarayından çıxdığını o biri keşikdə duranlara xəbər verıb artıq keşiyə ehtıyac qalmadığını bıldirməyə getdi.

Portosla Aramis bu qəribə görüşün səbəbini bilmək ıstədılər. D'Artanyan onlara ancaq bunu dedı:

– Cənab Rişelye məni ona görə çağırmışdır ki, öz qvardiyasında bayraqdar olmağı təklıf eləsin; mən də onun təklifini rədd elədım.

Portosla Aramis bir ağızdan:

Lap yaxşı eləmisiniz, dedilər.

Atos bərk fikrə getdi, heç bir söz soyləmədi. Sonra təklikdə ona dedi:

D'Artanyan, siz necə ki, lazımdı, elə də hərəkət etmisiniz, ancaq, deyəsən, yanılmısınız.

D'Artanyan dərindən ah çəkdi; çünki bu sözlər onun könlündəki gizli səslə tamamilə həmahəngdi; bu səs ona deyirdi ki, sənin başına böyük müsibətlər gələcək.

Ertəsi gün onlar getməyə hazırlaşdılar. D'Artanyan cənab de Trevillə vidalaşmağa getdi. O vaxt elə zənn edirdilər ki, qvardiyaçılarla muşketyorların ayrılığı çox sürməyəcək.

Cənab de Trevil d'Artanyandan bir şeyi ehtiyacı olub-olmadığı soruşdu. D'Artanyan da qürurla dedi ki, lazım olan şeylərin hamısını əldə etmişəm.

Gecə Dezessarın bölük qvardiyaçıları və cənab de Trevilin muşketyorları bir yerə yığışdılar; qvardiyaçılarla muşketyorlar bir-birilə dost idilər. Onlar ayrılırdılar; bir də Allah bilir nə vaxt görüşəcəkdilər, ya da bir də görüşəcəkdilərmi? Gecəni son dərəcə hay-küy və qızğınlıqla keçirtdilər; çünki belə hallarda qüssə və kədər ancaq ən böyük şənlik və qayğısızlıqla məğlub edilir.

Ertəsi gün şeypurlar səslənən kimi, dostlar ayrıldılar: muşketyorlar cənab de Trevilin evinə, qvardiyaçılar Dezessarın evinə yüyürürdülər; kapitanlar öz bölüklərini Luvra apardı; kral ordu hissələrini burada nəzərdən keçirirdi.

Kral kədərli idi; özü də elə bil xəstələnmişdi; bu hal onun qürurunu bir qədər yumşaltmışdı. Doğrudan da, dünən parlamentdə, iclas



zamanı onu titrəmə-qızdırma tutmuşdu. Bununla belə, o yenə həmin gecəni yola düşmək qərarını pozmadı; həkımlərın xəbərdarlığına baxmayaraq, ordu hissələrini nəzərdən keçırməklə xəstəliyi susdurmaq ümidində idi.

Kral ordu hissələrini nəzərdən keçirdikdən sonra qvardiyaçılar tək yola düşdülər. Muşketyorlar isə ancaq kralla getməli idilər. Buna görə də Portos öz gözəl yaraq-yasağı ilə Ayı küçəsinə gəlməyə imkan tapdı. Prokurorun arvadı onu yeni mundirdə, gözəl at belində gördü. O, Portosu çox sevirdi, onunla uzaqdan-uzağa belə ayaqüstü ayrıla bilməzdi; atdan düşüb yanına gəlməsini əli ilə işarə etdi. Portosun çox qəşəng və əzəmətli bir görünüşü vardı: yeridikcə mahmızları bərk-bərk səslənirdi, əynindəki zıreh par-par parıldayırdı, qılıncı qıçına dəyirdi. Portosun elə zəhmli bir görünüşü vardı ki, bu dəfə prokurorun mirzələri qətiyyən gülmək həvəsinə düşmədilər.

Muşketyoru cənab Koknarın kabinetinə apardılar. Yeni geyimdə par-par parıldayan "əmisi oğlunu" görəndə onun xırda boz gözləri hiddətlə parıldadı. Prokurora bircə şey təskinlik verirdi: hamı deyirdi ki, hərbı səfər çox ağır olacaq, buna görə də o ümid edirdi ki, Portos geri qayıtmayacaq, vuruşmada öləcəkdir.

Portos cənab Koknara bir neçə qəşəng söz deyib onunla xudahafizləşdi. Cənab Koknar da ona müvəffəqiyyətlər arzu etdi. Lakin xanım Koknar göz yaşını saxlaya bilmədi; onun kədəri belə hallarda heç də pis nəticə vermırdi, çünki onun öz qohumlarına olan dərin məhəbbəti hamıya məlum idi. Buna görə də əsl vıdalaşma xanım Koknarın otağında baş verdi. Özü də ürəyı rıqqətə gətirən çox təsirlı bir vidalaşma oldu.

Portos yola düşəndə prokurorun arvadı pəncərədən bayıra uzanaraq sevgilisi gözdən itənə qədər yaylığını yellədi; pəncərədən elə boylanmışdı kı, sankı oradan aşağı atılmaq istəyirdi. Portos bu sevgi ifadələrini belə hallara öyrənmiş bir adam kimı qəbul etdiyindən ancaq tindən dönərkən fitr şlyapasını çıxartdı, vıdalaşmaq əlaməti olaraq onu yellədi.

Aramis uzun bır məktub yazırdı. Kimə? Bunu heç kəs bilmirdi. Kettı yan otaqda onu gözləyirdi; o da həmin axşam Tura getməli idi.

Atos İspaniya şərabının son şüşəsini qurtum-qurtum ıçərək qurtarırdı

Bu zaman d'Artanyan öz bölüyü ilə nizamla hərəkət edirdi. Sent-Antuana çatandan sonra d'Artanyan həvəslə Bastıliyaya baxdı və bu

vaxt səmənd at üstündə ötüb keçən miledini görmədi; miledi iki nəfər şübhəli adama onu barmağı ilə göstərirdi. Bu iki adam d'Artanyanı daha yaxşı *tanımaq üçün dərhal bölük sıralarına yaxınlaşdı. Onların sualedici* baxışlarına miledi işarə ilə müsbət cavabı verdi. Əmrinin düzgün başa düşüldüyünü yəqin etdikdən sonra atını mahmızlayıb gözdən itdi.

O, iki naməlum adam da bölüyün ardınca getdi. Onlar Sent-Antuan şəhər qapısı iki nəfər qeyri-rəsmi geyimli xidmətçinin yedəkləyib saxladığı atlara mindilər.

## XI

## LAROŞELİN MÜHASİRƏSİ

Laroşelin mühasirəsi XIII Ludovikin padşahlıq dövrünün ən mühüm siyasi hadisələrindən və kardinalın ən böyük hərbi tədbirlərindən biri idi. Mühasirə haqqında bir neçə kəlmə də olsa danışmaq lazım gəlir; bu mühasirənin bəzi cəhətləri bizim nağıl etdiyimiz əhvalatla son dərəcə əlaqədar olduğundan bu barədə danışmamaq olmaz. Kardinalın güddüyü siyasi məqsəd çox mühüm idi. Ən əvvəl bundan bəhs edək, sonra da başqa məqsədlərindən danışaq; bunlar öz-özlüyündə onun üçün heç də siyasi məqsədlərindən az əhəmiyyətli deyildi.

İstehkam olmaq etibarilə, böyük şəhərlərdən qugenotların hakimiyyəti altında qalan bircə Laroşel idi; ardı-arası kəsilməyən xarici müharibələrə və daxili həyəcanlara səbəb olan kalvinizmin bu son istinadgahını da məhv etmək lazım idi.

Narazı ispaniyalılar, ingilislər, italyanlar, bütün millətlərdən olan fırıldaqçılar, qulluqdan çıxmış və müxtəlif təriqətlərə mənsub olan əsgərlər ilk çağırışda protestantların bayrağı altında toplaşır və qolbudağı bütün Avropaya yayılan böyük cəmiyyət kimi bir şey meydana gəlirdi.

Deməк, kalvinistlərin başqa istinadgahları ləğv edildikdən sonra daha böyük bir əhəmiyyətə malik olan Laroşel daxili vuruşmalar və fitnə-fəsad yuvası olmuşdu. Bundan başqa, Laroşel limanı, ingilislərin üzünə açıq qalan fransızların axırıncı limanı idi. Kardinal, Fransanın qədim düşməni olan İngiltərənin üzünə bu limanı bağlamaqla İngiltərəyə ciddi bir zərbə endirmiş olurdu.



Buna görə də, Laroşeli mühasirə edən dəstələrdən birinin başçısı olan Bassompyer, – o Bassompyer ki, həm protestant, həm də katolik idi, yəni əqidəcə protestant, müqəddəs ruh cəmiyyəti komandoru olmaq etibarilə katolik idi; o Bassompyer ki, anadan alman doğulmağına baxmayaraq, qəlbən fransız idi, - həmin Bassompyer bir neçə protestant əyanın yanında dedi:

Görərsiniz, ağalar, biz axmaqlıq edib Laroşeli tutacağıq.

Bassompyer səhv etmədi. Re adasının topa tutulması, – Sevenna draqonadları[1] amansızlığının başlanğıcı idi,

Laroşelin alınması isə Nant qanununun ləğv edilməsinə bir müqəddimə oldu.

Lakin yuxarıda göstərdiyimiz kimi, nazirin (kardinalın) mütləqiyyətə yol açan geniş siyasi planları ilə yanaşı, qısqanc bir aşiq və rəqib olmaq etibarilə, bir sıra xırda məqsədləri də var idi ki, tarixçi bunları istər-istəməz qeyd etməyə məcburdur.

Hamıya məlumdur ki, Rişelye kraliçaya vurulmuşdu; bu sevgi onun əlində siyasi məqsədlərə xidmət edən bir vasitəmi idi, ya o, öz gözəlliyi ilə ətrafdakıları məftun edən avstriyalı Annanı doğrudanmı sevirdi və bu hisslə mübarizə etməyə acizdi, bunu biz qəti söyləyə bilmərik. Hər halda Bekinhem hersoqu kitabın əvvəlki fəsillərində kardinalı üstələmişdi, hətta iki-üç dəfə də, xüsusilə boyunbağı məsələsində, onu çox axmaq bir vəziyyətdə qoymuşdu.

Buna görə də Rişelye həm Fransanı düşməndən xilas etmək, həm də öz rəqibindən qisas almaq istəyirdi; bütün bir krallıq ordusunu döyüş qılıncı kimi əlində tutan bir adamın qısası böyük, təntənəli və hər cəhətdən özünə layiq olmalı idi. Rişelye bilirdi ki, İngiltərə ilə vuruşmaqla Bekinhem hersoqu ilə də vuruşur, İngiltərəyə qalib gəlməklə Bekinhem hersoquna da qalib gəlmiş olur.

Bir sözlə, o, İngiltərəni Avropanın nəzərində alçaltmaqla hersoqu da kraliçanın nəzərində alçaltmış olurdu.

Hersoqu da maraqlandıran həmin məsələlərdi: o da kardinaldan qisas almaq üçün bir fürsət axtarırdı. Fransaya o bir elçi kimi deyil, düşməninə qalib gəlmiş bir adam kimi qayıtmaq istəyirdi.

[1] Draqonad Nant fərmanı ləğv edildikdən sonra Fransanın cənubunda (Sevennada) protestantların təqib olunması belə adlandırılmara başladı və bu işdə kral draqunları öz vəhşiliklərini xüsusilə göstərdilər.

İlk müvəffəqiyyətlər hersoq tərəfində oldu. O, doxsan gəmi və təxminən, iyirmi min qoşunla Re adasına qəflətən hücum edərək, qoşun komandanı qraf de Tuarakı pis bir vəziyyətdə qoydu və qanlı vuruşmadan sonra adaya qoşun çıxartdı.

Qraf de Tuarak La Pre adlanan kiçik bir limanda yüzə qədər adam qoyub öz qarnizonu ilə müqəddəs Martin qalasına çəkildi.

Bu hadisə kardinalın qəti tədbir görməsini sürətləndirdi Kralla bərabər Laroşelin mühasirəsinə şəxsən rəhbərlik etmək vaxtı gəlib çatıncaya qədər, kardinal ilk hərbi əməliyyata komandanlıq etmək üçün kralın qardaşını cəbhəyə göndərdi və tapşırdı ki, ixtiyarında olan bütün qoşunu müharibə meydanına toplasın. Bizim dostumuz d'Artanyan da ön dəstədə idi.

Yuxarıda dediyimiz kimi, kral parlament iclasından sonra dərhal öz ordusuna başçılıq etmək fikrində idi; iyunun 23-də titrətmə gəldiyini hiss etdisə də, yenə getmək qərarını pozmadı. Lakin yolda özünü pis hiss edərək Villeruada qalmağa məcbur oldu.

Kralın muşketyorları da orada dayanmalı oldu.

Bu qayda ilə, d'Artanyan qvardiyada qulluq etdiyindən, öz səmimi dostlarından – Atosdan, Portosdan və Aramisdən ayrı düşdü. Bu ayrılıq gənc qvardiyaçının ancaq kefini pozurdu; lakin o, qarşıda duran təhlükəni duymuş olsaydı, daha artıq narahat olardı.

D'Artanyan 1627-ci il sentyabrın 10-da, başına heç bir hadisə gəlmədən, Laroşel ətrafındakı düşərgəyə gəldi, hər şey əvvəlki vəziyyətində idi: Bekinhem hersoqu Re adasını tutduqdan sonra müvəffəqiyyətsiz həmlələrlə müqəddəs Martin qalasını və La Pre limanını mühasirəyə almağa çalışırdı. Laroşel önündəki vuruşma iki-üç gün idi ki, başlamışdı; Anqulem hersoqu şəhərin önündə yenicə kiçik bir istehkam düzəltmişdi.

Dezessarın komandası altında olan qvardiyaçılar fransiskan monastırında yerləşmişdilər.

Bildiyimiz kimi d'Artanyan muşketyor olmaq arzusu ilə yaşadığından qvardiyaçı yoldaşları ilə dostlaşmağa çalışmırdı. O, tənhalıq içərisində öz düşüncələrilə məşğuldu.

Bu düşüncələr də könülaçan düşüncələr deyildi. Parisə gələndən bəri bütün işi gücü siyasi intriqalara qarışmaqdan ibarət olmuşdu. Onun şəxsi işləri isə heç də yaxşı vəziyyətdə deyildi. Yeganə sevgilisi olan xanım Bonasye oğurlanmışdı və yazıq qadının başına nələr



gəldiyini bilmirdi. O, heç bir mənsəb də qazana bilməmişdi, bununla bərabər, özü bearnlı xırda bir mülkədar olduğu halda, kardinal kimi bir adamla hələ bir düşmən də olmuşdu; elə bir adamla ki, bütün döşünə döyənlər, hətta kral belə onun qarşısında tir-tir əsirdi!

D'Artanyanı məhv etmək kardinalın əlində heç bir şeydi, lakin nədənsə o bunu etmirdi; bizim uzaqgörən qaskoniyalı isə kardinalın bu mərhəmətində öz gələcəyi üçün yaxşı bir şey duyurdu.

Sonra o, özünə başqa bir düşmən də qazandı ki, bu da miledi idi; onun fikrincə, miledi kardinala görə zəif bir düşməndi, lakin hər necə olsa onu saymamaq da olmazdı

D'Artanyan bunun qarşısında kraliçanın hüsn-rəğbətini qazanmışdı: lakin o vaxtlar kraliçanın himayəsi ona daha artıq zərər yetirə bilərdi; çünki kraliça öz dostlarını müdafiə edə bilmirdi. Xanım Bonasyenin başına gələn hadisə buna gözəl bir sübut idi

Parisə gələndən bəri onun əldə etdiyi yeganə şey barmağına taxdığı brilyant üzük idi. Üzüyün brilyantı beş-altı min livrə dəyərdi; d'Artanyan onu saxlayırdı ki, fürsət düşəndə bunun köməyilə kraliçanın yanına gedə bilsin; buna görə də hələlik bu brilyant, gənc qvardiyaçının ayaqları altında qalan xırdaca daşlardan heç də qiymətli deyildi.

Biz brilyantı ayaqaltında qalan xırdaca daşlarla ona görə müqayisə etdik ki, d'Artanyan bu məsələləri düşərgədən Anquten kəndinə gedən gözəl, ensiz bir yolla gəzə-gəzə düşünürdü. Fikrə daldığından o, xeyli uzağa getmişdi. İkindi vaxtı idi. Birdən ona elə gəldi ki, batan günəşin son şüaları altında çəpər dalından bir muşketin lüləsi parıldadı.

D'Artanyan itigözlü idi, şeyi də tez başa düşəndi. O saat ağlına gəldi ki, muşket öz başına ora düşə bilməz, kim isə çəpər dalında gizlənərək onu əlində tutmuşdur, məqsədi də, yəqin ki, başqa şeydi. Qaçmaq istədi, lakin birdən yolun o biri tayında, qaya dalında başqa bir muşketin lüləsi gözünə sataşdı.

Görünür onu güdürlərmiş. Əvvəl birinci muşketin lüləsinə baxdı, tüfəngi düz onun üstünə tuşlayırdılar; bundan bir qədər narahat oldu. Lakin birdən tüfəng lüləsinin sakitləşdiyini gördü, elə o saat da üzüstə yerə atıldı. Elə o anda da tüfəng atıldı, güllə onun başı üstündən vıyıldayaraq keçdi. Belə bir vəziyyətdə bir an da olsa vaxt itirmək olmazdı. Cəld ayağa qalxdı, o biri muşketdən atılan güllə d'Artanyanın uzandığı yerdə olan çınqılları vurub dağıtdı.

Adam var ki, qəhrəmanlıqda adı çəkilsin deyə özünü nahaq yerə ölümə verər; d'Artanyan elə adamlardan deyildi. Bir də ki, burada qəhrəmanlıq naminə bir şey də yox idi: o ancaq öz diqqətsizliyi üzündən tələyə düşmüşdü.

O, öz-özünə dedi: "Üçüncü güllə açılsa, demək mən məhv oldum".

Odur ki, sürətlə düşərgəyə sarı yüyürməyə başladı: elə yüyürdü ki, ancaq bearnlılar belə yüyürə bilərdi. Lakin nə qədər bərk yüyürsə də, ilk gülləni atan adam yenə də tüfəngini doldurub onun dalından atdı. Güllə bu dəfə boşa çıxmadı: d'Artanyanın fetr şlyapasını deşdi və başından götürüb atdı; şlyapa ondan on addım qabağa düşdü. D'Artanyanın başqa şlyapası yox idi. Dayanıb şlyapanı götürdü və yenə də qaçmağa üz qoydu.

Düşərgəyə çatanda o, bərk tövşüyürdü. heç kəsə bir söz demədən, stul üstə oturub bərk fikrə daldı.

Bu hadisənin səbəbini üç cür izah etmək olardı. Onun birinci və ən təbii izahı bu idi: görünür laroşellılər pusquda yatıb onu öldürmək istəyirmişlər; çünki kral qvardiyaçılarından birini tələf eləmək özü də bir qənimətdi, – heç olmasa düşmənin biri azalardı. Bir də ki, bu adamın cibindən bəlkə pulla dolu bir kisə də tapmaq olardı.

D'Artanyan şlyapasını çıxartdı, güllənin açdığı dəliyi hər tərəfdən yoxlayıb başını yellədi. Güllə muşketdən deyil, cır tüfəngdən atılmışdı; özünün də əldəqayırma güllə olduğu aydınca görünürdü. Demək bunu atan hərbi adam deyilmiş.

Bu hadisə cənab kardinaldan da baş verə bılərdı. Oxucunun ya dındadır ki, tüfəngin lüləsi d'Artanyanın üstünə tuşlandığı anda o, kardinalın bu vaxta kimi səbir edib durduğuna, onu öldürtmədiyinə çox təəccüb etmişdi.

Lakin bunu düşünərkən yenə də başını yellədi: kardınal bır əl işarəsilə məhv edə biləcəyi adamlar haqqında çox az vaxtda belə bir tədbir görərdi.

Bəlkə də miledi ondan qisas almaq istəyirdi? O birilərə görə bu daha ağıl kəsəndi.

D'Artanyan qatillərin simasını və geyimlərini təsəvvür etmək istədi, lakin bu, mümkün olmadı. O, elə tez qaçmışdı kı, onlara heç baxa da bilməmişdi.

D'Artanyan bunları düşünərkən pıçıldayaraq öz-özünə dedi: "Ah, mənim dostlarım, siz indi haradasınız? Bilsəniz, indi mənim sizə necə ehtiyacım var!"



D'Artanyan gecəni çox səksəkəli yatdı. Üç-dörd dəfə yuxudan ayılıb dik qalxdı, ona elə gəlirdi ki, kım isə çarpayıya yaxınlaşıb onu öldürmək istəyir. Lakin gecə heç bir hadısə baş vermədi. Ancaq d'Artanyan bunu yaxşı bilirdi ki, dünən baş tutmayan sui-qəsd sabah yenə də təkrar oluna bilər.

Bütün günü evdən bayıra çıxmadı; havanın pisliyini bəhanə edərək özünü öz gözündə doğrultmağa çalışırdı. Hadisənın üçüncü günü, səhər saat doqquzda şeypurlar çalındı: Orlean hersoqu qarovul məntəqələrini yoxlayırdı.

Qvardiyaçılar cəld tüfənglərini götürub sıraya düzüldülər. D'Artanyan da yoldaşları arasında öz yerini tutdu. Kralın qardaşı bütün sıra qabağından keçib getdi. Sonra bütün baş zabitlər salam üçün onun ətrafına toplaşdılar. Qvardiya kapitanı Dezessar da o biri zabitlərlə bərabər hersoqun yanına gəldi. Bir az sonra d'Artanyana elə gəldi ki, Dezessar ışarə ilə onu öz yanına çağırır. Səhv edəcəyindən qorxaraq öz rəisinin bir də işarə etməsini gözlədi. Dezessar öz işarəsini təkrar etdikdən sonra d'Artanyan sıradan çıxıb ona yaxınlaşdı.

Hersoqun çox ciddi bir tapşırığı var; bunu öz arzusu ilə yerinə yetirməyə adam istəyir. Mən də sizə işarə etdim ki, hazır olun.

D'Artanyan:

Təşəkkür edirəm, kapıtan! – dedi. Onun ən çox arzu etdiyi şey baş komandanın müavini qarşısında özunu göstərmək və başqaların dan fərqlənmək idi.

Gecə laroşellilər qəflətən hücuma keçıb ikı gün əvvəl kral ordusu tərəfindən tutulmuş istehkamı geri almışdılar. Odur ki, təhlükəli bir kəşfiyyat əməliyyatı keçirıb, istehkamı mühafizə edən əsgərlərin sayını bilmək lazımdı.

Hersoq bir neçə dəqiqədən sonra dedi:

Mənə etibarlı bir adamın rəhbərliyi altında üç dörd qoçaq könüllü lazımdır!

Dezessar d'Artanyanı göstərib dedi:

– Zatı-alıləri, mənim etibarlı adamım var. Təki sız əmr edin, bu kimi beş-altı adam həmışə tapıla bilər.

D'Artanyan qılıncını qaldırıb dedi:

– Mənimlə getmək istəyən dörd adam istəyirəm!

Onun qvardiyaçı yoldaşlarından ikisı dərhal qabağa çıxdı. İki əsgər də onlara qoşuldu. D'Artanyan birincı çıxanları qırmamaq uçun başqa getmək istəyənlərin hamısını rədd etdi.

İstehkamı aldıqdan sonra laroşellilərin nə etdikləri qarnizonu orada saxlayıb–saxlamadıqları məlum deyildi. Bunu bilmək üçün kəşfiyyata getmək lazımdı.

D'Artanyan dörd yoldaşı ilə səngər boyu irəliləməyə başladı: iki qvardiyaçı onunla yan-yana gedirdi, əsgərlər isə daldan gəlirdi. Kəşfiyyatçılar daş ilə hörülmüş səngərin dibi ilə irəliləyərək istehkamın yüz addımlığına çatdılar. D'Artanyan dönüb geriyə baxdı: əsgərlər yox olmuşdu.

O, elə başa düşdü ki, əsgərlər qorxudan dalda qalmışlar; yoldaşlarına qabağa getməyi əmr etdi.

Üç qoçaq kəşfiyyatçı istehkamın altmış addımlığına yaxınlaşdı. Orada heç kəs görünmürdü. İstehkam sanki tərk edilmişdi.

Kəşfiyyatçılar tərəddüd içində idilər: bilmirdilər irəlimi getsinlər, ya gerimi qayıtsınlar. Elə bu anda istehkamın üstünü tüstü bürüdü: bir neçə tüfəng atıldı, güllələr d'Artanyanla yoldaşlarının ətrafına düşdü.

Onlar istədikləri şeyi bildilər: istehkam müdafiə edilirdi. Artıq bu təhlükəli yerdə durmaq nahaqdı. D'Artanyanla iki qvardiyaçı yoldaşı çəkilib geriyə üz qoydular.

Səngərə çatanda bir güllə açıldı. Qvardiyaçılardan biri yıxıldı: Güllə onun döşündən dəymişdi. Salamat qalan o biri qvardiyaçı dayanmadı, öz yoluna davam etdi.

D'Artanyan yaralı yoldaşını qoyub getmək istəmədi. Əyilib onu qaldırmaq istədikdə iki güllə də açıldı: güllələrdən biri yaralı qvardiyaçının başına dəydi, o biri isə d'Artanyanın lap yanından keçib daşa sancıldı.

D'Artanyan cəld geriyə baxdı. Düşmən gülləsi bura gəlib çata bilməzdi. Geridə qalmış əsgərlər yadına düşdü. Dünənki hadisəni xatırladı və bu adamların kim olduğunu bilmək qərarına gəldi. Qışqıraraq yerində sarsıldı, özünü ölülüyə vuraraq yoldaşının cəsədi üstünə düşdü.

Həmin saat otuz addım aralıda, səngərin alçaq torpaq bəndi üstündə iki adam başı göründü. D'Artanyan səhv etmirdi: bu iki əsgər onu öldürmək məqsədilə kəşfiyyata gəlmişdi. Görünür, onlar d'Artanyanın ölümünü düşmənin boynuna yıxmaqla yaxalarını qurtara biləcəklərinə arxayın olmuşlar. Lakin d'Artanyan ancaq yaralana da bilərdi; buna görə gəlib onun işini bitirmək istədilər. Qaskoniyalının bicliyinə aldanaraq tüfənglərini doldurmayıb ona sarı gəlməyə başladılar.



D'Artanyan əsgərləri on addım yaxınına buraxıb birdən yerindən sıçradı və onların qabağını kəsdi.

Xainlər bildilər ki, d'Artanyanı öldürməmiş düşərgəyə qayıtsalar, işləri əngəl olacaq. Odur ki, ilk fikirləri düşmən tərəfinə qaçmaq oldu. Onlardan biri tüfəngin lüləsindən yapışıb qaldırdı, d'Artanyanın təpəsinə dəhşətli bir zərbə endirmək istədi. D'Artanyan cəld özünü yana verdi, bununla da istehkama sarı qaçmaq istəyən quldura yol açdı. Lakın laroşellılər bu adamın nə məqsədlə onlara tərəf qaçdığını bılmirdılər: açılan güllə xainı yerə sərdı.

D'Artanyan. o biri əsgərin üstünə atıldı. Mübarizə çox davam etmədi: qvardiyaçının qılıncı tüfəngin lüləsi üstündən sürüşərək qatilin ombasını yaraladı. O yıxıldı D'Artanyan o saat qılıncının ucunu onun boğazına dirədi.

Quldur qışqırdı.

Ah, məni öldürməyin! Rəhm edin, rəhm edin, cənab zabit, hamısını açıb sizə deyim.

D'Artanyan soruşdu:

Sənin deyəcəyin sirr sənə aman verməyimə dəyərmi?

Əgər siz öz həyatınızın qədrini bilirsinizsə, dəyər! Sizin ancaq iyirmi iki yaşınız və parlaq bir gələcəyiniz var!

– Alçaq! Di tez söylə, məni öldürməyi sənə kim tapşırıb?

Tanımadığım bir arvad. Onun adı miledi idi.

Sən bu arvadı tanımırsansa, adını haradan bilirsən?

Mənim yoldaşım onu tanıyırdı, adını da bilirdi. Miledi onunla danışıb sözləşmişdi, mənimlə yox. Onun cibində hətta miledidən aldığı məktub da var. Yoldaşımdan eşitdiyim sözlərə əsasən deyim ki, sizə bu məktubun məzmunu ilə tanış olmaq vacibdir.

Necə oldu ki, sən bu alçaq işə qoşuldun?

– Yoldaşım dedı ki, sizi öldürməyə kömək edim, mən də razı oldum.

Miledı bunun üçün sizə nə qədər vermişdir?

– Yüz luidor.

D'Artanyan gülərək dedı:

– Yaxşı ki, o, mənə belə yüksək qiymət qoymuşdur! Yüz luidor sizin kımi alçaqlar üçün çox böyük puldur. Sənin bu işə razı olmağın məni təəccübləndirmır. Mən səni öldürmürəm, ancaq bir şərtlə...

Əsgər məsələnin hələ tamam həll olunmadığını görüb təşvişlə soruşdu:

– Hansı şərtlə?

– Sən gedib yoldaşının cibindəki məktubu mənə gətirməlisən.

– Bu özü elə məni başqa yolla öldürmək deməkdir! Mən bu məktubu istehkamdan atılan güllə altında necə gedib gətirə bilərəm?!

– Sən mütləq gedib məktubu gətirməlisən. Getməsən, canın üçün, səni öldürəcəyəm!

– Amandır, cənab zabit! Mənə yazığınız gəlsin. Ölmüş zənn etdiyiniz cavan bir qadın ki var, heç olmasa ona olan sevginiz xatirinə, mənə rəhm edin! O sağdır!

Quldur bunu deyib dizləri üstə düşdü, əllərini yerə verərək özünü saxladı: yarasından gedən qan get-gedə onu zəif salırdı.

D'Artanyan soruşdu:

– Sən haradan bilirsən ki, mənim sevdiyim bir qadın var və mən onu ölmüş zənn edirəm?

– Həmin o məktubdan!

– İndi özün görürsən, ki, bu məktub mənə nə qədər lazımdır. Mən mütləq onu əldə etməliyəm. Bu saat gedib onu gətirməlisən, yoxsa and olsun namusuma, qılıncımı sənin kimi bir alçağın qanına ikinci dəfə bulamaq mənə nə qədər iyrənc olsa da...

Bunu deyib qorxunc bir hərəkətlə əlini qılıncının dəstəsinə apardı. Yaralı bunu görüb ayağa qalxdı, qışqıraraq dedi:

– Dayanın, dayanın! Gedirəm, gedirəm!..

Qorxu onu cəsarətləndirmişdi.

D'Artanyan əsgərin cır tüfəngini əlindən aldı, qılıncın ucu ilə onu bızləyə-bizləyə yoldaşına sarı getməyə məcbur etdi.

Bu bədbəxtə baxanda adamın yazığı gəlirdi: irəlilədikcə yolda qanlı bir iz buraxır, özünü mümkün qədər düşməndən gizlədərək iyirmi addım aralıda yerə sərilib qalan yoldaşının yanına getməyə çalışırdı.

D'Artanyanın ona rəhmı gəlib dedi:

– İndı bu saat mən sənə əsl kişi ilə sənın kimı qorxaq arasında olan fərqi göstərərəm. Dayan. Qayıdıb özünü yenə daldaya verə bilərsən. Məktubun dalınca özüm gedəcəyəm!

D'Artanyan düşmənı gözdən qoymayaraq və özünü müdafiə üçün yerli şəraitdən məharətlə ıstifadə edərək cəld o biri əsgərin yanına getdi.

D'Artanyan elə oradaca məktubu onun cibindən götürə bilərdi, ya onu dalına atıb, bir qalxan kimi ondan istifadə edərək səngərə gətirər, burada onun ciblərini axtara bilərdi.



O, ikinci yolu daha əlverişli hesab etdi: quldurunu dalına atdı; elə bu anda laroşellilər atəş açdılar.

Üç güllə əsgərin bədəninə dəyərək boğuq-boğuq səsləndi, əsgər yüngülcə titrədi, axırıncı dəfə olaraq qışqırdı, bədənini ölüm rəşəsi bürüdü: d'Artanyanı öldürmək istəyən adam ındı onu ölümdən xilas etmişdi.

D'Artanyan son kərə qayıdıb cəsədi dalından yerə atdı Dərhal ciblərini yoxlamağa başladı. Cibindən bir pul kisəsi, bir meşin qovluq, bir balaca buynuz, üç də aşıq çıxdı: ondan qalan irs ancaq bundan ibarətdi; aldığı pulun bir hissəsi də pul kisəsində idi.

Buynuzu və aşıqları yerə atdı, pul kisəsini yaralı əsgərin üstünə tulladı və cəld meşin qovluğu açdı, kağızı tapdı. Bu kağızdan ötrü o özünü ölüm təhlükəsinə atmışdı.

Kağızda bu sözlər yazılmışdı:

*"Siz o qadının izini itirdiniz. O, indi monastırda tam təhlükəsiz bir vəziyyətdədir. Çalışın, heç olmasa, kişini əldən buraxmayın. Yoxsa işiniz əngəl olar: siz mənim kim olduğumu yaxşı bilirsiniz; aldığınız pul sizə çox baha oturar".*

Kağızın altında imza yox idi, lakin aydınca görünürdü ki, onu miledi yazmışdır.

D'Artanyan kağızı çibinə qoydu; lazım gəlsə, gələcəkdə ondan bir sənəd kimi istifadə etmək olardı. Səngərin tini ardında, təhlükəsiz bir yerdə oturub yaralı əsgəri danışdırmağa başladı. O boynuna aldı ki, mən, yoldaşımla bərabər, Laviliyet qarovulxanasından keçib Parisə gedən cavan bir qadını oğurlamaq istəyirdim, bunun üçün də hər ikimiz hazırlaşmışdıq. Ancaq meyxanada oturub başımız içkiyə qarışdığından on dəqiqə gecikdik; biz yola çıxanda kareta artıq ötüb getmişdi.

D'Artanyan təşvişlə soruşdu:

– Siz o qadına nə etməli idiniz?

Yaralı cavab verdi:

– Biz onu Kral meydanında olan bir evə aparmalıydıq.

D'Artanyan öz-özünə pıçıldadı: "hə, hə, düz deyir: miledinin evinə aparmaq istəyirlərmiş..."

Cavan oğlan, miledinin necə dərin bir intiqam hissilə həm onu, həm də onun sevdiyi adamları təqib etdiyini ancaq ındi başa düşdü. Miledinin saray intriqalarına bu qədər yaxşı bələd olduğundan, bu

məlumatların ona kardinal tərəfindən verildiyini öz özlüyündə qət etdi.

Kralıça, nəhayət, xanım Bonasyenın öz sədaqətliliyi üzündən hansı dustaqxanaya düşdüyünü bılib onu azad etdirmişdi, d'Artanyan bunu eşidəndə son dərəcə sevindi. Gənc qadının ona kağız yazmasının səbəbi və onun karetada bır xəyal kımi Şayo yolundan keçib getməsi indi d'Artanyana tamamilə aydın oldu.

Atos haqlı ımiş: xanım Bonasyeni axtarıb tapmaq mümkündür, – monastır keçılməz bir qala deyıldi!

Bu fikir onun ürəyində yaralı əsgərə qarşı dərin bir məhəbbət hissi oyatdı. D'Artanyan yaralıya sarı çevrıldı, əlini ona uzadıb dedi:

– Gedək, mən səni bu halda qoyub getmərəm. Qolumdan tut, düşərgəyə gedək.

Yaralı belə bir alicənablığa inana bilmirdi:

Məni aparıb sonra boğazımdan asdırmaqmı istəyirsən?

– Mən sənə aman verəcəyimi vəd etdim, ikinci dəfə sənə söz verirəm.

Yaralı dizləri üstə düşüb öz xilaskarının ayaqlarını öpdü.

Düşmənə belə yaxın bır məsafədə olmaq artıq d'Artanyana lazım deyildi; buna görə də o, yaralının təşəkkürünə nəhayət verib tez yola düşdü. İstehkamdan ilk atəş açılarkən düşərgəyə qayıdan qvardiyaçı dörd yoldaşının tələf olduğunu söyləmişdi; cavanın sağ-salamat gəlib çıxması alayda hamını təəccübləndirmiş, həm də sevindirmişdi.

D'Artanyan əsgərin necə yaralandığını izah edərkən yalan söyləməyə məcbur oldu; dedi ki: əsgər laroşellılərın hücumunu dəf edərkən əlbəyaxa vuruşmada yaralanmışdır. D'Artanyan o bıri əsgərin öldüyündən, məruz qaldıqları başqa təhlükələrdən də danışdı. Bu söhbət ona böyük şöhrət qazandırdı: o günü bütün orduda d'Artanyandan danışdılar; hersoq da onu təbrik etməyi əmr etdı.

Ümumiyyətlə, hər yaxşı iş öz-özünə mükafat qazandırır. Gənc qaskoniyalının bu nəcib hərəkəti onun itirmiş olduğu ruhi sakitliyi özünə qaytardı. Doğrudan da, bu gündən etibarən o, tamamilə sakit ola bilərdi; düşmənlərindən biri öldürülmüş, bıri də bütün varlığı ilə tabe olmuşdu. Lakin onun bu sakitliyi bır şeyı göstərirdi kı, o, hələ miledini tanımırdı.



## XII

## ANJU ŞƏRABI

Xəbər yayılmışdı ki, kral bərk xəstədir, sağalmasına da ümid yoxdur. Lakin çox keçmədı, düşərgəyə bır xəbər yayıldı: o sağalmaq üzrədir. Kral şəxsən mühasirədə iştırak etməyə tələsırdi

Orlean hersoqu vəzifədən götürüləcəyini, komandanlığın ya Anqulem hersoquna, ya Bassompyerə, ya da Şomberqə veriləcəyini bilirdı; onlar hər üçu komandan olmaq iddiasında idi və hər biri ancaq özünü bu vəzifəyə layiq görürdü. Buna görə də Orlean hersoqu ingilisləri Re adasından qovmaq üçün ciddi bır tədbir görmürdü. İngilislər yenə də müqəddəs Martin qalasını, La Pre ıstehkamını mühasirə edib dururdular. Fransızlar ısə Laroşeli mühasirə edirdılər.

Biz yuxarıda d'Artanyanın, nəhayət, sakit olduğunu demişdik. O, elə zənn edirdi ki, təhlükə artıq sovuşmuşdur. İndi onu ancaq bır şey narahat edirdi: öz dostlarından heç bır məlumat almırdı.

Bır gün səhər, noyabrın başlanğıcında hər şey ona aydın oldu. Villeruadan belə bir məktub aldı:

*"Cənab d'Artanyan!*

*Cənab Atos, Portos və Aramis bizdə bir neçə ay yaxşıca kef çəkdilər, şənləndilər və elə səs-küy saldılar ki, çox zabitəli bir adam olan qəsr rəisi bır neçə günlüyə onları həbs etdi. Lakin mən onların əmrini yerınə yetirərək sizə on iki şüşə Anju şərabı göndərirəm: bu şərab onların çox xoşuna gəlmişdı. Sizın dostlarınız arzu edirlər ki, bu şərabı siz onların sağlığına ıçəsiniz.*

*Sizə hörmət və ehtiram bəsləyən və sizın itaətkar xıdmətçiniz olan Hodo, mehmanxana sahibi".*

D'Artanyan sevinərək bərkdən dedi:

Nəhayət, onlardan da xəbər çıxarmış! Dostlar məni şən dəqiqələrində xatırlamış, lakin mən onları ağır dəqiqələrimdə yad etdim. Onlar əmin ola bilər kı, mən bu şərabı böyük bir məmnuniyyətlə onların sağlığına içəcəyəm, ancaq tək yox.

D'Artanyan, başqalarından daha artıq dostluq etdiyi iki qvardiyaçının yanına yüyürdü, onları Vılleruadan göndərilmiş Anju şərabı içməyə dəvət etdi.

Bu qvardıyaçılardan biri elə bu axşam, o biri də sabah axşama qonaq çağırılmışdı, buna görə də şərab içmək üçün yığılmağı iki gün sonraya qoydular.

D'Artanyan evə qayıtdıqdan sonra on iki şüşə şərabın hamısını, saxlanmaq üçün, ümumı qvardiya bufetinə göndərdi. İki gündən sonra qonaqlıq saat on ikiyə təyin edildiyindən, saat doqquzda, Planşeni göndərdi ki, gedib yemək-içməyi hazırlasın.

Planşe, yeni metrdotel rütbəsilə fəxr edir, özünü belə işlərdən başı çıxan, qabiliyyətli, bacarıqlı bir adam kimi göstərmək istəyirdi Bu münasibətlə də, qonaqlardan birinin Furro adlı xidmətçisini, d'Artanyanı öldürmək istəyən əsgəri də köməyə çağırdı. Əsgər ordugaha gələndən sonra heç bir alaya daxil olmamışdı, o ancaq d'Artanyana, daha doğrusu Planşeyə qulluq edirdi.

Hər iki qonaq təyin edilmiş vaxtda gəldi. Hər gəs öz yerində oturdu. Süfrəyə cürbəcür yemək gətirildi.

Planşe, əlində dəsmal, süfrəyə xidmət edirdi, Furro şərab şüşələrini açırdı. Brizmon adlanan əsgər də şərabı şüşələrdən qrafinə boşaldırdı. Şüşənin dibində çöküntü görünürdü. Yəqin şərab yolda bərk çalxalanmışdı. Birinci şüşə bir qədər bulanıq idi; Brizmon bulanıq şərabı stəkana tökdü, d'Artanyan bu stəkanı içməyə ona icazə verdi; çünki o hələ çox zəifdi, d'Artanyanın ona yazığı gəlirdi.

Qonaqlar şorbanı içəndən sonra şəraba əl atmaq istərkən birdən Lüdovik istehkamından və Yeni istehkamdan top səsi eşidildi. Qvardiyaçılar elə bildilər ki, duşmən qəflətən hücum etmişdir, cəld qalxıb qılınclarını götürdülər. D'Artanyan cəldlikdə onlardan geri qalmırdı; o da qılıncına əl atdı. Hər üçü vəzifə başına yüyürdü.

Lakin küçəyə çıxan kimı baş verən həyəcanın səbəbini bildilər. Hər tərəfdə təbil vurulur, hər yandan:

– Yaşasın kral! Yaşasın kardinal! – səsləri ucalırdı.

Kralın səbri tükəndiyindən daha gözləyə bilməmiş və iki mənzil heç dincəlmədən yol gələrək, on min qoşunla düşərgəyə daxil olurdu. Qabaqda və arxada muşketyorlar gəlirdılər.

Qvardiyaçılar kralın gəldiyi yol uzunu sıraya düzülmüşdülər. D'Artanyan da onların içində idi. O, öz dostlarını və cənab de Trevili əli ilə alqışlayırdı; dostları ondan gözlərini çəkmirdilər; cənab de Trevil də onu dərhal tanıdı. Kralın duşərgəyə daxil olmaq mərasimi qurtaran kimi Atos, Portos və Aramis yuyürüb d'Artanyanı qucaqladılar.



D'Artanyan bərkdən:

Sizin gəlməyiniz lap yerinə düşdü! Heç belə vaxtında gəlmək olmazdı, – dedi. Yəqin ki, yeməklərdən heç biri hələ soyumamışdır!

Öz dostlarına təqdim etdiyi iki nəfər qvardiyaçıya dönərək əlavə etdi: Belə deyilmi, cənablar?

Portos:

Hə! – dedi, deyəsən, qonaqlıq var!

Aramis:

Güman edirəm ki, burada qadın yoxdur, – dedi.

Atos soruşdu:

- Sizin, yəni bu yerdə babat şərab olurmu?

D'Artanyan dedi:

Dostum, bu ki sizin şərabınızdır!

Atos təəccüblə ona baxdı:

– Bizim?

– Bəli, sizın göndərdiyiniz şərabdır.

Biz sizə şərab göndərməmişik.

Bəs necə? Göndərdıyiniz Anju şərabıdır.

Portos:

– Demək, siz bizə Anju şərabı gətirtmisiniz? dedi. - d'Artanyan, siz nə səliqəli adamsınız!

Yox ey, bu şərabı mənə sizin adınızdan göndəriblər.

Üç muşketyorun üçü də bırdən soruşdu:

– Bizim adımızdan?

– Siz özünüz olmasanız da, sizin mehmanxananın sahibi göndərmişdir.

Bizim mehmanxananın sahibi?

– Hə də, Hodo, muşketyorlar mehmanxanasının sahibi.

Portos dedi:

Əşi, kim göndərib göndərsin, fərqi nədir axı! Bır dadına baxaq, yaxşı olsa içək.

Atos:

– Yox, dedi, – haradan göndərildiyi məlum olmayan bu şərabı biz içməyəcəyik.

D'Artanyan onunla razılaşdı.

Atos, siz haqlısınız! Demək, sizin heç biriniz mehmanxana sahibı Hodoya deməyib ki, mənə şərab göndərsin?

– Yox. Amma bu şərab bizim adımızdan göndərilmişdir, eləmi?
D'Artanyan:
Bəli, – bu da kağız.
O, aldığı kağızı öz dostlarına göstərdı.
Atos kağıza baxıb dedi:
– Bu Hodonun xətti deyil. Mən onun xəttini tanıyıram; oradan çıxanda haqq hesab çəkdiyim zaman görmüşəm.
Portos.
Burada yazılan başdan ayağa uydurmadır! dedi. Biz heç də dustağa düşməmişık.
Aramis töhmətli bir ifadə ilə:
D'Artanyan, dedi, – siz necə inana bıldiniz ki, bizi şuluqluq etdiyimizə görə tutublar?
D'Artanyanın rəngi ağardı; bütün bədəni gizildədi.
Atos:
Sən mənı qorxudursan, – dedı. Nə olub axı?
D'Artanyan çığıraraq:
Dostlar, tez olun, tez olun, gedək! dedi. Mənı dohşətli bir şübhə bürüdü! Olmaya bu miledinin yeni bir qısasıdır?
Atosun rəngi qaçdı. D'Artanyan tez bufetə yüyürdü. Üç muşketyorla iki qvardiyaçı da onun ardınca getdi.
Hamısı yeməkxanaya girdi. Brizmon taxta döşəmə üstündə dəhşətli ağrı iztirabları içində qovrula-qovrula çırpınırdı.
Planşe ılə Furronun rəngi meyit kimi ağarmışdı; onlar əsgərin ız tirabını yüngülləşdirmək istəyirdilər, lakin aydınca görünürdü ki, bu nun heç bir xeyri olmayacaq: əsgərin üzünə ölüm kölgəsi qonmuşdu.
O, d'Artanyanı görüb dedi:
– Ah! Bu nə insafsızlıqdır: sız özünüzü elə göstərırsiniz ki, guya məni əfv etdiniz, amma məni zəhərlədiniz...
- Mən? Bədbəxt, sən nə deyirsən?!
– Mən onu deyirəm ki, siz mənə bu şərabı verdiniz; mən onu deyirəm kı, siz bunu mənə içirtdiniz, mən onu deyırəm kı, siz məndən qisas almaq istədiniz, heç belə də zalımlıq olarmı?..
D'Artanyan:
– Brizmon, - dedi, sən nahaq belə düşünürsən! And olsun Allaha, mən qətiyyən belə şey eləməmişəm!



Allah özü görür! Allah sizin cəzanızı verər! Allah, sən bu adamı da mənim çəkdiyim əzaba mübtəla elə!
D'Artanyan qışqıraraq can verən əsgərin yanına yüyürdü:
And olsun namusuma, mən bu şərabın zəhərləndiyini bilmirdim, mən özüm də ondan içəcəkdim.
Mən sizə inanmıram.
Əsgər bu sözü deyərək dəhşətli ağrı iztirabları içində öldü.
Atos pıçıldayaraq dedi:
– Bu nə dəhşətdir! Heç belə də şey olarmı?
Portos şərab dolu şüşələri qırmağa başladı, Aramis bir qədər gec də olsa, keşiş dalınca adam göndərdı.
D'Artanyan:
Dostlar, – dedi, siz bır daha məni ölümdən xilas etdiniz; bir mənı yox, bu cənabların həyatını təhlükədən qurtardınız! Qvardiyaçılara dönərək sözünə davam etdi: Möhtərəm cənablar, sizdən xahiş edirəm ki, burada gördüklərinizi heç bir yerdə danışmayasınız. Bu məsələyə, görünür, mötəbər şəxslər də əl atmışlar; ən kıçik bir ehtiyatsızlıq bizim üçün çox pıs nəticələr verə bilər.
Qorxudan yarımcan hala düşmüş Planşe:
Ah, ağa, – dedi, mən bu işdən nə yaxşı qurtardım!
D'Artanyan çığıraraq dedi:
Yaramaz, necə? Sən şərab içmək istəyirdin?
– Ağa, kralın sağlığına bir balaca stəkan içmək ıstəyirdim, ancaq Furro dedi ki, səni çağırırlar.
Qorxudan tir-tir titrəyən və dişi-dişinə dəyən Furro;
– Ah, mən onu göndərirdim ki, dedi, – özüm içim, heç kəs də bılməsin...
D'Artanyan qvardiyaçılara müraciət edərək:
Ağalar! dedi. – Özünüz başa düşürsünüz ki, bu hadisədən sonra bizim qonaqlığımız çox kədərli keçmiş olardı... Xahiş edirəm ki, məni əfv edin, bu qonaqlığı başqa bir günə qoymağa mənə icazə verin.
Qvardiyaçılar d'Artanyanın xahişini qəbul edib getdilər. D'Artanyanla üç muşketyor tək qaldıqda bir-birinə baxdılar, bu baxışlardan sözsüz də aydın oldu ki, onlar baş verən hadisənin bütün ciddiyyətini dərk edirlər.
Atos sözə başladı:

Hər şeydən əvvəl, bu otaqdan çıxaq: meyitlə bir yerdə qalmaq yaxşı deyil, xüsusilə öz əcəli ilə ölməyən adamın meyiti ola.

D'Artanyan Planşeyə belə bir tapşırıq verdi.

Mən bu bədbəxtin meyitini sənə həvalə edirəm: onu xaçpərəst qaydasilə aparıb basdırarsan. Düzdür, o cinayət işləmişdi, ancaq sonra təqsirini boynuna aldı, tövbə elədi.

Dörd dost, Brizmonun dəfn işini Planşe ilə Furronun ixtiyarına buraxıb otaqdan çıxdı. Aşxanaçı onlara başqa bir otaq verdi; yeməyə ilıq yumurta ilə su verdi. Suyu Atos özü gedib bulaqdan gətirmişdi. D'Artanyan bir neçə sözlə məsələni Portosla Aramisə də izah etdi. Sonra üzünü Atosa tutub dedi:

– Görürsünüzmü, əziz dost, bu ölüm-dirim müharibəsidir!

Atos dedi:

Həmişə qorxu altında yaşamaq olmaz ki! Bu vəziyyətdən çıxmaq üçün yol tapmaq lazımdır.

- Axı nə yol tapasan?

Çalışın o qadınla bir görüşün, söhbət edin, ona ya barışıq təklif edin, ya açıq müharibə! Ona bir əsilzadə kimi söz verin ki, onun haqqında heç gəsə heç bir söz deməyəcəksiniz, zərər yetirəcək heç bir şey eləməyəcəksiniz. Qoy o da sizi rahat buraxacağına and içsin. Onu hədələyin, deyin ki, əgər buna razı olmazsa, siz kanslerin, kralın yanına gedəcəksiniz, cəllada müraciət edəcəksiniz, sarayı onun əleyhinə qaldıracaqsınız, onun lənət damğası ilə damğalandığını açıb deyəcəksiniz, onu məhkəməyə verəcəksiniz, əgər məhkəmə ona bəraət qazandırsa, onu güdüb bir quduz it kimi öldürəcəksiniz.

D'Artanyan bu fikirlə razılaşdı:

Bu yolla məsələni həll etmək mənim xoşuma gəlir. Ancaq onunla necə görüşmək olar?

Vaxt olar, əziz dost, belə bir fürsət ələ düşər, ancaq gözləməyin özünü də bacarmaq lazımdır...

Lakin qatillər və adam zəhərləyənlərlə mühasirəyə alındığım bir vəziyyətdə gözləmək... Atos sözə qarışdı:

– Allah bizi bu vaxta kimi saxlayıb, bundan sonra da saxlar.

D'Artanyan:

Biz bu didişmədən birtəhər yaxamızı qurtara bilərik, dedi, – biz kişiyik, əlimizdən hər şey gələr, həyatımızı təhlükəyə atmağa da adət eləmişik. Sonra yavaşca əlavə etdi. – Bəs o?

Atos soruşdu:



Xanım Bonasyemi? Bu doğrudur. Əziz dost, sizin bir-birinizi sevdiyinizi mən lap unutmuşam. Aramis sözə qarışdı:

– O, ölən əclafın cibindən tapdığınız kağızdan sizə məlumdur ki, o, monastırdadır. Monastırda da heç pis yaşamırlar. Mən sizə söz verirəm ki, Laroşel mühasirəsi qurtaran kimi...

Atos onun sözünü kəsdi:

– Yaxşı, yaxşı! Əziz dost Aramis, biz bilirik ki, monax olmağa söz vermisiniz.

Aramis mülayimcə.

Mən ancaq müvəqqəti bir zaman üçün muşketyoram, dedi.

Atos d'Artanyanın qulağına pıçıldadı:

Görünür o, öz sevgilisindən çoxdandır bir xəbər almır. Buna əhəmiyyət verməyin, bu səs bizə tanışdır.

Portos da öz fikrini söylədi.

Xanım Bonasyeni xilas etmək üçün, məncə, ən sadə bir yol vardır.

D'Artanyan soruşdu:

– Hansı yol?

– Siz deyirsiniz ki, o, monastırdadır?

Bəli.

Mühasirə qurtaran kimi biz onu monastırdan oğurlarıq.

Ancaq onun hansı monastırda olduğunu da bilmək lazımdır.

Portos buna etiraz etmədi:

Doğrudur.

Atos:

– Mənim başıma belə bir fikir gəldi, – dedi. Əziz d'Artanyan, siz deyirsiniz ki, kraliça özü onun hansı monastıra göndərilməsini təyin edibdir.

- Bəli. Hər halda mən belə düşünürəm.

– Onda Portos bizə kömək edə bilər. .

– Axı, hansı yolla?

· Sənin tanışın qadın ki, var, markizamı, hersoginyamı, prinssesəmı, nədir, bilmirəm, bax onun vasitəsilə; yəqin ki, onun yuxarılarla çox geniş əlaqəsi var.

Portos barmağını dodaqları üstə qoyub dedi:

– Yavaş. O, gərək ki, kardinal tərəfdarıdır: o, heç bir şey bilməməlidir.

Aramis dedi:

– İş ki, belə oldu, mən bu məsələni öyrənməyi öz öhdəmə götürürəm.

Üç yoldaş üçü də bırdən çığıraraq soruşdu:

Siz, Aramıs? Siz bunu necə edərsiniz?

Aramis qızararaq cavab verdi:

Kraliçanın keşişi vasitəsilə; mən onunla çox bərk dostam.

Dörd dost bu vədə arxayınlaşaraq sakit oldu; yeməklərini yeyib ayrıldılar, getməzdən qabaq sözləşdilər ki, axşam yenə də yığışsınlar. D'Artanyan Fransiskan monastırına qayıtdı, üç muşketyor da kral iqamətgahına getdi: onlar orada həm özləri, həm də xidmətçiləri üçün mənzil düzəltməli idilər.

## XIII

## "QIZIL GÖYƏRÇİN HİNİ" MEYXANASI

Kralın Bekinhem hersoquna nifrət etməyə kardinaldan daha artıq əsası vardı: ona görə də düşərgəyə gələn kimi düşmən üzərinə hücuma keçmək istədi. Qət olundu ki, hər şeydən əvvəl ingilisləri Re adasından qovsunlar, sonra da Laroşelin mühasirəsini sürətləndirsinlər. Bu planın həyata keçirilməsini Bassompyer və Şomberqlə Anqulem hersoqu arasında olan çəkişmə ləngitdi.

Cənab Bassompyerlə Şomberq Fransanın marşalları idilər, onlar bilavasitə kralın başçılığı altında orduya komandanlıq etmək haqqını müdafiə edirdilər; lakin kardinal qorxurdu ki, Bassompyer quqenotlara hüsn-rəğbət bəslədiyindən ingilislərə və dın qardaşları olan laroşellilərə qarşı çox zəif hərəkət edəcəkdir, bunu nəzərə alaraq Anqulem hersoqunu irəli sürürdü; kardinalın təkidi üzrə kral onu baş komandanın müavini təyin etmişdi. Bu məsələdən narazı olan Bassompyerlə Şomberqi, orduda saxlaya bilmək məqsədilə, onlara ayrı-ayrı hissələrin komandanlığı tapşırıldı. Bassompyerə cəbhənin Laledən Domerə kimi şimal sahəsi, Anqulem hersoquna Domerdən Perinyiyə kimi şərq sahəsi, Şomberqə də Perinyidən Anqutenə kimi cənub sahəsi tapşırıldı. Kralın qardaşı Orlean hersoqunun iqamətgahı Dompyerdə idi. Kralın iqamətgahı isə gah Etredə, gah da Lajarridə olurdu. Kardinalın iqamətgahı isə sahil boyundakı qum təpəsi üstündə Lapyerr körpüsü yanında, kiçik, istehkamsız bir evdə idi. Bu qayda ilə kralın qardaşı Bassompyeri, kral Anqulem hersoqunu, kardinal da Şomberqi nəzarət altına almışdı.



Arada olan çəkişmə götürülən kimi, ordu, ingilisləri adadan qovmaq üçün, hücuma keçdi. Bunun üçün də əlverişli bir şərait vardı. İngilis o zaman yaxşı əsgərdir ki, yaxşı yeməyi var. Halbuki onlara çoxdandır ki, duzlu mal əti ilə kiflənmiş suxarı verirdilər. İçlərində çoxlu azarlayan vardı. Ordunun təchizatı pozulmuşdu; çünki həmişə ilin bu vaxtında dənizdə bərk qasırğa başlayır. Hər gün bir neçə ərzaq gəmisi batırdı: Eqilyon burnundan ta səngərlərə kimi bütün sahil məddən sonra yelkənli və yelkənsiz gəmilərin qırıqları ilə dolu olurdu. Bundan görünürdü ki, kralın qoşunları hücuma keçməsə də, Bekinhem hersoqu yaxın vaxtda adanın mühasirəsini qaldırmağa məcbur olacaqdır.

Lakin cənab de Tuarak düşmən cəbhəsində yeni hücuma hazırlıq getdiyini xəbər verəndən sonra kral buna mane olmaq qərarına gəldi və dərhal hücuma geçmək əmrini verdi.

Biz bu vuruşmanı ətraflı surətdə təsvir etmək fikrində deyilik; biz ancaq onun söylədiyimiz əhvalatla əlaqədar olan cəhətindən bəhs edəcəyik. Ona görə də ikicə sözlə deyəcəyik ki, bu hücum istənilən nəticəni verdi: kral buna son dərəcə təəccüb etdi, kardinal isə bundan böyük şöhrət qazandı. İngilislər sıxışdırılaraq addım-addım geri oturdular, onlar hər toqquşmada məğlubiyyətə düçar oldular, de Lua adasından gedəndə tamamilə darmadağın edildilər. Döyüş meydanında iki min adam, o cümlədən beş polkovnik, üç podpolkovnik, iki yüz əlli kapitan, iyirmi adlı-sanlı əsilzadə, dörd top və əlli bayraq qoyub təzədən gəmilərə minmək məcburiyyətində qaldılar. Bu bayraqları Klod de Sen Simon Parisə gətirdi, böyük bir təntənə ilə Notr Dam kilsəsindən asdılar.

Kardinal indi, müvəqqəti də olsa, ingilislərdən qorxmayaraq Laroşelin mühasirəsini rahatca davam etdirə bilərdi.

Lakin, indicə dediyimiz kimi, bu sakitlik müvəqqəti oldu. Bekinhem hersoqunun göndərdiyi adamlardan Monteqyu adlı birisi əsir alındı; onun cibindən tapılan kağızdan məlum oldu ki, Avstriya, İspaniya, İngiltərə və Lotaringiya arasında bir ittifaq düzəlmişdir. Bu ittifaq Fransaya qarşı idi. Bundan başqa, hersoqun təsəvvür etdiyindən daha tez, tərk etməyə məcbur olduğu iqamətgahından, bu ittifaqın doğruluğunu subut edən bir kağız da tapıldı. Kardinal öz xatirələrində yazır ki, bu sənədlər xanım de Şevrözü, eyni zamanda kraliçanı çox rüsvay edirdi.

Məlum şeydir ki, bütün məsuliyyət kardınalın üzərinə düşürdü, çünki tam hakim bir nazir olub məsuliyyət daşımamaq olmazdı. Buna görə də o, gecə-gündüz öz dahiyanə zəka və ıstedadını işə salaraq, Avropanın böyük dövlətlərində baş verən ən kiçik dəyişiklikləri də izləyirdi.

Kardinal Bekınhem hersoqunun qızğın fəaliyyət göstərdiyını bilirdi O, bunu da bilirdi ki, hersoq ona nıfrət edir. Fransanın əleyhinə çevrilən ittifaq baş tutsaydı, kardinal öz təsirini bütünlüklə itirmiş olardı; lakin İspaniya, həm də Avstrıya sıyasətınə tərəfdar yox kimi idi; ancaq onlardan bırı Luvr kabinetində qalibiyyət qazansaydı, Rişelye sıradan çıxardı Kral, bir uşaq kımi, həm onun dediklərınə qulaq asır, həm də, öz zabıtəli müəllimındən zəhləsi gedən bir şagird kımı, ona nıfrət edırdı; məğlubıyyət üz versəydi, kardınalı o, kraliça ilə qardaşının ayaqları altına atardı. Deməк, Rişelye məhv olmaq təhlükəsi qarşısında idi; lakin bütün Fransa da belə bir qorxu altında idi. Bunun qabağını almaq lazımdı.

Buna görə saysız-hesabsız qasidlər gecə-gündüz La Pyerr körpüsü yanındakı kiçik evə gələrdilər: bu ev kardınalın iqamətgahı idı. Gə lənlər də monaxlar, qadınlar və kəndlilərdi; monaxlar heç əməllı-başlı əbaya bürünməyı də bacarmırdılar: onların mübarizlər kılsəsinə mən sub olduqlarını çox asanlıqla təyin etmək mümkündü; qadınların əynində paj paltarı vardı, bu da onları bır qədər sıxırdı; kəndlilərin əli çırklı də olsa, özlərının çox zərif yerişləri vardı: lap bir millikdən onların əsilzadə olduqları bilinirdi. Bunlardan başqa, ayrı gələnlər də olurdu; ancaq onların gəlişi çox da xoşa gəlmirdi: iki-üç dəfə söz yayılmışdı ki, guya kardinala sui-qəsd edilmışdır.

Doğrudur, onun düşmənləri deyırdılər kı, bu bacarıqsız qatilləri o özü öz üstünə göndərir ki, cəza tədbırlərıni işə salmaq üçün əlində bir əsas olsun. Ancaq nə nazirlərin, nə də onların düşmənlərinin dedıyınə inanılmamalıdır.

Lakin bunlar heç də kardınala Anqulem hersoquna mühüm əmrlər vermək, ya kralla müəyyən bır məsələ haqqında danışıb uzlaşmaq, ya da öz yanına buraxmaq istəmədıyi bir elçi ılə görüşmək üçün tez tez gecə gəzintilərinə çıxmağa mane olmazdı.

Muşketyorlar isə, işləri az olduğundan, şən həyat keçırırdilər. B izim dostlar cənab de Trevillə çox yaxın idilər; işıqlar sönəndən sonra düşərgədən qırağa çıxmaq üçün ondan çox asanlıqla xüsusi ıcazə ala bilmişdilər.



Bir gün axşam Atos, Portos və Aramis səfər plaşlarına bürünmüş və tapançalarını hazır tutmuş halda, at üstündə "Qızıl Göyərçin hini" meyxanasından qayıdırdılar; bu meyxananı Atos ikı gün bundan əvvəl kəşf etmışdi. D'Artanyan isə səngərdə olduğundan onlara qoşula bilməmişdi. Muşketyorlar düşərgəyə doğru gedən yolla irəliləyir, yuxarıda dediyimiz kimi, həmişə də gözdə qulaqda ıdılər. Buanar kəndinə, təxminən, bir çərək mil qalmış yaxınlaşmaqda olan at ayağı tappıltısı eşitdilər. O saat hər üçü bir-birinə sıxılaraq, yolun ortasında dayanıb gələn atlıları gözləməyə başladılar. Bır dəqiqə sonra, bulud altından çıxmış ay işığında, yol döngəsində iki atlı göründü; onlar da bu biri atlıları görüb dayandılar. Onlar elə bil qabağa getmək, ya geri dönmək haqqında məsləhətləşirdilər. Bu ıkı atlının tərəddüd etməsi muşketyorlara şübhəli göründü. Atos qabağa çıxıb qışqıraraq dedi:

– Gələn kimdir?

O biri atlılardan da biri soruşdu:

Bəs siz kimsiniz?

Atos yenə çığıraraq dedi:

– Bu cavab deyil! Gələn kimdir? Cavab verin, yoxsa sizi vurarıq!

Bu vaxt cingiltili bir səs eşidildi, görünür bu səs sahibi buyuruq verməyə adət etmiş adamdı:

Ehtiyatlı olun, ağalar!

Atos yoldaşlarına döndü:

– Bu, yəqin gecə yoxlamasına çıxan boyuk zabitlərdəndir. Biz nə edək?

Yenə də bayaqkı səs eşidildi:

Siz kimsınız? Cavab verin, yoxsa əmrə tabe olmamanız sizə baha oturar.

Atos:

– Kral muşketyorlarıyıq, dedi. – O, indi get-gedə inanırdı kı, bu adamın onların kim olduğunu soruşmağa ixtiyarı vardır.

Hansı bölükdənsiniz?

De Trevilin bolüyündən.

Yaxın gəlin və mənə deyin görüm siz bu vaxt burada nə qayırırsınız?

Muşketyorlar burunlarını sallayaraq, atlarını sürüb onlara yaxınlaşdılar. İndi artıq onlardan heç biri yüksək rütbəli bir adamla qarşılaşdığına şübhə etmirdi.

Atlılardan biri oz yoldaşından on addım qabaqda ıdi, Atos Portosla Aramisə öz yerlərində durmağı tapşırıb, atını ona sarı sürdü.

– Cənab zabit, üzr istəyirəm, – dedi. Biz sizin kim olduğunuzu bilmədik, özünüz də gördünüz ki, biz qarovul vəzifəmızı yaxşı yerinə yetirdik.

Zabit plaşı ilə üzünün yarısını örtüb soruşdu:

– Adınız nədir?

Atos belə sorğu sualdan əsəbıləşməyə başladı:

Bəs sız kimsiniz? Xahiş edirəm, məni sorğu-sual eləməyə ixtiyarınız olduğunu bildirin.

Atlı plaşı üzündən çəkərək bir də soruşdu.

Adınız nədir?

Muşketyor heyrətlə dedi:

Cənab kardınal!

Zati-aliləri sualını bır daha təkrar etdı:

– Adınız nədir?

Atos.

Kardinal işarə ilə öz yavərini çağırdı, o da dərhal atını sürüb yaxınlaşdı. Pıçıltı ilə ona dedi:

Bu üç muşketyor bizimlə bərabər gedəcək. Mən istəyirəm ki, düşərgədə mənim hara getdiyimi bilməsinlər. Onlar bizimlə getsə, gördüklərini heç kəsə deməz, buna qəti arxayın ola bılərik.

Atos:

Biz əsılzadəyik, monsinyor, – dedi, sizə söz veririk ki, bizdən tamamilə arxayın ola bılərsiniz. Şükür Allaha, biz sırr saxlamağı bacarırıq.

Kardinal nüfuzedıcı gözlərilə bu cəsarətli adama diqqətlə baxdı:

Cənab Atos, sızin qulaqlarınız çox yaxşı eşidir. İndi dinləyin, görün sizə nə deyirəm. Mən sizə inanmadığımdan deyil, öz təhlükəsizliyim üçün bızimlə bərabər getmənizi xahiş edirəm. Şübhəsiz ki, sizin yoldaşlarınız cənab Portosla cənab Aramisdir, eləmi?

Bəli, monsinyor.

Dalda duran iki muşketyor da, şlyapaları əllərində, atlarını sürüb yaxınlaşdı. Kardinal:

Cənablar, mən sızi tanıyıram, – dedi. Onu da bilirəm ki, siz mənim dostlarımdan deyilsiniz. Mən buna təəssüf edirəm; lakin sizin nəcib və igıd əsilzadə olduğunuz da mənə məlumdur: sizə inanmaq



olar. Cənab Atos və siz, cənablar, lütfən mənimlə bərabər gedək; onda mənim elə bir keşikçı dəstəm olar ki, buna əgər kral həzrətləri özü də rast gəlmiş olsa, qıbtə edə bilər.

Muşketyorlar başlarını atın yalına qədər əydilər. Atos:

And olsun namusuma, – dedi, – monsinyor bizi özü ilə bərabər aparmaqda haqlıdır: bız yolda çox şübhəli adamlara rast gəldik, hətta onlardan dordü ilə "Qızıl Göyərçin hini" meyxanasında dalaşdıq da.

Kardinal soruşdu:

– Nə üçün, cənablar? Siz özünüz bilirsiniz ki, mənim dalaşmaqdan xoşum gəlməz!

Elə buna görə də, monsınyor, mən sızi bu məsələdən xəbərdar etmək istəyirəm; monsinyor bunu başqalarından eşidib bizi müqəssir hesab edə bilərdı.

Kardınal qaşlarını çataraq soruşdu:

Bu dalaşmanın nəticəsi nə oldu?

Mənim dostum Aramisin qolunu qılıncla balaca yaraladılar; lakın monsinyor hücum əmri verərsə, bu yara heç də ona hücumda iştırak etməyə mane olmaz, siz özünüz də şəxsən bunu yoxlaya bilərsiniz.

Kardinal:

Lakin siz elə adam deyilsınız ki, düşməni cəzalandırmadan əldən qoyasınız, dedi. Cənablar, gəlin mənimlə açıq danışın! Yəqin ki, sız bu zərbəyə qarşı bir neçə zərbə ilə cavab vermisiniz, eləmi? Boynunuza alın, özünüz bılırsınız ki, adamların günahını bağışlamağa mənim ıxtiyarım var.

Atos dedi:

Monsinyor, mən heç qılıncımı da çıxarmadım. Eləcə öz düşmənımı qucağıma alıb pəncərədən bayıra atdım Atos bir az tərəddüdlə sözünə davam etdi: Deyəsən, yerə dəyəndə onun qıçı sınmışdır.

– Hə-hə! Bəs siz! Cənab Portos?

Mən, monsinyor, duelin qadağan edildiyini bildiyimdən kürsünü qapıb quldurlardan bırınə yüngülcə bir zərbə endirdim; lakin o pis çevrildiyindən, deyəsən, çıyın sümüyü qırıldı. .

– Yaxşı. Bəs sız, cənab Aramis?

Mən, monsinyor, xasiyyətcə çox həlim adamam, təbiətimin bu həlımlıyindən hətta, bılmırəm monsinyora məlumdurmu, hətta monax olmağa hazırlaşıram. Mən ıstədım kı, bu dalaşmanı kəsim, birdən bu yaramazlardan biri öz qılıncı ılə xaincəsinə mənim sol qolumu

yaraladı. Mənim də daha səbrim tükəndi, onu qılıncla hədələdim; bilmirəm necə oldu ki, o özü qılıncın üstünə atıldı, ancaq yaxşı yadımdadır ki, yerə yıxıldı. Deyəsən, onu da, o biri yoldaşları ilə bərabər apardılar. Kardinal dedi:

– Lənət şeytana, cənablar! Heç nəyin üstündə meyxanada üç adamı vurub sıradan çıxarmısınız. Yamanca ağır əlləriniz var! Axı bu dalaşma nədən oldu?

Atos bunun səbəbini belə izah etdi:

– Bu yaramazlar sərxoş idilər, meyxanada bir qadın olduğunu bilib zorla onun otağına girmək istəyirdilər.

Kardinal:

Zorla onun otağına girmək istəyırdilər? – deyərək Atosun sözünü təkrar etdi. Nıyə?

Heç şübhəsiz, onun başına bir iş gətirmək üçün! Monsinyor, mən ərz etdım kı, o yaramazlar sərxoşdular.

Kardinal bir azca təşvişlə soruşdu:

O qadın cavandımı, gözəldimi?

Monsınyor, biz onu görmədik. Kardinal cəld:

Sız onu görmədinizmi? Hə!.. Çox yaxşı! dedi. – Siz o qadının namusunu müdafiə etməklə çox yaxşı iş görmüsünüz. Mən özüm "Qızıl Göyərçin hını" meyxanasına gedirəm, öyrənərəm, görüm doğru deyirsiniz, ya yox.

Atos qürurla dedi:

– Monsinyor, bız əsılzadəyik, bız hətta öz həyatımızı xilas etməlı olsaydıq da yalan söyləməzdık!

– Sizin mənə dediyinizə mən şübhə etmirəm, cənab Atos, zərrə qədər də olsa şübhə etmirəm. Sonra söhbəti dəyişmək məqsədilə əlavə etdi: – O qadın təkdimi?

- Yox, yanında bır adam vardı; qapını vurub içəridə oturmuşdular. Yəqin o lap qorxağın bıri imiş: səs-küyə baxmayaraq otaqdan bayıra çıxmadı.

Kardinal dedi:

İncildə deyilir ki, başqası haqqında hökm verməyin ki, özünüz haqqında da hökm verilsın.

Atos baş əydi.

Kardinal sözünə davam etdi·

- Cənablar, yaxşı. İndi hər şey mənə məlumdur. – Ardımca gəlin.



Muşketyorlar kardinalı qabağa buraxdılar. O, yenə də üzünü plaşla örtdü, onu ötürənlərdən səkkiz, ya on addım qabağa keçıb yola düzəldi.

Çox çəkmədi kı, gəlib meyxanaya çatdılar. Meyxana sakit və boş idı. Görünür, meyxana sahibi davakarlar dəstəsini yola sala bilmişdı. Meyxanaya on addım qalmış kardinal öz yavərinə və muşketyorlara dayanmaq əmrini verdı. Bır yəhərlı at pəncərənin taxtasına bağlanmışdı. Kardinal atdan düşmədən, xususi bir tərzdə qapını üç dəfə tıqqıldatdı.

Səsə o saat ıçəridən plaşa bürünmüş bir adam çıxdı; kardinalla biriki kəlmə danışdıqdan sonra yəhərli ata minib Sürjer tərəfə yola düşdü. Bu yol eyni zamanda Parisə də gedirdi.

Kardinal geriyə dönüb dedi.

- Yaxın gəlin, cənablar. Sonra muşketyorlara müraciətlə dedi:

– Cənab əsılzadələr, sizin söylədıkləriniz doğru imiş. Bizim bugünkü təsadüfümüzdən sizə xeyir olmasa, günahı məndə görməyin. Hələ ki, mənim ardımca gəlin.

Əvvəl kardinal, sonra da muşketyorlar atdan düşdülər. kardinal cilovu öz yavərinin üstünə atdı, muşketyorlar isə özləri öz atlarını pəncərə taxtalarına bağladılar.

Meyxananın sahibi astanada durmuşdu: kardinal onun üçün qadınla görüşə gələn adicə bir zabitdən başqa bir şey deyildi.

Kardinal meyxana sahibindən soruşdu:

– Aşağı mərtəbədə sizin bir otağınız varmı ki, bu cənablar orada məni gözləyə bilsinlər, həm də sobanın yanında qızınsınlar?

Meyxana sahibı zalın qapısını açdı; burada bayaqkı pis bır buxarı yerində gözəl, böyük bir soba qurulmuşdu.

Kardinal:

– Yaxşı, dedı. Cənablar, zəhmət çəkib məni burada gözləyin. Mən uzaqbaşı yarım saata kimi qayıdacağam.

Muşketyorlar otağa girəndə, kardinal daha heç kəsə heç şey demədən, yol göstərənə ehtiyacı olmayan bır adam kimı, pılləkənlərlə yuxarı qalxdı.

## XIV

## SOBA BORUSUNUN FAYDASI HAQQINDA

Aydın idi ki, bizim bu üç dostumuz, özləri də bilmədən, alicənab lıq xatirinə kardinalın himayəsi altında olan bir qadına böyük yaxşılıq etmişdilər. İndi bilmək lazımdır ki, bu qadın kimdir? Muşketyorlardan hər biri bu sualı özünə verdi. Lakin bütün təsəvvürlərinin həqiqətdən çox-çox uzaq olduğunu görüb dilxor oldular və Portos meyxana sahibini çağırıb aşıq gətirməsini tapşırdı.

Portosla Aramis miz yanında oturub musiqiçi atmağa başladılar, Atos da fikrə dalmış halda otaqda gəzinməyə başladı.

O, yarısökülmüş buxarının bacası yanında dinməz-söyləməz o baş bu başa gedirdi; bacanın o biri başı yuxarı mərtəbəyə çıxırdı. O, hər dəfə bacanın yanından geçəndə adam səsi eşidirdi. Bu səs, nəhayət, onun diqqətini cəlb etdi. Bacaya yaxınlaşıb qulaq asdı; bir neçə sözü ayırd edə bildi.,

Bu sözlər onu o dərəcə maraqlandırdı ki, yoldaşlarına işarə ilə susmalarını əmr etdi, özü isə əyilərək qulağını bacanın ağzına tutdu.

Kardinalın səsi eşidilirdi:

Qulaq asın,miledi, məsələ çox ciddidir; oturun, danışaq.

Atos pıçıldayaraq öz-özünə dedi:

Miledi!

Bu dəfə qadın danışmağa başladı, muşketyor onun səsini eşidəndə diksindi:

Monsinyor, mən sizə çox diqqətlə qulaq asıram.

Kiçik bir ingilis gəmisi Şaranta çayı ağzında, de La Puant istehkamı yanında sizi gözləyir; gəminin kapitanı mənə sədaqətli adamdır. Gəmi sabah səhər yola düşəcək.

– Elə isə mən bu gecə oraya getməliyəm.

Yox, indi bu saat getməlisiniz, yəni məndən təlimat alan kimi iki adam sizi aparıb ötürəcək. Siz gözlərsiniz, əvvəl mən çıxaram, yarım saatdan sonra da siz çıxarsınız.

Yaxşı, monsinyor. Sizin tapşırığınız mənə nə olacaq? Cənabınızın mənə etibarını mən çox yüksək qiymətləndirirəm. Tapşırıqlarınızı aydın və düzgün söyləyin ki, mən heç bir səhv etməyim.



Onlar bir dəqiqə qədər susdular: görünür, kardinalılediyə verəcəyi tapşırıqları fikrində yoxlayırdı; miledi də onun deyəcəyi sözləri anlamaq və öz hafizəsində həkk etmək üçün bütün diqqətini toplayırdı.

Atos bu sükutdan istifadə edərək yoldaşlarından qapını içəridən bağlamağı xahiş etdi və onlara işarə ilə bildirdi ki, gəlib onunla birlikdə qulaq assınlar.

Portosla Aramis rahatlıq sevən adamdı: gedib hərəsi özünə bir stul gətirdi; Atosu da yaddan çıxarmadılar. Hamısı oturub başını əydi, bacadan gələn səsə qulaq asmağa başladı.

Kardınal sözünə davam etdi:

Siz Londona gedərsiniz. Ora çatandan sonra da Bekinhem herso · qunun yanına yollanacaqsınız.

Miledi dedi:

– Mən sizə deməliyəm ki, brilyant boyunbağı əhvalatından sonra hersoq mənə çox da etibar eləmir.

– Bu dəfə məsələ heç də onun etibarını qazanmaqdan ibarət deyil. Siz onun yanına açıq və mərd danışıq aparmaq üçün gedirsiniz.

– Açıq və mərd?

Kardinal yenə də əvvəlki ifadə ilə sözünü təkrar etdı:

– Bəli, açıq və mərd! Bütün bu danışıqlar açıq olmalıdır.

Mən sizin tapşırıqlarınızı dediyiniz kimi düz yerinə yetirəcəyəm.

– Siz mənim adımdan hersoqun yanına gedib deyərsiniz ki, onun gördüyü bütün hazırlıqlar mənə məlumdur, lakin bu məni çox az narahat edir, çünki ilk hərəkətdə mən kraliçanı məhv edəcəyəm.

– Siz cənabınızın bu təhdidi yerinə yetirmək imkanında olmanıza o inanarmı?

– İnanar, çünki mənim əlimdə sübutum var

Mən bu sübutların nədən ibarət olduğunu ona söyləyimmi?

– Mütləq söyləməlisiniz. Siz ona deyərsiniz ki, konnetablin arvadının bal-maskarad düzəltdiyi axşam, hersoqun kraliça ilə orada görüşdükləri haqqında de Bua Roberın və markiz de Botrünun verdiyi xəbəri elan edərəm.

Yaxşı, monsinyor.

Bu məsələ bütün təfərrüatı ilə mənə məlumdur. Hersoq italyan falçısı paltarında saraya girmiş, gecə də çıxıb getmişdir. O, əynindəki plaşın altından bir ağ don geyibmiş; donun üstü insan kəlləsi, çalın-

çarpaz qoyulmuş qol-qıç sümükləri şəkilləri ilə və işıldayan qara pərəklərlə dolu imiş. Əgər o, tanınmış olsaymış, özünü Bəyaz Qadın xəyalı kimi qələmə verəcəkmiş; bilirsiniz ki, rəvayətə görə, bu xəyal baş verəcək hər bir mühüm hadisədən qabaq Luvrda gözə görünür

Monsinyor, elə bu?

Bunu da ona deyin ki, Amyendə baş verən hadisə bütün təfərrüatı ilə mənə məlumdur. Mən tapşıraram, bu hadisə haqqında bir roman yazarlar, romanda bağın planını, iştirak edən baş qəhrəmanların şəkillərini də göstərərlər

Mən bunu ona söylərəm.

Bunu da deyərsiniz ki, Monteqü Bastiliyada mənim əlimdədir. Düzdür, ondan heç bir məktub tapmamışlar, ancaq əzab və işgəncə onu bütün bildiklərini... hətta bilmədiklərini də açıb söyləməyə məcbur edər.

Baş üstə, bunu da deyərəm.

Nəhayət, bunu da əlavə edərsiniz ki, zati-aliləri Re adasından tələsik gedərkən öz otağında xanım de Şevrözün kraliçanı rüsvay edən bir məktubunu yaddan çıxarıb qoymuşdu. Bu məktub kraliçanın – həm kral düşmənlərini sevdiyini, həm də əgər məktubda yazılanlara inanılarsa, Fransanın düşmənlərilə əlbir olduğunu sübut edir. Sizə söylədiklərimin hamısını yaxşı yadınızda saxladınızmı?

– Monsinyor buna əmin ola bilər: Luvr gecəsi, Amyen axşamı, Monteqünün tutulması, xanım de Şevrözün məktubu.

Tamamilə düzdür, tamamilə düzdür! Miledi, sizin çox gözəl hafizəniz varmış.

Lakin bütün bu dəlillərə baxmayaraq, hersoq tutduğundan əl çəkməyib yenə də Fransanı təhdid etsə, necə olsun?

Rişelye dərin bir kədərlə dedi:

Hersoq kraliçaya dəlicəsinə, daha doğrusu, axmaqcasına vurulmuşdur. Əgər o bilsə ki, başladığım mübarizə onun qəlbinə hakim olan qadının namusu, bəlkə də sərbəstliyi bahasına başa gələcək, sizə söz verirəm ki, belə bir mübarizəyə girişməyi qət etmədən əvvəl o xeyli düşünməli olacaqdır.

Miledi yenə də sualını təkrar etdi:

Birdən o, öz tutduğundan əl çəkməsə, necə olsun? – Bundan görünürdü ki, miledi kardinalın ondan tələb etdiyi şeyin hamısını yaxşı bilmək istəyir.



Birdən o, öz tutduğundan əl çəkməsə... – Kardinal həzrətləri bir az duruxub sonra yenə sözünə davam etdi: Əgər o tutduğundan əl çəkmirsə, onda mən dövlətin simasını dəyişdirən hadisələrdən birinə ümid etməli olacağam.

Miledi dedi:

Əgər cənabınız iltifat buyurub belə hadisələrin tarix nümunələrindən birini söyləyərsə, onda bəlkə də mən sizin gələcəyə olan inamınıza şərik ola bilərəm.

Rişelye:

- Yaxşı, qulaq asın! dedi. Məgər min altı yüz onuncu ildə kral IV Henrix Fransa ilə İtaliyanı tutub Avstriyaya eyni zamanda iki tərəfdən zərbə endirmək istədikdə, Avstriyanı xilas edən bir hadisə baş vermədimi? Elə isə bəs Fransa kralı niyə Avstriya imperatoru kimi xoşbəxt olmasın?

Monsinyor Mednikov küçəsindəki qətlimi buyururlar?

Kardinal:

– Bəli, – dedi.

Ravalyakın[1] öldürülməsi xatirələrdə elə bir iz buraxmışdır ki, onun hərəkətini təkrar etməyi bir anlığa ağlına gətirən şəxs vahimədən tir-tir titrəməyə bilməz, – məgər cənabınız bundan qorxmurmu?

– Hər bir dövrdə, hər bir dövlətdə, xüsusilə bu dövlətlərdə dini çəkişmə olduğu zaman, din ya başqa bir məqsəd uğrunda hər bir əzaba dözən, hətta özünü özümə verən adamlar olur. Dayanın, fikrimə bir şey gəldi: puritanlar bu saat Bekinhem hersoquna qarşı bərk qəzəblənmişlər, onların vaizləri onu dəccal adlandırırlar.

Miledi dedi:

– Nə olsun ki?

Kardinal laqeyd halda dedi:

O olsun ki, hersoqdan öz qisasını almaq istəyən gözəl, cavan, bacarıqlı bir qadın tapmaq lazımdır. Belə bir qadına rast gəlmək çətin deyil. Hersoq qadınlar arasında müvəffəqiyyət qazanmış bir adamdır, əgər o, öz sevgisinin daimiliyi haqqında verdiyi vədlərlə bir çox qadının qəlbini alovlandırmışsa, eyni zamanda verdiyi vədləri həmişə pozması ilə də bir çoxlarının könlündə özünə qarşı nifrət oyatmışdır.

Miledi soyuq bir tərzdə dedi:

[1] Ravalyak kral IV Henrixin qatili

- Şübhəsız, belə bır qadına rast gəlmək olar.

Əgər bu mümkünsə, onda bu qadın Ravalyakın bıçağını, din və məqsəd uğrunda canından keçməyə hazır olan bir adamın əlinə verməklə Fransanı xılas edə bilər.

Onda bu qadın özü də qatılın yoldaşı hesab olunar.

Ravalyakın yoldaşları haqqında məlumat verildimi?

Yox, bəlkə də ona görə ki, onun yoldaşları çox yüksək bir mövqe tuturdular. Hökumət də onları məsuliyyətə cəlb etməyə cürət eləmədi. Monsinyor, axı hər kəsdən ötrü Ədalət Sarayını yandırmazlar.

Siz elə düşünürsünüz ki, Ədalət Sarayındakı yanğın təsadüfi olmamışdır? – Rişelye bu sualı elə bir tərzdə verdi ki, sanki o heç əhəmiyyəti olmayan bir məsələdən danışırdı.

– Monsinyor, mən şəxsən heç bir şey düşünmürəm; mən ancaq olan şeyi deyirəm ki, əgər mən xanım de Monpansye, ya kraliça Marıya Mediçi olsaydım, indikindən daha az ehtiyatlı tərpənərdim; lakin indi mənim adım ancaq ledi Klarikdir.

Rişelye:

- Tamamilə doğrudur, – dedi. – Bəs siz nə istərdiniz?

– Mən istərdim əlimdə elə bir əmr olsun ki, bu əmrdə Fransanın xoşbəxtliyi üçün mənim edəcəyim bütün işlər əvvəlcədən təsdiq olunmuş olsun.

Əvvəlcə, hersoqdan qisas almağa razı olan qadını tapmaq lazımdır.

Miledi:

Bu qadın tapılmışdır, – dedi.

Onda Allahın ədalətini göstərmək yolunda canından keçən adamı tapmaq məsələsi qalır.

- O da tapılar.

Kardınal:

O tapılandan sonra da, – dedi, – sizin indicə söylədiyiniz əmri sizə vermək vaxtı çatar.

Miledi onunla razılaşdı:

– Cənabınız haqlıdır. Demək, hersoq öz hərəkətində ısrar edib dursa, mən ancaq Allaha dua eləməliyəm kı, bir möcüzə göstərıb Fransanı xilas etsin. Monsınyor, doğrumu deyırəm?

Kardinal soyuq bir ıfadə ılə onun sözünü təsdiq etdi:

– Tamamilə doğru deyırsınız.



Miledi, kardinalın ifadəsindəki dəyişikliyi duymurmuş kimi sözünə davam etdi:

Cənabınızın düşmənlərinə aid olan bütün tapşırıqları aldıqdan sonra, indi də, monsinyor, öz düşmənlərim haqqında sizə bir-iki kəlmə söz söyləməyə icazə verərsinizmi?

Rişelye soruşdu:

Sizin də düşmənləriniz var?

– Bəli, monsinyor, var; bu düşmənlərə qarşı siz mənə kömək etməlisınız; çünki bu düşmənləri cənabınıza xidmət etmək üstündə qazanmışam.

Düşməniniz kimdir?

- Birisi de Bonasye adlı balaca bir fitnəkar qadındır.

O, Mant həbsxanasındadır.

Miledi dedi:

– O, Mant həbsxanasında idi, lakin kraliçanın kraldan etdiyı xahışə görə onu monastıra göndərmişlər.

Monastıra?

– Bəli, monastıra.

Hansı monastıra?

- Məlum deyıl, bunu bir sirr kimi bərk gizlədırlər.

Mən bu sirri bilirəm!

– Cənabınız bu qadının hansı monastırda olduğunu mənə söylərmi?

Məmnuniyyətlə.

- Yaxşı... Lakin mənim bir başqa düşmənim də vardır kı, o, bu balaça xanım Bonasyedən çox-çox təhlükəlidir.

– O kimdır?

- Xanım Bonasyenin oynaşı.

- Adı nədir?

Miledi qəzəbli halda bərkdən dedi:

– Cənabınız ki, onu yaxşı tanıyır! O, sizin də başınıza bır bəladır, mənim də! Bu, həmin adamdır ki, cənabınızın xidmətində olan qvardiyaçıların kral muşketyorları ilə baş verən toqquşmasında muşketyorların qalib gəlməsinə səbəb oldu; bu, həmin adamdır ki, sizın qasidiniz olan de Varda üç qılınc zərbəsi endirmişdir; Brılyant boyunbağı məsələsindəki müvəffəqiyyətsizliyə də başlıça səbəb bu adamdır və nəhayət, bu, həmin adamdır ki, xanım Bonasyeni oğurladığımı biləndən sonra məni öldürməyə and içmışdir.

Hə-ə! Bildim sız kımi deyirsiniz

Mən o alçaq d'Artanyanı deyirəm.

O, cəsarətli oğlandır.

– Cəsarətlı olduğu üçün də ondan qorxmaq lazımdır.

Onun Bekinhem hersoqu ilə əlaqəsinə dair əldə bir sübut olmalıdır.

Miledi bərkdən:

– Sübutmu? dedi. Mən belə sübutun lap onunu əldə edərəm!

Belə olsa, onu məhv etməkdən asan dünyada bir şey yoxdur: siz bu sübutları mənə verın, mən də onu Bastiliyaya salım.

– Yaxşı, monsinyor, bəs sonra?

Kardinal tutqun bir səslə:

Bastiliyaya düşənin sonrası yoxdur, dedi. – Ah, lənət şeytana, mən də öz düşmənimin əlindən belə asanlıqla yaxamı qurtara bilsəydim və siz məndən xahiş etmiş olsaydınız...

Miledi ona belə bir təklif etdi:

– Monsinyor, istəyirsiniz gəlin düşmənlərimizi dəyişək: canı canla, adamı adamla, hə? Siz mənə birini verin, mən də sizə birini verirəm.

Kardınal:

– Mən bilmirəm siz nə demək istəyirsiniz, mən hətta heç bunu bilmək də istəmirəm, dedi. Ancaq mən sizə yaxşılıq eləmək, sizin xahişinizi yerinə yetirmək istəyirəm; d'Artanyan, doğrudan da, sizin dediyiniz kimi, əxlaqsız, duelçi, xain adamdır.

Namussuz adamdır, monsinyor, namussuz!

O qələm kağızı bir mənə verin.

Alın, monsinyor.

Bir qədər susdular; bu göstərirdi ki, kardinal ya məktubda yazacağı cümləni düşünür, ya da məktubu yazırdı. Atos danışılanların bircə kəlməsini də buraxmamışdı; o, yoldaşlarını otağın o birı başına çəkdi.

Portos:

Yaxşı, sən nə istəyirsən, dedı, – niyə bizi qoymursan söhbətə axıra kimi qulaq asaq?

Atos pıçıldayaraq:

– Yavaş! – dedi. Biz lazım olan şeylərin hamısını eşıtdik Siz yenə də qulaq asa bılərsınız, amma mən getməlıyəm.

Portos soruşdu:



Sən getməlisən? Kardinal səni soruşsa, biz ona nə deyək?

– Siz onun heç soruşmasını gözləməyın; özünüz deyin ki, kəşfiyyata getdi, çünki meyxana sahibinin bəzi hərəkətləri ona şübhəli kimi göründü, ona elə gəldi ki, yolda bir təhlükə vardır. Mən özüm də kardinalın mehtərinə bir neçə söz söylərəm. Qalan nə lazımsa özüm bilirəm, siz mənim barəmdə narahat olmayın.

Aramis dedi:

– Ehtiyatlı olun, Atos!

Atos:

Məndən arxayın olun, – dedi. Özünüz bilirsiniz ki, mən soyuqqanlı adamam.

Portosla Aramis yenə də soba bacası yanındakı stullarda oturdular.

Atos hamının gözü qabağında otaqdan bayıra çıxdı, kardinalın mehtərinə xəbərdarlıq elədi, atının cılovunu pəncərə qapısından açdı, tapançasının dolu olub olmadığını yoxladı, atını düşərgəyə sarı çapdı

## XV

## AİLƏ SÖHBƏTİ

Atos düşündüyü kimi də oldu: kardınal tez aşağı düşdü, muşketyorlar olan otağın qapısını açıb ıçərı gırdi. Portosla Aramisı böyük həvəslə aşıq-aşıq oynayan gördü. Bütün otağı cəld gözdən keçirtdi, gördü ki, muşketyorlardan bırı yoxdur.

Atos hanı?

Portos:

Monsinyor, dedi, o, yola, kəşfiyyata çıxdı, çünki bizim meyxana sahibinin bəzi hərəkəti ona şubhəli kimi göründü, ona elə gəlirdi ki, yolda bir təhlükə var.

Cənab Portos, siz nə edirdiniz?

- Mən Aramisdən beş pistol uddum.

Siz indi mənimlə qayıda bilərsinizmi?

– Biz cənabınızın əmrini gözləyirik.

- Elə isə, cənablar, ata minin. Gecdir.

Mehtər qapı qabağında durub, kardinalın atının cilovundan tutmuşdu. Bir az aralıda, kölgədə, iki adam da üç atın cilovundan tutub

durmuşdu. Bunlar, miledini de La Puant istehkamına aparmalı, oradan da onu gəmiyə qoyub yola salmalı idilər.

Kardinal mehtərin, iki də muşketyorun müşayiətilə düşərgəyə sarı getdi.

İndi görək Atos nə elədi.

O, atını eyni yürüşlə yüz addıma qədər sürüb cəld sağa döndü, bir dairə vurub ağaclığa qayıtdı, iyirmi addım yoldan qıraqda durub kardinalın gəlib keçməsini gözlədi. At üstə gələn yoldaşlarının sallaq şlyapalarını və kardinalın plaşının zər saçaqlarını görüb yerindən tərpənmədi: onlar tindən burulub gözdən itən kimi çapa-çapa meyxanaya qayıtdı: meyxana sahibi onu sorğu sualsız içəri buraxdı: Atosu görən kimi tanımışdı.

Mənim rəisim buradakı qadına çox mühüm bir tapşırıq verəcəyini unutmuşdur: məni göndərdi ki, bunu ona söyləyim.

Buyurun, o, hələ öz otağındadır.

Atos yüngül addımlarla cəld yuxarı qalxdı, yarıaçılmış qapıdan miledinin şlyapasını başına qoyduğunu gördü.

İçəri girib qapını örtdü. Miledi qapı açarının vurulduğunu eşidib üzünü çevirdi.

Atos plaşa bürünmüş halda qapı önündə durmuş, şlyapasını da gözünün üstə basmışdı.

Miledi bir heykəl kimi hərəkətsiz və lal dinməz duran adamı görüb diksindi.

Siz kimsiniz, sizə nə lazımdır?

Atos pıçıldayaraq öz özünə dedi: "Elə özüdür ki, var!"

Plaşı çiynindən atıb və fetr şlyapasını çıxarıbulediyə yanaşdı:

– Xanım, məni tanıdınızmı?

Miledi bir addım irəlilədi və birdən dəhşət içində geri çəkildi.

Atos:

– Yaxşı, – dedi. – İndi bildim ki, məni tanıdınız.

Miledi rəngi qaçmış halda divara sarı geri çəkilə-çəkilə pıçıldadı:

Qraf de la Fer!

Atos:

– Bəli, miledi, qraf de la Ferdir, dedi, o dunyadan ancaq sizi görmək iltifatına nail olmaq üçün gəlmişdir Yaxşı, kardinal deyən kimi, oturaq, söhbət edək.

Miledi bir kəlmə də söz söyləmədən, ağır bir dəhşət içində oturdu.



Atos sözünə davam etdi:

– Siz göydən yerə göndərilmiş iblissiniz. Mən sizin böyük bir qüvvətə malik olduğunuzu bilirəm, lakin siz də bilirsiniz ki, insanlar Allahın köməyilə çox vaxt ən dəhşətli iblislərə belə qalib gəlmişlər. Siz bir dəfə mənə rast gəlmişdiniz. Elə bilirdim ki, sizi məhv etmişəm, görünür, səhv etmişəmmiş, ya bəlkə də, cəhənnəm sizə təzədən can vermişdir.

Miledi başını endirib boğuq-boğuq inlədi.

Atos yenə də sozünə davam etdi:

Bəli, cəhənnəm yenə də sizə can vermişdir. Cəhənnəm sizi varlandırmışdır, sizə ayrı bir ad, başqa bir sima vermişdir: lakin qəlbinizdəki çirkabı yuyub təmizləməmiş, bədəninizdəki damğanı silməmişdir.

Miledi ilan vurmuş kimi yerindən qalxdı: onun gözlərində ildırımlar çaxdı. Atos yerindən tərpənmədi.

- Siz məni ölmüş hesab edirsiniz, eləmi? Mən də sizi ölmüş hesab edirdim. Ledi Klarik adı Anna de Beyli gizlədən kimi, Atos adı da qraf de La Feri gizlətdi! Sizin hörmətli qardaşınız bizi evləndirəndə sizin adınız Anna de Beyl deyildimi? – Atos gülərək əlavə etdi: – Bizim vəziyyətimiz doğrudan da çox qəribədir: biz hər ikimiz bu vaxta kimi ona görə yaşamışıq ki, bir-birimizi ölmüş bilmişik.

Miledi tutqun bir səslə dedi:

Yaxşı, siz axı mənim yanıma nə üçün gəlmisiniz? Məndən nə istəyirsiniz?

– Mən sizə bir şey demək istəyirəm: mən sizi görməsəm də, sizi gözdən qoymurdum.

Siz mənim etdiyim işlərin hamısını bilirsinizmi?

Kardinalın yanında qulluğa girən gündən ta indiyə kimi nə etmisinizsə, hamısını günü ilə saatı ilə sizə söyləyə bilərəm.

Miledinin rəngi qaçmış dodaqlarında bir təbəssüm titrədi; bu təbəssüm onun bu sözlərə inanmadığını göstərirdi.

- Qulaq asın, siz Bekinhem hersoqunun kamzolundan iki brilyant pərəyi kəsmisiniz; siz xanım Bonasyeni oğurlatmısınız; siz de Varda vurulmusunuz və onunla görüşmək arzusu ilə cənab d'Artanyanı öz yanınıza buraxmısınız; siz sonra elə zənn etmisiniz ki, de Vard sizi aldatmışdır, buna görə də onun rəqibinə onu öldürtmək istəmisiniz. Bu adam da sizin rəzil sirrinizi bildikdən sonra pulla iki qatil tutub, onu tələf etmək təşəbbüsündə olmusunuz; lakin siz atılan güllələrin

hədəfə dəymədiyini bilib d'Artanyana saxta bir məktubla, zəhərlənmiş şərab göndərmisiniz, bu məktubda da yazmısınız ki, şərabı guya onun dostları göndərmişdir. Nəhayət, siz həmin bu otaqda, mənim oturduğum bu stulda oturaraq Bekinhem hersoqunu öldürməyi öhdənizə götürmüsünüz, bunun da əvəzində kardinal d'Artanyanı tələf etməyə söz vermişdir.

Miledi meyit kimi ağardı, pıçıldayaraq dedi:

– İblis, bax, sizsiniz!

Bəlkə də. Ancaq mən sizə bir söz deyəcəyəm, onu yaddan çıxarmayın. Bekinhem hersoqunu ya özünüz öldürün, ya bir başqasına öldürtdürün – mənim üçün bunun heç bir fərqi yoxdur, – mən onu tanımıram; bir də ki, o, ingilisdir; lakin d'Artanyanın bir tükünə də toxunmayın, o, mənim sədaqətli dostumdur, mən onun xətrini çox istəyirəm, onu müdafiə edirəm. Əgər siz ona toxunsanız, and olsun atamın qəbrinə, sizin bu cinayətiniz etdiyiniz cinayətlərin sonuncusu olacaqdır!

Miledi tutqun səslə dedi:

Cənab d'Artanyan məni çox bərk təhqir etmişdir. Buna görə də o ölməlidir.

Atos istehza ilə gülümsədi:

Sizi də təhqir etmək olarmı? O, sizi təhqir etmişdir deyə ölməlidirmi?

Miledi sözünü təkrar etdi:

O ölməlidir Əvvəl o qadın, sonra da o!

Atos bərk hirsləndi. Bu qadının görünüşü onda dəhşətli xatirələr yaratdı. Bir dəfə o, indikindən daha az təhlükəli bir vəziyyətdə, miledini öz namusuna qurban etmər istədiyini xatırladı. İndi də bu qadını öldürmək üçün onun qəlbində böyük bir arzu oyandı. Ayağa qalxdı, əlini qurşağına aparıb tapançasını çıxartdı, çaxmağını çəkib üstayaqda qoydu.

Miledi meyit kimi ağardı, çığırmaq istədi, lakin qorxudan dili tutuldu. Boğazından vəhşi heyvan xırıltısına oxşar boğuq bir səs çıxdı; saçları dağınıq halda, tünd rəngli kağız çəkilmiş divara sıxıldı; bu vəziyyətdə o, dəhşət ifadə edən bir heykələ bənzəyirdi.

Atos tapançanı yavaş yavaş qaldırdı, əlini uzatdı: belə ki, tapançanın lüləsini miledinin az qala alnına toxundurdu

Kardinalın yazdığı kağızı bu saat mənə verin, yoxsa, and olsun namusuma, sizi öldürəcəyəm.



Başqa adam olsaydı, miledi onun öz təhdidini yerinə yetirəcəyinə şübhə edə bilərdi. Lakin o, Atosu tanıyırdı. Bununla belə, o, yenə də yerindən tərpənmirdi.

Düşünmək üçün bircə saniyə vaxt verirəm. Miledi cəld əlini döşünə apardı, kağızı çıxarıb Atosa verdi:

Alın, dedi. Sizi görüm lənətə gələsiniz!

Atos kağızı aldı, tapançanı yenə də qurşağına keçirtdi.

Kağızın kardinalın yazdığı kağız olub-olmadığını yəqin etmək üçün lampaya yaxınlaşdı; açıb oxudu:

*"Bu kağızı verən adam nə etmişsə, mənim əmrimlə və dövlətin xeyri üçün etmişdir.*

*5 avqust 1628-ci il. Rişelye".*

Atos plaşına bürünərək, şlyapasını başına qoya-qoya dedi:

Ilan, mən ki, sənin dişlərini çıxartdım, indi adam vura bilərsən, get vur.

Otaqdan çıxdı, heç dönüb geriyə də baxmadı. Meyxana qapısı ağzında iki adam üç atın cilovundan tutub durmuşdu:

– Cənablar, – dedi, – monsinyorun əmr etdiyi kimi, bu qadını vaxt itirmədən de La Puant istehkamına aparın və gəmiyə mindirməmiş geri qayıtmayın.

Mühafizəçilər hörmətlə baş əydilər. Bu sözlər, doğrudan da, onların aldığı əmrə müvafiq gəlirdi.

Yüngülcə yəhərə sıçradı, çapa-çapa uzaqlaşdı; yolla getmək əvəzinə çöllə, kəsmə yolla irəliləməyə başladı; atı bərk mahmızlayır, bəzən dayanaraq ətrafına qulaq da asırdı.

Bir də belə dayanıb qulaq asanda at ayağı tappıltısı eşitdi. Bu atlıların kardinalla mühafizəçilər olduğuna şübhə etmədi. Dərhal atını qabağa sürdü; ot və yarpaqlarla atının tərini sildi, düşərgəyə, təxminən, iki yüz addım qalmış yola çıxdı.

Uzaqdan atlılar gəldiyini görüb bərkdən soruşdu:

– Gələn kimdir?

Kardinal:

- Bu, deyəsən, bizim igid muşketyorumuzdur, dedi.

Portos:

– Bəli, monsinyor, – dedi, özüdür.

Cənab Atos, mənim qeydimə qaldığınıza görə sizə təşəkkür edirəm. Cənablar, budur, gəlib çıxdıq Sola dönün, parol: " Kral və Redir.

Kardınal bu sözləri deyib muşketyorlara baş əydi və oz mehtərilə sağa döndü; bu gecəni o, düşərgədə keçirmək ıstəyırdi.

Kardinal gözdən itən kimi Portosla Aramis bərkdən dedi:

Miledinin istədiyi kağızı o yazdımı?

Atos arxayınca:

Yazdı, dedı. – Kağız məndədir.

Onlar öz mənzilinə çatana kimi bir kəlmə də danışmadılar. Evə gələn kimi Muşketonu Planşenin yanına göndərdilər:

– Gedib ona deyərsən ki, ağan səngər qarovulu növbəsindən çıxan kimi tez cənab muşketyorların mənzilinə gəlsin.

Miledi də Atosun düşündüyü kimi elədi, aşağı endi. Meyxana qapısı qabağında onu gözləyən adamları görüb dinməz-söyləməz ata mindi, mühafizəçilərlə bərabər yola düşdü. Bir anlığa onun ağlına gəldi ki, əvvəlcə kardinalın yanına qayıdıb bütün başına gələn hadisəni ona söyləsin. Lakin o, bunun üstünü açarsa, Atos da o biri məsələnin üstünü aça bilərdi. Tutaq ki, o, belə deyərdi: Atos məni asmaq istəyirdi. Atos da deyərdi ki, o damğalanmışdır. Miledi düşünərək bu qərara gəldi ki, hər halda susmaq yaxşıdır; buradan gizlicə çıxıb getməli, öhdəmə götürdüyüm çətin tapşırıqları məharətlə yerinə yetirməliyəm. Elə ki, bütün məsələlər həll olundu, onda kardinalın yanına gedib qisas almağı ondan tələb edərəm.

Bütün gecəni yol gedərək səhər saat yeddidə de La Puant istehkamına gəldi. Saat səkkizdə o, artıq göyərtədə idi. Gəmi də saat doqquzda, kardinalın verdiyi "gəmi Bayona gedir" icazənaməsilə lövbəri qaldırıb İngiltərəyə yola düşdü.

## XVI

## SEN-JERVE İSTEHKAMI

D'Artanyan dostlarının yanına gələndə onların hamısını bir otaqda gördü; Atos düşüncəyə dalmışdı, Portos bığlarını eşirdi, Aramısc də mavi, məxmər cıldlı balaca, gözəl bir dua kıtabına baxaraq dua edirdı.

D'Artanyan.

Cənablar, dedi, yəqin siz mənə çox mühüm bir şeyi söyləyəcəksiniz, yoxsa mən sizı əfv etməyəcəyəm; çünki sız mənı istehkam



ətrafında gedən gecə vuruşmasından sonra dincəlməyə qoymayıb, buraya gəlməyə məcbur eləmisiniz. Ax, heyf kı, cənablar, siz orada deyilsiniz! Çox qızğın vuruşma getdi.

Portos bığlarını ayrı bir üsulla eşərək dedi:

Biz başqa bir yerdə idik, ancaq orada da elə buna oxşar bır qızğın iş vardı.

Atos:

Yavaş! dedi.

D'Artanyan muşketyorun yüngülcə çatılmış qaşlarını görüb dedi:

– Hə! Yəqin təzə xəbər var.

Atos Aramisə döndü:

Siz, deyəsən, üç gün bundan əvvəl "Neçestivitsa" aşxanasında nahar eləmisiniz?

Bəli.

– Yeməkləri necədir?

– Pisdir. Onda pəhriz günü idi, heç balıq da vermirdilər.

Atos soruşdu:

Necə, sahil şəhərində balıq yox idi?

Aramis yenə də ibadətə başlayaraq dedı:

– Deyirlər ki, kardinalın qurduğu bənd balıqların hamısını dənizə qovur.

Aramis, mən sizdən bunu soruşmuram, mən soruşuram ki, o aşxana sizin xoşunuza gəldimi, sızin narahat eləyən olmadı ki?

– Məncə orada zəhlətökən adamlar yox ıdi... Sizin söyləyəcəyiniz məsələ üçün həmin aşxana lap əlverişli bir yerdir.

Atos belə bir təklif etdi:

Onda həmin aşxanaya gedək, çünki burada divarlar elə bir kartondandır.

D'Artanyan öz dostunun qəribə hərəkətlərinə adət etmişdi; elə ilk sözündən onun mühüm bir şey söyləyəcəyini duyub qoluna girdi, bircə kəlmə də söz demədən otaqdan çıxdı. Portos da Aramislə danışa-danışa onların ardınca getdi.

Yolda Qrimoya rast gəldilər. Atos işarə ilə ona dallarınca gəlməsini bildirdi. Qrimo da, adəti üzrə, dinmədi. Yazıq o dərəcəyə çat mışdı ki, danışmağı da az qala yaddan çıxartmışdı.

"Neçestivtsa" aşxanasına gəldilər. Səhər saat yeddi idi, hava işıq lanmağa başlayırdı. Dostlar səhər yeməyi verilməsini tapşırıb böyük

bir otağa girdilər, aşxana sahibi dedi ki, burada onları heç kəs narahat eləməz.

Bədbəxtlikdən, gizli söhbət üçün seçilən vaxt heç yerinə düşmədi: səhər açılan kimi bir çox adam, yuxusunu dağıtmaq və qızınmaq üçün aşxanaya şərab içməyə gəldi. Draqunlar, isveçrəlilər, qvardiyaçılar, muşketyorlar, süvarilər tez-tez gəlib gedirdilər. Əlbət ki, bu, aşxana sahibinin xeyrinə idi, lakin dörd dostun məqsədinə qətiyyən uyğun deyildi. Buna görə də onlar öz yoldaşlarının salamına, zarafatlarına, sağlıq qədəhlərinə çox könülsüz cavab verirdilər.

Atos dedi:

– Vura indi burada birisi ilə dalaşaq, onda iş lap yerinə düşər! d'Artanyan, gecəni necə keçirdiniz, siz indi bundan danışın, biz də öz sözümüzü sonra deyərik.

Azca səndirləyən və araq stəkanını əlində tutan bir süvari sözə qarışdı:

– Doğrudan da, cənab qvardiyaçılar, siz bu gecə səngərdə idiniz, yəqin ki, Laroşellilərlə yamanca dalaşmısınız.

D'Artanyan Atosa baxdı, bununla o, elə bil söhbətə qarışan bu adama cavab verib-verməyəcəyini bilmək istəyirdi.

Atos dedi:

– Eşitmirsənmi, cənab de Büzinye iltifat buyurub sənə müraciət edir! De görək, gecə orada nə olmuşdur?

Pivə stəkanı ilə rom içən bir isveçrəli soruşdu?

Siz istehkamı aldınızmı?

D'Artanyan baş əyərək dedi:

Bəli, cənab, bu gözəl iş bizə müyəssər oldu. İstehkam tinlərindən birinin altına bir çəllək barıt qoyduq Barıt partladı. İstehkamın bir tərəfini uçurtduq. İstehkam təzə deyildi; partlayış təsiri ilə binaya çox böyük zərər dəydi.

Bir draqun qılınca keçirdiyi bir qazı əli ilə tutaraq soruşdu (qazı o qızartmaq üçün gətirmişdi):

Bu, hansı istehkamdır?

D'Artanyan:

Sen-Jerve istehkamı. Laroşellilər bu istehkama arxalanaraq bizim fəhlələri çox narahat edirdilər.

Vuruşma qızğın oldumu?

– Bəli. Biz beş adam itirdik, laroşellilər isə səkkiz, ya on.



Özlərinin alman dilində bolluca söyüşləri və andları olsa da, fransızca söyüş söyməyi və and içməyi adət edən isveçrəli dedi:

– Lənət şeytana!

Süvari:

Yəqin ki, bu gün onlar istehkamın uçmuş yerini düzəltmək üçün adam göndərəcəklər, dedi.

D'Artanyan:

– Bəli, ola bilər ki, göndərsinlər, – dedi.

Atos sözə qarışdı:

– Ağalar, mərc gəlmək istəyirsinizmi?

Süvari soruşdu:

– Nə mərc?

Draqun öz qılıncını soba üstündəki iki böyük dəmir manqal üstə qoyaraq dedi:

Dayanın. Ey, aşpaz! O tavanı buraya gətir, bu ləzzətli quşun bircə damla yağı da gərək yerə tökülməsin.

İsveçrəli:

O haqlıdır, – dedi. – Qaz ayağı mürəbbə ilə çox yeməli olur.

Draqun:

Bax belə, cənab Atos, dedi, indi biz sizə qulaq asırıq. O söylədiyiniz hansı mərcdir?

Atos sözə başladı:

Cənab Büzinyi, mən sizinlə mərc gəlirəm ki, düşmən nə qədər bizi qovmağa çalışsa da, mən və mənim üç yoldaşım – cənab Portos, Aramis və d'Artanyan Sen-Jerve istehkamı üstündə oturub səhər yeməyini yeyəcəyik və düz bir saat orada olacağıq.

Portosla Aramis bir-birinə baxdılar: onlar bunun nə olduğunu başa düşürdülər.

D'Artanyan əyilib Atosun qulağına pıçıldadı:

– Sən istəyirsən ki, bizi orada öldürsünlər?

Atos dedi:

Oraya getməsək bizi daha tez öldürərlər.

Portos stulun arxasına söykənib bığlarını buraraq dedi:

– Cənablar, and olsun Allaha, heç belə yaxşı mərc olmaz!

Cənab Büzinyi:

Buna görə də mən onu qəbul edirəm, dedi. İndi bilmək lazımdır ki, görək nədən mərc gəlirik.

Atos sözünə davam etdi:
– Cənablar, siz də dörd nəfərsiniz, biz də: səkkizadamlıq xörək, hərənin də könlü istəyəni. Razısınızmı?
Büzinyi bu təklifə razı oldu:
– Çox gözəl!
Draqun da onun sözünü təsdiq etdi:
– Daha bundan yaxşı nə ola bilər?
İsveçrəli də öz fikrini söylədi:
– Mən də razı!
Özünü lallığa vuran dördüncü adam da başı ilə razılıq işarəsi etdi.
Aşxana sahibi dedi:
Cənablar, yeməyiniz hazırdır.
Atos dedi:
– Elə isə gətirin!
Aşxana sahibi yeməyi gətirdi. Atos Qrimonu çağırdı, otağın bir küncündə atılıb qalan böyük bir zənbili göstərdi. İşarə ilə bildirdi ki, əti dəsmallara büküb ora qoysun.
Qrimo dərhal başa düşdü ki, məsələ nə yerdədir: deməк səhər yeməyini çöldə yeyəcəkdilər. Yeməkləri, şərab şüşələrini zənbilə yığdı.
Aşxana sahibi soruşdu:
Siz harada nahar eləmək istəyirsiniz?
Atos:
– Sizin üçün fərqi nədir; Siz pulunuzu alın. Nə qədər lazımdır? deyib mizin üstünə vüqarla iki pistol pul atdı.
Aşxana sahibi soruşdu:
Cənab zabit, necə buyurursunuz, artığını verimmi?
Yox. İki şüşə də şampan şərabı qoyun. Artığı da dəsmalların pulu olsun.
Aşxana sahibinin qazancı əvvəl düşündüyündən az oldu. Lakin o, iki şüşə şampan şərabı yerinə iki şüşə Anju şərabı verərək bunun əvəzini çıxdı.
Atos:
– Cənab Büzinyi, – dedi, istəyirsiniz siz öz saatınızı mənimki ilə düzəldin, ya icazə verin, mən öz saatımı sizinki ilə düzəldim.
Süvari öz cibindən brilyantlı gözəl bir saat çıxarıb dedi:
Çox gözəl, möhtərəm cənab. Mənimki səkkizin yarısıdır.



Atos:
Mənimkində səkkizə iyirmi beş dəqiqə qalıb, dedi. Deməк mənim saatım sizinkindən beş dəqiqə qabaqdır.
Dörd nəfər cavan adam heyrət içində donub qalan zabitlərə baş əyərək Sen Jerve istehkamına sarı yola düşdülər. Qrimo da, əlində zənbil, onların dalınca gəlirdi; lakin o, hara getdiyini bilmirdi. Atos onu elə dinməz-söyləməz boyun əyməyə adət etdirmişdi ki, hara getdiklərini soruşmaq heç onun ağlına gəlmədi.
Dörd dost düşərgə içindən keçərkən bir kəlmə də olsun danışmadı. Dostların mərc gəldiklərini bilən adamlar, bunun necə qurtaracağı ilə maraqlanaraq onların dalınca gedirdilər. Nəhayət, səngərləri keçdikdən sonra məsələdən qətiyyən xəbərdar olmayan d'Artanyan soruşdu:
İndi, əzizim Atos, deyin görüm, biz hara gedirik?
Görmürsünüzmü istehkama gedirik?
– Biz orada nə edəcəyik?
– Özünüz bunu çox gözəl bilirsiniz. nahar eləyəcəyik
Bəs niyə biz "Neçestivtsa"da oturmadıq?
Ona görə ki, biz çox mühüm məsələlər haqqında danışmalıyıq. O aşxanada beşcə dəqiqə oturub söhbət eləmək mümkün deyil. adamlar elə bir ucdan gəlib gedirlər, salam verirlər, söhbətə qarışırlar adamın lap zəhləsini tökürlər. İstehkamı göstərərək əlavə etdi:
Burada heç olmasa bizi narahat eləməyəcəklər.
Həm ağla, həm də fövqəladə bir igidliyə malik olan d'Artanyan dedi:
– Mənə elə gəlir ki, biz dəniz qırağındakı qum təpələri üstündə rahatca bir yer tapa bilərdik.
Orada bizi görərdilər, on beş dəqiqədən sonra da kardinala xəbər apardılar ki, biz burada müşavirə edirik.
Aramis:
Atos tamamilə haqlıdır, – dedi.
Portos:
Bir səhra tapa bilsəydik pis olmazdı. Ancaq belə səhranı haradan tapasan axı?
- Elə bir səhra tapmazsan ki, orada adamın başı üstündən bir quş uçub keçməsin, bircə adadovşanı zağasından bayıra çıxmasın, bircə balıq su üzünə qalxmasın; bax, həmin bu quş da, bu adadovşanı da, bu balıqda, mənə elə gəlir ki, kardinalın casusudur. Yaxşısı budur ki, istehkama gedək, birdə ki, biz artıq geri dönə bilmərik: mərc çəkiş-

mişik, udmalıyıq. Biz bir saat istehkamda qalacağıq Əgər hücum eləyən olmasa, bu vaxt bizə danışmaq üçün kifayət edər; heç kəs də bızım söhbətımizi eşitməz: mən sizə söz verirəm ki, istehkam dıvarlarının qulağı yoxdur. Bizə hücum eləsələr də, yenə biz işimiz haqqında danışa bilərik, özümüzü müdafiə etməklə, üstəlik, bir şöhrət də qazanarıq. Özünüz görürsünüz ki, məsələ necə bir şəkil alsa, yenə bizim xeyrimızə olur.

D'Artanyan:

Çovumuş bir güllə də olsa da dəyəcək, - dedi, - mən buna şübhə etmirəm.

Atos:

Ax, əzizim, dedi, – siz özünüz yaxşı bilirsiniz ki, ən qorxulu güllə düşmən atan güllə deyil.

Bız kı, belə bir işə girişmişik, heç olmasa muşketlərimizi özümüzlə götürməlı idik.

Əzızim Portos, sız axmaqsınız: niyə onları nahaq yerə özümüzə artıq yük eləyək?

Bu, heç də artıq yük deyil. Biz hərəmiz bir yaxşı muşket, barıt, on ıki də patron götürsəydik, heç pis olmazdı.

D'Artanyanın söylədıyini eşıtmədinizmi?

Portos soruşdu:

– D'Artanyan nə söylədi ki?

D'Artanyan söylədı kı, bu gecəki hücum zamanı səkkiz ya on fransız, bir o qədər də laroşelli ölmüşdür.

Nə olsun ki?

- Nə olacaq: onları hələ heç kəs soymayıb.

– Bundan bizə nə?

– Necə bizə nə? Biz onların muşketlərini də götürərik, güllələrini, barıtını da; dörd muşket, on iki patron yerinə on beş tüfəngimiz, yüzə qədər də patronumuz olar.

Aramis sözə qarışdı:

– Atos, sən nə ağıllı adamsanmış!

Portos başını əydi, bununla da, bu fikrə razı olduğunu bildirdi. Görünür ancaq d'Artanyan bu fikirlə razılaşmırdı.

Qrimo da bu işi d'Artanyan kimi təhlükəli bır ış hesab eləyirdi. O,əvvəl, onların istehkama gedəcəyinə inanmırdı, lakin məsələnin olduğunu görüb ağasının ətəyindən dartdı və işarə ılə soruşdu:



– Bız hara gedırik?

Atos əli ilə ıstehkamı göstərdi.

Qrimo yenə də işarə ılə dedı:

- Bızim axı orada meyıtimiz qalar.

Atos başını və əllərını göyə qaldırdı.

Qrımo zənbili yerə qoyub oturdu və başı ilə getməyəcəyini bildirdi.

Atos tapançasını qurşağından çıxartdı, çaxmaqdaşını yoxladı, doldurdu, tapançasının lüləsini Qrımonun qulağına dirədi.

Qrimo cəld ayağa qalxdı.

Atos ona zənbılı yerdən götürüb qabağa düşməsini işarə ilə bildirdi Qrimo əmri yerinə yetirdı. Onun bırcə dəqiqə sürən bu dilsiz danışıqdan qazandığı bu oldu ki, arxadan qabağa keçdi.

Dörd dost istehkamın üstünə qalxdıqdan sonra dönüb geriyə baxdı.

Müxtəlıf alaylardan olan üç yüzə qədər əsgər düşərgənin qabağın da durmuşdu: dəstələrdən birinin içində mərc çəkışdikləri cənab Büzinyini, draqunu, isveçrəlini və zabiti görmək olurdu.

Atos şlyapasını çıxarıb qılıncının başına taxdı və havada yellədi.

Düşərgə qabağında toplaşanlar, hörmət ifadə edən bu hərəkətə qarşı "ura!"-deyə bir neçə ağız bağırdılar. Bundan sonra dörd dost istehkamda gözdən itdi.

## XYII

## MUŞKETYORLARIN SÖHBƏTİ

Atosun dediyi tamamilə düz oldu: istehkamda on iki fransız və laroşelli meyitindən başqa heç kəs yox idi.

Yürüşə başçılıq edən Atos dedi:

– Cənablar, Qrimo naharı düzəldənə kimi biz tüfənglərı, patronları yığaq. Bu, bizə söhbət eləməyə də heç mane olmaz. Meyıtləri göstərərək əlavə etdi: – Laroşellilər bizım danışığımızı eşitməz.

Portos belə bir məsləhət gördü:

- Hər halda onları xəndəyə atsaq yaxşı olar, ancaq əvvəlcə ciblərini bir yoxlamaq lazımdır.

Atos sözə qarışdı:

– Bu, Qrimonun işidir.

D'Artanyan da öz fikrini söylədi.

Onda qoy Qrimo onların cibini axtarsın, sonra da divarın o tayına atsın.

Atos:

– Meyitləri atmasaq yaxşıdır, dedi, yenə də bizə gərək olar.

Portos buna təəccüb elədi:

Bu meyitlər bizə gərək olar? Əziz dost, sən, deyəsən, ağlını çaşdırırsan!

– İncildə də yazırlar, kardinal da deyir ki, düşünmədən hökm sürməyin. Cənablar, neçə tüfəng yığdınız?

Aramis cavab verdi:

On iki.

Patron neçədir?

Patron yüz olar.

- Bizə lazım olan da elə budur: tüfəngləri dolduraq.

Dörd muşketyor işə başladı. Qrimo işarə ilə süfrənin hazır olduğunu söyləyərkən, onlar axırıncı tüfəngi doldurub qurtardılar.

Atos da Qrimoya əli ilə "yaxşı" işarəsini verib daş daxmaya oxşar bir yeri göstərdi, orada qarovulda durmasını bildirdi, özü ilə çörək, iki kotlet, bir şüşə şərab götürməsinə icazə verdi.

Sonra da yoldaşlarına döndü:

İndi oturub nahar eləyə bilərik.

Dörd dost türk, ya dərzi kimi bardaş qurub yerdə oturdu.

D'Artanyan sözə başladı:

İndi daha sən başqalarının söhbətə qulaq asacağından qorxmaya bilərsən. Di o sirri aç, biz bilək.

Atos:

Cənablar, dedi, əminəm ki, bu tədbirimlə mən sizə həm kef verdim, həm şöhrətə çatdırdım. Mən sizi gözəl bir gəzintiyə çıxmağa məcbur etdim. Qabağınızda ləzzətli yemək, beş yüz adam da aşağıda sizin tamaşanıza durmuşdur, mazğaldan baxsanız özünüz də görə bilərsiniz. Onlar bizi ya dəli, ya da qəhrəman hesab edirlər: dəlilər də, qəhrəmanlar da axmaqlar sinfinə mənsubdurlar, bir-birlərinə də çox oxşayırlar.

D'Artanyan soruşdu:

– Bəs sirr?

Məndəki sirr bundan ibarətdir ki, dünən axşam miledini gördüm.



D'Artanyan şərab stəkanını ağzına aparırdı, miledi adını eşidən kimi əli elə bərk əsdi ki, şərabı dağıtmamaq üçün stəkanı yerə qoymağa məcbur oldu.

Sən öz...

Atos onun sözünü kəsdi:

– Yavaş! Əziz dost, unutmayın ki, bu cənablar mənim ailə işlərimə bələd deyil. Bəli, mən miledini gördüm.

Harada?

Təxminən, buradan iki lye arası olan "Qızıl Göyərçin hini" mehmanxanasında.

D'Artanyan pıçıldayaraq dedi:

Mən məhv oldum.

Yox, hələ tamam məhv olmamısan, çünki o, indi yəqin ki, Fransa sahillərini tərk etmişdir.

D'Artanyan rahatca köksünü ötürdü.

Portos sözə qarışdı:

Bu miledi axı kimdir?

Atos stəkandakı köpüklü şərabı içərək dedi:

– Füsunkar bir qadın! Haramzadə aşxanaçı. Şampan şərabı yerinə bizə Anju şərabı verib və yəqin, elə zənn edib ki, bizi yaxşıca aldada bilib. Bəli, miledi füsunkar bir qadındır, özü də bizim dostumuz d'Artanyana çox yaxşı əlaqə bəsləyirdi. Lakin d'Artanyan onun haqqında çox pis hərəkət edir, miledi də bunun qisasını almaq üçün bir ay əvvəl adam göndərib onu öldürtmək istəyir. Səkkiz gün əvvəl də onu zəhərləmək fikrinə düşür. Dünən də onun başını kardinaldan istədi, kardinal da buna razılıq verdi.

Qorxudan d'Artanyanın rəngi ağardı.

– Necə? Mənim başımı kardinaldan istədi? Kardinal da buna razılıq verdi?

Portos:

Bəli, dedi, – mən bunu öz qulağımla eşitdim.

Aramis də onun sözünü təsdiq etdi:

– Mən də.

D'Artanyan dərin məyusluq və ümidsizlik içində qollarını endirdi:

– Elə isə daha mübarizə etməyin heç bir mənası yoxdur. Bircə əlac buna qalır ki, güllənı təpəmə çaxım, – bütün məsələlər həll olub qurtarsın.

Atos:

– Bu, ən axırıncı axmaqlıqdır, dedı. – Bunu həmişə eləmək olar. Özü də bu, elə bir axmaqlıqdır ki, sonra heç bir yolla buna əlac eləmək olmaz.

D'Artanyan:

– Bu qədər ki, mənim qüvvətlı düşmənlərim var, mən ölümdən yaxa qurtara bilməyəcəyəm, dedi. Bunlardan biri o tanımadığım menqlidir, o biri də Varddır ki, ona üç qılınc zərbəsi endırmışəm, üçüncü milededir ki, sirrinə bələd olmuşam, dördüncüsü isə kardinaldır ki, ona da qisas almağa mane olmuşam!

Atos dedi:

Yaxşı da, dördcə düşmənin var, bu nədir ki! Biz də gördük. Adama birı düşür. Bir ora baxın! Qrimo işarə ilə deyir ki, aşağıdan çoxlu adam gəlir. Qrimo, nə olub ki? Vəziyyətin ciddiliyini nəzərə alaraq mən sizə, dostum, danışmağa icazə verirəm, ancaq xahiş edirəm, qısa danışın. Siz nə görürsünüz?

Bir dəstə adam.

Neçə nəfər olar?

İyirmı nəfər.

Kimdır onlar?

On altısı şəhər əhalisindəndir, dörd də əsgər.

Buradan ora neçə addım olar?

- Əlli.

Yaxşı, bizim hələ bu qızarmış əti yeməyə, d'Artanyanın da sağlığına bir stəkan şərab içməyə vaxtımız var.

Portos və Aramıs stəkanları qaldırdılar:

- D'Artanyan, ıçırik sənin sağlığına!

– Yaxşı, mənim sağlığıma olsun. Ancaq bundan mənə nə xeyir?

Məhəmməd dininə mənsub olanlar deyır ki, Allah qadir Allahdır və hər şey onun öz əlindədir.

Atos stəkanını ıçıb qurtardı, tənbəl-tənbəl qalxıb əlinə keçən tüfəngi götürdü, mazğala yanaşdı.

Portos, Aramıs və d'Artanyan da onun kimi elədilər, Qrimoya da əmr etdilər ki, arxada durub lazım olanda tüfəngləri doldursun. Gələn dəstə bir dəqiqə sonra göründü. Dəstə səngərə oxşayan dar bir keçidlə gəlirdi; şəhərdə istehkama, istehkamdan şəhərə bu yolla gedirdilər.

Atos dedi:



Bunlardan ötrü heç narahat olmağına dəyməzdi: iyirmi nəfər şəhər əhalisidir, əllərində də bel, külüng, kərki. Qrimo özü onlara bir ışarə eləsəydi, onlar rədd olub gedərdilər, bizı də narahat etməzdilər.

D'Artanyan:

İnanmıram, dedı. Onlar çox qətiyyətlə ırəlıləyirlər. İçlərində muşketli dörd əsgər, bir də briqadir var.

– Onlar bizi görmürlər, yoxsa qayıdıb gedərlər.

Aramis:

Düzü, mənım bu şəhər camaatına güllə atmağa yazığım gəlir, - dedi.

Dınsızə yazığı gələn keşış pis keşişdir.

Atos:

– Doğrudan da dedi. – Aramıs haqlıdır, mən onlara xəbərdarlıq edəcəyəm.

D'Artanyan çığıraraq:

Sız nə edirsiniz? dedi. Əzizim, sizı güllə ılə vurarlar.

Lakin Atos onun sözünə əhəmiyyət vermədı. Bir əlində tüfəng, o birı əlində də qılınc istehkam dıvarı üstünə çıxdı, istehkamdan əllı addıma qədər uzaqda duran əsgərlərə və şəhər əhalisinə nəzakətlə baş əyib dedi:

– Cənablar, mən və bir neçə də mənim dostum gəlmişik ki, istehkamda yemək yeyək; özünüz başa düşürsünüz ki, yemək vaxtı adamı narahat eləmək heç yaxşı deyıl Buna görə də sızdən xahiş edirık ki, əgər siz mütləq bızim yanımıza qalxmaq istəyirsinizsə, bir az dayanın, biz yeməyımızi yeyib qurtaraq, ya da ki, bir az sonra gəlın. Lap yaxşısı bu olar kı, ağlınızı başınıza yığıb qiyamçıları tərk edəsınız, bizim yanımıza buyurub Fransız kralı sağlığına şərab içəsiniz.

D'Artanyan bərkdən səsləndı:

– Atos özünüzü gözləyin! Onlar sizı nişan alırlar.

– Görürəm! Bu meşşanlar çox pis tüfəng atırlar, məni vura bilməzlər.

Doğrudan da, elə o saat tüfəng atıldı, dörd güllə Atosun yanından vıyıltı ılə ötüb keçdi, biri də ona dəymədi.

Buna cavab olaraq o dəqiqə yuxarıdan da dörd tüfəng atıldı, lakin bunlar aşağıdakılardan daha sərrast atılmışdı: üç əsgər elə yerındəcə qaldı, şəhərlilərdən də bırı yaralandı.

Atos divarın üstündən düşmədən əmr etdı:

Qrimo, o biri muşketi ver!

Qrimo dərhal əmrı yerinə yetirdı.

O biri üç muşketyor da tüfəngləri doldururdu. Yenə də dörd güllə atıldı: briqadir, iki də şəhərli öldürüldü, qalanları qaçmağa üz qoydular.

Atos:

Cənablar, dedi, – qaladan bayıra çıxın!

Dörd dost o saat istehkamdan bayıra yüyürdü, vurulan adamların yanına gəldi, dörd muşket, bir də briqadirin nizəsini götürdülər. Qaçanların ancaq şəhərə çatandan sonra dayanacaqlarını yəqin bildiklərindən, yenə istehkama qayıtdılar.

Qrimo, yenə də tüfəngləri doldurun. Biz də, cənablar, gedib yeməyimizi yeyək, söhbətimizi davam etdirək. Sözümüz harada qaldı?

D'Artanyan dedi:

Orada qaldı ki, sən deyırdin miledi kardinaldan mənim başımı istədi, kardinal da ona söz Verdi, sonra miledi Fransa sahillərini tərk etdi. Yaxşı, o, hara getdi axı? – Miledinin hara getməsi məsələsi onu çox narahat etdi.

Atos:

*İngıltərəyə getdi*, – dedi.

Nə üçün?

Bekinhem hersoqunu öldürmək üçün.

D'Artanyan bərkdən dedi:

– Belə də alçaqlıq olar?!

Atos:

Sizi inandırıram ki, bu, məni qətiyyən narahat etmir, dedi, Qrımo, tüfəngləri ki doldurub qurtardınız indi, briqadirin nizəsini götürün, dəsmalı ucuna bağlayın, sonra da onu bizim istehkamın qülləsinə sancın; qoy qiyamçı laroşellilər görsünlər və bilsinlər ki, burdakılar kralın igid və nəcib əsgərləridir.

Qrimo sözsüz-sorğusuz onun buyruğunu yerinə yetirdi; bir dəqiqədən sonra bizim dostların başı üstündə ağ bayraq dalğalanmağa başladı. Aşağıdan gurultu ilə əl çalaraq bayrağı təbrik etdilər; düşərgənin yarısı istehkam xəttindən qırağa çıxmışdı.

D'Artanyan dedi:

Necə? Onun gedib Bekinhem hersoqunu öldürməsi, ya adam göndərib öldürtməsi səni heç narahat etmir? Hersoq axı bizim dostumuzdur!



– Hersoq ingilisdir, hersoq bizimlə vuruşur. Qoy miledı onunla nə eləyir eləsin. Mənim üçün onun heç bir boş şüşə qədər də qiyməti yoxdur.

Atos bunu deyib əlindəki şüşəni özündən on beş addım uzağa atdı, – içindəki şərabı son damlasına kimi öz stəkanına boşaltmışdı.

D'Artanyan:

– Mən heç vaxt hersoqu bu vəziyyətdə qoya bilmərəm, dedi. O, bizə yaxşı atlar bağışlamışdır.

Portos:

Xüsusilə yaxşı yəhərlər bağışlamışdır, dedi.

Onun plaşının dövrəsi yəhər baftasından tikilmişdi

Aramis də əlavə etdi:

Bir də ki, günah işləmiş adamın öldürülməsi deyil, tövbə eləməsi Allaha xoş gələr.

Atos:

– Amin, deyərək hersoq haqqında gedən bu söhbəti qurtarmaq istədi. – Əgər lazım görsəniz bu məsələ barədə sonra danışarıq. Ancaq o vaxt məni ən çox başqa bir şey maraqlandırırdı, d'Artanyan, əminəm ki, sən məni başa düşürsən: mən mütləq o qadından kardinalın verdiyi əmri almalı idim. Kardinal bu əmrlə miledinin edəcəyi hər şeyi qabaqcadan bəyənirdi; miledi bu əmrlə, heç bir şeydən ehtiyat etmədən səni, bəlkə də bizim hamımızı tələf eləyə bilərdi.

Portos quş ətini kəsən Aramisə öz boşqabını uzadıb dedi:

– Bu ki, lap iblismiş!

D'Artanyan soruşdu:

Əmr onda qaldımı?

– Yox, əmri ondan aldım; ancaq asanlıqla almadım, – yalan nə deyim.

D'Artanyan həyəcanla:

Əzizim Atos, gör neçənci dəfədir ki, siz məni ölümdən qurtarırsınız, dedi, – mən artıq bunun hesabını itirmişəm.

Aramis soruşdu:

– Sən bizi mehmanxanada ona görə qoyub getdin ki, təzədən miledinin yanına qayıdasan?

Bəs nə!

D'Artanyan soruşdu:

– Kardinalın kağızı indı səndədirmi?

Budur, - deyib qiymətli kağızı cibindən çıxarıb d'Artanyana verdi.

D'Artanyan əli əsə-əsə kağızı açdı; o hətta öz həyəcanını gizlətmək də istəmirdi; kağızda bu sözlər yazılmışdı;

*"Bu kağızı verən adam nə etmişdisə, mənim əmrimlə və dövlətin xeyri üçün etmişdir.*

*5 avqust 1628-ci il.*
*Rişelye".*

Aramis dedi:

- Bu ki, qayda -qanunla günah bağışlamaqdır.

D'Artanyan elə bil öz ölüm hökmünü oxumuşdu·

– Bu kağızı cırmaq lazımdır.

Atos onunla razılaşmadı:

Əksinə, bunu ən qiymətli bir şey kimi saxlamaq lazımdır. Bu kağızı mən heç bir dəfinə ilə də dəyişmərəm.

D'Artanyan soruşdu:

- Miledi indi buna qarşı nə kimi tədbir görəcək?

Atos etinasızca dedi:

Yəqin o, kardinala yazacaq ki, Atos adlı bir məlun muşketyor sənin verdiyin kağızı mənim əlimdən aldı. Məktubunda o, yəqin, kardinala bunu da məsləhət görəcək ki, həm bu adamı, həm də onun yoldaşları olan Portosla Aramisi tələf eləmək lazımdır. Kardinalın da yadına düşəcək ki, həmin bu adamlar həmişə yol üstündə ona rast gəlirlər. Günlərin birində də d'Artanyanı tutmaq əmrini verəcək; Bastiliyada darıxmasın deyə bizi də onun yanına göndərəcək

Portos:

Bilirsənmi, əzizim, – sənin bu zarafatın çox da elə ürəkaçan zarafat deyil

Atos:

Mən heç də zarafat eləmirəm, – dedi.

Portos:

– Bilirsənmi, bu yazıq quqenotları qırmaqdansa, bu məlun miledini öldürmək daha yaxşı olardı; o yazıqların axı nə günahı var? Günahları budur ki, bizim latınca oxuduğumuz duaları onlar fransızca oxuyurlar.

Atos sakitcə soruşdu:

– Bu barədə bizim keşişin fikri nədir?

Aramis:



– Mən Portosun fikrilə şərikəm, dedi.

D'Artanyan da onlarla razılaşdı:

Mən də.

Portos:

Xoşbəxtlikdən, indi miledi buradan uzaqdadır, – dedi, – yoxsa, düzü, o, məni çox narahat edərdi.

Atos:

O, İngiltərədə olsa da, yenə məni narahat edir, – dedi.

D'Artanyan:

– Harada olur olsun, o, məni qol-qanad açmağa qoymur, dedi.

Portos dedi:

Yaxşı, o ki sənin əlinə düşmüşdü, niyə onu boğmadın, asmadın, öldürmədin, hə? Ancaq ölülər bir daha ayağa qalxmaz, – bunu bilirsənmi?

Atos mənalı-mənalı gülümsəyərək dedi:

– Portos, demək siz belə düşünürsünüz, eləmi? – Onun təbəssümündəki mənanı ancaq d'Artanyan başa düşürdü.

D'Artanyan:

– Mənim başqa bir fikrim var! – dedi.

Muşketyorlar:

Söyləyin, dedilər.

Qrimo qışqırdı:

– Silah başına!

Cavanlar dərhal sıçrayıb silahlarını qapdılar. Bu dəfə istehkama iyirmi beş adamdan ibarət bir dəstə yaxınlaşırdı; ancaq bunlar şəhər əhli deyil, qarnizon əsgərləri idi.

Portos yoldaşlarından soruşdu:

– Düşərgəyə qayıtmayaqmı? Mənə elə gəlir ki, onlarla bizim gücümüz bir bərabərdə deyil.

Atos.

Biz düşərgəyə bu saat qayıda bilmərik, – dedi. – Çünki, əvvələn, biz hələ yeməyimizi qurtarmamışıq, ikincisi, biz hələ çox mühüm məsələlər barəsində danışmalıyıq, üçüncüsü də ki, bir saat tamam olmağa hələ on dəqiqə qalmışdır.

Aramis:

Bu gələn dəstə ilə vuruşmaq üçün bir plan düzəltmək lazımdır, – dedi.

Atos:

Bunun planı çox sadədır, dedi. Düşmən güllə tutan məsafəyə gəlib çatanda biz atəş açırıq. Gülləmiz qurtarana kimi onlarla atışırıq. Əgər onlar hücuma keçib qalaya soxulmaq ıstəsələr, biz onlara, xəndəyə enənə qədər istehkama yaxınlaşmağa ımkan veririk, sonra da dıvarın bir hıssəsini onların başına uçururuq, özünüz görürsünüz ki, divarın bu hissəsi bır təkana bənddir, o saat uçub töküləcək.

Portos qışqıraraq dedi·

– Sağ ol, Atos! Sən elə anadan sərkərdə doğulmusan! Özünü hərbi dahi hesab edən kardinal sənin yanında bir heçdır!

Atos:

· Cənablar, xahiş edirəm artıq söhbətləri kəsin, dedi. Yaxşı nişan alın.

D'Artanyan hazır olduğunu bildirdi.

– Mən nişan almışam.

Portos dedi:

Mən də.

Aramis:

Mən də hazıram, – dedi.

Atos komanda verdi:

– Elə isə atəş!

Dörd tüfəng bırdən atıldı, düşmən sırasında da dörd adam yerə yıxıldı.

O saat laroşellilər təbil döydü və bütün dəstə hücuma keçdi.

Güllələr bir-birinin ardınca atılırdı. Lakin laroşellilər sanki bizim dostların sayca azlığını və onların zəifliyinin də bundan ibarət olduğunu bilir, buna görə də dayanmadan yüyürə-yüyürə irəliləyirdilər.

Atılan uç gülləndən iki laroşelli də yıxıldı, qalanları durmadan yüyürdülər. Düşmən dəstəsində on beşə qədər əsgər qalmışdı. Onları son yaylımla qarşıladılar, lakin bu da onları dayandıra bilmədı. Nəhayət, gəlib xəndəyə çatdılar və divarın uçuq yerindən yuxarı qalxmaq istədilər.

Atos:

– Dostlar, dedi, bir zərbə ilə onların işini bitirək! Divara güc verin! Divara güc verin!

Bizim dostlarımız, Qrimo ilə bərabər tüfəngin lüləsi ilə daş divarın böyük bir hissəsini itələməyə başladılar; divar küləkdən əsirmiş kimi



titrədi, əyildi, bünövrədən ayrılaraq dəhşətli bir gurultu ilə xəndəyə uçdu. Çığırtı qopdu. Toz dumanı havaya qalxdı. Düşmənin işi bitmişdi.

Atos soruşdu:

– Görəsən onların hamısı məhv oldumu?

D'Artanyan:

Deyəsən, – hamısı tələf olub, dedi

Portos sözə qarışdı:

Yox, bir baxın, ıkısi-üçü axsaya axsaya qaçır.

Doğrudan da, toza-torpağa və qana bulaşmış bir neçə əsgər yolla şəhərə sarı qaçırdı· dəstədən sağ qalan da bunlar idi.

Atos saata baxdı:

Cənablar, bır saatdır ki, biz buradayıq. Mərcı udduq... Ancaq işimizi hələ qurtarmamışıq. Bir də ki, d'Artanyan hələ öz fikrini bizə söyləməmişdir.

Muşketyorlar, yenə də, onlara xas olan bir soyuqqanlıqla yeməyə oturdular.

D'Artanyan ona sarı döndü:

Mənimi deyirsiniz?

Bəli. Siz bayaq dediniz ki, mənim ağlıma bir şey gəlib.

Hə, yadıma düşdü: mən yenə də İngiltərəyə, Bekinhem hersoqunun yanına gedəcəyəm.

Atos soyuq bir tərzdə:

Yox, siz getməyəcəksiniz, – dedi.

Necə? Mən ki bir dəfə ora getmişdim.

O vaxt hələ biz İngiltərə ilə müharibə eləmirdik, hersoq da bizim düşmənimiz deyil, müttəfiqimiz idi. Sizin indi etmək istədiyiniz xəyanətə oxşayır.

D'Artanyan deyiləni başa düşüb susdu.

Portos:

Mənim də ağlıma bir yaxşı şey gəlib, - dedi.

Atos yoldaşlarına döndü:

– Qulaq asaq, görək Portos bizə nə söyləyəcək.

Mən cənab de Trevildən bir bəhanə ilə məzunıyyət alaram; ancaq bu bəhanəni siz özünüz uydurun, mən belə şeyləri bacarmıram. Miledi məni tanımır; buna görə də mən onun yanına gedə bilərəm, o da məndən qorxub eləməz. Elə ki, onu tapdım, tutub boğaram.

Atos bu fikri bəyəndi:

Mən Portosun fikrinə şərikəm.
Aramis:
– Eh, – dedi, – arvad nədi ki, gedib onu öldürəsən! Mənim ağlıma çox gözəl bir fikir gəlib.
Atos bu cavan muşketyora böyük bir hörmət bəsləyirdi:
Söyləyin görüm, Aramıs!
- Kraliçaya xəbər verınək lazımdır.
Portos və d'Artanyan bir ağızdan dedilər:
– Hə! Doğrudan da siz, deyəsən, məsələnin həlli üçün əsil yolu tapmısınız.
Atos dedi:
– Kraliçaya xəbər vermək? Bunu necə eləmək olar? Sarayda sizin tanışınız varmı? Biz Parisə adam göndərsək, bunu dərhal bütün düşərgədə bılməzlərmi? Buradan Parisə yüz qırx lyedir, məktubumuz Anjerə çatana kimi bizim hamımızı burada tutub dama basarlar.
Mən bu ışı boynuma götürürəm: elə elərəm ki, məktub düz kraliçanın özünə çatar. Turda mənim tanıdığım çox bacarıqlı bir qadın var...
Aramis bunu deyib qızardı. Atosun gülümsədiyini görüb susdu.
D'Artanyan:
Lap yaxşı dedı, Atos, Aramisin planı sizin xoşunuza gəlirmi?
Atos:
Mən onun planı əleyhinə deyiləm, dedi ancaq mən Aramisin nəzərinə çatdırmaq istərdim ki, o, düşərgəni qoyub gedə bilməz, bu işi də ayrı heç kəsə tapşırmaq olmaz; o adam yola düşəndən ikicə saat sonra bütün monaxlar, alqvazıllər, kardınalın qara əba geymiş bütün adamları sizin məktubunuzda yazılan sözləri əzbər biləcəklər, onda sizi də, sızın o bacarıqlı adamınızı da tutarlar.
Portos sözə qarışdı:
Bir də ki, kralıça hersoqu xılas edər, bizi yox.
D'Artanyan dedi
Cənablar, Portosun dediyi çox ağlasığan şeydir.
Atos dedi:
Hə, şəhərdə nəsə bir şey olub: həyəcan olduğu bıldirilir.
Onlar susub qulaq asdılar, təbil səsı eşidildi.
Atos:
İndi görərsiniz, dedi, onlar bizim üstümüzə düz bir alay göndərəcəklər.



Portos ondan soruşdu:
Yoxsa bır alay əsgərlə də vuruşmaq fikrindəsiniz?
– Niyə də vuruşmayaq? Mən özümü vuruşmada hiss edirəm: lap bütün bir orduya qarşı durmağa hazıram, ancaq bunu əvvəldən bilib, özümüzlə on ikicə şüşə də artıq şərab götürsəydik pis olmazdı.
D'Artanyan:
Təbil səsi get-gedə yaxınlaşır, dedi.
Atos:
– Qoy yaxınlaşsın, dedi. – Buradan şəhərə on beş dəqiqəlik yoldur, demək şəhərdən də buraya ancaq on beş dəqiqəyə gəlmək olar. Müəyyən bir qərar qəbul etmək üçün bu qədər vaxt kifayətdir. Biz indi buradan getsək, bir daha belə arxayınca yer tapa bilməyəcəyık. Mənim özümün də, cənablar, başıma bir yaxşı fikir gəlib.
Di söyləyin!
– Icazə verin Qrimoya lazımi əmrlər verim, sonra.
Atos işarə ilə öz xidmətçisini çağırdı və meyitləri göstərərək dedi:
– Qrimo, bu cənabları götürün, divara söykəyin, başlarına şlyapa qoyun, əllərinə də tüfəng verin.
D'Artanyan bərkdən:
- Vallah, sən böyük adamsan! dedi. – Sənin nə eləmək istədiyini mən başa düşürəm!
Atos:
– Daha bundan ayrı şey lazım deyil, dedı. İndi mən sizə başıma gələn fikri söyləyım.
Portos:
– Mən sənin bu əmrinin mənasını anlamıram, dedi. Bu, axı nəyə lazımdır?
Atos ona əhəmiyyət verməyib sözünə davam etdi:
– O qadının, o ıblısin bir qaynı var. D'Artanyan, siz, deyəsən, mənə belə demişdiniz.
Bəli. Mən onu yaxşı tanıyıram. Məncə onun öz qardaşı arvadından zəhləsi gedir.
Atos:
– Bu heç də pıs deyil, – lakin bu adam bu qadına nifrət etsəydi, daha yaxşı olardı.
– Hər halda onun bizə köməyi dəyər.
Portos:

– Bircə mən bılmək istəyirəm ki, bu Qrimo nə eləyir, dedi.
Aramıs onun sözünü kəsdi.
Portos, kirıyin!
– O qadının qayınının adı nədir?
Lord Vinter.
O, indi haradadır?
– Müharibə haqqında söz çıxan kımi, o, İngiltərəyə qayıtdı.
– Bızə də elə bir adam lazımdır. Atos dedi. – Onu xəbərdar etməliyik. Ona çatdırmalıyıq ki, sizin qardaşınız arvadı kimi isə öldürmək fikrindədır. Xahış edirik onu gözdən qoymayın. Yəqin ki, Londonda Müqəddəs Maqdalina və ya Tövbə eləyənlər evi kimi adam yumşaldan evlər var. O, öz qardaşı arvadını ora saldırar, biz də rahat olarıq.
D'Artanyan:
Bəlı, dedi, – oradan qaçana kimi rahat olarıq.
Atos:
– D'Artanyan, dedi, vallah, sizin tələbiniz çox böyükdür. Ancaq mən bundan artıq bır şey təsovvür edə bılmirəm.
Aramis sözə qarışdı:
– Bu barədə mən belə düşünürəm: kraliçanı və lord Vinteri xəbərdar etmək daha yaxşı olardı.
Yaxşı, bəs Tura və Londona məktubu kimlə göndəririk?
Aramis:
Bu işi mən Bazenə arxayın ola bilərəm, – dedi.
D'Artanyan:
– Mən də Planşeyə, dedi.
Portos sözə qarışdı:
Doğrudan da, biz düşərgəni buraxıb gedə bilmərik, amma xidmətçilərimizin getməsinə heç kəs mane ola bilməz.
Aramis dedı:
Şübhəsiz Elə bu gün də məktub yazarıq, xidmətçilərimizə pul verib yola salarıq
Atos soruşdu:
Pul verərik? Bizim heç pulumuz varmı?
Dörd dost bir-birinə baxdı: onların gülər üzü yenə də tutuldu.
D'Artanyan birdən:



- Ora baxın! – dedi. – Uzaqda adamlar qara və qırmızı nöqtələr kimi qayır-qayır qaynaşır. Atos, siz deyirsiniz ki, üstümüzə bir alay gəlir. Bu ki, düz bir ordu imiş!
Atos:
Vallah, siz haqlısınız, dedi. – Bir onların bicliyinə baxın, sakitcə gəlirlər: nə təbil vururlar, nə də şeypur çalırlar. Qrimo, qurtardınmı?
Qrimo başı ilə qurtardığını bildirdi və çox qəşəng bir şəkildə düzdüyü on iki meyiti əlı ilə göstərdi; onlardan bəzisi əlində tüfəng tutmuşdu, bəzısı nışan almışdı, bəzısı də qılıncını siyirib durmuşdu.
Atos onun gördüyü işi bəyəndı:
Sağ ol Qrimo! Bu göstərır ki, sən məsələnı başa düşən adamsan.
Portos.
– Mən yenə də bunun mənasını anlaya bilmirəm, dedı.
D'Artanyan:
Hər şeydən əvvəl buradan çəkilib getməliyik, dedi, sonra özün başa düşərsən.
– Cənablar, bircə dəqiqə toxdayın, bircə dəqiqə! Qoyun Qrimo süfrəni yığışdırsın.
Paho! – Aramis bərkdən dedi, qara və qırmızı nöqtələr getdikcə böyüyür. D'Artanyan doğru deyirmiş. Məncə, daha vaxt itirməyin heç mənası yoxdur. Tez getməliyik.
Atos:
Daha mən geri çəkilməyə qətiyyən etiraz eləmirəm, dedi. - Biz mərc çəkmişdik ki, burada bir saat qalaq. Amma indi saat yarım olub. Danışılası da bir məsələ qalmayıb, hamısı qurtarıb. Gedək, cənablar, gedək!
Qrimo əlində zənbil qabağa düşdü: yeməli şeylərin artığı zənbildə idi. Dörd dost da onun ardınca gedirdi ki, Atos birdən dayandı:
Cənablar, bir görün biz nə eləyirik!
Aramıs dedi:
– Yoxsa, yaddan bir şey çıxıb?
Heç vaxt bayrağı düşmənə tərk etmək olmaz, – bu bayraq lap bir parça dəsmaldan da ibarət olsa belə.
Atos tez ıstehkama qayıtdı, yüyürə-yüyürə yuxarı qalxdı, bayrağı sancıldığı yerındən çıxartdı. Laroşellılər artıq ona güllə məsafəsinə qədər yaxınlaşmışdılar; tüfənglərdən şiddətli atəş açmağa başladılar. Atos bundan ləzzət alırmış kimi özünü güllə qabağına verirdi. O, elə

bir sehrlənmişdi; güllələr vıyıltı ilə onun yan yörəsindən keçib gedir, biri də ona dəymirdi.

Atos arxasını düşmənə çevirdi, əlindəki bayrağı havada yelləyərək düşərgə qabağına yığışmış əsgərlərə baş əydi. Hər iki tərəfdən bağırtı səsləri ucaldı; bu, – arxadan yüksələn hiddət və qəzəb, öndən yük sələn heyrət və alqış səsləri idi.

Düşmən tərəfindən ikinci yaylım atəşi açıldı; üç güllə dəsmala dəyərək onu bir döyüş bayrağı kimi dəlik-dəlik elədi. Bütün düşərgə bir ağızdan deyirdi: "Özünü xilas elə!"

Nəhayət Atos istehkamdan aşağı endi. Yoldaşları aşağıda onu səbirsizliklə gözləyirdilər. Atosu böyük sevinclə qarşıladılar.

D'Artanyan onu tələsdirərək:

– Gedək, Atos gedək - dedi, tələsmək lazımdır. İndi kı, bizim bir puldan başqa hər işimiz düzəlib, həyatımızı təhlükəyə verməyin mənası yoxdur.

Yoldaşları tələsdirsə də, Atos vüqarını pozmadan təntənəli addımla irəliləyirdi. Qrimo bir az onlardan qabaqda getdiyindən artıq qorxu altından çıxmışdı

Az sonra tüfəng səsi eşidildi.

Portos təəccüblə soruşdu:

– Bu nədir? Onlar kimə güllə atırlar? Onların gülləsinə heç cavab verən də yoxdur, heç adam da görmürəm.

Atos dedi:

Onlar bızim meyitlərə güllə atırlar.

– Meyıtlər ki onlarla atışmayacaq!

Əlbət ki, atışmayacaq. Onda laroşellilər elə biləcək ki, burada bır kələk var; müşavirə edəcəklər, danışıq aparmaq üçün istehkama nümayəndə göndərəcəklər; məsələnin nə yerdə olduğunu bilənə kimı biz də artıq buradan uzaqda olacağıq.

Portos:

– Hə, indi mən də başa düşdüm! dedi.

Atos çiyinlərini sıxaraq ona baxdı:

Bunu çoxdan başa düşmək lazımdı.

Fransızlar bu dörd ıgidin yaxınlaşdığını görüb onları alqış səsləri ilə qarşıladılar. Yenə də tüfəng səsi eşıdıldi. Güllələr vıyıltı ilə bizim dostların yanından ötüb keçdi; laroşellilər, nəhayət, istehkamı tuta bilmişdilər.



Atos dedi:

Yaxşı atıcı deyillər. Biz neçə adam vurduq? On ikisinimi?

– Yox, on beşini.

– Neçəsi torpaqda qaldı?

– Səkkizi ya onu.

Bunun müqabilində bizim heç bir yerimiz də cızılmayıb! d'Artanyan, o əlinizə nə olub? Deyəsən qanayıb!

– Elə şey deyil.

Yoxsa ovulmuş güllə dəyib?

Yox.

– Bəs onda nə olub?

Atos d'Artanyanı öz oğlu kimi sevirdi, həmişə də onun qayğısına qalırdı.

D'Artanyan izah etdi:

Bir balaca cızılıb. Divarı uçuranda barmağım daş arasında qaldı, üzük dərini sıyırdı.

Atos nifrətlə dedi:

– Möhtərəm cənab, brilyant üzük taxanda, bax, belə olar!

Portos bərkdən soruşdu:

– Doğrudanmı onun brilyant üzüyü var? Yaxşı, bizim ki belə bir qiymətli şeyimiz var, bəs onda niyə pulsuzluqdan şikayət edirik?

Aramis onun sözünə qüvvət verdi:

- Doğrudur, doğrudur.

Lap yerində dediniz, Portos! Bu dəfə siz çox ağıllı söz söylədiniz.

Atosun sözü Portosun xoşuna gəldiyindən qürurla dedi:

– Madam ki, brilyant var, biz onu sata bilərik.

D'Artanyana bu fikir əvvəl birtəhər göründü:

Axı bunu kraliça bağışlamışdır...

Atos:

– Daha yaxşı, – dedi. Kraliça öz sevgilisi hersoqu ölümdən xilas etməklə çox ədalətli bir iş görmüş olar, lakin hersoqun dostları olan bizi xilas etməklə çox əxlaqi bir hərəkət etmiş olar. Brilyant üzüyü satmaq lazımdır. Cənab keşiş bu barədə nə düşünür? Mən Portosun rəyini soruşuram, çünki onun rəyi bizə artıq məlumdur.

Aramis qızararaq öz fikrini söylədi:

– Məncə, bu üzüyü satmaq olar, çünki bunu d'Artanyana bir sevgi əlaməti olaraq bağışlamamışlar.

Əziz dostum Aramis, siz bir ilahiyyət alimi kimi mühakimə yürüdürsünüz. Demək, sizin fikrinizcə...

Aramis onun sözünü tamamladı:

Bu brilyant üzüyü satmaq lazımdır.

D'Artanyan onunla razılaşdı:

Çox gözəl! Üzüyü satırıq, daha bu barədə danışmaq lazım deyil.

Yenə də tüfəng atılırdı; lakin muşketyorlar artıq təhlükədən qurtarmışdılar. Laroşellilər isə ancaq vicdanlarını sakitləşdirmək üçün güllə atırdılar.

Doğrudan da, üzüyü satmaq məsələsi lap vaxtında Portosun ağlına gəldı. Bu da düşərgə; gəlib çatdıq. Bizi müşahidə edirlər, bizi qarşılamağa gəlirlər, bizə təntənəli bir görüş düzəldəcəklər.

Doğrudan da, bütün düşərgə hərəkətə gəlmişdi, iki mindən artıq adam bu dörd dostun tamaşasına durmuşdu. Lakin heç kəs onların bu qəribə mərcinin əsl səbəbini bilmirdi. Hər tərəfdən bağıraraq deyirdilər:

Yaşasın qvardiyaçılar! Yaşasın muşketyorlar!

Cənab de Büzinyi hamıdan əvvəl Atosun əlini sıxdı və mərci uduzduğunu etiraf etdi. Draqunla isveçrəli də onun kimi etdi; sonra da bütün yoldaşları təbrik etdilər: bir-bir əllərini sıxır, onları qucaqlayır, laroşellilərі də bərk ələ salırdılar. Elə bir səs-küy qalxdı ki, kardinal düşərgədə həyəcan olduğunu zənn edərək öz qvardiyasının kapitanı La Udinyeri ora göndərdi. Kapitana olan hadisəni nağıl etdilər.

La Udinyer geri qayıtdıqdan sonra kardınal ondan soruşdu:

Nə olub orada?

Monsinyor, üç muşketyor və bır qvardiyaçı de Büzinyı ilə mərc çəkişirlər ki, gedib Sen-Jerve istehkamında yemək yesinlər, bu müddət ərzındə onlar iki saat istehkamı düşməndən qorumuşlar, çoxlu da laroşellı öldürmüşlər.

O muşketyorların adını bildınizmi?

Bəli, monsinyor, bildim.

Onların adını mənə deyin.

Cənab Atos, Portos və Aramis.

Yenə də həmin o üç nəfər! Bəs qvardiyaçı?

Qvardıyaçının da adı cənab d'Artanyandır.

– Yenə də həmin dəlisov cavan oğlan! Mütləq bu dörd dost mənim yanımda qulluğa girməlidir.



Həmin gecə kardinal muşketyorların igidliyi haqqında cənab de Treville söhbət elədi. Muşketyorlar özləri barədə cənab de Trevilə ətraflı məlumat verdiyindən, de Trevil də bütün eşitdiklərini kardinala söylədi, hətta dəsmaldan bayraq düzəltdiklərini də unutmadı.

Kardinal:

Cənab de Trevil, xahiş edirəm o dəsmalı mənə göndərin, – dedi. - Mən onun üstünə üç zanbaq çiçəyi şəklini zərli sapla işlədib bir bayraq kimi sizin bölüyə bağışlayacam.

Cənab de Trevil:

Monsinyor, - dedi, – bu, qvardiyaçılara qarşı bir haqsızlıq olardı: çünki d'Artanyan mənim bölüyümdə deyil, cənab Dezessarın bölüyündə qulluq edir.

– Onu da öz yanınıza götürün: madam ki, bu dörd dost bir-birini bu qədər sevir, onda gərək onlar bir bölükdə də qulluq etsinlər.

Elə o axşam cənab de Trevil bu yeni xəbəri həm muşketyorlara, həm də d'Artanyana söylədi və dördünü də səhər yeməyinə çağırdı.

Bu məsələ d'Artanyanı son dərəcə sevindirdi: onun elə həyatda arzu etdiyi də muşketyor olmaq idi. Yoldaşları da buna çox sevindilər.

D'Artanyan Atosa dedi:

Doğrudan da, sənin fikrin dahiyanə bir fikırmiş: sənin sayəndə bir çox mühüm məsələdən bəhs edə bildik, hətta şöhrət də qazandıq.

– Bu məsələ barəsində biz indi də, heç kəsdə şübhə doğurmadan, danışa bilərik. Bundan sonra da, Allahın köməyilə, kardinalçı hesab ediləcəyik.

Elə o axşam, d'Artanyan muşketyorlar bölüyünə keçdiyini xəbər vermək və vidalaşmaq üçün Dezessarın yanına getdi.

Dezessar d'Artanyanın xatirini çox istəyirdi: bu məsələ ilə əla qədar olaraq ona kömək etmək istədi, çünki alayı dəyişirkən yeni yaraq – yasaq üçün böyük xərc çəkmək lazım gəlirdi.

D'Artanyan onun təklif etdiyi yardımı qəbul etmədi, ancaq fürsətdən istifadə edərək Dezessardan xahiş elədi ki, onun brilyant üzüyünə qiymət qoysun və satmağa kömək etsin.

Ertəsi gün səhər saat səkkizdə Dezessarın xidmətçisi d'Artanyana bir kisədə yeddi min livr qızıl gətirdi: bu, kraliçanın d'Artanyana bağışladığı üzüyün qiymətı idi.

## XVIII

## AİLƏ MƏSƏLƏSİ

Atos dostların düşündüyü işə ad tapdı: "Ailə məsələsi". Ailə məsələsi kardinalın ixtiyarında deyildi; ailə məsələsinin heç kəsə dəxli yoxdu; ailə məsələsi haqqında hamının yanında danışmaq olardı.

Bəli, Atos belə bir ad tapdı: "Ailə məsələsi".

Aramis xidmətçiləri göndərmək fikrini meydana atdı.

Portos brilyantı satmağı təklif etməklə pul məsələsini həll etdi. Lakin onların hamısından zirək olan d'Artanyan bu dəfə heç bir şey düşünüb tapa bilmədi; çünki miledi adı gələndə onun bütün fikirləri alt-üst olurdu.

Yox, biz səhv etdik; o da brilyant üzüyə müştəri tapdı.

Cənab de Trevilin səhər qonaqlığı çox canlı və xoş keçdi. D'Artanyan təzə paltarda gəlmişdi. O, təxminən, Aramislə bir boyda idi. Aramisin öz poemasına kitab satandan çoxlu pul aldığı oxucuların yadındadır. O, özünə iki dəst paltar almışdı Bunun birini məmnuniyyətlə d'Artanyana verdi.

Dostlar səhər yeməyindən sonra bu qərara gəldilər ki, axşam Atosun mənzilinə yığışsınlar və məsələni həll edib qurtarsınlar.

D'Artanyan bütün günü düşərgənin küçələrində, təzə muşketyor paltarında gəzdi.

Axşam təyin edilmiş vaxtda yığışdılar. Miledinin qaynına, Turdakı məharətli xanıma nə yazmaq, məktubları xidmətçilərdən hansı ilə göndərmək məsələlərini həll etmək lazımdı.

Hər kəs öz xidmətçisini təklif edirdi. Atos dinib danışmaz bir adam olan Qrimonun təvazökarlığını xüsusilə qeyd edirdi; Portos, pəhləvan Muşketonun gücünü və diribaşlığını tərif eləyib deyirdi ki, o təkbaşına çox asanlıqla dörd adamın öhdəsindən gələ bilər; Aramis də etibar etdiyi Bazenin qoçaqlığından dəm vururdu; Planşenin igidliyinə tamamilə arxayın olan d'Artanyan isə çətin işi ona tapşırmağı məsləhət görürdü.

Bu məsələ ətrafında gözəl nitqlər söyləndi, ancaq biz bunları yazmırıq, qorxuruq ki, bu nitqlər oxuculara çox uzun və yorucu görünsün.

Atos bərkdən deyirdi:



Bədbəxtlikdən, bu dörd xüsusiyyətin dördü də bizim göndərdiyimiz adamda olmalıdır!

Belə bir adamı haradan tapmalı?

Atos:

Mən də bilirəm ki, bunu tapmaq mümkün deyil, - dedi, – elə isə Qrimonu göndərək.

Yox, Bazen yaxşıdır.

Yox, Muşketonu!

– Məncə, Planşe. o həm diribaşdır, həm də igiddir.

Aramis:

– Cənablar, – dedi, əsil məsələ onların hansının daha təvazökar, qüvvətli, bacarıqlı və igid olmasında deyil, əsil məsələ onlardan hansının pulu daha çox sevməsindədir.

Atos onunla razılaşdı:

Aramisin söylədiyi çox ağıllı sözdür. İnsanların yaxşı cəhətlərindən daha çox pis cəhətləri nəzərə alınmalıdır. Cənab keşiş gözəl psixoloqdur.

Aramis sözünə davam etdi:

– Çünki bizə elə adam lazımdır ki, o, həm bizim tapşırığımızı yaxşı yerinə yetirsin, həm də elə eləsin ki, işin üstü açılmasın. İşin üstü açılsa, öz başı ilə cavab verən xidmətçi deyil...

Atos onun sözünü kəsdi:

– Yavaş!

Aramis yenə sözünə davam etdi:

– Sən haqlısan... Başı ilə cavab verən ağa və hətta ağalar olacaqdır. Əcəba, xidmətçilərimiz bizə o dərəcədə sədaqətlidirmi ki, bizdən ötrü öz həyatlarını təhlükəyə atsınlar? Yox!

D'Artanyan:

– Vallah, mən öz Planşemə arxayınam, dedi.

Əziz dost, əgər elə isə, siz onun sədaqətinə bir qədər də pul əlavə edin ki, qoy bu pulu o könlü istədiyi şeyə xərcləsin, onda siz ona ikiqat arxayın ola bilərsiniz.

Atos dedi:

Vallah onlar sizi aldadacaqlar. Söhbət bir şey haqqında gedəndə o, nikbin, adam haqqında gedəndə isə bədbin olardı. – Pul almaq üçün onlar çox şey vəd edəcəklər, lakin yolda qorxuya düşüb heç bir şey eləyə bilməyəcəklər. Onlar ələ keçsə, onları sıxma – boğmaya salsa-

lar, bütün sirri açıb deyəcəklər. Lənət şeytana, biz axı uşaq deyilik, belə şeylərdən az – çox başımız çıxır! İngiltərəyə getməkdən ötrü (Atos səsini alçaltdı) kardinalın casusları və nökərlərilə dolu olan bütün Fransadan keçib getmək lazımdır; gəmiyə minmək üçün icazə vərəqəsi tələb olunur; Londonda yol tapmaq üçün ingilis dilini bilmək lazımdır. Mən belə hesab edirəm ki, bu iş çox çətin işdir.

D'Artanyan bu planın yerinə yetirilməsini artıq dərəcədə istəyirdi:

– Heç də çətin deyil. Əgər biz lord Vinterə bütün dəhşətləri yazsaq, kardinalın iyrənc hərəkətləri...

Atos yenə də ona xəbərdarlıq elədi:

Yavaş danış!

D'Artanyan səsini alçaldaraq:

– ...İntriqalar və dövlət sirləri haqqında yazsaq, əlbət ki, bizi çarmıxa çəkərlər. Ancaq, Atos, Allah xatirinə, bir şeyi siz yaddan çıxarmayın: necə ki, siz özünüz dediniz, biz ona ancaq ailə məsələsi haqqında kağız yazıb bildirəcəyik ki, bizim bircə məqsədimiz var: miledi Londona gələndə elə eləyin ki, o, bizə zərər yetirə bilməsin. Təxminən, yazacağımız məktubun məzmunu belə olmalıdır...

Aramis:

– Söylə, qulaq asaq, – dedi. Yazılacaq məktuba o indidən tənqidi yanaşacağını göstərirdi.

"Möhtərəm cənab və əziz dost..."

Əcəb! İngilis əziz dost?! Yaxşı başlamısan, – söz yox! Sağ ol, d'Artanyan! Elə bircə bu sözün üstündə bizi çarmıxa çəkmək deyil, atlara bağlayıb parça parça edərlər.

Xoşunuza gəlmir yazmıram. Elə belə başlaram: "Möhtərəm cənab".

Həmişə rəsmiyyət sevən Atos:

– Siz hətta "milord" yaza bilərsiniz, dedi.

"Milord, Lüksemburqdakı keçilər üçün düzəlmiş balaca ağıl sizin yadınızdadırmı?.."

– Çox yaxşı. Lüksemburq yazsan, elə bilərlər ki, bu kralıçanın anasına bir işarədir. Ağlına əcəb şeylər gəlir!

- Yaxşı, onda belə yazırıq: "Milord, sizə həyat bəxş etdiyimiz o balaca ağıl yadınızdamı?

Bu da Atosun xoşuna gəlmədi:



– Əziz d'Artanyan, siz heç vaxt yaxşı stilist olmayacaqsınız. "Sizə həyat bəxş etdiyimiz!" Heç belə şeyi yazarlarmı? Belə xidmətləri abırlı adama xatırlatmazlar. Göstərilən xidməti adama xatırlatmaq – onu özündən incitmək deməkdir.

D'Artanyan:

– Ah əzizim, - dedi, siz qəribə adamsınız! Sizin senzorluğunuz altında yazmaq lazım gələrsə, mən onda bu işdən boyun qaçırıram.

Çox yaxşı edirsiniz ki, boyun qaçırırsınız. Əzizim, sizinki tüfəng və qılıncdır, bunları siz çox məharətlə işlətməyi bacarırsınız. Qələmi isə cənab keşişə verin. – Bu, onun işidir.

Portos:

Doğru sözə nə demək olar! Qələmi Aramisə verin, – dedi. – O hətta latınca dissertasiya yazmağı da bacarır.

D'Artanyan buna razı oldu:

– Yaxşı da. Siz deyən olsun. Aramis, məktubu siz yazın. Ancaq bu başdan sizə xəbərdarlıq edirəm: ehtiyatlı olun, yoxsa, and olsun müqəddəs ataya, sizin yazdığınızı elə tənqid edərəm ki, daha sağ yeri qalmaz.

Aramis şairlərə xas olan sadəlövh bir inamla dedi:

– Mən onda özümü xoşbəxt hesab edərəm. Ancaq deyin görüm, məsələ nə yerdədir? Eşitdiyimə görə milordun qardaşı arvadı yaramızın biridir, onun kardinalla olan söhbətinə qulaq asanda biz bunu aydınca gördük.

Atos onun sözünü yarımçıq qoydu:

– Canım, sizə nə olub, yavaş danışsanız!

Aramis sözünə davam etdi·

Ancaq mən bu məsələni ətraflı bilmirəm.

Portos:

– Mən də bilmirəm, dedi.

D'Artanyanla Atos xeyli bir-birinə baxdılar. Nəhayət, Atos qəti bir nəticəyə gələrək başı ilə razılıq işarəsi etdi; d'Artanyan bundan anladı ki, məsələni açıb söyləyə bilər:

– Bax, belə yazmaq lazımdır: "Milord, sizin qardaşınızın arvadı cinayətkar, xəbis bir qadındır: o, sizi öldürmək, sizin irsə sahib olmaq istəyirdi. Sizin qardaşınıza onun ərə getməyə ixtiyari yox idi. O Fransada ərə getmişdi və ..."

D'Artanyan söz axtarırmış kimi susub Atosa baxdı.

Atos d'Artanyanın dediyini tamamladı:
"Əri onu qovmuşdu".
D'Artanyan sözünü davam etdi:
"Çünki o damğalanmışdı".
Portos bərkdən dedi:
– Ba! Ola bilməz! O, öz qaynını öldürmək istəyirdi?
Bəlı.
Aramis soruşdu:
O, ərdə imiş?
– Bəli.
Portos da soruşdu:
- Əri də onun çiynində zanbaq çiçəyi damğasını görübmüş?
Bəli.
Bu "bəli"ləri Atos söyləmişdi, hər söyləyəndə də onun səsi daha artıq tutqun görünürdü.
Aramis soruşdu:
Bu damğanı onun çiynində kim gördü?
Atos:
D'Artanyan və mən, daha doğrusu, xronoloji qaydaya riayət edilsə; mən və d'Artanyan, – dedi.
Aramis yenə soruşdu:
– Bu dəhşətli məxluqun əri indi sağdırmı?
Sağdır.
– *Siz,* yəqin, bunu *bilirsiniz*?
– Bilirəm.
Bir anlığa ortaya ağır, sıxıcı bir sükut çökdü.
Bu sükutu hamıdan əvvəl Atos pozdu:
Bu dəfə d'Artanyan çox gözəl bir plan tökdü, məktubu da bu plan uzrə yazmaq lazımdır.
Aramis onunla razılaşdı:
– Atos, siz lap doğru deyirsiniz. Bu məktubu yazmaq çox çətin bir məsələdir. Lap kansler özü də belə bir kağızı yazıb başa çatdıra bilməz, buna baxmayaraq ki, protokolları o, çox yaxşı redaktə eləyir. Nə isə, səsinizi kəsin, yazıram
Aramis lələk qələmi götürdü, bir neçə dəqiqə düşündü, xırda xətlə səkkiz, ya da on sətirlik bir kağız yazdı. Sonra da asta səslə, hər kəlməni ölçüb biçirmiş kimi ağır-ağır oxumağa başladı:



*"Milord!*
*Bu bir neçə sətri sizə yazan adam Cəhənnəm küçəsində, hasarlanmış kiçik bir yerdə sizinlə qılınc davasına çıxmaq şərəfinə nail olmuşdu. Siz bir neçə dəfə bu adamın dostu olduğunuzu söyləmisiniz, indi bu adam da sizə qarşı olan dostluğunu isbat etmək istəyir. Öz varisiniz hesab etdiyiniz bir yaxın qohumunuz iki kərə sizi az qalıb ki, öldürsün. Bu qadın İngiltərədə ərə gedəndən əvvəl Fransada ərdə olmuşdur, lakin siz bunu bilmirsiniz. O, üçüncü dəfə sizi öldürtmək fikrinə düşsə, siz məhv ola bilərsiniz. Sizin qohumunuz bu gün İngiltərəyə getdi. Onu gözdən qoymayın. Çünki onun çox dəhşətli niyyəti var. Siz onun nəyə qabil olduğunu bilmək istəsəniz, onun sol çiyninə baxın; onun keçmişi sol çiynində yazılmışdır".*
Atos:
Çox gözəl yazılmışdır, dedi. Əzizim Aramis, siz lap bir dövlət katıbı kimi yazırsınız. Lord Vınter indi onu çox yaxşı nəzarət altına alar. Ancaq ki, məktub ona vaxtında çata. Bu məktub hətta kardinalın əlinə düşsə də, biz rüsvay olmarıq. Ancaq, bilirsinizmi, məktub aparan xıdmətçilər bizə kələk də gələ bilər; Şatelro, da qalıb deyərlər ki, Londona getmişdik. Buna görə də biz onlara pulun ancaq yarısını verməliyik kı, yarısını da cavab gətirəndə alarsınız. D'Artanyan, brilyant üzük yanınızdadırmı?
D'Artanyan:
Yanımdakı üzükdən yaxşı bir şeydir, – deyib mizin üstünə bir kisə qızıl qoydu. Aramıs qızılın səsini eşidib başını qaldırdı. Portos diskindi. Yalnız Atos bu səsə qarşı laqeyd qaldı.
- Bu balaca kisədə nə qədər qızıl var?
Yeddi min livr, hamısı da on iki franklıq lundordur.
Portos heyrətlə dedi:
Yeddı min livr? O, xırdaca brilyantın qiyməti yeddi min livrdir?
Atos:
Görünür ki, belədir, – dedi, çünki pulu gözümüzün qabağındadır. Dostumuz d'Artanyan da, yəqin ki, öz pulunu bunun üstünə qoymayıb.
D'Artanyan yenə də sözə başladı:
Cənablar, biz ki kraliçanın dərdinə qalmırıq. Onda heç olmasa onun əziz dostu olan hersoqun qayğısına qalaq. Kraliçanın ki, bizə belə yaxşılığı dəyib, bu, onun qabağında lap xırdaca bir şeydir.

Atos onunla razılaşdı:

– Tamamilə doğrudur. Ancaq bu, Aramisə aid bir məsələdir.

Aramis qızararaq dedi:

Əgər belə isə, onda mən nə etməliyəm?

Atos:

Sən Turda yaşayan o bacarıqlı qadındı da bir kağız yazmalısan.

Aramis yenə də lələk qələmi götürüb fikrə getdi, sonra aşağıdakı sətirləri yazıb o saat dostlarına oxudu:

"Əzizim əmiqızı!"

Atos soruşdu:

– Hə! Bu bacarıqlı qadın sizin əmınız qızıdır?

– Bəli. Əmim qızıdır.

Yaxşı. Qoy sizin əminiz qızı olsun.

Aramis məktubu oxumağa başladı:

*"Əzizim əmiqızı! Kardinal həzrətləri, Allah onu Fransanın xoşbəxtliyi və kralın düşmənlərini dəhşətə salmaq üçün öz pənahında saxlasın, bəli, kardinal həzrətləri az qalıb ki, Laroşelin qiyamçı laməzhəblərinin işini bitirsin; çox ehtimal ki, bizim düşmənlərin köməyinə gələn ingilis donanması heç bizə yaxınlaşa da bilməsin; hətta cəsarətlə deyə bilərəm ki, mühüm bir hadisə Bekinhem hersoqunun İngiltərədən çıxmasına mane olacaq, kardinal həzrətləri həm keçmişdə olan, həm də indiki siyasətçilərin ən məşhur siyasətçisi hesab ediləcəkdir. Günəş ona mane olsa, o hətta günəşi də söndürə bilər. Əzizim əmiqızı, bu xoş xəbəri öz bacınıza söyləyin; Mən yuxuda gördüm ki, o məlun ingilisi öldürüblər; onu xəncərləmi öldürmüşdülər, ya zəhərləmişdilərmi, burası xatirimdə deyil; ancaq gördüm ki, onu öldürüblər. Siz ki, bilirsiniz, mənim yuxum həmişə düz olur. Məni aldatmır. Bu yaxında görüşəcəyimizə əmin olun".*

Atos heyrətlə:

Çox gözəl yazılıb! dedı. Əzizim Aramıs, sız şairlər padşahı sınız! Ancaq indi bu məktuba ünvan yazılmalıdır

Aramis:

– Bu, çox asan bir şeydır, deyərək kağızı nəzakətlə bükdü və üstündə bu sözləri yazdı:

*"Turda köynəktikən Mışon xanıma"*

Üç dost gülərək bir-birinə baxdı: Aramis onlara kələk gəlmişdi.

Aramis sözünə davam etdi:



Cənablar, ındi özünüz başa düşürsünüz ki, bu kağızı Tura ancaq Bazen apara bilər; mənim əmıqızım ancaq Bazeni tanıyır, ancaq ona inanır. Başqası olsa, işi pozar. Burası da var ki, Bazen həm oxumuş, həm də izzət-nəfsini sevən bır adamdır. Onun hətta tarixdən də xəbəri var; o bilir ki, Beşinci Sikst, papa olmazdan əvvəl donuz otarmışdı. O da istəyir ki, mənımlə bərabər ruhani olsun; o hətta ümid edir ki, ya papa taxtını ələ alsın, ya da heç olmasa kardınal olsun. Gələcəyə belə ümidlər bəsləyən bir adam heç vaxt özünü ələ verməz, ələ düşsə də, hər əzaba dözər, amma sirri verməz.

D'Artanyan onunla razılaşdı:

Yaxşı. Mən lap ürəkdən Bazenin getməsinə razıyam. Siz də Planşenin getməsinə razı olun. Miledi bir kərə Planşeni ağacla öz evindən qovmuşdur. Planşenin yaxşı hafizəsi var; sızə söz verirəm kı, əgər onun əlinə fürsət düşsə, lap ölsə də bunun qisasını alacaqdır. Aramis, əgər Tur məsələsi sizə aiddirsə, London məsələsi də monə aiddir. Xahiş edirəm Planşenin göndərilməsinə etiraz etməyın, burası da var ki, Planşe bir dəfə mənimlə Londona getmişdir, yolu yaxşı tanıyır.

Atos belə qərara gəldi:

– Onda Planşeyə gedəndə yeddi yüz livr veririk, qayıdandan sonra da yeddi yüz. Bazenə də elə: gedəndə üç yüz, qayıdandan sonra üç yüz. Belə olanda bızim kapitalımız iki min livr azalacaq. Biz hərəmiz də min livr götürüb kefimiz necə istəsə xərcləyə bilərik. Qalan mın livri cənab keşişə verərik, ehtiyat üçün saxlar: lazım olanda xərclərik. Buna razısınızmı?

Aramis:

Əzizimi Atos, – dedi, – siz lap Nestor[1] kimi danışırsınız: özünüz bilirsiniz ki, o, qədim yunanlar ıçərisində ən ağıllı adam hesab olunurdu.

Atos sözünə davam etdi:

Deməli, məsələ həll olundu. Planşe ilə Bazen gedirlər. Düzü, Qrimonun burada qalmasına mən çox sevindim: o artıq mənim hər bır xasiyyətimə bələd olub. Mən də onun xatirini isteyirəm. Dünənkı hadisə görünür ki, onun əsəblərinə bərk toxunmuşdur, ındi biz onu bır yana göndərsəydik o lap üzülərdi.

[6] Nestor – Homerın "İliada" poemasının qəhrəmanlarından biri Pilos padşahı olan Nestor əfsanəvı Troya müharibəsinin ıştırakçılarından ən qədımi olaraq öz ıdrakılə şohrətlənmişdı.

Planşeni çağırıb ona lazımi tapşırıqları verdilər. D'Artanyan qa baqcadan onunla bu barədə söhbət etmişdi ki, bu tapşırığı yerinə yetirməklə sən şöhrət qazanacaqsan: sonra ona pul veriləcəyini söyləmişdi: ən axırda da bu işin təhlükəli bir iş olduğunu qeyd etmişdi.

Planşe:

– Mən məktubu pencəyimin astarına tikərəm, dedi. Ələ keçsəm, udaram.

D'Artanyan:

Onda sən tapşırığı yerinə yetirməzsən, – dedi.

– Siz bu axşam məktubun surətini mənə verərsiniz, mən də onu sabaha kimi əzbərləyərəm.

D'Artanyan öz dostlarına baxdı, bununla sanki o soruşdu: "Görürsünüzmü? Mən doğru deyirdimmi?"

Sonra o Planşeyə dönüb dedi:

Lord Vinterin yanına getmək üçün sizə səkkiz gün vaxt verilir, geri qayıtmağa da səkkiz gün, hamısı eləyir on altı gün. Hərgah on altıncı gün axşam saat səkkizdə gəlməsən, beşcə dəqiqə geciksən, pulsuz qalacaqsan.

Planşe:

– Ağa, onda mənə bir saat alın, – dedi:

Atos əliaçıq adamdı: saatını çıxarıb ona verdi:

Al, tapşırığı yaxşı yerinə yetir, qoçaq ol. Bil ki, bu sirri ağzından qaçırıb bir adama desən, ya bir gün orada-burada ləngiyib qalsan, öz ağanı məhv edə bilərsən: o, sənə gör nə qədər inanır ki, bizim yanımızda sənin üçün zamin oldu. Bunu da yadından çıxartma ki, əgər sənin təqsirin üzündən d'Artanyana bir bədbəxtlik üz versə, harda olsan səni tapıb qarnını cıracağam.

Planşe Atosun bu sözlərindən incidi, onun ifadəsindəki sərtlikdən qorxaraq dedi:

Ağa, heç elə şey olarmı?

Portos iri gözlərini bərəldərək:

– Mən isə diri-diri sənin dərini soyaram, – dedi.

– Ağa!

Sonra Aramisin sakit, ahəngdar səsi eşidildi:

– Unutma ki, mən də səni bir vəhşi kimi vam odda yandıraram!

– Ah ağa!



Planşe ağladı. O, qorxusundanmı, ya ağasına qarşı göstərilən bu dostluq hissinin təsirindən riqqətə gələrəkmi ağladı, – biz bunu söyləyə bilməyəcəyik.

D'Artanyan onun əlini sıxıb alnından öpdü:

Planşe, bu ağalar mənim dostum olduğu üçün bu sözləri sənə deyirlər, lakin əslində onlar sənin xatirini istəyirlər.

Planşe:

– Ağa, ya məni parça-parça doğrayacaqlar, ya da mən sizin bütün tapşırıqlarınızı yerinə yetirəcəyəm, dedi. Məni lap parça-parça doğrasalar da dilimdən söz çıxmayacaq.

Belə qərara gəldilər ki, Planşe səhər saat səkkizdə yola düşsün, – ona vaxt vermək lazımdı ki, gecə məktubu əzbərləyə bilsin; belə olan surətdə düz on iki saat artıq vaxt əldə etmiş olurdu; o, on altıncı gün axşam saat səkkizdə burda olmalı idi.

Səhər Planşe yola düşməyə hazır ikən, d'Artanyan, Bekinhem hersoqunun xatirini istədiyindən Planşeni qırağa çəkib dedi:

Sən ki məktubu lord Vinterə verdin, o, məktubu oxudu, sonra ona deyərsən ki, "Cənab, Bekinhem lordunu qoruyun, onu öldürmək istəyirlər". Planşe, bu o qədər mühüm, o qədər ciddi bir məsələdir ki, bunu mən hətta öz dostlarıma da söyləmək istəmədim: sənə inandığım üçün bu sirri sənə deyirəm. Mənə hətta kapitanlıq rütbəsi vəd etsəydilər də, mən bunu kağıza yazmazdım.

Ağa, lap arxayın olun, sonra özünüz görəcəksiniz ki, mən necə adamam.

Planşe cilovundan tutduğu gözəl bir atın üstünə sıçradı və çapa-çapa uzaqlaşdı: o, iyirmi lye getdikdən sonra bu atı qoyub poçta atına minəcəkdi. Üç muşketyorun təhdidi yadına düşdükcə ürəyi bir balaca sıxılırdı; buna baxmayaraq onun kefi kökdü, qəlbi də gözəl ümidlərlə dolu idi.

Bazen də ertəsi gün səhər Tura getdi. Tapşırığı yerinə yetirmək üçün ona səkkiz gün vaxt verilmişdi.

Planşe ilə Bazen gedəndən sonra dörd dost əvvəlki vaxtlardan daha artıq sayıq və ehtiyatlı olmağa başladılar; qulaqları həmişə səsdə idi. Onlar ətrafda deyilənlərə qulaq asır, kardinalın hərəkətlərini izləyir, göndərdikləri qasidlərin gəlməsini səbirsizliklə gözləyirdilər. Birini qəfil qulluq işinə çağıranda hamısını dərin bir həyəcan bürüyürdü. Eyni zamanda, özlərini qorumalı idilər də: miledinin xəyalı onları gecə rahat yatmağa qoymurdu.

Bazen səkkizinci günün səhəri, həmişəki kimi gümrah və gülər üzlə "Neçestivtsa" meyxanasına girdi, oturub səhər yeməyi yeyən muşketyorlara dedi:

– Cənab Aramis, bu da sizin əminiz qızının cavabı.

Dörd dost sevinclə bir-birinə baxdı: işin yarısı görülmüşdü, – işin bu yarısı həm yüngül, həm də az vaxt tələb edirdi.

Aramis qızararaq məktubu aldı; məktub kobud bir xətlə yazılmışdı; imla səhvləri də vardı.

Gülərək bərkdən dedi:

- Vallah, bu yazıq Mişon, deyəsən heç vaxt düz yazı yazmağı öyrənməyəcək: mən ondan daha ümidimi kəsirəm.

Bazen məktubu gətirərkən, öz dostları ilə söhbət edən isveçrəli soruşdu:

– Bu yazıq Mişon kimdir ki?

Aramis:

Əşi, heç kim, - dedi, köynəktikən xırdaca füsunkar bir qızdır. Onu mən çox sevirdim. Xahiş etmişdim ki, yadıgar olaraq mənə bir neçə sətir söz yazsın.

İsveçrəli:

Əgər o, özü də kağızdakı hərflər kimi böyükdürsə, onda, yoldaş, siz çox xoşbəxtsiniz, – dedi.

Aramis məktubu oxuyub Atosa verdi:

– Atos, gör nə yazır.

Atos məktubu tez gözdən keçirtdi, heç bir şübhə əmələ gətirməmək üçün bərkdən oxudu:

*"Əmioğlu, mən də, mənim bacım da yuxu yozmağı çox yaxşı bacarırıq, yuxudan da çox yaman qorxuruq; lakin sizin yuxunuz haqqında ancaq bunu deyə bilərik: hər bir yuxu yalandır. Əlvida, sağlıqla qalın, arabir özünüzdən bir xəbər yazın.*

*Aqlaya Mişon"*

Məktub oxunurkən draqun yaxınlaşıb soruşdu:

O, hansı yuxunu deyır?

İsveçrəli də eyni sualı verdi:

Onun dediyi hansı yuxudur?

Aramis onlara belə cavab verdi:

Eh, boş bir şeydir: mən yuxu görüb ona söyləmişdım, onu deyir.

Amma mən heç yuxu görmürəm.



Atos ayağa qalxaraq:

Siz çox xoşbəxt adamsınız, - dedi.

İsveçrəli, Atos kimi bir adamın heç olmasa bu məsələdə ona qibtə etməsindən sevinərək dedi:

– Heç vaxt! Heç vaxt! Heç vaxt!

D'Artanyan da ayağa durub onun qoluna girdi. Hər ikisi aşxanadan çıxdı. Portosla Aramis, draqun və isveçrəli ilə söhbət eləməyə qaldılar. Bazen bəlim şələsinə söykənərək fikrə getdi, xəyalında belə bir şey canlandı: Aramıs papa olmuş, onun da başına kardinal papağı qoyur.

Bazenin tapşırığı yerinə yetirib qayıtması dörd dostun ürəyini ancaq bir azca sakit edə bilmişdi. Onların gözü yolda idi. Həsrətli günlər, adətən, ağır gəlib keçir. Bunu hamıdan artıq d'Artanyan hiss edirdi; o, lap mərc gələ bilərdi ki, indi gecə-gündüz iyirmi dörd saat deyil, qırx səkkiz saatdır. O, dəniz yolunun uzunluğunu unudur, miledinin bacarıq və qüdrətini artırırdı. Bu qadın ona bir iblis kimi görünürdü; öz təsəvvüründə ona özü kimi fövqəltəbii qüvvələrdən köməkçilər yaradırdı. Xırdaca bir hənirti eşitcək, elə zənn edir ki, onu tutmağa gəlirlər. Yada Planşeni onunla, onun dostları ilə üzləşdirməyə gətirilər. O hətta Planşenin sədaqətinə də get-gedə şübhələnməyə başlayırdı. Onun gündən-günə artan narahatlığı Portosa və Aramisə də keçirdi. Ancaq Atos əvvəlki kimi sakitdi, sanki ətrafda heç bir təhlükə yox idi, heç bir şey əvvəlki vəziyyəti pozmurdu.

Planşe gedənin on altıncı günündə d'Artanyan və onun dostları elə bir hala düşdülər ki, beşcə dəqiqə də bir yerdə otura bilmədilər: onlar Planşenin gələcəyi yol ayrıcında bir kölgə kimi avara-avara dolaşırdılar.

Atos onlara deyirdi:

– Arvad ki, sizi belə qorxuya sala bilirmiş, vallah, siz kişi deyilsiniz, uşaqsınız! Axı siz nədən qorxursunuz? Dustaqxanadanmı? Dustaqxanaya düşsək də, bizi oradan buraxdıracaqlar: xanım Bonasyeni buraxmadılarmı? Daha nədən qorxursunuz? Başınızın kəsilməsindənmi? Biz ki, hər gün səngərlərdə gülə-gülə, danışa-danışa bundan daha artıq təhlükə qarşısında oluruq: hər atılan top gülləsi qıçımızı qıra bilər, mən əminəm ki, cərrah bu qırılmış qıçı kəsəndə bizə, bizim başımızı kəsən cəlladdan daha artıq əziyyət verəcəkdir. Planşenin gəlməsini sakitcə oturub gözləyin: iki saatdan, ya dörd saatdan, ya bundan da gec olsa, hər halda gəlib çıxacaqdır. O, söz verib

ki, vaxtında özünü yetirəcək, mən onun sözünə tamamilə inanıram. Planşe, məncə, çox etibarlı oğlandır.

D'Artanyan dedi:

Birdən gəlmədi, sonra?

– Sonrası yoxdur ki, o gəlməsə, demək gecikmişdir, vəssalam? O, atdan yıxıla bilər, körpüdən suya düşə bilər, atı bərk çapmaqdan tərləyib sətəlcəm ola bilər... Adamın başına çox şey gələ bilər, cənablar, bunu nəzərə almaq lazımdır. Həyat kiçik bədbəxtliklər silsiləsindən ibarətdir; filosof bunları gülüşlə qarşılayır. Siz də mənim kimi filosof olun; oturun. Bir yaxşı içək: adam ki, al Şamberten şərabı qədəhi arxasından gələcəyə baxır, gələcək heç vaxt ona bu qədər gözəl görünmür.

D'Artanyan dedi:

Lap düz deyirsiniz! Ancaq bir şey mənim zəhləmi töküb: hər şüşəni açanda qorxa qorxa öz özündən soruşursan: görəsən bu miledinin zirzəmisindən gətirilməyib ki?

Atos:

– Siz yaman vasvasısınız, dedi. Elə bir gözəl qadın sizin xoşunuza gəlmir.

Portos bərkdən gülərək dedi:

– Damğalanmış bir qadın!

Atos diksınıb, əsəbi halda əlini alnına apardı, sankı alnının tərini silirdi...

Nəhayət, gün gəlib keçdi, axşam oldu. Aşxanalar adamla dolu idi. Atos brilyant üzüyün pulundan öz payına düşəni almışdı, indi o bütün günü "Neçestivtsa" meyxanasından bayıra çıxmırdı. Atos mərci uduzan və dörd muşketyoru yaxşıca bir nahara qonaq edən cənab de Büzinyi ilə əməllicə tapışmışdı: saat yeddini vuranda onlar yenə də ikilikdə oturub şərab içirdilər. Qarovul məntəqələrini möhkəmlətmək üçün gedən keşikçinin ayaq səsləri eşidildi. Səkkızın yarısında düşərgəyə yığışmaq şeypuru çalındı:

D'Artanyan Atosun qulağına pıçıldayaraq dedi:

– Məhv olduq.

Atos cıbından dörd pıstol çıxarıb mizin üstə atdı və sakitcə dedi:

– Demək istəyirsiniz ki, biz uduzduq? Cənablar, gedək, şeypur çalınır, yatmaq vaxtıdır.

Atosla d'Artanyan aşxanadan çıxdılar. Aramislə Portos da qol-qola girib daldan gəlirdilər. Aramis öz-özünə yavaşca şeir oxuyur, Portos da, ümidsizlik əlaməti olaraq, arabir bığının tüklərindən dartıb çıxarırdı.



Birdən qaranlıqda kölgə kimi bir şey göründü və d'Artanyanın qulağına yaxşı tanıdığı bir səs gəldi:

Ağa, mən sizə plaş gətirmişəm, çünkı bu axşam hava bır qədər soyuqdur.

D'Artanyan sevincindən çığırdı:

– Planşe!

Portosla Aramis də bir ağızdan dedilər:

Planşe!

Atos:

– Yaxşı da, Planşedir də. Burada təəccüblü nə var ki? dedi. O, saat səkkizdə gələcəyinə söz vermişdi, indi düz saat səkkizi vurur. Sağ ol, Planşe, sözündə möhkəm adamsanmış. Nə vaxt siz öz ağanızın yanından getmək istəsəniz, mən sizi saxlayacağam.

Planşe:

– Heç vaxt! dedi. Heç vaxt mən cənab d'Artanyanı qoyub getməyəcəyəm.

Elə bu anda d'Artanyan ovcuna bir kağız qoyulduğunu hiss etdi.

Planşe gedəndə d'Artanyan onu qucaqlayıb bağrına basmışdı; indi də o, Planşeni beləcə qucaqlamaq istəyirdi; ancaq bundan ehtiyat eləyirdi; xıdmətçiyə qarşı, özü də küçənin ortasında, belə bir əlaqə göstərmək, yoldan ötənlərə çox qəribə görünə bilərdi.

D'Artanyan öz yoldaşlarına pıçıldayaraq dedi:

Kağız məndədir.

Atos:

Yaxşı, – dedi. Evə gedib oxuyarıq.

Kağız d'Artanyanın əlini elə bil kı, yandırdı. O, addımlarını yeyinlətmək istədi, lakin Atos onun qoluna girdi, cavan oğlan da istər-istəməz öz dostunun yerişi ilə getməyə məcbur oldu.

Nəhayət, gəlib çadıra girdilər, çırağı yandırdılar. Planşe çadırın ağzında qarovulda durdu ki, qəfildən gələn olmasın. D'Artanyan əli əsə-əsə məktubun möhürünü qırdı və səbırsizliklə gözlədiyi kağızı açıb oxudu.

Kağız çox qısa yazılmışdı:

*"Təşəkkür edirəm, narahat olmayın".*

Atos məktubu d'Artanyanın əlindən aldı, çırağa tutdu, ta yanıb kül olana qədər əlini çəkmədi.

Sonra Planşeni çağırdı:

– Hərçənd belə bir kağızı gətirmək elə təhlükəli bir şey deyildir, hər halda, əzizim, indi sən yeddi yüz livri ala bilərsən.

D'Artanyan Planşeyə dedi:

Bütün gördüklərini indi bizə nağıl elə.

Ağa, bu uzun məsələdir!

Atos:

– Planşe, sən haqlısan, dedi - Bir də ki, yatmaq şeypuru çalınmışdır, hamının çırağı sönəndən sonra bizimki yenə də yansa, bu nəzərə çarpa bilər.

D'Artanyan buna etiraz etmədi:

– Yaxşı, qoy siz deyən olsun. Yataq. Planşe, rahat yat.

Ağa, bu on altı günün müddətində, vallah mən ancaq bu gecəni rahat yatacağam.

D'Artanyan dedi:

Mən də!

Bunu Portos da, Aramis də təkrar etdilər:

– Mən də!

Mən də!

Atos buna yalnız iki söz əlavə etdi:

- Düzünü desəm mən də!

## XIX

## TALE

Miledi acıqlanmış pələng kimi gəminin göyərtəsində çırpınır, bir yerdə qərar tuta bilmirdi: hirsi onu boğurdu: o az qalırdı ki, özünü dənizə atıb üzə üzə sahilə qayıtsın.

D'Artanyanla Atosdan qisas almadan Fransanı tərk etmək ona son dərəcə ağır gəlirdi. Gedib kapitana yalvarmağa başladı ki, gəmini döndər, məni sahilə çıxart, mən getmək istəmirəm. Bununla kardinalın narazılığına səbəb olacağını bilirdi, lakin bu, onu qorxutmurdu, kapitan isə tələsirdi ki, tez özünü İngiltərə sahillərinə yetirsin, çünki onun vəziyyəti çox pis idi: yarasa özünü sıçanla quş arasında necə pis hiss edirsə, o da özünü fransız kreyserlərilə ingilis kreyserləri arasında elə hiss edirdi. Ona görə də bu şıltaq qadını qəti surətdə rədd etdi. Lakin



kardinal miledini xüsusi olaraq ona tapşırmış, ondan muğayat olmasını söyləmişdi. Kapitan yəqin ki, bunu nəzərə alaraq öz miniyinə söz verdi ki, əgər dəniz və fransızlar imkan versə sizi Breton limanlarından birində, ya Lorianda, ya da Brestdə sahilə çıxararam. Lakin bütün yol uzunu külək əsdiyindən dəniz dalğalı idi, buna görə də gəmini sahildən uzaq sürmək lazım gəlirdi.

Miledi Şarantadan çıxandan doqquz gün sonra ancaq Finisterin göyümtül sahillərini görə bildi; hirsindən onun rəngi ağarmışdı. Buradan kardinalın yanına getmək üçün ona heç olmasa üç gün vaxt lazımdır; bir gün də gəmidən sahilə çıxmağa vaxt gedərdi; təzədən əvvəlki yerə gəlib çatmaq üçün də doqquz gün vaxt gərəkdir! Bu müddət ərzində Londonda çox mühüm hadisələr ola bilərdi. Kardinal da, yəqin ki, onun geri qayıtmasından bərk hirslənəcək və onun sözündən daha artıq başqalarının ona qarşı olan şikayətlərinə əhəmiyyət verməyə başlayacaqdı. Buna görə də gəmi Lorian və Brest yanından ötüb keçərkən o, artıq sahilə çıxarılmasını kapitandan tələb etmədi. Kapitan da qəsdən bunu onun yadına salmadı. Bu qayda ilə miledi öz yoluna davam etdi; Planşe gəmiyə minib Portsmutdan Fransaya qayıdanda kardinal həzrətlərinin elçisi gəlib London limanına çatdı.

Bütün şəhər fövqəladə bir həyəcan içində idi: yenicə qayırılmış dörd böyük gəmi suya salınırdı. Bekinhem hersoqu öz məiyyəti ilə əhatə olunmuş halda, sədd üstündə durmuşdu; o, başdan ayağa zər-ziba içində idi; üstündəki brilyantlar və başqa qiymətli qaş-daşlar par-par parıldayırdı; başındakı şlyapanın ağ lələkləri çiyinlərinə doğru sallanırdı; onu əhatə edən adamlar da bəzək-düzəkdə ondan geri qalmırdılar.

İngiltərədə çox nadir ələ düşən və ingilislərə dünyada günəş olduğunu xatırladan gözəl qış günlərindən biri idi. Üfüqə doğru əyilən günəşin son şüaları qüllələrin, köhnə evlərin üstünə düşmüşdü. Miledi sinədolusu təmiz dəniz havasını tənəffüs edir, iri gəmilərə, dəniz desantı üçün gedən bu böyük hazırlığa baxırdı; - o, buna mane olmalı idi. Miledi düşmən ordusunun bütün əzəmətini görürdü. Lakin o, bu ordunu yıxıb dağıtmalı idi; bu qüvvət qarşısında onun yalnız bir neçə kisə qızılı vardı. Fikrində özünü Yudiflə[1] müqayisə edirdi. Yudif də assurilərin ordugahına daxil olur, orada çoxlu araba, at, adam və silah

[1] Y u d i f – İncilin qəhrəmanlarının biri. O, yəhudilərin düşməni olan Olofernin düşərgəsinə girərək onu öldürmüş və mühasirədə olan Qüdsü xilas etmişdir.

görür ki, bunlar onun bir əl hərəkəti ilə bir tüstü dumanı kimi dağılıb məhv olmalı idi.

Gəmi reyddə dayandı. Lövbər atmağa hazırlaşırdılar ki, balaca, lakin yaxşı silahlanmış birdorlu hərbi gəmi ticarət gəmisinə yaxınlaşıb dənizə bir qayıq saldı; qayıq gəmi nərdivanına sarı irəlilədi. Qayıqda bir zabit, bir bosman, səkkiz də kürək çəkən vardı. Zabit gəminin göyərtəsinə qalxdı, hərbi geyimini nəzərə alaraq onu çox hörmətlə qəbul etdilər. O, bir neçə dəqiqə kapitanla danışdı, kapitana bir neçə kağız verib oxutdu. Sonra da kapitanın əmri ilə gəminin bütün əmələ və minikləri göyərtəyə çağırıldı.

Bu da yerinə yetirildikdən sonra zabit bərkdən gəminin haradan və hansı yolla gəldiyini, harada dayandığını soruşdu. Kapitan sualların hamısına tərəddüd etmədən və çətinlik çəkmədən cavab verdi Bu da qurtarandan sonra zabit bütün minikləri bir bir gözdən keçirtməyə başladı;ılediyə çatanda, ona çox diqqətlə baxdı, lakin heç bir söz demədi. Kapitanın yanına döndü, yenə də ona bir neçə kəlmə söz söylədi. Bundan sonra da gəmini idarə edirmiş kimi komanda verdi, gəminin əmələsi əmri dərhal yerinə yetirdi; gəmi yola düşdü. Birdorlu hərbi gəmi də, altı topunu onun üstə dikəldərək, yandan gedirdi; qayıq isə daldan gəlirdi; o, böyük ticarət gəmisinin yanında güclə seçiləcək bir nöqtəyə oxşayırdı.

Zabit miledini gözdən keçirəndə miledi də çox diqqətlə ona baxır, az qalırdı ki, onu gözləri ilə yesin (oxucu bunu çox asanlıqla təsəvvür edə bilər). Bu qadın insan qəlbinin sirrini insanın simasından oxumaqda çox mahir idi; lakin bu dəfə qarşısında duran adamın simasında elə bir etinasızlıq və soyuqluq var idı ki, nə qədər diqqətlə baxsa da heç bir şey öyrənə bilmədi. Miledini diqqətlə nəzərdən keçirən zabitin iyirmi beş yaşı olardı. Onun üzü ağ, gözləri mavi, dodaqları nazik, ağzı qəşəng idi. Çənəsinin uzunluğu möhkəm bir iradəyə malik olduğunu göstərirdi. Saçları üzünün aşağı hissəsini örtən saqqalı gözəl, tünd şabalıdı rəngində idi.

Gəmilər limana girəndə artıq hava qaralmışdı. Ətrafı bürüyən duman bu qaranlığı daha da artırdı Mayakların və sahil fənərlərinin ətrafında ağ dairələr əmələ gəlmişdi; bu dairələr, yağıntı başlamazdan əvvəl, ayın ətrafında görünən dairəyə bənzəyirdi. Hava rütubətli və soyuqdu. Miledi cəsarətli və möhkəm bir qadın olsa da, yenə bədənində bir titrətmə hiss etdi.



Zabit miledidən şeylərini göstərməyi tələb etdi və bu şeylərin qayığa aparılması əmrini verdi. Əmr yerinə yetirildikdən sonra, zabit əlini milediyə uzadaraq onu qayığa enməyə dəvət etdi.

Miledi ona baxıb tərəddüd içində dayandı:

– Möhtərəm cənab, siz kimsiniz və mənə qarşı edilən bu hörmət nə üçündür?

Xanım, siz bunu mənim mundirimdən çox asanlıqla təyin edə bilərsiniz; mən ingilis donanması zabitiyəm.

Məgər ingilis donanmasının bütün zabitləri Böyük Britaniya limanlarına gəlib sahilə çıxmaq istəyən ingilis xanımlarına qarşı belə xidmətmi göstərir?

Bəli, miledi; ancaq bu xidmət bəzən hörmət üçün deyil, ehtiyatlı olmaq üçün edilir. Müharibə vaxtında xarici qonaqları müəyyən edilmiş mehmanxanaya aparırlar; onlar haqqında ən düzgün məlumat toplayana qədər onlar burada hökumətin nəzarəti altında qalır.

Bu sözlər incə bir nəzakət və çox sakit ifadə ilə deyilmişdi Lakin bunlar miledini şübhədən çıxara bilmədi.

Sonra o, ən təmiz ingilis dilində dedi:

– Mən ki xarici deyiləm. Mənim adım ledi Klarikdir. Bu tədbir...

– Miledi, bu tədbir hamıya aiddir. Sizə bu barədə güzəşt ola bilməz, siz bunun üçün nahaq zəhmət çəkirsiniz.

Elə isə, cənab, mən sizinlə gedirəm.

Zabitin uzatdığı əlinə dayanaraq, nərdivanla qayığa enməyə başladı. Zabit də onun dalınca düşdü. Qayığın dal tərəfinə böyük bir plaş salınmışdı. Zabit onu plaş üstə oturtdu, sonra da özü onun yanında oturdu.

Matroslara əmr etdi:

– Sürün.

Səkkiz kürək birdən suya endi, qayıq elə bil quş kimi su üzərində uçdu. Beş dəqiqədən sonra sahilə yan aldılar.

Zabit qayıqdan sahilə atılıb əlini milediyə uzatdı.

Onları bir kareta gözləyirdi.

Miledi soruşdu:

Bu kareta bizim üçünmü hazırlanmışdır?

Bəli, xanım.

– Mehmanxana yoxsa çox uzaqdadır?

– Şəhərin o biri başındadır.

– Gedək!

Miledi tərəddüd etmədən karetaya mindı.

Zabit onun bütün şeylərini, çamadanlarını səliqə ilə karetanın dalına bağlatdı. Sonra miledinin yanında oturub karetanın qapısını örtdü.

Sürücü buyruq gözləmədən atları bərk sürdü, kareta şəhərin küçələrini arxada buraxaraq sürətlə uzaqlaşdı.

Bu qəribə hadisə miledini bərk düşündürürdü. Gənc zabitin qətiyyən danışmaq fikrində olmadığını görüb özünü karetanın bucağına verdi və fikrə daldı. Onun xəyalına cürbəcür şeylər gəlirdi, lakin o, bunların hamısını bir bir rədd edirdi.

On beş dəqiqə keçdi. Belə yol getdiklərinə təəccüb edərək əyilib pəncərədən bayıra baxdı. Hara getdıklərini bilmək istədı Evlər daha görünmürdü. Ağaclar qaranlıqda böyük, qara bir xəyal kimı bır-bırı ardınca çapırdı.

Miledi bunu görüb diksindi:

– Bu nə olan şeydir: biz şəhərdən qırağa çıxmışıq.

Gənc zabit dinmədi.

– Möhtərəm cənab, siz məni hara apardığınızı deməsənız, mən daha getməyəcəyəm.

Miledinin bu təhdidi yenə də cavabsız qaldı.

Miledi qışqıraraq dedi:

– Bu lap ağ oldu! Köməyə gəlın! Köməyə gəlin!

Lakin heç kəs onun harayına gəlmədi. Kareta yenə əvvəlki sürətlə yoluna davam edirdı, zabit də elə bil heykələ dönmüşdü.

Miledi karetanın qapısını açıb bayıra atılmaq istədi.

Gənc zabıt soyuqqanlıqla dedi:

– Xanım, özünüzü gözləyın, yıxılıb baş-gözünüzü əzərsiniz.

Miledi geri çəkilib oturacağın dalına söykəndı: hirsindən o, az qala boğulurdu. Zabit əyilib onun üzünə baxdı və təəccüb elədi: onun qəşəng üzü hirsindən, bir an içində eybəcər bir şəklə düşmüşdü. Miledi bıc arvaddı, hirslənməklə ancaq özünə zərər yetirəcəyini başa düşdü. Üzünün ıfadəsi dəyişdi və şikayətlı bir səslə dedi:

– Siz allah, deyin görüm, mənə ki belə zor edilir, mən bunun üçün kimə minnətdar olmalıyam? Sizin hökumətəmi, sizəmi və ya mənim düşmənləriməmi?

– Xanım, sizə qətiyyən zor eləyən yoxdur, bu ancaq ehtiyat üçün edilən adıcə bir tədbirdır. İngiltərəyə kim gəlsə, biz ona qarşı belə bir tədbir görməliyik.



– Cənab, siz axı məni tanımırsınız.

– Mən bırıncı dəfədir ki, sizi görmək şərəfinə nail oluram.

– Öz vicdanınız qarşısında düzünü deyin: siz mənə nifrət etmirsınız ki?

– And içirəm ki, yox.

Gənc zabıtin səsındəki sakıtlık, soyuqqanlılıq və yumşaqlıq miledıyə bir təskinlık verdi.

Kareta bır saat yol gedəndən sonra kənddən, şəhərdən uzaq qədim bir qəsrin dəmir barmaqlıqlı darvazası qabağında dayandı. Kareta içəri daxıl olub parkın baş xiyabanının narın qumları üstündə ırəlilədi. Miledi bərk bir gurultu eşitdi; diqqət etdikdə bunun sahil qayalarına çarpan dalğa səsi olduğunu təyin etdi. Kareta iki qübbə altından keçdikdən sonra yenə də qaranlıq, dördbucaq bir həyətdə dayandı. Elə o saat da karetanın qapısı açıldı; gənc zabit yerə atılıb əlini milediyə uzatdı. Miledi sakitcə bu ələ dayanaraq aşağı düşdü.

O, əvvəl ətrafına, sonra da könülaçan xoş bır təbəssümlə gənc zabitə baxaraq dedi:

– Belə görünür ki, mən əsirəm. Ancaq əminəm ki, bu, uzun sürməyəcək. Cənab, mənim vicdanım və sizın nəzakətiniz buna bir əsas ola bılər.

Gənc zabıt heç bir söz demədi. Toqqasının altından, hərbi gəmi bosmanlarının fişqırığına oxşar balaca gümüş bir fişqırıq çıxartdı və üç dəfə müxtəlif səslə fit verdi. Səsə bir neçə adam gəldi; onlar tərdən köpüklənmiş atları açdılar. Karetanı da dama apardılar.

Zabit yenə əvvəlki nəzakətlə əsir qadını evə dəvət etdi. O da bayaqkı kimi gülümsəyərək zabitin qoluna girdı və hər ikisi alçaq qapıdan içəri daxil oldular. Qübbəlı, yarımqaranlıq dəhlizdən keçərək burma-burma daş pilləkənlə yuxarı qalxdılar. Zabit yanındakı qadınla iri bir qapı qabağında dayandı; əlindəki açarı qapının qıfıl yerinə saldı; qapı petlələri üstə dönərək ağır-ağır açıldı. Onlar içəri girdilər. Miledi otağa ötəri bir nəzər saldı.

Bu otağın müxəlləfatı eyni dərəcədə həm dustaqxanaya, həm də sərbəst bir adamın yaşayışına yarardı; lakin pəncərələrin dəmir barmaqlığı və qapıların rəzəsi, hər şeydən əvvəl, buranın dustaqxana olduğunu göstərirdi.

Miledi ağır sınaqlardan çıxmış bir qadındı; lakin bu vəziyyəti görcək bütün bədəni sustaldı; o, taqətsiz halda kresloya oturdu, qollarını

döşündə çarpazlayaraq başını aşağı saldı, bir az sonra hakimin gəlib onu sorğu-sual edəcəyini gözləməyə başladı.

Lakin iki-üç matrosdan başqa heç kəs gəlmədi. Onlar miledinin çamadanını, qutularını gətirib otağın bir küncünə qoydular. Bir kəlmə də söz söyləmədən çıxıb getdilər.

Zabit sakitcə matroslara baxır, əmrlərini sözlə deyil əl hərəkəti, ya fişqırıqla verirdi.

Belə güman etmək olardı ki, bu adamlar ona tabe olan matrosların arasında danışıq deyilən şey yoxdur, ya da ki, danışıq onlar üçün tamamilə gərəksiz bir şey olmuşdur.

Axırda miledi bu vəziyyətə tab gətirə bilməyib dedi:

Möhtərəm cənab, siz allah, bir mənə izah edin görüm, bu nə olan şeydir? Məni şübhədən çıxarın; onu da bilin ki, mən hər bir təhlükəyə, hər bir bədbəxtliyə dözə bilərəm. Bura haradır, niyə məni bura gətirmişlər? Əgər mən sərbəstəmsə, bəs bu dəmir barmaqlıq, bu qapılar nə üçündür? Yox, əgər mən dustağamsa, onda deyin görüm mənim günahım nədir?

Xanım, siz, sizin üçün müəyyən edilən otaqdasınız, mənə buyruq verilmişdir ki, sizi gəmidən götürüb bu qəsrə gətirim. Mən də, elə bilirəm ki, bir əsilzadə nəzakəti ilə bu əmri yerinə yetirdim. Bununla da hal-hazırda sizin haqqınızda mənim üzərimə qoyulan vəzifə qurtarmış olur. Qalanları daha mənə aid deyil, başqa bir adamın işidir.

Miledi soruşdu:

Bu başqa adam dediyiniz kimdir? Onun adını mənə söyləyə bilməzsinizmi?

Bu anda dəhlizdə mahmız cingiltisi və bir neçə adam səsi eşidildi; sonra bu səslər kəsildi, ancaq qapıya sarı gələn bir adamın ayaq səsi eşidilməyə başladı.

Zabit hörmət və itaətlə qapıdan qırağa çəkilib dedi:

Xanım, başqa adam dediyim bax, odur!

Bu anda qapı açıldı, astanada bir adam göründü.

O şlyapasız idi; belində də qılınc vardı; əlindəki yaylığı əzişdirirdi.

Miledi elə bil qaranlıqda gördüyü bu kölgəni tanıdı. Əllərini kresloya dayayaraq diqqətlə ona baxdı.

İçəri girən adam yavaş yavaş lampa işığına yaxınlaşdıqca miledi də qeyri-ixtiyari geri çəkilirdi.

Elə ki, bu adamın kim olduğunu qəti tanıdı, heyrət içində dedi:



Necə?! Lord Vinter? Sizsiniz?

Lord Vinter yarı nəzakət və yarı istehza ilə onu salamladı:

Bəli, gözəl xanım. Özüdür ki, var.

– Demək bu qəsr də...

– Mənimdir

Bu otaq da..

Sizindir.

Demək mən sizin əsirinizəm?

– Elə buna oxşar bir şeydir

Bu ki, dəhşətli bir zorakılıqdır!

- Gurultulu sözlər nəyə lazım? Oturaq qardaş-bacı kimi sakitcə danışaq.

Dönüb qapıya tərəf baxdı: gənc zabit onun əmrini gözləyirdi.

Təşəkkür edirəm! Cənab Felton, indi gedə bilərsiniz.

## XX

## QARDAŞLA BACININ SÖHBƏTİ

Lord Vinter qapının açarını burdu, pəncərə taxtalarını örtüb, öz stulunu miledinin kreslosu yanına çəkdi. O, bunları edirkən miledi düşünür, bu məsələni özünə aydınlaşdırmağa çalışırdı. Nəhayət, məsələnin əsil səbəbini təyin edə bildi: kimin əlinə düşdüyünü bilməyincə bu heç onun ağlına da gəlməzdi. O, öz qaynını həqiqi bir əsilzadə, ehtiraslı bir ovçu, cəsarətli bir qumarbaz, qadınsevən və intriqaya qabil olmayan bir adam kimi tanıyırdı. "Bəs o, haradan mənim buraya gəldiyimi bilib məni tutdura bilmişdir?"

Doğrudur, Atosun söylədiyi sözlər göstərirdi ki, onun kardinalla olan söhbətini başqaları da eşitmişlər. Lakin buna qarşı belə tez, belə bir cəsarətlə tədbir görüləcəyini heç ağlına sığışdıra bilmirdi. O, daha çox, İngiltərədə bundan əvvəl gördüyü işlərin üstünün açılmasından qorxurdu. Hersoq duya bilərdi ki, brilyant pərəkləri o kəsmişdir; lakin o, bir qadın haqqında, xüsusilə o qadının qısqanclıq hissilə hərəkət etdiyini bildiyi halda, zərrə qədər də zorakılıq etməzdi, buna qabil də deyildi.

Bu son ehtimal ona daha düzgün göründü. O, elə təsəvvür edirdi ki, keçmiş işləri üçün ondan qisas almaq istəyirlər. Hər halda başqa-

sının deyil, öz qaynının əlinə düşməsi onu sevindirdi. Bu adamın əlin dən yaxa qurtarmaq ona daha asan görünürdu; lakin o, hiyləgər və ağıllı düşmən əlinə düşsəydi bu, daha çətin başa gələrdi.

Miledi şən bir halda dedi:

Buyurun, qardaş, oturaq, danışaq. – O, lord Vinterın sırr verməyən bir adam olduğunu bılirdi, bununla belə, o, söhbət içində ondan lazımi məlumat qoparmaq fikrində ıdi: bu məlumatlar ona görəcəyı işlər üçün lazımdı.

Lord Vinter:

Deməк, siz İngiltərəyə qayıtdınız, – dedi. Bızım qərarımızın əksinə olaraq qayıtdınız. Siz axı Parisdə həmişə mənə söylərdiniz ki, bir də mənim ayağım Böyük Britaniya torpağına dəyməyəcək, bəs necə oldu ki, gəldiniz?

Mıledi suala sualla cavab verdi:

Hər şeydən əvvəl mənə deyin görüm; nıyə siz məni belə dıqqətlə təqib edirdiniz? Mənim hansı gündə, hansı saatda bura gələcəyimi sızə kım xəbər vermişdir?

Lord Vinter miledinin suala sualla cavab vermək üsulundan istifadə etdıyını görüb, bunun ən yaxşı bir üsul olduğunu zənn etdı, o da bu yolla hərəkət etməyi lazım gördü.

Əziz bacım, siz əvvəl bir mənə söyləyin görüm, İngiltərəyə niyə gəlmisiniz?

Mən sızinlə görüşməyə gəldim. – Bu yalanla qaynının hüsn-rəğbətini qazanmaq istəyirdi; lakin bununla o, d'Artanyanın məktubu ilə qaynının fikrində doğan şübhələri nə dərəcədə artırdığını bılmirdi.

Vinter tutqun halda dedi:

Mənimlə görüşməyəmi?

– Bəli, sizı görmək ıstəyirdim. Burada təəccüblü nə var ki?

Demək, sizin məni görməkdən ayrı bir arzunuz yoxdur?

Xeyr.

Bircə elə məni görmək üçün Lamanşı keçərək buraya gəlmək əziyyətinə qatlaşmısınız?

– Bəli, bircə elə sizi görmək üçün.

Siz nə mehriban bacı imişsiniz!

Miledi ürəyı riqqətə gətirən sadəlövhcəsinə bir ifadə ilə soruşdu:

Mən sizin ən yaxın qohumunuz deyiləmmi?

Lord Vinter düz onun gözünün içinə baxıb dedi:



Hətta yeganə varısimsiniz, elə deyilmi?

Miledi özünü nə qədər yaxşı ələ alsa da, bu sözü eşitcək qeyri-ixtiyari diksındi, lord Vinter son sözləri söylərkən əlini onun çiyninə qoyduğundan bu diksınməni hıss etdi.

Doğrudan da, onun endirdıyi zərbə həm qüvvətli, həm də lap yerinə dəymişdi. Miledinin ilk ağlına gələn fikir bu oldu ki, onu Ketti satmışdır. O hətta qaynını ölümdən xilas etdıyi üçün d'Artanyana qəzəblə və ehtiyatsızcasına hücum etdıyini də xatırladı.

Miledi qarşısındakı düşməni danışdırmaq və ürəyindəkini bilmək məqsədilə dedi:

Milord, sizin nə demək istədiyinizi mən anlaya bilmirəm. Sizin sözlərinizdə, deyəsən, başqa bir məna var?

Lord Vinter özünü qəsdən sadəlövhlüyə vurdu:

Yox, yox! Başqa heç bir məna yoxdur. Siz məni görmək istəyirsiniz, bu arzu ılə də İngiltərəyə gəlirsiniz. Mən sizin bu arzunuzdan xəbərdar oluram, daha doğrusu, mən sizin belə bir arzuda olduğunuzu duyuram, sizi gəmidən sahilə çıxmaq əziyyətlərindən xılas etmək üçün zabitlərimdən birini sizin yanınıza göndərirəm. Sizin ixtiyarınıza bir kareta verirəm; zabit də sizi bu qəsrə gətirir; mən də ki, bu qəsrin komendantıyam, hər gün də buraya gəlirəm. Bizim bir-birimizlə görüşmək arzumuzu təyin etmək üçün sizə xüsusi bir otaq hazırlanmasını əmr edirəm. Məgər bunlar sizə, sizin mənə söylədiyınızdən daha artıq təəccüblümü görünür?

– Yox. Mənə ancaq təəccüblü görünən odur ki, mənim buraya gələcəyimi sizə xəbər verıblər.

Əziz bacım, bunu da lap adicə bir səbəbi var: məgər siz, sizin gəminin kapitanı reyddə durmazdan əvvəl limana girməyə icazə almaq üçün, bir balaca qayıqla gəmi jurnalını və mınıklərin siyahısını göndərdiyini görmədinizmi? Mən limanın komendantıyam; gəmi jurnalını gətirib mənə verdilər, mən də orada sizın adınızı gördüm. Onda mənim qəlbimin duyduğunu indi sız özünüz də şəxsən isbat etdiniz, yəni o məqsəd üçün ki, siz belə bir təhlükəli dəniz səfərinə çıxmısınız, hər halda bu dəniz səfəri ilin bu vaxtında çox yorucu olur, buna görə də mən öz hərb gəmimi sizin qabağınıza göndərdim. Qalanı da ki, sizin özünüzə məlumdur.

Miledi bildi ki, lord Vinter yalan deyir: bu, onu daha artıq qorxutdu.

- Qardaşım, biz axşamüstü limana girəndə sədd üstə duran Bekinhem hersoqu deyildimi?

O idi Hə, indi başa düşdüm: ona rast gəlməyiniz sizi qorxutmuşdur Siz elə bir ölkədən gəlmisiniz ki, orada yəqin Bekinhem hersoqu ilə çox maraqlanırlar Mən bilirəm ki, onun Fransaya qarşı gördüyü tədbirlər sizin dostunuz kardinalı çox narahat edir.

Miledi bərkdən dedi:

Mənim dostum kardinalı? Bunun da lord Vinterə məlum olması miledini çox təəccübləndirdi.

Baron etinasızcasına soruşdu:

– Yoxsa o, sizin dostunuz deyil? Əgər səhv edirəmsə, məni bağışlayın; mənə elə gəlirdi ki, o sizin dostunuzdur. Biz milord hersoqdan sonra danışarıq, amma indi ürəyi riqqətə gətirən bu söhbətimizdən uzaqlaşmayaq. Deyirsiniz ki, məni görməyə gəlmişsiniz, eləmi?

Bəli.

Yaxşı da! Mən də izah etdim ki, hər şey sizin ürəyiniz istəyən kimi düzəlmişdir. Biz hər gün görüşəcəyik.

Miledi dəhşət içərisində soruşdu.

– Mən burada çoxmu qalacağam?

– Bacı, yoxsa sizin otaqdan xoşunuz gəlmir? Sizə nə lazımsa tələb edin, mən sizin bütün arzularınızı dərhal yerinə yetirəcəyəm.

Mənim nə qulluqçu qızım, nə də nökərim var.

Xanım, bunlar hamısı olacaq. Ancaq siz mənə deyin görüm, birinci ərinizlə yaşadığınız zaman eviniz necə idi? Mən sizin qaynınız olsam da, evinizi belə düzəltdirərəm

Miledi qorxmuş halda lord Vinterə baxdı və qışqıraraq dedi:

- Mənim birinci ərim?

Bəli, birinci əriniz, özü də fransız idi. Mən qardaşımı demirəm. Əgər siz bunu yaddan çıxarmısınızsa, mən ona kağız yaza bilərəm, Allaha şükür, o hələ sağdır, bu məsələ haqqında lazımi məlumat verə bilər

Miledinin alnını soyuq tər bürüdü. Boğuq səslə:

Siz zarafat edirsiniz, dedi.

Baron ayağa qalxıb bir addım geri çəkildi·

– Olmaya mən zarafatçı adama oxşayıram?

Miledi kreslonun qoltuğunu əllərilə əsəbi halda sıxaraq dedi:

Onda siz məni təhqir edirsiniz!

Lord Vinter nifrətlə.

Sizi təhqirmi edirəm? dedi. – Yoxsa, xanım, doğrudan da, elə zənn edirsiniz ki, sizi təhqir etmək olar?



– Siz, möhtərəm cənab, ya sərxoşsunuz, ya da ki, dəli olubsunuz... Gedin buradan, mənim yanıma qadın göndərin.

- Bacı, qadınlar boşboğaz olurlar! Mən qulluqçu qızı əvəz edə bilmərəmmi? Belə olsa bütün bizim ailə sirlərimiz öz aramızda qalar.

Miledi bərkdən dedi:

Ədəbsiz! – Yay ilə hərəkətə gələn bir şey kimi, baronun üstünə atıldı; baron öz qılıncının dəstəsinə söykənərək onun hücum edəcəyini gözləyirdi.

Milord:

Hə! Mən bilirəm ki, siz adam öldürməyə adət eləmisiniz, dedi. - Ancaq bu başdan sizi xəbərdar edirəm ki, mən özümü müdafiə edəcəyəm.

Siz doğru deyirsiniz. Mənə belə gəlir ki, siz elə alçaqsınız ki, qadına əl qaldıra bilərsiniz.

Bəli, qaldıra bilərəm; çünki mənim buna əsasım var. məncə, mənim əlim sizin üstünüzə qaldırılan birinci kişi əli olmayacaqdır.

Baron əlini ağır-ağır qaldırıb miledinin sol çiynini göstərdi, onun barmaqları az qalırdı ki, qadının çiyninə toxunsun.

Miledi boğuq-boğuq nərildədi, adam üstünə atılmağa hazırlaşan qaplan kimi bucağa tərəf geri çəkildi.

Lord Vinter·

Nə qədər könlünüz istəyir nərildəyin! dedi. - Ancaq hücum etmək fikrinə düşməyin, yoxsa bu, sizə ancaq zərər yetirə bilər. Burada səyyah cəngavər yoxdur ki, sevdiyi gözəli əsir etdiyim üçün mənimlə dalaşmağa başlasın; lakin əvəzində elə bir hakim vardır ki, əri sağ ikən başqa bir adama ərə gedən həyasız bir qadının öhdəsindən gələ bilər. Bu hakim sizi cəlladın üstünə göndərər, cəllad da sizin sağ çiyninizi sol çiyninizə oxşadar!

Miledinin gözlərindən qəzəb ildırımları çaxırdı; lord Vinter onun qarşısında silahlı dursa da, yenə də qəlbinin dərinliklərində bir qorxu hiss edirdi. Bununla belə, get-gedə artan bir hiddətlə sözünə davam etdi:

– Bəli, mən bilirəm ki, qardaşım öləndən sonra siz onun irsinə sahib olan kimi, mən öləndən sonra da mənim irsimə sahib olmaq arzusundasınız. Siz məni öldürtmək üçün adam göndərə bilərsiniz; ancaq sizə məlum olsun ki, bu məsələ haqqında mən lazımi tədbirlər görmüşəm: mənim irsimdən bircə penni də sizin əlinizə keçməyəcək. Yoxsa sizin dövlətiniz azlıq edir? Yəqin bilin ki, qardaşımın xatiri

mənim üçün müqəddəs olmasaydı, mən sizi dövlət dustaqxanalarından birində çürüdərdim, ya Taybernə[1] göndərib matrosların əlinə verdirərdim. Lakin mən bunları etməyəcəyəm, siz də dinməz-söyləməz bu əsarətə dözməlisiniz. On beş ya iyirmi gündən sonra mən ordu ilə Laroşelə gedəcəyəm. Gedəndən bir gün qabaq bir gəmi gəlib sizi bizim cənub müstəmləkələrindən birinə aparacaq. Sizinlə, mənə sədaqətli olan bir adam da gedəcək. Bunu bilin ki, əgər siz İngiltərəyə qayıtmaq fikrinə düşsəniz, ya ümumiyyətlə, oradan qaçmaq istəsəniz, bu adam sizin başınızı əzəcəkdir.

Miledi ona diqqətlə qulaq asırdı.

Lord Vinter sözünə davam etdi:

– Bəli, siz bu qəsrdə qalacaqsınız. Bu qəsrin divarları qalındır, qapıları dəmir, barmaqlıqları möhkəmdır. Pəncərəsi də dənizə tərəf dir. Mənim adamlarım məndən ötrü canını verməyə hazırdır. Onlar bu otaq qapısını keşiyində durmuşlar. Onlar burada bütün gəliş-gediş yerlərini qoruyurlar. Siz hətta imkan tapıb həyətə çıxa bılsəniz də, bundan sonra üç dəmir barmaqlığı keçməli olacaqsınız. Çox qəti bir əmr verilmişdir: qaçmaq üçün bircə addım atsanz, bir əl hərəkəti etsəniz, ya bircə kəlmə söz söyləsəniz, dərhal sizi vuracaqlar. Sizi öldürsələr, eminəm ki, ədalətli ingilis məhkəməsi mənə təşəkkür edəcəkdir. Siz, deyəsən sakitləşdiniz, üzünüzdə yenə əvvəlki ifadə göründü; bu ifadə yenə də özünüzə güvəndiyinizi göstərir. Yəqin siz indi belə düşünürsünüz: "Mən zirək bır qadınam, bu on beş iyirmi gün ıçində bir yol tapa bilərəm. Mən son dərəcə agıllıyam, yenə də bir adam tapıb onu özümə qurban edərəm. On beş gündən sonra siz artıq mənı burada görə bilməzsiniz". Yaxşı da, əlınizdən gələni eləyin! Mən qayıdıb gələnə kimı buranın bir rəisi olacaq, - siz onu görmüsünüz. Siz əmin olmusunuz ki, o, verilən əmri yerinə yetirməyi bacarır; mən sizi yaxşı tanıyıram, yəqin ki, Portsmutdan buraya gələnə kimi yolda onu danışdırmaq istəmisiniz... Heç mərmər heykəl də onun qədər dinməz və ehtirassız ola bilməzdi. Sız öz füsunkar təsirinizin qüvvətini çoxları üzərində sınaqdan keçirmisiniz, həmişə müvəffəq olmusunuz. Bu dəfə də bu qüvvənizi sınayın, əgər müvəffəq olsanız, onda deyərəm ki, siz iblıssiniz.

[1] Taybern qədim London məhəlləsidir. Burada xalqın gözü önündə ekzekusıya (bədən cəzası) verilirdi.



Qapıya yaxınlaşıb qətı bır hərəkətlə onu açdı.

– Cənab Feltonu buraya çağırın. Mən onu sizə təqdim edım.

Otağa bir sakitlik çökdü. Ancaq bayırdan yavaş-yavaş irəliləyən addım səsi eşıdilirdi. Çox çəkmədi ki, yarıqaranlıq dəhlizdə bir adam göründü. Bizim tanıdığımız gənc leytenant qapı ağzında dayandı.

Lord Vinter ona müraciət edərək dedi:

Əziz Con, içəri girin, qapını da örtün.

Gənc zabit içəri girdi.

Baron sözünə davam etdı:

– İndi bu qadına baxın: o gəncdir, gözəldir, adamı yoldan çıxarmaq üçün o hər şeyə qadirdir. Gözəldir, lakin yırtıcıdır! Cəmısı ıyirmi beş yaşı olduğu halda, o qədər cinayət işlətmışdir ki, bizim məhkəmə arxivlərində bir il müddətində bu qədər cinayətə rast gəlmək olmaz. Gözəllik onun əlində adamları məhv etmək üçün bir vasitə olmuşdur. O, sizi də yoldan çıxarmağa çalışacaq; hətta sizi öldürmək də istəyəcək. Mən sızi, Felton, dilənçilik çəngəlindən çəkib qurtardım. Sızi leytenant etdim; mən bır dəfə sizi ölümdən də qurtardım, bunun necə bir şəraitdə olduğu sizin yadınızdadır. Mən yalnız sizın haminiz deyiləm, mən, eyni zamanda, sizin dostunuzam. Bu qadın mənim həyatıma sui-qəsd etmək üçün İngiltərəyə gəlmişdir. Mən bu ilanı tutmuşam: indi o mənim əlimdədır. Əziz dostum Felton Con, oğlum, sizdən xahiş edirəm kı, məni bundan qoruyun, xüsusilə özünüzü bu qadından qoruyun. Namusunuza and ıçin ki, onu cəza verilən günə qədər mühafizə edəcəksiniz. Con Felton, mən sizin verdiyiniz sözə arxayın oluram. Con Felton, mən sizin namuslu bir adam olduğunuza inanıram!

Gənc zabit milediyə nifrətlə baxaraq dedi:

Milord, and olsun sızin canınıza, sizin bütün arzularınıza əməl ediləcəkdir.

Miledi, artıq taleyə boyun əyməli olan bir qadın kimi, yazıq-yazıq oturmuşdu. Onun gözəl üzünə baxan elə zənn edərdi ki, dünyada daha bundan müti, bundan həlim bir qadın ola bilməz. Hətta bir az əvvəl onunla mübarizə etməyə hazırlaşan lord Vinter özü də onun qaplan təbiətli bir qadın olduğunu təyin edə bilməzdi.

Baron sözünə davam etdi:

O, heç vaxt bu otaqdan bayıra çıxmamalıdır, eşidirsinizmi, Con? O, heç kəsə kağız yazmamalı, heç kəsdən də kağız almamalıdır. O, sizdən başqa heç kəslə danışmamalıdır, sız də əgər iltifat etsəniz onunla danışarsınız.

Mən and içdim, milord, bu kifayətdir.

Siz isə, xanım, indi Allaha yalvarın, çünki insan məhkəməsi sizin haqqınızda öz hökmünü vermişdir.

Miledi başını endirdi, sanki o, bu hökmün təsirini hiss etmişdi.

Lord Vinter Feltona işarə edərək otaqdan çıxdı. Felton da onun ardınca çıxıb qapını bağladı.

Elə o saat da keşikçinin addım səsləri eşidildi

Miledi, açar yerindən baxıldığını zənn edərək, bir neçə dəqiqə eyni vəziyyətdə qaldı. Sonra yavaş-yavaş başını qaldırdı. Yenə onun üzünə təhdidedici dəhşətli bir ifadə çökdü. Qalxıb qapıya yüyürdü, pəncərəyə baxdı, sonra yenə əvvəlki yerinə qayıdıb kresloda oturdu və fikrə daldı.

## XXI

## ZABİT

Kardinal səbirsizliklə İngiltərədən məlumat gözləyirdi; lakin oradan gələn yeni xəbərlərin hamısı yenə əvvəlki kimi qorxulu və pis idi.

Laroşel bərk mühasirəyə alınmışdı; bu mühasirənin müvəffəqiyyətlə nəticələnəcəyinə şübhə edilmirdi, çünki lazımi tədbirlər görülmüşdü, xüsusilə mühasirəyə alınmış şəhərə bircə qayıq da buraxmayan sədd bu işə ayrıca bir əhəmiyyət verirdi.

Bununla belə, şəhər hələ uzun müddət özünü müdafiə edə bilərdi; bu isə kralın silahlı qüvvələri üçün böyük bir həqarətdi, kardinal da bu vəziyyətdən çox narazı idi. Doğrudur, kardinal həzrətləri XIII Lüdoviklə avstriyalı Annanın arasını vurmaqla daha məşğul olmurdu. Çünki bu iş görülüb qurtarmışdı. Lakin indi onun qarşısında cənab de Bassompyeri Anqulem hersoqu ilə barışdırmaq məsələsi dururdu.

Kralın qardaşına gəlincə o, ancaq mühasirəni başlamış, sona yetirilməsini isə kardinalın üzərinə atmışdı.

Şəhər, bələdiyyə rəisinin möhkəmliyinə baxmayaraq, təslim olmaq da istəmişdi. Hətta qiyam da qaldırmışdı; lakin bələdiyyə rəisi qiyamçıları dar ağacından asdırmışdı Bu cəza qiyamçılıq fikri ilə beyni qızan adamları ağla gətirdi. Laroşellilər acından ölməyi dar ağacından daha üstün tutdular; çünki ac qalmaq boğazdan asılmaq kimi



hələ doğrudan-doğruya ölmək deyildi, bir də ki, acından ölmək boğazdan asılmaq kimi birdən deyil, yavaş-yavaş olurdu.

Hersoqun laroşellilərə göndərdiyi qasidlər bəzən ələ keçirdi. Bunların mühakiməsi çox qısa olurdu: kardinalın bircə kəlmə "asın" deməsi ilə də məsələ bitirdi. Kralı edama baxmağa dəvət edərdilər. O da gələr, bu əməliyyatı bütün təfərrüatı ilə görmək üçün özünə yaxşı bir yer seçərdi. Belə şeylər onu bir az da olsa əyləndirər, mühasirənin uzun sürməsinə darılmağa qoymazdı. Lakin o, yenə də darıxardı, hər saat da Parisə qayıdacağından danışardı. Düşmən qasidləri və casusları edam edilməsəydi, kardinal həzrətləri nə qədər iş bacaran olsa da, çox çətin bir vəziyyətdə qalardı.

Günlər gəlib keçirdi. Lakin laroşellilər təslim olmurdu. Son ələ keçən qasiddən bir məktub tapdılar. Bu məktubda laroşellilər Bekinhem hersoquna şəhərin çox pis vəziyyətdə olduğundan yazırdılar. Ancaq məktubda: "On beş günə kimi bizə kömək göndərməsəniz, təslim olacağıq" sözləri yox idi. Məktub belə bir cümlə ilə qurtarırdı: "əgər siz on beş günə kimi köməyə gəlməsəniz, hamımız acından qırılacağıq".

Laroşellilər ancaq Bekinhem hersoquna ümid bağlayırdı. Əgər onlar hersoqa bel bağlamasaydılar, ruhdan düşər, mərdlik göstərə bilməzdilər, bütün ümidləri məhv olardı. Buna görə də kardinal İngiltərədən Bekinhem hersoqunun köməyə gəlməyəcəyi xəbərini səbirsizliklə gözləyirdi.

Şəhəri hücumla almaq məsələsi kral şurasında tez tez müzakirə edilirdi, lakin hər dəfə də bu son tədbir rədd edilirdi. Laroşel alınmaz bir qala kimi təsəvvür edilirdi. Hər iki tərəfdə də vuruşan fransızlar idi: kardinal çox yaxşı bilirdi ki, bu vuruşmada tökülən qanlar ölkəyə Varfolomey gecəsini xatırladacaqdır. İndi belə deyirlər ki, guya kardinal o zaman tərəqqi tərəfdarı olduğundan belə bir şeyə yol verə bilməzdi.

1628 ci ildə Laroşelin dağıdılması və üç dörd min huqenotun öldürülməsi 1572 ci il Varfolomey gecəsinə oxşayacaqdı. Lakin təəssübkeş bir katolik olan kral bu son tədbiri heç də pis bir şey hesab etmirdi; şəhəri mühasirəyə alan generallar isə belə bir tədbirin əleyhinə idilər. Onlar bu təklifi rədd edir, laroşellilərı ac qoymaqla Laroşel qalasını almaq mümkün olduğunu isbat edirdilər.

Miledi kardinalın sözündən çıxmasa da, kardinal ondan bir qədər qorxurdu; bu dəhşətli qadın ona gah bir ilan, gah da bir aslan kimi

görünürdü. Bəlkə də o gedib kardinala xəyanət etmişdir? Bəlkə də ölmüşdür? Kardinal onu yaxşı tanıyırdı: o, kardinalın xeyrinə, ya zərərinə işləsə də, kardınala dostluq, ya düşmənçilik etsə də, sakıt dura bilməzdi. Ancaq ciddi bir manеə onu hərəkətsizliyə məcbur edərdi. Kardinal buna tamamilə əmindı. Lakin belə bir maneə haradan ola bilərdi?

Bununla belə, kardinal miledinin sədaqətli olmasına da şübhə etmirdi. Hiss edirdi ki, bu qadının keçmişi çox dəhşətlıdir, bunu ancaq onun qırmızı mantiyası ilə gizlətmək mümkündür. Miledi ona sədaqətli idi, çünki yalnız kardinal onu hər bir təhlükədən qoruyur, ona kömək edirdi.

Bu qayda ilə kardinal, heç kəsdən kömək gözləmədən, təkbaşına müharibəni davam etdirməyi qət etdi, eyni zamanda o, gözəl bir təsadüf nəticəsində, belə bir köməyin gələ biləcəyinə də inanırdı. Məşhur səddi çəkdirməkdə davam edirdi: bu sədd Laroşel əhalisini acından qırmalı idi.

IV Henrix Parisi mühasirə edərkən, şəhərin divarı üstündən şəhər əhalisinə taxıl və başqa ərzaq atılmasını əmr etmişdi. Kardinal da qala divarı üstündən imzasız məktublar atdırırdı. Bu məktublarda laroşellilərə isbat etməyə çalışırdı ki, onların rəisi ədalətsiz, xudbin, zalım bir adamdır, çünki əhaliyə çörək paylamır, deyir ki, qoy arvadlar, uşaqlar, qocalar acından ölsünlər, təki qalanı müdafiə edən kişilərin qarnı tox, özləri də sağlam və möhkəm olsun.

Bu məktublar kişilərin də yadına salırdı ki, acından ölməyə məhkum edilən uşaqlar, arvadlar və qocalar onların uşaqları, arvadları, atalarıdır.

Məktublar gözlənilən təsiri buraxdı. Laroşel əhalisində bir çoxu kral ordusu ilə danışığa girişməyə hazırdı. Kardinal bu tədbirin müvəffəqiyyət qazandığını görür, özü-öz hiyləgərliyinə sevinirdi. Lakin bu zaman laroşellilərdən biri Portsmutdan gəlib kral ordusu mövqeyindən mühasirədə olan şəhərə girə bilmişdi. Bassompyerin, Şomberq və Anqulem hersoqunun sayıqlığına baxmayaraq, o buna necə müvəffəq olmuşdu, – bunu yalnız bir Allah bilir, hər halda bir nəfər laroşelli düz Portsmutdan gəlib öz şəhərinə daxil olmuşdu. O, Portsmutda böyük bir ingilis donanmasının azı səkkiz gündən sonra yola düşməyə hazır olduğunu öz gözü ilə görmüşdü. Bundan başqa, Bekinhem hersoqundan bir kağız da gətirmişdi, kağızda yazılırdı ki, bu yaxında Fransa əleyhinə böyük bir ittifaq bağlanacaq, Fransa krallığına



eyni zamanda həm ingilis, həm Avstriya, həm də İspaniya qoşunları hücum edəcəkdir. Bu məktub hər yerdə açıqca oxunurdu: məktubun surəti çıxarılıb divar tinlərinə də yapışdırılmışdı. Bunu nəzərə alaraq, hətta düşmənlə danışığa girişmək istəyənlər də böyük bir təntənə ilə vəd edilən köməyi gözləməyi qət etdilər.

Bu gözlənilməyən hadisə yenə də Rişelyeni narahat eləməyə başladı, yenə də onu İngiltərə sahillərinə tərəf nəzər salmağa məcbur etdi.

Lakin kral ordusu öz kefində idi; yeganə və əsl başçıları olan kardinalın qorxu və həyəcan keçirdiyi onların heç vecinə də deyildi. Düşərgədə ərzaq bol idi, puldan da korluq çəkmirdilər. Hərbi hissələr qoçaqlıq göstərmək, şən əyləncələr düzəltməkdə bir-biri ilə bəhsə girişmişdilər. Casus tutub dar ağacından asmaq, sədd ətrafında və dənizdə təhlükəli əməliyyatlar düzəltmək, boş-boş şeylər uydurub, sonra da onu soyuqqanlılıqla yerinə yetirmək – uzun görünən günləri qısaltmaqda orduya kömək edirdi; günlər, aclıq və qorxu içində yaşayan laroşellilərə də, hətta laroşelliləri böyük bir qətiyyətlə mühasirəyə alan kardinala da uzun görünürdü.

Kardinal adi bir süvari kimi at üstdə gəzər, ağır-ağır irəliləyən işlərə düşüncəli nəzərlə baxardı; onun əmri ilə görülən bu işlərə, Fransanın hər yerindən gətirilmiş mühəndislər başçılıq edərdi. Bəzən o, belə gəzintilərində de Trevilin muşketyorlarına rast gələr, yaxınlaşıb diqqətlə onlara baxardı, bu adamlardan heç birinin bizim dostlarımızdan olmadığını görüb yenə də uzaqlaşardı.

Bir gün də, iki zabitlə bərabər gəzməyə çıxmışdı. O, bərk darıxırdı; mühasirəyə alınmış şəhərin danışığa girəcəyindən ümidini kəsmişdi. İngiltərədən də heç bir xəbər alınırdı. O, atını addım-addım sürərək okeanın qumlu sahili ilə irəliləyirdi. Bir təpə üstünə qalxanda gördü ki, bir az aralıda, çəpər dalında yeddi adam qum üstə uzanmışdır, yan-yörələrində də boş şüşələr var. Onlardan dördü bizim muşketyorlar idi: təzəcə aldıqları məktubu oxuyurdular. Bu, elə əhəmiyyətli bir məktub idi ki, onlar kart oyununu yarımçıq qoyub, məktubu oxumaq üçün, bu boş sahilə gəlmişdilər.

Üç nəfəri də böyük, üzü toxunma Kalliur şərabı şüşəsini açmaqla məşğuldu; bunlar muşketyorların xidmətçisi idi.

Yuxarıda dediyimiz kimi, kardinalın ovqatı çox təlxdi, belə hallarda da onu ən çox acıqlandıran şey – başqalarının kef çəkməsi idi.

O, həmişə elə zənn edirdiki, özgələrinin şadlığına onun dərdı səbəb olur. Atdan düşüb bu şübhə oyadan dəstəyə yaxınlaşdı. Çəpər onu görünməyə, qum da ayağının səsini eşidilməyə qoymurdu. O, muşket yorların danışığına gizlicə qulaq asmaq fikrində idi. D'Artanyanın səsini eşidəndən və muşketyorların mundirlərini görəndən sonra yəqin etdi ki, o birilər də qaskoniyalının ayrılmaz dostlarıdır, yəni Atos, Portos və Aramisdır.

Onların kim olduğunu bıldikdən sonra, söhbətlərinə qulaq asmaq arzusu daha da artdı. Onun gözlərində qərıbə bir ıfadə göründü; pişik kimi səssizcə hasarın dibinə gəldi. Birdən uca bir səs eşidıb diksindi.

Qrimo qışqıraraq dedi:

– Zabit!

Atos hirsləndi:

Axmaq, sən deyəsən, danışdın? O dirsəyı üstə qalxaraq parıldayan gözlərini Qrimoya zillədi. Qrımo daha bırcə kəlmə də söz demədı; ancaq şəhadət barmağı ilə çəpər tərəfi göstərdı: bununla da kardinalın və yanındakıların gəldıyını bildirdı.

Muşketyorlar cəld ayağa qalxıb hörmətlə təzim etdilər.

Kardinal, gəlişinin duyulduğundan son dərəcə acıqlandı:

Deyəsən, cənab muşketyorlar yan-yörələrınə qarovul qoyurlar? Olmaya bu cənablar ingilisləri qurudan gözləyırlər? Bəlkə muşketyorlar ozlərini baş zabit hesab edirlər?

Atos özünə xas olan həqiqi bir əyan soyuqqanlılığı ilə dedi:

– Monsinyor, muşketyorlar qulluqdan sonra içir və aşıq-aşıq oynayır. Öz xidmətçiləri üçün onlar çox yüksək rütbəli zabitdirlər

Kardinal deyinə-deyinə:

– Öz xidmətçiləri!.. Bir adamın gəldiyini gorən kimi oz ağasına xəbər vermək əmrini alan xidmətçi artıq xidmətçi deyil, keşikçidir, dedi.

– Monsinyor, özünüz görürsünüz ki, belə bir xəbərdarlıq olmasaydı, biz sizə qarşı olan hörmətımizi nəzərə çatdıra bilməzdik, göstərdiyiniz iltifata qarşı öz təşəkkürümüzü ızhar etməyə müvəffəq olmazdıq, - sonra d'Artanyana sarı dönüb dedi:

– D'Artanyan, siz indıcə monsinyora öz təşəkkürünüzü bildirmək arzusunda olduğunuzu söyləyırdiniz. Fürsət ələ düşmüşkən bundan istifadə edın.

D'Artanyan yaxına gəlib öz təşəkkürünü bildirmək üçün danışmağa başladı, lakin kardinalın sərt baxışlarını görüb susdu.



Kardinal Atosun kinayəli sözlərini eşitməmiş kimi dedi:

Hər necə olsa da, cənablar, mənim heç xoşuma gəlməz ki, adi əsgərlər, ımtıyazlı hissələrdə qulluq edirlər deyə, özlərini təşəxxüslü əyan yerınə qoysunlar: nizam intizam hamı üçün birdir.

Atos razılıq əlaməti olaraq baş əydi:

– Mən əmınəm kı, monsinyor, biz nizam intızamı pozmamışıq. Bız bu saat qulluqda deyilik, elə düşünürdük ki, boş vaxtımızı könlümüz istədiyı kimi sərf edə bılərık. Əgər kardinal həzrətləri iltifat buyurub öz əmri ilə bizi şərəfyab etmək istəsə, biz bu əmrə tabe olmağa hazırıq.

Kardinalın sözləri Atosa get-gedə daha artıq təsir etdiyindən onun səbri tükənirdı; buna görə də qaşqabağını tökərək sözünə davam etdi:

Monsinyor özü görür ki, biz silahımızı da özümüzlə götürmüşük: xırdaca bir həyəcan baş verən kimi hazır olacağıq. Bunu deyib yerdə baş-başa qoyulmuş dörd muşketi kardinala göstərdi.

D'Artanyan da bu sözləri əlavə etdi:

– Əgər bilsəydik kı, belə bir kiçik məiyyətilə bizim yanımıza gələn monsinyor özüdür, onda biz qabağınıza çıxardıq.

Kardinal dodağını və bığını çeynəyirdi.

O soruşdu:

– Siz ki belə yaraqlı yasaqlısınız və ətrafınıza da keşikçi qoymusunuz, bu halda siz sui-qəsdçilərə oxşadığınızı bilirsinizmi?

Atos onun sualına belə cavab verdi:

Tamamilə doğrudur. Biz sui–qəsd hazırlayırıq, ancaq laroşellilərə qarşı.

Kardinal da qaşqabağını tökərək dedı:

– Cənab siyasətcilər, yəqin ki, sizin beyninizdən çox-çox sirlər tapmaq olardı, – əgər sizin beyninizi, mən yaxınlaşarkən gizlətdiyiniz məktub kimi, oxumaq mümkün olsaydı.

Qan Atosun beyninə vurdu. O, bir addım kardinala sarı irəlilədi.

– Monsinyor, bundan elə başa düşmək olar ki, siz doğrudanda bizim sui-qəsd düzəltdiyimizdən şübhələnirsiniz, bunun üçün də bizi sorğu -sual edirsiniz. Əgər belə isə, onda qoy monsinyor iltifat buyurub bunu bizə izah etsin, biz də heç olmasa nədə müqəssir olduğumuzu bilək.

Kardinal dedi:

– Bəlkə də elə bu, doğrudan da, sorğu-sualdır? Cənab Atos, başqaları belə sorğu-suala tutulmuş, cavab da vermişlər.

Buna görə də mən monsinyora ərz etdim ki, biz sorğu-suala cavab verməyə hazırıq.

Cənab Aramis, oxumağa hazırlaşdığınız, məni görərkən gizlətdiyiniz məktub nə məktubdur?

- Monsinyor, bu məktubu bir qadın yazmışdır.

Bəli, bəli, mən başa düşürəm: qadın məktubunu başqasına oxumaq yaxşı deyil. Lakin belə bir məktubu ruhani ataya göstərmək olar: siz ki mənim ruhani olduğumu bilirsiniz.

Atos bu anda ölüm təhlükəsi qarşısında idi, buna görə də özünü sakit tutmaq ona çox ağır görünürdü·

– Monsinyor, bəli. Bu məktub bir qadından alınmışdır, ancaq o qadın nə Marion delormdur, nə də xanım d'Egilyon.

Kardinal meyit kimi ağardı; gözlərində ildırımlar çaxdı. O, öz zabitlərinə sarı döndü. Atos bunu görüb tüfənginə tərəf yönəldi. Onun dostları da gözlərini öz tüfəngindən çəkmirdilər, aydın görünürdü ki, onlar yaxalanmalarına yol verməyəcəklər. Kardinalla zabitlər üç adam idi. Əgər xidmətçilər də hesaba alınsaydı, muşketyorlar tərəfindən yeddi adam vardı. Demək, dəstələrin gücü bir bərabərdə deyildi. Bu rası da var ki, kardinal muşketyorların sui qəsd hazırladıqlarını yəqin etmişdi və buna qarşı bir tədbir görəcəkdi. Lakin muşketyorların fikrini duyub o saat hərəkətini dəyişdi. Hiddəti dərhal soyudu, üzünə geniş bir təbəssüm yayıldı:

Yaxşı, yaxşı, siz igid, məğrur və sədaqətli cavanlarsınız! Siz ki özünüzü belə qoruyursunuz, mən bunda heç bir şey görmürəm, çünki siz başqalarını bundan da yaxşı qorumağı bacarırsınız. Cənablar, məni "Qızıl Göyərçin hini" meyxanasına yola saldığınız gecəni unutmamışam. Əgər qarşıda bir təhlükə olsaydı. Mən sizdən xahiş edərdim ki, mənimlə bərabər gedək. Lakin yollar qorxulu deyil, siz qalın, şərabınızı için, aşıq-aşıq oyununuzu qurtarın, məktubunuzu da oxuyub başa yetirin. Cənablar, salamat qalın!

Zabitin gətirdiyi ata mindi, muşketyorlara əli ilə salamat qalın edib yola düşdü.

Dörd cavan heç bir söz söyləmədən onu gözlərilə yola saldı. Sonra da dönüb bir-birinə baxdılar. Onlar hamısı dərin bir həyəcan içində idi. Kardinal dostcasına salamatlaşıb getsə də, onlar bu adamın çox bərk acıqlandığını bilirdilər.



Yalnız Atos nifrətlə, həm də amiranə bir tərzdə gülümsəyirdi. Portos isə öz acığını tökmək üçün bir adam axtarırdı: buna görə də kardinal xeyli uzaqlaşandan sonra çığıraraq dedi:

– Kardinalın gəlməsini Qrimo bizə gec xəbər verdi!

Qrimo özünü müdafiə etmək üçün nə isə demək istədi, lakin Atosun barmaq qaldırdığını görüb bircə kəlmə də danışmadı.

D'Artanyan soruşdu:

Aramis, kardinal istəsəydi siz məktubu verərdinizmi?

Aramis könüloxşayan səslə dedi:

– Əgər, o məktubu istəsəydi, mən bir əlimlə kağızı verər, o biri əlimlə də qılıncı qarnına soxardım.

Atos:

Mən də bunu bilirdim, ona görə də söhbətə qarışdım, dedi. Əslində kardinal belə danışıqla çox böyük ehtiyatsızlıq edirdi. Görünür bu vaxta kimi o ancaq arvad-uşaqla qarşılaşmışdır.

D'Artanyan:

Əzizim Atos. Mən sizə heyranam, - dedi, ancaq əslinə qalanda biz haqlı deyildik.

Atos dedi:

Necə haqlı deyildik? Bizim tənəffüs etdiyimiz bu hava kimindir? Bizim gözümüz önündə olan bu okean, üstündə uzandığımız bu qum kimindir? Sizin sevgilinizin göndərdiyi məktub kimindir? Kardinalınmı? And olsun namusuma, bu adam elə bilir ki, bütün dünya onundur. Siz özünüzü tamam itirmişdiniz, onun qabağında yazıq-yazıq durmuşdunuz, gendən baxan elə zənn edərdi ki, nəhəng bir meduza sizi daşa döndərmək istəyir. Bir mənə deyin görüm: sevilmək, sui-qəsd düzəltməkmi deməkdir? Siz, kardinalın həbs etdiyi bir qadını sevirsiniz; siz onu kardinalın əlindən qurtarmaq istəyirsiniz; siz bu kardinal cənabları ilə oyun oynayırsınız; bu məktub sizin əlinizdə bir kozırdır; niyə axı bunu açıb düşmənə göstərəsiniz? Oyunu belə oynamırlar. Bacarırsa, qoy o, özü bunu bilsin! O, öz kartını açıb bizə göstərirmi? Bunu biz özümüz öyrənirik.

D'Artanyan:

- Bəli, Atos, siz nə söyləyirsinizsə, hamısı doğrudur, – dedi.

Elə isə bu barədə bircə kəlmə də danışılmasın. Qoy Aramis öz əmisi qızının məktubunu oxusun, özü də kardinalın gəlişilə dayandığımız yerdən başlasın.

Aramis məktubu cibindən çıxartdı; dostları da ona yaxınlaşdılar Xidmətçilər yenə şərab şüşələrinin başına yığışdılar.

D'Artanyan:

– Siz ancaq bir-iki xətt oxumuşdunuz, – dedi. Başdan başlasanız yaxşı olar.

Aramis:

- O da göz üstə, – deyib məktubu oxumağa başladı.

*"Mənim əziz əmioğlum, deyəsən mən bu yaxında bacımın bizim kiçik qulluqçunu göndərdiyi Steneyə gedəcəyəm. O, Karmelitlər monastrında yaşayır. Yazıq qız öz taleyinə boyun əydi; o bilir ki, başqa heç bir yerdə öz ruhunu xilas edə blməyəcək və bu cəhətdən təhlükə qarşısında olacaqdır. Bunu da deyim ki, əgər bizim ailə işlərimiz arzu etdiyimiz şəkildə düzəlsə, onda qız da öz ruhunu məhv etməli olsa da, həsrətini çəkdiyi adamın yanına qayıdacaqdır. O bilir ki, həmişə onu düşünürlər! Hələ ki, çox da bədbəxt deyildir. O ancaq bir şey istəyir: öz sevgilisindən məktub almaq! Mən bilirəm ki, belə şeylər monastırın dəmir barmaqlıqları arasından asanlıqla nüfuz etmir. Lakin, əziz əmioğlum, mən belə tapşırıqların öhdəsindən gələ biləcəyimi sizə isbat etmişəm. Bacımı həmişə hörmətlə xatırladığınız üçün sizə təşəkkürlər edir Bir vaxt o, çox bərk həyəcan keçirirdi, lakin indi bir qədər sakitləşmişdır, çünkı ınandığı adamı sizə məlum olan yerə göndərmişdir ki, baş verə biləcək hər bir hadisəni qabaqcadan öyrənə bilsin.*

*Əziz əmioğlum, sağlıqla qalın! Mümkün qədər tez-tez kağız yazın, yəni o zaman yazın ki, məktubun öz yerinə çatacağına əmin ola biləsiniz. Öpürəm sizi.*

*Aqlaya Mişon."*

D'Artanyan bərkdən dedi:

– Aramis, mən sizə çox-çox minnətdaram! Əzizim Konstansiya! Nəhayət, mən onun haqqında məlumat ala bildim. O sağ-salamatdır, monastırdadır, təhlükədən uzaqdır! Atos, Stene hansı tərəfdədir?

– Lotaringiyadadır, Elzasın sərhədindən bir neçə lye aralıda. Mühasirə qurtarandan sonra biz o tərəflərə gəzməyə gedə bilərik.

Partos da öz fikrini söylədi:

– Yəqin ki, mühasirə də tez qurtaracaqdır, çünki bu səhər də bir nəfər casus tutmuşlar; o deyir ki, laroşellilər öz çəkmələrinin meşinini yeyirlər. Belə güman etmək olar ki, onlar meşini yeyib qurtarandan sonra çəkmənin gönünə əl atacaqlar; bu da qurtarandan sonra bir-birini yeməkdən başqa ayrı əlacları qalmayacaq.



Atos stəkan dolusu gözəl Bordo şərabını içib dedi:

– Mənim o axmaqlara yazığım gəlir! Axı katolik dini dinlərin hamısından əlverişli və gözəl bir dindir. Hər necə olsa, onlar qoçaq adamdır. Aramis, siz nə edirsiniz? Məktubu cibinizə qoyursunuz?

D'Artanyan onun sözünə qüvvət verdi:

– Atos haqlıdır: məktubu yandırmaq lazımdır... Ancaq bircə yandırmaq kifayətdirmi? Bəlkə kardinal onun külünü də danışmağa məcbur etdi?

Atos:

Mümkündür, - dedi.

Portos onlardan soruşdu:

– Bəs siz bu kağızı nə etmək istəyirsiniz?

Atos Qrimonu çağırdı:

- Qrimo, bura gəl!

Qrimo gəldi.

Dostum, siz icazəsiz danışdığınız üçün bir cəza alaraq bu kağızı yeməlisiniz. Sonra da göstərdiyiniz bu xidmətə qarşı mükafat olaraq bir stəkan şərab içərsiniz. Əvvəl məktubu götürün, bir yaxşıca çeynəyin.

Qrimo gülümsədi, gözlərini şərab stəkanına dikərək məktubu çeynəyib uddu.

Atos:

Sağ ol, Qrimo, sən lap qoçaqsanmış ki! dedi. – İndi də şərabı iç. Yaxşı, yaxşı, təşəkkür etməyə bilərsən.

Qrimo stəkan dolusu Bordo şərabını başına çəkdi; onun göyə sarı qaldırılan gözləri sözsüz də nə demək istədiyini aydınca göstərirdi.

Atos sözünə davam etdi:

- İndi əgər kardinalın ağlına Qrimonun qarnını yırtmaq kimi dahiyanə bir fikir gəlməsə, elə bilirəm ki, biz arxayın ola bilərik.

Bu zaman kardinal öz melanxolik gəzintisinə davam edir və bığaltı öz-özünə deyirdi: "Bu dörd adam mütləq mənim olmalıdır".

## XXII

## BİRİNCİ GÜN DUSTAQDA

Biz nəzərimizi Fransa sahillərinə çevirməklə müvəqqəti olaraq miledini gözdən itirmişdik. İndi yenə də onun yanına qayıdaq. Biz ondan ayrılarkən o, ümidsiz halda ağır fikirlərə dalmışdı, xilas olacağına da az qala bütün ümidini kəsmişdi. İndi o, yenə də eyni vəziyyətdə idı. İlk dəfə olaraq şübhə onun qəlbinə yol tapa bilmişdi və ilk dəfə olaraq qorxuya düşmüşdü.

Xoşbəxtlik iki dəfə ondan üz çevirmişdi, iki dəfə onun sirri duyulub ifşa edilmişdi; bu müvəffəqiyyətsizliyin hər ikisinə də d'Artanyan səbəb olmuşdu.

D'Artanyan onun sevgisini ələ salmışdı, qürurunu təhqir etmişdi, şan şöhrət qazanacaq yerdə onu aldatmışdı; indi də onu azadlıqdan məhrum etmişdi, hətta həyatını da təhlükə altına almışdı; hələ bundan başqa, arxasında bir sipər kimi gizləndiyi və onu belə qüvvətli edən maskanın da ucunu bir balaca qaldırmışdı. D'Artanyan Bekinhem hersoqunu kardinalın endirdiyi qılıncdan yayındırmışdı; miledi isə, bütün əvvəl sevdiklərinə nifrət etdiyi kimi, hersoqa da nifrət edirdi. Miledi de Varda dərin ehtiras bəsləyirdi. D'Artanyan isə gecə de Vard adı ilə onun yanına girmişdi. D'Artanyan miledinin ən gözəl bir sirrini bilmişdi, halbuki bu sirri yer üzündə yaşayanlardan heç kəs bilməməli idi. Kardinalın əmri ona düşməndən intiqam almaq imkanını verirdi. Lakin bu əmr həyata keçiriləcək günün ərəfəsində onun əlindən alınmışdı. Nəhayət, yenə də həmin d'Artanyan onu bir əsir olaraq saxlayırdı, onu kürək cəzasına, ya Botanıbeyə[1], ya da Tayberna göndərə bilərdi...

Miledi son zamanda başına gələn bu hadisələrin hamısına d'Artanyanın səbəb olduğunu bilir, buna bir an da olsa şübhə etmirdi: ancaq o, miledini belə biabır edər, ancaq o, lord Vinterə miledinin sirrini açıb deyə bilərdi.

Nifrət miledinin ürəyini bir od kimi yandırırdı. O, odlu gözlərini otağın dərinliklərinə zilləyib sakitcə oturmuşdu. Hərdən onun sinəsindən boğuq fəryad qopur. Qayalara toxunan dalğaların səsi bu səsə

[1] Botanıbey limanı kapitan Kuk tərəfindən yalnız 1770-ci il-də kəşf edilmiş, daha sonralar sürgün yeri olmuşdur. Burada Duma tarixi təhrif etmişdir.



cavab verirdi. Onun qızmış beynində xanım Bonasyedən, Bekinhem hersoqundan və d'Artanyandan qisas almaq planları bir-birinin ardınca doğurdu.

Lakin qisas almaqdan ötrü azad olmaq lazımdı; azad olmaq üçün də divarı yarmaq, dəmir barmaqlıqları mişarlamaq, döşəməni sökmək gərəkdir. Bunu etsə etsə yenə də səbirli, qüvvətli bir adam edə bilərdi, lakin zəif bir qadın bunu bacarardımı? Bir də ki, bunun üçün aylar, illər lazımdı, halbuki onun əlində ancaq on-on iki gün vardı, – onu dustağa salan rəhmsiz və amansız lord Vinter özü də belə deyirdi.

O kişi olsaydı, azad olmaq üçün heç bir şeydən çəkinməzdi, ən cəsarətli, ən çılğın tədbirlərə əl atardı, bəlkə də bu yolla müvəffəqiyyət qazanardı. Niyə Allah səhv edib kişi ruhunu zəif və zərif arvad bədəninə qoymuşdur?

Dustağa düşəndən sonra ilk dəqiqələr ona çox dəhşətli göründü. Hirsindən onun bədəni əsir, özünü ələ ala bilmirdi. Lakin o, yavaş-yavaş bu çılğın hiddətinə qalib gəldi, vücudunu bürüyən əsəbi titrəyiş dayandı o, sakitləşib qüvvəsini toplamağa başladı.

Güzgüyə baxaraq öz-özünə dedi: "Belə bir ümidsizliyə qapılmaq özü ağılsızlıqdır. Hirslənmək heç lazım deyil; hirslənmək zəiflik əlamətidir. Əgər mən arvadlarla mübarizə etsəydim, qalib gələ bilərdim, çünki onlar məndən zəif olardı. Lakin mən kişilərlə mübarizə edirəm, onların qarşısında mən ancaq zəif bir qadınam. Mən də təbiətin qadınlara verdiyi silahla mübarizə edəcəyəm: mənim gücüm mənim zəifliyimdədir".

O, güzgü qabağında durub üzünə gah məsumluq, gah da əzab və iztirab ifadəsi verirdi; gah da onun üzündə zəif, füsunkar bir təbəssüm doğurdu. Sonra o, öz məharətli əli ilə saçının daranışını dəyişdirdi, – bu da onun gözəlliyini daha da artırdı. Ən axırda, özündən tamamilə razı qalmış halda, pıçıldayaraq dedi:

Heç bir şey itirməmişəm. Mən yenə də gözələm.

Axşamdı. Saat səkkizə az qalmışdı. Miledi çarpayıya baxdı; bir neçə saat yatıb dincəlsəydi bu onun fikrinə aydınlıq, üzünə də təravət verərdi. Lakin elə bu anda onun ağlına daha yaxşı bir fikir gəldi. O, axşam yeməyindən danışıldığını, eşitmişdi. Özü də bir saatdan çox idi ki, bu otaqda idi. Yəqin ki, yemək veriləcəyinə az qalmışdı. Miledi vaxt itirmək istəmirdi. Elə bu axşam şəraiti yoxlamaq, ətrafında olan adamların xasiyyəti ilə tanış olmaq qərarına gəldi.

Qapının altındakı yarıqdan işıq düşdü: dustaqxana xidmətçiləri gəlirdilər. Miledi cəld kresloda oturdu. Başını geri atdı, gözəl saçlarını açıb tökdü, bir əlini ürəyinin üstünə qoydu, o biri əlini də aşağı salladı.

Kilid açıldı. Qapı öz həncamaları üstə cırıldadı; otaqda ayaq səsləri eşidildi.

Felton:

Bu mizi ora qoyun,  dedi.

Onun əmri yerinə yetirildi

İndi şam gətirin və keşikçini əvəz edin

Gənc leytenant bu iki əmri bir adama vermişdi; miledi bundan belə nəticə çıxartdı: bir əsgər, eyni zamanda, həm ona qulluq edəcək, həm də onun keşiyini çəkəcəkdir.

Feltonun əmri müstəsna bir cəldliklə yerinə yetirilmişdi; bu isə burada gözəl bir nizam-intizam olduğunu göstərirdi.

Nəhayət, Felton milediyə baxdı.

– Hə, yatıb; yaxşı da. Duranda yeməyini yeyər.

Qapıya sarı yönəldi; bir neçə addım atmışdı ki, rəisi kimi möhkəm olmayan əsgər milediyə yaxınlaşaraq dedi:

Yox, cənab leytenant, bu arvad yatmayıb.

Felton soruşdu:

– Yatmayıb? Bəs nə edir axı?

Özündən gedib. Rəngi də ağappaqdır, nə qədər qulaq asıram da, nəfəs aldığını eşitmirəm.

Felton milediyə yaxınlaşmadan dedi:

Doğru deyirsiniz. Gedin, lord Vinterə söyləyin ki, əsir özündən gedib. Belə bir hadisə olacağı əvvəldən nəzər alınmamışdır, mən də bilmirəm ki, nə edim.

Əsgər zabitin əmrini yerinə yetirmək üçün otaqdan çıxdı.

Felton təsadüfən qapı ağzında qoyulmuş bir kresloda oturdu; heç bir hərəkət etmədən kirimişcə lord Vinteri gözləməyə başladı. Miledi göz qapaqlarını açmadan kirpikləri arasından baxmağı çox məharətlə bacarırdı. Üzü o tərəfə oturmuş Feltonu gördü. On dəqiqə gözünü ondan ayırmadı; bu vaxt içərisində Felton bircə kərə də dönüb ona baxmadı.

Bu vaxt onun ağlına belə bir şey gəldi: lord Vinter öz gəlişilə bu həbsxanaçıya yeni bir qüvvə verə bilər. İlk təcrübə bir müvəffəqiyyət vermədi. Miledi buna hələ ehtiyatda çox çox imkanları olan bir qadın kimi dözdü. Başını qaldırıb gözlərini açdı və yüngülcə bir ah çəkdi.



Felton ah səsini eşidib geri döndü:

– Xanım, ayıldınız ki? Elə isə daha mənim burada görüləsi bir işim qalmadı. Sizə bir şey lazım olsa zəng edərsiniz.

Miledi ahəngdar bir səslə pıçıldayaraq dedi:

– Ah Allah, Allah, mən necə iztirab çəkirdim!

Dikəlib kresloda oturduqdan sonra o daha gözəl və daha sərbəst bir vəziyyət aldı.

Felton ayağa qalxdı:

– Xanım, gündə sizə üç kərə yemək verəcəklər: bir səhər saat doqquzda, bir gündüz saat birdə, bir də ki, axşam saat səkkizdə. Əgər bu, sizin xoşunuza gəlməsə, saatların vaxtını dəyişə də bilərsiniz. Biz də sizin arzularınızı yerinə yetirməyə çalışarıq.

Miledi soruşdu:

– Yoxsa mən adama kədər verən bu böyük otaqda tək qalacağam?

– Qonşu kənddən bir qadın çağırılmışdır. O sabahdan qəsrdə olacaq, nə vaxt istəsəniz sizin yanınıza gələcəkdir.

Miledi sakitcə dedi:

– Təşəkkür edirəm.

Felton yüngülcə baş əyib qapıya sarı yönəldi. Bu zaman lord Vinterlə əsgər dəhlizdə göründülər. Onun əlində bir duz şüşəsi vardı.

Əsiri ayaq üstə görüb istehza ilə dedi:

Hə, nə var? Nə olmuşdu ki? Ölü dirilib ki! Felton, oğlum, məgər sən başa düşmədin ki, bu qadın səni xam hesab edib qabağında komediya oynamağa başlamışdır? Komediyanın bu birinci pərdəsidir. Heç şübhəsiz, biz bunun hamısını görmək iltifatına nail olacağıq.

Felton:

Milord, – dedi,  mən də bunu düşündüm,  ancaq bizim əsir hər necə olsa qadındır; yaxşı tərbiyə görmüş hər bir adam öz diqqətini qadından əsirgəməməlidir,  bu da onun xətri üçün deyil. Adamın ləyaqəti üçündür, buna görə mən də ona belə bir diqqət göstərmək istədim.

Miledi bu sözdən elə diksindi ki, bütün bədəni sarsıldı; sanki qanı damarlarında donub qaldı.

Vinter gülərək dedi:

Demək, məharətlə açıb tökülmüş saçlar, füsunkar solğun bəniz, xumar gözlər səni, daşqəlbli adamı yoldan çıxara bilmədi?

– Yox, milord. İnanın ki, qadının kələk və işvələri məni yoldan çıxara bilməz.

Elə isə, mənim igid leytenantım, qoy miledi bunun üçün başqa bir yol axtarsın, biz də gedək axşam yeməyini yeyək... Amma bunu da bil ki, bu qadın vəziyyətdən çıxmaq üçün yol tapmağı bacarır: komediyanın birinci pərdəsindən sonra tezliklə ikinci pərdəsini də oynayacaq.

Lord Vinter bu sözləri deyib, Feltonun qoluna girdi və gülə-gülə onu apardı.

Miledi dişlərini bir-birinə qıcıyaraq öz-özünə pıçıldadı:

"Bacarıqsız, yazıq rahib, bədbəxt mövhumatçı, öz mundirini əbaya çevirən əsgər, lap arxayın ol ki, səni cəlb etməyə bir yol tapacam!"

Vinter qapının astanasında dayanıb melidiyə dedi:

Qoy bu müvəffəqiyyətsizlik sizin iştahanızı pozmasın. Bu cücə ilə balığı yeyin, qorxmayın, and olsun namusuma, onlara zəhər qatılmamışdır. Mən öz aşpazımdan razıyam, o məndən irs gözləmədiyi üçün ondan lap arxayınam. Siz də mənim kimi edin. Sağlıqla qalın, əziz bacım! Ikinci dəfə özünüzdən gedəndə yenə görüşərik!

Miledinin əlləri əsəbi halda kreslonu qamarladı. O, gözlərini lord Vinterlə Feltonun ardınca bağlanan qapıdan ayırmırdı. Tək qalandan sonra yenə də onu dərin bir ümidsizlik bürüdü. Miz ustündə gördüyü bıçağı cəld götürdü; bıçaq yumşaq gümüşdən qayırılmışdı, ucu da dəyirmi şəkildə idi; bıçağın belə olması onu lap dilxor elədi.

Kip örtülməmiş qapı dalından qəhqəhə səsi eşidildi, qapı yenə də açıldı. Lord Vinter bərkdən dedi:

Hə! Bir bax, özün görürsən ki, mənim igid Feltonum, özün gö rürsən ki! Mən sənə nə deyirdim: bu bıçaqla, oğlum, o səni öldürərdi. Bilirsənmi, bu, onun zəif cəhətlərindən biridir: ona mane olan adamları o, hər necə olur-olsun rədd etməyə çalışır. Əgər mən sənin sözünə baxıb ona iti bıçaq verdirsəydim, indi Felton yox idi; o əvvəl səni, sonra da bizim hamımızı bu bıçaqla kəsərdi. Görürsənmi, Con, bıçaqdan o çox yaxşı istifadə edə bilir.

Miledi hələ də bıçağı əsəbi halda sıxdığı əlində tuturdu, lakin bu sözləri eşidəndən sonra əli boşaldı, bıçaq döşəmə üstünə düşdü.

Felton dərin bir nifrətlə dedi:

Siz haqlısınız, milord, siz haqlısınız, mən səhv etmişəm...

Onlar hər ikisi otaqdan çıxdı.

Miledi pıçıldayaraq dedi:



"Mən məhv oldum. Mən elə adamların əlinə düşmüşəm ki, onların ürəyini yumşalda bilməyəcəyəm. Onlar məni tanıyırlar, mənim bütün kələklərimə qarşı özlərini müdafiə edirlər. Lakin buna yol vermək olmaz ki, hər şey onların istədiyi kimi qurtarsın!.."

Miledi miz dalında oturdu, yeməyini yedi, bir az da İspaniya şərabı içdi, bütün əvvəlki qüvvəsinin geri qayıtdığını hiss etdi.

Yatmadan əvvəl, lord Vinterlə Feltonun söylədiyi sözləri, bütün hərəkətlərini xəyalında canlandırıb ətraflı surətdə tədqiq etdi; məharətlə edilmiş bu dərin və düzgün tədqiqatdan sonra bu nəticəyə gəldi ki, ona əziyyət verən bu iki adamdan az-çox yenə də Feltona batmaq olar. Lord Vinterin Feltona söylədiyi bu cümlə miledinin diqqətini cəlb etdi. Lord Vinter demişdi:

"Əgər mən sənin sözünə baxıb ona iti bıçaq verdirsəydim..."

"Demək Felton mənim haqqımda ondan bunu xahiş edibmiş. Bundan görünür ki, Feltonun azca da olsa mənə yazığı gəlir, onun qəlbində bir rəhm qığılcımı var.

Bu qığılcımdan mən elə bir yanğın törədərəm ki, bu yanğın onun özünü məhv edər. Lakin lord Vinter məni tanıyır, məndən qorxur, bilir ki, əgər mən onun əlindən qaçıb qurtarsam, işi əngəl olacaq. Buna görə, ona təsir etməyə çalışsam da, bir nəticə verməyəcək. Felton isə bir başqa. O, təmiz ürəkli, sadəlövh bir adamdır, özü də, deyəsən, xeyirxahdır. Onu ələ almaq olar".

Miledi bu duşuncələrdən sonra yerinə girib yatdı; onun dodaqlarında bir təbəssüm görünürdü. Onu bir adam yatmış görsəydi! O, yuxusunda bayram çiçəkləri çələngini görən gənc bir qıza oxşayırdı.

## XXIII

## İKİNCİ GÜN DUSTAQDA

Miledi yuxusunda gördü ki, d'Artanyanın edamında iştirak edir.

O, ilk ümid təskinliyilə yatan bir dustaq kimi yuxulayırdı.

Ertəsi gün otağına girəndə onu hələ də yatmış gördülər. Felton dəhlizdə durmuşdu. O, dünən dediyi qadını gətirmişdi. Qadın miledinin çarpayısına yaxınlaşıb soruşdu:

Xanım, nə qulluğunuz var, buyurun.

Miledı:

Mən qızdırmışam, – dedi. – Bırcə dəqiqə də yatmamışam. Gecə nə uzunmuş! Mən ağır iztirab içindəyəm... Əminəm ki, siz mənimlə, dünən məni incidən adamlar kimi deyıl, daha insancasına rəftar edəcəksiniz. Mən sizdən ancaq yataqdan qalxmamağa icazə verməyinizı xahış edirəm.

Qadın soruşdu:

Həkim çağırımmı?

Felton bu söhbəti eşidirdi, lakin bir kəlmə də olsun danışmırdı.

Mıledi soruşdu:

Hə, həkım çağırasınız? Həkim nəyə lazımdır? Dünən bu cənablar söylədı kı, mənım xəstəlıyım komediyadır. Onlar, yəqin kı, bunu həkimə də deyiblər, o da, şübhəsiz, onların sözünü təsdiq edəcəkdir.

Feltonun səbri tükəndı:

Elə isə, xanım, necə müalicə olunmaq istədiyinizi siz söyləyin.

– Ah, Allah, mən bunu heç bılirəmmi? Mən ancaq onu bılirəm ki, xəstəyəm.

Felton bu bitməz-tükənməz şıkayətdən yorulmuşdu. Qadına:

– Gedin, – dedi, – lord Vinteri çağırın.

Miledi çığıraraq.

– Yox, yox! – dedi. – Yox, yalvarıram sizə, onu çağırmayın! Mən özümü yaxşı hiss edirəm, mənə heç nə lazım deyıl, siz ancaq onu çağırmayın.

Bu sözlər elə odlu söylənmişdi ki, Felton otaqda bır neçə addım ataraq gəzindi.

Miledi bunu görüb düşündü: "Onun qəlbi riqqətə gəlmişdır".

Felton:

– Xanım, – dedi, – əgər siz, doğrudan da, xəstəsınızsə, həkim gəlsın, yox əgər özünüzü xəstəliyə vurursunuzsa, sizin üçün yaxşı olmayacaq, onda biz hər nə etsək, özümüzü haqlı hesab edəcəyik.

Miledi heç bir söz demədi. Gözəl başını balışa qoyub ağlamağa başladı.

Felton ona laqeydcə baxırdı; ağlamasının uzun sürəcəyini görüb otaqdan çıxdı; qadın da onun ardınca getdi. Lord Vinter gəlmirdi.

Miledı öz sevıncını başqalarından gizlətmək üçün döşəkağı ilə başını örtərək öz özünə pıçıldadı: "Deyəsən, bəzi şeyləri anlamağa başlayıram".



Iki saat da keçdi.

"İndi daha sağalmaq lazımdır, azarladığım bəsdır. Ayağa durub bu gün bir şey əldə etməyə çalışmalıyam. Mənim ixtiyarımda ancaq on gün qalır. Bu gün axşam iki gün tamam olur".

Səhər yeməyi hələ də miz üstə dururdu. İndi gəlıb onu yığışdıracaqdılar, miledi də yenə Feltonu görəcəkdi.

Miledi səhv etmirdi: Felton yenə də gəldi və üstündə yemək gətirilmiş mizin aparılmasını əmr etdı.

Mizi apardılar. Felton hələ getməmışdı. Onun əlində bir kitab vardı.

Miledi iztirab çəkən bir adam kımı, buxarı yanında kresloda məzlum-məzlum oturmuşdu: o gözəldi, kədərliydi, solğundu. Felton ona yaxınlaşdı:

Xanım, lord Vinter də sızın kimi katolikdir; o, belə düşünür ki, kilsənizin adət və ayinini icra etmək imkanına malik olmamanız bəlkə də sizin üçün ağır bır məhrumiyyət oldu, buna görə də o razılıq verdi ki, siz hər gün günorta ibadətinə aıd olan duaları oxuyasınız. Həmin dualar da bu kitabda vardır.

"Sizın günorta ibadəti" sözlərini söylərkən Feltonun üzündə doğan həqarətli təbəssümü miledi sezə bildi. Başını qaldırıb çox diqqətlə zabitə baxdı.

Onun adi bir qayda ılə daranmış saçlarından, paltarının sadəli yindən bildi kı, bu adam kral Yakovun sarayında tez-tez rast gəldiyi tutqun təbiətli puritanlardan[1] bıridir. Bırdən ona qəribə bir ilham gəldi. Bu hal ancaq, ınsanın bütün taleyi, bütün həyatı asılı olan dahı adamların böhranlı dəqiqələrində olur.

O, gənc zabitin səsində sezdiyi eyni həqarətlə ona dedi:

Günorta ibadətinə aid olan dualarımı? Pozğun əxlaqlı bir katolik olan Vinter çox gözəl bilır ki, mən başqa bir məzhəb sahibiyəm; o mənə kələk gəlmək ıstəyır

Felton gızlədə bilmədiyi bir təəccüblə dedi:

Xanım, bəs sız nə məzhəb sahibisiniz?

Miledi sünı bır həyəcanla bərkdən dedi:

[1] **Puritanlar** İngiltərədə XVI əsrın ıkinci yarısında meydana gəlmiş dıni hərəkatda iştirak edənlər. Purıtanların dını məfkurəsi kalvınizmin qüvvətlı təsırı altında törəmışdır. Tıcarət burjuaziyasının, varlı əkınçilərin nümayəndələri olan purıtanlar mutləqiyyətın qatı düşmənı olmuşlar. Onlar həyatda ozlərını duzgün bır adam, har hansı bir bezəyin, dəbdəbənin və sairənın düşməni kımı göstərırdilər.

– Mən bunu öz məzhəbimin qurbanı olanda söyləyəcəyəm.

Miledi bu sözləri söyləməklə çox şey qazandı. Gənc zabit susurdu, lakin onun gözləri qəlbindəkini sözdən daha gözəl ifadə edirdi.

Miledi yenə həyəcanla sözünə davam etdi:

– Mən öz düşmənlərimin əlindəyəm. Mən öz Allahıma ümid bağlamışam; mənim Allahım məni xilas edəcək, ya da mən onun yolunda məhv olacağam! Mənim cavabım budur və sizdən xahiş edirəm ki, mənim bu sözlərimi lord Vinterə yetirəsiniz. – Sonra o murdarlanmaqdan qorxmuş kimi, barmağı ilə dua kitabını göstərərək əlavə etdi: – Bu kitabı siz özünüzə götürə bilərsiniz. Heç şübhə yoxdur ki, siz lord Vinterin ikiqat şərikisiniz: həm adamı təqib etmək şəriki, həm də dinə zələlət qatmaq şəriki!

Felton heç bir söz demədi; kitabı götürüb getdi.

Axşam saat səkkizə az qalmışdı ki, lord Vinter gəldi. Miledi artıq nə edəcəyini ətraflı surətdə düşünmüşdü; özünü də tamamilə ələ ala bilmişdi.

Baron miledinin qarşısındakı kresloda oturdu, ayaqlarını etinasızca buxarıya sarı uzadaraq dedi:

– Deyəsən, biz öz məzhəbimizdən uzaqlaşmağa təşəbbüs etmişik.

– Möhtərəm cənab, siz bununla nə demək istəyirsiniz?

– Mən onu demək istəyirəm ki, bizim son görüşümüzdən sonra siz öz dininizə xəyanət etmisiniz. Yoxsa protestant olan üçüncü bir ərə getmisiniz?

Əsir qadın əzəmətli bir ifadə ilə dedi:

– Milord, izah edin. Mən sizin sözlərinizi eşidirəm, amma başa düşmürəm.

Lord Vinter istehza ilə:

– Deməli, siz heç bir dinə qulluq eləmirsiniz, – dedi, – bu, mənim daha artıq xoşuma gəlir.

Miledi soyuq bir tərzdə:

– Əlbət ki, – dedi, – bu, sizin prinsipinizə daha çox uyğundur.

– Etiraf edirəm ki, dini məsələlərdə mən heç bir prinsipə əsaslanmıram.

– Sizin əxlaqsızlığınız və cinayətləriniz bunsuz da sizin kim olduğunuzu açıb göstərir.

– Hə!.. Siz əxlaqsızlıqdanmı danışırsınız? Ya mən sizi pis başa düşürəm, ya da siz heç misli görünməyən həyasız bir qadınsınız.



Miledi yenə də soyuq bir tərzdə dedi:

– Siz bilirsiniz ki, bizə qulaq asan var, ona görə də belə danışırsınız. Bir də ona görə belə deyirsiniz ki, siz öz məhbəs xidmətçilərinizi və cəlladlarınızı mənim əleyhimə qaldırmaq istəyirsiniz.

– Öz məhbəs xidmətçilərinizi və cəlladlarınızı! Xanım, siz lap şair kimi danışmağa başlayırsınız və dünənki komediya da bu gün traqediyaya çevrilir. Səkkiz gündən sonra siz, sizin üçün müəyyən edilən yerdə olacaqsınız, onda mənim vəzifəm bitmiş olacaqdır.

Miledi, öz hakiminə qarşı meydan oxuyan günahsız adam kimi, həyəcanla dedi:

– Namussuzcasına bir vəzifə! İmansızcasına bir vəzifə!

Lord Vinter ayağa qalxaraq dedi:

– Sözün doğrusu, mənə elə gəlir ki, bu əxlaqsız qadın dəli olur. Xanım puritan, sakit ol, yoxsa əmr edərəm sizi dustağa salarlar.

Lord Vinter bunu deyib otaqdan çıxdı.

Felton, doğrudan da, qapı dalında imiş və bu söhbətin hamısını eşidibmiş.

Miledi bunu duydu.

Pıçıldayaraq öz qaynının dalınca dedi:

– Get, get! Bunun hamısının lap bu yaxında əvəzini çıxacağam. Axmaq adam, sən bunu başa düşüncə, iş–işdən ötmüş olacaq.

Otağa yenə də bir sakitlik çökdü.

İki saat keçdi. Xidmətçilər axşam yeməyi gətirdilər, gördülər ki, miledi bərkdən dua oxuyur. Bu duanın ona ikinci ərinin qoca bir xidmətçisi öyrətmişdi. O sanki dua oxuya-oxuya vəcdə gəlmişdi; ətrafında olan hadisələrə zərrə qədər də əhəmiyyət vermirdi. Felton işarə ilə bildirdi ki, ona mane olmayın; işlərini qurtardıqdan sonra, səssizcə, öz əsgərləri ilə bərabər, otaqdan çıxdı.

Miledi bildirdi ki, qapı dalında ona qulaq asan olar; buna görə də duaların hamısını oxudu. Ona elə gəldi ki, qapı ardındakı keşikçinin addımları başqa cür səslənməyə başladı: sanki o, lediyə qulaq asırdı. O, elə bunu istəyirdi. Miz dalında oturdu, bir az yemək yedi, üstündən də ancaq su içdi.

Bir saat sonra süfrəni yığışdırmağa gəldilər. Bu dəfə Felton əsgərin yanında deyildi. Deməli o, miledini tez-tez görməyə qorxurdu.

Üzündə doğan təbəssümü gizlətmək üçün divara sarı çevrildi. Onun qabiliyyətini göstərən bu təbəssüm sirrini aça bilərdi.

Yarım saat da gözlədi. Qəsrə dərin bir sakitlık çökmüşdü. Ancaq dalğaların arası kəsilməyən səsi, okeanın ucsuz-bucaqsız tənəffüsü eşidilirdi... O, öz təmiz, ahəngdar, titrək səsilə Zəburun birinci ayəsini oxumağa başladı; bu ayəni o zaman purıtanlar çox sevərdılər:

Deməк qüvvəmizi imtahan üçün,
Aman Allah, bızi atıb gedirsən!
Sonra da dərd çəkən hər insan üçün,
Mərhəməti özün bizə edirsən.

Miledi həm oxuyur, həm də qulaq asırdı Qapı dalında keşik çəkən əsgər, yerində donmuş kimi, birdən-birə dayandı Miledı daha ehtirasla oxumağa başladı. Ona elə gəlirdi ki, bu səs qəsrin tağları altında uzaqlara yayılır, cazibəli bir sehr kimi məhbəs xidmətçilərinin ürəyini yumşaldır.

Lakin təəssübkeş bir katolik olan keşikçi bu sehri pozaraq qapı ardından çığırdı:

– Xanım, kiriyin! Sizin səsiniz ölü üstündə oxunan dua kimi adama qüssə verir. Bu qarnizonun "Ürək açan" xidmətinə sizin bu dua oxumanız da əlavə olunsa, onda lap bizim işimiz bitər ki!

Feltonun sərt səsi eşidildi:

– Susun! Öz vəzifənizi yerinə yetirin, axmaq! Sizə buyurulubmu bu qadının oxumasına mane olun? Yox. Sizə əmr olunub ki, onun keşiyini çəkin və əgər qaçmaq istəsə, vurun. Elə də eləyin: onun qarovulunu çəkin, qaçmaq fikrinə düşsə öldürün. Lakin əmrdən kənara çıxmayın.

Sevinc ani bir ildırım kimi, miledinin üzünü işıqlandırdı. Lakin bu danışığı o, elə bil heç eşitmədi: səsinə iblisanə bir gözəllik və məftu niyyət verərək yenə də oxumağa başladı:

Acı göz yaşları, vuruşlar, hərblər,
Qaranlıq məhbəslər, paslı zəncirlər.
Əvəzində vardır gənclık, həm dua,
Bir də dərdimizə qalan bir Allah.

Görünməmiş bir qüvvətə malik olan və yüksək bir ehtirasla can lanan bu səs Zəburdakı kobud şerlərə sehrli bir gözəllık verirdi. Feltona elə gəlirdi ki, o mələk səsini eşidir. Miledi yenə də oxuyurdu·



Lakin o qurtuluş saatı gələr,
Ey Allah, bizi də o xilas edər.
Bizi iradəmiz aldatsa bir an,
Ancaq heç aldatmaz ölüm, şöhrət, şan.

Bu dəhşətli, füsunkar qadın bütün ruhunu bu şerdə ifa etməyə çalışırdı. Bununla da o, gənc zabitin qəlbini tamamilə alt üst edə bilmişdi. Felton sərt bir hərəkətlə qapını açdı, gəlib miledinin qabağında durdu; onun rəngi qaçmışdı, gözləri parıldayırdı.

– Niyə siz belə oxuyursunuz? Belə bir səslə...

Miledi mülayimcə dedi:

Əfv edin. Mənim oxumağımın bu evdə yersiz olduğunu unutmuşdum. Mən, bəlkə, də sizin dini hisslərinizi təhqir etmış oldum, ancaq, and olsun Allaha, mən bunu başqa bir məqsəd üçün etmədim. Taqsırım varsa, məni bağışlayın.

Miledi bu coşqunluq içində daha gözəl görünürdü Felton özünü itirmişdi, ona elə gəlirdi ki, indicə səsini eşitdiyi bu qadın mələkdir.

– Bəli, bəli, siz bu qəsrdə yaşayan adamları karıxdırırsınız, həyəcanlandırırsınız.

Yazıq Felton lap ağlını itirmişdi; nə dedıyini heç özu də yaxşı bilmirdi. Miledı iti nəzərlərilə onun qəlbinin lap dərinliklərinə soxulmaq istəyirdi.

O, mülayimcə və müti halda dedi:

- Mən daha oxumayacağam.

Yox, yox, xanım, oxuyun, ancaq belə bərk oxumayın. Xüsusilə gecələri...

Felton bu sözləri deyib tez otaqdan çıxdı.

Əsgər ona dedi:

Siz yaxşı etdiniz, leytenant Onun oxumağı adamın bütün ruhunu alt-üst edir: nə gözəl səsi var!

## XXIV

### *ÜÇÜNCÜ GÜN DUSTAQDA*

Felton tərəddüd edirdi. Miledi onunla təklikdə olmalı idi; onunla danışmaq üçün mütləq onun özünü danışmağa məcbur etmək lazımdı. Miledi füsunkar, ilahi bir səsə malik olduğunu bilirdi. O, zabitin hər bir hərəkətinə, sözünə, baxışına, hətta tənəffüsünə də diqqət etməyə başladı. Nəhayət, yeni rol götürən bacarıqlı bir aktyor kimi, Feltonu tamamilə öyrənə bildi.

Lord Vinterə qarşı olan əlaqəsində o, belə çətinlik hiss etmirdi. Öz-özlüyündə qət etdi ki, lord gələndə dinib-danışmasın, öz ləyaqətini qorusun; bəzən də qəsdən etinasızlıq göstərərək onu acıqlandırsın; həqarətli sözlərlə onu hədə-qorxu gəlməyə məcbur etsin, bunun da qarşısında özünü müti göstərsin. Miledinin planı bundan ibarətdi. Felton onun öz qaynı ilə görüşməsinin şahidi olmalı idi, bəlkə də o, *birco kəlmə də söz söyləməyəcəkdi. Lakin hər şeyi görəcəkdi.*

Səhər Felton yenə də gəldi; lakin miledi susurdu. Getməyə hazırlaşarkən o, elə bil danışmaq istədi. Ancaq cəsarət etmədi. Özünü zorlayaraq, demək istədiyi sözü ürəyində gizlətdi. Günortaya az qalmışdı ki, lord Vinter gəldi.

Gözəl bir qış günü idi; solğun İngiltərə günəşinin adamı qızdırmayan, lakin işıq saçan şüaları dustaqxananın pəncərə barmaqlığından içəri süzülürdü.

Miledi pəncərəyə baxırdı; özünü elə göstərdi ki, guya qapı açıldığını eşitmədi.

Lord Vinter:

Hə, dedi, – əvvəl komediya, bunun da ardınca tragediya oynadıqdan sonra indi də özümüzü malxulyaya vurmuşuq.

Əsir qadın heç bir söz söyləmədi.

Lord Vinter sözünə davam etdi:

Bəli, bəli. Mən başa düşürəm: siz çox istərdiniz ki, azad olasınız; siz istərdiniz ki, yaxşı bir gəmiyə minib bu fırtınalı dənizin zümrüd sularını yara-yara Fransaya gedəydiniz, siz istərdiniz ki, məharətlə qura bildiyiniz tələlərdən birini də quruda, ya suda mənə qurasınız. Səbir edin, səbir edin! Dörd gündən sonra sahil sizin ixtiyarınızda olacaq, dəniz öz sinəsini sizin qarşınızda, bəlkə də, sizin arzu etdiyinizdən daha geniş açacaq, çünki dörd gündən sonra İngiltərə yaxasını sizdən qurtaracaq.

*Miledi əllərini döşünə qoyub gözəl gözlərini göyə sarı qaldırdı* və bir mələk yumşaqlığı ilə dedi:

Allah, Allah! Sən də bu adamı mənim kimi əfv et!

Lord Vinter bərkdən:

– Dua et, məlun dedi. – Allaha dua et! Çünki sən elə adamın əlinə düşmüsən ki, o, heç vaxt səni əfv etməyəcək.

Lord Vinter otaqdan çıxdı.

Miledi yarıya qədər açılmış qapıdan ötərgi bayıra baxdı və Feltonu gördü; o, cəld qırağa çəkildi ki, miledinin gözündən yayınsın. Miledi bu zaman dizləri üstə düşüb Allaha yalvarmağa başladı:

– Allah, Allah! Sən özün bilirsən mən necə bir müqəddəs iş üstündə əzab çəkirəm. Bu əzaba tab gətirmək üçün mənə qüvvət ver!

Qapı yavaşca açıldı, Allaha yalvaran bu gözəl qadın, qapının açıldığını heç duymamış kimi, göz yaşı tökə-tökə:

Ey qisas alan Allah! Ey rəhmdil Allah! Yoxsa sən bu adamın öz dəhşətli planını yerinə yetirməyə imkan verəcəksən?

Sonra da, Feltonun ayaq səslərini eşitmiş kimi, cəld qalxdı və qızardı.

Felton ciddi bir tövrlə:

Xanım, dedi, – mən Allaha dua edənlərə mane olmağı xoşlamıram.

Miledi hönkürtü ilə ağlaya-ağlaya dedi:

– Siz haradan bildiniz ki, mən dua edirdim? Siz yanılırsınız: mən dua eləmirdim.

Felton yenə əvvəlki ciddiyyətlə:

Xanım, dedi, yoxsa siz elə zənn edirsiniz ki, mən Yaradanın qarşısında diz çöküb dua edən adama mane olmağa özümü haqlı hesab edirəm? Heç elə şey olarmı? Allah eləməsin! Bir də ki, müqəssirlər gərək tövbə etsin. Bir adam, nə kimi taqsırı olsa da, o dua edərkən mənim üçün müqəddəsdir.

Miledinin üzündə elə bir təbəssüm doğdu ki, bu qiyamət günündə mələyi belə özünə məftun edə bilərdi.

– Mən müqəssirəmmi? Ey Allah, bunun doğrumu, yalanmı olduğunu bir sən özün bilirsən! Cənab zabit, siz deyin ki, mən məhkum edilmişəm, bu, daha düzgün olardı. Lakin Allah əzab çəkənləri sevir, bəzən təqsiri olmayanların da məhkum edilməsinə yol verir.

Felton:

– Siz müqəssirmisiniz, ya nahaq yerə əzabmı çəkirsiniz – hər halda dua etməlisiniz, mən də sizin üçün Allaha dua edəcəyəm.

Miledı özünü onun ayaqları altına ataraq bərkdən dedi:

– Siz haqlısınız! İndi mənə qulaq asın, artıq mən başıma gələn mü sibəti sizdən gizlədə bilmirəm. Siz ümidsiz bir qadının yalvarışlarını dinləyin. Cənab, siz, xəbislər əlində bir alətsiniz, mən sizdən ancaq bir sədəqə istəyirəm; siz bunu mənə versəniz, mən sizə bu dünyada da, o dünyada da xeyır dua edəcəyəm

Xanım, sız bu barədə milordla danışın. Xoşbəxtlikdən, mənim nə əfv etməyə, nə də cəza verməyə ixtiyarım var. Bu vəzifəni Allah məndən yuxarıda duran adama tapşırmışdır.

Yox, bunu Allah ancaq sizə tapşırmışdır! Siz mənim məhv edilməyimə və bıabır olmağıma razılıq vermədən qabaq, yaxşısı budur ki, mənə qulaq asın.

– Xanım, əgər sız biabır olmağa layıqsınızsə, onda hər bır cəzaya boyun əyməlisiniz, Allahın qabağında üzü ağ olmaq üçün hər şeyə dözməlisiniz.

– Sız nə deyirsiniz! Siz məni başa düşmürsünüz! Mən biabırçılıq deyəndə siz elə zənn etməyin ki, mən dustaqxananı, ya ölümü nəzərdə tuturam. Yox. Allah eləməsin! Mənim üçün dustaqxana və ölüm heç bir şeydir!

Elə isə, xanım, mən sizi heç anlaya bilmirəm.

Ya özünüzü elə göstərirsiniz ki, guya anlaya bilmirsiniz.

Yox, xanım, and olsun əsgər namusuna, and olsun xrıstıan məzhəbinə ki, yox!

– Necə? Lord Vinterin nə fikirdə olduğu sizə məlum deyilmi?

– Yox, məlum deyil.

Bu, ola bilməz! Siz onun etibar etdiyi bir adamsınız.

– Xanım, mən heç vaxt yalan demərəm.

Lakin onun nə niyyətdə olduğunu bilmək çətin deyıldır: lord Vinter bunu heç gizlətmək də istəmir.

– Xanım, o şeyi ki, mənə tapşırmırlar, heç vaxt onu öyrənmək fikrinə düşmürəm.

Miledi səsinə fövqəladə bir səmimiyyət verərək bərkdən dedi:

– Demək, bu məsələdə siz onun yoldaşı deyilsiniz? Siz bilirsinizmi ki, o məni elə biabır eləmək istəyir ki, yer üzündə olan bütün cəzalar bunun yanında bir heçdir?



Felton qızararaq:

Sız səhv edirsiniz, xanım, dedi. Belə bir cinayət lord Vinterin əlindən gəlməz.

Miledi duşündü. "Yaxşı, bu hələ məsələnin nə yerdə olduğunu bilmədən bunu cinayət adlandırır". Sonra bərkdən dedı: – Alçaq adamla dost olanın əlindən hər nə desən gələr.

Felton soruşdu:

Bu alçaq adam dediyiniz kimdir?

- İngiltərədə ancaq bir adam bu ada layiqdir.

Feltonun gözləri parıldadı:

Siz Corc Villyersimi deyirsiniz?

Miledi onun sözünü təsdiq etdi:

Bəli, həmin adam ki, müşriklər və dinsizlər ona Bekinhem hersoqu deyirlər. İngilis olan bir adama kımin haqqında söhbət getdiyindən bu qədər də izah etmək lazımdırmı?

Felton:

– Allahın bəlası ondan uzaq deyil: o layiq olduğu cəzadan qaçıb qurtara bilməyəcək.

Bütün ingilislər hersoqa nifrət edirdi. Hətta katoliklər onu talançı, rüşvətxor və əxlaqsız hesab edir, puritanlar isə ona iblis deyirlər.

Miledi bərkdən:

Allah, Allah, – dedi, – sən bu adamı layiq olduğu cəzaya yetir! Mən bunu öz qisasım üçün deyil, bütün bir xalqın qurtuluşu üçün Allahdan arzu edirəm!

Felton soruşdu:

Siz hersoqu tanıyırsınızmı?

Miledi sevinərək düşündü: "Nəhayət, o, mənə sual verməyə başlayır!"

– Tanıyıram? Bədbəxtlıkdən onu tanıyıram. Onu tanıdığıma da ömrüm boyu təəssüf edəcəyəm.

Miledi, dərin bır ümidsizlıyə tutulmuş kimi, əllərini ovmağa başladı. Felton isə bu zaman öz mətanətini itirdiyini hiss etdi. Qapıya tərəf yönəldi. Əsir qadın arxadan yüyürüb onu saxladı və bərkdən dedi:

– Cənab, rica edirəm, rəhmə gəlin, mənim xahişimə qulaq asın: baronun ehtiyat üçün məndən aldığı bıçağı mənə verin... Ah məni axıra kimi dinləyin! O bıçağı. . Onu bircə dəqiqəliyə mənə verin; mənə yazığınız gəlsin. Mənim bu xahişimə əməl edin. Mən sizin ayaqlarınıza düşüb yalvarıram! Sız qapını vırarsınız, mən sizə heç bir şey

etməyəcəyəm. Allah! Siz mənim rast gəldiyim yeganə ədalətli, rəhmdil, gözəl bir insansınız, mən sizə nifrət edə bilərəmmi?.. Sizə, bəlkə də mənim xilaskarım olan bir adama? O bıçağı bircə dəqiqə mənə verin! Mən sizə qapıdakı pəncərədən qaytararam... Bircə dəqiqəliyə, cənab Felton, bununla da sin mənim namusumu ayaqlanmadan xilas edərsiniz.

Felton öz əlini əsir qadının əlindən dartıb almağı unudaraq, dəhşətlə çığırıb dedi:

- Siz özünüzü öldürməkmı istəyirsiniz? Özünüzü öldürməkmi?

Miledi səsini alçaldaraq və taqətsizlikdən döşəmə üstə yıxılaraq pıçıldadı:

– Cənab, mən öz sirrimi açıb sizə dedim, öz sirrimi açıb dedim. İndi o, hər şeyi bilir. Allah, mən məhv oldum.

Felton karıxmış halda ona baxırdı.

Miledi düşündü: "O, hələ də şübhə edir. Görünür, mən onu lazımınca inandıra bilməmişəm".

Lord Vinterin dəhlizdən ayaq səsləri eşidildi. Felton bu addım səsindən baronun gəldiyini bilib qapıya sarı yönəldi Miledi onun dalınca yüyürüb dedi:

Bu adama mənim dediklərimdən bir kəlmə də söyləməyin. Yoxsa mən məhv olaram, bunu da eləyən sizsiniz, siz...

Addım səsləri yaxınlaşırdı. Miledi susdu və dəhşət içində gözəl əlini Feltonun dodaqları üstə qoydu.

Felton onu yavaşca özündən itələdi. Miledi kreslo üstünə yıxıldı

Lord Vinter qapının yanından ötüb keçdi. Addım səsləri get-gedə uzaqlaşırdı.

Feltonun rəngi meyit kimi ağarmışdı; o, bir qədər bu vəziyyətdə durub addım səslərinə qulaq asdı. Səs kəsildikdən sonra yuxudan ayılan adam kimi, köksünü ötürüb cəld otaqdan çıxdı.

Miledi onun ardınca dedi:

Hə! İndi artıq sən mənimsən!

Sonra onun üzü yenə də tutuldu.

"O, barona söyləsə, mən məhv oldum. Baron çox yaxşı bilir ki, mən özümü öldürməyəcəyəm. O, Feltonun yanında mənə bıçaq verəcək. Feltonda başa düşəcək ki, mənim göstərdiyim bu dəhşətli ümidsizlik komediyadan başqa bir şey deyilmiş".

Miledi güzgüyə baxdı; o, heç vaxt hələ indiki kimi gözəl olmamışdı.



Gülümsəyərək öz-özünə dedi:

- Yox, o, barona heç bir söz söyləməyəcək.

Lord Vinter axşam onun otağına gəldi.

Miledi ona:

– Möhtərəm cənab, – dedi, mənim dustaqxanama gəlməyiniz vacibdirmi? Siz məni, mənim iztirabımı artıran bu gəlişlərdən xilas edə bilməzsinizmi?

Lord Vinter:

– Əziz bacım, – dedi, - bu necə olur? Siz deyildinizmı, o gözəl dodaqlarınızla mehribanca mənə deyən ki, mən İngiltərəyə ancaq sizi görmək iltifatına nail olmaq üçün gəlmişəm? Bunun üçün də siz hər bir çətinliyə dözmüsünüz. Sizi dəniz xəstəliyi tuta bilərdi, siz fırtınaya düşə bilərdiniz, düşmən sizi əsir ala bilərdi. Yaxşı da, indi ki, mən sizin yanınızdayam. Siz bundan gərək razı qalasınız. Bir də ki, mənim bu dəfə gəlişimdən xüsusi bir məqsədim var.

Miledi titrəyirdi: o, elə zənn edirdi ki, Felton bayaq ki, söhbəti ona xəbər vermişdir.

Lord Vinter onunla yan yana oturdu, cibindən bir kağız çıxarıb yavaş-yavaş açmağa başladı.

Mılediyə:

- Baxın, – dedi, gələcəkdə sizə veriləcək pasportu sizə göstərmək istəyirəm. Bunu sizə mən hazırlamışam, bundan sonra bu sizin həyatınızın yeganə bir sənədi olacaq; bunu sizə verməyə mən razıyam.

Lord Vinter aşağıdakı sözləri oxudu:

*"Fransız krallığı məhkəməsi tərəfindən damğalanmış və cəza verildikdən sonra azad edilmiş bu Şarlota Bakson adlı qadını . göndərmək üçün əmr..."*

Lord Vinter əmrin oxunmasını kəsib dedi:

Hara gedəcəyiniz yazılmamışdır. Bunu siz özünüz də göstərə bilərsiniz, yalnız bir şərtlə ki, bu yer Londona min mildən yaxın olmasın. Bəli, dalısını oxuyuram:

*"Bu qadın bu yerdə yaşamalıdır, heç vaxt bu yerdən üç mildən artıq kənara çıxmamalıdır. Qaçmaq istəsə, edam ediləcəkdir. Gündə ona mənzil və yemək haqqı olaraq beş şillinq pul buraxılacaqdır".*

Miledi soyuq bir tərzdə:

– Bu əmr qətiyyən mənə aid deyil, dedi, – çünki oradakı ad mənim adım deyil.

– Ad? Sizin heç adınız varmı?

– Mən sizin qardaşınızın familiyasını daşıyıram.

Siz yanılırsınız; mənim qardaşım sizin ikinci əriniz idi. Lakin birinci əriniz durur. Siz onun adını mənə söyləyın, mən də Şarlota Bakson adını dəyişim, sizi onun familiyası ilə yazım. Yox? Bunu istəmirsinizmi? Susursunuzmu?.. Yaxşı! Siz onda Şarlota Bakson adı ilə dustağa salınacaqsınız.

Miledi susurdu. Onu qorxu bürümüşdü. O, elə zənn edirdi ki, bu əmr elə bu saat yerinə yetiriləcəkdir. Hər şeydən ümidini kəsmişdi. Lakin birdən əmrin imzasız olduğu gözünə çarpdı. Bunu bilməklə böyük bir sevinc duydu. Bu sevincini gizlədə də bilmədi.

Lord Vinter onun üzündəki dəyişikliyi görüb dedi·

Bəli, bəli, siz əmrin altındakı imzanı axtarırsınız və düşünürsünüz ki: "Madam ki, əmr imzalanmamışdır, demək hələ ümid yeri var, bunu mənə ancaq məni qorxutmaq üçün göstərirlər". Səhv edirsiniz: sabah bu əmr Bekinhem lorduna göndəriləcək, o biri gün də möhür və imza ilə mənə qaytarılacaq, iyirmi dörd saatdan sonra da yerinə yetiriləcəkdir, buna siz lap arxayın ola bilərsiniz. Xudahafiz, xanım mənim sizə söyləyəcəyim bu idi

Möhtərəm cənab, mən də sizə söyləməliyəm ki, bu hakimiyyətdən sui-istifadə etmək deməkdir, məni başqa bir ad altında sürgün etmək alçaqlıqdır.

Miledi, siz öz adınız altında boğazınızdan asılmağı daha yaxşı hesab edirsiniz? İngilis qanunları izdivacın müqəddəsliyinə qarşı cinayət işləyənlərlə amansızcasına rəftar edir, siz ki, bunu bilirsiniz. Açıq danışım, mənim adım, daha doğrusu, mənim qardaşımın adı bu məsələyə qarışsa da, mən lap biabır olsam da, sizdən həmişəlik yaxa qurtardığıma tamamilə əmin olmaq üçün bu işdən çəkinməyəcəyəm.

Miledi heç bir söz demədi, lakin meyit kimi ağardı.

Lord Vinter sözünə davam etdi:

– Bəli! Mən görürəm ki, siz səyahət etməyi daha üstün tutursunuz. Çox gözəl, xanım. Qədim bir zərb-məsəl var, deyirlər ki: adam çox oxumaqla deyil, çox gəzməklə çox şey bilər. İndi qalır beş şillinq məsələsi. Lakin, deyəsən, bir az xəsis kimi görünürəm, eləmi? Lakin mən istəmirəm ki, siz keşikçinizi pulla ələ alasınız, – pulunuz çox olsa siz buna da cəhd edərsiniz. Doğrudur, keşikçini yoldan çıxartmaq üçün sizin bütün gözəlliyiniz sizin özünüzdə qalır. Əgər Feltonu ələ almaq



yolunda boşa çıxan səyləriniz sizi belə şeylərdən bezikdirməyibsə, onda öz gözəlliyinizdən də istifadə etməyə çalışın.

Miledi düşündü: "Felton ona heç bir söz söyləməyib. Elə isə heç bir şey itirməmişəm".

– Xudahafiz, xanım! Sabah mən gəlib sizə qasidin getməsini xəbər verəcəyəm.

Lord Vinter öz əsirinə istehza ilə baş əyib otaqdan çıxdı.

Miledi sərbəstcə köksünü ötürdü: hələ onun əlində dörd gün vardı; Feltonu da tamamilə ələ almaq üçün dörd gün kifayətdi.

Birdən onun ağlına dəhşətli bir fikir gəldi: lord Vinter əmri imzalamaq üçün Feltonun özünü hersoqun yanına göndərə bilər; onda Felton əldən çıxar. Lakin ona bir şey təskinlik verirdi: Felton lord Vinterə heç bir şey söyləməmişdi.

Miledi axşam yeməyini yedi. Sonra da, dünənki kimi, dizləri üstə düşüb bərkdən dua oxumağa başladı.

Yenə də əsgər qapı dalında dayanıb qulaq asmağı başladı.

Çox çəkmədi ki, dəhlizdə keşikçininkindən daha yüngül ayaq səsləri eşidildi; səs yaxınlaşıb qapı dalında kəsildi.

Miledi düşündü: "Bu, odur!"

O, yenə də, dünən Feltona çox bərk təsir edən dini himni oxumağa başladı. Lakin qapı açılmadı. Miledi qapıdakı pəncərəyə gizli bir nəzər saldı:ona elə gəldi ki, dəmir barmaqlıq ardında gənc zabitin odlu gözləri parıldadı.

Oxumaq səsi kəsildi. Qapı dalında dərindən bir ah çəkdilər. Miledinin bayaq eşitdiyi ayaq səsləri, təəssüf edirmiş kimi, yenə də yavaş-yavaş uzaqlaşmağa başladı.

## XXV

## DÖRDÜNCÜ GÜN DUSTAQDA

Ertəsi gün Felton miledinin yanına gələndə, miledi kreslo üstündə durub, əlində də batist yaylıqlarından hörülmüş bir ip tutmuşdu. Feltonu görüb yüngül bir hərəkətlə kreslodan yerə atıldı, əlindəki ipi də dalında gizlətmək istədi. Gənc zabitin rəngi həmişəkindən daha solğundu. Gözləri qızarmışdı. Lakin üzü əvvəlkilərdən daha artıq bir sərtlik ifadə edirdi.

Livediyə ağır ağır yaxınlaşıb soyuq bir tərzdə soruşdu:

Xanım, nə edirsiniz?

Miledi dərdli-dərdli gülümsədi.

– Heç bir şey. Darıxmaq dustağın ən amansız düşmənidir. Mən darıxıram, əylənmək üçün bu ipi hörmüşəm.

Felton miledinin başı üstündə divara vurulmuş bir qarmaq gördü; qarmaq qızıl suyuna çəkilmişdi. Felton diksindi. Əsir qadın bunu duydu. Onun gözündən heç bir şey yayınmırdı.

Siz kreslo üstündə durub nə edirsiniz?

– Sizin nəyinizə gərəkdır?

Felton təkidlə:

Mən bilmək istəyirəm, – dedi.

– Bunu məndən soruşmayın. Əsil xristian olan bir adama yalan söyləmək yasaq edılmışdır.

Elə isə sizin nə etmək istədiyinizi mən sizə söyləyim: siz özünüzü öldürmək haqqında olan fikrinizi yerinə yetirmək istəyirdiniz. Düzdür, xanım, Allah yalan söyləməyi yasaq etmişdir, lakin adamın öz-özünü öldürməsini bundan da bərk qadağan etmışdır.

Lakin Allahın yaratdığı insanlardan biri nahaq yerə təqib edilirsə və bu adam da ya özünü öldürmək, ya da biabır olmaq qarşısında durursa, onda Allah o adama özünü öldurməyi bağışlar, çünki belə halda adamın öz-özünü öldürməsi məzlumluqdur.

– Siz ya mübaliğə edirsiniz, ya da fikrinizi tamam açıb söyləmirsiniz. Xanım, siz allah, nə varsa, hamısını açıb deyin.

– Mən başıma gələn müsibətləri sizə söyləyim ki, siz də bunu bir əfsanə hesab edəsiniz? Öz planımla sizi tanış edim ki, siz də gedib bunu məni təqib edən adama xəbər verəsiniz? Yox, cənab! Bır də ki, bədbəxt bır dustağın ölməsi, ya qalması məsələsinin sizin üçün nə əhəmiyyəti var? Siz ki ancaq mənim bədənimin meydanda olmasına cavab verirsınız. Elə deyılmi? Mənim cəsədim üçün bəlkə də sizə ikiqat mükafat verəcəklər.

Felton bərkdən dedi:

– Mənəmi, xanım, mənəmi? Siz elə zənn edirsiniz ki, mən sizin ölümünüz üçün hələ bir mükafat da alaram? Siz nə dediyinizi heç başa düşürsünüzmü?

Miledı canlanaraq dedi:



Felton, məni tərk edın. Qoyun mən öz fikrimi yerinə yetirim. Hər bir əsgər şöhrətpərəst olmalıdır, elə deyilmi? Siz indi leytenantsınız, lakin mənım tabutumun dalınca kapitan rütbəsində gedəcəksiniz.

Bu söz Feltonu sarsıtdı:

– Siz insanların və Allahın qarşısında belə bir məsuliyyəti nə üçün mənim üzərimə qoyursunuz? Bir neçə gündən sonra, xanım, siz bu qəsri tərk edəcəksiniz, onda sizin həyatınız da artıq mənim mühafizəm altında olmayacaq. Köksünü ötürərək əlavə etdı: Onda nə istəsəniz edərsiniz.

Miledi qəzəblə dedi:

Necə? Siz kı, belə mömin, pak, günahsız bir adamsınız, bununla belə qorxursunuz ki, bəlkə də sizi mənim ölümümdə təqsirləndirərlər?

Xanım, mən sizin həyatınızı qorumalıyam.

Lakin siz necə bir vəzifəyə xidmət etdiyinizi başa düşürsünüz? Sizin hərəkətləriniz hətta müqəssir bır adam üçün də sərtdir. Lakin bəlkə də mən müqəssir deyiləm, onda siz öz hərəkətlərinizə necə baxarsınız, Allah özü buna necə baxar?

Xanım, mən əsgərəm, mən ancaq mənə tapşırılan əmri yerinə yetirirəm.

Qiyamət günündə Allah kor-koranə hərəkət edən cəlladları ədalətsiz hakimlərdən ayırmayacaq. Siz istəmirsiniz ki, mən özümü öldürəm, lakin siz mənim ruhumu məhv etmək istəyən adama kömək edirsiniz.

Felton tərəddüd etməyə başlamışdı.

Təkrar edirəm... Sizin üçün heç bir təhlükə yoxdur; mən lord Vıntерə də özüm kimi arxayınam.

Miledi bərkdən dedi:

– Ağılsız! Ağılsız o adamdır ki, başqasına arxayın olur; ağılsız o adamdır kı, zəiflərə, bədbəxtlərə təzyiq etmək istəyən qüvvətli, xoşbəxt adamların tərəfini saxlayır.

Felton öz qəlbinin dərinliklərində bu sözün doğru bir söz olduğunu duyaraq pıçıldadı:

Mümkün deyil, xanım, mümkün deyil. Nə qədər ki, siz dustaqsınız, siz mənim köməyimlə azad olmayacaqsınız, eyni zamanda, mən sizin ölümünüzə də baıs olmayacağam.

Miledi bərkdən dedi:

– Eləmi? Lakin, Felton, onda mən, mənə öz həyatımdan da qiymətli olan bir şeyi itirmiş olacağam: mən namusumu itirəcəyəm! Həm allahın, həm də insanların qarşısında mənim biabır olmağıma, namusumun ayaqlar altına atılıb tapdalanmasına siz, ancaq siz məsul olacaqsınız!

Felton artıq bu füsunkar qadının qarşısında özünü saxlaya bilmirdi. Belə gözəl, belə təmiz, xəyal qədər pak bir qadını gah ağlar, gah da təhdid edən görmək, onun ümidsiz hallarının şahidi olmaq, xəyalpərəst bir gənc üçün, – Allaha qarşı odlu bir məhəbbətlə, insanlara isə dərin nifrətlə döyünən bir qəlb üçün dözüləcək bir şeydirmi?

Miledi Feltonun karıxdığını duydu. O, bu təəssübkeş adamın qanında qaynayan ehtiraslar mübarizəsini şüursuz olaraq hiss etdı. Düşmənin gerıyə çəkilmək istədiyini görüb, hücuma keçən mahir bir general kimi, o da bir əlini qabağa uzadaraq, o biri əli ilə də paltarını utana utana döşünə sıxaraq, boynu açıq, saçları dağınıq halda yumşaq bir səslə oxuya oxuya Feltonun üstünə getdi:

Qurbanı Vaalın[1] ağzına atan,
Şəhıd də nəsibi olsun aslanın.
Qadir Allah sizdən alar intıqam,
Məni də qaldırar uçurumlardan,
Yüksəldər, o uca göylərə müdam.

Felton əllərini döşünə qoyaraq bərkdən dedi:

– Sız kimsınız? Siz kimsiniz? Allahın göndərdiyi bir elçisiniz, ya cəhənnəm xidmətçısimisiniz, mələkmisiniz, iblismisiniz, siz kimsiniz?

Felton, yoxsa siz məni tanımadınız? Mən nə mələyəm, nə şeytan, mən yerdə doğulmuş bir qızam, mən sənin dinbir bacınam, başqa heç bir şey deyiləm.

– Bəli, bəli, mən hələ də şübhə edirdim, indi artıq inanıram.

– Sən buna inanırsan, eyni zamanda Vaaldan törəmə lord Vinterə kömək edirsən. Sən buna inanırsan, eyni zamanda məni düşmənlərimin, İngiltərənin və Allahın düşməni olan bir adamın əlində qo-

[1] Vaal qədim Fınıkıya xalqının allahı olmus vo ona insan qurban gətirilmişdir. Vaal *məcazı mənada qəzəbli deməkdir*



yursan! Sən buna inanırsan, eyni zamanda, məni elə bir adamın əlinə verirsən ki, o, öz dini rəzalətilə, öz əxlaqsızlığı ilə dünyanı doldurur, murdarlayır; bu namussuz adam bir Sardanapaldır[1]. Gözləri kor olanlar ona Bekinhem hersoqu, möminlər isə ona kafir deyirlər!

- Mən sizi hersoqun əlinə verirəm? Mən? Siz nə deyirsiniz?

Miledi bərkdən dedi:

– Onların gözü görməmək üçündür; onların qulağı eşitməmək üçündür!

Felton əlini tərli alnına çəkərək:

– *Bəli, bəli,* – *dedi,* – *bəli,* mən yuxuda eşitdiyim səsi *indi* tanıdım; hər gecə mənim yanıma gələn mələyin kim olduğunu indi gördüm; o yuxu nə olduğunu bilməyən qəlbimə deyirdi: "Öldür, İngiltərəni xilas selə, ona görə ki, sən Allahın əmrini yerinə yetirmədən öləcəksən". Söyləyin, söyləyin! İndi mən sizi başa düşürəm.

Böyük bir sevinc bir anda ildırım kimi miledinin gözlərində parıldadı. Bu, nə qədər ani olsa da, Felton onu görüb diksindi. O, birdən lord Vinterın miledi haqqında söylədiyi sözləri, etdiyi xəbərdarlığı, miledinin onu özünə məftun etmək üçün göstərdiyi ilk təşəbbüsləri xatırladı. Geriyə çəkilib başını aşağı saldı, lakin, əfsuna tutulmuş kimi gözlərini ondan ayırmadı.

Miledi onun tərəddüd etdiyini bildi. Miledi üzdən özünü həyəcanlı göstərsə də, əslində soyuqqanlı və sakit idi. Əllərini aşağı endirdi, sanki qadın zeifliyi onun həyəcan içində çırpınan ilhamına üstün gəlmişdi.

Miledi:

– Yox, – dedi, – mən ayrı heç bir şey eləyə bilmərəm. Siz ancaq mənə biabır olmamaq üçün ölməyə, ruhumu xilas etməyə imkan verin. Mən sizdən azad edilməyimi xahiş eləmirəm, – bunu müqəssir bir adam edərdi; mən sizə, mənim qisasımı alın, deyə yalvarmıram, – bunu bir müşrik tələb edərdi. Mən ancaq sizdən bir şeyi xahiş edirəm: mənə ölməyə imkan verin. Dizləri üstə düşüb sizə yalvarıram: mənə ölməyə imkan verin; son nəfəsimə qədər mən öz xilaskarıma xeyir dua edəcəyəm.

Felton yenə də ona yaxınlaşdı. Miledi yavaş-yavaş yenə də onu özünə məftun edə bildi.

[1] Sardanapal əfsanəyə görə, Assıriyanın qüdrətli padşahı olmuş (mıladdan əvvəl IX əsrdə) və onun adı *pozğun, şərəfsiz hakimlərə verilən bır ad olmuşdur*

Felton:

– Əfsus, – dedi, – sizin əgər, doğrudan da, günahınız yoxsa, mənim ancaq sizə yazığım gələ bilər. Lakin lord Vinter sizi ağır cinayətlərdə təqsirləndirir. Siz xristiansınız, mənim dinbir bacımsınız; məni sizə cəlb edən də budur. Bu vaxta qədər mən öz xeyirxahımdan başqa heç kəsi sevməmişəm; mənim bu həyatda rast gəldiyim ancaq xainlər və dinsizlər olmuşdur, lakin, xanım, siz o qədər gözəlsiniz ki... elə təmiz, elə pak görünürsünüz ki... Ancaq lord Vinter ki, sizi belə təqib edir, görünür siz qanunsuz bir iş görmüsünüz.

Miledi təsvir edilməyəcək bir kədərlə dedi:

– Onların gözü görməmək üçündür; onların qulağı eşitməmək üçündür.

Gənc zabit bərkdən dedi:

– Elə isə söyləyin, söyləyin!

Miledi də qızararaq bərkdən:

– Öz rüsvayçılığımı açıb söyləyim? dedi. – Rüsvayçılıq deyirəm; çünki birinin cinayəti bir başqasının rüsvayçılığına səbəb olur... Mən bir qadın olduğum halda öz rüsvayçılığımı açıb kişiyəmi söyləyim? – Əlləriilə utana-utana gözəl gözlərini örtərək sözünə davam etdi: Yox! Yox! Heç vaxt, mən bunu eləyə bilməyəcəyəm.

Mən ki sizin qardaşınızam, mənə də söyləməyəcəksiniz?

Felton bunu deyib yalvarıcı halda əllərini döşünə qoydu.

Yaxşı da, mən öz qardaşıma arxayın oluram; söyləməyi qət etdim.

Bu anda lord Vinterin ayaq səsləri eşidildi.

Lord keşikçi ilə bir neçə kəlmə danışdı; sonra qapı açıldı, o içəri girdi.

Felton cəld kənara çəkildi.

Baron əsir qadını, gənc zabiti ağır-ağır və çox diqqətlə gözdən keçirdi.

– Con, siz xeyli var buradasınız. Yoxsa bu qadın öz cinayətlərini açıb sizə söyləyir? Sizin söhbətinizin bu qədər uzanması mənə aydın olur.

Felton diksindi; miledi bildi ki, qəflətən üstünə çıxılan bu puritana kömək eləməsə, özü məhv olacaq.

- Hə! Siz qorxursunuz ki, əsiriniz sizin əlinizdən çıxar? Siz bunu sizə layiq olan öz məhbəs xidmətçinizdən soruşun, görün mən indicə ondan nəyi xahiş edirdim.



Baron şübhə ilə soruşdu:

- Siz xahiş edirdiniz?

Felton karıxmış halda dedi:

Bəli, milord.

Lord Vinter soruşdu:

Nəyi xahış edirdi?

O, məndən bıçaq istəyirdi, özü də söz verirdi ki, bir dəqiqədən sonra qapıdakı pəncərədən geri qaytarsın.

Lord Vinter həm istehza, həm də nifrətlə dedi:

Yoxsa burada bir gizlənən var? Bu möhtərəm xanım kimi öldürmək istəyir?

Miledi:

– Burada olan ancaq mənəm, – dedi.

Lord Vinter sözünə davam etdi:

– Mən sizə Amerikanı da təklif etdim. Tiburnu da... miledi, Tiburnu seçin: inanın ki, kəndir bıçaqdan daha yaxşıdır.

Miledi:

– Siz haqlısınız, – dedi, – mən bu barədə düşünmürəm. – Sonra tutqun bir səslə əlavə etdi: – Yenə də düşünəcəyəm.

Feltonun əti ürpəşdi. Yəqin bu da lord Vinterin diqqətindən yayınmadı:

– Con, buna inanma, – dedi. - Dostum, mən sənə arxayın olmuşam; ehtiyatlı ol; bu barədə mən əvvəldən sənə xəbərdarlıq etmişəm. Üç gündən sonra biz bunun üzündən qurtaracağıq; o yerə ki mən onu göndərəcəyəm, orada o heç kəsə ziyan yetirə bilməyəcək.

Miledi, Allaha müraciət edirmiş kimi, bərkdən dedi:

- Eşidirsənmi?

Felton bildi ki, bu söz ona aiddir. Başını aşağı salıb fikrə getdi. Baron zabitin qolundan tutdu və gede-gedə dönübılediyə baxdı; otaqdan çıxana qədər onu gözdən qoymadı

Əsir qadın öz-özünə dedi: "Mənim məsələm heç də mənim düşündüyüm qədər qabağa getməmişdir. Vinter son dərəcə ehtiyatlı olmaqla öz əvvəlki səfehliyindən çıxdı. Qisas almaq arzusu adamı necə dəyişdirərmiş!"

Bir saatdan sonra miledi qapı dalından danışıq səsi eşitdi. Feltonu səsindən tanıdı. Gənc zabit cəld otağa girib qapını aralı qoydu və milediyə susmaq işarəsi etdi. O, çox həyəcanlı idi.

Miledı soruşdu:

Siz məndən nə istəyirsiniz?

Felton yavaşca:

– Qulaq asın, - dedi, – mən keşikçini göndərmişəm. Mənim buraya gəldiyimi heç kəs bilməməlidir. Baron bu saat mənə dəhşətli bir şey söylədi.

Miledi müti halda gülümsəyərək başını yellədi.

Felton sözünə davam etdi:

– Ya siz iblissiniz, ya da mənim xeyirxahım, mənim atam olan baron dəhşətli bir insandır. Mən sizi ancaq dörd gündür ki, tanıyıram, onu isə iki ildir ki, bir ata kimi sevirəm. Mən sizin hansınıza inanmalıyam? Buna görə də mənim tərəddüd etməyim əfv olunası bir şeydır. Mənim sözlərim sizı qorxutmasın: mən sizin sözünüzün doğruluğuna inanmalıyam. Bu gecə saat on ikidən sonra yanınıza gələcəyəm.

– Yox, Felton, yox qardaşım, siz özünüzü belə bir təhlükəyə atmayın... mən artıq məhv olmuşam, siz nıyə mənımlə bərabər məhv olasınız? Mənim ölümüm mənim həyatımdan daha da mənalı olacaqdır, mənim dinməz-danışmaz cəsədim sizi bir dustaq sözündən daha artıq inandıracaqdır.

Susun, xanım! Mən sizin yanınıza bir şey üçün gəlmişəm ki, sizin üçün müqəddəs olan nə varsa, ona and ıçəsiniz ki, öz canınıza qəsd etməyəcəksiniz.

– Mən bunu vəd etmirəm. Çünki mənim anda böyük hörmətim var. And içsəm, gərək andımı yerinə yetirəm.

– Elə isə, heç olmasa biz yenə görüşənə kimi canınıza qəsd etməyəcəyinizə and için. Bu görüşdən sonra da siz öz fikrinizdən əl çəkməsəniz, onda daha hər nə istəsəniz eləyə bılərsiniz. Hətta ıstədıyiniz silahı da sizə verərəm.

– Mən buna razıyam.

– And için!

– And olsun Allahımıza! Razı qaldınızmı?

Yaxşı. Mən getdim. Xudahafiz.

Cəld otaqdan çıxıb qapını örtdü, keşikçini əvəz edirmış kimı, əsgərın nizəsini götürüb qapı dalında durdu. Əsgər qayıdandan sonra Felton nizəni ona verdi. Bu zaman miledi qapıdakı pəncərədən Feltonun həyəcanla xaç vurub getdıyini gördü.



Öz yerinə qayıdıb nifrətlə gülümsədi:

Allah, dedi, – belə də ağılsız fanatık olarmı?! Lakin qısas almaq üçün o, mənə kömək edə bilər.

## XXVI

## BEŞİNCİ GÜN DUSTAQDA

Miledi bilirdi ki, burada ancaq iki gün qalacaqdır. Bekinhem hersoqu əmri imzalayan kimi lord Vinter onu göndərəcəkdir. Miledi başa düşürdü ki, sürgünə məhkum edilən qadınlar, başqalarını özünə məftun etmək vasitələrinə, - gözəlliyi saray şöhrəti ilə parlayan və dillərdə əzbər olan xeyirxah qadınlardan daha az malikdirlər. Doğrudur, həqarətli, rüsvayedicı cəza hökmü qadını öz gözəlliyindən məhrum etmir, lakin belə bir qadının əvvəlki əzəmətını əldə etməsı daha mümkün deyil. Miledi ancaq kraliçalar içində kraliça idi. Aşağı təbəqədən olan adamlar üzərində hökmranlıq etmək ona həzz verməzdi, bu, onun üçün bəlkə alçalmaq deməkdi.

Əlbəttə, o, sürgündən qayıdacaqdı, lakin bu sürgün uzun sürsə necə olar? Bir il, iki il, üç il vaxt itirmək hər şeyi itirmək deməkdi! Qayıdanda da görərsən ki, d'Artanyan öz dostları ilə kraliçadan mükafat alıb kef içində xoşbəxt bir həyat sürür... Bu fikirlər miledinin ürəyini parçalayırdı. Lakin onun qəlbində coşan fırtına onun gücünü qat-qat artırırdı, əgər miledinin fiziki qüvvəsi bir anlığa əqli qüvvəsi dərəcəsinə yüksələ bilsəydi, o, bu həbsxana divarlarını yıxıb dağıdardı.

Bəs kardinal? Adama şübhə edən, inanmayan, rahatlıq nə olduğunu bilməyən bu adam indı onun haqqında nə düşünür, onun susmasını nə ilə izah edir? O, hal hazırda mıledinin yeganə arxası və hamisi olmaqla qalmırdı; o, eyni zamanda, miledinin gələcəkdə xoşbəxt olması və qisas alması üçün yeganə bir vasitə idi. Miledi bunu yaxşı bilirdi. O, belə bir səmərəsiz səyahətdən geri qayıtdıqdan sonra özünü doğrultmağa çalışsa da, dustaqxanaya düşdüyünü, ağır əzab və iztirab çəkdiyini nağıl etsə də, bunun heç bır təsiri olmayacaqdı; kardinal isə, böyük bir hakimiyyət və ağıl sahibı olan bır skeptik sakıtliyi və istehzasilə ona belə deyəcəkdi: "Siz elə düşməməliydiniz!"

Saatlar bir-birinin ardınca ötüb gedir, hər dəfə vurulan zəngın səsi əsir qadının ürəyini çırpındırırdı. Saat doqquzda yenə də lord Vinter gəldi, pəncərəni, dəmır barmaqlığı, döşəməni, divarları, buxarını, qapını gözdən keçirdi Lakın bir kəlmə də söz demədi, miledi də dinmədi. Vəziyyət çox cıddi idi: danışmağın və hiddətlənməyin mənası yox idi, belə şeylərə vaxt ıtırmək olmazdı.

Baron otaqdan çıxarkən dedı:

Yox, yox, sız hələ bu gecə qaça bilməyəcəksiniz.

Saat onda Felton keşıkçini dəyişdirməyə gəldi. Miledi onu ayaq səsındən tanıdı. Qadınlar öz sevgililərıni ayaq səsindən tanıdığı kimi, miledi də indi Feltonu yerişindən tanıyırdı, – lakın o, bu zəif təbiətli fanatikə nifrət edır, ondan zəhləsi gedırdi.

Təyin edılən vaxta hələ vardı, buna görə də Felton miledinin yanına gəlmədi. İki saat sonra, saat on ıkıdə keşikçi dəyişdirildı.

Daha vaxt idi; mıledi Feltonu səbırsızlıklə gözləyırdi.

Yeni keşikçi dəhlizdə gəzinməyə başladı.

Felton on dəqiqədən sonra gəldi. Miledi özünü yığışdırdı.

Felton keşikçiyə dedi:

– Bura bax, bu qapıdan qətiyyən uzaqlaşmazsan. Özün bilirsən ki, keçən gecə milord bir əsgəri bunun üstündə cəzalandırdı: o, bircə dəqiqə öz keşiyini buraxıb getmışdı; halbukı bu zaman mən özüm onun yerində durmuşdum.

Əsgər:

– Bəli, bunu bilirəm, dedi.

– Mən sənə əmr edirəm: ətrafına diqqətlə göz yetır. Mən də girib bu qadının otağını bir də gözdən keçirim, o, deyəsən, öz canına qəsd etmək istəyir. Mən ciddi əmr almışam ki, onu gözdən qoymayım.

Miledi pıçıldayaraq öz-özünə dedi: "Çox gözəl! Bu cıddı purıtan yalan söyləməyə başlayır." Əsgər gülümsədi:

– Cənab leytenant, dedi, – gənc bir xanımın otağını gözdən keçirmək heç də pis məşğələ deyil.

Felton qızardı. O, əsgərə belə zarafat üstündə töhmət edə bılmədi: vicdan əzabı onu sıxırdı.

Felton əsgərə tapşırdı ki:

Əgər mən səni çağırsam, gələrsən; yox, bır başqası gəlib-eləsə, məni çağırarsan.

Baş üstə, cənab leytenant.



Felton otağa girdi. Miledi ayağa qalxdı.

Sizsınizmı?

Sizə söz vermişdim kı, gələcəyəm; gəldim.

– Siz mənə başqa şey vəd etmişdiniz.

Gənc zabit qıçlarının titrədiyini hiss edərək dedi:

Aman Allah! Aman Allah! Onun alnını tər basdı.

Sız bıçaq gətirəcəyinizi, söhbətinizdən sonra onu burada qoyub gedəcəyinizi vəd etmişdiniz.

– Bunu söyləməyin, xanım! Vəziyyət nə qədər ağır, nə qədər də dəhşətli də olsa, Allah bəndələrinə özünü öldürmək ixtiyarını vermir. Mən belə bir günahı boynuma götürməməliyəm.

Əsir qadın kresloya otura-otura nifrətlə dedi:

Olmaya fikrinizı dəyişmisiniz? Mən də fikrımi dəyişdim

– Necə?

Mən sözünün üstündə durmayan adama heç bir şey söyləmərəm.

Felton pıçıldayaraq dedi:

Aman Allah!

– Sız gedə bilərsiniz: mən heç bir şey söyləməyəcəyəm.

Felton cıbindən bıçağı çıxararaq:

Bu da bıçaq! – dedi. Bıçağı o öz əsrinə vermək istəmirdı.

Verin!

Niyə verim?

– And olsun namusuma, mən bu saat onu sızə qaytaracağam; sız də onu miz üstə qoyarsınız.

Felton bıçağı milediyə verdi. Miledi bıçağı diqqətlə gözdən keçirdi, barmağının ucu ilə itiliyini yoxladı.

Bıçağı gənc zabitə qaytarıb dedi:

– Yaxşı. Bıçaq çox gözəl və möhkəm poladdandır... Felton siz vəfalı bir dostsunuz.

Felton bıçağı alıb miz üstə qoydu.

Miledı özünü elə göstərdı ki, guya bundan tamamilə razı qalmışdı.

– İndi mənə qulaq asın, – dedi.

Gənc zabıt miledinin yanında durub onun söyləyəcəyi sözlərı səbirsizliklə gözləyirdı.

Miledı kədərlı bir halda sözə başladı:

– Felton, sızin atabir, anabir bacınız sizə belə bir şey demiş olsaydı: mən hələ cavandım və bədbəxtlikdən, çox da gözəldim; hiylə qurub

məni tələyə saldılar, lakin məni ələ ala bilmədilər; etiqad etdiyim dini, ibadət etdiyim Allahı məsxərəyə qoydular, lakin mən buna da tab gətirdim. Sonra məni təhqir etməyə başladılar: ruhumu məhv edə bilmədiklərindən vücudumu həmişəlik alçaltmaq istədilər və nəhayət ..

Miledi susdu, dodaqlarında acı bir təbəssüm göründü.

Felton soruşdu:

– Nəhayət? Nəhayət, sizə nə etdilər?

Nəhayət, bir gün axşam onlar mənim inadımı qırmaq qərarına gəldilər. Bəli, bir gün axşam onlar mənim içdiyim suya yuxu gətirən dərman qatdılar. Yeməyi yeyib qurtaran kimi bədənimin sustaldığını, yuxuya getdiyimi hiss etdim. Heç bir şeydən şübhələnməsəm də, məni qorxu bürüdü, yuxunu özümdən qovmağa çalışdım. Ayağa qalxdım, pəncərəyə sarı yüyürüb köməyə adam çağırmaq istədim, lakin ayaqlarım hərəkət etmədi. Mənə elə gəldi ki, otağın tavanı üstümə enir, məni öz ağırlığı altına alır; əllərimi qabağa uzatdım. Danışmaq istədim, lakin dilim dönmədi. Yıxıldığımı hiss edərək kreslodan yapışdım, lakin əllərim birdən düşdü. Dizlərim üstə enib dua etmək istədim, lakin dilim söz tutmadı. Allah məni görmürdü, qəlbimdə qopan fəryadı eşitmirdi. Nəhayət, məni yuxu apardı, döşəmə üstünə yıxıldım; bu yuxu bir ölümə bənzəyirdi.

Bu zaman başıma nələr gəlmişdi, yuxu çoxmu davam etmişdi, – bunu qətiyyən xatırlamıram. Ayılanda özümü çox bəzəkli, girdə bir otaqda gördüm; buraya işıq ancaq tavandakı yarıqdan düşürdü. Elə bil otağın heç qapısı yox idi. Bura çox gözəl bir dustaqxana idi.

Bu vəziyyətdə mən əvvəl özümü çox qəribə hiss etdim: sanki mən yenə də yuxu görürdüm. Sonra səndirləyə-səndirləyə ayağa qalxdım. Əynimin paltarı yanımdakı stul üstünə qoyulmuşdu. Mən nə vaxt soyunmuşdum, nə vaxt yerimə girmişdim, – bu, yadımda deyil. Yavaş-yavaş bu dəhşətli həqiqət mənə aydın oldu. Bura mənim yaşadığım ev deyildi. Günəşin içəri düşən şüalarından birtəhər başa düşə bildim ki, axşam olur; lakin mən dünən axşam yatmışdım; demək, mənim yatdığım iyirmi dörd saat olmağa az qalırdı. Bu uzun yuxu içində mənim başıma nələr gəlmişdi?

Gücüm nə qədər imkan verirdisə, o qədər tez geyindim. Hərəkətlərimin zəifliyi, bədənimdəki süstlük göstərirdi ki, mənə verilən dərmanın təsiri hələ tamamilə getməmişdir. Görünür mənim olduğum otaq qadın qəbul etməkdən ötrü imiş: ən şıltaq, nazlı-işvəli bir qadın



bundan daha gözəl bir otaq arzu edə bilməzdi, çünki o, hara nəzər salsaydı, istədiyi hər şeyin burada hazır olduğunu görəcəkdi.

Yəqin ki, bu zinətli dustaqxanaya məndən qabaq da düşənlər də varmış. Lakin buranın gözəlliyi mənim qorxumu daha da artırırdı.

Bəli, bura, doğrudan da, bir dustaqxana idı, mən nahaq yerə buradan çıxmağa yer axtarırdım. Bütün divarı əlimlə yoxladım, qapını tapa bilmədim; divarın harasına toxunurdumsa oradan boğuq bir səs çıxırdı. Bəlkə də iyirmi dəfə otağı dolandım, qapı deyilən şey görmədim. Dəhşət məni bürüdü, kreslo üstünə düşdüm.

Hava qaraldı. Qorxum daha da artdı. Elə bil ki, hər tərəfdən üstümə gələn vardı Dünəndən bəri heç bir şey yeməsəm də, yenə acımamışdım. Hava lap qaraldı. Yəqin ki, saat yeddi, ya də səkkiz olardı. Birdən qapı cırıltısı eşitdim; tavanın şüşəli yerindən otağa parlaq bir işıq düşdü. Mən, dəhşət içində, özümdən bir neçə addım aralıda bir adam gördüm.

Haradansa otağın ortasına bir miz gəldi; mizin üstündə iki adamlıq yemək vardı.

Mən qabağımda duran adamı tanıdım. O, bir il idi ki, məni təqib edirdi, mənim namusumu ləkələməyə and içmişdi. İlk sözündən də başa duşdüm ki, keçən gecə o, öz arzusunu yerinə yetirmişdir...

Felton pıçıldayaraq dedi:

Alçaq! – O, bu qəribə hekayənin bir kəlməsini də buraxmaq istəmirdi.

Miledi:

– Əlbət ki, alçaqdı! – dedi. – O, elə bilirdi ki, hissiz bir qadın üzərində qalibiyyət əldə etməklə hər şey bitmiş olacaqdır. O, bu ümidlə mənim yanıma gəlmişdi ki, mən bu rüsvayçılığı qəbul edim, çünki bu, artıq olub qurtarmışdı. O gəlmişdi ki, mənim sevgim əvəzində öz dövlətini mənə təklif etsin.

Mən, təhqir edilmiş bir qadın ehtirasilə öz qəzəb və nifrətimi ona bildirdim. O, əllərini döşündə çarpazlayaraq, gülümsəyə-gülümsəyə, sakitcə mənə qulaq asırdı; sonra da mənə yaxınlaşdı. Mən cumub miz üstündəki bıçağı götürdüm və ucunu öz döşümə dirədim:

– Bir addım da atın, – dedim, – onda siz mənim yalnız rüsvayçılığıma deyil, ölümümə də bais olacaqsınız.

Görünür mənim baxışım, səsim və vücudum, hətta ən pozğun adamları belə inandıra bilən aydın bir səmimiyyət ifadə edirdi; o, doğrudan da, özümü öldürəcəyimdən ehtiyat edərək daha yaxınlaşmadı

– Sizin ölümünüzə bais olmaq? – dedı. – Yox, yox, sizin kimi füsunkar bir cananı ıtirməyə mən heç razı olarammı?! Əlvida, gözəlim! Mən sizin yanınıza, sizin kefiniz açıq olanda gələrəm.

Bu sözləri deyib fit verdı. Tavandakı çıraq qalxıb gözdən itdi. Otağı qaranlıq bürüdü. Açılan və örtülən bır qapı səsı eşidildı. İşıq yenə də yandı. Mən otaqda tək qaldım.

Dəhşətli dəqiqələr keçirdim. Mən artıq bədbəxt olduğuma şübhə etmirdim. Mən bütün qəlbimlə nifrət etdıyım bir adam əlində ıdım; bu adamın əlindən hər nə desən gəlirdi.

Felton soruşdu·

– Bu adam kimi idi axı?

Bütun gecəni stul üstə oturaraq keçirdim; ən xırdaca səsdən belə diksinirdim. Çıraq gecə yarısı söndü, yenə də qaranlıq otağı bürüdü. Məni təqib edən adam gecə yanıma gəlmədı, mənı sakıt buraxdı. Səhər açıldı. Miz otaqdan yox oldu. Lakin bıçaq mənım əlimdə qaldı.

Mənim bütün ümidim ancaq bu bıçağa idi

Yorğunluq məni əldən salırdı. Gözlərım yuxusuzluqdan alışıb yanırdı, lakin bircə dəqiqə də olsa yatmağa qorxurdum. Havanın işıqlanması məni sakitləşdirdi; çarpayı üstünə yıxılıb bıçağı balışın altında gizlətdim. Nə vaxt gözümə yuxu getdıyini heç özüm də bilmirəm. Ayılanda gördüm ki, mız yenə otaqda hazırdı. Bərk acımışdım. Qırx səkkiz saat idi ki, mən heç bir şey yemirdım. Bır parça çörək kəsdim, bir az da meyvə yedim. Dünən suya yuxu gətırən dərman qatıldığı yadıma düşdü. Buna görə də miz üstündəki qrafinə əl vurmadım, divardakı mərmər əl-üz yuyandan su alıb ıçdim.

Nə qədər ehtiyatlı olsam da, yenə qorxurdum; yeməyə yenə də yuxu dərmanı qata bilərdilər. Günü başa vurdum. Axşam oldu. Gözlərim qaranlığa alışmağa başladı. Zülmət içində mızın döşəmə altına endiyini, on beş dəqiqədən sonra yenə də, yeməklə bərabər yuxarı qalxdığını gördüm. Azca sonra da çıraq otağı işıqlandırdı.

Mən ancaq o şeydən yedim ki, ona yuxu dərmanı qatıla bilməzdi; axşam yeməyi iki yumurta ilə meyvədən ibarət oldu; sonra da əl-üz yuyandan bir stəkan su aldım. Bir neçə qurtum ıçmişdim ki, gördüm sudan birtəhər dad gəlir. Nifrət və dəhşətlə stəkanı yerə atdım. Alnımı soyuq tər basdı.

Yəqin ki, məni gizlicə müşahidə edən bir adam, əlüzyuyandan su alıb içdiyimi görübmüş, onun üçün də gətirib o suya yuxu dərmanı tökübmüş.



Yarım saatdan sonra yenə bədənimdə mənə tanış olan əlamətləri hiss etməyə başladım; lakin sudan ancaq yarım stəkan içdiyimdən, dərman əvvəlki kimi mənə təsir edə bilmədi, özümü ələ almağa çalışdım, lakin ən axırda yuxuya gedən kimi oldum. Ətrafımda nə olurdusa, onu dərk edə bilmirdim, lakin özümü müdafiə etmək və qaçmaq iqtıdarında deyildim.

Bıçağı gizlətdiyim yerdən götürmək üçün birtəhər çarpayıya sarı getdim, lakin çarpayının baş tərəfinə çatmamış lap taqətdən düşdüm, üz üstə yıxılıb titrəyə-titrəyə çarpayının ayağından tutdum. Bu vaxt artıq məhv olduğumu anladım...

Feltonun rəngi ağardı və bütün bədəni gizıldədi.

Miledinin səsi dəyişdi, sanki bu dəhşətli dəqiqələri yenidən keçirirdi.

– Ən dəhşətlisi də bu ıdı kı, mən başıma nələr gələcəyini dərk edirdim; bədənim yatmışdı, lakin ruhum oyaqdı. Hər şeyı görür, hər şeyi eşidirdim. Gördüm ki, çıraq yuxarı qalxdı; otağa qaranlıq çökdü. Sonra da qapı cırıltısını eşıtdim, qapı bununla ıkıncı dəfə açılsa da, səsindən onu tanıyırdım.

Kiminsə mənə yaxınlaşdığını hıss etdım; deyirlər ki, Amerika çöllərində azıb qalan bir adam da ılanın yaxınlaşdığını belə hiss edir.

Bütün ıradəmi toplayaraq ayağa qalxdım, lakin elə o saat da yerə yıxıldım... özü də məni təqıb edən adamın qucağına yıxıldım...

Gənc zabit soruşdu:

– Deyin görüm axı bu adam kım idi?

Miledi başına gələn hadisəni bütün təfərrüatı ilə Feltona söyləmək istəyirdi. O, bu adamın qəlbinə nə qədər artıq təsir etsə, miledi üçün qısas alacağına da bir o qədər əmın ola bilərdi.

İndi o alçağın əlindəki hissis bir qadın deyildi. Mən var qüvvəmlə mübarızə edir onu özümdən rədd etməyə çalışırdım. Görünür ona qarşı xeyli müqavımət göstərmişdim. Onun bu sözləri söylədiyini eşitdim:

– Bu yaramaz puritan qadınları bir görürsənmi? Mən bilirdim ki, cəlladlar onların öhdəsindən çox çətinliklə gəlir, lakin heç düşünməzdim ki, onlar öz oynaşlarına da belə inadla müqavimət göstərərlər.

Heyhat! Belə amansız müqavimət çox da uzun sürə bilməzdi. Nəhayət, mən gücdən düşdüm...

Felton ağır-ağır nəfəs alaraq dinləyirdi, soyuq tər alnından damcı-damcı tökülürdü.

Ayılanda bıçağı götürdüm ki, özümü öldürüm. Lakin başıma dəhşətli bir fikir gəldi. Felton, mən and içmişəm ki, nə varsa hamısını açıb sizə söyləyəcəyəm, bununla özümü məhv etsəm də, sızdon heç bir şey gizlətməyəcəyəm.

Felton dedi:

Dəhşətlı bir fikir... O adamdan intiqam almaq, – eləmi?

– Bəli, ondan mümkün qədər tez intiqam almaq qərarına gəldım. O, mütləq ertəsi günün gecəsi də gələcəkdi, – mən buna şübhə etmirdim. Gündüz heç bir şeydən ehtiyat eləmirdim. Buna görə də, səhər yeməyini yeyib-içdim, heç bır şeydən qorxmadım. Axşam yeməyində özümü elə göstərdim kı, guya yeyirəm. Amma heç bır şeyə toxunmayacaqdım.

Ancaq bir stəkan su gizlətdım, çünki susuzluq mənə çox əziyyət verirdı

Mən bir şeydən qorxurdum kı, bəlkə onlar üzümün ifadəsindən kələyimi başa düşər, çünki məni müşahidə edirdilər. Hətta bir neçə dəfə gülümsədiyimi də hiss etdim. Felton, mən hansı fikrə qarşı gülümsədıyımi sizə söyləməyə qorxuram, çünki siz bunu bilsəniz, dəhşət içində məndən üz döndərə bilərsiniz...

Felton onu tələsdirdi:

Sonra, sonra?

– Axşam oldu. Hər şey öz qaydasınca gedırdi. Əvvəlki kimi yemək verildi; sonra yuxarıdan çırağı salladılar; mən də miz dalında oturdum. Özümü elə göstərdim ki, guya yeyirəm, amma ağzıma bircə tikə də qoymadım.

Yeməkdən sonra özümü elə göstərdim kı, guya dünənki kimı məni yuxu aparır. Birtəhər özümü çarpayıya yetirdim, paltarımı çıxarıb uzandım.

Balışın altına qoyduğum bıçağı əlimlə tapdım, özümü yuxuluğa vuraraq bıçağın dəstəsindən bərk-bərk tutdum.

İki saat tam sakitliklə keçdi, qorxdum ki, o heç gəlməyə. Allah, belə bir şey olacağına dünən heç inana bilərdımmi?

Nəhayət, çıraq yavaş yavaş qaldırıldı və tavanda gözdən itdi. Mən diqqətlə ətrafıma baxdım. Otaqda nələr olacağını bilmək istəyirdim.

Təxminən, on dəqiqə keçdi. Mən öz ürəyimın döyüntüsündən başqa heç bir şey eşıtmirdım. Mən onu gözləyırdim.

Nəhayət, mənə tanış olan qapı cırıltısını eşitdım. Kölgəyə bənzər bir şey çarpayıma yaxınlaşdı...



Felton:

Tez olun, tez olun! – dedi. – Görürsünüzmü, sizin hər bir sözünüz məni ərimiş bir qurğuşun kimi yandırır?

Miledi sözünə davam etdi:

Onda mən var qüvvəmi topladım; artıq qısas almaq vaxtı idi; ədalət bunu tələb edirdi. Mən əlimdə bıçaq onu gözləyirdim. O, qollarını açıb mənə yaxınlaşanda mən canımdan keçib çımxıraraq bıçağı onun döşünə endirdim.

O alçaq qabaqcadan hər şeyi nəzərə alıbmış: əynində zirehlı geyim varmış; bıçaq zirehə dəyib sındı.

O çığıraraq:

– Bəs belə! deyib əlimi tutdu və bıçağı əlimdən aldı. – Gözəl puritan qız, siz mənım canıma qəsd edirsiniz! Belə də nankorluq olarmı? Eybi yoxdur, gözəl qız, sakit olun. Mən elə bilirdim ki, siz artıq yumşalmısınız. Mən qadını zorla tutub saxlayan zalımlardan deyiləm. Siz məni sevmirsiniz, indi mən bunu yəqin etdim. Sabah siz azad ediləcəksiniz.

Ah, bu anda o, məni niyə öldürmədi, mən bunu elə arzu edirdim!

Özünüzü gözləyin, – dedim, – mənim azad olunmağım sizi rüsvay edəcək.

– Mənim gözəl sevgilim, bunu mənə izah edin!

– Buradan çıxan kimi mən, mənə qarşı edilən zorakılığı, sizin məni əsir saxlamağınızı açıb söyləyəcəyəm. Mən bunu, hər cür rəzalət baş verən sarayda deyəcəyəm. Milord, siz böyük bir qüvvət sahıbısınız, lakin bunu bilin ki, sizın başınızın üstündə kral, kralın da başı üstündə Allah vardır!

O, özünü nə qədər möhkəm tutmağı bacarsa da, hiddətini saxlaya bilmədi: mən onun əlinin titrədiyini hiss etdım.

Elə isə, – dedi, siz buradan çıxmayacaqsınız!

Mən də:

– Çox gözəl, – dedim. Mənə əzab verilən bu yer, eyni zamanda, mənim qəbrim olacaq. Lap yaxşı! Mən öləcəyəm, onda görəcəksiniz ki, sirlər ifşa edən xəyal canlı insan hədəsindən də qorxuludur.

– Sizin yanınızda özünüzü öldürmək üçün heç bir silah olmayacaq.

– Mənim bir silahım var! Bundan istifadə etmək üçün məndə cəsarət də var: mən özümü acından öldürəcəyəm.

O alçaq dedi:

Belə müharibədənsə, sülh yaxşı deyilmi? Mən dərhal sizi azad etdirərəm. Mən sizin ismətli bir qadın olduğunuzu bildirərəm.

Lakin mən sizi Allah qarşısında ifşa etdiyim kimi, insanlar qarşısın da da ifşa edəcəyəm, əgər lazım gəlsə, mən bunu qanımla isbat edəcəyəm.

Mənim düşmənim istehza ilə dedi:

Hə–ə! Bu, başqa bir məsələ. Sözün düzü, deyəsən, elə sizin burada qalmağınız yaxşıdır. Siz burada heç bir şeydən korluq çəkməyəcəksiniz. Əgər özünüzü acından öldürsəniz də, buna yenə özünüz müqəssir olacaqsınız.

O, bu sözləri deyib getdi. Mən qəm-qüsə çəkməkdən daha çox bərk utanırdım, ona görə utanırdım ki, özüm öz qisasımı ala bilmədim.

O, öz sözünün üstündə durdu. Bir gün keçdi, iki gün keçdi, o, mənim yanıma gəlmədi.

Lakin mən də öz sözümdən dönmədim: heç bir şey yemirdim, içmirdim də: qət etmişdim ki, özümü acından öldürəcəyəm.

Bütün günü və gecəni dua oxumaqla keçirirdim. Allaha yalvarırdım ki, özümü öldürmək üstündə məni əfv etsin.

Səhər qapı açıldı.

Mən döşəmə üstündə uzanmışdım. Get gedə gücdən düşürdüm. Bir əli üstə qalxdım.

Yenə də həmin səsi eşitdim:

– Hə, nə fikrə gəldiniz? Heç bir az yumşaldınızmı? Azad olmaq üçün sizə bircə şey lazımdır: susmaq! Bunu vəd edirsinizmi? - Sonra o əlavə etdi. Qulaq asın, mən rəhmli adamam. Mənim puritanlardan xoşum gəlməsə də, onlara, eyni zamanda, qəşəng puritan qadınlara haqq verirəm. Di yaxşı, İsaya and için ki, susacağam, sizdən ayrı heç bir şey tələb etmirəm.

Mən yerimdən qalxaraq dedim:

– İsaya and içim? Nifrət dolu bu səs sanki bütün qüvvətimi mənə qaytardı. And içirəm ki, heç bir vəd, heç bir hədə–qorxu, heç bir əzab və işgəncə məni susdura bilməyəcək! İsaya and içməkmi! And içirəm ki, mən hər yerdə sizi göstərib deyəcəyəm ki, o mənim qatilimdir, o, mənim namusumu, ismətimi əlimdən almışdır, o alçaq adamdır!

O, təhdidedici bir səslə dedi:

– Özünüzü gözləyin! Sizi susdurmağa mənim əlimdə bir imkan da var, bərkə düşsə mən bundan da istifadə edəcəyəm. Bu, sizi susmağa məcbur edər.



Mən qəhqəhə ilə güldüm.

O:

– Qulaq asın, dedi, bu gecənin qalan hissəsini də, sabahkı günü də sizin ixtiyarınıza verirəm: əməlli fikirləşin, həll edin. Susacağınızı vəd etsəniz, siz dövlət, hörmət, hətta şan-şöhrət sahibi olacaqsınız, yox, bu məsələni açıb söyləməklə məni qorxutsanız, sizi rüsvay edəcəyəm.

Siz? Siz?

Əbədi rüsvay edəcəyəm! Elə rüsvay edəcəyəm ki, daha bunu düzəltmək mümkün olmayacaq.

Mən yenə də təkrar etdim:

– Siz? Felton, mən onu dəli hesab edirdim.

O cavab verdi:

Bəli, mən!

Ah, məni yalqız buraxın! dedim. – Gedin buradan, yoxsa elə bu saat, sizin gözünüzün qabağında, başımı divara vurub əzərəm!

– Yaxşı. Mən söyləyəcəyimi söylədim. Sabah axşam yenə görüşəcəyik.

Mən yenə də döşəmə üstündə yıxılaraq və hırsımdan xalçanı gəmirərək dedim:

– Sabah axşam yenə görüşəcəyik!

Felton mizə söykənib durmuşdu; miledinin qəlbində iblisanə bir sevinc doğdu: o görürdü ki, Felton hekayəni axıra qədər dinləməyib özündən gedə bilər.

## XXVII

## KLASSİK TRAGEDİYADAN BİR SƏHNƏ

Miledi bir qədər susduqdan sonra yenə sözə başladı (bu zaman o gənc zabiti diqqətlə müşahidə edirdi):

Demək olar ki, mən üç gün bir şey yeyib-içmədim; çox əzab çəkdim. Bəzən elə bil alnıma bulud çökür, gözlərim tutulurdu. Sayıqlamağa başlayırdım. Axşam oldu. Mən o qədər zəifləmişdim ki, hər dəqiqə şüurumu itirirdim. Elə bilirdim ki, ölürəm, bunun üçün də Allaha şükür edirdim.

Birdən yenə qapı açıldı, mənə əzab verən adam, üzümaskalı başqa bir adamla içəri girdi. O, özü də maska taxmışdı, mən lakin onu yerişindən və səsindən tanıdım.

O, məndən soruşdu:

– Yaxşı, sizdən tələb etdiyim məsələ haqqında and içməyə razısınızmı?

- Siz özünüz dediniz ki, puritanlar öz sözündən dönməzlər. Mən demişəm, yenə də deyirəm: mən sizi bu dünyada da təqib edəcəyəm, o dünyada da: bu dünyada mən sizi insanların, o dünyada isə Allahın məhkəməsı qarşısına atacağam!

Deməklə siz yenə də inad edib durursunuz?

İndı Allah mənim səsimi eşidir mən ona and içirəm: mən sizdən qisasımı alan bir adam tapıncaya qədər sizin bu cinayətinizi bütün dünyaya yayacam!

O bağıraraq dedi:

– Siz rəzil bir qadınsınız! Siz, sizə layiq olan bir cəza ilə cəzalanacaqsınız! Sız məni buna vadar edirsiniz. Cəmiyyət qarşısında damğalanmış bir qadın nə edə bilər? Siz ondan sonra ha çalışın ki, özünüzün cani və dəli olmadığınızı isbat edin, – buna heç bir kəs inanmayacaq.

Sonra onunla gələn adama dönüb əmr etdi:

Cəllad, vəzifəni yerinə yetir!

Felton həyəcanla dedi:

Onun adı? Onun adı nədir? Tez olun, onun adını söyləyin!

Bildim ki, bu, mənim başıma ölümdən də ağır bir müsibət gətirəcək Cəllad çığırmağıma baxmayaraq, məni yerə yıxdı. Mən hönkürtü ılə ağlayırdım, ağlamaqdan boğulurdum, az qalırdı ki, özümdən gedəm, Allahı köməyə çağırırdım. Lakin buna baxan kimdi, birdən bərk bir ağrı duydum, həm bu ağrıdan, həm də utandığımdan çığırdım: cəllad odlu dəmirlə çiynimə damğa basmışdı.

Feltonun sinəsindən vəhşicəsinə bir bağırtı qopdu.

Mıledı kralıça əzəmətilə yerindən qalxıb dedi:

Baxın, baxın, Felton, zorakılıq qurbanı olan gənc, məsum bir qızın başına gör nələr gətirdilər, gör ona necə bir cəza verdilər! İnsan qəlbini dərk etməyi öyrənin, bundan sonra onların əlində haqsız yerə qisas almaq üçün bır alət olmayın.

Miledi bunu deyib paltarının döşünü açdı, gözəl çiynini biabırcasına ləkələyən damğanı gənc zabitə göstərdi.



Mən ki burada zanbaq şəklini görürəm!

– Bütün alçaqlıq da elə burasındadır! Əgər bu ingilis damğası olsaydı, yenə isbat etmək olardı ki, məhkəmə məni bu cəzaya məhkum etməmişdir. Onda mən dövlətin bütün açıq məhkəmələrinə şikayət edə bilərdim. Lakin fransız damğası... Mən, doğrudan da, damğalanmışdım.

Felton miledinin qarşısında diz çökdü.

O, artıq mıledının çiynindəki damğanı deyil, yalnız öz əsirinin gözəlliyini görürdü.

Bağışlayın, bağışlayın, ah bağışlayın!

Miledı onun gözlərində: sevirəm, sevirəm... sözlərini oxudu.

Mən sızə nəyı bağışlamalıyam?

Felton onun əllərini, ayaqlarını öpərək dedı:

Siz nə qədər gözəlsiniz, nə qədər gəncsiniz!

Bu ehtiras dəqiqəsi keçdikdə miledi öz yalın çıynini örtdü.

Felton dedi:

İndı mən ancaq bir şeyi bilmək istəyirəm: əzab və işgəncə verən adamın adını.

- Qardaş, onun adını sənə demək lazımdırmı? Məgər özün başa düşmürsən ki o kimdir?

Necə? Odurmu? Həmin adamdır? Bütün bunları eləyən odur? Yoxsa, əsl müqəssir...

– Bəli, əsl müqəssir o adamdır ki, İngiltərəni viran edir, həqiqı xristianları təqib edir, qadınların namusunu alçaqcasına əlindən alır; bu gün o, protestantları himayə edir, lakin sabah onlara xəyanət edəcək...

Felton bərkdən dedi:

– Bekinhem hersoqu!..

Miledi əllərilə üzünü örtdü.

Bu mələk qədər gözəl qadının cəlladı Bekinhem hersoqu imış! Aman Allah, sən nıyə onu məhv etmədin! O, yenə şan-şöhrət, hörmət və qüvvət sahibi olub qaldı, bizim hamımızın başına yenə bir bəla oldu!

Miledi:

Kim ki öz-özünü gözdən salır, onu Allah da gözdən salır, - dedi.

Felton get gedə daha artıq həyəcanlanaraq:

- Yox! – dedi. İnsanın qisası Allahın qisasından qabaq olmalıdır!

– Bu adamdan qorxurlar; onlar bacara bilmirlər.

- Mən ki ondan qorxmuram, mən onunla bacararam.

Miledi qurduğu hiylənin baş tutmasından son dərəcə sevinirdi.

Felton ondan soruşdu:

– Bəs necə olub ki, mənim himayəçim, mənim atam olan lord Vinter bu işə əl qatmışdır?

Miledi:

Qulaq asın, Felton, dedi. – Dünyada alçaq, sayğısız adamlardan başqa nəcib və yüksək təbiətli insanlar da var. Mənim bir nişanlım vardı.; biz bir birimizi sevirdik. Mən başıma gələn əhvalatı ona söylədim: o, məni yaxşı tanıyırdı, heç də tərəddüd etmirdi. O, adlı-sanlı bir əyan idi, hər cəhətdən hersoqa bərabər bir adamdı. Qılıncını götürdü, plaşına büründü, Bekinhem hersoqunun sarayına getdi.

Felton:

– Bəli, bəli, o nə etmək istədiyini mən başa düşürəm, – dedi. Hərçənd belə hallarda qılınc deyil, xəncər lazımdır.

Lakin hersoq bundan bir gün əvvəl, İspaniya kralının qızını kral I Karla almaq üçün fövqəladə bir səfər kimi İspaniyaya gedibmiş; bu zaman I Karl hələ prinssessa Uels idi. Mənim nişanlım əliboş geri qayıtdı. O, mənə belə dedi: "O adam çıxıb getmişdir. Müvəqqəti olaraq o, mənim qisasımdan yayındı. Biz bu saat evlənməliyik. Lord Vintere arxayın ola bilərsiniz: o həm özünün, həm də arvadının namusunu qoruya bilər".

Felton birdən dedi:

– Lord Vinterə?

Bəli, lord Vinterə. İndi gərək ki, hər şey sizə aydın oldu, eləmi? Hersoqun geri qayıtması bir ildən çox çəkdi. Gəlişinə səkkiz gün qalmış lord Vinter birdən öldü, mən onun yeganə varisi qaldım. O, nədən ölmüşdü? Bunu ancaq hər şeydən agah olan Allah bilir, mən heç kəsi taqsırlandırmıram...

Felton pıçıldayaraq dedi:

- Ah, belə də müsibət olarmı, belə də müsibət olarmı?

Lord Vinter qardaşına heç bir söz demədən öldü. Ərim mənim qisasımı alana kimi hersoqun mənim başıma gətirdiyi əhvalat bir sirr olub qalacaqdı, bunu heç kəs bilməyəcəkdi. İndi sizin hamınız olan lord Vinter o zaman öz böyük qardaşının mənim kimi cavan bir qızı almasına heç könlü yox idi, çünki mən varlı bir qız deyildim. Ərimdən qalan dövlətə varis olmağım onun xoşuna gəlmədi, buna o özü sahib olmaq arzusunda idi. Belə bir vəziyyətdə mən ondan kömək gözləyə bilərdimmi? İngiltərəni tərk edib Fransaya getdim, bütün ömrüm boyu



orada yaşamaq qərarına gəldim. Lakin mənim bütün var-dövlətim İngiltərədədir. Müharibə məni ehtiyac içində yaşamağa məcbur etdi. Mən istər-istəməz yenə də İngiltərəyə qayıtmalı oldum; altı gün əvvəl Portsmuta gəldim.

Felton soruşdu:

Sonra?

Sonramı? Hersoq mənim İngiltərəyə qayıtdığımı bilib, yəqin ki, bu barədə lord Vinterlə danışmışdır; lord Vinter elə onsuz da mənim əleyhimə idi. Hersoq ona demişdir ki, sizin gəlininiz damğalanmış bir qadındır. Mənim nəcib ərimin haqq səsi artıq məni müdafiə edə bilmədi. Lord Vinter bir də ona görə hersoqun sözünə inandı ki, bu, onun xeyrinə idi. O əmr etdi ki, məni tutub buraya gətirsinlər, sizin mühafizəsinə versinlər. Bundan sonrası artıq sizə məlumdur: sabaha, yox, o biri gün də o məni sürgünə göndərir, bir cinayətkar kimi məni buradan uzaqlaşdırır. Ah! Onlar hər şeyi nəzərə almışlar. Mənim namusum məhv olacaqdır. Siz özünüz görürsünüz ki, Felton, mən ölməliyəm! Felton, bıçağı mənə verin!

Miledi bu sözləri deyib taqətsiz halda gənc zabitin qucağına yıxıldı; o, sevgidən, hiddətdən, indiyə kimi görmədiyi, duymadığı bu zövqdən sərxoş kimi idi. Felton hərarətlə onu qucaqlayıb bağrına basdı:

Yox, yox, sən təmiz və ləkəsiz halda yaşayacaqsan. Sən düşmənlərinə qalib gəlmək üçün yaşayacaqsan.

Miledi yorğun səslə pıçıldayaraq deyirdi:

– Ah, ölmək, ölmək! Ah, biabır olmaqdansa tez ölmək yaxşıdır! Felton, dostum, qardaşım, yalvarıram sənə...

Felton bərkdən:

Yox! dedi. Yox, sən yaşayacaqsan, sənin qisasın alınacaqdır!

– Felton, mən ətrafımda olan adamların hamısına bədbəxtlik gətirirəm. Felton, məni tərk et! Felton, mənim ölməyimə icazə ver!

Felton çığıraraq dedi:

- Elə olsa, onda bir yerdə öləcəyik.

Kim isə qapını döydü. Miledi Feltonu özündən geri itələdi.

– Eşidirsənmi? Buraya gəlirlər .. hər şey bitdi! Biz məhv olduq!

Felton:

– Qapını döyən keşikçidir, dedi, qarovulun gəlməsini mənə xəbər verir.

Elə isə özünüz gedib qapını açın.
Felton onun sözündən çıxmadı: bu qadın artıq onun bütün fikirlərinə, bütün qəlbinə hakim olmuşdu.
Qapını açarkən, qarovullara başçılıq edən serjantla üz-üzə gəldi.
Gənc leytenant soruşdu:
Nə olub ki?
Siz əmr etmişdiniz ki, əgər mən çağırıb köməyə adam çağırsam, qapını açarsınız, ancaq yaddan çıxarıb açarı mənə verməmisiniz. Mən sizin səsinizi eşitdim, qapını açmaq istədim, gördüm ki, qapı içəridən kilidlənmişdir. Buna görə də serjantı çağırdım.
Serjantın səsi eşidildi:
– Qulluğunuzda hazıram!
Felton lap özünü itirmişdi.
Miledi bildi ki, mütləq ona kömək etmək lazımdır. Yüyürüb miz üstündə Feltonun gətirdiyi bıçağı götürdü.
- Siz nə haqq ilə mənim ölməyimə mane olmaq istəyirsiniz?
Felton miledinin əlində bıçağı görüb çığırdı.
– Aman Allah!
Elə bu anda dəhlizdə istehzalı bir qəhqəhə eşidildi. Baron əynində xalat, əlində qılınc qapı ağzında göründü; o, hay-küyü eşidib gəlmişdi:
Hə-ə! Bu da tragediyanın son pərdəsi... Felton, indi gördünüzmü, mən sizə dediyim kimi də oldu: bütün pərdələr bir-birinin ardınca gözümüzün önündən ötüb keçdi; siz ancaq narahat olmayın: qan tökülməyəcək.
Miledi bildi ki, əgər bu saat Feltona öz mərdliyini göstərməsə, məhv olacaq.
Səhv edirsiniz, milord, qan töküləcək, özüdə bu qan, bu qanın tökülməsinə səbəb olan adamın üstünə düşəcək.
Felton qışqırıb onun üstünə yüyürdü, lakin artıq gec idi: miledi bıçağı öz döşünə vurmuşdu.
Miledi burada da öz biclıyini işlətmişdi: bıçağı elə vurmuşdu ki, bıçaq korsetin dəmirinə dəymişdi; korsetin dəmir hissələri bu dövrdə arvadların döşünü bir zireh kimi örtərdi. Bıçaq dəmir üstündən sürüşüb miledinin paltarını cırdı və qabırğaüstü dərini çəpinə kəsdi.
Qan o saat miledinin paltarını buladı.
Miledi sanki özündən gedib arxası üstə yerə yıxıldı.
Felton bıçağı onun əlindən aldı və tutqun bir səslə dedi:



Görürsünüzmü, milord, mühafizəsi mənə tapşırılan bu qadın özünü həyatdan məhrum etdi.
Lord Vinter:
Sakit olun, Felton, – dedi. – O ölməyib: iblislər belə asanlıqla ölmürlər. Sakit olun. Gedin mənim otağıma: məni gözləyin.
Lakin, milord...
– Sizə əmr edirəm: gedin!
Felton öz rəisinin əmrinə tabe oldu, ancaq otaqdan çıxanda bıçağı öz döşündə gizlətdi.
Lord Vinteralediyə xidmət edən qadını çağırdı, hələ də döşəmə üstündə sərilib qalan əsirin qayğısına qalmağı ona tapşırdı. Lord Vinter yaranın bəlkə də ağır olduğunu nəzərə alaraq tez həkim dalınca bir atlı göndərdi.

## XXVII

## MİLEDİNİN QAÇMASI

Miledinin yarası, doğrudan da, qorxulu deyildi. Lord Vinter gedəndən sonra miledıyə xidmət edən qadın onu cəld soyundurmağa başladı; miledi bu zaman gözlərini açdı. Lakin o, özünü zəif və halsız göstərməyə çalışırdı. Yazıq qadın bərk əl-ayağa düşmüşdü, əsirin halına acıyırdı; miledinin etirazına baxmayaraq, bütün gecəni onun yanında qalmağı qət etdi.
Qadının burada olması miledıyə düşünməyə heç də mane olmurdu.
Felton tamamilə məğlub edilmişdi. O, bütün varlığı ilə miledıyə sədaqətli idi. Əgər indi lap mələk özü gəlib miledini müqəssir hesab etmiş olsaydı, Felton, yəqin ki, onun iblis tərəfindən göndərildiyini zənn edərdi.
Miledi bunu düşünərkən gülümsədi. İndi onun ümid bağladığı yalnız Felton idi; yalnız Felton onu xilas edə bilərdi. Lakin lord Vinter Feltonun özünü də nəzarət altına ala bilməzdimi?
Gecə saat dördə az qalmışdı ki, həkim gəldi. Yaranın ağzı bağlanmışdı, buna görə də həkim onun nə dərinlikdə olduğunu təyin edə bilmirdi; o ancaq onu dedi ki, qorxulu bir şey yoxdur.

Səhor mıledi qadını bir təhər dıncəlməyə göndərdı, bu bəhanə ılə də onu başından elədi O, səhər yeməyi vaxtı Feltonun gələcəyını gözləyirdi, lakın o gəlmədı.

Olmaya lord Vınter Feltondan şübhələnib onu, doğrudan da, nəzarət altına almışdı? Məsələnin həll edildiyi bir vaxtda o gəlməyəcəkdımı?

Onun göndərilməsinə indi bircə gün qalmışdı: lord Vinter onu ayın iyirmi üçündə gəmi ilə yola salacaqdı.

Miledi günorta yeməyinə kimi gözlədi; yeməyı həmişə kımi öz vaxtında gətirdilər, lakın Feltondan xəbər çıxmadı. Miledi qarovulda duran əsgərlərin əynindəki geyimdən bildi ki, bunlar əvvəlki keşikçilər deyil, bu vaxt onu dəhşət aldı. O cürət edib Feltonun harada olduğunu soruşdu. Ona dedilər ki, bir saat bundan qabaq Felton ata minib getdi.

Miledi lord Vinterin qəsrdə olub-olmadığını da soruşdu. Əsgər cavab verdi kı, lord öz mənzilindədir; o tapşırmışdır ki, dustaq məni görmək istəsə mənə xəbər verərsiniz.

Lakin miledi zəifliyi və tək qalmaq istədiyını bəhanə edərək lordla görüşmək istəmədiyini bildirdi.

Əsgər yeməyi miz ustunə qoyub çıxdı.

Feltonu buradan uzaqlaşdırmışdılar, keşikçiləri də dəyişdırmişdilər; Feltona artıq inanmırdılar. Bu, əsirə endirilən sonuncu zərbə idi.

Miledi otaqda tək qaldığını görüb ayağa qalxdı, yatağı onu od kimi yandırdı. Qapıya baxdı: qapıdakı pəncərəyə taxta vurulmuşdu. Görünür, baron əsirin iblisanə bir kələklə keşikçiləri də yoldan çıxarmasından qorxurdu.

Nəhayət, miledi güdüləcəyindən qorxmayaraq otaqda sərbəst hərəkət edə bilirdi. O, qəfəsə salınmış dişi bir qaplan kimi hiddətlə və tez-tez otaqda gəzinməyə başladı.

Saat altıda lord Vinter gəldi. O, başdan ayağa silahlanmışdı. Miledi həmişə onu səfeh bir centlmen hesab edirdi, amma indi gözəl bir dustaqxanaçı olmuşdu. Sanki o, hər şeyi qabaqcadan görmüş, duymuş və lazımi tədbir görmüşdü.

Lord Vinter miledinin nələr düşündüyünü bilirdi.

– Siz hələ bu gün məni öldürə bilməzsiniz, – dedi. – Sizin daha silahınız yoxdur; birdə ki, mən ehtiyat üçün bəzi tədbirlər görmüşəm. Siz mənim yazıq Feltonumu bir qədər yoldan çıxarmağa müvəffəq oldunuz, o, sizin iblisanə təsiriniz altına düşməyə başladı. Ancaq mən



onu xilas etmək istəyirəm. O, artıq sızı görməyəcək. Hər şey bitmışdır Şeylərinizi yığışdırın, sabah gedəcəksiniz. Mən sizi ayın ıyirmı dördündə yola salmaq istəyırdim, amma sonra fikrimi dəyişdım. Sabah gündüz saat on ıkıdə Bekinhem hersoqunun imzaladığı əmr mənım əlimdə olacaqdır. Gəmiyə minməzdən qabaq siz kimə olur-olsun, bırcə kəlmə söz söyləmiş olsanız, mənim serjantım gülləni sizin təpənızə çaxacaqdır. Əgər gəmıdə kapıtanın ıcazəsi olmadan birisilə danışsanız, kapıtan sizi dənizə atacaqdır. Xudahafiz! Mən bu gün sizə bunu demək istəyırdim Sabah bir də sizı yola salanda görəcəyəm, bu bızim axırıncı görüşümüz olacaq.

Baron bu sözlərı deyıb otaqdan çıxdı.

Mıledi bu hədə-qorxunu axıra kımi kirimişcə dinlədi. Hırsindən onun ürəyi partlayırdı.

Axşam yeməyi gətirildı. Miledi yeyib özünü bərkitmək ehtıyacını hiss edirdi. Gecə nə olacağını bilmirdi. Bütün göyü bulud bürümüşdü, uzaqda şığıyan ildırımlar tufan qopacağını göstərirdı.

Saat ona az qalmışdı ki, tufan qopdu. Göy, miledinin qəlbindəki qəzəb kımı, gur-gur gurlayırdı. Mılediyə elə gəlirdi ki, ağacları əsdirən, budaqları əyən, yarpaqları qırıb tökən külək onun da üzünə elə zərblə toxunur. O, özü də tufan kimi inildəyir, onun səsi təbiətın əzəmətli gurultuları içində itib gedirdi; təbiət özü də sanki ümıdsizlik ıçındə ınləyirdı. Birdən miledı pəncərənin döyüldüyünü eşitdi, ildırım ışığında, dəmır barmaqlıq ardında bir adam üzü gördü.

Yüyürüb pəncərəni açdı. Çığırıb dedi:

Felton! Mənı xilas etməyəmi gəldin?

Bəli, ancaq susun, susun! Hələ mən gərək pəncərənin dəmir barmaqlığını mişarlayım. Bircə onlar bizi qapıdakı pəncərədən görməsinlər!

Miledi:

Onlar qapıdakı pəncərəyə taxta vurmuşlar, dedi. Bu özü Allahın bızım tərəfimizdə olduğunu sübut edir.

Bu, lap yaxşı oldu Allah onların ağlını əlındən alıb.

Miledi soruşdu:

– Bəs mən nə etməliyəm?

Heç bir şey, heç bir şey, siz ancaq pəncərəni örtun. Soyunmadan uzanıb yatın. Qurtaranda pəncərəni döyəcəyəm. Amma siz mənimlə bərabər gedə bilərsinizmi?

Əlbət ki!

Bəs yaranız?

– Yaram ağrısa da, gəzə bilirəm.

Hazır olun. Dəmir barmaqlığı mişarlayan kimi sizə xəbərdarlıq edəcəyəm.

Miledi pəncərini örtdü, çırağı söndürüb yatağına girdi. O, mişarın qıcırtısını eşidir, hər ildırım çaxanda Feltonun üzünü görürdü.

Miledi bir saat uzandı; o, güclə nəfəs alırdı; soyuq tər alnını bürümüşdü; dəhlizdə xırdaca bir hənirti olanda onun ürəyi qorxudan sıxılırdı.

Saat var ki, adama bir il qədər uzun görunur.

Bir saatdan sonra Felton yenə də pəncərəni tıqqıldatdı. Barmaqlığın iki dəmir çubuğu mişarlanmışdı. Əmələ gələn açıqdan adam keçə bilərdi.

Felton soruşdu:

Hazırsınızmı?

- Bəli. Özümlə bir şey götürümmü?

- Qızıl varınsa, götür.

– Var. Xoşbəxtlikdən, mənim şeylərimə əl vurmayıblar.

Bu lap yaxşı oldu; çünki mən bütün pulumu qayıq tutmağa sərf eləmişəm.

Miledi qızıl kisəsini Feltona verdi.

– Alın.

Felton qızıl kisəsini alıb yerə atdı.

– Hazırsınızmı?

Hazıram.

Miledi kreslo üstünə çıxıb pəncərədən boylandı, gördü ki, Felton kəndir nərdivan üstündə durmuşdur: yerə baxanda adamın gözü qaralırdı. Əvvəl o qorxdu. Başı gicəldi.

Feltn dedi:

Mən elə bundan qorxurdum.

Eybi yoxdur, eybi yoxdur, gözlərimi yumaram.

Felton soruşdu:

– Mənə arxayın olursunuzmu?

Siz hələ bir bunu soruşursunuz da?..

Əllərinizi uzadın, bir-biri üstə qoyun.

Felton onun biləklərini yaylıqla sarıdı, üstündən də kəndirlə bağladı.



Miledi təəccüblə soruşdu:

Siz nə edirsiniz?

İndi əlinizi boynuma keçirin, heç bir şeydən qorxmayın.

- Siz müvazinətinizi itirə bilərsiniz, ikimiz də yıxılarıq.

– Arxayın olun, mən dənizçiyəm.

Bircə saniyə də boş yerə itirmək olmazdı. Miledi əllərini Feltonun boynuna keçirdi, Felton onu pəncərədən çıxarıb nərdivanla yavaş-yavaş enməyə başladı.

Kəndir nərdivan küləyin təsirindən yellənirdi.

Felton birdən dayandı.

Miledi soruşdu:

- Nə var?

Yavaş danış. Ayaq səsi eşidirəm.

– Bizi görüblər!

Onlar bir neçə dəqiqə susdular.

Yox, elə bir şey yoxdur.

Bəs o səs-küy nədir?

Keşikçidir, gəzir.

– O gəlib haradan keçməlidir?

Lap bizim altımızdan.

Bizi görəcəklər!

İldırım çaxmasa, görməzlər!

– Onlar bizim nərdivanı görəcəklər!

– Xoşbəxtlikdən, nərdivanın ayağı yerdən altı fut hündürdədır.

Aman Allah, budur gəlirlər!

Dinməyin.

Onlar yerdən iyirmi fut hündürlükdə nəfəslərini qısaraq, nərdivandan sakitcə asıla qalmışdılar. Əsgərlər gülə-gülə, danışa-danışa lap onların altından keçib getdilər.

Bu dəhşətli bir dəqiqə idi.

Keşikçilər ötüb keçdilər.

Felton:

– İndi biz xilas olduq, – dedi.

Miledi köksünü ötürərək özündən getdi.

Felton nərdivandan enməyə başladı. Aşağı çatanda son pillədən yapışıb sallandı, yerə düşdü. Əyilib qızıl kisəsini yerdən götürdü, dişində tutdu.

Sonra miledini qolları üstə alıb tez yola düzəldi.

Çox keçmədi ki, keşikçi gedən yoldan yana buruldu, cığırı tərk etdi, qayaların arası ilə sahilə enib fit verdi.

Fitə fitlə cavab verdilər; beş dəqiqədən sonra dördkürəkli bir qayıq sahilə yaxınlaşmağa başladı. Sahil çox dayaz olduğundan qayıq bir az aralıda dayandı. Felton qurşağa kimi suya girib qayığa sarı getdi. Öz qiymətli yükünü o, heç kəsə arxayın ola bilmirdi.

Xoşbəxtlikdən fırtına sakitləşməyə başlayırdı, dəniz hələ bərk dalğalanırdı. Dalğalar qayığı qoz qabığı kimi atıb-tuturdu.

Felton miledini qayığa qoyub əmr etdi:

– Yelkənli qayığa! Cəld olun!

Dörd qayıqçı qayığı kürəkləməyə başladı; lakin dalğalar mane olur, qayıq çox ağır-ağır irəliləyirdi. Bununla belə, onlar qəsrdən uzaqlaşırdılar.

Elə qaranlıqdı ki, göz-gözü görmürdü. Qayıqdan sahili çox çətinliklə sezmək olurdu. Dənizdə qara nöqtəyə oxşar bir şey yırğalanırdı; bu – yelkənli gəmi idi.

Felton miledinin əllərini bağladığı kəndiri və yaylığı açdı.

Miledinin üzünə dəniz suyu çilədi. Miledi köksünü ötürərək gözlərini açdı:

– Mən haradayam?

Gənc zabit dedi:

Siz xilas edildiniz!

Miledi həyəcanla səsləndi:

Ah, xilas edildim! Xilas edildim! Bəli, bu dəniz, bu göy! Tənəffüs etdiyim havadan sərbəstlik qoxusu gəlir. Ah... təşəkkür edirəm, Felton, təşəkkür edirəm!

Gənc zabit onu bağrına basdı.

Miledi ondan soruşdu:

Mənim əllərimə nə olub axı? Elə bil ki, biləklərimi məngənəyə salıb sıxıblar.

Doğrudan da, miledinin biləkləri keyimişdi.

Felton onun gözəl əllərinə baxdı, mehribanca başını yelləyərək dedi:

- Heyhat!

Bunun eybi yoxdur! İndi yadıma düşdü ki, niyə belə olub.

Miledi qayığın içində nə isə axtarmağa başladı.



Felton ayağı ilə qızıl kisəsini ona sarı itələyərək:

– Buradadır, dedi.

Yelkənli gəmiyə yaxınlaşdılar; növbətçi gəmidən onları səslədi; qayıqdan da ona cavab verdilər.

Miledi soruşdu:

– Bu nə gəmidir?

Yelkənli qayıqdır, sizin üçün tutmuşam.

- O, məni hara aparacaq?

Hara istəsəniz; ancaq məni Portsimutda düşürəcək.

– Portsimutda siz nə edəcəksiniz?

Felton tutqun bir təbəssümlə:

Mən lord Vinterin əmrini yerinə yetirməliyəm, – dedi.

Hansı əmri?

Yoxsa başa düşmürsünüz?

– Yox, rica edirəm, izah edin.

– Mənə inanmadığından, sizi o, özü qorumaq qərarına gəldi, məni isə hersoqun yanına göndərdi. Hersoq sizin sürgün edilməniz haqqındakı əmri imzalamalıdır.

– Lakin lord Vinter sizə inanmadığı halda belə bir işi necə sizə tapşırmışdır?

Məni nə üçün göndərdiyini o, mənə deməmişdi.

Doğrudur. Demək siz Portsmuta gedirsiniz?

– Mən gecikə bilmərəm: sabah ayın iyirmi üçüdür. Hersoq donanma ilə gedir.

– Sabah gedir? Hara?

Laroşelə.

Miledi bərkdən dedi:

– O getməməlidir!

Arxayın ola bilərsiniz: o getməyəcəkdir.

Miledi sevincindən titrədi.

Felton... Siz də İuda Makkavey[1] kimi böyüksünüz! Əgər siz ölsəniz, mən də sizinlə bərabər öləcəyəm! Mənim sizə söyləyəcəyim söz ancaq budur.

[1] İuda Makkavey (miladdan əvvəl II əsrdə) yəhudi milli müharibəsinin qəhrəmanı və suriyalıların Yəhudistana soxulmasına qarşı üsyan edən yəhudilərin başçısı olmuşdur.

Susun.

Qayıq gəmiyə yan aldı.

Felton gəmı nərdivanı ilə yuxarı qalxıb əlini malediyə uzatdı. Bir dəqıqədən sonra onlar artıq göyərtədə idilər.

Felton:

– Kapitan, – dedı, – sizə söylədiyim xanım bax budur. Bunu Fransaya aparmalısınız.

– Bunun üçün min pistol verməlısiniz.

– Sızə beş yüz pistol kı, vermişəm.

– Doğrudur.

Mıledi:

– Alın, – dedi, – bu da beş yüz pistol.

– Yox, mən öz sözümün ağasıyam. Mən bu cavan adama söz vermışəm: qalan beş yüz pıstolu da Bulona çatanda alacam.

– Biz ora gedıb çıxacağıqmı?

– Lap sağ-salamat; mənim adımın Cek Bütler olduğu necə bır həqiqətsə, bu da elə bır həqiqətdir.

Miledi:

– Əgər sız sözünüzü yerinə yetirsəniz, mən sizə beş yüz deyil, min pistol verəcəyəm, –dedi.

Kapitan bərkdən:

– Gözəl xanım, təşəkkür edirəm, – dedi. – Allah sizin kimı hörmətli minikləri bizə çox-çox yetirsin.

Felton sözə qarışdı:

– İndi ısə bizi əvvəlcə danışdığımız kiçik limana aparın.

Kapitan heç bir söz deməyib dərhal lazımi əmrlər verdi. Səhər saat yeddiyə az qalmışdı kı, yelkənli gəmi Feltonun söylədiyi limanda lövbər saldı.

Yolda Felton malediyə, Londona getmək əvəzində, kiçik bir gəmi tutub geri döndüyünü, gecə ilə divar daşları arasına dəmir çivlər keçirə-keçirə yuxarı qalxdığını və nəhayət, pəncərəyə çatıb kəndir nərdivanın ucunu dəmir barmaqlığa bağladığını söylədi.

– Sonra da nələr olduğu artıq sizə məlumdur, – deyərək sözünü tamamladı.

Miledi Feltonun könlünü açmaq istəyirdi. Lakin çox keçmədi, başa düşdü ki, bu gənc fanatikin könlünü açmaqdansa, onu ciddi bir vəziyyətdə saxlamaq lazımdır.



Onlar belə şərtləşdilər: miledi Feltonu saat ona kimi gözləyir, əgər o saat onda gəlməsə, miledi yola düşür.

Felton ələ keçməsə, onlar Fransada, Betün karmelıtləri monastırında görüşürlər.

## XXIX

## 1628-ci İL AVQUSTUN 23-də PORTSMUTDA NƏ KİMİ BİR HADİSƏ BAŞ VERDİ

Felton adi bır gəzıntıyə gedərkən, qardaş bacıdan ayrılan kımı, miledi ilə vıdalaşdı.

O tamamilə sakitdi, ancaq üzü əvvolkındən daha artıq ağarmışdı, gözləri də, qızdırmalı adam gözləri kimı, parıldayırdı.

Qayığa minib gəmidən sahilə gedırkən gözlərini miledıdən ayırmırdı; miledi də göyərtədə durub onun ardınca baxırdı. Artıq onlar təqib olunmaqdan qorxmurdular: miledının otağına saat doqquzdan qabaq gələn olmazdı, qəsrdən də Londona üç saatlıq yol idı.

Felton sahilə çıxdıqdan sonra bir təpənın başına qalxdı, uzaqlaşan gəmiyə, axırıncı dəfə olaraq, bir də baxdı və Portsmuta tərəf yola düşdü.

Yolda o, Bekinhem hersoquna qarşı olan bütün doğru və yalan ittihamlarını fikrində bir-bir araşdırdı. Bu gənc zabit bir neçə il idi ki, puritanlarla oturub dururdu. Puritanlar da, məlum olduğu üzrə, VI İakovun və I Karlın sevimlisi olan hersoqa nifrət edirdilər. Onlar bu adamı hər cür cinayətdə müttəhim etməyə hazırdılar.

Felton yol ilə gedə-gedə, ilahi bir qadın hesab etdiyi miledinin də bu əyanın cinayətkar ehtiraslarının, dəhşətli qisaslarının qurbanı olduğunu düşünürdü. Miledinin söylədiyi qorxunc hekayəni dönə-dönə xatırlayır, hersoqa qarşı olan nifrəti də getdikcə artırdı.

Səhər saat səkkizə az qalmışdı ki, Portsmuta çatdı. Küçələr adamla dolu idi, adamlar tələsə-tələsə limana sarı gedirdilər: orada gurultulu təbil səsləri altında desant qoşunu gəmilərə yerləşdirilməyə başlamışdı.

Felton toz və tər basmış halda admirallıq idarəsinə getdi; onun həmişə solğun olan bənizi indi istidən və hıddətdən qızarmışdı. Keşikçi onu buraxmaq istəmədi; lakin o, qarovul rəisini çağırdı, gətirdiyi məktubu göstərərək dedi:

– Lord Vinterin təcili tapşırığıdı.

Qarovul rəisi hersoqun ən yaxın dostlarından biri olan lord Vin terın adını eşidən kimi gənc zabiti içəri buraxmaq əmrini verdi.

Felton dəhlizə girəndə, toz basmış, yorğunluqdan tövşüyən bir ada mın da onunla dəhlızə girdiyini gördü. O, saray darvazası ağzında atdan sıçrayıb düşərkən, çox qovduğundan atının bağrı çatlayıb ölmüşdü.

Onlar hər ikisi birdən hersoqun qapı xidmətçisinə müraciət etdi. Felton lord Vinterin yanından gəldiyini söylədi; o biri naməlum adam isə kimın tərəfindən gəldiyini söyləmədi, dedi ki, bunu ancaq hersoqun özünə söyləyə bilərəm. Hər ikisi də qabaqca içəri girməyə çalışırdı.

Patrik əvvəl Feltonu içəri buraxdı. O biri qasid isə gözləməli oldu.

Qapı xidmətçisi Feltonu böyük bir zaldan keçirib hersoqun kabinetinə apardı. Laroşel əhalisini nümayəndələri də, başda Subız olmaqla, bu zalda oturub hersoqu gözləyirdilər. Hersoq vannadan çıxdıqdan sonra geyinib qurtarmaq üzrə idi.

Patrik ona:

Leytenant Feltondur, – dedı, lord Vinterin yanından gəlmışdır.

Bekınhem hersoqu soruşdu:

– Lord Vinterınmi? Söyləyın gəlsin.

Felton içəri girdi. Bu zaman hersoq, başdan başa mirvarı bəzəklı mavi məxmər kamzolunu geyinmək üçün zər işləməlı xalatını çıxarıb taxt üstünə atdı. Soruşdu ki:

Lord Vinter özü niyə gəlmədi? Mən bu səhər onu gözləyirdım.

Felton dedi:

– Lord Vinter mənə tapşırdı ki, zati-alilərınə deyim ki, qəsrin keşıyını çəkmək məcburıyyətində qaldığından o gələ bılməyəcəyinə çox təəssüf edır.

Bəli, bəli, mən bilirəm, orada bir əsır qadın var.

– O əsir qadın haqqında da mən sız zati-aliləri ilə danışmaq istərdim.

Söyləyin!

– Mənim sizə dedıyimı, milord, sızdən başqa heç kəs eşıtməməlidir.

– Patrık, bızı tək buraxın, ancaq uzağa getməyın. Mən bu saat zəng eləyəcəyəm.

Patrik otaqdan çıxdı.



Hersoq:

Cənab, - dedi, – biz təkik, söyləyin.

Milord, lord Vinter üç gün əvvəl sizə kağız yazıb və sizdən xahiş etmişdir ki, Şarlota Bakson adlı bir qadının sürgün edilməsi haqqında yazdığı əmri ımzalayasınız...

Mən də ona cavab verdim ki, əmri imzalamaq üçün ya özü gətirsın, ya da bir başqasına verib göndərsin...

Milord, budur əmr!

– Verın!

Kağızı alıb tez gözdən keçırdi Bunun lord Vinterin öz məktubunda qeyd etdiyi əmr olduğunu yəqin etdikdən sonra kağızı mizin üstünə qoyub lələk qələmı götürdü.

Felton hersoqa:

Bağışlayın, milord, dedi, Şarlota Bakson bu gənc qadının əsl adı olmadığı siz zati-alilərinə məlumdurmu?

Hersoq qələmi mürəkkəbə batıraraq dedı:

Bəli, məlumdur.

Felton həyəcanla soruşdu:

– Bəs onda siz zati-aliləri onun əsl adını bilirsinizmi?

– Bilirəm.

Hersoq qələmi kağıza tərəf gətirdi. Feltonun rəngi qaçdı.

Onun əsl adını bilə-bilə zati-aliləri yenə də əmri ımzalayacaqmı?

– Əlbət ki, bu daha yaxşı.

– Mən inana bilmirəm ki, zati-aliləri onun ledi Vinter olduğunu bilir...

- Mən bunu çox yaxşı bilirəm, lakin bunu sizin haradan bildiyinizə mən çox təəccüb edirəm!

– Siz zati-aliləri də vicdan əzabı duymadan bu əmri imzalayacaqsınız?

Bekinhem hersoqu qürurla gənc adama baxdı:

Cənab, siz mənə çox qəribə suallar verirsiniz, bu suallara cavab verməklə mən sizə çox-çox iltifat göstəririəm.

Zati-aliləri, cavab verin, çünki vəziyyət siz düşündüyünüzdən daha çox ciddidir.

Hersoq bu qərara gəldi ki, gənc adam ona lord Vinterin söylədiyi sözləri təkrar edir.

Təkrar edirəm: mən bu əmri zərrə qədər də vicdan əzabı duymadan imzalayıram. Mən də bilirəm və barona da məlumdur ki, miledi Vinter qəddar bir canidir; bunun qarşısında onu sürgünə göndərməklə kifayətlənmək, – ona bəlkə də mərhəmət etmək deməkdir.

Hersoq qələmin ucunu kağıza qoydu ki, imzalasın.

Felton hersoqa sarı bir addım irəliləyib dedi:

- Milord, siz bu əmri imzalamayacaqsınız!

Mən bu əmri imzalamayacağam? Niyə?

– Siz vicdanınıza bir nəzər salın, onda milediyə ədalətlə yanaşarsınız.

- Onu Taybernə göndərmək daha ədalətli olardı. Miledi rəzil bir qadındır.

Zati-aliləri, miledi – mələkdir, siz özünüz bunu yaxşı bilirsiniz; sizdən xahiş edirəm ki, onu azad edin

Siz dəli olmusunuz. Siz necə cürət edib mənimlə bu dildə danışırsınız?

Milord, məni əfv edin, mən bacardığım kimi də danışıram. Siz bir düşünün, görün nə etmək istəyirsiniz.

Hersoq bərkdən:

– Necə? Siz hələ cəsarət edib məni təhdid də edirsiniz?

Yox, milord, mən hələ sizdən xahiş edirəm və sizə deyirəm: səbir kasasının daşmasına bircə damcı kifayətdir. Xırdaca bir səhv, etdiyi cinayətlərə baxmayaraq, yenə də aman verilən bir adamı cəzalandıra bilər.

Hersoq buyruqverici bir ifadə ilə dedi:

– Cənab Felton, dərhal buradan çıxmanızı və həbsə getmənizi əmr edirəm...

Milord, axıra kimi məni dinləyin. Siz o gənc qızı yoldan çıxarmısınız, siz onu amansızcasına təhqir etmisiniz, çirkab içinə atıb ayaqlamısınız. İndi öz təqsirinizi təmizləyin: onu sərbəstcə buradan çıxıb getməyə imkan verin, mən bundan artıq sizdən heç bir şey tələb etməyəcəyəm.

Hersoq heyrətlə Feltona baxdı:

Siz heç bir şey tələb etməyəcəksiniz?

Felton get-gedə qızışaraq dedi:

– Milord, özünüzü gözləyin, bütün İngiltərə sizin cinayətlərinizdən daha cana gəlmişdir. Milord, siz kral hakimiyyətini mənimsəmisiniz, siz bu hakimiyyətdən sui-istifadə edirsiniz. Milord, insanlar da sizə nifrət edir, Allah da... siz onların gözündən düşmüsünüz. Allah sizi sonra cəzalandırar, lakin mən indi cəzalandıracağam.



Bekinhem hersoqu qapıya sarı gedərək bərkdən:

– Belə də ədəbsizlik olarmı, dedi.

Felton onun qabağını kəsdi.

Mən sizdən acizanə rica edirəm: ledi Vinterin azad edilməsi əmrini verin; unutmayın ki, siz onun namusunu əlindən almısınız.

– Cənab, rədd olun buradan, yoxsa bu saat çağırıb əmr edərəm, sizi buxovlayarlar.

Felton, gümüş zəng olan mizlə hersoqun arasına atılıb dedi:

Siz heç kəsi çağırmayacaqsınız. Milord, özünüzü gözləyin, siz indi Allahın əlindəsiniz.

Bekinhem hersoqu səsini ucaltdı, lakin köməyə adam çağırmadı:

Demək istəyirsiniz ki, iblisin əlindəyəm?

Felton kağızı hersoqa uzadaraq inadla deyirdi:

Milord, ledi Vinterin azad olunması əmrini imzalayın!

Siz məni zorla buna məcbur etmək istəyirsiniz? Siz məni ələ salmısınız. Patrik!

Milord, imzalayın!

- Heç vaxt!

Heç vaxtmı?!

Hersoq qılıncına əl ataraq bərkdən səsləndi:

Ey, kim var orada? Bura gəlin!

Lakin Felton ona qılıncını qınından çıxarmağa imkan vermədi, miledinin özünü yaraladığı bıçaq onun əlində idi, bu bıçaqla da hersoqun üstünə cumdu.

Elə bu anda Patrik yüyürə-yüyürə içəri girib çığırdı:

Milord, Fransadan məktub var! Hersoq bir anda hər şeyi unudaraq dedi:

Fransadan?

Felton fürsətdən istifadə edərək bıçağı hersoqun böyrünə soxdu.

Bekinhem hersoqu çığırdı:

Aha, xain... sən məni öldürdün!

Patrik səsi dəyişmiş halda bağırdı:

Cinayət! Ölüm!

Felton ətrafına baxdı. Qapını açıq görüb Laroşel nümayəndələrinin gözlədiyi yan otağa yüyürdü. Oradan da pilləkənə sarı cumdu, lakin elə

birinci pillədə lord Vinterlə üz-üzə gəldi. Lord Vinter Feltonu rəngi qaçmış, özünü itirmiş və əlləri qanlı görüb boğazından tutdu və çığırdı·

– Mən bunu bilirdim! Mən bunu duymuşdum, ancaq bircə dəqiqə gecikdim! Ah, gör başıma nə gəldi!

Felton qətiyyən müqavimət göstərmədi! Lord Vinter onu keşikçiyə tapşırıb hersoqun kabinetinə yüyürdü.

Feltonla bir vaxtda gələn adam da Patrikin çığırtısını eşidib hersoqun kabinetinə cumdu.

Hersoq taxt üstündə uzanıb əlini də yarasının üstünə basmışdı.

Pıçıldayaraq içəri girən adamdan soruşdu:

– La Port, La Port, onun yanındanmı gəlmisən?

Avstriyalı Annanın sədaqətli xidmətçisi dedi:

- Bəli, zati-aliləri, ancaq, deyəsən, çox gec gəlmişəm...

Yavaş danış, La Port, bizi eşidən olar... Patrik, heç kəsi içəri buraxma. Ah, onun mənə göndərdiyi xəbəri mən bilməyəcəyəm. Aman Allah! Mən ölürəm!

Hersoq bunu deyib özündən getdi.

Onun kabineti bir anda adamla doldu. Lord Vinter, Laroşeldən gələn nümayəndələr və hersoqun məiyyətindəki zabitlər yaralının başına toplaşdı. Bu dəhşətli xəbər sürətlə şəhərə yayıldı.

Top atıldı.

Lord Vinter başını yolur, çığıra-çığıra deyirdi:

Bircə dəqiqə gecikdim, bircə dəqiqə! Ah, Allah, Allah! Belə də bədbəxtlik olarmı?

Qəsrdə, səhər saat yeddidə ona xəbər verdilər ki, pəncərələrin birindən kəndir nərdivan asılmışdır, o dərhal miledinin otağına yüyürdü. Pəncərə açıqdı, dəmir barmaqlığın çubuqları mişarlanmışdı. Bu zaman d'Artanyanın Planşe vasitəsilə etdiyi xəbərdarlıq onun yadına düşdü. Hersoqun başına bir iş gəlməsindən qorxaraq cəld tövləyə cumdu, ilk əlinə keçən yəhərlənməmiş bir ata mindi, özünü tez saraya yetirmək üçün atı dördnala çapmağa başladı, lakin, çox təəssüf ki, vaxtında çata bilmədi...

Hersoq hələ ölməmişdi; o özünə gəldi, gözlərini açdı, hamının ürəyi ümidlə doldu.

Cənablar, dedi, məni La Port və Patriklə tək buraxın. Hə, Vinter, siz buradasınız! Bu gün səhər siz mənim yanıma qəribə bir dəli adam göndərmişdiniz, bir görün o məni nə hala saldı!



Baron bərkdən:

– Ah, milord! dedi. Mən bunu heç vaxt özümə bağışlamayacağam.

Hersoq əlini ona uzadaraq dedi:

Əzizim Vinter, nahaq yerə. Mən elə bir adam tanımıram ki, bir başqası bütün ömrü boyu onun dərdini çəkməsinə layiq ola... Rica edirəm, bizi tək buraxın.

Baron hönkürə-hönkürə bayıra çıxdı.

Otaqda ancaq yaralı hersoq, Patrik, bir də La Port qaldı.

Avstriyalı Annanın sədaqətli xidmətçisi hersoqun uzandığı taxt qabağında dizləri üstə düşüb deyirdi:

– Siz yaşayacaqsınız, siz yaşayacaqsınız, milord!

Hersoq zəif səslə soruşdu:

O nə yazır? – Qan onu aparırdı, yarasından dəhşətli ağrı duyurdu, lakin o sevdiyi qadından danışmaq üçün özünü ələ almağa çalışırdı. – O nə yazır? Onun göndərdiyi məktubu oxuyun.

– Ah, milord!

– La Port, dediyimi elə! Özün görmürsənmi mən nə haldayam?

La Port məktubun möhrünü qırdı, perqamenti açdı, yaralının gözləri önünə tutdu, lakin hersoq nə qədər çalışdısa, məktubu oxuya bilmədi.

Pıçıldayaraq dedi:

– Oxu, özün oxu, mən heç bir şey görmürəm; oxu, bəlkə elə mən bu saat heç eşidə də bilməyəcəyəm, onun mənə nə yazdığını bilmədən öləcəyəm.

La Port məktubu oxumağa başladı·

*"Milord!*

*Sizdən ötrü və sizin xatiriniz üçün çəkdiyim əziyyətlər naminə sizi and verirəm, əgər mənim rahatlığım sizin üçün əzizdirsə, Fransaya qarşı, apardığınız böyük hazırlığı dayandırın və bu müharibəni qurtarın; hamı açıqca deyir ki, bu müharibənin əsl səbəbi, sizin mənə olan sevginizdir, din isə buna ancaq bir bəhanədir. Milord, bu müharibə yalnız Fransanın və İngiltərənin deyil, sizin özünüzün də başınıza böyük müsibətlər gətirə bilər.*

*Öz həyatınızı qoruyun. Həyatınız təhlükə qarşısındadır. Sizin həyatınız mənim üçün o zaman qiymətli olacaq ki, mən sizi düşmən hesab etməyəcəyəm.*

*Sizə qarşı lütfkarlıq göstərən*

*Anna".*

Hersoq məktuba axıra qədər qulaq asmaq üçün son qüvvəsini topladı; məktub oxunub qurtardıqdan sonra o, ümidləri puça çıxmış bir adam kimi dedi:

La Port, o, dilcavabı söyləmək üçün sizə bir şey tapşırmadımı?

– Zati-aliləri, əlbət ki, tapşırdı: kraliça mənə söylədı ki, ona deyin, ehtiyatlı olsun, eşitdiyimə görə onu öldürmək istəyirlər

Hersoq soruşdu:

Elə bu? Elə bu?

O, mənə tapşırdı sizə bir şeyi də deyim, deyim ki, sizi əvvəlki kimi sevir.

Hersoq bərkdən:

Şükür Allaha! dedi. – Demək mənim ölümüm onun üçün yad bir adamın ölümü kimi olmayacaq.

La Portun gözlərindən yaş axmağa başladı.

– Patrik, brilyant boyunbağı qutusunu bura gətirin.

Patrik qutunu gətirdi.

– İndi də, mirvarilə onun adı yazılmış ağ atlaz kisəni gətirin.

Patrik onu da gətirdi.

La Port, onun mənə qarşı yaxınlığını göstərən bu iki şeyi alın: bu gümüş qutunu, bir də bu iki məktubu. Bunları ülyahəzrət kraliçaya verin və məndən axırıncı bir yadigar olaraq... (o, gözlərilə otaqda qıymətli bir şey axtarırdı) bunu da əlavə edin...

Onun gözləri, Feltonun əlindən düşüb qalmış bıçaqdan başqa ayrı bir şey görmədi; bıçağın üstündəki al qan hələ də buğlanırdı.

. .Bu bıçağı da onlara əlavə edin, deyərək La Portun əlini sıxıb son sözünü söylədi. Kisəni, onun da üstündən bıçağı gümüş qutuya qoydu, – buna hələ də onun gücü qalmışdı... Sonra isə can çəkişmə çırpıntıları içində taxtdan döşəməyə yıxıldı, daha özünü ələ almağa onun qüvvəsi yetməmişdi. Patrik onun yerə yıxıldığını görüb qışqırdı,

Elə bu anda hersoqun həkimi içəri girdi; onun dalınca admiral gəmisinə adam göndərilmişdi.

Həkim hersoqa yaxınlaşıb nəbzini tutdu, az sonra onun əlini buraxaraq dedi:

Hər şey bitdi: hersoq öldü.

Patrik qışqırdı:

– Öldü? Öldü?

Hersoqa yaxın olan adamlar otağa doluşmağa başladılar.



Lord Vinter hersoqun öldüyünü görüb Feltonun yanına yüyürdü; saray eyvanında keşikçilər onun qarovulunu çəkirdilər.

Çığıraraq gənc zabitə dedi:

– Alçaq, alçaq, gör sən nə elədin!

Felton:

Mən öz qisasımı aldım, – dedi.

Öz qisasını aldın? Yaxşısı budur söylə ki, mən o məlun qadının əlində bir alət oldum... Lakin, and olsun Allaha, bu, onun axırıncı cinayəti olacaqdır.

Felton sakitcə:

Mən bilmirəm siz nə demək istəyirsiniz, mən bilmirəm, milord, siz kimi nəzərdə tutursunuz, dedi. Mən Bekınhem hersoqunu ona görə öldürdüm ki, məni kapitan rütbəsinə keçirmək üçün o sizin xahişinizi iki dəfə rədd etdi; mən də onu belə bir ədalətsizlik üstündə cəzalandırdım. Vəssalam,

Lord Vinter gənc zabitə heyrətlə baxır, onun bu laqeydliyinin səbəbini nə ilə izah edəcəyini bilmirdi.

Feltonun sakit üzünü yalnız bir şey tutqunlaşdırırdı: hər xırdaca addım və ya danışıq səsi eşidəndə bu sadəlövh puritan elə zənn edirdi ki, miledinin ayaq səsini və danışığını eşidir: miledi indicə gəlib onun boynuna sarılacaq, özünü müqəssir elan edib onunla bərabər məhv olacaqdır.

Birdən o, dənizdə qara bir nöqtə görüb diksindi: o, qartal dənizçi baxışları ilə, başqalarının seçə bilməyəcəyi çox-çox uzaq bir məsafədə, Fransa sahillərinə doğru irəliləyən bir yelkənli gəmi görmüşdü.

Rəngi ağardı, əlini, partlamaq dərəcəsinə gələn ürəyinin üstünə qoydu: miledi ona xəyanət etmişdi.

Lord Vinterə dedi:

Milord, sizdən axırıncı dəfə bir iltifat göstərməyinizi xahiş edirəm!

İstədiyiniz nədir?

Söyləyin saat neçədir?

Baron saatını çıxarıb baxdı:

– Doqquzun tamamına on dəqiqə qalıb.

Miledi vaxtından saat yarım əvvəl yola düşmüşdü; hersoqun öldüyünü xəbər verən top səsini eşidən kimi, gəmi kapitanına lövbəri qaldırıb yola düşməyi əmr etmişdi.

Felton bir fanatik mütiliyi ilə dedi:

Allahın məsləhəti bu imiş. Bununla belə, gözünü uzaqda bir qoz qabığı kimi qaralan nöqtədən çəkmirdı. Ona elə gəlırdi ki, həyatını qurban etdiyi qadını gəminin göyərtəsində görür.

Lord Vinter onun baxışlarına göz qoyaraq, çəkdiyi iztirabın səbəbini anladı və hər şey ona aydın oldu.

Feltona:

– Alçaq, – dedi, – əvvəl sən edam edıləcəksən; lakın and olsun qardaşımın xatirinə, onu mən hamıdan çox istərdim, – sənin o adamın bizim əlimizdən qaçıb qurtara bilməyəçək.

Felton heç bir söz deməyib başını aşağı saldı.

Lord Vinter cəld pilləkəndən düşüb limana sarı getdı.

## XXX

## FRANSADA

İngiltərə kralı I Karl Bekinhem hersoqunun ölümünü eşidib hər şeydən çox laroşellilərin ruhdan düşməsindən qorxdu; buna görə də, Rişelyenin öz qeydlərində göstərdiyi kimi, bu dəhşətli hadisəni onlardan gızlətməyə, bu xəbərin mümkün qədər onlara gec çatmasına çalışdı; əmr etdi ki, bütün limanlar bağlansın, qoşun yola düşməzdən qabaq, heç bir gəmi qırağa çıxmasın. Hersoqdan sonra ordunun qayğısına qalmağı da kral öz öhdəsinə götürdü.

I Karl hadısənin yayılması xəbərının qabağını almaq məsələsində o dərəcə cıddiyyət göstərdi ki, hətta getməyə rəsmən ıcazəsı olan Danimarka elçılərını və Müttəfiq Ştatlara qaytarılan hind gəmilərinin Flessinhenə yola salan holland səfirini yoldan saxladı. Lakin o, bu əmri, hadisə baş verəndən beş saat sonra, yəni gündüz saat ıkıdə ver mişdi, bu vaxta kımi də ıkı gəmı lımandan çıxa bilmışdi. Bunlardan biri, yuxarıda məlum olduğu kimı, miledini aparmışdı: o, atılan topdan hersoqun öldürüldüyünü duymuşdu və admiral gəmisində qaldırılan qara bayrağı görüb buna tamamilə əmin olmuşdu. O biri gəminin isə kimi apardığını və limandan necə çıxa bildiyini sonra söyləyəcəyık.

Bu zaman Laroşel ətrafındakı düşərgədə yeni heç bir şey baş verməmişdi, ancaq Lüdovik həmişəki kimi, bəlkə də həmişəkindən



daha çox darıxdığından gedib Sen-Jermendə gizli surətdə müqəddəs Lüdovik bayramını keçirmək qərarına gəldi və kardinaldan iyirmi muşketyor mühafizəçi xahiş etdi. Kralın darıxması bəzən kardinala da təsir edirdi, buna görə də o, sentyabrın 15-də qayıdacağını vəd edən öz şahanə köməkçisinə getməyə böyük məmnuniyyətlə icazə verdi.

Kardinal həzrətləri kralı yola salmağı cənab de Trevilə tapşırdı; de Trevil də öz dostlarının Parisə getmək arzusunu nəzərə alıb, onları kralın mühafizə dəstəsinə daxil etdi.

Cənab de Trevil özü bu məsələni onlara söylədi. D'Artanyan xüsusilə kardinalın ona göstərdiyi lütfkarlıqdan razı idi, o muşketyor olmasaydı, indi yoldaşları ilə gedə bılməyəcəkdı.

Dörd dost, xanım Bonasyenın ən qəddar düşməni olan miledının Betün monastırında ona rast gələ biləcəyindən qorxaraq Parisə getmək istəyirdi. Buna görə də yuxarıda qeyd etdiyimiz kimi, Aramis Turdakı köynəktikən Aqlaya Mişona tez bir məktub yazmışdı: məktubda, xanım Bonasyenin monastırdan çıxıb Lotaringiya və ya Belçikaya getməsi üçün kraliçadan ıcazə almasını ondan xahiş etmışdı, çünki belə ışləri düzəltmək üçün onun tanışları çox idi. Məktubun cavabı tez gəlmişdi. Səkkiz, ya on gündən sonra Aramıs Aqlaya Mışondan belə bir kağız aldı:

*"Mənim əziz əmioğlum!*

*Bizim yazıq qulluqçu qızın Betün monastırından çıxması üçün bacımdan aldığım icazənaməni sizə göndərirəm; madam ki, sizin fikrinizcə monastırın havası onun üçün zərərlıdir, qoy belə olsun. Mənim bacım bu içazənaməni sizə böyük məmnuniyyətlə verdi, çünki o, qızı çox istəyir və sonraları da ona kömək etmək ümidındədır.*

*Öpürəm sizi.*

*Aqlaya Mişon".*

Məktuba belə bir kağız da əlavə edılmışdı.

*"Betün monastırı başçısı, bu yaxınlarda həmin monastıra girən və mənim hamiliyim altında olan müdavimi bu məktubu təqdim edən adamın himayəsinə verməlidir.*

*Luvr, 10 avqust 1628-ci il.*

*Anna"*

Kralıçanı öz bacısı adlandıran bu köynəktikən qadının Aramislə qohumluğu məsələsi cavanları son dərəcə güldürmüşdü. Aramis Portosun kobud zarafatlarından qulağının ucuna qədər qızararaq

demişdi ki, bir də bu məsələ haqqında kim bircə kəlmə də söz söyləsə, mən öz əmim qızına daha heç bir şey üçün müraciət etməyəcəyəm.

Bu qayda ilə muşketyorlar arasında Aqlaya Mişon barəsində daha söhbət olmadı: bir də ki, onlar xanım Bonasyenin Betün monastırından azad edilməsinə müvəffəq olmuşdular. Lakin, nə qədər ki, onlar Laroşel ətrafındakı düşərgədə, yəni Fransanın o biri başında idilər, kraliçanın göndərdiyi kağızın heç bir köməyi ola bilməzdi; buna görə də d'Artanyan məzuniyyət almaq üçün də Trevilə müraciət etmək istədi. Elə bu zaman da onlar eşitdilər ki, kral iyirmi muşketyorun mühafizəsi altında Parisə gedir və onlar da bu dəstəyə daxil edilmişlər.

Muşketyorlar çox bərk sevinirdilər. Şeylərini xidmətçilərinə verib qabaqca yola saldılar, özləri isə səhər tezdən yola düşdülər.

Kardinal əlahəzrət kralı Mozeyə qədər yola saldı və orada kralla nazir çox dostcasına bir-birindən ayrıldılar.

Kral əylənmək istədiyindən çox tələsirdi. Ayın 23-də Parisdə olmaq istəyirdi. Yolda arabir dayanıb sağsağanların uçuşuna baxırdı: bu, Lüdovikin ən çox zövq aldığı şeylərdəndi. İyirmi muşketyordan on altısı bu fasilələrdən çox xoşlanırdı. Lakin bizim dostlarımız buna lənət oxuyurdular. Xüsusilə bu, d'Aranyanı darıxdırırdı, qulağı da ki, elə daima cingildəyirdi. Portos bunu belə izah etdi:

Bir kübar xanım mənə demişdi ki, qulağın cingildəməsi o deməkdir ki, səni haradasa xatırlayırlar.

Nəhayət, onlar ayın 23 də gecə Parisə çatdılar. Kral cənab de Trevilə təşəkkür etdi və muşketyorları dörd gün sərbəst buraxmağa ona icazə verdi; lakin bunu da tapşırdı ki, gərək ictimai yerlərdə görünməsinlər, görünsələr tutulub Bastiliyaya göndəriləcəklər.

Çox asanlıqla başa düşmək olar ki, hamıdan əvvəl bizim dörd dostumuz getməyə icazə aldı. Atos xahiş edərək de Trevildən dörd gün əvəzinə altı günlük məzuniyyət götürdü, hətta bir kələk işlədərək iki gecə də buna əlavə etdi: de Trevil onların məzuniyyətini ayın 25-dən hesaba almışdı.

Məlumdur ki, d'Artanyan heç vaxt heç şeydə tərəddüd etməzdi.

Aman Allah! dedi. Mənə elə gəlir ki, biz lap boş bir şey üstündə narahat oluruq. İki gündə mən iki-üç atı yorub (eybi yoxdur, pulum var!) özümü Betünə yetirərəm, monastır başçısına kraliçanın kağızını verib öz sevgilimi Lotarinkiyaya və ya Belçikaya deyil, düz Parisə gətirərəm; cənab kardinal Laroşel ətrafında ikən mən onu



burada yaxşıca gizlədərəm, hərbi səfərdən qayıdandan sonra da, Aramisin əmisi qızının himayəsindən istifadə edərək, kraliçanın köməyilə biz arzumuza nail olarıq. Siz burada qalın, özünüzü boş yerə yormayın. Mən Planşe ilə bu işin öhdəsindən gələrəm.

Bunun müqabilində Atos sakitcə dedi:

– Bizim də pulumuz var: brilyant üzükdən payıma düşəni mən hələ şəraba verib içməliyəm. Portosla Aramis də hələ öz var-dövlətini yeyib qurtarmamışlar. Deməк bizim bir at deyil, dörd at qovub yormağa yaxşıca imkanımız var. Ancaq siz nəzərə alın ki... – O elə tutqun bir halda danışmağa başladı ki, d'Artanyan bundan diksindi. Siz nəzərə alın ki, Betün o şəhərdir ki, orada kardinal, ayağı dəydiyi yerdə bədbəxtlik törədən bir qadınla görüş təyin etmişdi. Əgər siz dörd kişiyə qarşı durmalı olsaydınız, mən sizi tək buraxa bilərdim. Lakin sizin işiniz o qadınla olacaqdır. Dördümüz də gedərik, Allah elə eləsin ki, biz hamımız dörd də xidmətçimizlə onun öhdəsindən gələ bilək.

D'Artanyan bərkdən:

Atos, dedi, – siz məni qorxudursunuz! Siz axı nədən ehtiyat edirsiniz?

Hər şeydən!

D'Artanyan diqqətlə yoldaşlarına baxdı. Onların da üzündə böyük bir narahatlığın ifadəsi oxunurdu.

Ayın 25-də, axşam dörd dost Arrasa gəlib çatdı. D'Artanyan bir stəkan çaxır içmək üçün "Qızıl mala" mehmanxanası qabağında atdan düşdü. Bu zaman bir atlı karvansaradan çıxıb atını çapa-çapa Parisə tərəf sürməyə başladı. Darvazadan bayıra çıxanda külək onun, isti avqust axşamına baxmayaraq, büründüyü plaşın yaxasını açdı; şlyapasını da az qaldı başından vurub salsın, amma o yenə də şlyapasını cəld gözləri üstünə basdı.

D'Artanyan bu adama diqqətlə baxırdı; birdən onun rəngi ağappaq ağardı, stəkan əlindən yerə düşdü.

Planşe soruşdu:

Ağa, sizə nə oldu? Cənablar, tez köməyə gəlin, cənab d'Artanyanın halı pisdir!

D'Artanyanın dostları tez Planşenin çığırtısına yüyürdülər: onlar d'Artanyanın özündən getdiyini zənn etmişdilər, lakin onun öz atına sarı cumduğunu görüb təəccüb elədilər. D'Artanyanı saxladılar.

Atos çığıraraq dedi:

Hara yüyürürsən, bir dayan görək!
D'Artanyan bərkdən:
– Odur! – dedi. Həmın adamdır! Qoyun onu tutum!
Atos:
O kımdır? – deyə soruşdu.
O, həmin adamdır!
– Hansı adamdır?
Bu, həmin məlun adamdır ki, mən həmişə bır bədbəxtlik üz verməzdən qabaq ona rast gəlirəm; o, həmişə rezalət törədən bir iblisdir; ilk dəfə o dəhşətli qadına rast gələndə bu adam onun yanında idi; bizim dostumuz Atosu mən duelə çağıranda mənim axtardığım bu adam ıdı: xanım Bonasyeni götürüb qaçanda mən həmın bu adama rast gəlmişdim! Mən onu gördüm, o özü ıdi! Mən onu tanıdım.
Atos düşüncəli halda dedi:
Lənət şeytana!
– Atlara minin, cənablar, atlara! Onun dalınca gedək Bız onu qovub tutarıq. Aramis sözə qarışdı:
– Əzizim, o, Parisə sarı getdi. Onun mindiyi at təzədir, bizimkılər isə yorulmuşdur. Biz onu qovub tuta bilmərik. D'Artanyan, bu kişidən əl çəkək, gedək o qadını xilas edək.
Bir uşaq tövlədən çıxdı, – atını çapıb gedən naməlum adamın dalınca yüyürərək çığıra-çığıra dedi:
– Hey, ağa! Ağa! Bu kağız sizin şlyapanızdan duşdü. Hey, ağa, dayanın!
D'Artanyan onun qabağını kəsdi:
- Dostum, yarım pistol versəm o kağızı mənə verərsənmi?
Buyurun, ağa, lap canla-başla verərəm! Alın! Uşaq pulu alıb, sevinə-sevinə karvansara həyətinə qayıtdı. D'Artanyan vərəqi açıb baxdı.
Dostları onun başına toplaşaraq soruşdular:
Orada nə yazılıb!
D'Artanyan cavab verdi:
– Bircə kəlmə söz yazılıb.
Aramis:
– Bəli, dedi, – amma bu ya bir şəhərin, ya da kəndin adıdır.
Portos yazılanı oxudu:
– "Armantyer". Mən belə bır yer tanımıram.



Atos da yazıya baxdı:
Bunu mıledi öz əli ilə yazmışdır!
D'Artanyan:
- Bu kağızı möhkəmcə gizlətmək lazımdır, – dedi. Bəlkə də mən o pulu heç havayı yerə sərf eləməmişəm. Atlara minin, dostlar, atlara!
Dörd yoldaş atlarını çapa-çapa Betünə tərəf sürdü.

## XXXI

## BETÜN KARMELİTLƏRİ MONASTIRI

Çox vaxt əlverişli bir vəziyyət caniləri bütün təhlükələrdən qurtarır, bütün maneələri rədd etməyə onlara kömək eləyir; ancaq bu, müəyyən bir vaxta kimi olur; nəhayət, onlar tutduqları işin xəcrini çəkirlər, gec-tez layiq olduqları cəzaya çatırlar.
Miledi ilə də belə oldu. O, iki millətin hərbi gəmiləri arasından sağ-salamat keçib getməyə müvəffəq oldu, başına heç bir iş gəlmədən özünü Bulona yetirdi.
Portsmutda o, özünü fransızlar tərəfindən Laroşeldən qovulan bir ingilis kimı qələmə verdi, amma iki gün yol gəlib Bulona çatandan sonra dönüb fransız oldu, guya ıngilislər Fransaya nifrət etdıklərındən onu Portsmutda incidirdilər.
Bir də ki, onun əlində gözəllik və əliaçıqlıq kimi çox etıbarlı bir pasportu vardı.
Onun əlini öpən qoca liman rəisinin nəzakəti ilə miledi adı gömrük rəsmiyyətlərindən canını qurtardı və Bulonda çox az qaldı, elə ancaq poçt ilə aşağıdakı məktubu göndərdi.
*"Laroşel ətrafındakı düşərgəyə, kardinal de Rişelye həzrətlərinə.*
*Kardinal həzrətləri rahat ola bilər. Bekinhem hersoqu cənabları Fransaya gəlməyəcəkdir.*
*Bulon, 25 avqust, axşam.*

*xxx*
*Miledi.*

*P.S. Kardinal həzrətlərinin arzusu mövcibincə mən Betünə, karmelitlər monastırına gedirəm, sizin sərəncamınızı orada gözləyəcəyəm"*

Doğrudan da, elə o axşam mıledi yola düşdü. Gecəni bir mehmanxanada qalıb səhər saat beşdə yenə yoluna davam etdi; üç saatdan sonra Betünə çatdı. Karmelıtlər monastırının yerini öyrənib dərhal ora getdi.

Monastır başçısı onun qabağına çıxdı: miledi kardinalın əmrini ona göstərdi. Onu dərhal bir otağa aparıb yemək verdilər.

Miledinin hafizəsindən keçmiş silinmişdi; o ancaq gələcək haqqında düşünür, böyük mənsəb və şan-şöhrət sahibi olacağını indidən görürdü; çünki tapşırılan çətin vəzifəni o, çox asanlıqla yerinə yetirmiş, hətta özü şəxsən bu qanlı işdə iştirak etməmişdi. Miledini içində yeyib-gəmirən yeni-yeni arzu və ehtiraslar, onu, göy üzündə üzən, gah lacivərd, gah qırmızı rəngə çalan, gah da göz işləməz fırtına zülmətinə tutulan, yerdə ancaq viranəlik və ölüm izləri buraxan buluda oxşadırdı.

Səhər yeməyindən sonra monastır başçısı onun görüşünə gəldi; monastırda əyləncə az olduğundan, yumşaqürəkli monastır başçısı təzə qonağı ilə tanış olmağa tələsirdı.

Mıledi də istəyirdi ki, bu adamın xoşuna gəlsin.

Buna görə də mehriban və xoş rəftarlı olmağa çalışırdı Yumşaqürəkli monastır başçısı onun xarici gözəlliyinə, hərəkət tərzinə, ürək açan hadisələr söyləmək bacarığına məftun olmuşdu. O, özü zadəgan ailəsindəndi, sarayda baş verən hadisələrdən söhbət edilməsini çox sevirdi, çünki bu barədə monastır divarları içində çox az şey eşitmək olurdu

Mıledi fransız sarayındakı, kralın qədərsiz dindarlığı ilə kəskin bir vəziyyət təşkil edən əxlaq yüngüllüyündən danışdı; saray senyorları və xanımlarının (monastır başçısı bunların adını çox yaxşı bilirdi) biabırçı macəraları ilə tanış etdi; sözarası kraliçanın Bekinhem hersoqunu sevməsinə də bir işarə vurdu, ümumiyyətlə, qarşısındakını açıq danışmağa cəlb etmək üçün daha bir çox şeylərdən söhbət açdı.

Lakin monastır başçısı onun dediklərinə ancaq qulaq asır və gülümsəyirdi, özü isə bircə kəlmə də danışmırdı. Miledi, onun belə söhbətlərdən xoşu gəldiyini görüb sözünə davam etdi və birdən sözü gətirib kardinalın üstünə çıxartdı. Lakin o, böyük bir çətinlik qarşısında idi: monastır başçısının kral ya kardinal tərəfdarı olduğunu bilmirdi, buna görə də ehtiyat üçün orta bir mövqe tutmağa çalışırdı; monastır başçısı isə ondan daha ehtiyatlı tərpənirdi: mıledi kardinal həzrətlərinin hər dəfə adını çəkəndə o, başını aşağı salırdı.



Miledi bu xoştəbiətli monastır başçısının nə dərəcə təvazökar olduğunu bilmək üçün kardinal haqqında söylənilən dedı-qodulardan, onun xanım d'Egilyonla, Marion Delormla və başqa qadınlarla olan sevgi macəralarından danışmağa başladı.

Monastır başçısı onun sözlərinə daha diqqətlə qulaq asır və getgedə həvəslənirdi. Mıledı düşünərək öz-özünə dedi: "Yaxşı, o yavaş-yavaş mən istəyənə gəlir; o, kardınalçı olsa da, hər halda fanatizmdən uzaq bir adamdır".

Bunu öz-özlüyündə təyin etdikdən sonra, kardinalın öz düşmənlərini təqib eləməsindən söhbət açdı. Monastır başçısı bu sözlərə qarşı nə müsbət, nə də mənfi əlaqə göstərir, ancaq xaç vururdu.

Miledi bundan belə bir nəticə çıxartdı ki, monastır başçısı kardinalçı deyil, bəlkə kral tərəfdarıdır.

O, get-gedə daha cəsarətlə danışmağa başladı.

Nəhayət monastır başçısı dedi:

- Mənim belə şeylərdən başım çıxmaz. Ancaq, biz saraydan və kübar cəmiyyətini maraqlandıran məsələlərdən nə qədər uzaq olsaq da, bizim əlimizdə sizin söylədiklərinizin doğruluğunu təsdiq edən könül bulandırıcı sübutlar vardır: bizim pansionda olan qadınlardan biri cənab kardinalın əlindən çox-çox əzab çəkmişdir.

Miledi soruşdu.

– Sizin pansionda olan qadınlardan biri? Ah, aman Allah, aman Allah! Yazıq qadın, mən onun halına çox acıyıram.

Siz haqlısınız; o yazığın halına acımamaq olmaz: onun başına nələr gətirməyiblər: dustaqxana, hər cür hədə qorxu... Sonra da əlavə etdi: – Görünür cənab kardinal bunu havayı yerə eləməyib, yəqin ki, buna müəyyən səbəblər vardır... Doğrudur, bu qadın üzdən lap mələk kimidir, ancaq insanı bir zahiri görünüşünə əsasən tanımaq çətindir.

Miledi yenə öz-özünə düşünərək dedi: "Çox gözəl! Kim bilir, bəlkə də mən burada bəzı şeylər öyrənə biləcəyəm".

O, öz simasına ən məsumanə bır ifadə verməyə çalışdı:

Heyhat! Bu, mənə məlum bir məsələdir; doğrudan da, deyirlir ki, insanın zahiri görünüşünə inanmaq olmaz. Bəs onda axı nəyə inanmaq lazımdır? Ola bilsın ki, mən bütün ömrüm boyu aldanacağam, ancaq siması mənə xoş gələn bır adama mən həmişə inanıram.

Siz inanarmısınız ki, bu qadının heç bir taqsırı yoxdur?

Miledi ona belə cavab verdi:

- Cənab kardinal ancaq cinayət işləyənləri təqib eləmir; elə xeyirxah adamlar var ki, o, bunları bədxah adamlardan da bərk izləyir.

Monastır başçısı dedi:

– Xanım, icazə verin, sizə bir şey söyləyim, mənə elə gəlir ki, bu, çox qəribədir.

Miledi sadəlövhcəsinə soruşdu:

Nə qəribədir?

– İndicə dediyiniz.

Miledi gülümsəyərək soruşdu:

Mənim sözümdə qəribə nə var ki?

Siz kardinalın dostusunuz. Sizi buraya o göndərib, amma siz...

Miledi monastır başçısının sözünü tamamladı:

Amma mən onun pisliyinə danışıram, eləmi?

Hər halda siz onun haqqında heç yaxşı bir şey söyləmirsiniz.

Miledi ah çəkdi:

Bu, ona görədir ki, mən onun dostu deyiləm; mən onun əlində giriftar olub qalmışam.

- Bəs onun sizi mənə tövsiyə etdiyi məktubu?

– Bu, məktub deyil, bu, mənim burada dustaqda qalmağım üçün bir əmrdir; onun tərəfdarlarından biri məni azad edənə kimi mən burada qalacağam.

Bəs onda siz niyə qaçmadınız?

– Mən hara qaça bilərəm? Sizin fikrinizcə, dünyada elə bir yer var ki, mən ora getmək istəsəm kardinal məni axtarıb tapa bilməz? Yenə kişi olsaydım... Arvadın əlindən nə gələr? Sizin pansionda olan o gənc qadın yoxsa qaçmaq istəyirdi?

Yox, qaçmaq istəmirdi... Mənə elə gəlir ki, Fransada onu saxlayan sevgidir...

Miledi yenə də ah çəkərək dedi:

Əgər o sevirsə, demək, hələ o qədər də bədbəxt deyil. Monastır başçısı get-gedə artan bir maraqla llalediyə baxaraq sözünə davam etdi:

– Demək siz də kardinalın əlində giriftar olub qalanlardansınız?

– Bəli!

Monastır başçısı miledini nəzərdən keçirərək ehtiyatla soruşdu:

Siz bizim müqəddəs dinin düşməni deyilsiniz ki?

Miledi bərkdən dedi:



– Mənmi? Mən protestantam? Yox, yox, Allah özü şahiddir ki, mən qeyrətli və təəssübkeş bir katolikəm.

Monastır başçısı gülümsədi:

Xanım, əgər belə isə onda arxayın ola bilərsiniz: yaşayacağınız bu ev sizin üçün çox da ağır bir dustaqxana olmayacaq, sizin bu dustaqxananı sevməniz üçün biz əlimizdən gələni edərik. Siz burada o gənc qadını da görərsiniz. O, çox mehriban, xoştəbiətli bir insandır.

- Onun adı nədir?

Çox əsilzadə bir xanım onu mənə Ketti adı ilə tövsiyə etmişdir. Ancaq mən heç onun əsl adını öyrənməyə cəhd etmirəm.

Miledi soruşdu:

– Ketti? Necə? Siz bunu yəqin bilirsiniz?

Bəli, xanım. Yoxsa siz onu tanıyırsınız?

Miledi bu gənc qadının keçmiş qulluqçu qızı olduğunu düşünərək gülümsədi. Qisas almaq ehtirası onun üzünü eybəcərləşdirdi.

Bu cavan xanımı nə vaxt görə bilərəm? İndidən mən ona qarşı dərin bir məhəbbət duyuram.

Elə bu axşam, hətta istəsəniz lap gündüz də görə bilərsiniz. Ancaq siz söylədiniz ki, dörd gün yol gəlmisiniz, bu gün də səhər saat beşdə durmusunuz, yəqin dincəlmək istəyirsiniz. Yatın, dincəlin. Günorta yeməyinə sizi çağırıb ayıldarıq.

Miledi yatmaya da bilərdi, bununla belə o, yenə də monastır başçısının təklifini qəbul etdi. On dörd-on beş gün idi ki, o, elə ağır həyəcanlı hallar keçirmişdi ki, ruhən dincəlməyə böyük ehtiyac hiss edirdi.

Monastır başçısı getdikdən sonra o, dadlı intiqam ümidləri içində yatağına girdi.

Kardinalın verdiyi vədlər yadına düşdü. Miledi müvəffəqiyyət qazanmışdı. D'Artanyan indi onun əlində idi.

Ancaq bircə şey onu qorxudurdu: o da ərinin sağ qalması idi. O elə bilirdi ki, qraf de La Fer ölmüşdür, ya da Fransanı tərk edib getmişdir, lakin qəflətən ona rast gəldi və məlum oldu ki, o, miledinin ən qəddar düşməninin – d'Artanyanın dostudur.

Əgər o, d'Artanyanın dostu idi, demək kardinal həzrətlərinə qarşı fitnə fəsad törədən d'Artanyana kömək edirdi. Əgər o, d'Artanyanın dostu idi, demək kardinalın düşməni idi; belə olan surətdə miledi gectez onu elə bir intriqa toruna salar ki, oradan o bir daha canını qurtara bilməz.

Bunlar hamısı dadlı ümidlər idı. Çox keçmədi ki, miledı bu ümidlər nəşəsi içində yuxuya getdi.

Yatağı yanındakı yavaş səsdən ayıldı. Gözünü açarkən monastır başçısı ılə gursaçlı, zərifüzlü gənc bir qadın gördü.

Bu qadının sıması ona, qətiyyən, tanış deyildi. Onlar bir-birinə xoşa gələn adi sözlər söyləyir, eyni zamanda, diqqətlə bir-birinə baxırdılar, onlar hər ikısı gözəldi, lakin bu gözəllikləri tamamilə birbirindən fərqlənırdı.

Mıledi qürurla gülümsədi: onun boy buxunu, duruşu, baxışı, kübarcasına hərəkətləri onu gənc qadından xeyli üstün göstərirdi. Ancaq burası vardı ki, onlar başqa-başqa vəziyyətdə idılər. Gənc qadının sadə monastır paltarı hər kəsdə olsa, zahırı görünüşünü poza bilərdi.

Monastır başçısı getdi.

Gənc qadın miledinin qalxmadığını görüb monastır başçısının ardınca getmək istədi, amma miledi onu saxladı:

– Xanım, siz ki indicə gəlmisiniz, olmaya məni tək qoyub getmək istəyirsiniz? Düzünü deyim ki, mən sizin gəlmənizə azacıq da olsa ümid edirdim. Axı bura adamı yaman darıxdırır.

Yox, xanım, mən ancaq ondan qorxurdum ki, bəlkə vaxtında gəlməmiş olam: siz yatmışdınız, sizi yol yormuşdur.

Miledi bərkdən dedı:

Çox böyük şeymiş! Yatan adamlar nəyi arzu edə bilərlər? Yuxudan sevinclə ayılmağı. Siz məni bu iltifata nail etdiniz. İndi icazə verin mən bundan məmnuniyyətlə istifadə edim.

Bunu deyib gənc qadının əlindən tutdu və onu yatağı yanındakı kresloda oturtdu.

Gənc qadın:

Allah, mən nə qədər bədbəxtəm! – dedi. – Altı aydır ki, burada bır dustaq kimi tək-tənha yaşayırdım. İndi siz gəldiniz; sizin gəlişınız mənim ürəyimi aça bılərdi, ancaq bu elə bir vaxta düşdü ki, mən yəqin kı, buranı tərk etməli olacağam, özü də bunu hər dəqiqə gözləyirəm.

Miledi soruşdu:

Necə? Sız monastırdan getmək istəyirsiniz?

Gənc qadın heç də gizlətmək istəmədiyi bir sevinclə dedi:

– Hər halda mən buna arxayınam.

Eşitdiyimə görə kardinal sızə çox əziyyətlər verib, bu, bizi birbirimizə daha artıq yaxınlaşdıra bilərdi.



– Deməк, bizim mərhəmətli anamız doğru deyirmiş? Siz də o bədxah keşişin əlində giriftar olub qalmısınız?

Mıledı onu ehtiyatlı olmağa dəvət etdi:

- Yavaş! dedı. Hətta buranın özündə də ondan danışmaq olmaz Mən də ona görə bədbəxt oldum ki, dost zənn etdiyim bir qadına eynən belə bir soz dedim, o da mənə xəyanət elədi. Demək siz də bir xəyanət qurbanısınız?

Gənc qadın:

Yox, dedi, mən sevdiyim bir qadına olan sədaqətimin qurbanıyam; o qadına oz canımı da qurban etməyə hazırdım, hətta lap ındı də qurban edə bilərəm.

O da sizi unutdu, eləmi?

Mən o qədər haqsız idim ki, belə düşünürdüm; amma iki-üç gün bundan əvvəl, tamamilə, bunun əksini gördüm, bunun üçün də Allaha dua elədim, onun məni unutmağını düşünmək, bılirsınızmı, mənə nə qədər ağır gəlırdi! Lakin, xanım, siz gərək ki, azadsınız, qaçmaq ıstəsəydiniz, qaçardınız.

Mən dostum olmadan, pulsuz-parasız, tanımadığım bir yerdə hara qaça bilərdim? Mən axı əvvəlləri bu yerdə heç olmamışam.

Gənc qadın bərkdən:

– Siz hara getsəniz, orada dostlarınız olacaqdır: siz o qədər mərhəmətli görünürsünüz, siz o qədər gözəlsiniz ki!

Miledinın üzündə məsumanə bir təbəssüm titrədı.

Ancaq bunlar məni təklikdən və təqib olunmaqdan qətıyyən xilas etmir.

– Həmişə ümidini Allaha bağla. Görülən bır yaxşı iş, gec-tez bizim üzümüzü Allahın yanında ağ eləyəcək. Bəlkə də elə bizim burada goruşməyimiz sizin üçün bir xoşbəxtlik olacaqdır; ona görə ki, buradan çıxandan sonra, mən nə qədər əhəmiyyətsız, nə qədər adamsız olsam da, sizə də bir neçə güclü, iş bacaran dost tapa bilərəm ki, onlar məni xilas edən kimi, sizi də xilas edərlər

Miledı açıq danışmaqla bu qadını da açıq danışmağa məcbur edəcəyinə əmin idi.

Mən desəm də ki, təkəm, hər halda bır neçə yüksək rütbəli dostum vardır; ancaq çox təəssüf ki, bu dostlarım özü də kardinalın qabağında tir-tir əsirlər. Hətta kraliça özü də bu qorxunc nazirin sözünə zidd gedə bilmir. Mənim əlimdə belə bir sübut vardır ki,

ülyahəzrət kraliça, nə qədər mərhəmətli bir qəlbə malik olsa da, ona xidmət göstərən adamlardan bir neçəsini kardinal həzrətlərinin hiddətinə qurban verməyə məcbur olmuşdur.

Xanım, mənə inanın: kraliça özünü elə göstərə bilər ki, guya dostlarını unutmuşdur, amma zahiri görünüşə əsasən hökm yürütmək olmaz: belə adamlar nə qədər çox təqib olunsa bu adamlar haqqında o daha artıq düşünür və onlar heç gözləmədiyi halda görürlər ki, kraliça heç də onları unutmamışdır.

Miledi·

Mən buna inanıram, - dedi. - Kraliça çox mərhəmətli insandır.

Gənc qadın heyrət və sevinclə dedi:

- Siz bizim gözəl, nəcib kraliçamız haqqında belə danışırsınızsa, demək, onu tanıyırsınız!

Miledi qədərindən artıq açıq hərəkət etdiyini duyaraq sözünə davam etdi:

Yəni, mən kraliça ilə şəxsən tanış olmaq iltifatına nail olmamışam, ancaq onun ən yaxın dostlarından bir çoxunu tanıyıram: mən cənab de Pütanı tanıyıram, mən İngiltərədə cənab Düjarla bir neçə dəfə görüşmüşəm, mən cənab de Trevillə tanışam.

Gənc qadın bərkdən dedi:

Cənab de Trevillə? Siz cənab de Trevillə tanışsınız?

– Bəli, yaxşı tanışam, hətta çox yaxından tanışam.

– Elə isə siz görəcəksiniz ki, biz çox tezliklə görüşəcəyik, hətta dost da olacağıq! Əgər siz cənab de Trevillə tanışsınızsa, yəqin ki, onun evinə də getmisiniz, eləmi?

Miledi yalanının baş tutduğunu görüb elə bu yolla da axıra qədər getmək qərarına gəldi:

– Bəli, çox getmişəm.

Yəqin ki, onun muşketyorlarına da orada rast gəlmisiniz?

Söhbətin bu yeri miledini son dərəcə maraqlandırmağa başladı.

Adəti üzrə öz evində qəbul etdiklərinin hamısını tanıyıram.

– Tanıdıqlarınızın bir neçəsinin adını söyləyin, onda görəcəksiniz ki, onlar mənim dostumdur.

Miledi özünü itirdi:

– Lakin mən cənab de Suvinyi, cənab de Kurtivronu, cənab de Ferüssakı tanıyıram...

Qadın susurdu; miledinin dayandığını görüb soruşdu:



– Siz Atos adlı bir zadəganı tanıyırsınızmı?

Miledinin rəngi kətan kimi ağardı; o, özünü ələ almağı bacarsa da həyəcanını gizlədə bilmədi. Gənc qadının əlini qamarlayıb tutdu.

Yazıq qadın ondan soruşdu:

Sizə nə oldu? Aman Allah, yoxsa sizə pis bir söz dedim?

– Yox, o ad məni heyrətə saldı; çünki mən də o zadəganı tanıyırdım, onun sizə təsadüf etməsi mənə qəribə göründü: görünür siz onunla yaxşı tanışsınız.

- Əlbət ki! Çox yaxşı tanışam! Bir onunla deyil, onun dostları olan cənab Portosla və cənab Aramislə də tanışam.

– Doğrudanmı? Mən də onları tanıyıram. O bütün bədənindən soyuq bir gizilti keçdiyini hiss etdi.

Elə isə, əgər siz onları tanıyırsınızsa, onda gərək siz onların mərhəmətli, yaxşı bir yoldaş olduqlarını da biləsiniz. Sizə kömək lazım idisə, bəs niyə onlara müraciət etmədiniz?

Miledi özünü itirmiş halda dodaqaltı dedi:

Mən onlarla tanış deyiləm, aramızda siz deyən həqiqi dostluq yoxdur. Mən onları ancaq uzaqdan-uzağa tanıyıram: onların dostu cənab d'Artanyan var, mən ondan onların barəsində bir çox şeylər eşitmişəm.

Gənc qadın bərkdən:

Siz cənab d'Artanyanı tanıyırsınız? – deyərək miledinin əlini tutdu.

Sonra miledinin üzündə qəribə bir ifadə görüb əlavə etdi.

Bağışlayın, xanım, mən sizdən bir şey soruşum: sizin onunla əlaqəniz necədir?

Miledi karıxmış halda dedi:

- O... mənim dostumdur.

- Xanım, siz məni aldadırsınız; siz onun aşnası olmusunuz!

Siz olmusunuz onun aşnası, miledi ona cavab verdi.

Mən?

- Bəli, siz. İndi mən sizi tanıdım: siz xanım Bonasyesiniz.

Gənc qadın heyrət və dəhşət içində geri çəkildi. Miledi təkidlə:

Boynunuza alın, boynunuza alın, - dedi.

- Yaxşı da, nə olsun ki? Bəli, mən xanım Bonasyeyəm. Demək biz rəqibik?

Miledinin üzündə elə bir vəhşicəsinə ifadə göründü ki, ayrı bir vaxtda xanım Bonasye qorxu içində onun yanından qaçardı, lakin indi qısqanclıq onu saxladı.

Xanım Bonasye təkidlə soruşdu:

Xanım, cavab verin: siz onun aşnası olmusunuzmu? – Bu sözləri o, elə bir qüvvətlə söylədi ki, bunu ondan heç gözləmək olmazdı.

Miledi də ona elə bir səslə cavab verdi ki, onun səmimiliyinə inanmamaq olmazdı:

– Yox! – dedi. – Heç vaxt! Heç vaxt!

Mən sizin sözünüzə ınanıram. Ancaq bəs nıyə elə həyəcanla səsləndiniz?

Mıledi artıq özünü ələ almışdı:

Siz bunun səbəbini başa düşmürsünüzmü?

Haradan başa düşə bılərəm. Mən ki, heç bir şey bilmirəm.

Sız başa düşmürsünüzmü ki, cənab d'Artanyan mənim dostum olurkən öz sirlərini açıb mənə söyləmişdir?

Doğrudanmı?

– Siz başa düşmürsünüz ki, mən hər şeyi bilirəm: sizin Sen-Kludakı kiçik evdən oğurlandığınızı, d'Artanyanın kədərlənməsini, yoldaşlarının sizi axtarmasını və tapa bilməməsini... İndi mən birdən, heç gözləmədiyim halda, sizə rast gəlirəm, – mən buna təəccüb etməyə bilərdimmi? Heç bilirsinizmi sizin haqqınızda biz onunla necə tez-tez danışardıq, heç bilirsinizmi o, sizi nə qədər sevır? Ah, əziz Kovstansiya, nəhayət, mən sizi tapdım, nəhayət, mən sizı gördüm!

Miledı əllərını xanım Bonasyeyə sarı uzatdı.

*Xanım Bonasye*·

Ah, məni əfv edin, əfv edin, – deyərək miledini qucaqladı. – Bılsəniz, mən onu nə qədər sevirəm!

İki qadın bir dəqiqəyə qədər bir-birini qucaqlayıb durdu. Əgər miledinin gücü nifrəti barəbərində olsaydı, xanım Bonasyeni elə bu saat qucağında boğub öldürərdi.

Lakin bunu bacarmadığından o gülümsədi:

– Ah mənim gözəlim, mənim quzum! Mən nə qədər xoşbəxtəm! Qoyun bır doyunca sizə baxım!

Bunu deyərək gənc qadına elə baxdı ki, sanki onu gözlərilə yemək istəyirdi.

– Bəli, lap siz özünüzsünüz. Ah! O, mənə sizin barədə danışmışdı. Mən sizi indi tanıyıram, elə tanıyıram ki, elə bil özüm sızinlə lap əvvəldən tanışam.



– Əgər o, mənim çəkdiyim əzablardan sizə danışıbsa, onda mən deməmişdən də özünüz mənim nə qədər iztirab çəkdiyimı bilərsınız... Ancaq onun əzabını çəkmək özü böyük xoşbəxtlikdir!

Miledi düşünmədən dərhal dedi:

Bəli, xoşbəxtlikdir.

O tamamılə başqa bır şey haqqında düşünürdü.

Xanım Bonasye sözünə davam etdi:

Ancaq bundan sonra mən daha ıztırab çəkməyəcəyəm: sabah, lap elə bəlkə bu gün, mən yenə də onu görəcəyəm, o vaxt gördüyüm ağır günlər bir tüstü kimi əriyib yox olacaqdır.

Bu sözlər miledını fikrındən ayırdı:

Bu axşam? Sabah? Siz bununla nə demək istəyirsiniz? Yoxsa siz d'Artanyandan bir xəbər gözləyirsiniz?

– Mən onun özünü gözləyirəm.

Onun özünü? Siz d'Artanyanı gözləyirsiniz?

– Bəli.

– Bu mümkün olan şey deyil: o, Laroşel ətrafındakı düşərgədədir. O ancaq şəhər alınandan sonra geri qayıdacaq.

Sız elə düşünürsünüz? Lakin dünyada mənim nəcıb, namuslu d'Artanyanım üçün mümkün olmayan şey varmı?

Mən sizin sözünüzə inana bilmərəm.

Elə isə, alın oxuyun. Bədbəxt qadın qürur və şadlıq həyəcanı *içində mılediyə bır məktub verdi.*

Miledi məktuba baxıb düşündü: "Xətt xanım de Şevrözün xəttidir! Hə! Mən bilirdım ki, onlar bu yolla bir birilə əlaqə saxlayırlar".

O, səbirsizliklə bu sətirləri oxudu:

*"Mənim əziz balam, hazır olun: bizim dostumuz bu yaxında sizi görəcəkdir, ona görə görəcəkdir ki, qorunmaq üçün gizləndiyiniz həbsxanadan sizı xilas etsin. Getməyə hazırlaşın. Həmişə də bizim köməyimizə əmin ola bilərsiniz*

*Bizim əziz qaskoniyalımız həmişəki kimi yenə də igid və sədaqətli olduğunu göstərdi; ona söyləyin ki, etdiyi xəbərdarlığa görə bəzi yerdə ona öz təşəkkürlərini bildirirlər".*

Miledi:

– Bəli, bəlı, – dedi, – bəli, bu məktub daha heç bir şübhəyə yol vermır. Bu edilən xəbərdarlığın nədən ibarət olduğunu siz bilırsınız?

– Yox, bilmirəm, ancaq belə güman edirəm ki, o yəqin kardinalın yeni bir fitnə-fəsadı haqqında kraliçanı xəbərdar etmişdir.

Miledi məktubu xanım Bonasyeyə qaytardı.

Bəli, şübhəsiz ki, bu belədir!

Elə bu anda at ayağı səsi eşidildi. Xanım Bonasye pəncərəyə sarı yüyürdü.

Ah, görəsən odurmu?

Miledi heyrətdən donub qaldı: yatağından heç qalxmadı da. Bu az vaxtda o bir çox gözlənilməz hadisələrə rast gəlmişdi, lakin həyatında birinci dəfə idi ki, özünü tamamilə itirirdi.

Pıçıldayaraq dedi:

Odur? Odur? Doğrudanmı odur?

- Çox təəssüf ki, o deyil Bu mənim tanımadığım bir adamdır. Amma özü bura gəlir. Bax atının cilovunu çəkdi; darvaza ağzında dayandı; indi də zəngi basır

Miledi yatağından sıçradı:

Siz yəqin bilirsiniz ki, bu d'Artanyan deyil?

Əlbəttə ki, bilirəm!

Bəlkə əməlli baxmamısınız?

Mən onu şlyapasındakı bir lələkdən, lap plaşının uçundan tanıyıram.

Miledi geyinirdi.

Deyirsiniz ki, o adam bura gəlir?

Bəli. O artıq içəridədir.

– O ya sizin yanınıza gəlir, ya da mənim!

– Aman Allah! Siz nə yaman həyəcan içindəsiniz!

Bəli, etiraf edirəm ki, mən sizin kimi, hər adama etibar eləyən deyiləm, mən hər şeydən ehtiyat edirəm.

Doğrudan da, qapı açıldı, monastır başçısı içəri girib miledidən soruşdu:

Siz Bulondanmı gəlmisiniz?

Bəli. Məni soruşan kimdir?

Kardinal tərəfindən gəlmiş bir cənabdır, ancaq adını söyləmək istəmir.

– O məni görməkmi istəyir?

O, Bulondan gəlmiş qadını görmək istəyir.

Elə isə, xanım, rica edirəm buyurun, gəlsin.



Xanım Bonasye dedi:

Aman Allah! Görəsən o, bir pis xəbər-zad gətirməyib ki?..

Qorxuram ki, sizin söylədiyiniz doğru ola.

Mən sizi bu naməlum adamın yanında qoyub gedirəm. Ancaq o gedən kimi icazə versəniz yenə yanınıza gələrəm.

Əlbət ki, gələrsiniz, rica edirəm!

Monastır başçısı və xanım Bonasye otaqdan çıxdılar.

Miledi tək qaldı, gözlərini qapıya zillədi: çox keçmədi ki, pilləkəndə mahmız səsi eşidildi, sonra qapı açıldı, naməlum adam içəri girdi.

## XXXII

## İKİ MÜXTƏLİF İBLİS

Miledi də, Roşfor da birdən çığıraraq dedi:

– Ah, sizsiniz!

Bəli, mənəm.

Miledi soruşdu:

Siz haradan gəlirsiniz?

– Laroşeldən. Bəs siz?

İngiltərədən.

– Bekinhem hersoqu necə oldu?

– Ya ölüb, ya da bərk yaralanıb.

Roşfor gülümsəyərək dedi:

– Hə! Lap yaxşı! Kardinal həzrətləri bunu eşidib çox sevinəcək. Siz bunu ona bildirmisinizmi?

– Bulondan ona kağız yazmışdım. Bəs siz haradan bura gəlmisiniz?

Kardinal həzrətləri sizin barədə narahat idi, mənə əmr etdi ki, sizi axtarım tapım.

– Mən dünən gəlmişəm.

– Dünəndən bəri nə eləmisiniz?

Vaxtımı havayı yerə itirməmişəm.

– Mən buna şübhə etmirəm!

– Bilirsinizmi mən burada kimə rast gəldim?

– Yox.

Sızcə kim ola bilər?

Mən haradan bunu bilərəm?

Kralıçanın dustaqxanadan buraxdırdığı gənc qadına!

D'Artanyanın aşnasına?

Bəli, xanım Bonasyeyə. Onun yerı kardinala məlum deyildir.

– Çox gözəl! Bu da ıkinci bir yaxşı xəbər! Cənab kardinalınkı gətirir də, zor deyil ki!

Heç bilirsiniz bu qadınla üz-üzə gələndə mən nə qədər təəccüb etdim, siz bunu təsəvvür edə bilməzsiniz.

O sizi tanıyırmı?

– Yox.

Demək siz onun üçün yad bir adamsınız.

Miledi gülümsədi:

Mən onun ən yaxşı dostuyam!

Əziz qrafinya, and olsun namusuma, belə möcüzələri ancaq siz icad edə bılərsiniz!

– Mən bura lap vaxtında gəlmişəm. Bilirsinizmi burada nələr olur?

Yox.

Sabah, ya o biri gün kraliçanın əmrilə onun dalınca gələcəklər.

- Doğrudanmı? Kim gələcək?

– D'Artanyan öz dostları ilə.

Nəhayət, onlar bizi o yerə gətirəcək ki, tutub hamısını Bastiliyaya basmağa məcbur olacağıq.

Bəs niyə bu vaxta kimi bunu eləməmisiniz?

Cənab kardinal bu adamlara qarşı nədənsə zəiflik göstərir, mən bunun səbəbini heç anlaya bilmirəm.

Doğrudanmı?

- Bəli.

Roşfor, kardinala bu sözləri deyərsiniz; deyərsiniz ki, bizim "Qızıl Göyərçin hini" mehmanxanasındakı söhbətımizi o dörd cavan eşitmişdir; kardinal mənim yanımdan gedəndən sonra onlardan biri gəldi, kardınalın mənə verdiyi mühafizə vərəqəsını dartıb əlımdən aldı. Kardinala bunu da deyərsiniz ki, mənim İngiltərəyə getdıyimi bu adamlar lord Vıntерə xəbər verıblər, brilyant boyunbağı məsələsi kımi, bu dəfə də onlar az qalmışdı ki, tapşırığı yerınə yetirməyə mane olsunlar. Bu dörd adamdan ancaq d'Artanyanla Atos təhlükəlidir. Aramıs xanım de Şevrözün aşnasıdır Onu sağ qoymaq olar Onun sırri bizə məlumdur, o hətta bizə xeyir də verə bilər. Portos isə axmağın, ədəbazın, sarsağın biridir, ona heç baş qoşmaq da lazım deyil.



Ancaq bu dörd qoçaq gərək ki, indi Laroşelin mühasirəsındədir.

– Mən də elə düşünürdüm. Lakin xanım Bonasye baş komandanın arvadından aldığı məktubu, öz axmaqlığı üzündən, ehtiyatsızlıq edərək mənə göstərdi; orada yazılıb ki, o dörd adam xanım Bonasyeni oğurlamaq üçün bura gələcəkdir.

- Gör ha! Bəs onda nə etmək lazımdır?

– Kardinal mənim haqqımda sizə nə tapşırıb?

Tapşırıb ki, ondan şifahi və yazılı məlumat aldıqdan sonra dərhal poçt atları ilə onun yanına qayıdım. O, sizin barədə məlumat aldıqdan sonra, gələcək işləriniz haqqında sizə lazımi sərəncamlar verəcəkdir.

– Deməк mən burada qalmalıyam?

– Burada, ya bura yaxın bir yerdə.

– Siz məni özünüzlə apara bilməzmisiniz?

Yox, mənə müəyyən tapşırıq verilib. Düşərgə ətrafında sizi tanıya bilərlər; sizin orada olmağınız kardinal həzrətlərini biabır eləyə bilər.

– Deməк, mən ya burada, ya da bu ətrafda qalmalıyam?

– Bəli. Ancaq siz kardinalın əmrini harada gözləyəcəyinizi mənə söyləyin. Mən sizin harada olduğunuzu həmişə bilməliyəm.

- Qulaq asın. Yəqin ki, mənim burada qalmağım yaxşı olmayacaq.

– Niyə?

– Mənim düşmənlərimin hər dəqiqə bura gələcəyini siz unudursunuz.

Bu, doğrudur. Ancaq xanım Bonasye yenə də kardinal həzrətlərinin əlindən çıxacaqdır.

Miledinin üzündə ancaq ona xas olan bir təbəssüm göründü:

– Pah, siz bir şeyi unudursunuz: mən ki onun ən yaxın dostuyam...

Hə, doğrudur! Deməк, mən kardinala söyləyə bilərəm ki...

O lap arxayın ola bilər.

– Elə bu?

– Bunun nə demək olduğunu o başa düşər.

– Başa düşər. Yaxşı, indi mən nə etməliyəm?

Elə bu saat geri qayıtmalısınız. Sizin ona apardığınız xəbər tələsməyinə dəyər.

– Lilyeyə girəndə mənim arabam sındı.

– Çox gözəl.

Necə yəni çox gözəl?
– Sizin arabanız mənə lazımdır.
Bəs onda mən necə gedərəm?
– At ilə.
– Bunu sözlə demək asandır: yüz səksən lye yolu atla getmək sizə zarafat gəlməsin
Bu nədir ki!
Tutaq ki, elədir. Sonra?
Sonra, Lilyedən keçib gedəndə arabanı mənə göndərərsiniz və xidmətçinizə də tapşırıq verərsiniz ki, mənim əmrimdən çıxmasın.
Yaxşı
Yəqin ki, sizin yanınızda kardinalın yazılı bir əmri vardır?
Mənə ixtiyar verilib ki, istədiyim kimi hərəkət edim.
Siz o kağızı monastır başçısına göstərərsiniz və deyərsiniz ki, bu gün, ya sabah bu qadının dalınca gələn olacaq, o, mənim göndərdiyim adamla getməlidir.
- Çox yaxşı.
– Monastır başçısı ilə mənim haqqımda danışanda kəskin ifadələr işlətməyi unutmayın.
– Bu niyə?
– Elə göstərmək lazımdır ki, guya mən kardinalın əlində giriftar olub qalmışam. Mutləq o yazıq xanım Bonasyenin etibarını qazanmaq lazımdır.
Tamamilə doğrudur. İndi siz başınıza gələn əhvalatın hamısını yazmaq istəyirsinizmi?
– Kağız itə bilər. Sizin yaddaşınız yaxşıdır. Sizə söylədiklərimin hamısını təkrar edin görüm.
– Bunu doğru deyirsiniz. İndi mən hər şeyi bilməliyəm: siz harada olacaqsınız, daha mən boş-boşuna o yan-bu yanı axtarmayım.
– Bunu düz deyirsiniz. Bir dayanın.
– Xəritə lazımdırmı?
Yox, mən bu yerləri çox yaxşı tanıyıram.
- Siz? Siz nə vaxt burada olmusunuz?
Mən burada tərbiyə almışam.
Doğrudanmı?
– Görürsünuz ki, bəzən tərbiyə özü də adama gərək olur.
– Siz məni harada gözləyəcəksiniz?



– Qoyun bir balaca fikirləşim. Mən sizi Armantyerdə gözlərəm.
Armantyerdə? Armantyer nə deməkdir?
Lis çayı kənarında balaca bir şəhərdir. Çayı keçdimmi, mən artıq xarici bir dövlət torpağında olacağam.
– Çox gözəl! Yəqin ki, siz çayı ancaq təhlükəli bir vəziyyət əmələ gələndə keçəcəksiniz, elə deyilmi?
Əlbət ki.
Belə bir şey olsa, onda mən sizin harada olduğunuzu necə bilim?
– Xidmətçiniz sizə lazım deyil ki?
– Yox.
Ona arxayın olmaq olarmı?
- Lap yaxşı. O sınaqdan çıxmış adamdır!
Onu verin mənə; o yerdən ki gedəcəyəm, mən onu orada qoyaram, o da sizi mən olan yerə gətirər.
– Siz deyirsiz ki, məni Armantyerdə gözləyəcəksiniz?
– Bəli.
Bunu bir parça kağıza yazıb mənə verin ki, yadımdan çıxmasın. Şəhərin adı ki, bizi rüsvay eləməz, elə deyilmi?
– Kim bilir! Mən lap özümü də rüsvay etməyə hazıram.
Roşfor:
Yaxşı, – deyib miledinin verdiyi bir parça kağızı aldı, qatlayıb fetr şlyapasının astarının arasına qoydu. – Hər halda narahat olmayın; kağızı itirsəm də, mən, bir uşaq kimi, bütün yol uzunu bu kəlməni təkrar edə-edə gedəcəyəm: yadımdan çıxmaz. Deyəsən, məsələni qurtardıq.
Deyəsən.
Yoxlayaq: hersoq ölmüş, ya ağır yaralanmışdır; sizin kardinalla olan söhbətinizi dörd muşketyor eşitmişdir; sizin Portsmuta getməyiniz lord Vintərə xəbər verilmişdir; Atosla d'Artanyanı – Bastiliyaya; Aramis, xanım de Şevrözün aşnasıdır. Portos özünə güvənən bir axmaqdır; xanım Bonasye tapılmışdır; sizə tez araba göndərmək; xidmətçini sizin ixtiyarınıza vermək; monastır başçısı yanında sizin kardinal əlində giriftar olub qaldığınızı göstərmək; Armantyer Lis çayı qırağındadır. Beləmi?
Doğrudan da, sizin gözəl hafizəniz varmış. Ancaq bunlara bir şey də artırın.
– Nəyi?

- Mən monastır bağına bitişik qəşəngcə bir meşə görmüşəm. Deyin ki, o meşədə gəzməyə mənə icazə versinlər: kim bilir, bəlkə də mən dal həyət qapısından getməli olacağam.

Siz hər şeyi qabaqcadan nəzərə alırsınız!

– Siz bır şeyi unutmusunuz...

– Nəyi?

Məndən soruşmağı kı, sızə pul lazımdırmı?

– Tamamilə doğrudur. Nə qədər lazımdır?

Nə qədər kı, özünüzlə qızıl götürmüsünüz, hamısı.

– Mənim, təxminən, beş yüz pistolum var.

Məndə də o qədər olar. Min pistolla hər bır təhlükəni sakitcə qarşılamaq mümkündür. Ciblərinızi boşaldın.

- Yaxşı! İndı gedırsınız?

Bir saatdan sonra. At üçün gərək adam göndərəm. İndi bir az çörəkdən-zaddan yeyim.

Çox gözəl, sağ olun, kavaler!

Sağ olun, qrafinya!

Kardınaldan xahiş edin ki, məni mükafatlandırsın.

Siz də mənim mükafatlandırılmamı iblisdən xahiş edin.

Miledi ilə Roşfor bir-birinə baxaraq gülümsəyib ayrıldılar. Bir saatdan sonra Roşfor atını dördnala çapa-çapa geriyə qayıtdı; beş saatdan sonra da Arrasdan keçib getdi.

Bizım oxucularımız d'Artanyanın bu adamı necə tanıdığını, bununla da dörd muşketyorun qorxaraq getdikləri yerə tələsməyə məcbur olduqlarını bilir.

## XXXIII

## BİR DAMLA SU

Roşfor gedən kimi xanım Bonasye miledinin yanına qayıtdı; onun kefini açıq gördü.

Bəli, o şeydən ki, siz qorxurdunuz, o oldu: bu gün axşam, ya sabah kardinal sizin dalınızca adam göndərəcək.

Miledi soruşdu:



– Quzum, bunu sizə kim söylədi?

Qasıdın öz dilindən eşitdim.

Gəlin, bax burada, mənim yanımda oturun.

Baş üstə.

- Dayanın. Bizım söhbətimizə qulaq asan olar; qoy bir o yan-bu yana baxım.

Belə ehtiyatlı olmaq niyə lazımdır?

Bu saat bilərsiniz.

Miledi qapını açdı, dəhlizə baxdı, sonra da qayıdıb xanım Bonasyenin yanında oturdu.

Deməк o, öz rolunu yaxşı oynayıb.

Kim?

Monastır başçısına özünü kardinalın qasidi kimi tanıtdıran adam.

Demək, o kələk gəlirmiş?

– Bəli, quzum.

– Demək, o adam...

Miledi səsini alçaldaraq dedi:

O adam mənim qardaşımdır. Xanım Bonasye bərkdən dedi:

– Sizin qardaşınızdır?

– Quzum, yalnız siz bu sirri bilməlisiz. Əgər bunu bir adama açıb desəniz, demək, mən məhv oldum, bəlkə siz də.

Aman Allah!

İndi qulaq asın, görün nə olub. Qardaşım bura mənim köməyimə gəlirmiş, mümkün olsa məni lap güclə azad etmək fikrində imiş. Yolda kardinalın mənim dalımca göndərdiyı qasidinə rast gəlir. Qardaşım onun dalınca düşür. Adamdan xalı bir yerə çatdıqda qılıncını çıxarır, qasiddən apardığı kağızı tələb edir; qasid vermir, qardaşım da onu öldürür...

Xanım Bonasye dəhşət içində tıtrəyərək dedi:

Ah!

- Başqa cür də etmək olmazdı. Sonra qardaşım məsələni güclə deyıl, hiylə ilə başa çatdırmaq qərarına gəlir. Kağızı qasidin cibindən götürür və kardinalın qasidi adı ilə bura gəlir. Bir ya iki saatdan sonra kardinal həzrətləri adından mənim dalımca kareta gələcək.

Başa düşürəm: bu karetanı sizin qardaşınız göndərəcək, eləmi?

Bəli. Mən hələ hamısını deyib qurtarmadım. Siz ki məktub almısınız, elə bilirsiniz ki, onu xanım de Şevröz göndərib?

Bəs necə?

O, saxta məktubdur.

Neçə yəni?

Bəli, saxtadır. Sizə elə tələ qurublar ki, sizi aparmağa gələndə müqavimət göstərməyəsiniz.

– Mənim dalımca d'Artanyan gələcək!

– İnanmayın! D'Artanyanla dostları Laroşel ətrafındakı düşərgədədirlər.

Siz bunu haradan bilirsiniz?

– Mənim qardaşım yolda kardinalın muşketyor paltarı geymiş adamlarına rast gəlmişdir. Sizi aldadıb qapıya çağıracaqlar, oğurlayıb Parisə aparacaqlar.

Aman Allah! Mən bu xəyanət qarışıqlığı içində lap başımı itirirəm. Əllərini üzünə apararaq əlavə etdi: Belə getsə mən dəli olacağam.

- Dayanın...

– Nə var ki?

At ayağı səsi eşidirəm: mənim qardaşımdır, gedir. İstəyirəm onunla bir də görüşüm. Gedək.

Miledi pəncərəni açdı və xanım Bonasyeni işarə ilə yanına çağırdı.

Roşfor çapa-çapa gedirdi.

Miledi qışqıraraq dedi:

Yaxşı yol, qardaş!

Atlı bu iki qadını görüb başını qaldırdı, atını saxlamadan əli ilə miledini dostcasına salamladı.

Miledinin üzünə kədərli bir ifadə çökdü və pəncərəni örtə-örtə dedi:

Mərhəmətli Jorj.

O, yenə də öz yerində oturdu, özünü elə göstərdi ki, guya dərin fikrə getmişdi.

Xanım Bonasye ona müraciət edərək:

– Bağışlayın, xanım, dedi, sizi fikrinizdən ayırıram. İndi siz mənə nə məsləhət görürsünüz? Aman Allah! Siz məndən təcrübəlisiniz; deyin görüm, mən nə etməliyəm?

- Hər şeydən əvvəl, bunu deyim ki, bəlkə də mən səhv eləyirəm: d'Artanyan, doğrudan da, öz dostları ilə sizin köməyinizə gələcək.

Xanım Bonasye bərkdən dedi:



Ah, nə yaxşı olardı! Belə bir xoşbəxtlik haradandı!

Onda məsələ bircə şeydən asılı olacaqdır: görək kim tez gələcək. Sizin dostlarınız əvvəl gəlsə, demək siz xilas oldunuz, yox, kardinalın adamları əvvəl gəlsə, demək siz məhv oldunuz.

Ah, bəli, bəli, heç də mənə rəhm etməyəcəklər, məni məhv edəcəklər Bəs mən nə etməliyəm, nə etməliyəm?

Bunun çox asanca bir yolu vardır.

O nədir? Söyləyin.

Sizin dalınızca gələn adamların kim olduğunu bilənə kimi yaxın bir yerdə gizlənmək lazımdır.

Harada axı?

Bu barədə heç narahat olmayın. Mən özüm bir neçə lye buradan uzaq bir yerdə gizlənib qardaşımı gözləyəcəyəm... İstəyirsiniz sizi də aparım, ikimiz bir yerdə gizlənib gözlərik!

Məni axı buradan buraxmazlar. Mən burada elə bil ki, dustaqdayam.

– Burada elə zənn edirlər ki, mən kardinalın tələbi üzrə gedirəm. Sizin mənimlə gedəcəyiniz heç kəsin ağlına da gəlməz.

Sonra?

Kareta gələndə siz mənimlə vidalaşmağa gələrsiniz və axırıncı dəfə məni qucaqlamaq üçün karetanın pilləkəninə qalxarsınız. Qardaşımın xidmətçisinə qabaqcadan tapşırılıb: bu vaxt o, arabaçıya işarə edəcək, o da arabanı bərk sürüb gedəcək.

Birdən d'Artanyan gəldi? Birdən d'Artanyan gəldi?

Biz bunu da bilərik.

Necə bilərik?

- Bundan asan nə var ki. Mənim qardaşımın xidmətçisini Betünə göndərərik; bu adama tamamilə bel bağlamaq olar. O, paltarını dəyişib monastırla üzbəüz bir yerdə otaq tutar. Kardinalın adamları gəlsə, o heç yerindən də tərpənməz, d'Artanyan öz dostları ilə gəlsə, onları götürüb bizim yanımıza gətirər.

Məgər o onları tanıyır?

O, d'Artanyanı bir neçə dəfə mənim yanımda görmüşdür.

Ah, bəli, bəli, siz doğru deyirsiniz. Hələ ki, işimiz çox yaxşı gedir Ancaq buradan çox uzağa getməyək...

Yeddi, ya səkkiz lyedən uzağa getməyəcəyik. Sərhəddə dayanacağıq; qorxulu bir hadisə üz verən kimi Fransanı tərk edərik.

– Bəs o vaxta kimi nə edək?

Gözləyək.

– Birdən onlar gəldilər?

Mənim qardaşımın karetası daha tez gələcək.

– O vaxt ki, sizin dalınızca gələcəklər, onda mən sizdən uzaqda olsam, məsələn, bu vaxt mən nahar eləsəm, ya axşam yeməyi yemiş olsam, onda necə olar?

– Onda belə etmək lazımdır...

Nə etmək?

– Siz monastır başçısına deyin ki, mən o qadının yanında daha çox olmaq istəyirəm; xahiş edin ki, mənimlə bir yerdə nahar eləməyə sizə icazə versin.

– İcazə verərmi?

Niyə verməz?

– Belə olsa, çox yaxşı: biz bir dəqiqə də bir-birimizdən ayrılmarıq.

İndi gedin, bunu ondan xahiş edin. Başımda bir ağırlıq hiss edirəm, gedim bir az bağda gəzim.

Gedin. Ancaq sizi harada tapa bilərəm?

Bir saatdan sonra burada olacağam.

Ah, sizə təşəkkür edirəm. Siz nə mərhəmətlisiniz!

Mən sizə, sizin kimi gözəl, cazibəli bir qadına kömək etməyə bilərəmmi? Məgər siz mənim ən yaxşı dostlarımdan birinin dostu deyilmisiniz?

– Əzizim d'Artanyan! Bilirsinizmi o sizə necə təşəkkürlər edəcək!

Yəqin. Biz hər şeyi şərtləşib müəyyən etdik; indi də aşağı enək.

– Siz bağa gedirsiniz?

– Bəli.

Bu dəhlizlə gedin, sonra da balaca bir pilləkəndən düşərsiniz.

Çox gözəl. Təşəkkür edirəm.

Onlar mehribanca gülümsəyərək ayrıldılar.

Miledi düz demişdi: onun, doğrudan da, başı ağrıyırdı. Onun planı hələ özünə də tamamilə aydın deyildi. Öz fikirlərini nizama salmaq üçün o, mütləq bir qədər tək qalmalı idi.

Hər şeydən əvvəl, xanım Bonasyeni mümkün qədər tez oğurlamaq, etibarlı bir yerdə gizlətmək, müvəffəqiyyətsizlik üz verərsə, onu bir girov kimi saxlamaq lazımdır Miledi bu dəhşətli mübarizənin yaxşı nəticə verə bilməyəcəyindən qorxmağa başlamışdı; çünki onun



düşmənləri də onun özü qədər inad göstərirdilər. O, tufanın yaxınlaşdığını hiss edirdi; hiss edirdi ki, məsələnin sonu yaxınlaşır; bu da çox dəhşətli olacaqdır.

D'Artanyan xanım Bonasyeni sevdiyi üçün onun həyatını öz həyatından üstün tuturdu. Miledi bu işdə müvəffəqiyyət qazanmasaydı, xanım Bonasye d'Artanyanla danışıq aparmaq, əlverişli şərtlər qəbul etmək üçün ona kömək edə bilərdi. Bu məsələ yoluna qoyulmuşdu: xanım Bonasye tamamilə ona inanır, onun ardınca gedirdi. D'Artanyanın Betünə gəlmədiyini Armantyerdə ona çox asanlıqla inandırmaq olardı. Roşfor iki həftədən sonra qayıdacaqdır; miledi də bu on beş gündə dörd dostdan necə qisas almaq məsələsini düşünərdi. Allaha çox şükür ki, o darıxmayacaqdı, çünki vaxtını, qisas planını ətraflı düşünmək, mükəmməl bir şəklə salmaq kimi çox gözəl bir şeylə keçirəcəkdi.

Gəzə gəzə bağı gözdən keçirirdi; fikrində bağın topoqrafik xəritəsini tərtib etdi. Miledi, hər şeyi qabaqcadan nəzərə alan təcrübəli bir sərkərdə kimi, hərəkət edirdi; elə bir sərkərdə ki, qalibiyyət əldə etməyi hazırlarkən, eyni zamanda məğlub olmaq məsələsini də nəzərə alıb lazımi tədbirlər görür ki, vuruşmanın gedişində irəlimi getməyi, ya gerimi çəkilməyi müəyyən edə bilsin.

Bir saat keçdi. Miledi asta bir səs eşitdi. Xanım Bonasye onu çağırırdı. Mərhəmətli monastır başçısı onun xahişini yerinə yetirmişdi: hər iki qadın bir yerdə axşam yeməyini yeməyə getdi.

Həyətə girəndə bir kareta səsi eşitdilər: kareta gəlib darvaza ağzında dayandı. Miledi qulaq asaraq dedi:

Eşidirsinizmi?

Bəli. Deyəsən, kareta gəldi.

Bunu mənim qardaşım göndərib.

Aman Allah!

Əzizim, cəsarətli olun!

Monastırın darvaza zəngi vuruldu. Miledi səhv etmirdi.

O, xanım Bonasyeyə dedi:

Öz otağınıza gedin, yəqin ki, sizin qiymətli bir şeyiniz vardır ki, özünüzlə götürmək istərsiniz.

Bəli, d'Artanyanın məktubları var.

Gedin onları götürün və mənim yanıma qayıdın. Biz gərək tez yemək yeyib özümüzü bərkidək, bəlkə bütün gecəni yol gedəsi olduq.

Xanım Bonasye döşlərindən tutaraq bərkdən dedi:

Aman Allah! Mənim nəfəsim tutulur, mən yeriyə bilmirəm!

– Cəsarətli olun! Bunu bilin ki, siz on beş dəqiqədən sonra xilas ediləcəksiniz, bütün bunları da siz onun üçün edirsiniz.

– Bəli, bəli, hamısı onun üçün! Siz elə bircə bu sözlə mənə ürək verdiniz. Gedin, mən sizin yanınıza gələrəm.

Miledi cəld öz otağına qalxdı və Roşforun xidmətçisini otaqda gördü. Ona lazımi tapşırıqlar verdi; xidmətçi darvaza ağzında durub gözləyəcəkdi. Təsadüfən muşketyorlar gəlmiş olsa, karetanı dərhal çapa-çapa sürüb aparacaqdı, monastırın tinindən döndərib meşənin o tərəfində, xırdaca kəndin yanında miledini gözləyəcəkdi. Miledi də monastır bağının qapısından çıxıb piyada o kəndə gedəcəkdi. Miledinin bu yerlərə yaxşı bələd olduğu bizə məlumdur. Muşketyorlar gəlməsə, hər şey əvvəlcədən müəyyənləşmiş qayda ilə olacaqdı

Xanım Bonasye miledinin otağına gəldi. Miledi gənc qadının şübhələnməməsi üçün onun yanında Roşforun xidmətçisinə öz tapşırığının ikinci hissəsini söylədi.

Sonra xidmətçiyə kareta haqqında bir neçə sual verdi. Məlum oldu ki, karetaya üç at qoşulmuşdur. Roşforun xidmətçisi qabaqda getməli idi.

Miledi, xanım Bonasyenin şübhələnəcəyindən lap nahaq yerə qorxurdu: o, son dərəcə ürəyi təmiz bir qadındı, miledinin hiylə və xəyanət işlətdiyinə qətiyyən şübhə etmirdi. O, monastır başçısından qrafinya Vinter adını eşitmişdi, lakin onun kim olduğunu bilmirdi. Bu qadının onun həyatında belə dəhşətli, fəlakətli bir rol oynadığını heç ağlına gətirə bilməzdi.

Xidmətçi bayıra çıxandan sonra miledi dedi:

Görürsünüz ki, hər şey hazırdır. Monastır başçısı elə bilir ki, kardinal mənim dalımca adam göndərib. Bu adam hər şeyi yoluna qoyacaqdır. İndi siz heç olmasa bir şey yeyin, bircə damcı da olsa şərab için, sonra da gedək.

Xanım Bonasye təkrar etdi:

– Bəli, gedək.

Miledi onu öz qabağında oturtdu, ona bir qədəh İspaniya şərabı tökdü, boşqabına da bir parça çolpa əti qoydu.

– Görürsünüzmü, hər şey bizim xeyrimizə olur. Budur, hava da qaralır. Hava açılana kimi biz öz məskənimizə çatarıq, heç kəs də bilməz ki, biz haradayıq. Di cəsarətli olun, bir şey yeyin.



Xanım Bonasye heç də düşünmədən cəld bir neçə parça ət yeyib dodaqlarını şərabla islatdı.

Miledi qədəhi onun ağzına apararaq təkidlə dedi:

– Di bir az şərab için, bir mənə baxın, siz də mənim kimi edin.

Elə bu anda o, xeyli uzaqdan gələn at ayağı səsi eşitdi. Səs getdikcə yaxınlaşırdı. Harada isə at kişnədi.

Miledinin rəngi qaçdı. Pəncərəyə yüyürdü. Xanım Bonasyenin bütün bədəni titrədi, ayağa qalxdı, yıxılmamaq üçün stula söykəndi.

Hələ heç bir şey görünmürdü, ancaq at ayağı tappıltısı get gedə daha aydın eşidilirdi.

Xanım Bonasye soruşdu:

– Aman Allah, bu nə səsdir?

Miledi özünə xas olan bir soyuqqanlılıqla dedi:

Ya bizim dostlarımız, ya da düşmənlərimiz gəlir. Bir azca dayanın, bu saat mən sizə bunların kim olduğunu deyərəm.

At ayağı tappıltısı daha aydın eşidilirdi. Səs gələn yerdə yol, yana dönürdü. Atlılar görünmürdülər, lakin nal səsindən atların miqdarını təyin etmək mümkündü.

Miledi çox diqqətlə uzağa baxdı. Hava hələ o qədər qaralmamışdı, gələnləri tanımaq olardı.

Yolun burulan yerində sürətlə ötüb keçən atlıların şlyapalarının havada titrəyən lələkləri onun gözünə sataşdı. Əvvəl iki, sonra beş, ən axırda da səkkiz atlı göründü. Onlardan biri hamısından qabaqda gəlirdi.

Miledi tutqun bir səslə inildədi: o, d'Artanyanı tanımışdı.

Xanım Bonasye bərkdən dedi:

Aman Allah! Orada nə olub?

– Mən cənab kardinalın qvardiyaçıları mundirini görürəm. Bir dəqiqə belə itirmək olmaz. Qaçaq, qaçaq!

– Hə, hə, qaçaq! Lakin dəhşət onu bürüdüyündən o heç yerindən tərpənə də bilmədi.

Atlıların pəncərə qabağından ötüb getdikləri eşidildi.

Miledi gənc qadının əlindən dartaraq çığırırdı:

– Gəlin də! Di gəlin! Fürsət varkən bağdan qaçaq; məndə açar var... Di tez olun, beş dəqiqədən sonra qaçmaq mümkün olmayacaq.

Xanım Bonasye yerimək istədi, iki addım atdı, lakin qıçları kirdən düşüb dizləri üstə yıxıldı. Miledi istədi onu qaldırıb aparsın, amma gücü çatmadı.

Elə bu anda təkər səsi eşidildi; qaçıb gedən karetanın dalınca üç-dörd güllə atıldı.

Miledi gənc qadına:

– Axırıncı dəfə sizdən soruşuram, dedi. Getmək istəyirsinizmi?

Allah, Allah! Siz özünüz görürsünüz ki, taqətdən düşmüşəm. Yerimdən tərpənə bilmirəm. Siz qaçın.

Təkmi? Sizi burada qoyum? Yox, yox! Heç vaxt!

Birdən o dayandı. Gözlərində məşum bir ildırım çaxdı. Mizə sarı cumdu, xanım Bonasyenin qədəhinə nə isə tökdü, – bunu o son dərəcə tez etdi.

Bu, buğda dənəsinə oxşayan qırmızı bir şeydı, elə o saat da şərabın içində əridi. Sonra əli titrəmədən qədəhi götürüb gənc qadına dedi:

– Bu şərabı için, sizə qüvvət verər, için!

Qədəhi qadının ağzına apardı. Xanım Bonasye şərabın hamısını içdi. Miledi boş qədəhi miz üstə qoyaraq iblisanə bir təbəssümlə dedi:

Ah, mən öz qisasımı belə almaq istəmirdim. Çarə nədir, nə mümkünsə onu eləmək lazımdır.

Bunu deyib otaqdan bayıra cumdu.

Xanım Bonasye miledinin qaçdığını gördü; ancaq yerindən tərpənməyə taqəti yox idi.

Bir neçə dəqiqə keçdi. Darvaza bərk döyüldü. Xanım Bonasye miledinin qayıtmasını gözləyirdi. Onun od kimi yanan alnını soyuq tər basdı.

Nəhayət o, dəmir barmaqlıqlı darvazanın cırıltısını eşitdi, pilləkəndən çəkmə, mahmız, adam səsi gəldi. Xanım Bonasyeyə elə gəldi ki, deyəsən onun adını çəkirlər.

Birdən o sevinclə qapıya sarı yüyürdü: d'Artanyanı səsindən tanımışdı.

D'Artanyan! d'Artanyan! deyərək qışqırdı. – Sizsiniz? Bura, bura gəlin!

Cavan oğlan onun səsinə səs verdi.

Konstansiya! Konstansiya! Haradasınız? Aman Allah!

Bir neçə adam otağa yüyürdü; xanım Bonasye özünü saxlaya bilməyib kreslo üstünə yıxıldı.

D'Artanyan hələ də tüstülənməkdə olan tapançasını yerə atıb öz sevgilisinin qabağında diz çökdü. Atos tapançasını toqqasına keçirtdi, Portos və Aramis isə siyrılmış qılınclarını qınına saldılar.



– Ah, d'Artanyan, mənim əzizim d'Artanyan! Nəhayət gəlib çıxdın, məni aldatmadın! Bu, doğrudan da, sənsənmi?

- Bəli, bəli, Konstansiya, mənəm! Axırda biz yenə bir-birimizə qovuşduq!

– O məni ha inandırmağa çalışdı ki, sən gəlməyəcəksən. Amma ürəyimə dammışdı ki, sən gələcəksən, ona görə də qaçmaq istəmirdim. Ah, nə yaxşı elədim ki, qaçmadım, mən nə xoşbəxtəmmiş!

Atos "o" sözünü eşitcək birdən dayandı.

D'Artanyan soruşdu:

– O? O dediyin kimdir?

Mənim dostum qadın. O, məni çox sevirdi, sevdıyı üçün də məni təqib edilməkdən qurtarmaq isteyirdi; o sizi kardınalın qvardiyaçıları hesab edərək qaçdı.

D'Artanyanın rəngi sevgilisinin ağ örpəyindən daha artıq ağardı:

– Sizın dostunuz? Siz hansı dostunuzu deyırsiniz?

– Karetası darvaza ağzında duran dostumu; sizı öz dostu hesab edən qadını.

D'Artanyan təkidlə soruşdu·

Onun adı, onun adı nə idi? Allah, yoxsa siz onun adını bilmırsiniz?

– Bilirəm, mənim yanımda onun adını söylədilər.. dayanın... Bu nədir? Aman Allah, başım gıcəlir, mən heç bır şey görmürəm.

D'Artanyan çığırdı:

Dostlar, bura gəlin, kömək edin! Əlləri lap buz kımidir. Halı xarab olur! Aman Allah! Şüurunu itirir!

Portos bərkdən köməyə çağırarkən, Aramis bır stəkan su tokmək üçün mizə sarı yüyürdü, lakin Atosun üzündə əmələ gələn dəyişikliyi görüb dayandı. Atos miz yanında durub, dəhşətlə boş qədəhə baxırdı. Sanki onun fikrində qorxunc bir şübhə əmələ gəlmişdi.

Atos:

- Yox, yox, – deyirdi, bu ola bilməz, Allah belə bir cinayətə yol verməz.

D'Artanyan qışqırırdı:

Su! Su! Su!

Atos qırıq bir səslə pıçıldayaraq öz-özünə deyirdi:

– Ah, yazıq qadın, yazıq qadın!

Xanım Bonasye d'Artanyanın öpüşlərilə canlanaraq yenə gözlərını açdı.

– Özünə gəlir! Allah, sənə çox şükür!
Atos xanım Bonasyedən soruşdu:
– Xanım, xanım, siz allah, deyin görüm, bu boş qədəh kimindir?
Gənc qadın güclə eşidiləcək bir səslə cavab verdi:
– Mənim.
Şərabı sizin qədəhə kim tökdü?
– O.
– "O" dediyin kimdir axı?
– Ax, yadıma düşdü: qrafinya Vinter.
Dörd dostun dördü də birdən səsləndi, – lakin Atosun səsi hamı sınkından bərk çıxmışdı.
Elə bu anda xanım Bonasyenin üzü göyərdi; ağrının şiddətindən Portosla Aramisin qolları arasına düşdü.
D'Artanyan dəhşət içində Atosun əlini qamarladı:
– Necə? Sənin fikrincə, lakin hönkürtü onu danışmağa qoymadı.
Atos öz həyəcanını gizlətmək üçün dodaqlarını çeynəyib qanatdı:
Məncə, hər şey ola bilər, – dedi.
Xanım Bonasye bərkdən səsləndi:
– D'Artanyan, d'Artanyan! Sən haradasan? Məni tək qoyub getmə, görürsən ki, mən ölürəm!
D'Artanyan Atosun əlini əsəbi halda sıxırdı; xanım Bonasyenin səsini eşidən kimi onun əlini buraxıb gənc qadının yanına yüyürdü.
Xanım Bonasyenin gözəl üzü tamamilə dəyişmişdi; sönük gözləri artıq heç bir şey ifadə etmirdi; bədəni qıclaşaraq titrəyir, alnını soyuq tər bürüyürdü.
– Siz allah, yüyürün, bir adam çağırın. Portos, Aramis, çağırın, köməyə gəlsinlər!
Atos:
– Bunun xeyri yoxdur, dedi, – xeyri yoxdur: onun verdiyi zəhərin padzəhri yoxdur.
Xanım Bonasye pıçıldayaraq deyirdi:
Hə, hə, kömək edin, kömək edin...
Sonra o, bütün qalan gücünü toplayaraq d'Artanyanın başını əlləri içinə aldı, onun üzünə elə baxdı ki, sankı bu son baxışla bütün könlünü ifadə etmək istəyirdi; sonra hönkürtü ilə ağlayaraq dodağını onun dodaqlarına yapışdırdı.
D'Artanyan çığırdı:



Konstansiya, Konstansiya!
Xanım Bonasyenin son nəfəsi ağzından çıxaraq d'Artanyanın dodaqlarına toxundu.
D'Artanyan onun cəsədini bağrına basmışdı. Birdən o çığıraraq hissiz halda öz sevgilisinin yanına yıxıldı. Portos ağlayırdı, Aramis əli ilə ona göyü göstərdi, Atos xaç vurdu.
Elə bu anda qapıda rəngi qaçmış bir adam göründü; o ətrafına baxaraq ölmüş bir qadını, bir də onun yanında hissiz halda yerə sərilib qalan d'Artanyanı gördü.
– Mən səhv etməmişəm, – dedi. – Bu, cənab d'Artanyan, bu da onun üç dostu: cənab Atos, Portos, Aramis.
Adları çəkilən üç muşketyor təəccüblə naməlum adama baxdı: onlar bunu haradasa görmüşdüdər.
Təzə gələn adam:
– Cənablar, dedi, – siz də mənim kimi bir qadını axtarırsınız, - onun üzündə qorxunc bir təbəssüm göründü. O, yəqin ki, burada olmuşdur, çünki mən burada insan cəsədi görürəm.
Üç dost kirimişcə ona baxırdı: naməlum adamın səsi də, üzü də onlara tanış gəlirdi, lakin onu harada gördüklərini xatırlaya bilmirdilər.
Naməlum adam sözünə davam etdi:
– Cənablar, belə görürəm ki, siz mənim kim olduğumu bilmək istəmirsiniz, amma siz məni ölümdən qurtarırsınız. Mən lord Vinterəm, o qadının... qaynıyam.
Üç dost heyrətlə bir-birinə baxdı.
Atos yerdən qalxıb əlini ona uzatdı:
Xoş gəlmisiniz, milord, dedi.
– Mən o qadından beş saat sonra Portsmutdan çıxmışam. Ondan üç saat sonra da Bulona gəlmişəm, ancaq Sent-Omerdə ona çatmağa iyirmi dəqiqə gecikdim. Lılyedə isə onun izini tamamilə itirdim. Bununla belə, yenə onu axtarmaqdan əl çəkmədim. Yolda birdən sizə rast gəldim: siz atları dördnala çapa çapa gedirdiniz; içinizdə cənab d'Artanyanı tanıdım. Sizi çağırdım, lakin cavab vermədiniz. Sizin ardınızca getmək istədim, ancaq atım çox yorulmuşdu, sizə çata bilməzdim. Siz çox tələsirdiniz, amma nədənsə yenə bura çox gec gəlib çıxmısınız
Atos xanım Bonasyenin meyitini və Portosla Aramisin, huşa gətirmək istədiyi d'Artanyanı lord Vinterə göstərərək dedi:

– Görürsünüzmü?
Lord Vınter dəhşət içində soruşdu:
– İkisi də ölubdürmü?
– Yox, cənab, d'Artanyan ancaq özündən gedib.
Lord Vinter:
– Allaha çox şükür ki, ölməyib, – dedi.
Elə bu anda d'Artanyan gözünü açdı.
O, Portosla Aramisin əlləri arasından dartınıb çıxdı və dəli kimi sevgilisinin cəsədi üstünə cumdu, hönkürtü ilə ağlamağa başladı.
Atos yerindən qalxdı, yavaş-yavaş və huznlə oz dostunun yanına getdi, onu mehribanca qucaqlayıb dedi:
– Dostum, kişi ol: ölünün üstə arvadlar göz yaşı tökərlər, kişilər isə onun qisasını alarlar.
D'Artanyan dedi:
– Bəli, bəli, elədir! Onun qisasını almaq üçün mən hər şeyə hazıram.
Qisas almaq ümidi d'Artanyanı az da olsa toxtatdı; Atos öz bədbəxt dostunun bu vəziyyətindən istifadə edərək Portosla Aramisə işarə etdi ki, gedib monastır başçısını çağırsınlar.
Muşketyorlar dəhlizdə monastır başçısına rast gəldilər: o həm özünü itirmişdi, həm də həyəcan içində idi; bir neçə monax qadını yanına çağırdı; qadınlar, monastır qayda-qanunu xılafına olaraq, kişilərin yanına gəldilər.
Atos d'Artanyanın qoluna girərək monastır başçısına dedi:
– Xanım, biz bu bədbəxt qadının meyitini sizin ixtıyarınıza veririk. Onu da öz bacılarınızdan biri hesab eləyin, o cür də onu rahatlayın. Biz onun qəbri üstündə dua eləməyə gələcəyik.
D'Artanyan üzünü Atosun döşünə qoyaraq hönkürtü ilə ağlamağa başladı.
Atos:
– Ağla, – dedi, – ağla, sənin qəlbin sevgi, həyat və gənclik duyğuları ilə doludur. Heyhat! Mən də çox istərdim ki, sənin kimi ağlaya bilim.
O, öz dostunu atalıq qayğısı ilə dilə tutaraq apardı; onu başı çox çox müsibətlər çəkmiş bir adam kimi, ovutmağa çalışdı.
Onlar beşi də, xidmətçilərlə bərabər, Betün şəhərinə yola düşdülər; monastır bunun yaxınlığında idi; yolda ilk rast gəldikləri mehmanxananın qabağında dayandılar.



D'Artanyan Atosdan soruşdu:
– Niyə biz o qadının dalınca getmirik?
– Sonra gedəcəyik. Mən bunun üçün bəzi tədbirlər görməliyəm.
Gənc sözünə davam etdi:
– O, əlimizdən çıxa bilər. Bax, Atos, o, əlimizdən çıxarsa, sonra sən müqəssir olarsan!
– Mən hamısına cavab verirəm.
D'Artanyan öz dostuna çox etibar edirdi, buna görə də heç bir söz deməyib, başını aşağı salaraq mehmanxanaya girdi.
Portosla Aramis bir-birinə baxdılar: onlar Atosun özünə belə arxayın olmasının səbəbini başa düşə bilmirdilər.
Lord Vinter öz-özlüyündə bu qərara gəldi ki, Atos bu sözləri d'Artanyana, az da olsa, təskinlik vermək üçün söyləmişdir.
Atos mehmanxanada beş boş otaq olduğunu öyrənib dedi:
– İndi, cənablar, hər kəs öz otağına getsin. D'Artanyanın ağlayıb ürəyini boşaltması və yatması üçün mütləq tək olması lazımdır. Mən hər şeyi boynuma götürürəm, arxayın ola bilərsiniz.
Lord Vınter sözə qarışdı:
– Əgər qrafinya haqqında bir tədbir görmək lazımsa, bu, mənə aid bir məsələdir; çünki o bizim gəlinimizdir.
Atos:
– Mənə də aiddir, – dedi, – çünki o mənim arvadımdır.
D'Artanyan gülümsədi: o, Atosun qisas alacağına əmin olduğunu bildi; belə olmasaydı, o öz sirrini açıb söyləməzdi. Portosla Aramis təəccüblə bir-birinə baxdılar. Lord Vınter elə zənn etdi ki, Atos dəli olmuşdur. Atos:
– Hər kəs öz otağına getsin, – dedi, – qoyun mən də istədiyim kimi hərəkət edim. Onun əri olduğum üçün bu məsələ ilə mən sizin hamınızdan çox maraqlanıram. D'Artanyan, o adamın şlyapasından düşən kağızı, əgər itirməyibsinizsə, mənə verin, o kağızda kəndin adı yazılmışdır.
D'Artanyan:
– Hə, indi mən başa düşdüm, – dedi, – kəndin adı onun əli ilə yazılmışdır...

## XXXIV

## QIRMIZI PLAŞLI ADAM

Atosu, keçirdiyi məyusluqdan sonra gizli bir kədər bürüdü; lakin bu adam dərd içində də, ona xas olan fikir aydınlığını itirmirdi.

O, miledini axtarıb tapacağını vəd etmiş, bu işin məsuliyyətini öz üzərinə götürmüşdü; bu fikirlə də hamıdan sonra öz otağına getdi, mehmanxana sahibindən xahiş edərək əyalət xəritəsini tapdırdı, xəritəni diqqətlə gözdən keçirtdi, qəti öyrəndi ki, Betündən Armantyerə dörd yol gedir; sonra da xidmətçiləri öz yanına çağırtdırdı.

Planşe, Qrimo, Muşketon və Bazen onun otağına gəldilər. Atos onlara nə edəcəkləri haqqında aydın, düzgün və ətraflı məlumat verdi. Hava açılanda onların hər biri bir yolla Armantyerə getməli idi. Planşe bunların hamısından zirək olduğundan Atos karetanın getdiyi yolu ona tapşırdı.

Atos ona görə xidmətçilərdən istifadə etmək istəyirdi ki, onlar yolda gəlib-gedəndən söz soruşanda, ağaları kimi şübhə oyatmırdılar, müraciət etdikləri adamlar da onlara böyük rəğbət göstərirdilər. Bundan başqa miledi, muşketyorları tanıyırdı, ancaq onların nökərlərini görməmişdi.

Xidmətçilər ertəsi gün səhər saat on birdə bir-birini görməli idilər; onlardan miledinin yerini bilən olsa, üçü onun keşiyini çəkməli, biri də Betünə qayıdıb bu barədə Atosa məlumat verməli idi.

Xidmətçilər bu tapşırığı aldıqdan sonra getdilər.

Atos durdu, qılıncını bağladı, plaşa bürünüb mehmanxanadan çıxdı. Saat doqquza az qalmışdı. Məlumdur ki, axşam saat onda əyalət şəhərlərinin küçələri tamam boşalır. Lakin Atos bir nəfər yerli ilə görüşmək istəyirdi. Nəhayət, o bir adam gəldiyini gördü, yaxınlaşıb ona bir neçə kəlmə söz dedi; o adam dəhşət içində geri çəkildi, bununla belə, yenə də muşketyorun sözünü cavabsız qoymadı. Atos bu adama bələdçilik etmək üçün yarım pistol pul təklif etdi, amma o bundan boyun qaçırtdı.

Atos o adamın göstərdiyi küçə ilə getdi, ancaq yol ayrıcına çatanda yenə dayandı: yəqin ki, o, hara gedəcəyini bilmirdi. Yol ayrıcında təsadüfi adama daha tez rast gəlmək olur, buna görə də o qabağa getmədi, dayanıb adam gözlədi. Doğrudan da, bir neçə dəqiqədən



sonra gecə qarovulçusu göründü. Atos bayaqkı sualını təkrar etdi. Gecə qarovulçusu ah çəkərək Atosa bələdçilik etməyi boynuna götürmədi, ancaq gedəçəyi yolu əli ilə göstərdi. Atos bu yolla gedib şəhərin kənarına çatdı. Burada da dayandı.

Xoşbəxtlikdən bir dilənçi Atosa yaxınlaşıb sədəqə istədi. Atos ona, istədiyi yerə apararsa, bir ekü verəcəyini vəd etdi. Dilənçi əvvəl bir az tərəddud etdi, lakin qaranlıqda işıldayan gümüş pulu görüb Atosun qabağına düşdü, Bir küçənin tininə çatıb dayandı, uzaqda olan kiçik, tək bir evi əli ilə göstərdi. Atos bu evə sarı getdi; dilənçi vəd edilən pulu alan kimi var güçü ilə qaçmağa başladı.

Atos göstərilən evə çatdı. Ev qırmızı rənglə rənglənmişdi; qapını tapmaq üçün evin ətrafına hərlənməli oldu. Pəncərə taxtası arasından işıq görünmürdü, içəridən səs gəlmirdi, sanki evdə heç kəs yaşamırdı: ev qəbir kimi səssizdi, adama kədər verirdi.

Atos qapını üç dəfə döydü, səs verən olmadı; bir az sonra ayaq səsi eşidildi; nəhayət, qapı açıldı, qarasaçlı, qarasaqqallı, solğunbənizli, uzun bir adam göründü.

Atos naməlum adamla astaca bir neçə kəlmə danışdı, bundan sonra qara saçlı adam işarə ilə muşketyoru içəri dəvət etdi. Atos içazə verilməsindən istifadə edərək dərhal içəri girdi, qapı da arxasınca bağlandı Belə çətinliklə axtarıb tapdığı bu adam onu öz laboratoriyasına apardı; burada o, dəmir simlərlə skelet sümüklərini bir-birinə quraşdırmaqla məşğul imiş

Skeletin hər yeri quraşdırılıb qurtarmışdı, bircə başı yerinə qoyulmamışdı, hələ miz üstündə idi.

Otağın içindəki şeylər ev yiyəsinin təbiət elmlərilə məşğul olduğunu göstərirdi: burada içinə ilan qoyulmuş bərinilər vardı; qurudulmuş və zümrüd kimi işıldayan kərtənkələlər qarağacdan qayırılmış böyük çərçivələr içərisində qoyulmuşdu; tavandan çəngə-çəngə ətirli ot asılmışdı; yəqin ki, bunların başqalarına məlum olmayan özünə görə bir xüsusiyyəti vardı. Lakin evdə bu adamın nə ailəsi, nə də xidmətçisi görünürdü: bu evdə o, tək yaşayırdı.

Atos laqeyd və soyuq baxışlarla otağı nəzərdən keçirib gəlməsinin səbəbini naməlum adama izah etdi. Lakin o, öz xahişini söyləyən kimi naməlum adam dəhşət içində geri çəkildi və Atosun xahişini yerinə yetirməyi boynuna götürmədi. Bu zaman Atos cibindən bir parça kağız çıxarıb naməlum adama göstərdi: kağızda iki xətt yazı yazılmışdı,

altında da imza və möhür vardı. Uzunboylu adam bu iki sətri oxuyub altındakı imza və möhürü görən kimi təzim etdı: bu təzim artıq etiraz etmədiyini və xahişi yerinə yetirməyə razı olduğunu bildirirdi.

Atosa da elə bu lazımdı. Yerindən qalxıb baş əydı, evdən çıxdı, getdiyi yolla da geri qayıtdı. Mehmanxanaya gəlib öz otağına gırdi, qapını bərkitdi. Səhər açılanda d'Artanyan onun yanına gəlib nə etmək lazım gəldiyini soruşdu.

Atos:

Gözləmək lazımdır, - dedı.

Bır neçə dəqiqədən sonra monastır başçısı muşketyorların yanına adam göndərdı ki, dəfn saat on ikidə olacaqdır. Xanım Bonasyenı zəhərləyən qadın haqqında isə heç bir məlumat əldə edilməmişdi; belə zənn edilirdi kı, o, bağdan keçib qaçmışdır; çünki qum üstündə ayaq ləpirləri görünürdü, bağ qapısının da açarı itmişdi.

Deyilən vaxtda lord Vinter dörd nəfər muşketyorla monastıra gəldı. Bütün zənglər .vurulurdu. Kiçik monastır kılsəsinin qapısı açıqdı, lakin kliros bağlı idi. Tabut da klirosun ortasında qoyulmuşdu. Klirosun hər iki tərəfində, dəmir barmaqlıq dalında karmelit monaxlarının hamısı hazır durmuşdu. Onlar ölünün üstündə oxunan duaya qulaq asır, onu təkrar edirdilər, dua edən başqa adamları isə görmürdülər, adamlar da onları görmürdü.

D'Artanyan kilsə qapısı ağzında, bu dərdə tab gətirməyəcəyini hiss edib, Atosu gözlərilə axtardı, lakin Atos yox idı.

Atos bağa getmişdi. O, miledinin yüngül ayaq ləpirlərini izləyə-izləyə meşəyə çıxan bağ qapısına çatdı, qapını açıb meşəyə girdı.

Burada o, düşündüyü şeylərin doğru olduğunu aydınca gördü: karetanın getdiyi yol meşənin yanından burulub uzaqlaşırdı. Atos gözlərini yerə dikərək bir qədər bu yolla getdi; yerdə arabir kiçık qan ləkəsi görürdü: yəqin karetanı sürən adam, ya da at yaralanmışdı. Bir lyenin dörddə üçü qədər getdikdən sonra, Festüberin, təxminən, əlli addımlığında bir qan ləkəsi gördü. Torpaq burada at ayaqları ilə tapdalanmışdı. Buradan bir az aralı, meşə ılə bu yer arasında yenə də qan izləri vardı: yəqin ki, kareta gəlib burada dayanıbmış, mıledı də meşədən çıxıb karetaya burada minibmiş.

Atos, düşündüklərının doğru olduğunu təsdiq edən bu kəşflə kıfayətlənərək mehmanxanaya döndü. Planşe onu səbırsizliklə gözləyirdi.



Hər şey Atosun düşündüyü kımi olmuşdu. Planşe də, Atos kımi yolla gedərkən qan izi görür. Ancaq o, Atosdan uzağa gedir. Festüber kəndində, bir stəkan çaxır içmək üçün mehmanxanaya girir; burada belə bir söhbət eşidir: dünən saat doqquzun yarısında kareta ilə bir xanım gedirmiş; karetanı sürən adam yaralandığından kənddə qalmağa məcbur olur. O deyirmış ki, onu yolda karetaya basqın edən soyğunçular yaralamışlar. Qadın atları dəyişdirib yoluna davam etmişdir.

Planşe karetaçını axtarmağa başlayır və tez də tapır. Karetaçı deyir ki, mən o qadını Fromelə apardım, oradan da o, Armantyerə getdı, Planşe də kənd yoluna keçib səhər saat yeddidə özünü Armantyerə yetirir. Orada elə bircə poçt stansıyasında mehmanxana varmış Planşe özunu elə göstərir ki, guya qulluq üçün yer axtarmağa gəlmişdir. On dəqiqə keçməmiş mehmanxana xidmətçilərındən bilir ki, dünən axşam saat on birdə bir qadın burada bir otaq tutmuşdur, mehmanxana sahibini öz yanına çağırtdırıb demışdir kı, mən bir qədər Armantyerin civarında yaşamaq istəyirəm.

Planşeyə də elə bunu bilmək lazımdı. O, görüş üçün təyin edilən yerə yüyürür, orada öz yoldaşlarını görür, mehmanxananın keşiyini çəkməyi onlara tapşırıb, Atosun yanına qayıdır.

Planşe sözünü təzəcə qurtarmışdı ki, Atosun dostları otağa girdilər.

Onlar hamısı qaşqabaqlı və tutqundu.

D'Artanyan soruşdu:

– Nə etmək lazımdır?

Atos da cavab verdi:

- Gözləmək lazımdır.

Hər kəs öz otağına getdi.

Axşam saat səkkizdə Atos atları yəhərləmək əmrini verdi, lord Vinterə və öz dostlarına dedi ki, yola çıxmağa hazır olsunlar.

Bir anda hamısı ayağa qalxdı. Hərə öz silahını yoxladı. Atos hamıdan sonra aşağı endi, d'Artanyanı at üstündə gördü.

Səbir elə, – dedi, – bizim hələ bir adamımız əskikdir.

Hamısı heyrətlə ətrafına baxdı: çatışmayan kim idi?

Elə bu anda Planşe Atosun atını gətirdi, muşketyor atın üstünə sıçradı.

– Məni gözləyin, bu saat qayıdıram, deyib atını çapa-çapa getdi.

On beş dəqiqədən sonra qara maska taxmış, böyük qırmızı plaşa bürünmüş bır adamla geri qayıtdı.

Lord Vinterlə o biri üç dost təəccüblə bir-birinə baxdılar. Onlardan heç biri bu adamı tanımırdı. Lakin onlar oz-ozlüyündə bu qərara gəldilər ki, bu adamın gəlməsi elə lazımmış, çünki bu, Atosun əmrilə olan bir ışdi.

Saat doqquzda onlar, dünən karetanın getdiyi yolla atları çapa-çapa uzaqlaşdılar. Planşe onlara bələdçilik edirdi.

Onlar hamısı kədərli görünürdü: hamısı susur, hamısı düşüncəyə dalmışdı; onların üzü məyusluq qədər tutqun, cəza qədər qorxuncdu.

## XXXV

## MƏHKƏMƏ

Qaranlıq və tufanlı bir gecə idi; iri bulud yığınları göy üzü ilə süzülür, ulduzların qabağını tuturdu; ay gecə yarısı çıxacaqdı.

Arabir üfüqdə ıldırım çaxır, yolu işıqlandırırdı; sonra yenə hər şey zülmətə bürünürdü.

D'Artanyan dəstəni ötüb keçdiyindən Atos tez tez onu geri çağırır, hamı ilə bərabər getməyə məcbur edırdi; lakın o, bır az sonra yenə də qabağa keçirdi. D'Artanyanın ancaq bir arzusu vardı: o da hamıdan tez getmək idi.

Yaralı karetaçının qaldığı Festüber kəndini, sonra da Rışburq meşəsini ötüb keçdılər. Erlıyeyə gələndən sonra, bütün dəstəyə yol göstərən Planşe sola döndü.

Gah lord Vinter, gah Portos, gah da Aramıs neçə dəfə qırmızı plaşlı adamla danışmaq istədi, lakin o hər dəfə başını aşağı salaraq dinmirdi Nəhayət, onlar başa düşdülər kı, qırmızı plaşlı adamın susmasına yəqin ki, bir səbəb vardır, buna görə də daha onu dındırmədilər.

Tufan get-gedə artırdı: ildırımlar ara vermədən çaxır, göy guruldayırdı, qasırğa olaçağını xəbər verən külək atlıların şlyapasındakı lələkləri qoparırdı.

Onlar atlarını bərk sürməyə başladılar.

Fomelə az qalmışdı ki, yağış başladı. Atlılar plaşlarına büründülər. Mənzilə hələ üç lye qalırdı. Bu yolu da bərk yağış altında getdilər.

D'Artanyan şlyapasını çıxartdı, plaşının yaxasını açdı; yağış onun od kimi yanan üzündən süzülüb axır, ona xoş bir sərinlik verirdi.



Atlılar Qoskaldan keçib poçt stansiyasına yaxınlaşanda, yağış islatmasın deyə ağac altında duran bir adam yolun ortasına çıxıb barmağını dodaqlarına qoydu.

Atos Qrimonu tanıdı.

D'Artanyan ondan soruşdu:

Nə olub? O, yoxsa Armantyerdən getmişdır?

Qrımo başı ilə "bəli" ışarəsı etdi. D'Artanyan dişini dişinə sıxıb xırçıldatdı. Atos:

- D'Artanyan, səs salma, dedi. – Mən hər şeyı öz öhdəmə götürmüşəm, di qoy Qrımodan da istədiyimı soruşum.

Sonra öz xidmətçisınə döndü:

O, hara gedib?

Qrimo əlını Lis çayı tərəfə uzatdı.

Buradan çox uzaqdırmı?

Qrimo şəhadət barmağını əyərək ağasına göstərdi.

Atos yenə ondan soruşdu:

Tək?

Qrımo başı ilə "bəli" işarəsini etdi.

Atos yoldaşlarına döndü:

– Cənablar, o təkdir, özü də buradan yarım lye uzaqdadır.

D'Artanyan dedi:

Yaxşı. Qrimo, bizi ora apar.

Qrimo onları çölləmə apardı: dəstənin bələdçisi indi o idi.

Beş dəqiqədən sonra balaca bir çaya çatdılar; çayı keçdilər.

İldırım işığında Ankenkem kəndini gördülər. Atos soruşdu:

– Qrımo, buradırmı?

Qrimo başı ılə yox işarəsi etdi.

Atos yoldaşlarına dedi:

– Cənablar, səs salmayın!

Atlılar yollarına davam etdilər.

Bir də ildırım çaxıb ətrafı işıqlandırdı. Qrimo əlini uzatdı; onlar ildırımın göyümtül işığında çay qırağında, bərədən yüz addım aralıda balaca bir ev gördülər. Evin bir pəncərəsindən ışıq gəlirdi.

Atos:

– Gəlib çatdıq, - dedi.

Bu zaman xəndəkdən bir adam qalxdı: o, Muşketon ıdı. Muşketon barmağı ilə ışıq gələn pəncərəni göstərdi:

– Oradadır, – dedı.
Atos soruşdu:
Bəs Bazen hanı?
Mən pəncərənin keşıyini çəkəndə, o da qapının keşiyini çəkirdi.
Atos onları tərif elədi:
Yaxşı Siz hamınız sədaqətli xidmətçisınız.
Atos atdan sıçrayıb düşdü, cilovu Qrimoya verıb pəncərəyə yaxınlaşdı, o birilərinə də işarə ilə qapıya tərəf getməyı bildirdi.
Kiçık ev iki-üç fut hündürlükdə ağaç və kollarla əhatə olunmuşdu. Atos barının üstundən atılıb həyətə düşdü, pəncərəyə yaxınlaşdı. Pəncərə yarıya qədər pərdə ilə örtülmüşdü.
Pərdə üstündən otağa baxmaq üçün bir daş ustünə qalxdı.
Çıraq işığında bir qadın gördü; o qara bir mantilə bürünüb titrək, zəif işıq qarşısında, kürsüdə oturmuşdu; dirsəklərini köhnə bir miz üstünə qoyub başını, fil sümüyü kimi ağ, hamar əlləri içinə almışdı. Üzü görünmürdü; lakin Atosun dodaqlarında titrəyən məşum təbəssüm onun səhv etmədiyini göstərirdi: bu qadın miledi idi,
Birdən at kişnədi. Miledi başını qaldırdı, Atosun pəncərə şüşəsinə yapışmış solğun üzünü görüb qışqırdı. Atos tanındığını bilib pəncərəni dizıylə itələdi. Pəncərə çərçivələri davam gətirməyib açıldı; şüşələr qırıldı.
Atos otağa atılıb, intiqam kabusu kimi, miledinin üstünə getdi.
Mıledi yüyürüb qapını açdı; d'Artanyan qapının ağzında durmuşdu.
Miledi çığırıb geri çəkildi. D'Artanyan onun qaçacağını zənn edib, tapançanı qurşağından çəkib çıxartdı.
Lakin Atos əli ilə onu saxladı.
– D'Artanyan, tapançanı yerınə qoyun, dedi. - Bu qadını öldürmək deyil, mühakimə etmək lazımdır. Bir dəqiqədə səbir edin. Cənablar, içəri girin!
D'Artanyan heç bir söz demədi: Atosun səsi əzəmətli, hərəkətləri isə amiranə idi, – o, amansız bir hakimə oxşayırdı.
D'Artanynın dalınca Portos, Aramis, lord Vinter, qırmızı plaşlı adam da ıçəri girdi.
Dörd xidmətçi qapı ilə pəncərənin keşiyini çəkirdi.
Miledı kreslo üstünə düşüb, əllərini qabağa uzatdı, sanki o qorxunc bir xəyala əl açıb yalvarırdı; bırdən qaynını görüb dəhşət içində çığırdı.
– Sizə nə lazımdır?



Atos sözə başladı:
Bizə, əvvəl qrafinya de La Fer, sonra isə ledi Vinter, baronessa Şeffild adlanan Şarlotta Bakson lazımdır.
Miledı dəhşət içində pıçıldadı:
– O mənəm, o mənəm! Siz məndən nə istəyirsiniz?
Atos:
Biz sizi işlədiyiniz cinayətlər üstündə mühakimə eləmək istəyirik, dedi. – Sizə özünüzü müdafiə eləmək ıxtiyarı verilir: bacarırsınızsa, özünüzü təmizə çıxarın. Cənab d'Artanyan, birinci ittihamçı sizsiniz.
D'Artanyan yaxına gəldi:
Mən həm Allah, həm də insanlar qarşısında bu qadını, dünən axşam ölən Konstansiya Bonasyeni zəhərləməkdə ittiham edirəm.
O, bunu deyıb Portosla Aramısə sarı döndü.
Onlar da birağızdan dedilər:
Bız bunu təsdiq edirik.
D'Artanyan sözünə davam etdi:
Mən həm Allah, həm də ınsanlar qarşısında bu qadını şərabla mənım özümü zəhərləməyə təşəbbüs etməsi üstündə ittiham edirəm: bu qadın həmin şərabı Belleruadan, mənim dostlarımın adından yazılmış saxta bir məktubla mənə göndərmışdi. Allah məni saxladı, amma mənim əvəzimdə bir başqası öldü: onun adı Brizmon idi.
Portosla Aramis yenə bir ağızdan dedilər:
– Bız bunu təsdiq edirik.
– Mən həm Allah, həm də insanlar qarşısında bu qadını bir şeydə də ıttıham edirəm: o məni qraf Vardı öldürməyə vadar etmək istəyirdi; lakın burada olanlardan heç biri bunu təsdiq edə bilməyəcəyindən mən özüm bunun şahidliyini verirəm. Mən sözümü qurtardım.
D'Artanyan Portos və Aramıslə otağın o biri başına keçdi.
Atos lord Vintere döndü:
- Milord, indi növbə sizindir!
Baron sözə başladı:
Mən həm Allah, həm də insanlar qarşısında bu qadını Bekinhem hersoqunun öldürülməsi üstündə ittiham edirəm.
Otaqda olanların hamısı bir ağızdan dedılər:
Bekinhem hersoqunu öldürüblər?
Bəli, öldürüblər! Sizin məktubunuzu alandan sonra mən bu qadını həbs etmək əmrini verdim, onun keşiyini çəkməyi mənə sadiq olan

nəcib bir adama tapşırdım. Bu qadın onu yoldan çıxarıb əlinə xəncər verır və hersoqu öldürməyə onu məcbur edir. Bəlkə də bu gün Felton bu ifritənin cinayəti üzündən edam edilmişdir... – Lord Vinter sözünə davam etdi: – Bu hələ hamısı deyil. Mənim qardaşım onu özünə varıs edərək, qəribə bır xəstəlikdən öldü. Bu xəstəlik üççə saat davam etdi, onun bütün bədənində göyümtül ləkələr əmələ gətirdi. Bacı, sizin əriniz nədən öldü?

Portosla Aramis bərkdən dedilər:

Belə də dəhşət olarmı?

– Bu qadın hersoqun qatili, Feltonun qatili, mənim qardaşımın qatilidir... Mən ədalətli bir hökm tələb edirəm: belə bir hökm verilməsə, onu mən özüm icra edəcəyəm.

Lord Vinter d'Artanyanın yanına çəkildi.

Miledi başını endırıb, fikrini toplamağa çalışırdı.

Aslan ilan görəndə titrəyən kimi, Atosun da bütün bədəni titrəyirdi.

– İndı növbə mənimdir, – dedı. – Bu qadını mən alanda o hələ cavan qızdı, özü də ailəmiz istəmədən mən bununla evlənmişdim. Mən ona dövlət verdim, öz adımı verdim, bir dəfə də gördüm ki, o damğalanmışdır: bu qadının sol çiynində zanbaq şəkilli damğa vardır.

Miledı yerindən qalxaraq dedi:

Mən əminəm ki, sız hansı məhkəmənin bu biabırçı hökmü mənim üzərimdə ıcra etdiyini söyləyə bilməyəcəksiniz! Siz bu damğanı vuran adamı tapmayacaqsınız.

Kım isə yerindən dilləndi:

– Susun! Bunu da mən söyləyə bilərəm.

Qırmızı plaşlı adam milediyə yaxınlaşdı. Miledi çığıraraq dedı:

Bu kimdir, bu kimdır?

Qorxudan onun nəfəsi tutulurdu; gözəl saçları dağılıb, tükləri biz biz durdu, sıfətı meyit kimi ağardı.

Hamı bu naməlum adama baxdı; onu ancaq Atos tanıyırdı.

Atos da ona, o biriləri kımı, təəccüblə baxırdı; çünki o da bu adamın artıq nəticələnməkdə olan bu dəhşətli façiə ilə necə əlaqədar olduğunu bılmırdı

Naməlum adam ağır və təntənəli addımlarla milediyə sarı gedib üzündəkı maskasını çıxartdı; o, solğun bənizli, qarasaqqal bir adamdı; tük bütün üzünu bürümüşdü. Miledı ılə onun arasında ancaq bir mız vardı.



Mıledi xeyli onun üzünə baxıb birdən çığırdı:

Aman! Yox, yox! Bu dəhşətli bir xəyaldır, o deyıl! Köməyə gəlın, köməyə gəlin!

Hamı bırağızdan soruşdu:

Siz axı kimsiniz?

Qırmızı plaşlı adam:

Bu qadından soruşun, dedi. Görürsünüz ki, o məni tanıdı.

Miledi yıxılmamaq üçün titrəyə-titrəyə divardan yapışaraq, qorxudan dəlı olmuş kimi çığırdı:

– Lıll cəlladı! Lill cəlladı!

Hamı geri çəkildi. qırmızı plaşlı adam otağın ortasında tək qaldı.

Bədbəxt qadın dizləri üstə düşərək qışqırdı:

– Ah, mənə aman verin, mənə aman verin, məni bağışlayın!

Naməlum adam qadın sakitləşənə qədər gözlədi.

– Cənablar, mən sizə dedim ki, o, mənı tanıdı. Bəli, mən Lill şəhərının cəlladıyam. Başıma da belə bir hadisə gəlmişdir.

Cəllad başına gələn hadisəni söyləməyə başladı:

Bu qadın vaxtilə cavan bir qız idi, indiki qədər də gözəldi. O Tamplemar benediktinlərin monastırında monax idi. Bu monastırın kilsəsində sadə ürəkli, mömin, gənc bir keşiş qulluq edirdi. Bu onu yoldan çıxarmaq fikrinə düşür, müvəffəq də olur. Bu elə bir qız idi ki, lap müqəddəsləri də yoldan çıxara bilərdi. Ancaq onların əlaqəsi uzun zaman təhlükəsiz bir vəziyyətdə davam edə bilməzdi. O, keşişi tovlayır ki, monastırdan qaçsınlar, ancaq pulları yox imiş. Keşiş kilsə qablarını oğurlayıb satır. Qaçmaq istəyəndə onları tuturlar. O, səkkiz gündən sonra dustaqxanaçının oğlunu yoldan çıxarıb dustaqdan qaçır.

Gənc keşiş on illik həbsə və damğalanmağa məhkum edilir. Necə ki, bu qadın deyir, mən Lill şəhərinın cəlladı idim. Mən məhkum edilən gənc keşişə damğa vurmalı idim, o keşiş isə, cənablar, mənim qardaşım idi.

O zaman mən and içdim kı, qardaşımı məhv edən bu qadını cəzasız buraxmayacağam, çünkı onun cinayəti mənim qardaşımın cinayətındən daha artıq idi; qardaşımı cinayətə sövq edən o qadındı. Mən onun gizləndiyı yeri öyrəndim, gedıb onu tapdım, əl-qolunu bağladım, ona da qardaşıma vurduğum damğa kimi, bir damğa vurdum.

Lillə qayıtdığım günün səhəri qardaşım dustaqxanadan qaçdı. Bu iş üstündə məni də taqsırlandırdılar, guya mən onun qaçmasına kömək

etmişdim; məni tutub dustağa saldılar; məhkəmənin hökmü belə idi ki, qardaşım tapılmayınca mən dustaqda qalacaqdım. Yazıq qardaşımın bu hökmdən xəbəri yox idı. O, yenə də həmın bu qadınla tapışır, bir yerdə Berriyə qaçırlar; Berrıdə o, özünə balaca bir kilsədə iş tapır. Bu qadın da özünü onun baçısı kimi tanıdır.

Kilsə bır əyanın mülkündə imiş. Mülk sahibi bu qadına bərk vurulur, onu almaq fikrinə düşür. Bu zaman o, bir başqasını məhv etmək üçün əvvəl məhv etdiyi adamı atır və qrafinya de La Fer olur...

Hamı Atosa baxdı, çünki onun əsil adı bu idi. Atos cəlladın söylədikləri sözün doğru olduğunu başı ilə təsdiq etdı.

Cəllad sözünə davam etdi.

- Mənım yazıq qardaşım bunu görüb, bir məyusluq içində, Lillə qayıdır, mənım dustağa düşməyimin səbəbini bilib özünü hökumətə təslim edir, elə o axşam da dustaqxana otağının hava bacasından özünü asıb öldürür. Ancaq haqqı danmaq olmaz: mənim barəmdə hökm çıxaran hakimlər, verdikləri sözu yerinə yetirdilər. Özünü asan adamın şəxsiyyəti müəyyən edilən kimi məni dustaqdan buraxdılar. Mən bu qadını həmın cinayətlər üstündə müttəhim edirəm; ona damğa vurmağımın da səbəbi budur.

Atos:

Cənab d'Artanyan, – dedi, siz bu qadın üçün hansı cəzanı tələb edirsiniz?

Ölüm cəzasını.

Atos barona döndü:

– Milord Vinter, siz bu qadın üçün hansı cəzanı tələb edirsiniz?

– Ölüm cəzasını.

– Cənab Portos və cənab Aramis, siz bunun hakimisiniz: bu qadını siz hansı cəzaya məhkum edirsiniz?

Hər iki muşketyor tutqun səslə dedi:

– Ölüm cəzasına.

Miledi vəhşicəsinə qışqırdı və dizləri üstə öz hakimlərinə sarı süründü. Atos dedi:

Şarlotta Bakson, qrafinya de La Fer, miledi Vinter, sizin cinayətləriniz yerdə insanların, göydə də Allahın səbrini tükətdi. Bildiyiniz dua varsa, oxuyun, çünki sizin haqqınızda hökm verilmişdir: siz ölməlisiniz.

Bu sözdən sonra miledinin daha heç bir şeyə ümidi qalmadı; ayağa qalxıb bütün boyu uzunu şaxlaşdı. Bir şey demək istədi. Lakin deməyə



taqəti olmadı. Elə bu anda saçından qüvvətli bir əlin yapışdığını hiss etdi və taleyin özü qədər amansız olan bu əl onu dartıb apardı. Ölümə məhkum edilən qadın heç bir müqavimət göstərmədən otaqdan çıxdı.

Lord Vinter, d'Artanyan, Atos, Portos və Aramis də onun dalınca çıxdılar. Xidmətçilər də öz ağalarının ardınça getdilər; pəncərəsi sınmış, qapısı taybatay açıq qalmış otaq boşaldı; ancaq miz üstündə yanan çıraq dərdli dərdli tüstülənirdi.

## XXXVI

## EDAM

Gecə yarı olmağa az qalmışdı. Oraq kımı nazik ay kiçik Armantyer şəhəri üfüqlərindən qalxdı, öz solğun işığı ılə evləri, ağacları işıqlandırdı. Hündür zəng qülləsi qaranlıqdan sıyrılıb çıxdı.

Uzaqlarda tufan gurlayır, arabir ildırım çaxaraq üfüqləri işıqlandırır, sanki qılıncla göyü iki parçaya bölürdü.

Təbiətə ölü bir sükut çökmüşdü. Bir az əvvəl yağan Yağışdan yer islanmışdı və sürüşkəndı. havadan yaşıl ağaçların, otların ətri gəlirdi.

İki xidmətçi miledini əllərindən tutub aparırdı. Cəllad onların dalınca gedirdi. Lord Vinter, d'Artanyan, Atos, Portos və Aramıs də cəlladın ardınca irəliləyirdilər.

Ən axırda Planşe ilə Bazen gəlirdi.

Muşketonla Qrimo miledini çaya tərəf aparırdı.

Miledi susur, hamıya yalvarıçı bir nəzərlə baxırdı.

Miledi cəlladın bir az dala qaldığını görüb xidmətçilərə dedi:

– Siz mənə qaçmağa kömək eləsəniz, hər birinizə min pistol verəcəyəm, yox, məni öz ağalarınızın əlinə versəniz, bu yaxında mənim adamlarım var, onlar sizə mənim üstümdə çox ağır divan tutacaqlar.

Qrimo tərəddüd etdi. Muşketonun bütün bədəni titrəməyə başladı. Atos miledinin səsini eşidən kimi tez onlara yaxınlaşdı; lord Vinter də onun dalınca getdi.

Atos:

Bu xidmətçiləri dəyişin, – dedi. Bu qadın onlarla danışdı, daha onlara etibar eləmək olmaz.

Planşe ilə Bazeni çağırdılar; onlar Qrimo ilə Muşketonu əvəz etdilər.

Çayın qırağına çatanda cəllad miledıyə yaxınlaşdı, onun əl-qolunu bağladı.

Bu zaman miledi danışmağa başladı:

Siz alçaq, rəzil qatillərsiniz! On adam yığışıb bir qadını öldürmək istəyirsiniz... Özünüzü gözləyin! Mənim köməyimə gəlməsələr də, qisasımı alacaqlar!

Atos soyuqqanlılıqla dedi:

– Siz qadın deyilsiniz, siz insan nəslinə mənsub deyilsiniz, siz cəhənnəmdən qaçmış iblissiniz! Biz sizi gəldiyiniz yerə qayıtmağa məcbur edərik.

Miledi ucadan:

Mən sizin əxlaqınıza nifrət edirəm! dedi. Bunu bilin ki, kim mənim bircə tükümə də toxunsa, o özü də qatil olacaqdır.

Qırmızı plaşlı adan əlini enli qılıncına toxunduraraq dedi:

Xanım, cəllad adam öldürər, qatil də hesab olunmaz. Cəllad axırıncı hakimdir.

Miledi vəhşicəsinə çığırdı:

Əgər mən müqəssirəmsə, əgər mən cinayət işləmişəmsə, onda məni məhkəməyə aparın. Məni mühakimə etməyə sizin ixtiyarınız yoxdur.

Lord Vınter:

Mən sizə Tayberni təklif etdim. Bəs niyə siz mənim təklifimi rədd etdiniz?

Miledi dartınaraq dedi:

Ona görə ki, ölmək istəmirəm! Ona görə ki, mən həm cavanam, mənim ölən vaxtım deyil.

D'Artanyan sözə qarışdı:

- Xanım, sizin Betündə zəhərləyib öldürdüyünüz qadın sizdən də cavandı, lakın o öldü...

Miledi dedi:

– Mən monastıra girərəm, mən monax olaram...

Cəllad onun sözünü kəsdi:

– Siz bir dəfə monastıra girmısiniz, oradan da qaçmısınız ki, mənim qardaşımı məhv edəsiniz.

Mıledi dizləri üstə düşdü. Cəllad onu qaldırıb qayığa aparmaq istədi. Mıledı qışqıraraq dedi:



– Aman Allah!.. Aman Allah! Yoxsa bunlar məni suya atıb boğmaq istəyirlər.

Bu çığırtıda elə bir ümidsizlik, elə bir məyusluq vardı ki, miledini bu vaxta kimi hamıdan çox, hamıdan amansızcasına təqib edən d'Artanyan belə dayandı, kötük üstündə oturdu, başını aşağı salıb əllərilə qulaqlarını tutdu, lakin o, yenə də miledinin hədə-qorxularını, çığırtılarını eşıdirdi.

D'Artanyan orada onların hamısından cavandı, buna görə də onun ürəyi tab gətirmədi:

- Ah, mən bu dəhşətli hadisəyə dözə bilmərəm! Mən razı ola bilmərəm ki, onu mənim gözümün qabağında öldürsünlər.

Mıledi bu sözləri eşitdi. Onun ürəyində ümid doğdu.

Çığıra-çığıra dedi:

D'Artanyan, d'Artanyan! Yadına sal ki, mən səni sevirdim.

D'Artanyan yerindən qalxıb milediyə sarı getdi. Atos qılıncını siyirib onun qabağını kəsdi:

D'Artanyan, siz bir addım da atmış olsanız onda qılınclarımız toqquşacaq.

D'Artanyan dizləri üstə düşüb dua eləməyə başladı. Atos cəllada dedi:

– Cəllad, vəzifəni yerinə yetir.

Bu saat, cənab. Mən mərhəmətli bir katolikəm və möhkəm əminəm ki, bu qadına qarşı öz vəzifəmi yerınə yetirməklə ədalətlı bir iş görürəm.

Miledi qalxıb qulaq asdı, ancaq heç bir şey eşitmədi.

Orada düşmənlərindən başqa heç kəs yox idi.

Soruşdu ki:

– Mən harada öləcəyəm?

Cəllad:

O biri sahildə, – dedi. Miledini qayığa qoydu.

Qayıq çayın sol sahilinə üzdü. O birılər çayın sağ sahılində qaldılar.

Qayıq çayla ağır-ağır üzürdü. Nəhayət, gedib o biri sahilə yan aldı. Miledi qayıqda ikən qıçlarına bağlanan kəndirı açа bilmişdi; qayıq sahilə çatan kimi, qırağa atılıb qaçmağa başladı.

Yer yaş idi; diki qalxırkən ayaqları sürüşdü, dizləri üstə yıxıldı.

Mıledi mövhumatçı ıdı. Allahın da ona öz köməyini əsirgədiyini zənn edərək düşdüyü vozıyyətdə qaldı, başını əyərək əllərini döşünə qoydu.

Bu vaxt o biri sahildə cəlladın yavaş-yavaş əlinin qalxdığını gördülər. Enli qılınc ay işığında parıldayıb aşağı endi.

Cəllad qırmızı plaşını çıxarıb, yerə sərdi, cəsədi onun üstünə qoyub qayığa gətirdi.

Çayın ortasına çatanda dayandı, cəsədi başı üstə qaldırıb bərkdən dedi:

– Ədalət yerınə yetirildi!

Bunu deyib cəsədi çayın ən dərin yerinə atdı; çayın üzü ləpələndi, bir azdan sonra yenə də sakitləşdi.

Üç gün sonra dörd muşketyor Parisə qayıtdı. Onlar məzuniyyətin vaxtını keçirməmişdilər, gəldikləri gün cənab de Trevilin yanına getdilər.

İgid kapıtan onlardan soruşdu.

Cənablar, yaxşı kef elədinizmi?

Atos həm özü, həm do yoldaşları tərəfindən:

Lap yaxşı, dedi.

## NƏTİCƏ

O biri ayın altısında kral, kardinala verdiyi vədı yerinə yetırərək, Parisdən çıxıb Laroşelə yola düşdü. O hələ də Bekinhem hersoqunun ölüm xəbərının təsiri altında idi.

Kraliçaya sevdiyı adamın təhlükə qarşısında olduğu haqqında məlumat verilmişdi: amma o, hersoqun ölüm xəbərini eşidəndə buna inanmaq istəmədi· hətta ehtıyatsızlıq edərək bırdən çığırıb dedi:

Bu doğru deyil! Mən indicə ondan məktub almışam!

Lakin ertəsı gün istər-ıstəməz bu mənhus xəbərə ınanmalı oldu. La Port, kral I Karlın verdıyı əmr nəticəsində, bır neçə gün İngiltərədən çıxa bılmədiyindən gecıkmışdı: o, hersoqun ölümündən qabaq verdiyi hədıyyəni gətirəndən sonra məsələ kralıçaya aydın oldu.

Kral hersoqun ölümünə son dərəcə sevınirdi; o hətta sevıncini gızlətmək də istəmırdı, xüsusilə bunu kraliçaya daha açıq göstərırdı. XIII Lüdovik alicənablığı ılə fərqlənən adam deyıldi.



Çox çəkmədi ki, kralın ovqatı yenə də təlx oldu; o, düşərgəyə qayıdarkən yenə də kardinalın hökmü altına düşəcəyini hiss edirdi, bununla belə, yenə də ora qayıdırdı. Onun elə gücü yox idi ki, kardinalın iradəsinə qarşı dura bilsin; kardinala o nifrət edirdi, lakin yenə ona tabe olurdu.

Buna görə Laroşelə qayıtmaq heç də onun ürəyini açmırdı. Xüsusilə bizim dörd dostumuz öz yoldaşlarını heyrətə salırdı. Onlar qaşqabağını tökərək atlarını bir-birinin yanı ilə sürür, bircə kəlmə də danışmırdılar. Ancaq Atos bəzən başını qaldırıb acı-acı gülümsəyir, lakin az sonra yenə başını endirib dərin fikrə dalırdı.

Kralın başındakı mühafizə dəstəsi bir şəhərə gələndən və kralı təmin edilən evdə yerləşdirəndən sonra dörd dost o saat ucqar bir meyxanaya gedirdi; onlar orada nə içir, nə də qumar oynayırdılar, ancaq öz aralarında asta-asta danışır, söhbətlərini başqalarının eşitməməsinə diqqət edirdilər.

Bir dəfə kral yolda ov ovlamaq üçün dayanarkən, dörd dost ovda iştirak etmədiklərindən, karvansaraya getdilər. Birdən Laroşeldən atını çapa-çapa gələn bir adam əyilərək muşketyorların oturduğu otağa baxdı və çığıraraq dedi:

– Hey, cənab d'Artanyan, deyəsən sizsiniz!

D'Artanyan başını qaldırıb sevinclə səsləndi. Nəhayət o, köhnə düşmənilə üz-üzə gəlmişdi: bu naməlum adam menqli idi. D'Artanyan qılıncını siyirib qapıya cumdu. Ancaq naməlum adam bu dəfə qaçmaq əvəzinə atdan düşdü, d'Artanyanın qabağına gəldi.

D'Artanyan:

Hə, axırda mən sizi tapdım, - dedi. – Bu dəfə siz artıq mənim əlimdən qaçıb qurtara bilməyəcəksiniz.

Mən heç qaçmaq niyyətində deyiləm, ona görə ki, mən özüm sizi axtarırdım: mən sizi kralın adından həbs edirəm. Möhtərəm cənab, mən tələb edirəm ki, siz qılıncınızı verəsiniz! Müqavımət göstərməyin; sızə bu başdan xəbərdarlıq edirəm: məsələ sizın həyatınıza aiddir.

D'Artanyan qılıncını endirdi, lakin vermədi.

Siz axı kimsiniz?

Naməlum adam dedi:

Mən kavaler de Roşforam, cənab kardinal Rışelyenii baş mehtəriyəm. Mənə əmr edilmişdir ki, sizi kardınal həzrətlərinin yanına aparam.

Atos yaxınlaşıb söhbətə qarışdı:

– Cənab kavaler, biz elə kardinal həzrətlərinin yanına qayıdırıq. Siz əlbət ki, cənab d'Artanyanın sözünə inanarsınız. O, buradan düz Laroşelə gedəcək.

Mən cənab d'Artanyanı qarovulun əlinə verməliyəm, o da onu düşərgəyə, kardinalın yanına aparacaq.

– Hörmətli cənab, biz özümüz onun qarovulunda olaçağımıza, bir əsilzadə kimi söz veririk. Sonra qaşlarını çataraq əlavə etdi: – Bunu da bilin ki, cənab d'Artanyan bizsiz getməyəcək.

Kavaler de Roşfor geriyə baxıb gördü ki, Portosla Aramis onunla qapı arasında durmuşdur. O, bu adamların hakimiyyəti altında olduğunu başa düşdü.

Cənablar, dedi, əgər cənab d'Artanyan qılıncını mənə təslim etsə və mənə söz versə, onda mən sizin cənab d'Artanyanı kardinal həzrətlərinin iqamətgahına aparacağınız haqqındakı vədinizlə kifayətlənərəm.

D'Artanyan:

– Möhtərəm cənab, - dedi, – gedəcəyimə söz verirəm; bu da mənim qılıncım.

Roşfor buna razı oldu:

– Bu mənim üçün daha yaxşı, çünki mən hələ uzağa getməliyəm.

Atos soyuq bir tərzdə dedi:

– Əgər siz miledini görməyə gedirsinizsə, onda lap nahaq gedirsiniz, çünki onu tapmayacaqsınız.

Roşfor qorxmuş halda soruşdu:

Ona nə olub ki?

– Düşərgəyə qayıdın. Orada hamısını bilərsiniz.

Roşfor bir anlığa düşündü; kardinalın kralla görüşmək üçün Sürjerə gələcəyini, buradan ora bir günlük yol olduğunu nəzərə alıb, Atosun məsləhətini qəbul etdi. Bir da ki, Sürjerə qayıtmaqla o, özü dustağı gözdən qoymazdı.

Onlar yenə də yola düşdülər.

Ertəsi gün, gündüz saat üçdə atlılar Sürjerə gəldilər. Kardinal orada XIII Lüdoviki gözləyirdi. Nazirlə kral bir-birinə lütfkarlıq göstərdi, bütün Avropanı Fransa əleyhinə qaldıran ən qəddar bir düşməndən xilas olmaları münasibətilə bir-birini təbrik etdilər. Roşfor

– Dövlətin düşmənlərilə məktublaşmaq üstündə təqsirləndirirlər; sizi dövlət sirlərinə gizli qulaq asmaq üstündə təqsirləndirirlər; öz komandanınızın planlarını pozmağa təşəbbüs etdiyiniz üstündə təqsirləndirirlər.

D'Artanyan bunların miledi tərəfindən söyləndiyini duyaraq dedı:

Monsinyor, məni axı bu cinayətlər üstə təqsirləndirən kımdır? Dövlətin ədalət məhkəməsi hökmü ilə damğa vurulmuş bir qadın; Fransada əri ola-ola, bu ərdən boşanmadığı halda, İngiltərədə bir başqasına ərə gedən qadın, ikinci ərini zəhərləyib öldürən, mənim özümü də zəhərləmək ıstəyən bir qadın!

Kardinal təəccüblə dedi:

- Siz nə söyləyirsiniz? Siz hansı qadından danışırsınız?

- Mən ledi Vinterdən danışıram. Bəli, o ledi Vinterdən ki, onun cinayətləri, heç şübhəsiz, sizə məlum deyil; çünki, monsinyor, siz ona etibar edirdiniz.

Möhtərəm cənab, əgər ledı Vinter sizin soylədiyiniz cinayətləri işləmişsə, onda o cəzalanacaqdır.

- Zati aliləri, o artıq cəzalanmışdır.

Kim onu cəzalandırıb?

– Biz!

O dustaqdırmı?

Xeyr, o ölmüşdur.

Kardinal öz qulaqlarına inanmadı:

Ölmüşdür? Ölmüşdur? Siz dediniz ki, ölmüşdür?

O, üç dəfə məni öldürmək istədi, lakin mən bunu ona əfv etdim. Sonra o, sevdiyim qadını zəhərləyib öldürdü. Onda öz yoldaşlarımla bərabər onu tutduq, mühakimə etdik, ölüm cəzası kəsdik.

D'Artanyan Betündəkı karmelıtlər monastırında xanım Bonasyenin zəhər verilıb öldürülməsini, kıçık, yalqız bir evdə düzələn məhkəməni və Lis çayı kənarında olan edamı kardinala söylədi.

Kardinal özünü ələ almağı bacarırdu, lakin bu dəhşətli xəbəri eşidərkən, özü də qeyri-ixtiyari olaraq diksindi.

Bırdən, sankı söylənılməyən bir fikrin təsirilə onun üzü yavaş-yavaş açıldı, o tamamılə sakitləşdi

Demək siz öz üzərinizə hakim vəzifəsini götürmüsünüz və düşünməmisiniz ki, ixtiyarı olmadan cəza verənlər hakim deyil, qatildırlər? – Kardinalın səsındəki yumşaqlıqla sözlərindəki sərtlik arasında böyük bir ziddiyyət vardı.



– Monsinyor, mən özümü müdafiə etmək fikrində deyıləm. Kardınal həzrətləri mənə nə kimı cəza vermək istəsə, mən onu qəbul etməyə hazıram. Həyatım mənim üçün o qədər də qiymətli deyıldir ki, mən ölümdən qorxum.

Kardınal mehribanlıq ifadə edən bir səslə dedi:

– Bəli, mən sizin mərd bir adam olduğunuzu bilirəm; ona görə də qabaqcadan sizə deyirəm ki, sizi mühakimə edəcəklər və cəzalandıracaqlar.

– Zati-aliləri, bir ayrısı mənim yerimdə olsaydı sızə deyərdi kı, bağışlanmaq kağızı mənim cibimdədır; ancaq mən bunu demırəm. Əmr edin, monsinyor, mən boyun əyməyə hazıram.

Rişelye təəccüblə soruşdu:

– Siz hansı bağışlanmaq kağızından danışırsınız?

Monsinyor, mənim bağışlanmaq kağızımdan.

– Bu bağışlanmaq kağızına kim qol qoymuşdur? Kralmı?

Kardinal bu sözləri nəzərə çarpmayan bir nifrətlə dedi:

Xeyr, ona siz cənabları qol qoymusunuz.

Mən? Siz dəli olmusunuz!

– Monsinyor öz ımzasını tanıyarmı?

D'Artanyan, Atosun miledıdən aldığı və d'Artanyana verdiyi *qiymətlı kağızı kardinala təqdım etdi.*

Kardinal həzrətləri kağızı alıb hər sözü ayrı-ayrı qeyd edərək yavaş-yavaş oxudu:

*"Bu kağızı təqdim edən adam nə etmişsə, mənim əmrimlə və dövlətın xeyri üçün etmişdir*

*3 dekabr 1627 ci il.*

*Rişelye"*

Kardinal bu iki sətri oxuyub dərin düşüncəyə daldı, ancaq kağızı d'Artanyana qaytarmadı.

D'Artanyan öz-özünə dedi: "O fikirləşir kı, mənı hansı növ edama məhkum etsin; daha bunu bilmir kı, əsilzadə öləndə də bir əsılzadə kimi ölür".

Gənc muşketyor elə bir vəziyyətdə idi ki, başqa dünyaya köçmək onu çox da elə qorxuda bılməzdi.

Rişelye düşünürdü. Nəhayət, o, başını qaldırdı, qartal baxışları ilə muşketyora baxdı, onun ağıllı, könül açıqlığı və nəciblik ifadə edən üzündə son aylarda çəkdiyi iztırabın izlərini gördü. Kardinal bu gəncin gələcəyini, bu ağıllı, igid, bacarıqlı adamın sadiq olacağı şəxsə nə dərəcə xeyir verəcəyini bir neçə dəfə düşündü.

Burası da vardı ki, miledinin cinayətləri kardinalı bir neçə dəfə qorxutmuşdu. Bu təhlükəli qadından həmişəlik yaxasını qurtardığına da ürəyində sevinən kimi idi.

O, d'Artanyanın nəciblik göstərərək verdiyi kağızı yavaş-yavaş cırdı.

D'Artanyan öz-özünə dedi: "Mən məhv oldum".

Kardinal mizə yanaşdı, oturmadan, üçdə iki hissəsi yazılmış dəri kağıza bir neçə sətir də əlavə edib öz möhürünü vurdu. D'Artanyan düşündü: "Bu, məndən ötrü verilən hökmdür. Bu, məni Bastiliyada çürüməkdən və uzun zaman davam edən məhkəmə sorğu-sualından xilas edər: elə bu, özü də böyük bir iltifatdır".

Kardinal kağızı gənc adama verərək:

- Alın, – dedi. Mən sizdən bir vərəq kağız aldım, əvəzində başqasını verirəm. Ancaq burada ad göstərilməmişdir; bunu özünüz yazarsınız.

D'Artanyan tərəddüd içində kağızı alıb ötəri ona göz gəzdirdi.

Bu leytenant rütbəsi verilməsi üçün bir fərmandı. D'Artanyan kardinalın ayaqlarına düşdü:

– Monsinyor, – dedi, mənim həyatım bu gündən sizin ixtiyarınızdadır, hər nə buyursanız qulluğunuzda hazıram... Ancaq sizin göstərdiyiniz bu iltifata mən özümü layiq görmürəm. Mənim üç dostum var ki, onlar buna daha artıq layiqdir, daha artıq...

Kardinal əlini dostcasına onun çiyninə vuraraq:

– D'Artanyan, siz nəcib oğlansınız! dedi. O, belə dikbaş, inadkar bir adamı özünə tabe edə bilməsinə sevinirdi. Bu fərmandan istədiyiniz kimi istifadə edə bilərsiniz. Ancaq yadınızda saxlayın ki, orada ad yazılmayıbsa da, o, sizə verilmişdir.

D'Artanyan:

– Mən bunu heç vaxt unutmaram, – dedi. – Zati-aliləri buna əmin ola bilər.

Kardinal geriyə dönüb ucadan:

– Roşfor!



Kavaler dərhal içəri girdi; o, yəqin ki, qapı dalında durubmuş.

Roşfor, siz cənab d'Artanyanı görürsünüz. Mən onu öz dostlarımın sırasına qəbul edirəm; buna görə də, xahiş edirəm, onunla öpüşəsiniz; əgər başınızın sağ-salamat qalmasını istəyirsinizsə onunla ağıllı rəftar ediniz.

Roşforla d'Artanyan istəmədən dodaqlarını bir-birinə toxundurdular: onlar kardinalın əmrindən çıxa bilməzdilər, bir də ki, kardinal diqqətlə onlara baxırdı.

Roşforla d'Artanyan otaqdan bir çıxdılar. Roşfor:

– Cənab, dedi, – biz yenə də görüşəcəyik, elə deyilmi?

D'Artanyan ona belə cavab verdi:

– Nə vaxt istəsəniz mən hazıram.

Hər halda fürsət düşəcək.

Rişelye qapını açıb dedi:

– Hm, nə olub?

Roşforla d'Artanyan gülümsəyib bir-birinin əlini sıxdı, hər ikisi kardinal həzrətlərinə baş əydi. Atos d'Artanyanı görüb dedi:

– Harada qalmısan, az qalmışdı ki, bizim səbrimiz tükənsin.

– Dostlar, bu da mən! Azad olmaqdan başqa hələ böyük bir iltifata da nail oldum.

Nə olubsa hamısını bizə söyləsənmi?

– Elə lap bu axşam.

Doğrudan da d'Artanyan axşam Atosun yanına getdi; Atos yenə, adəti üzrə, qabağına bir şüşə İspaniya şərabı qoyub içirdi. D'Artanyan kardinalla olan söhbətini ona danışdı və cibindən fərmanı çıxarıb dedi:

Əzizim, alın, bu haqq sizindir.

Atosun üzündə həlim, füsunkar bir təbəssüm göründü:

– Əzizim, bu rütbə Atos üçün çox böyükdür, qraf de La Fer üçünsə çox kiçikdir, – dedi. – Bu fərmanı özünüz üçün saxlayın; o sizindir. Çox təəssüf ki, o, sizə çox baha oturdu.

D'Artanyan Atosun yanından çıxıb Portosun otağına girdi.

Portos çox gözəl işləməli bir kaftan geymişdi.

- Ba! Xoş gəlmisiniz! Portos onu sevinclə qarşıladı. – Əziz dost, sizsiniz? Necə görürsünüz, bu paltar mənə yaraşırmı?

– Lap yaxşı yaraşır. Ancaq mən sizə başqa bir paltar təklif etməyə gəldim, bu paltar sizə daha yaxşı yaraşar.

Portos soruşdu:

– Bu, necə paltardır?

– Bu, muşketyorlar leytenantı mundiridir.

D'Artanyan kardinalla olan söhbətini Portosa danışdı və kardinalın verdiyi fərmanı cibindən çıxarıb dedi:

– Alın, əziz dost, adınızı ora yazın, mənim yaxşı bir rəisim olun.

Portos kağızı alıb baxdı və yenə də d'Artanyana qaytardı; gənc muşketyor buna çox təəccüb etdi.

– Bəli, bu mənim üçün böyük bir şərəf olardı, ancaq mən kardinalın bu iltifatından uzun zaman istifadə edə bilməzdim. Biz Betünə gedəndə mənim hersoginyamın əri ölmüşdür. Rəhmətlik Koknarın sandığı, nəhayət, öz ağuşunu açaraq məni dəvət edir. Mən onun dul qalmış arvadını alıram. Mən indicə toy paltarını geyib yoxlayırdım... Leytenant rütbəsini özünüz üçün saxlayın, əzizim, özünüz üçün saxlayın.

Portos bunu deyib kağızı d'Artanyana qaytardı.

D'Artanyan oradan Aramisin yanına yollandı.

Aramis ikona qabağında dizləri üstə düşüb dua edirdi.

D'Artanyan kardinalla olan görüşünü nağıl edib, leytenantlıq fərmanını cibindən çıxartdı:

– Siz bizim dostumuz, bizim himayəçimizsiniz, – dedi.– Bu fərmanı alın; siz buna bizim hamımızdan artıq layiqsiniz, çünki siz öz ağıllı məsləhətlərinizlə bizi həmişə çətinlikdən qurtarıb xoşbəxtliyə çıxarmısınız.

Aramis dedi:

– Əziz dostum, heyhat! Son vaxtlarda bizim başımıza gələn hadisələr məni tamamilə hərbi qulluqdan, ümumiyyətlə, bu dünyanın işlərindən iyrəndirdi. Mən bu dəfə belə bir qərara gəlmişəm. Laroşelin mühasirəsi qurtaran kimi lazarçılar monastırları birliyinə girəcəyəm.. D'Artanyan,bu fərmanı özünüz üçün saxlayın: hərbi qulluq daha çox sizə yaraşır, siz igid, bacarıqlı bir sərkərdə olacaqsınız.

D'Artanyanın həm ürəyi sevinclə çırpınır, həm də yoldaşlarına qarşı duyduğu minnətdarlıq hissindən gözləri yaşarırdı. Bu halda da o, Atosun yanına qayıtdı:

– Görürsünüzmü, onlar da qəbul eləmədilər.

– Əziz dost, ona görə qəbul eləməyiblər ki, leytenantlıq rütbəsini almağa heç kəs sizin qədər layiq deyil.



Atos bunu deyib lələk qələmi götürdü, d'Artanyanın adını fərmana yazdı.

D'Artanyan dedi:

– Demək, mənim daha dostum olmayacaq, əfsus ki, mənə acı xatirələrdən başqa bir şey qalmayacaq...

O, başının endirərək əlləri içinə aldı, iki damla göz yaşı yanaqlarından aşağı süzüldü.

Atos ona:

– Siz gəncsiniz, – dedi, – sizin hələ irəlidə ömrünüz çoxdur, sizin acı xatirələriniz xoş xatirələrlə əvəz ediləcəkdir.

## SON SÖZ

Laroşel, Bekinhem hersoqunun vəd etdiyi yardımı almadığından, bir il davam edən mühasirədən sonra, 1628-ci il oktyabrın 28-də təslim oldu. Dekabrın 23-də kral Parisə qayıtdı. Onun üçün böyük bir qalibiyyət təntənəsi düzəldi, sanki o, fransızlara deyil, düşmənə qalib gəlmişdi. O, Sen-Jak civarında qurulmuş, güllər və ağac budaqları ilə bəzənmiş zəfər tacı altından keçib Parisə girdi.

D'Artanyana leytenantlıq rütbəsi verildi. Portos hərbi qulluğu buraxıb, bir il sonra xanım Koknarı aldı: prokurorun sandığından səkkiz yüz min livr pul çıxmışdı.

Muşketon gözəl bir livreya geyindi və zərli karetanın dal pilləkənində getmək arzusuna nail oldu; bütün ömrü boyu o, bunun həsrətini çəkmişdi.

Aramis Lotarinkiyaya getdi və birdən yox oldu; yoldaşlarına daha məktub yazmadı. Sonralar xanım Şevrözdən eşitdilər ki, o, Nansido monastıra girmişdir.

Bazen də gedib monax oldu.

Atos 1631-ci ilə kimi d'Artanyanın başçılığı altında muşketyorluq elədi. Turenə gedəndən sonra, Rusilyonda kiçik bir irs aldığını bəhanə edərək qulluqdan çıxdı.

Qrimo da Atosla getdi.

D'Artanyan üç dəfə Roşforla qılınc davasına çıxdı, üçündə də onu yaraladı.

Üçüncü dəfədə əlini uzadıb ona yerdən qalxmağa kömək edərkən dedi:

– Yəqin dördüncü dəfədə sizi öldürəcəyəm.

Yaralanmış Roşfor da ona dedi:

– Elə isə biz bununla davamızı qurtarmalıyıq: bu, sizin üçün də yaxşı olar, mənim üçün də. Heç bilirmisiniz, mənim sizə, sizin düşün-düyünüzdən çox-çox artıq hörmətim var. Birinci dəfə ki, sizə rast gəldim, sizi çox asanlıqla məhv edə bilərdim: bunun üçün kardinala bircə kəlmə deməyim kifayətdi.

Onlar bir-birini qucaqladılar; ancaq bu dəfə, ürəklərində gizli ədavət saxlamadan, səmimiyyətlə qucaqlaşmışdılar.

Planşe Roşforun vasitəsilə qvardiya serjantı rütbəsini aldı.

Cənab Bonasye sakitcə yaşayırdı: o, arvadının başına nələr gəldiyini bilmirdi, bu barədə heç narahat da olmurdu.

Bir gün o ehtiyatsızlıq edərək özü haqqında kardinala məlumat verdi; kardinal da ona xəbər göndərdi ki, çalışaram, cənab Bonasye bu gündən sonra heç bir şeyin ehtiyacını çəkməsin.

Doğrudan da o, ertəsi gün, axşam saat yeddidə Luvra getmək istərkən bir daha Məzarçılar küçəsində görünmədi. Məsələdən xəbərdar olan şəxslərin dediyinə görə, kardinal həzrətlərinin əliaçıqlığı sayəsində, cənab Bonasye kral qəsrlərindən birində yemək və otaqla təmin edilmişdi.



## MÜNDƏRİCAT



### I HİSSƏ

## II HİSSƏ

